# SƏHİH MÜSLİM

Əbul Hüseyn Müslim bin əl-Həccac əl-Quşeyri ən-Neysaburi

Ərəb dilindən tərcümə edənlər:

**İsrafilov Anar Telman oğlu**
**Hacıyev Arif Süleyman oğlu**

Redaktor:
**Heydərov Rəfail Mikayıl oğlu**

Azərbaycan Respublikası Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin 29.12.2009-cu il tarixli DK-408/B saylı məktubu ilə nəşrə razılıq verilmişdir

# İman kitabı

## Birinci fəsil: Ən birinci iman lə iləhə illəllah (Allahdan başqa haqq məbud yoxdur) dəməkdir

1- Əbu Cəmradən Belə rəvayət olunur: ”Abdullah ibn Abbasın önünde, insanlara dediyini tərcümə edirdim. Onun yanına bir qadın gəlib, saxsı qabda qıcqırdılmış şərab haqda soruşduqda o , belə dedı: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına Abd əl-Qeys qəbiləsindən bir necə nəfər gəldi, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlardan soruşdu: “kimsisiniz və ya hansı qövmdənsiniz?” Onlar: “Rabiədənik” deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: “Gələn kəslərə və ya qövmə salam olsun, rüsvayçılıq, peşmançılıq üzaq olsun sizdən” Onlar dedilər: “Ey Allahın elçisi, sənin yanına uzaq yoldan gəlmişik, səninlə bizim aramızda olan yol kafir Mudar qəbiləsinin ərazisidir, buna görə sənin yanına yalnız haram ayında gələ bilərik, bizə mühim olan bir şeyi əmr et ki, biz də başqalarına onu çatdıraq və onunla cənnətə girək” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): onlara dörd şeyi əmr edib, dörd şeydən çəkindirdi, onlara yalnız Allaha iman etməyi əmr edərək dedi: “Bilirsinizmi yalnız Allaha iman etmək nədir?” Onlar: “Allah və Rəsulu bilər” deyə cavab verdilər Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: “ Allahdan başqa haqq məbud olmadığına və Məhəmmədin onun rəsulu olduğuna şəhadət etmək, namaz qılmaq, zəkat vermək, Ramazanda oruc tutmaq və qənimətin beşdə birini verməkdir” onlara dubbə (quru balqabaqdan olan qab), həntəm (yaşıl saxsı) və müzəffəti (qirla sıvanmıs qab) (bu qablarda nəsə qıcqırtmağı) qadağan etdi”. Şöbə belə demişdir: “bəlkə də nəqir (içi ovulmuş xurma ağacının kötüyündən olan qab) dedi” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: “bunları əzbərləyin və başqalarına da xəbər verin” deyə tövsiyə etdi.” Muazın oğlu atasından rəvayət etdiyi hədisdə belə əlavə etdi: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Abd Əl-qeys qəbiləsindən olan Əşəc adlı birinə belə demişdir: “Səndə Allahın sevdiyi iki xislət var: hövsələ və tələsməmək”. (Buxari \ 87, Müslim\17)

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə demişdir: “Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insaların arasında olduğü zaman ona bir kişi yaxınlaşaraq soruşdu: “Ey Allahın Elçisi iman nədir?” O: “İman; Allaha, Mələklərinə, Kitablarına, Allahla görüşməyinə, Rəsullarına (Peyğəmbərlərinə) və Qiyamət günü diriləcəyinə iman etməkdir” deyə cavab verdi. Kişi yenə soruşdu: “Ey Allahın Elçisi islam nədir?” O: “İslam Allaha ibadət etmək və Ona heç bir şeyi şərik qoşmamaq, Fərz olunmuş Namazları qılmaq, Fərz olunmuş Zəkatı vermək və Ramazan orucunu tutmaqdır” deyə cavab verdi. Kişi “Ey Allahın Elçisi Ehsan nədir?” deyə yenə soruşdu. O , “Ehsan, Allaha Onu gördüyün kimi ibadət etməkdir. Həqiqətən , sən Onu görməsən də, O səni görür” deyə cavab verdi: Kişi “Ey Allahın Elçisi Qiyamət nə zamandır?” deyə soruşdu?: O belə cavab verdi: “Soruşulan Soruşandan artıq bilmir, lakin sənə onun əlamətlərindən danışaram. Kəniz ağasını doğduğu zaman; bu onun əlamətlərindəndir. Ayaqyalın, çılpaq kəslərin insanlara başçılıq etdikləri zaman; bu onun əlamətlərindəndir. Qoyun otaran çobanların uca binalar tikərək yarışdıqları zaman; bu onun əlamətlərindəndir. Beş şeyi Allahdan başqa heç kəs bilməz (sonra bu ayəni oxudu) “Həqiqətən, o saatı ancaq Allah bilir. Yağışı göydən O yağdırır, bətnlərdə olanı O bilir. Heç kəs səhər nə kəsb edəcəyini, heç kəs harada öləcəyini bilməz. Allah isə,

şübhəsiz ki, biləndir, xəbərdardır!" (Loğman\ 34) Sonra kişi getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ətrafındakılara belə dedi: "Kişini mənim yanıma qaytarın!" Onu qaytarmaq üçün axtardılar, lakin heç kəsi tapmadılar. Belə olduqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "O Cəbrail idi, insanlara onların dinini öyrətməyə gəlmişdi". (Buxari \ 50, Müslim\9).

3- Səid ibn Museyyibdən o da atasından (Allah ondan Razı olsun) belə rəvayət etmişdir: Əbu Talib ölüm yatağında ikən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanına gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Onun yanında Əbu Cəhl və Abdullah ibn Ümeyyə ibn Əl- Muğirəni gördü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Ey əmi! Lə iləhə illəllah de ki, bu kəlmə ilə sənin üçün Allahın qarşısında şahidlik edim" deyə söyləli. Əbu Cəhl və Abdullah ibn Ümeyyə: "Ey Əbu Talib! Əbdül Muttalibin dinindən imtina edirsən?!" deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Talibin onlara son sözü "O Abdul Muttalibin dinindədir " olanadək, ona bu kəlməni deyərək, onun üçün təkrar edti. O, Lə iləhə illəllah deməkdən imtina etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə dedi: And olsun Allaha , mənə qadağan olunmayınca, sənin üçün bağışlanma diləyəcəyəm. Allah Təala bu ayəni nazil etdi: "Müşriklərin cəhənnəmlik olduqları bəlli olduqdan sonra, onlarla qohum olsalar belə, Peyğəmbərə və iman gətirənlərə onlar üçün bağışlanma diləmək yaraşmaz!" (Tövbə \ 113) Allah Təala Əbu Talib barəsində bu ayəni nazil edərək Rəsuluna belə dedi: "Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah dilədiyini doğru yola salar. Doğru yolda olacaq kəsləri daha yaxşı O bilir! (Qəsas\ 56)" . (Buxari \ 1360, Müslim\24).

## İkinci fəsil: Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur deyənədək insanlarla vurşmağa əmr olundum.

4- Əbu Hüreyrədən (Allah ondan razı olsun) belə rəvayət olunur: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) öldükdən sonra Əbu Bəkr (Allah ondan razı olsun) xəlifə seçildiyi, ərəblərdən bəziləri kafir olaraq dindən çıxdığı bir dövürdə, Omər ibn Əl – Xattab (Allah ondan razı olsun) Əbu Bəkrə belə dedi: "İnsanlarla necə vuruşursan?! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) demişdir: "Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur, deyənədək insanlarla vurşmağı əmr olundum. Kim Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur desə, artıq islamın haqqı müstəsna olmaqla, malını və nəfsini məndən qorumuş olar, haqq – hesabını çəkmək isə Allaha aiddir." Əbu Bəkr (Allah ondan razı olsun) belə cavab verdi: "Namazı zəkatdan ayıranla vuruşacağma Allaha and içirəm. Zəkat malın haqqıdır, Allaha and olsun ki , Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) verdikləri qaytanı belə mənə verməyi qadağan etsələr, buna görə onlarla vuruşaram. Omər ibn Əl–Xattab (Allah ondan razı olsun) belə dedi: "Allaha and olsun ki , o anda Allahın Əbu Bəkrin qəlbini döyüş üçün açdığını gördüm və anladım ki, o haqqdır" (Buxari \ 1399, Müslim\20).

5- Abdullah ibn Omərdən (Allah onların hər ikisindən razı olsun) belə rəvayət olunur: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) demişdir: "Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Allahın elçisi olduğuna şəhadət edincəyə, namaz qılıb, zəkat verincəyə qədər insanlarla vuruşmağa əmr olundum. Elə ki, bunu etdilər, islamın haqqı müstəsna olmaqla , qanları və mallarını məndən qorumuş olarlar. Haqq – hesablarını çəkmək isə Allaha aiddir" (Buxari \ 25, Müslim\22).

## Üçüncü Fəsil: Kafirlərdən olan bir kəsi “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur “ dedikdən sonra öldürən haqqda.

6- Migdad ibn Əl-Əsvəddən (Allah onda razı olsun) belə rəvayət olunur: Ey Allahın Elçisi! Kafirlərdən bir kişi ilə üz-üzə gəlsəm və mənimlə vuruşsa, qılıncı ilə vurub bir əlimi kəssə, sonra məndən qaçaraq ağac atlına sığınaraq, Allaha təslim oldum desə, onu ,bunu dedikdən sonra öldurümmü? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “öldürmə” deyə cavab verdi. Belə dedim: “Ey Allahın Elçisi artıq o, əlimi kəsib. Əlimi kəsdikdən sonra bunu deyib, onu öldürümmü? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “ oldürmə” əgər onu oldürsən, elə bil ki, o, sən onu öldürmədən öncə sənin dərəcəndə, sənsə onun demiş olduğu kəlməni deməzdən öncə olduğu dərəcədəsən” deyə cavab verdi. Əl- Əvzai və İbn Cüreycin hədisində belə deyilir: “Allaha təslim oldum”. Məmarın hədisinsə isə belə deyilir: “Onu öldürməyə atıldığımda belə dedi: “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur” (Buxari \ 4019, Müslim\95).

7- Usamə ibn Zeyddən (Allah ondan razı olsun) belə rəvayət olunur: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizi kiçik bir dəstədə yolladı, səhər Cüheynə qəbiləsindən olan bir dəstə atlı ilə üz–üzə gəldik. Onlardan bir kişiyə çatdığımda “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur”, dedi və mən onu öldürdüm. Nəfsimdə buna görə nəsə qaldığından, bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur, dedi və sən onu öldürdün?!” Ona “Ey Allahın Elçisi, O bunu silahdan qorxduğu üçün dedi” deyə cavab verdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: “Məgər deyib-demədiyini bilmək üçün onun qəlbini (girmişdin) yarmışdın?!” O bunu mənə təkrarladıqca, kaş ki, o gün islama gireydim, deyə arzuladım. “Saad belə demişdir: “And olsun Allaha ki, Zul Butayin (yəni Usamə) bir müsəlmanı oldürməyincə mən də oldürmərəm”. Bir kişi belə dedi: “Məgər Allah Təala: “fitnə qalmayıb, bütün din yalnız Allaha məxsus olanadək onlarla vuruşun” (Ənfal\ 39) deməyibmi?» Saad: “Biz fitnə qurtaranadək vuruşmuşuq, sən və əshabın isə fitnə olanadək vuruşmaq istəyirsiniz” deyə cavab verdi. (Buxari \ 4269, Müslim\96).

8- Safvan ibn Muhrizdən belə rəvayət olunur: “Cundub ibn Abdullah Əlbəcəli (Allah ondan Razı olsun) İbn Zübeyr Fitnəsi zamanı Asasa ibn Sələmənin yanına adam gondərərək: “qardaşlarından bir necesini, mən onlarla danışmaq üçün, cəm et” deyə söylədi. Elə ki, yığışdılar, Cundub gəldi, əynində başlıqlı sarı paltar vardı. Onlara: “haqqında danışdığınız seyi danışmaqda davam etmələrini söylədi” . Sohbət uzandı, və nəhayət söz ona çatdıqda, başlıqı başından açaraq belə dedi: “mən sizin yanınıza gəlmişəm və sizə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbərindən başqa heç nə danışmaq istəmirəm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müsəlman bir kişini müşriklərdən olan bir qövmə elçi olaraq göndərdi. Onlar qarşılaşdılar. Müşriklərdən biri müsəlman olan kişini öldürməyə qəsd edərək onu ölürdü. Müsəlman olan bir kişi onu qəflətdə tutmaq istədi. Onun “Usamə ibn Zeyd olduğunu deyirdik” elə ki, qılıncı onun üzərinə qaldırdı o, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur-deyəndə onu öldürdü. Bir kişi bunu soruşmaq üçün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək kişinin necə etdiyini xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu çağıraraq soruşdu: “onu nə üçün öldürdün”? O: “Ey Allahın Elçisi müsəlmanlara əzab verib, bir neçə nəfərin adını sayaraq, filankəsi və filankəsi

öldürüb, və mən də onu öldurmək istədim. Qılıncı gördüyündə “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur” dedi” deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruşdu: “Onu öldürdün?!” O: “Bəli” deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə dedi: “qiyamət günü “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur” kəlməsi ilə gəldiyində nə edəcəksən?” O : “Ey Allahın Elçisi, mənim üçün bağışlanma dilə!” deyə xahiş etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə dedi: “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur” kəlməsi ilə gəldiyində nə edəcəksən? Ona “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur” kəlməsi ilə gəldiyində nə edəcəksən? sözündən artıq bir şey əlavə etmədi. (Müslim\ 97).

## Dördüncü fəsil: kim Allah təala ilə imanında şəkk etmədən qarşılaşsa cənnətə girər.

9- Osmandan (Allah ondan razı olsun) belə rəvayət olunur: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) demişdir: “kim ölsə və bilsə ki “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur” cənnətə girər” (Müslim\ 26).

10-Əbu Hüreyrədən (Allah ondan razı olsun) (və ya Əbu Səid (Allah ondan razı olsun) Əyməş şək etmişdir) belə rəvayət olunur: “ Tabuk döyüşü günü insanlar aclığa düçar oldular. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) “Ey Allahın Elçisi , izn ver dəvələrmizi kəsib yeyək və yağını götürək” deyə, izn istədilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: “Edin” deyə cavab verdi: “Ömər Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib belə dedi: “ Ey Allahın Elçisi , əgər belə etsən , minik azalacaq, ondansa onlara ərzaqlarından qalanı gətirmələrini söylə , sonra Allahdan onlar üçün bərəkət dilə ki, bəlkə Allah Təala bunda bərəkət verdi”. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Bəli” deyərək , dəri döşəmə tələb etdi və onu yerə sərdi. Sonra onlara olan ərzaqlarının qalanını gətirmələrini tələb etdi. “Kişilərdən biri bir ovuc qarğıdalı toxumu, başqa biri bir ovuc xurma, başqa biri isə bir parça nə isə gətirdi. Elə ki, döşəmənin üzərində cuzi bir şey yığıldı, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bərəkət diləyərək dua etdi. Sonra dedi: “yığın qablarınıza!”. Başladılar qablara yığmağa hətta qoşunda olan bütün qablar doldu. Sonra yeyib doydular, artıq da belə qaldı” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: “Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və mənim onun Rəsulu olmağıma şəhadət edirəm ki, bu iki kəlmədə şəkk etmədən, Allahla qarşılaşan, cənnətdən məhcub (məhrum) olmaz” (Müslim\ 27).

11-“Əssunabihidən O da Ubadə ibn Əs-Samitdən (Allah ondan razı olsun) belə rəvayət edir: “Onun (Ubadə) ölum ayağında ikən, yanına girdim. Sonra ağladım, mənə: “bir dur niyə ağlayırsan? deyə soruşdu və belə dedi: “And olsun Allaha! Şahidlik etmək tələb olunsa sənin üçün şahidlik edərəm, Şəfaətçilik etmək tələb olunsa sənin üçün şəfaət edərəm, bacarsam sənə faydalı olam, olaram. Sonra belə dedi: “And olsun Allaha! Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyim, sizin üçün xeyrli olan hər bir hədisi sizin üçün danışdım yalnız bir hədisdən başqa, onu da sizə bu gün danışacağam. Artıq nəfəsim (ölümlə) əhatə olunub, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “Kim Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin Onun Rəsulu olduğuna şəhadət edərsə Allah Təala ona odu (cəhənnəmi) haram edər. (Müslim\ 29).

12-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə demışdir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ətrafında oturmuşduq. Əbu Bəkr və

Omər (Allah onların hər ikisindən razı olsun) bir nəçə nəfər olmaqla bizimlə idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxaraq aramızdan ayrıldı, qayıtması gecikdiyindən qorxduq ki, biz olmadan ona bir şey olar. Təlaşdan durduq. Ən birinci duran mən oldum. Çıxıb Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) axtarmağa başladım. Bəni Nəccar qəbiləsindən olan ənsarlardan birinin evinin divarına çatıb qapısının olub-olmadığını tapmaq üçün divarın ətrafını dolaşdım, heç nə tapmadım. Birdən quyudan axan suyun axmasından meydana gələn arxın divarın altından içəriyə doğru girdiyini gördüm. Ordan keçərək Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına girdim. Məni görəndə "Əbu Hüreyrə" sənsən? dedi. Mənəm Ey Allahın Elçisi deyə cavab verdim. O: "nə üçün gəldin" deyə soruşdu? Mən belə cavab verdim: "bizimlə idin qalxaraq aramızdan ayrıldın, qayıtman gecikdiyindən qorxduq ki, biz olmadan sənə bir şey olar. Təlaşdan durduq. Ən birinci duran mən oldum və bu divarın yanına gəldim. Oradan tülkü keçdiyi kimi içəri keçdim, insanlarda arxamda. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) : "Ey Əbu Hüreyrə" dedikdən sonra ayaqqabılarını mənə verdi və belə dedi: " ayaqqablarımla get divarın arxasında qarşılaşdığın , Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına qəlbi ilə yəqin olaraq şəhadət verən hər bir kəsi cənnətlə müjdələ". Ən birinci qarşılaşdığım Ömər oldu. Mənə: "Ey Əbu Hüreyrə" bu ayaqqabılar nədir deyə söruşdu? Dedim ki: "bunlar Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaqqablarıdır, bunları mənə verərək divarın arxasında qarşılaşdığım , Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına qəlbi ilə yəqin olaraq şəhadət verən hər bir kəsi cənnətlə müjdələmək üçün göndərib. Əbu Hüreyrə belə dedi: "Ömər mənim sinəmin ortasından elə vurdu ki, arxam üstə oturdum" O mənə: "Ey Əbu Hüreyrə qayıt" deyə əmr etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək hönkür–hönkür ağlamağa başladım. Ömər də mənim arxamca gələrək gəlib çatdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Əbu Hüreyrə , sənə nə olub? " deyə məndən soruşdu? Ona belə cavab verdim: "Ömərlə qaşılaşdım, sənin mənə əmr etdiyin şeyi ona xəbər verdikdə mənim sinəmin ortasından elə vurdu ki, arxam üstə oturdum, sonra mənə qayıtmamı əmr etdi". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Ömər , səni belə etməyə nə vadar etdi?" deyə ondan soruşdu. O belə cavab verdi: "Ey Allahın Elçisi , atam anam sənə fəda olsun Əbu Hüreyrəyə ayaqqablarını verərək divarın arxasında qarşılaşdığı , Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına qəlbiilə yəqin olaraq şəhadət verən hər bir kəsi cənnətlə müjdəməyi sən əmr etdinmi? O: "bəli mən" deyə cavab verdi. Ömər ona belə dedi: " belə etmə, qorxuram ki, insanlar ona arxayınlaşarlar, qoy əməl etməkdə davam etsinlər" Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "qoy davam etsinlər" deyə onunla razılaşdı. (Müslim\ 31)

13-Müaz ibn Cəbəldən belə dediyi rəvayət olunur: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni tərkinə almışdı, mənimlə onun arasında yəhərin arxası vardı. Məndən soruşdu: "Ey Muaz ibn Cəbəl!" Mən dedim: "səni eşidirəm, əmrindəyəm , Ey Allahın Elçisi" bir müddət susdu sonra yenidən dedi: "Ey Muaz ibn Cəbəl!" Mən yenə cavab verdim: "səni eşidirəm, əmrindəyəm , Ey Allahın Elçisi" O yenə bir müddət susdu sonra yenidən dedi: : "Ey Muaz ibn Cəbəl!" Mən yenə cavab verdim: "səni eşidirəm , əmrindəyəm , Ey Allahın Elçisi" O belə dedi: "Bilirsənmi Allahın bəndələrində olan haqqı nədir? Mən dedim: Allah və Rəsulu daha yaxşı bilər! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: Allahın bəndələrində haqqı, bəndələrin Ona ibadət etmələri və bu ibadətdə heç bir şeyi Ona şərik qoşmamalarıdır». Bir müddət susdu, sonra yenə soruşdu: "Ey Muaz ibn Cəbəl! Mən dedim: "səni eşidirəm,

əmrindəyəm , Ey Allahın Elçisi” O belə dedi: “Bilirsənmi , Ona heç bir şeyi şərik qoşmayan bəndələrin Allahda olan haqqı nədir? Mən dedim: Allah və Rəsulu daha yaxşı bilər! O: “Onlara əzab verməməkdir” dedi. (Buxari \ 2856, Müslim\30).

14- Mahmud ibn Rabidan, o da Utban ibn Malikdan belə rəvayət etmişdir: “Mədinəyə gəldiyimdə Utbanla qarşılaşdım. Ona belə dedim: “sənin haqda belə bir hədis eşitmişəm” Utban dedi: “gözlərimə (görməyim zəifləmişdi) nəsə bir şey olmuşdu. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına adam göndərərək ona belə deməsini istədim: “ İstəyirəm ki, gəlib mənim evimdə namaz qılasan, məndə oranı özüm üçün namazgah edim”. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allahın istədiyi səhabələrlə gəldi və evə daxil oldu. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qilarkən səhabələr öz aralarında söhbət edirdilər. Sonra bu işin əzəmətliyini və böyüklüyünü Məlik ibn Duxşuma nisbət edərək belə dedilər: “kaş ki , ona dua edərdi və o həlak olardı, kaş ki , ona bir şey olardı”. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirdikdən sonra belə dedi: “Məgər O Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və mənim onun Elçisi olduğuma şəhadət etmir?” Onlar: “O qəlbində olmadığı bir şeyi deyir.” deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: “ hər kim Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və mənim onun Elçisi olduğuma şəhadət etsə cəhənnəmə girməz və ya onu dadmaz” Ənəs belə demişdir: “Bu hədis mənin xoşuma gəldi, oğluma bunu yazmasını söylədim, o da yazdı.” (Buxari \ 425, Müslim\33).

## Beşinci fəsil: İman Nədir? Və onun xislətinin bəyanı.

15- Əbu Səid əl Xudrıdən (Allah ondan razı olsun) belə rəvayət olunur: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına Abd Əl-qeys qəbiləsindən bir necə nəfər gəlib belə dedi: “Ey Allahın elçisi , biz: “Rabiə” diyarındanıq “səninlə bizim aramızda olan yol kafir Mudar qəbiləsinin ərazisidir, buna görə sənin yanına yalnız haram aylarında gələ bilərik, bizə mühim olan bir şeyi əmr et ki, biz də başqalarına onu çatdıraq və ona əməl etsək, onunla cənnətə girək” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: “sizə dörd şeyi əmr edirəm, dörd şeyi qadağa edirəm; Allaha ibadət edin və ona hec bir şeyi şərik qoşmayın, namaz qılın, zəkat verin, Ramazanda oruc tutun və qənimətin beşdə birini verin, və dörd şeyi qadağa edirəm: “onlara dubə (quru balqabaqdan olan qab), həntəm (yaşıl saxsı) və müzəffəti (qirla sıvanmıs qab) (bu qablarada nəsə qıcqırtmağı) qadağan etdi”. Onlar : “Ey Allahın elçsi bəs “nəqir” haqda nə bilirsən?” deyə soruşdular? O belə cavab berdi: “bəli, (xurma ağacının) kötüyü ovub içini çıxarıb içinə kiçik xurmalar atırsınız, (Said belə demişdir: “və ya quru xurna” dedi) sonra içinə su tökürsünüz. Elə ki köpüyü yatdi, onu içirsiniz. Hətta sizdən biri, (və ya: onlardan biri) əmisi oğlunu qılıncla vurur. Gələnlərin içindən bu səbəbdən yara almış bir kişi belə dedi: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) utandığımdan yaramı ondan gizlədirdim. Ondan:“Ey Allahın Elçisi bəs hansı qablarda içək” deyə soruşdum ? O: “Ağzı bağlanan , aşılanmış dəridən olan su qablarından” deyə cavab verdi. Onlar belə dedilər: “Ey Allahın Elçisi , bizim ərazimiz çox siçovulludur, orada aşılanmış dəridən olan su qabları qalmır. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “onu siçovullar yesə belə”, “onu siçovullar yesə belə” , “onu siçovullar yesə belə” deyə təkrar etdi.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Abd Əl-qeys qəbiləsindən olan Əşəc adlı birinə belə demişdir: “Səndə Allahın sevdiyi iki xislət var: hövsələ və tələsməmək” (Müslim\18).

## Altıncı fəsil: Allaha iman ən əfzəl əməllərdəndir.

16-Əbu Zərdən (Allah ondan razı olsun) belə rəvayət olunur: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , hansı əməllər daha əfzəldir" deyə soruşdum? O: "Allaha iman etmək və Allah yolunda vuruşmaq" deyə cavab verdi. Mən: "hansı köləni azad etmək daha əfzəldir" deyə soruşdum? O: "Sahibləri üçun ən nəfis və qiymətdə bahalı olanı" deyə cavab verdi. Mən: "əgər bunu edə bilməsəm" deyə soruşdum? O: "edənə kömək et, və ya bacarmayan üçün et" deyə cavab verdi. Mən: "Ey Allahın elçisi , bəzi əməllərdən aciz olsam necə" deyə soruşdum? O: "Şərini insanlardan uzaq et, bu , səndən nəfsin üçün sədəqədir" deyə cavab verdi." (Buxari \ 2518, Müslim \ 84).

## Yeddinci fəsil: İman etməyə əmr etmək və Şeytanın vəsvəsəsindən Allaha sığınmaq.

17-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə rəvayət edir: "İnsanlar sizdən: "Bunu Allah yaradıb bəs Allahı kim yaradıb" soruşmayıncaya qədər elm haqda soruşmaqda davam edəcəklər. Əbu Hüreyrə (Allah ondan razı olsun) belə demişdir: "bir dəfə məsciddə oturduğum zaman yanıma bədəvi ərəblərdən bir neçə nəfər gəldi və məndən: "Ey Əbu Hüreyrə "Allah bizi yaradıb bəs Allahı kim yaradıb" deyə soruşdular. O, bir ovuc daş götürüb onlara atıb sonra "durun gedin, durun gedin, Xəlilim doğru demişdir" deyə cavab verdi. ( Müslim \ 135).

18-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə rəvayət edir: "İnsanlar sizdən bu kəlməni: "Allah bizi yaradıb bəs Allahı kim yaradıb" soruşmayıncaya qədər elm haqda soruşmaqda davam edəcəklər. O bir kişinin Əlindən tutaraq belə dedi: "Allah və Elçisi doğru demişdir, artıq məndən bu haqda bir nəfər soruşmuşdu bu da ikincidir (və ya məndən bir nəfər sorüşmüdü bu da ikincidir)." ( Müslim \ 135).

## Səkkizinci fəsil: Allaha iman etmək və düz yolda olmaq.

19-Sufyan ibn Abullah As–Saqafidən belə rəvayət olunur: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdum: "Ey Allahı Elçisi, mənə İslamda elə bir söz söylə ki, onu səndən sonra heç kəsdən soruşmayım"? (Əbi Usamnın hədisində: "Səndən başqa"). O: "de ki , Allaha iman etdim, sonra düz yolda ol" deyə cavab verdi." ( Müslim \ 38).

## Doqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) möcüzələri və ona iman.

20-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə rəvayət edir: " Elə bir peyğəmbər yoxdur ki , ona bəşərin iman etdiyi möcüzələr mislində bir möcüzə verilməsin. Mənə verilən möcüzə isə Allahın mənə etdiyi vəhydir. Diləyirəm ki , qiyamət günü ən çox ardıcılı olan mən olum." (Buxari\4981, Müslim\152).

21-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə rəvayət edir: " Muhəmmədin nəfsi əlində olana and olsun ki, bu ümmətdən (dəvət ümmətindən) yahudi və ya nəsrani olmağına baxmayaraq, mənim haqqımda eşidən və mənə göndərilənə iman etəmədən ölən hər bir kəs yalnız cəhənnəm əhlindən olar." (Müslim \ 153).

22-Saleh ibn Saleh Əl- Hamadanidən, o da Şəbidən belə rəvayət edir: "Xorasan əhlindən olan bir kişi Şəbidən belə soruşdu: "Ey Əbə Amr , bizim Xorasan əhli tərəfdə öz kənizini azad edib sonra onunla evlənən kişi haqda: "Dəvəsini minən" deyirlər. Şəbi ona belə cavab verdi. Mənə Əbu Burda ibn Əbu Musa o da atasından Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə dediyini rəvayət etdi: "Üç nəfərə əcri iki dəfə verilər: Əhli kitabdan olan öz Peyğəmbərinə iman gətirib və Peyğəmbər Muhəmmədi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) görmüş ona iman etmiş, ardınca getmiş, onu təsdiqləmiş kəsə iki əcr var. Qul bir kölə Allahın və sahibinin haqqını ödəsə, ona iki əcr var. Kənizi olan, onu yaxşı bir şəkildə yedizdirən, onu yaxşı bir şəkildə ədəbləndirən, sonra onu azad edib onunla evlənən kişiyə iki əcr var. Sonra Şəbi xorasanlı kişiyə belə dedi: Bu hədisi heç bir şey vermədən götür, vaxt vardı ki, bundan kiçik bir məsələyə görə kişi Mədinəyə qədər gedərdi." (Buxari \ 97, Müslim \ 154).

## Onuncu fəsil: Üc əlamət kimdə olarsa o imanın şirinliyini tapar.

23-Ənəs (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə dediyini rəvayət edir: "Üc əlamət kimdə olarsa, o imanın şirinliyini tapar: Kim Allahı və Elçisini hər bir şeydən çox sevsə, bir kimsəni yalnız Allah xatirinə sevsə, Allah Təala onu kufürdən çıxartdıqdan sonra yenə küfrə düşməyə, oda atılmaq istəmədiyi kimi nifrət etsə." (Buxari \ 16,21, Müslim \ 43).

24- Ənəs (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə rəvayət edir: "Sizlərdən biri məni övladından, valideyinlərindən və bütün insanlardan çox sevməyincə iman etmiş olmaz." (Müslim \ 44).

25-Ənəs (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə dediyini rəvayət edir: "Nəfsim Əlində olana and olsun ki, hər hansı bir bəndə öz nəfsinə istədiyini qonşusu (və ya qardaşı) üçün istəməyincə iman etmiş olmaz." (Müslim \ 45).

## On birinci fəsil: Rəbbinin Allah olamasına razılaşan kəs imanın ləzzətini dadar.

26-Abbas ibn Abd al-Muttalib (Allah ondan Razı olsun) belə rəvayət edir: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: Rəbbinin Allah, dininin İslam, Peyğəmbərinin Muhəmməd olamasına razılaşan kəs imanın ləzzətini dadar." (Müslim \ 45).

## On ikiknci fəsil: Dörd əlamət kimdə olarsa , o, xalis münafiq olar.

27-Abdullah ibn Amr (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "«Dörd əlamət kimdə olarsa , o , xalis münafiq olar. Bu dörd əlamətdən biri olarsa , o əməli tərk edənə qədər həmin adamda münafiqliyin bir xüsusiyyəti olar. Danışanda yalan danışar, söz versə sözündə durmaz, vəd verdikdə vəfasızlıq edər, münaqişə etdikdə günah (pis, nalayiq sözlərlə) danışar." Sufyanın rəvayət etdiyi hədisdə isə belə deyilir: "hər kimdə bu xislətdən nəsə olsa, onda münafiqlikdən bir xislət olar." (Buxarı \ 34, Müslim / 58).

28-Əbu Hüreyrə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deidyini rəvayət edir: "Münafiqliyin əlaməti

uçdür: “danışanda yalan deyər, vəd versə vədinə xilaf çıxar, etibar olunsa xəyanət edər.” (Buxarı \ 335, Müslim / 59).

## On üçüncü fəsil: Mömінin əkin cücərtisinə bənzər, kafirin və münafiqin isə sidr ağacına bənzər misalı var.

29-Kaab ibn Malikdən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedyini rəvayət olunur: “Mömінin misalı yaş əkin cücərtisinə bənzəyir ki, quryana kimi külək onu istədiyi tərəfə əyir, gah aşagı əyir, gah da duzəldir. Kafirin misalı isə sərt gövdəsi üzərində dayanmış sidr ağacına bənzəyir ki , onu heç bir şey əyə bilmir , ta ki , bir dəfə çıxarılıb atılır.” Başqa rəvayətdə belə deyilir: “əcəli çatana kimi gah da duzəldir, Münafigin misalı isə sərt gövdəsi üzərində dayanmış sidr ağacına bənzəyir ki , ona heç bir şey təsir etmir”. (Buxari \ 5643, Müslim \2810).

30-Abdullah ibn Ömərdən (Allah onların hər ikisindən razı olsun) belə rəvayət olunur: “Bir dəfə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında oturduğumuzda O: “mənə müsəlmana ( və ya müsəlman kişiyə) bənzəyən , yarpağını tökməyən bəhrəsini hər vaxt (ilin bütün fəsillərində) verən ağac haqda xəbər verin” deyə soruşduqda, nəfsimdə onun xuma ağacı olduğunu bildim. Əbu Bəkr və Ömərin susduğunu gördükdə danışıb nəsə bir şey deməyə utandım. Ömər mənə belə dedi: “ Sənin deməyin mənə belə və belə etməyindən daha sevimli olardı.” (Buxari \ 61, Müslim \2811).

## On dördüncü fəsil: Həya etmək imandandır.

31-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “İmanın yetmidən (və ya altmışdan) çox şöbəsi var. Onların ən fəzilətlisi “Lə ilahə illallah” kəlməsi, ən aşağı olanı isə yoldan bir maneəni uzaqlaşdırmaqdır. Həya da imanın şöbələrindən biridir.” (Buxari\9, Müslim\35).

32-Əbi Qatədədən (Allah ondan razı olsun) belə rəvayət olunur: “Bir neçə nəfərlə İmran ibn Huseynin yanında idik. Buşeyr ibn Kaabda aramızda idi. İmran həmin gün bizə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət etdi: “Həya xeyirin hamsıdı (və ya xeyir həyanın hamsıdı).” Buşeyr ibn Kaab ondan soruşdu: “Bəzi kitablarda (və ya hikmətli sözlərdə) görmüşük ki, O (həya) arxayınlıq (rahatlıq və mənəvi möhkəmlik), Allah üçün vüqarlığdı. Həmçinin onda zəiflik var.” Əbi Qatədə belə dedi: İmran elə qəzəbləndi ki gözləri də qızardı. Ona: “Sənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədisini danışdığımı bildikdən sonra ona zidd olursan?” deyərək İmran hədisi yenidən təkrarladı. Buşeyr ondan yenə soruşduqda İmran yenə qəzəbləndi. Biz ona (sakitləşsin deyə): “O bizdəndir , onda heç nə yoxdur deyə təkrar edirdik.” (Büxari\6118, Müslim\37).

## On beşibci fəsil: Qonşu ilə yaxşı keçinmək və qonağa ikram etmək imandandır.

33-Əbu Şureyh əl–Xuzaidən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyi rəvayət olunur: “Kim Allaha və axirət gününə iman gətirirsə , qonşusuna yaxşılıq etsin. Kim Allaha və axirət gününə iman gətirirsə , qonağına ikram etsin. Kim Allaha və axirət gününə iman gətirirsə , ya xeyir danışsın ya da sussun.” (Büxari \ 6019, Müslüm \ 46).

## On altıncı fəsil: Qonşusu onun şərrindən əmin olmayan kəs cənnətə girməz.

34-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qonşusu onun şərrindən əmin olmayan kəs cənnətə girməz." (Büxari \ 6016, Müslüm \ 46).

## On yeddinci fəsil: Münkəri (pis işi) əl, dil və qəlbdə dəyişdirmək imandandır.

35-Tariq ibn Şihabin belə dediyi rəvayət olunur: "Ən birinci bayram gününü xütbəyə namazdan əvvəl başlayan Marvan oldu. Bir kişi ayağa qalxaraq ona : "Namaz xütbədən əvvəldir dedikdə, o ona: oradakı tərk edilmişdir deyə cavab verdi. Əbu Səid əl–Xudri belə demişdir: "Amma O kişi üzərinə düşəni etmişdir. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Sizdən biriniz münkər bir işi görərsə onu əli ilə dəyişsin, bacarmasa , dili ilə, bunu da bacarmasa , qəlbi ilə dəyişsin, bu da ən zəif imandır." (Müslim \ 46).

36-Abdullah ibn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Məndən öncəki ümmətlərə göndərilən elə Peyğəmbər yoxdur ki, Ona ümmətindən havarilər, sünnətinə tabe olub əmrini yerinə yetirən əshabı olmasın. Sonra dediyinə əməl etməyən, əmr olunamamış şeyləri edən onlardan sonrakı nəsil gələr. Kim onlara qarşı əli ilə mücadilə etsə , o , mömindir, kim onlara qarşı dili ilə mücadilə etsə , o , mömindir, və kim onlara qarşı qəlbi ilə müçdilə etsə, o , mömindir. Bundan o yana xardal dənəsi kimi belə olsa iman yoxdur." Əbu Rafii belə demişdir: "Abdullah ibn Ömərə bu hədisi danışdıqda , mənə inkar etdiyində, İbn Məsud gəldi və Qanat vadisində endi. Abdullah ibn Ömər onu ziyarətə getdiyində, mənim də onunla getməyimi tələb etdi. Mən onunla getdim. Elə ki , oturduq , İbn Məsuddan bu hədisi soruşdum. O, mən ona danışdığım kimi eyni ilə danışdı." (Müslim\ 50).

## On Səkkizinci fəsil: Əlini sevən yalnız mömin, ona nifrət edən isə yalnız münafiq olan kəs olar.

37-Zir ibn Hubeyş (Allah ondan Razı olsun) Əli ibn Əbu Talibin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: "Toxumu yaran və insanı yaradan Allaha and olsun ki, ummi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə əhdi-peymanı budur: "Məni (Əlini) sevən yalnız mömin, mənə nifrət edən isə yalnız münafiq olan kəs olar." (Müslim\78).

## On doquzuncu fəsil: İmanın əlaməti Ənsarları sevmək, münafiqliyin əlaməti isə onlara nifrət etməkdir.

38-Adiy ibn Sabit , o da Baradan (Allah ondan Razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarlar barəsində belə dediyini rəvayət edir: "Onları yalnız mömin sevər. onlara yalnız münafiq nifrət edər. Kim onları sevsə , Allah onu sevər. Kim onlara nifrət etsə , Allah onlara nifrət edər." (Müslim \ 75).

## İyirminci fəsil: İmanın Mədinəyə çəkilməsi.

39-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən iman ilan dəliyinə çəkildiyi kimi Mədinəyə çəkiləcək." (Buxarı \ 1876, Müslim \147).

## İyirmi birinci fəsil: İman yəməndədir, hikmət yəməndədir.

40-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə demişdir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Yəmənlilər gəldi, onlar nazik könüllü və yumuşaq qəlbli insanlardır. İman yəməndədir, hikmət yəməndədir. Arxayınlıq (rahatlıq və mənəvi möhkəmlik) qoyun sahiblərindədir (əhlindədir , çobanlardadır). Fəxr, kibr (yekə xanalıq) isə günəşin doğduğu tərəfdə bağırtılı səsli dəvə sahiblərindədir." (Buxari \ 3301, Müslim \ 52).

41-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sərt qəlblilik və kobudluq şərqdə, İman isə hicaz əhlindədir." (Müslim \53).

## İyirmi ikinci fəsil: İman etməyənə saleh əməl etməsi fayda verməz.

42-Aişə (Allah ondan Razı olsun) Belə demişdir: Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruşdum: "Ey Allahın Elçisi , İbn Cudan Cahillikdə qohumluq əlaqələrini qırmaz, kasıbları yedirdərdi. Bu ona nəsə bir fayda verəcəkmi? O belə cavab verdi: "Xeyr. O bir gün olsun belə Rəbbim Qiyamət günü mənim günahlarımı bağışla deməyib." (Müslim \ 214).

## İyirmi üçüncü fəsil: İman gətirməyincə , Cənnətə daxil olan deyilsiniz.

43-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İman gətirməyincə , cənnətə daxil olan deyilsiniz. Bir–birinizi sevməyincə , iman gətirməyəcəksiniz. Sizə elə bir şey deyim ki, onu etsəniz bir–birinizi sevəsiniz? Öz aranızda Salamı yayın." (Müslim \ 54).

## İyirmi dördüncü fəsil: Zinakar zina etdiyi vaxt mömin olmaz.

44-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Zinakar zina etdiyi vaxt mömin olmaz (yəni imanı tam olmaz), və oğru oğurluq etdiyi vaxt mömin olmaz. Araq içən araq içdiyi vaxt mömin olmaz." Əbu Hüreyrə (Allah ondan razı olsun) bunlara belə əlavə edərdi: "Qəsibkar insanların gözü önündə şərəfli və qıymətli bir şeyı qəsb etdiyi vaxt mömin olmaz." Həmamın hədisində belə deyilir: "qəsibkar möminlərin gözü önündə qəsb etdiyi vaxt mömin olmaz." Və belə əlavə etdi: "Sizdən biriniz Qənimətə xəyanət (bölüşdürülmədən qənimətdən nəsə götürmək) etdiyi vaxt mömin olmaz. Diqqət edin, diqqət edin!" (Buxari \ 2475, Müslim 57).

## İyirmi beşinci fəsil: Mömin bir dəlikdən iki dəfə sancılmaz.

45-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mömin bir dəlikdən iki dəfə sancılmaz." (Buxari \ 6133, Müslim \ 2998).

## İyirmi altıncı fəsil: Vəsvəsə imandandır.

46-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə demişdir: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına səhabələrindən bir neçə insan

gəlib ondan belə soruşdular?: “Bizdən biri nəfsimizdə elə şeylər düşünürük ki, onu dilimzə gətirməyi əzəmətli bir (günah) şey sayırıq. O belə soruşdu: “Artıq düşünmüsünüz?” “Bəli” deyə cavab verdikdə , O belə dedi: “Açıq – aydın iman budur.” (Müslim \ 132).

## İyirmi yeddinci fəsil: Ən böyük günah Allaha şərik qoşmaqdır.

47- Abdurrahman ibn Əbi Bakradan, o da atasından (Allah ondan razı olsun) Belə dediyi rəvayət olunur: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında idik. Bizə: “Sizə ən böyük günahı deyimmi” deyə üç dəfə təkrar etdi: “Allaha şərik qoşmaq, valideyinin üzünə ağ olmaq və yalançı şahidlik (və ya yalan şöz demək). Rəvayətçi deyir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dirsəklənmişdi bunları dedikdən sonra qalxıb oturdu , bu sözü o qədər təkrarladı ki, biz , kaş ki o susaydı, dedik.” (Buxarı \ 2654, Müslim \ 87).

48- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Yeddi böyuk günahdan çəkinin! Səhabələr soruşdular: Ey Allahın Elçisi , onlar hansılardır? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: “Allaha şərik qoşmaq, sehr, haqsız yerə Allahın qanını haram buyurduğu insanı öldürmək, sələm yemək, yetimin malını yemək, qızğın döyüş meydanından qaçmaq, namuslu, iffətli və zinadan bixəbər mömin qadınlara böhtan atmaq.” (Buxarı \ 2766, Müslim \ 89).

## İyirmi səkkizinci fəsil: Məndən sonra dönüb bir birinin boynunu vuran kafirlərdən olmayın.

49- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Vay olsun sizin halınıza (və ya vayl (Cəhənnəmdə yer adı) olsun sizə) Məndən sonra dönüb bir birinin boynunu vuran kafirlərdən olmayın.” (Buxari \ 6166, Müslim \ 66).

## İyirmi doqquzuncu fəsil: Kim atasindan imtina edərsə o küfr edər.

50-Əbi Osman belə rəayət edir: “Ziyada nəsəb iddia olunduğu bir zamanda Əbu Bəkrə (Allah ondan razı olsun) ilə qarşılaşdım , belə dedim: “Siz nə edirsiniz? Sad ibn Abu Vaqqasın belə dediyini eşitmişəm: “Bu iki qulağım Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşidib: “kim islamda atası olduğu halda atası olmadığını bildiyi başqa birsini özunə ata iddia edərsə , Cənnət ona haram olar.” Əbu Bəkrə belə demişdir: “mən bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdim.” (Buxari \ 6766, Müslim \ 63).

## Otuzuncu fəsil: Kim bir qardaşına kafir desə.

51-Əbu Zər (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdiyini rəvayət edir: “Atasını kim olduqunu bildiyi halda atasından başqasının atası olduğunu iddia edən küfr etmiş olar. Və hər kim onun olmayan bir şeyi iddia edərsə bizdən deyil, qoy Cəhənnəmdə özunə oturacağı yeri hazırlasın. Və hər kim bir kişini kafir və ya Allahın düşməni adlandırsa, o kişi belə olmadığı halda, dediyi onun özünə qayıdar.” (Buxarı \ 3508, Müslim \ 61).

## Otuz birinci fəsil: Hansı günah daha böyükdür.

52-Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edmişdir: “Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdu: “Ey Allahın Elçisi , Allah qatında hansı günah daha böyükdür? O: “Səni yaratmış olan Allaha şərik qoşmağın” deyə cavab verdi. O yenə soruşdu: “Sonra hansı?” Peyğəmbər: “Səninlə bərabər yemək yeməyinə şərik olmağından qorxaraq övladını öldürməyin” deyə cavab verdi. O: “Sonra hansı” deyə soruşdu? Peyğəmbər: “Qonşunun zövcəsi ilə zina etməyin” deyə cavab verdi. Sonra Allah Təala bunun təsdiqini nazil etdi: “Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz, Allahın haram buyurduğu cana nahaq yerə qıymaz, zina etməzlər. Hər kəs bunu etsə, cəzasını çəkər.” (Buxari \ 4477, Müslim \86).

## Otuz ikinci fəsil: Allaha şərik qoşmayaraq ölən hər bir kəs Cənnətə daxil olar.

53-Cəbir ibn Abdullahdan (Allah onların hər ikisindən razı olsun) “Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə soruşdu: “Ey Allahın Elçisi , iki vacib olan şey hansıdır? O: “Allaha şərik qoşmayaraq ölən hər bir kəs Cənnətə daxil olar. Allaha şərik qoşaraq ölən hər bir kəs Cəhənnəmə daxil olar.” Deyə cavab verdi.” (Müslim \ 93).

54- Əbul əl-Əsvad Əddəyləyidən ona Əbu Zərin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim və O yatmışdı əynində ağ paltar var idi. Sonra yenə gəldim O hələ yatmışdı. Sonra yenə gəldiyimdə O artıq oyanmışdı. Onun yanında otyurdum mənə belə dedi: “Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur deyən və onun üzərin də ölən hər bir qul cənnətə girər. Mən belə soruşdum: “zina, oğurluq etsə belə?” O: “zina, oğurluq etsə belə” deyə cavab verdi. Mən beləcə üç dəfə soruşdum: “zina, oğurluq etsə belə?” O: “zina, oğurluq etsə belə” deyə cavab verdi. Dördüncü dəfə soruşduqda isə belə dedi “Abu Zərin burnu yerə dəysədə belə.” Sonra Əbu Zər “Abu Zərin burnu yerə dəysədə belə.” Deyə-deyə cıxdı (Buxari \1237, Müslim \ 94).

## Otuz üçüncü fəsil: Qəlbində zərrə qədər kibr olan cənnətə girməz.

55-Abdullah ibn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət etmişdir: “Qəlbində zərrə qədər kibr olan Cənnətə girməz. Bir kişi ondan soruşdu: “Bir kişi paltarının və ayaqqabısının gözəl olmasını istəyirsə necə? O: “Allah gözəldir, gözəl olanı sevər, kibr isə haqqı inkar etmək və insanları təhqir etməkdir.” (Müslim \ 91).

## Otuz dördüncü fəsil: Nəsəbə tənə etmək, ah–nalə, şivən qopardaraq ağlamağın küfr olması.

56- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “İnsanlarda küfr olan bu iki xislət var: “Nəsəbə tənə etmək və ah–nalə, şivən qopardaraq ölü üçün ağlamaq” (Müslim \ 91).

## Ozuz beşinci fəsil: udulduzların doğub–batmasına görə bizim üçün yaqış yağdı.

57- Zeyd ibn Xalid əl-Cuhani (Allah ondan Razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hüdeybiyyədə yağışlı bir gecənin ardından bizə subh namazını qıldırdı. Namaz qurtardıqdan sonra

insanlara tərəf dönərək belə soruşdu: “Rəbbinizin nə dediyini bilirsinizmi? Onlar: “Allah və Rəsulu bilər” deyə cabab verdilər. Peyğəmbər: “Allah Təala buyurdu: “Qullarımdan bəzisi mənə mömin, bəzisi isə kafir olaraq sabahladı. Kim Allahın lütfü və rəhmətinə görə bizim üçün yaqış yağdı deyibsə, O, mənə iman, ulduzlara isə küfr etdi. Və kim bu və ya bu udulduzun doğub–batmasına görə bizim üçün yaqış yağdı deyibsə , mənə küfr , ulduzlara isə iman etdi.” (Buxari \ 846, Müslim \ 71).

## Otuz aıtıncı fəsil: Qul ağasından qaçarsa küfr etmiş olar.

58- Şəbi Cərirdən (Allah ondan razı olsun) belə eşitdiyini rəvayət edir: “Sahiblərindən qaçan hər bir qul onlara geri qayıdana qədər küfr etmiş olar.” Mənsur belə demişdir: “And olsun Allaha ki, Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə rəvayət olunur, lakin məndən bu hədisin burada Bəsrədə rəvayət olunmasını istəmirəm.” (Müslim\68).

59- Cəbir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Qul ağasından qaçarsa , namazları qəbul olunmaz” (Müslim \ 70).

## Otuz yeddinci fəsil: Mənim dostlarım yalnız Allah və Saleh möminlərdir.

60- Amr ibn əl–Ass (Allah ondan razı olsun) belə demişdir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gizlində yox açıq aydın belə dediyini eşitdim: “Bilin ki, Atamın qohumları (yəni filankəs və filan kəs) mənim dostlarım (vəlilərim) deyil. Mənim dostlarım yalnız Allah və Saleh möminlərdir.” (Buxari \5990, Müslim \ 215).

## Otuz səkkizinci fəsil: Möminin əcri dünya və axirətdə verilir, kafirin isə əcrinin dunayada verilməsi tezləşdirilər.

61- Ənəs ibn Malik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təala möminin bir əcrini belə verməkdə zulm etməz. Əcrini dunyada verər və axirətdə də əvəzini ödüyər. Kafirin isə yaxşı əməllərinin əvəzinin əcrini bu dünyada verər, axirət dünyasına qovuşduqda isə ona əvəzi ödəniləcək əcri qalmaz.” (Müslim \ 2898)

## Otuz doqquzuncu fəsil: İslam nədir? Xislətinin bəyanı.

62- Talha ibn Ubeydullah (Allah ondan razı olsun) belə demişdir: “Nəcd əhlindən saçı daqınıq halda olan bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi. Biz onun səsinin mızıltısını eşidir lakin nə dediyini anlamrdıq. Elə ki, o, Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yaxınlaşdı onun İslam haqda soruşduğu anlaşıldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Gecə və gündüzün beş namazını qıl” deyə cavab verdi. O: “Mənim üzərimə başqa nə isə əməl etməm vacib deyilmi?” deyə soruşdu. Peyğəmbər ona: “Xeyr , yalnız nafilə qıldığın namazlar başqa. Ramazan ayında oruc tutman” deyə cavab veri. O yenə soruşdu: “Mənim üzərimə başqa nə isə əməl etməm vacib deyilmi?” Peyğəmbər ona: “Xeyr , yalnız nafilələrdən başqa” deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona zəkatı xatırlatdı. O yenə soruşdu: “Mənim üzərimə başqa nə isə əməl etməm vacib deyilmi?” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona:

“Xeyr , yalnız nafilələrdən başqa” deyə cavab verdi. Sonra kişi çevrililib getdiyində belə dedi: “And olsun Allaha buna nə artıracağam , nə də əsgildəcəyəm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: “Dediyinə sadiq qalsa , o , zəfərə çatar.” (Müslim \ 11). Başqa rəvayətdə: “dediyinə sadiq qalsa , atasının canı üçün o , zəfərə çatar. Və ya dediyinə sadiq qalsa , atasının canı üçün o , Cənnətə girər.”(Buxarai \ 46, Müslim \11).

## Qırxıncı fəsil: İslam beş dayaq üzərində qurulub.

63-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “İslam beş dayaq üzərində qurulub. Allahı ibadətdə fərdləşdirmək, Namaz qılmaq, Zəkat vermək, Ramazan ayında oruc tutmaq və Həcc etmək. Bir kişi İbn Ömərə belə dedi: “Həcc etmək və Ramazan ayında oruc tutmaq.” O: “Xeyr Ramazan ayında oruc tutmaq və Həcc etmək. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdim” deyə cavab verdi.” (Buxari\8 Müslim\16).

## Qırx birinci fəsil: İslamın hansı (əməli) daha xeyirlidir?

64-Abdullah ibn Amr (Allah onların hər ikisindən razı olsun) belə demişdir: “Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdu: “İslamın hansı (əməli) daha xeyirlidir? O: “Yemək yedizdirmək və tanıdığına və tanımadığına salam vermək ” deyə cavab verdi.” (Buxari \ 12 Müslim \39).

## Qirx ikinci fəil: İslam özünüdən əvvəlki əməllərin hökmünü silər. Həcc və hicrət etmənin də belə olması.

65- İbn Şuməmə əl–Məhri belə rəvayət edir: “Abr ibn əl-Ass ölüm ayağında olduğu ikən yanına gəldik. Uzun zaman ağladıqdan sonra üzünü divara tərəf çevirdi. Oğlu ona: “Ata can , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səni filan şeylə müjdələmədimi? Ata can , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səni filan şeylə müjdələmədimi?” deməyə başladı. O, üzünü çevirərək belə dedi: “Həqiqətən , hazırlamaqda olduğumuz ən fəzilətli şey Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və Muhəmmədin onun Elçisi olduğuna şəhadət etməkdir. Həqiqətən , mən üç hal üzərində olmuşam. Düşünürəm ki , o vaxt Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən çox nifrət edən olmayıb. Mənə imkan tapıb onu öldürməkdən sevimli bir iş olmayıb. Əgər o halda ölmüş olsaydım , cəhənnəm əhlindən olardım. Allah Təala İslamı qəlbimə saldıqda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib ona belə dedim: “Sağ əlini uzat sənə beyət edim” O əlini üzatdı. Mən əlimi sıxaraq dayandım. O mənə: “Ey Amr , sənə nə olub?” deyə soruşdu. Mən: “Şərt qoymaq istəyirəm” deyə cavab verdim. O: “Nə şərt?” deyə soruşdu? Mən: “Günahlarım bağışlansın” deyə cavab verdim. O: “Məgər İslamın özünüdən əvvəlki əməllərin hökmünü sildiyini , həccin özünüdən əvvəlki əməllərin hökmünü sildiyini və hicrətin özünüdən əvvəlki əməllərin hökmünü sildiyini bilmirsənmi?” deyə soruşdu. Mənə (o anda) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sevimli, gözümdə ondan daha hörmətli bir kəs qalmadı. Ona hörmətimdən , doyunca onun üzünə baxa bilmirdim. Bir kimsə məndən onu vəsf etməmi soruşsaydı , onu vəsf edə bilməzdim , çünki ona doyunca baxa bilməmişəm. Əgər o halda ölmüş olsaydım , cənnət əhlindən olmağımı ümid edərdim. Ondan sonra etdiyim şeylərə görə halımın necə olacağını bilmirəm.

Oldüyümdə arxamca od aparıb, ah-nalə çəkməyin. Məni dəfn etdiyinizdə üzərimə torpağı yaxşıca tökün, sonra qəbrimin ətrafında dəvənin kəsilib paylandığı müddət qədər durun ki, sizinlə ünsiyyətdə olum və Rəbbimin elçisini nə ilə qarşılayacağımı düşünüm.” (Müslim \ 121).

## Qırx üçüncü fəsil: İslamda yaxşı işlər görəndən sonra cahillikdə etdiyi əməllərə görə hesabat alınmaz.

66-Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə buyurur: “Bir neçə insan Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdu: “Ey Allahın Elçisi , cahillikdə etdiyimiz əməllərə görə hesabat verəcəyikmi? O: “Sizlərdən kim islamda yaxşı işlər görərsə , cahillikdə etdiyi əməllərə görə hesabat alınmaz, kim pis işlər görərsə , cahillikdə və islamda olduqda etdiyi əməllərə görə hesabat verər.” deyə cavab verdi” (Buxarı\6921, Müslim\120).

## Qırx dördüncü fəsil: Müsəlmanı söymək fasiqlik, öldürmək isə küfürdür.

67-Abdullah ibn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Müsəlmanı söymək fasiqlik, öldürmək isə küfürdür.” (Buxarı \ 48, Müslim \ 64).

## Qirx beşinci fəsil: Dininə (islama) gözəl bir şəkildə riayət edənə etdiyi hər bir əməlin savabı on qat mislində yazılar.

68-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təala buyurur: Əgər bəndəm yaxşı əməl etmək istəsə Mən ona bu əməli etməsə belə, bir savab yazaram, əgər O, bu əməli etsə , mən ona bu savabı on qat mislində yazaram. Əgər pis əməl etmək istəsə və bu əməli etməsə , Mən bağışlayıram, əgər O, bu əməli etsə , Mən ona bu əməlin mislində günah yazaram.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: “Mələklər dedi: “Ey Rəbb o bəndən bu pis əməli etmək istəyir (və o , bunun pis əməl olduğunu bilir).” Allat Təala buyurdu:”Ona nəzarət edin. O, bu əməli etsə , ona bu əməlin mislində günah yazın, əgər etməsə , əvəzinə ona savab yazın. Çünki o , bu əməli mənə görə tərk etdi.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Allahla qarşılaşana kimi dininə (islama) gözəl bir şəkildə riayət edənə , etdiyi hər bir əməlin savabı on qat mislindən yeddiyüz qat mislinə kimi yazılar və etdiyi hər bir pis əməlin günahı etdiyi günahın mislində yazılar.” (Buxari\42, Müslim\129).

69- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təala ümmətimə könlündən keçirdiyi şeyi, onu danışb və ya etməyincəyə qədər , onlara bu şeyi bağışlar.” (Buxarı \ 2528, Müslim \ 127).

## Qirx altıncı fəsil: Müsəlman başqa müsəllmaların ondan salamat olduqları kəsdir.

70-Abdullah Amr ibn əl-Ass (Allah ondan razı olsun) demişdir: “Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdu: “Hansı müsəlman daha xeyirlidir?” O: “Başqa müsəlmanların onun dilindən və əlindən salamat olandır” deyə cavab verdi. “ (Buxarı \ 10, Müslim \ 40).

## Qirx yeddinci fəsil: Cahillikdə yaxşılıq edəndən sonra islama girən haqda.

71-Urva ibn Zubeyr Həkim ibn Hizəmin ona Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini xəbər verir: "Ey Allahın Elçisi , cahillikdə sədəqə vermək, qul azad etmək, qohumluq əlaqəsi saxlamaq kimi etdiyim yaxşı əməllər haqda nə deyirsən, mənə ona görə savab varmı? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Etdiyin xeyir üzərinə islama girdin." deyə cavab verdi." (Buxarı \ 1436, Müslim \ 123).

## Qırx səkkizinci fəsil: Musibətlərlə imtahan olununacağından xəbardar etmək.

72- Hüzeyfə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında idik. Bizə: "Mənim üçün neçə nəfərin islamı tələffuz etdiyini sayın" buyurduqda, biz: "Ey Allahın Elçisi , bizim sayımız altı yüzlə yeddi yüz arası olduğu halda , bizim üçün qorxursan" deyə soruşduq? O: "Siz bilmirsiniz , bəlkə müsibətlərlə imtəhan olundunuz" deyə cavab verdi. Hüzeyfə belə buyurdu: "Elə müsibətlə imtəhan olunduq ki, bizdən olan bir kişi namazını belə gizlində qılırdı". (Buxarı\3060, Müslim\149).

## Qırx doqquzuncu fəsil: İslam qərib olaraq başladı və bir gün başladığı kimi qayıdacaq , o iki məscid arasına çəkiləcək.

73- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən İslam qərib olaraq başladı və bir gün başladığı kimi qərib olaraq qayıdacaq. O , ilan yuvasına çəkildiyi kimi iki məscid arasına çəkiləcək. (Müslim \ 147).

## Əllinci fəsil: Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəhyin necə başlaması.

74-Urva ibn əz–Zubeyr ona Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişənin (Allah ondan razı olsun) belə xəbər verdiyini rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ən birinci vəhyin başlaması, yatdığı zaman sadiq yuxu görməsi olub ki, oyandıqda gördüyü hər bir yuxu sübhün açıldığı kimi açıq-aşkar qarşısına çıxardı. Sonra ona tənhalığa çəkilmək sevdirildi. Hira mağarasında tənhalığa çəkilərək orada ailəsinə dönmədən bir neçə gecə ibadət edərdi. Bu məqsədlə yanına azuqə alardı. Sonra Xədicənin yanına qayıdaraq eyniylə bir neçə günlük azuqə götürərdi. Nəhayət bir gün Hira mağarasında ikən birdən ona Haqq gəldi. Onun yanına Mələk gələrək ona: "Oxu" deyərək əmr etdi. O "Mən oxuya bilmirəm" deyə , cavab verdi. Sonra belə dedi: "Məni qaldırıb taqətim kəsilənədək sıxdı, sonra məni buraxıb: "Oxu" deyə əmr etdi. Mən yenə: "Mən oxuya bilmirəm" dedikdə məni ikinci dəfə qaldırıb taqətim kəsilənədək sıxdı, sonra məni yerə buraxıb: "Oxu" deyə əmr etdi. Mən yenə də: "Mən oxuya bilmirəm" dedikdə məni üçüncü kəs qaldırıb taqətim kəsilənədək sıxdı , sonra məni yerə buraxıb dedi: "Yoxdan yaradan Rəbbinin adı ilə oxu. O İnsanı laxtalanmış qandan yaratdı. Oxu, sənin Rəbbin ən böyük kərəm sahibidir. O Rəbin ki, qələmlə öyrətdi. İnsana bilmədiklərini öyrətdi." (əl–Alaq 1-5). Qorxudan boynunun əti titrəyərək Xədicənin yanına gəldi. O: "Məni örtün, məni örtün" deyə təkrarlayırdı. Onu örtdülər. Qorxu ondan getdikdən sonra Xədicədən: "Ey Xədicə , mənə nə olur?" deyə soruşdu. Ona: "Nəfsim üçün qorxdum" deyə , başına gələni xəbər verdi. Xədicə ona: "Xeyr! Müjdə olsun sənə. And olsun Allaha ki, O səni heç vaxt alçaltmaz. And olsun Allaha ki, sən qohumluq əlaqəsi saxlayır, düz danışır, aciz

olanın ağırlığını yüklənir, kasıba, qazana bilməyənə qazandırır, qonağı yedizdirir və haqq olan hadisələrdə kömək edirsən.” Xədicə onu götürüb Varaqa ibn Nofəl ibn Əsəd ibn Abd əl-Uzzanın yanına apardı. O, Xədicənin əmisi oğlu, atasını qardaşı idi. Cahıllikdə Nəsraniliyi qəbul etmiş bir kişi idi, ərəbcə yaza bilirdi. İncili Allah istədiyi yerə qədər ərəbcə yazmışdı. Gözləri tutulmuş yaşlı insan idi. Xədicə Ona: “Ey əmi , qardaşın oğlunu bir dinlə” deyə müraciət etdi. O: “Qaraşım oğlu , nə görürsən?” deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona gördüyü şeyi xəbər verdikdə , Varaqa ona belə dedi: “Bu , İmran oğlu Musaya enən Namusdur. (Cəbrail qəsd edilir) Kaş ki, cavan olaydım, kaş ki qövmünün səni çıxardıqları (Qovduqları) zaman sağ olaydım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: “Məgər onlar məni çıxaracaqlar?” deyə soruşdu. Varaqa ona: “Bəli, sənin gətirdiyinlə gələn elə bir kəs yoxdur ki , onunla düşmənçilik edən olmasın. Sənin o günlərinə kimi qalsam , sənə var güclə kömək edərəm” deyə ona cavab verdi.” (Buxari\3, Müslim\160).

75- Yəhyanın belə dediyi rəvayət olunur: “Əbə Sələmədən belə soruşdum: “Qurandan ən birinci nazil olan hansıdır? O: “Ey bürünüb sarınan” deyə cavab verdi. Mən Onadan: “bəlkə “Oxu” deyə soruşdum? O belə cavab verdi: “Cabir ibn Abdullahdan (Allah onların hər ikisindən razı olsun) belə soruşdum: “Qurandan ən birinci nazil olan hansıdır? O: “Ey bürünüb sarınan” deyə cavab verdi. Mən ondan: “bəlkə “Oxu” deyə soruşdum? O belə cavab verdi: “Sizə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə danışdığını danışacağam. O belə buyurdu: “Hira mağarasında bir ay qaldım, bir ay tamam olduğunda , vadinin ortasına endim. Çağrıldığımı eşitdiyimdə, önümə və arxama, sağıma və soluma baxdım , heç kəsi görmədim, sonra yenə çağrıldım , yenə də heç kəsi görmədim. Sonra yenə çağrıldım , başımı qaldırdığımda Onu (yəni Cəbraili) havada , ərşin üzərində gördüm. Məni şiddətli titrəmə bürüdü. Xədicənin yanına gəlib , məni örtün , dedim. Məni örtüb , üzərimə su tökdülər. Allah Təala bu ayəni nazil etdı: “Ey bürünüb sarınan! Qalx qorxut! Öz Rəbbini uca tut! Libasını təmizlə! Pisliyi tərk et!” (Əl–Muddəssir 1-4). (Buxari \ 4924, Müslim \ 161).

## Əlli birinci fəsil: Vəhyin çox olması və ardıcıl enməsi.

76-Ənəs ibn Məlikin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: ”Allah Təala Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Vəhyi olümündən öncə öldüyü günə kimi ardıcıl olaraq endirdi. Vəhyin ən çox endiyi gün də, onun öldüyü gün idi.” (Müslim \ 3016).

## Əlli ikinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İsra olunması (göyə aparılması) və namazın vacib olması.

77-Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Mənə Buraq gətirildi, bu eşşəkdən hündür, qatırdan alçaq , addımını gözünün görə bildiyi son nöqtəyə qədər qoya bilən hündür ağ heyvandır. Onun tərkinə minərək Beytu əl-Məqdisə gəldim və onu Məndən əvəllki Peyğəmbərlərin bağladığı halqaya bağladım. Sonra məscidə girib orada iki rükət namaz qıldım. Sonra məsciddən çıxdığımda Cəbrail (Ona salam olsun) Mənə birində şərab, digərində süd olan iki qab gətirdi. Mən südü seçdim. Cəbrail mənə: “Fitrəti seçdin” dedi. Sonra biz səmaya qaldırıldıq. Cəbrail səmanın qapısını döydükdə , ondan ”kimsən?” deyə soruşuldu. O: “Cəbrailəm” deyə cavab verdi? Ondan: “yanındakı kimdir?” deyə soruşuldu. O: “Muhəmməddir” deyə cavab verdi? Ondan: “Onun ardınca göndərilib?” deyə soruşuldu. O: “Bəli göndərilib” deyə cavab verdikdə , bizə qapını açdılar. Birdən qarşımda Adəmi gördüm, məni salamlayıb , Allahdan mənim üçün

xeyir dilədi.  Sonra biz səmanın ikinci qatına qaldırıldıq. Cəbrail (ona salam olsun) səmanın qapısını döydükdə ondan ”Kimsən?” deyə soruşuldu. O: “Cəbrailəm” deyə cavab verdi. Ondan: “Yanındakı kimdir?” deyə soruşuldu. O: “Muhəmməddir” deyə cavab verdi. Ondan: “Onun ardınca göndərilib?” deyə soruşuldu? O: “Bəli göndərilib” deyə cavab verdikdə , bizə qapını açdılar. Birdən qarşımda xalam övladlarını: Məryəm oğlu İsa və Zəkəriyyə oğlu Yəhyanı (onların hər ikisinə Allahın salavatı olsun) gördüm. Məni salamlayıb , Allahdan mənim üşün xeyir dilədilər. Sonra biz səmanın üçüncü qatına qaldırıldıq. Cəbrail səmanın qapsını döydükdə ondan ”Kimsən?” deyə soruşuldu. O: “Cəbrailəm” deyə cavab verdi? Ondan: “Yanındakı kimdir?” deyə soruşuldu. O: “Muhəmməddir (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)” deyə cavab verdi? Ondan: “Onun ardınca göndərilib?” deyə soruşuldu. O: “Bəli göndərilib” deyə cavab verdikdə , bizə qapını açdılar. Birdən özümü Yusifin (ona Allahın salamı olsun) qarşısında dayanmış bildim, ona gözəlliyin yarısı verilmişdi. O, məni salamlayıb , Allahdan mənim üçün xeyir dilədi. Sonra biz səmanın dördüncü qatına qaldırıldıq. Cəbrail səmanın qapsını döydükdə ondan ”Kimsən?” deyə soruşuldu. O: “Cəbrailəm” deyə cavab verdi? Ondan: “Yanındakı kimdir?” deyə soruşuldu. O: “Muhəmməddir (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)” deyə cavab verdi? Ondan: “Onun ardınca göndərilib?” deyə soruşuldu. O: “Bəli göndərilib” deyə cavab verdikdə , bizə qapını açdılar. Birdən özümü İdrisin (ona Allahın salamı olsun) qarşısında dayanmış bildim. O, məni salamlayıb , Allahdan mənim üçün xeyir dilədi. Allah Təala Buyurur: “Biz onu yüksək bir məqama qaldırdıq”. Sonra biz səmanın beşinci qatına qaldırıldıq. Cəbrail səmanın qapısını döydükdə ondan ”Kimsən?” deyə soruşuldu. O: “Cəbrailəm” deyə cavab verdi. Ondan: “Yanındakı kimdir?” deyə soruşuldu? O: “Muhəmməddir (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)” deyə cavab verdi? Ondan: “Onun ardınca göndərilib?” deyə soruşuldu. O: “Bəli göndərilib” deyə cavab verdikdə , bizə qapını açdılar. Birdən qarşımda Harunu (ona Allahın salamı olsun) gördüm, məni salamlayıb , Allahdan mənim üçün xeyir dilədi. Sonra biz səmanin altıncı qatına qaldırıldıq. Cəbrail səmanın qapsını döydükdə ondan ”Kimsən?” deyə soruşuldu. O: “Cəbrailəm” deyə cavab verdi. Ondan: “Yanındakı kimdir?” deyə soruşuldu. O: “Muhəmməddir (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)” deyə cavab verdi? Ondan: “Onun ardınca göndərilib?” deyə soruşuldu. O: “Bəli göndərilib” deyə cavab verdikdə , bizə qapını açdılar. Birdən qarşımda Musanı (ona Allahın salamı olsun) gördüm, məni salamlayıb , Allahdan mənim üçün xeyir dilədi. Sonra biz səmanın yeddinci qatına qaldırıldıq. Cəbrail səmanın qapısını döydükdə ondan ”Kimsən?” deyə soruşuldu. O: Cəbrailəm” deyə cavab verdi? Ondan: “Yanındakı kimdir?” deyə soruşuldu? O: “Mühəmməddir (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)” deyə cavab verdi. Ondan: “Onun ardınca göndərilib?” deyə soruşuldu. O: “Bəli göndərilib” deyə cavab verdikdə , bizə qapını açdılar. Birdən özümü kurəyini Beyt əl-Məmura söykənmiş halda dayanmış İbrahimin (ona Allahın salamı olsun) qarşısında bildim. Ora Hər gün yetmiş min mələk girir, və (ora girən mələklər ) bir daha ora gayıtmırlar.  Sonra məni Sidratul Muntahaya apardılar. Birdən onun yarpaqları fil qulağı kimi, meyvəsi böyuk küp qablar kimi olduğunu gördüm. Onu Allah Təalanın əmrindən nə bürümüşdüsə də, dəyişmişdi, Allah Təalanın xəlq etdiyi heç bir məxluq onun gözəlliyini vəsf edə bilməzdi. Sonra Allah Təala mənə  bir çox şey vəhy etdi, və mənə gecə və gündüz  əlli namaz fərz etdi.  Musanın (ona Allahın salamı olsun) yanına qayıtddım. O məndən: “Rəbbin sənə ümmətin üçün nə fərz etdi” deyə soruşdu. Mən:”Gecə və gündüz əlli namaz qılmağı” deyə cavab verdikdə, mənə: “Rəbbinin yanına qayıt və ümmətin üçün azaltmasını istə, çünki ümmətin bunu etməyə qadir deyil, mən Bəni İsraili sınaqdan keçirdim , onları imtəhan etdim”:

deyə buyurdu. Rəbbimin yanına qayıdıb ona: “Ey Rəbbim ümmətim üçün azalt” deyə dilədim. Mənə beşini azaltdı. Sonra Musanın (Ona Allahın salamı olsun) yanına gələrək : “Mənə beşini azatdı” deyə xəbər verdim. O: “Ümmətin buna qadir deyil, Rəbbinə dön ondan ümmətin üçün azaltmasını dilə” deyə buyurdu. Rəbbim ilə Musa arasında o qədər gedib gəldim ki , nəhayət , Rəbbim mənə: “Ey Muhəmməd , gecə və gündüz beş namaz, hər namaz on namaz mislində , beləcə əlli namaz olar, kim bir yaxşılıq etməyə niyətlənsə , onu etməsə belə , ona bir savab, etsə isə , on savab var, və kim bir pis şey etməyə niyətlənsə , onu etmədikcə , ona heç bir günah yazılmaz, yox əgər etsə , ona bir günah yazılar” deyə buyurdu. Mən Musanın (Ona Allahın salamı olsun) yanına qayıdıb bunu xəbər verdikdə mənə: “Rəbbinin yanına dön ondan ümmətin üçün azaltmasını dilə” deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Mən Rəbbimin yanına o qədər qayıtdım ki, artıq ondan utandım” deyə cavab verdi. (Buxari / 7517, Müslim / 162).

## Əlli üçüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başqa Peyğəmbərləri (Onlara Allahın salamı olsun) xatırlaması.

78- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: ”Peyğəmbər ilə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yola çıxmışdıq, Məkkə və Mədinə arasında olan bir vadinin yanından keçdikdə belə soruşdu: “Bu hansı vadidir?” Onlar : “ əl-Əzraq” (göy vadi) deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Sanki Musanı (Mənə onun rəngi və saçından Davudun hifz etmədiyi şeyi söylədi) barmağını qulağına qoymuş halda , uca səslə Allahı təlbiyə edərək vadini keçdiyini görürəm.” Sonra yolmuza davam edib bir dağa çatdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizdən: “Bu hansı dağdır?” deyə soruşdu. Onlar: “Hərşə və yaxud ləft dağı” deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Sanki Yunusu əynində yundan olan yapıncıda, yüyəni lifdən olan qırmızı dişi dəvənin üstündə bu vadini keçən görürəm”. (Buxari / 3355, Müslim 166).

79- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Meraca qaldırıldığım zaman Musa ilə qarşılaşdım.- Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu belə vəsf elədi – zənnimcə belə dedi - O uca boy , başı düz saçlı bir kişi idi, sanki Şanua qəbiləsindən bir kişi idi. İsa ilə qarşılaşdım - Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu belə vəsf elədi - O orta boylu , sanki hamamdan çıxmış kimi qırmızı bir kişi idi. Sonra İbrahimi də (Ona Allahın salamı olsun) gördüm. Övladlarından ona ən çox bənzəyəni mənəm. Sonra iki qabın yanına gəldim, birində sud o birində isə şərab vardı. Mənə onlardan birini seçməyim buyuruldu. Mən südü seçdim və içdim. Mənə belə buyuruldu: “sən fitrətə hidayət olundun (və ya fitrətə müvəffəq olundun) əgər şərabı seçsəydin ümmətini düz yoldan azdırmış olardın”. (Buxari/ 3437, Müslim/ 168)

## Əlli dördüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məsihi (İsani ona Allahın salamı olsun) və Dəccalı xatırlaması.

80- Abdullah ibn Ömərin (Allah onların hər iki sindən razı olsun) belə dediyi rəvayət olunur: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlar arasında olduğu bir gün Məsih əd-Dəccalı xatırladı və belə buyurdu: “Allah Təala tək göz deyildir. Həqiqətən , bilin və agah olun ki, Məsih əd-Dəccal sağ gözü

kor bir kəsdir. Sanki gözü batmış üzüm dənəsidir.“ Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Özümü bir gecə yuxuda Kəbənin yanında gördüm. Birdən qarayanız bir kişi gördüm. Sanki qarayanızların içində ən gözəl olanı o idi. Saçı düz, teli çiyinləri arasına çatır, başından su damcılayırdı. Əllərini iki kişinin çiyinlərinə qoymuşdu. Onların arasında Kəbəni tavaf edirdi. “Bu kimdir?” deyə soruşdum. “Məryəm oğlu Məsih“ deyə cavab verdilər. Birdən arxasında çox qıvrımsaçlı, sağ gözü kor olan bir kişini gördüm.  İnsanlardan ona ən çox bənzəyəni İbn Qatnı görmüşdüm. O əlini iki kişinin çiyninə qoymuş halda Kəbəni tavaf edirdi. “Bu kimdir?” deyə soruşdum. “Məsih əd-Dəccal” deyə cavab verdilər”. (Buxari/ 3439, Müslim/169).

## Əlli beşinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) baçqa Peyğəmbərlərə Namaz qıldırması.

81-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyi rəvayət edir: “Özümü Hicrdə gördüm, Qureyş məndən Meraca qaldırılmağım barəsində soruşurdu. Məndən Qüds evi haqda təsdiqləmədiyim şeyləri soruşurdular. Elə bir sıxıntı keçirdim ki, bu günə qədər belə sıxıntı keçirməmişdim. Allah Təala mənim üçün onu (Qüdsü) açdı və mən ona baxırdım. Bundan sonra nə soruşdularsa, onların hər bir sualına cavab verdim. Özümü bir dəstə Peyğəmbərlərin içində gördüm. Musa (Ona allahın salamı olsun) dayanıb namaz qılırdı. Uca boy qıvrımsaç idi. Sanki Bəni Şanua qəbiləsindən olan bir kişi idi. Sonra Məryəm oğlu İsanın dayanıb namaz qıldığını gördüm. İnsanlardan ona ən çox bənzəyən Urva ibn Məsud Əs-Səqafidir. Sonra İbrahimi (Ona Allahın salamı olsun) dayanıb namaz qılan gördüm. İnsanlardan ona ən çox bənzəyən sizin Peyğənbərinizdi (yəni ozünü nəzərdə tutur). Namaz vaxtı gəlib çatdı. Onlara imamlıq etdim, elə ki, namazı qurtardım , kimsə mənə belə dedi: “Ey Muhəmməd , bu Cəhənnəmin sahibi Məlikdir, onu salamla. Mən ona tərəf döndükdə , O məni salamladı.” (Müslim/172).\\

## Əlli altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sidratül Muntahaya çatdırılması.

82- Abdullah ibn Məsudun (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Meraca qaldırıldıqda , onu Sidratul Müntaha deyilən yerə çatdırdılar. Ora səmanın altıncı qatındadır. Yerdən ucalan hər bir şey ora çatır və ordan qəbul olunur. Yuxarıdan nazil olan nə varsa ora enər və ordan qəbul olar. O bu ayəni oxudu: “O zaman Sidrəni nələr bürümüşdü, nələr” (Ən- Nəcm/16). Sonra belə dedi: qızıldan kəpənək. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üç şey verildi: “Beş namaz, əl-Bəqərə surəsinin son ayələri, Umətində Allaha heç bir şeyi şərik qoşmayanların böyük günahlarının bağışlanması”. (Müslim/ 173)

## Əlli yeddinci fəsil: Allah Təala buyurur: “İki yay uzunluğunda, bəlkə, ondan da yaxın oldu.”

83-Şeybəni belə rəvayət edir: “Zirr ibn Hubeyşdən Allah Təalanın bu ayəsi haqda soruşdum: “iki yay uzunluğunda, bəlkə, ondan da yaxın oldu.” (Ən-Nəcm/9). O belə cavab verdi: “Mənə Abdullah ibn Məsud belə rəvayət etdi: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cəbraili gördüyündə onun altımış min qanadı vardı”. (Buxari/3232, Müslim/ 174).

84-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə buyurur: “Qəlb gördüyünü yalan saymadı. Siz onunla gördüyü barəsində mübahisəmi edirsiniz? And olsun ki, görmüşdü.” (ən-Nəcm 11-13). O, qəlbi ilə iki dəfə görmüşdür”. (Müslim/176).

## Əlli səkkizinci fəsil : Allah Təalanı görmək haqda.

85-Masruq belə rəvayət edir: “Aişənin (Allah ondan razı olsun) yanında idim, mənə belə dedi: “Ey Əbu Aişə üç şey vardır ki, olardan birini kim söylərsə, Allah Təalaya böyük bir böhtan etmiş olar. Ondan “O hansı üç şeydir?” deyə soruşdum. O belə cavab verdi: “Muhəmmədin Rəbbini gördüyünü iddia edən kəs artıq Allaha böyük bir böhtan atmış olar”. Mən söykənmişdim, qalxıb oturdum. Ona: “Ey möminlərin anası , mənə imkan ver tələsmə, məgər Allah Təala belə buyurmur: “And olsun ki, onu açıq üfüqdə gördü” (ət-Təkvir/23), “And olsun ki, başqa bir dəfə də görmüşdü” (ən-Nəcm/13). Aişə (Allah ondan razı olsun) mənə belə cavab verdi: “Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu ümmətdən bu haqda soruşan ən birincisi mənəm. O mənə belə cavab verdi: “Həqiqətən O , Cəbraildir. Onu xəlq olunduğü şəklində bu iki dəfədən başqa vaxtda görməmişəm. Onu səmadan enərkən gördüm, əzəmətli varlılığı ilə yerlə səmanı örtmüşdü.” Sonra mənə belə buyurdu: “Məgər Allah Təalanın belə buyurduğunu eşitməmisən: “Gözlər Onu dərk etməz. O, gözləri dərk edər. O, Lətifdir Xəbərdardır!” (Ənam/103), Məgər Allah Təalanın belə buyurduğunu eşitməmisən: “Allah bəşər övladı ilə ancaq vəhylə, yaxud pərdə arxasından danışar Və ya bir Elçi göndərər ki, o da Allahın izni ilə Onun istədiyini vəhy edər. Həqiqətən, O Ucadır, Hikmət Sahibidir!” (əş-Şura/51). Sonra O belə dedi: “Muhəmmədin Allahın kitabından bir şey gizlətdiyini iddia edən kəs artıq Allaha böyük bir böhtan atmış olar. Allah Təala buyurur: “Ya Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil ediləni təbliğ et. Əgər etməsən, risalətini yerinə yetirmiş olmazsan. Allah səni insanlardan qoruyacaq. Həqiqətən, Allah kafir camaatı düz yola yönəltməz” (əl-Məidə/67). Sonra belə dedi: “Və onun sabah nə baş verəcəyini xəbər verə bilməsini iddia edən kəs artıq Allaha böyük bir böhtan atmış olar. Allah Təala buyurur: “De! Allahdan başqa göylərdə və yerdə olan heç kəs qeybi bilməz!”.(ən-Nəml). Davud bunu əlavə etdi: “O belə dedi: “Əgər Muhəmməd nazil olan bir şeyi gizlətmiş olsaydı onda bu ayəni gizlədərdi: “Xatırla ki, bir zaman Allahın nemət verdiyi və sənin özünün nemət verdiyi şəxsə: “Zövcəni saxla, Allahdan qorx!” – deyir, Allahın aşkar etdiyi şeyi ürəyində gizli saxlayır və adamlardan qorxurdun. Halbuki əslində sənin qorxmalı olduğuna ən çox layiq Allahdır.” (əl-Əhzab). (Buxari/4855,Müslim/177).

86-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə beş kəlimə ilə belə xitab etdi: “Allah Təala yatmır, və ona yatmaq yaraşmaz, tərəzini endirir və qaldırır, gecənin əməli gündüzün əməlindən öncə qaldırılar, gündüzün əməli ona gecənin əməlindən öncə qaldırılar, Hicabı nurdur (bir rəvayətdə oddur), əgər onu açsa üzünnün nuru gözünün ğördüyü bütün məxluqatı yandırar”.(Buxari/179).

87-Əbu Hüreyrənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: “Bir dəstə insan Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdu: “Ey Allahın Elçisi Rəbbimizi qiyamət günü görəcəyik?“ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə cavab verdi: “Siz bədir gecəsi açıq aydın görünən bir ayı görmək üçün bir- birinizə əziyyət edirsiniz?” Onlar: “Xeyr , ey Allahın Elçisi” deyə cavab verdilər. O yenə soruşdu: “Siz buludsuz bir gündə günəşi görmək üçün bir-birinizə əziyyət edirsiniz?” Onlar: “Xeyr , ey Allahın Elçisi” deyə cavab verdikdə O belə buyurdu: “Həmçinin Onu da beləcə görəcəksiniz”. Allah Təala insanları qiyamət günü yığacaq və onlara belə deyəcək: “Kim nəyə ibadət edirdisə , onun ardınca getsin!

Və  kim günəşə ibadət edirdisə günəşin, kim aya ibadət edirdisə ayın, kim tağutlara ibadət edirdisə tağutların ardınca gedəcək. Yalnız bu ümmət və münafiqlər qalacaq. Sonra Allah Təala onların yanına onların Onu tanımadığları bir şəkildə gələcək və belə deyəcək: "Mən sizin Rəbbinizəm". Onlar deyəcəklər: "Səndən Allaha sığınırıq, Rəbbimiz gələnədək bizim yerimiz buradır, O gəlsə biz onu tanıyacayıq. Sonra Allah Təala onların yanına onların onu tanıdığı sımada gələcək və belə deyəcək: "Mən sizin Rəbbinizəm" Onlar: "Sən bizim Rəbbimizsən" deyərək onun Ardınca gedəcəklər. Və Cəhənnəmin üzərində Sirat körpüsü salınacaq. Və ilk keçən mən və ümmətim  olacaq. O gün yalnız peyğəmbərlər danışacaq. Peyğəmbərlər o gün bu duanı edəcək: "Allahım salamat et, salamat et". Cəhənnəmdə Sədan tikanı kimi qarmaqlar var. "Sədanı görmüsünüzmü?" deyə onlardan soruşdu. Onlar: "bəli , ey Allahın Elçisi" deyə cavab verdikdə O belə buyurdu: "Bəli Sədan tikanı kimi. Yalnız onun əzəmətliliyini yalnız Allah bilir, insanları əməllərinə görə caynağına alacaq. Onlardan bəziləri əməlinə görə qurtulacaq, bəziləri isə xilas olana kimi cəzasını çəkəcək. Elə ki, Allah Təala insanlar arasında hökm verib qurtaracaq, öz rəhməti ilə Cəhənnəm əhlindən kimi istəsə çıxaracaq. Mələklərə rəhm etmək istədiyi, Allaha  heç bir şeyi şərik qoşmayan kəsləri çıxarmalarını əmr edəcək. Onlar: "Allahdan başqa ibadətə layiq ilah yoxdur" deyənlərdir. Onları cəhənnəmdə tanıyacaqlar. Onları səcdə yerlərindən tanıyacaqlar. Cəhənnəm Adəm övladının səcdə yerindən başqa hər bir əzasını yeyəcək (yandıracaq). Yanıb kül olmuş halda cəhənnəmdən çıxarılacaqlar. Onların üzərinə həyat suyu tökəcəklər. Yabanı otun selin suyunda bitdiyi kimi bitəcəklər. Sonra Allah Təala insanlar arasında hökm verib qurtaracaq. Üzü Cəhənnəmə dönmüş bir kişi qalacaq. O Cənnətə daxil olan ən sonuncu kəs olacaq. O: "Ey Rəbbim mənim üzümü cəhənnəmdən uzaq et onun iyi məni zəhərləyir, həlak edir, alovu isə yandırır" deyə Allaha Allah istədiyi qədər dua etdi. Allah Təala buyurdu: "İstədiyini etsəm məndən başqa heç bir şey istəməyəcəksən? O: "Xeyr başqasını istəməyəcəyəm" deyə cavab verdi. Rəbbi ona Allahın istədiyi qədər əhd–peyman verib onun üzünü cəhənnəmdən çevirəcək. Elə ki, üzü Cənnətə çevrildi, onu gördükdə Allahın istədiyi qədər sakit qaldıqdan sonra belə dedi: "Ey Rəbbim məni Cənnətin qapsına yaxınlaşdır". Allah Təala ona deyəcək  məgər sənə əhd-peyman etmədim ki, sənə istədiyini verərsəm məndən başqa heç nə istəməyəcəksən. Vay olsun sənin halına Adəm oğlu sən nə qədər də bivəfasan (qəddarsan). O: "Düzdü Rəbbim" deyərək dua etdi. Nəhayət ona: "İstədiyini etsəm məndən başqa heç bir şey istəməyəcəksən? deyə ondan soruşduqda O: "Xeyr izzət və cəlalına and olsun ki, başqasını istəməyəcəyəm" deyə cavab verdi. Ona Allahın istədiyi qədər əhd-peyman verildikdən sonra Cənnətin qapsına yaxınlaşdırdılar. Cənnətin qapsının qabağında dayandıqda Cənnət ona açılacaq və o orda olan xeyir və sevinci görəcək. Allahın istədiyi qədər susduqdan sonra belə deyəcək: "Ey Rəbbim məni Cənnətə sal. Allah Təala ona deyəcək  məgər sənə əhd-peyman etmədim ki, sənə istədiyini versəm məndən başqa heç nə istəməyəcəksən. Vay olsun sənin halına Adəm oğlu sən nə qədər də bivəfasan (qəddarsan). O: "Ey Rəbb Məxluqlarının ən bədbəxti mən olmayım" deyə o qədər dua edəcək ki, nəhayət ona Allah Təala onun bu sözlərinə güləcək. Allah Təala güldükdən sonra isə ona belə buyuracaq: "Gir Cənnətə". O Cənnətə girdikdən sonra Allah Təala ona belə deyəcək: "Dilə (arzula, istə)" və Allahdan diləyək istəyəcək, Allah Təala ona bunu və bunuda dilə deyə xatırladacaq. Elə ki, dilədiyi hər şey qurtaracaq Allah Təala ona belə buyuracaq: "Dilədiyin və onun mislində verirəm" Ata ibn Yezid belə  buyurur: "Əbu Səid əl-Xudri Əbu Hüreyrə ilə rəvayət etdiyi hədisdən heç bir şey rədd etmədi , hətta Əbu Hüreyrənin hədisin bu ləfzinə kimi: "Allah İzzət və Cəlalət sahibi  kişiyə belə dedi: "Dilədiyin və onun mislində verirəm". Bu zaman Əbu Səid Əl-Xudri belə dedi "Onun on mislildə" Əbu Hüreyrə ona: "Mən yalnız onun belə dediyini "sənə dilədiyin və onun mislində verirəm"

əzbərləmişəm. Əbu Səid Əl-Xudri ona belə cavab verdi: “şəhadət edirəm ki, “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini: “sənə dilədiyin və onun on mislində verirəm” əzbərləmişəm. Əbu Hüreyrə belə buyurdu : “Cənnətə ən son girən o kişi olacaq” (Buxari/ 806. Müslim/182).

Əlli doqquzuncu fəsil: Tovhid əhli olan kimsələrin Cəhənnəmdən çıxarılması.

88-Əbu Səid Əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Amma Cəhənnəm əhli olub, əbədiyyən Cəhənnəmdə qalan kimsələr orada nə yaşayıb nə də öləcəklər. Lakin sizlərdən olan insanlar, bəzilərinə günahlarna (və yaxud xəta etdiklərinə) görə Cəhənnəm atəşi toxunsa Allah Təala onları öldürəcək, elə ki yanıb (közə) gömürə dönəcəklər, şəfaət etməyə izn veriləcək onları dəstə-dəstə gətirib Cənnətin çaylarına səpələyəcəklər. Sonra belə deyiləcək: “Ey Cənnət əhli onların üzərinə səpin, və onlar yabanı otun selin suyunda bitdiyi kimi bitəcəklər. Orada olan kişilərdən biri belə dedi: “Sanki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çöldə (səhrada) olub (yaşayıb)”. (Müslim/185).

89-Ənəs , o da İbn Abbasdan (Allah onlardan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Cənnətə ən son girən insan bəzən gedir, bəzən üzü üstə düşür, bəzən də od onu yandırır. Elə ki, Cəhənnəmdən uzaqlaşdı, ona tərəf çevrilib belə dedi: “Məni səndən qurtaran Allah necə ucadır, Allah Təala mənə , məndən əvvəlki və axırıncılara vermədiyi bir şey vermişdir.” Ona bir ağac göstəriləcək, O: “Ey Rəbbim , məni o ağaca yaxınlaşdır ki, onun kölgəsində kölgələnim, onun suyundan içim” deyə Allaha dua edəcək. Allah Təala ona belə buyuracaq: “Ey Adəm övladı , yəqin ki, sənə onu versəm , məndən başqa bir şeylər də diləyəcəksən. O: “Xeyr , ey Pəbbim” deyə cavab verdikdə, ondan başqa heç bir şey istəməyəcəyinə əhd–peyman alınacaq və Allah Təala onu üzürlü sayacaq, çünki O , ona səbr etməsi mümkün olmayan bir şeyi görürdü. Onu ağaca yaxınlaşdıracaq, o , onun kölgəsində kölgələnib, suyundan içəcək. Sonra ona əvvəlkindən də gözəl bir ağac göstəriləcək. O: “Ey Rəbbim , məni o ağaca yaxınlaşdır ki, onun suyundan içim və onun kölgəsində kölgələnim, bundan başqa səndən heç bir şey diləmirəm” deyə Allaha dua edəcək. Allah Təala ona belə buyuracaq: “Məgər səndən əhd-peyman almadım ki, məndən başqa heç nə diləməyəcəksən. O: “Bəli , ya Rəbb , daha heç nə diləməyəcəm” deyə cavab verdikdə, Allah Təala ona belə deyəcək: “Yəqin ki, sənə onu versəm , başqa şeylər də diləyəcəksən?” Və Allah Təala onu üzürlü sayacaq, çünki O , ona səbr etməsi mümkün olmayan bir şeyi görürdü. Onu ağaca yaxınlaşdıracaq, o ,onun kölgəsində kölgələnib, suyundan içəcək. Sonra ona Cənnətin qapsının yanında bir ağac göstəriləcək. O , əvvəlki ağaclardan dahada gözəl idi. O: “Ey Rəbbim , məni o ağaca yaxınlaşdır ki, onun suyundan içim və onun kölgəsində kölgələnim, bundan başqa səndən heç bir şey diləmirəm” deyə Allaha dua edəcək. Allah Təala ona belə buyuracaq: “Məgər səndən əhd-peyman almadım ki, məndən başqa heç nə diləməyəcəksən.” O: “Bəli , ya Rəbb , daha heç nə diləməyəcəm” deyə cavab verəcək. Allah Təala onu üzürlü sayacaq, çünki O , ona səbr etməsi mümkün olmayan bir şeyi görürdü. Ona yaxınlaşdırıldıqda , Cənnət əhlinin səslərini eşidəcək və deyəcək: “Ey Rəbbim , məni ora daxil et.” Allah Təala ondan: “Ey Adəm oğlu , məni sənin məndən istədiklərini nə kəsər, isəyirsənsə sənə dünya və onun mislində olanı verim? Deyə soruşduqda, O ona belə cavab verəcək: “Ey Rəbbim , sən aləmlərin Rəbbisən , mənə istehza edirsən”. İbn Məsud güldü, üzünü ətrafındakılara tutub: “Məgər mənim nəyə güldüyümü soruşmayacaqsınız?” deyə soruşdu . Onlar: “Nəyə gülürsən?” deyə soruşdular. O belə buyurdu: “Peyğəmbər də (ona, ailəsinə

və səhabələrinə Allahın salavatı və salamı olsun) belə güldüyündə ondan nəyə güldüyünü soruşdular. O: "Aləmlərin Rəbbinin gülüşünə, ona belə dedikdə: "Sən aləmlərin Rəbbisən mənə istehza edirsən" Allah Təala ona deyəcək: "Mən sənə istehza etmirəm, lakin Mən istədiyim hər şeyə qadirəm".(Müslim/187)

90-Əbu Zubeyr belə rəvayət edir: Cəbir ibn Abdullahdan qiyamət günü toplanış haqda soruşulduqda , belə dediyini eşitdim: "Qiyamət günü biz bu və bu tərəflərdən gələcəyik. Bax (yəni bu insanların üzərindədir). Ümmətlər öz bütləri və ibadət etdikləri ilə öncəkilərdən başlayaraq bir-birinin ardınca çağırılacaqlar. Ondan sonra Rəbbimiz gələcək və belə soruşacaq: "Kimi gözləyirsiniz"? Onlar: "Rəbbimizi" deyə cavab verdikdə , O , onlara belə deyəcək: "Mən sizin Rəbbinizəm". Onlar: "Sənə baxmayınca , xeyr" Onda O , gülərək onlara görünəcək və onları ardınca aparacaq. Onlar mömin və ya münafiq olsa belə hər birinə nur veriləcək və onlar Ona tabe olaraq Onun ardınca gedəcəklər. Cəhənnəm körpüsünün üzərində qarmaqlar və iynə kimi tikanlar var. O tikanlar Allahın istədiyi kimsələri tutacaq. Sonra münafiqlərin nuru sönəcək və möminlər nicat tapacaqlar. Ən birinci nicat tapan toplunun üzləri ayın bədir gecəsi olduğu kimi olacaq. Yetmiş min nəfərə sorğu-sual olunmaz. Onlardan sonrakılar səmadakı ulduzun parıltısı kimi olacaq. Sonra gələnlər də həmçinin. Sonra şəfaətə izn veriləcək. Cəhənnəmdən qəlbində buğda dənəsi qədər xeyr olan , Allahdan başqa İbadətə layiq ilah olmadığına şəhadət verən kimsə çıxanadək şəfaət olunacaq. Onu cənnətin içinə salacaqlar və Cənnət əhli onun üzərinə su səpəcək. O selin axarında bitən ot kimi bitəcək və yanmış yaraları sağalacaq. Sonra ona dünya və onun on mislində verilənə qədər diləyib istəyəcək". (Buxari/6558, Müslim/191).

91-Yezid ibn əl-Fəqir belə rəvayət edir: "Xəvariclənin fikirlərindən bir fikir qəlbinə girmişdi. Bir neçə nəfərlik bir dəstə ilə həccə çıxdıq. Həcc edib sonra insanlara qarşı çıxmağı düşünürdük. Mədinə şəhərinə gəldik. Cabir ibn Abdullah bir dirəyə söykənib insanlara Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədis danışırdı. Birdən Cəhənnəmlik olanları xatırlatdı. Mən Ona belə dedim: "Ey Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabəsi sən nə danışırsan? Məgər Allah Təala belə buyurmur: " Ey Rəbbimiz! Sən cəhənnəm oduna atdığın şəxsi, əlbəttə, rüsvay edərsən və zalımlara kömək edən olmaz!" (Əl-İmran/192) və "Onlar hər dəfə oddan çıxmaq istədikdə yenə ora qaytarılacaq" (Əs-Səcdə). Bəs sənin danışdıqların nədir!?" O məndən: "Sən quran oxuyursan?" deyə soruşdu. Mən: "Bəli" deyə cavab verdikdə , O məndən yenə soruşdu: "Muhəmmədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məqamı (yəni Allah Təalanın onu qiyamət günü dirildəcəyi yer) haqda eşitmisən?" Mən: "Bəli" deyə cavab verdikdə , O mənə belə dedi: "Muhəmmədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mahmud məqamıdır ki, Allah Təala ona görə istədiyi kimsələri (Cəhənnəmdən) çıxaracaq. Sonra Sirat körpüsünün qoyulmasından. Və insanların onun üzərindən keçməsini vəsf etməyə başladı. Qorxuram ki, o yerini əzbərləməmiş olum, ancaq bəzi insanların cəhənnəmə düşdükdən sonra ordan çıxmalarını iddia edərək belə dedi: "yəni oradan çıxdıqda qaralmış küncüt çöplərinə bənzəyəcəklər. Cənnət çaylarından birində girib oradan kağız səhifəsi kimi ağ çıxacaqlar. Biz qayıtdıq və belə dedik: "Vay olsun sizə , Şeyxin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) adından yalan danışdığını zənn edirsiz. Biz fikrimizdən qayıtdıq, and olsun Allaha ki, bir kişidən başqa heç birimiz çıxmadı. Və ya Əbu Nueymin dediyi kimi.

92-Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cəhənnəmdən dörd kişi çıxacaq və Allah Təalaya göstəriləcək. Onlardan biri

dönüb Ondan belə diləyəcək: “Ey Rəbbim , məni oradan çıxartdın , bir daha məni ora qaytarma” və Allah onu oradan xilas edəcək”. (Buxari/4712, Müslim/192).

## Altımışıncı fəsil: Şəfaət

93- Əbu Hüreyrə (Allah ondan razı olun) belə rəvayət edir: “Bir gün Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ət gətirdilər. Qol tərəfindən bir parca ona tərəf uzatdılar. Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qol tərəfini çox xoşlayardı. Ondan bir parça dişlədikdən sonra belə buyurdu: “Qiyamət günü insanların ağası mənəm, bilirsinizmi nə üçün? Allah Təala qiyamət günü gəlib getmiş hər bir kəsi düz bir yerdə toplayacaq. Çağıranın səsi hər kəsə eşitdiriləcək, göz hər kəsi görə biləcək və günəş yaxınlaşacaq. İnsanlar tab gətirə bilmədikdə bir qəm-qüssə və kədər icində olacaqlar. İnsanlar bir-birinə belə deyəcəklər: “Halınızı görmürsünüzmü? Başınıza gələni görmürsünüzmü? Rəbbinizin yanında sizə şəfaətçi olacaq birini axtarmırsınızmı?” Və insanlardan bəziləri bir birinə belə deyəcək: “Adəmin yanına gedin”. Və Adəmin yanına gəlib ona belə deyəcəklər: “Ey Adəm , sən insanların atasısan, Allah Təala səni Öz əlləri ilə yaradıb. Sənə öz ruhundan üfürüb, Mələklərə sənə səcdə etməyi əmr edib, Rəbbin yanında bizim üçün səfaətçi ol, məgər halımızı görmürsənmi, başımıza gələni görmürsənmi. Adəm onlara belə cavab verəcək: “Həqiqətən , Rəbbim bu gün elə gəzəblənib ki, bundan əvvəl belə qəzəblənməyib və nə də bundan sonra belə qəzəblənməyəcək. Mənə ağaca yaxınlaşmağı qadağan etmişdi mən asilik etdim. Nəfsim, nəfsim məndən başqasının yanına gedin, Nuhun yanına gedin.” Və Nuhun yanına gəlib belə deyəcəklər: “Ey Nuh , sən yer üzünə göndərilən ən birinci Elçisən, Allah Təala səni şükr edən qul adlandırıb, Rəbbin yanında bizim üçün səfaətçi ol, məgər halımızı görmürsənmi, başımıza gələni görmürsənmi.” Nuh Onlara belə cavab verəcək: “Həqiqətən , Rəbbim bu gün elə gəzəblənib ki, bundan əvvəl belə qəzəblənməyib və nə də bundan sonra belə qəzəblənməyəcək. Həqiqətən , mənim bir duam vardı ki , onu da qövmüm üçün bəd dua etdim. Nəfsim, nəfsim, İbrahimin (Ona Allahın salamı olsun) yanına gedin.” Və İbrahimin yanına gəlib deyəcəklər: “ sən Allahın Peyğəmbərisən, dünya əhlindən olan Xəlilisən (dostu), Rəbbin yanında bizim üçün səfaətçi ol, məgər halımızı görmürsənmi, başımıza gələni görmürsənmi.” İbrahim Onlara belə cavab verəcək: “Həqiqətən Rəbbim bu gün elə gəzəblənib ki, bundan əvvəl belə qəzəblənməyib və nə də bundan sonra belə qəzəblənməyəcək , sonra-yalan danışdığnı-onlara xatırladacaq və belə deyəcək: “Nəfsim, nəfsim, məndən başqasının yanına gedin, Musanın (Ona Allahın salamı olsun) yanına gedin. Və onlar Musanın (Ona Allahın salamı olsun) yanına gələrək belə deyəcəklər: “Ey Musa , sən Allahın Elçisisən, Allah Təala səni risalələri və səninlə danışmaqla insanlardan üstün etmişdir, Rəbbin yanında bizim üçün səfaətçi ol, məgər halımızı görmürsənmi, başımıza gələni görmürsənmi. Musa Onlara belə cavab verəcək: “Həqiqətən , Rəbbim bu gün elə gəzəblənib ki, bundan əvvəl belə qəzəblənməyib və nə də bundan sonra belə qəzəblənməyəcək. Mən öldürməsi əmr olunmayan bir nəfsi öldörmüşəm. Nəfsim, nəfsim, İsanın yanına gedin.” İsanın (Ona Allahın salamı olsun) yanına gəlib belə deyəcəklər: “ Ey İsa , sən Allahın Elçisisən, insanlarla beşikdə ikən danışmısan, Allahın Məryəmə qoyduğu bir kəlimə və ruhsan, Rəbbin yanında bizim üçün səfaətçi ol, məgər halımızı görmürsənmi, başımıza gələni görmürsənmi. İsa Onlara belə cavab verəcək: “Həqiqətən Rəbbim bu gün elə gəzəblənib ki, bundan əvvəl belə qəzəblənməyib və nə də bundan sonra belə qəzəblənməyəcək. (Heç bir günah söyləmir) Nəfsim, nəfsim, məndən başqasının yanına gedin, Muhəmmədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gedin.” Və Onlar mənim yanıma gələrək deyəcəklər: “Ey Muhəmməd , sən Allahın Elçisisən,

Peyğəmbərlərin sonuncususan, Allah Təala sənin keçmiş və gələcək günahlarını bağışlayıb Rəbbin yanında bizim üçün səfaətçi ol, məgər halımızı görmürsənmi, başımıza gələni görmürsənmi? Və durub gedəcəyəm. Ərşin altına çatıb Allaha səcdəyə qapılacağam. Sonra Allah Təala mənə məndən qabaq heç bir kəsə etmədiyi bir açılış edəcək və mənə öz gözəl həmd–sənalarından ilham edəcək. Sonra belə buyuracaq: “Ey Muhəmməd başını qaldır, istə ki, isədiyn verilsin, şəfaəat dilə ki, şəfaət diləmə haqqı verilsin. Mən başımı qaldırıb belə deyəcəyəm: “Ey Rəbbim: “Ümmətim! Ümmətim!” Mənə belə deyiləcək: “Ey Muhəmməd Ümmətindən haqq-hesabı çəkilməyən kəsləri Cənnətin sağ qapılarından birindən Cənnətə daxil et. Onlar bu qapıdan başqa qalan qapılarda da insanlarla şərikdilər.” Muhəmmədin nəfsi Əlində Olana and olsun ki, sizə verilən Cənnətin iki dirəyinin arası Məkkə ilə Həcər şəhərinin arası qədərdir. (və ya Məkkə ilə Basra arası qədər)” (Buxari/4712,Müslim/194).

## Altımış birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Cənnət üçün Ən birinci Şəfaətçilik edən mənəm, və Peyğəmbərlərin ən çox tabe olunanı da mənəm” deməsi.

94- Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Cənnət üçün ən birinci Şəfaətçilik edən mənəm, Peyğəmbərlərin içində mənim təsdiqlədiyim qədər təsdiqlənəni yoxdur. Həqiqətən Peyğəmbərlərdən eləsi vardır ki, onu ümmətindən yalnız bir kişi təsdiqləyib”. (Müslim/196).

## Altımış iknci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cənnətin qapsının açılmasını istəməsi.

95-Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Qiyamət günü cənnətin qapsına gəlib açılmasını istəyəcəyəm. Cənnətin qapsını qoruyan: “Sən kimsən” deyə soruşduqda, Ona: “Muhəmməd” deyə cavab verəcəyəm. Onda belə deyəcək: “Yalnız sənin üçün açmağı əmr olundum, səndən qabaq heç kəs üçün açamyacaqdım”. (Müslim/197).

## Altımış üçüncü fəsil: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “hər bir Peyğəmbərin müstəcəb (qəbul olan) duası var” deməsi.

96-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər bir Peyğəmbərin müstəcəb (qəbul olan) duası var, və hər biri öz duasını əvəlcədən edib, mən öz duamı qiyamət günü ümmətimə şəfaət üçün saxlamışam. Və o , Allahın izniylə , ümmətimdən Allaha heç bir şeyi şərik qoşmadan ölən hər bir kəsə çatacaq”. (Buxari /6304, Müslim /199).

## Altımış dördüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ümməti üçün dua etməsi.

97-Abdullah ibn Amr (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allah Təalanın İbrahim (Ona Allahın salamı olsun) haqda buyurduğu ayəni oxudu: “Ey Rəbbim! Onlar, həqiqətən, çox insanı azdırıblar. İndi kim arxamca gəlsə, o, şübhəsiz ki, məndəndir. Kim mənə qarşı çıxsa, Sən bağışlayansan, rəhm edənsən!”

(İbrahim/36). Və İsa (Ona Allahın salamı olsun) haqda belə buyurdu: "Əgər onlara əzab versən, şübhə yoxdur ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, yenə şübhə yoxdur ki, Sən yenilməz qüvvət sahibi, hikmət sahibisən." (Əl- Məidə/ 118). Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əllərini qaldıraraq: "Allahım , Ümmətim, Ümmətim!" dedi və ağladı. Allah Təala Cəbrailə  belə buyurdu: "Ey Cəbrail , Muhəmmədin yanına get - Halbuki, Rəbbin onu daha yaxşı bilir - ondan nə üçün ağladığını soruş." Cəbrail gəlib soruşduqda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nə dediyini Allaha xəbər verdi. – Halbuki Allah Təala onud dediyini daha yaxşı bilir - və Allah Təala belə buyurur: "Ey Cəbrail ,  Biz səni Ümmətin barəsində razı edəcək və səni  üzməyəcəyik. (Müslim / 202).

98-Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Tufeyl ibn Amr əd-Dövsi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib belə dedi: "Ey Allahın Elçisi , möhkəm bir qalaya və mühafizlərin yanına getmək istəyirsənmi." Bu qala cahillikdə Dövs qəbiləsinin idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buna razı olmamışdı, çünki Allah Təala onun mühafizəsini Ənsarlara həvalə etmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə hicrət etdiyində , Tufeyl ibn Amrda ora hicrət etdi. Onunla birlikdə qövmündən bir kişi də hicrət etmişdi. Mədinədə sıxıntıdan xəstələnmişdi. Səbirsizlik edib öz oxu ilə barmaq oynaqlarının ust dərisini kəsir. Əlindən qanın fışqıraraq axdıgından öldü. Tufeyl ibn Amr onu yuxuda gözəl bir qiyafəddə görür. Yalnız  Onun əllərini örtdüyünü görüb ondan belə soruşur: "Allah Təala sənə nə edib" O belə cavab verdi: "Peyğəmbərinin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanina Hicrət etdiyimə görə məni bağışladı" Mən yenə soruşdum: "Bəs nə üçün əllərini bağlayırsan?" O: "Mənə belə deyilldi: "Sənin korladığın bədən üzvünü biz düzəltməyəcəyik" deyə cavab verdi. Tufeyl bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) danışdıqda , O belə dedi: "Allahım , onun əllərinidə bağışla" (Çüslim/116).

## Altımış beşinci fəsil: Allah Təal buyurur: "Və ən yaxın qohumlarını qorxut!"

99-Əbu Hüreyrə (Allah ondan razı olsun belə rəvayət edir: "Bu ayə nazil olanda: "Və ən yaxın qohumlarını qorxut" (Əş-Şuara/214) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qureyşi çağırdı. Onlar yığışdıqda, onlara ümumən və xüsüsən xitab edərək belə dedi: "Ey Bəni Kəəb ibn Luey , nəfsinizi oddan xilas edin, Ey Bəni Murra ibn Kəəb , nəfsinizi oddan xilas edin, Ey Bəni Abd əş-Şəms , nəfsinizi oddan xilas edin, Ey Bəni Abd əl-Manaf , nəfsinizi oddan xilas edin, Ey Bəni Həşim , nəfsinizi oddan xilas edin, Ey Fatimə , nəfsini oddan xilas et, Çünki mən sizin üçün Allahın yanında heç bir şeyə malik deyiləm. Yalnız sizinlə qohumluq əlaqəsi var ki, mən onu saxlayacağam" (Buxari / 2753. Müslim / 204).

## Altımış altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Talibə heç bir fayda verməməsi.

100- Abbas ibn Abd əl-Muttalibin (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşduğu rəvayət olunur: "Ey Allahın Elçisi, Əbu Talib səni qoruyardı, sənə görə qəzəblənərdi , ona nəsə bir fayda verə bildinmi? O belə cavab verdi: "Bəli , Cəhhənəmin ən yuxarı yerindədir , əgər mən olmasaydım , onda Cəhənnəmin ən dibində olardı." (Buxari / 3883, Müslim / 209).

101- İbn Abbas (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Cəhənnəm əhlindən ən yüngül əzab verilən Əbu Talibdir. Ona oddan çarığlar geydiriləcək ki, onun istisindən beyni qaynayacaq.” (Buxari/3885, Müslim / 212).

## Altımış yeddnci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ümmətimdən yetmiş mini Cənnətə sorğu-sualsız girər” deməsi.

102- Huseyn ibn Abd ər-Rahman (Allah ondan razı olsun) belə rəvayət edir: “Səid ibn Cubeyrin yanında idim birdən belə dedi : “Dünən axşam düşən ulduzu hansınız gördü? Mən: “Gördüm” deyə cavab verdim. Sonra belə dedim: “Dünən mən namazda deyildim, məni əqrəb sancmışdı. Məndən: “nə etdin” deyə soruşdu. Mən: “Ruqyə (əli xəstə olan yerin uzərinə qoyaraq şəfa olsun deyə , quran oxumaq) etdim” deyə cavab verdikdə, O: “Səni belə etməyə nə sövq etdi?” deyə soruşdu . Mən: “Şəbinin bizə danışdığı hədis” deyə cavab verdikdə O: “Şəbi sizə nə danışıb?” deyə soruşdu . Mən “bu hədisi” deyə cavab verdim: “Bizə Bureydə ibn Huseyn əl–Əsləmi belə danışdı: “Rüqyə etmək yalnız nəzərdən və sancıldıqda olar”. Onda , o belə dedi: “Eşitdiyi şeydə qərar tutan kəs, neçə də gözəl bir iş tutmuş olar. Yalnız İbn Abbas bizə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət etmişdir: “Bütün ümmətlər mənə göstərildi. Elə Peyğəmbər var idi ki, yanında kiçik bir camahat, eləsi də var idi ki, yanında bir və ya iki kişi, elə Peyğəmbər də var idi ki, yanında heç kim yox idi. Birdən mənə böyük bir qaraltı göstərildi. Ümmətim olduğunu zənn etdim. Mənə belə dedilər: “Bu Musanın ümmətidi, Sən üfüqə bax”. Baxdığımda böyük bir qaraltı gördüm. Mənə: “Oradakı üfüqə bax” dedilər. Baxdığımda böyük bir qaraltı gördüm. Mənə belə dedilər: “Bu sənnin ümmətindir, onlarla yetmiş min nəfər var ki, Cənnətə sorğu–sualsız girəcəklər.” Sonra qalxıb evinə girdi. İnsanların başı Cənnətə sorğu-sualsız girən kəslərin kimlər olcağı haqda söhbətə qarışdı. Bəziləri belə dedi: “Yəqin onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələridir”. Bəziləri isə belə dedi: “Yəqin onlar İslamda doğulub Allaha heç bir şeyi şərik qoşmayanlardır”. Və bunun kimi bir neçə şey xatırladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların yanıana çıxıb: “Aranızda nə danışırsınız“ deyə soruşduqda , ona danışdıqları şeyi xəbər verdilər. Onda O belə buyurdu: “Onlar Ruqyə etməyən və özlərinə ruqyə olunmasını tələb etməyənlər, bədbilik etməyənlər və Allaha təvəkkül edənlərdir.” Ukaşa ibn Mihsan qalxaraq ona belə dedi: “Allaha mənim onlardan olmağım üçün dua et. O: “Sən onlardansan” deyə cavab verdi. Sonra başqa bir kişi qalxaraq “Allaha mənim onlardan olmağım ünün dua et” dedikdə, O ona: “Ukaşa səni qabaqladı” deyə cavab verdi”. (Büxai/5705. Müslim/220).

## Altımış səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Sizin Cənnət əhlinin yarı olmağınızı diləyirəm.(arzulayıram)” deməsi.

103- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: “Biz qırxa yaxın sayda kişi Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə bir qübbətin altında idik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə: “Cənnət əhlinin dördə biri olmagnıza razı olarsınızmı” deyə soruşdu? Biz: “Bəli” deyə cavab verdikdə, O yenə soruşdu: “Cənnət əhlinin üçdə biri olmağnıza razı olarsınızmı?”. Biz yenə də: “Bəli” deyə cavab verdikdə, O belə buyurdu: “Muhəmmədin nəfsi əlində olana and olsun ki, mən sizin Cənnət əhlinin yarısı olmağnızı diləyirəm. O Cənnət ki, ora

yalnız müsəlman olan bir nəfs daxil olacaq. Siz şirk əhli içində qara öküzün dərisindəki ağ dur tük kimisiniz, və yaxud Qırmızı öküzün dərisinindəki qara tük kimisiniz”. (Buxari /6528, Müslim /221).

## Altımış doqquzuncu fəsil: Allah Təalanın Adəmə: “Cəhənəmə göndərilənləri hər min nəfərdən doqquyüz doxsan doqquzunu çıxart” deməsi.

104- Əbu Səid (Allah ondan razı olsun) : Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təala Adəmə belə buyuracaq: “Ey Adəm”. O: “Eşidirəm, əmrindəyəm, xeyir sənin əlindədir” deyə cavab verdikdə Allah Təala ona belə buyurur: “Cəhənnəmə göndərilənləri çıxart (ayır)”. O: “Cəhənnəmə göndərilənləri çıxart (ayır) kimlərdir” Deyə soruşduqda, O ona belə buyuracaq: “hər min nəfərdən doqquz yüz doxsan doqquzunu çıxart”. Sonra belə dedi: “Bu , uşağın qocaldığı bir vaxtda (qiyamətdə) olacaqdır : “Onu görəcəyiniz gün hər bir əmzikli qadın əmizdirdiyi uşağını unudar, hər bir hamilə qadın bari-həmlini yerə qoyar (uşaq salar). İnsanları sərxoş görərsən, halbuki onlar sərxoş deyillər. Ancaq Allahın əzabı çox şiddətlidir!” (Əl-Həcc). Bu , səhabələrə çox ağır gəldi və Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ey Allahın Elçisi o bir kişi hansımız olacağıq” deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə cavab verdi: “Müjdələnin, çünki (Cəhənnəmə girən) Yəcuc və Məcuc qəbilisdən min, sizdən isə bir kişi ollacaq”. Sonra isə belə dedi: “Nəfsim əlində olana and olsun ki, Sizin Cənnət əhlinin dörddə biri olmağınızı çox istəyirəm.” Biz Allaha həmd edib təkbir (Allahu əkbər) etdik. O yenə buyurdu: “Nəfism əlində olana and olsun ki, Sizin Cənnət əhlinin üçdə biri olmağnızı çox istəyirəm.” Biz yenə Allaha həmd edib təkbir etdik. “Nəfism əlində olana and olsun ki, Sizin Cənnət əhlinin yarısı olmağınızı çox istəyirəm. Başqa ümmətlər ilə Sizin misalınız qara öküzün dərisindəki ağ dur tükün misalı kimidir və yaxud, Eşşəyin qabaq ayaqlarının iç tərəfindəki dairəvi iz kimidir.” (Buxari / 6530, Müslim 222).

# Dəstəmaz (Təharət) kitabı

## Birinci fəsil: “Allah Təala təharətsiz (dəstəmaz və qüsul) Namazı qəbul etməz”.

1- Musab ibn Saad belə rəvayət edir: “Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) İbn Amirin xəstə ikən ziyarət etmək üçün yanına girdi. O, ona belə dedi: “Ey İbn Ömər mənim üçün Allaha dua edərsənmi?” İbn Ömər ona belə cavab verdi: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “Allah Təala təharətsiz namazı, və qənimətdən izinsiz götürülən malın sədəqəsini qəbul etməz.” Halbuki, sən Bəsrənin valisi olmusan”. (Müslim / 224).

## İkinci fəsil: Yuxudan oyandıqda əlləri qabın içinə salmazdan öncə yumaq.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz yuxudan oyandıqda əllərini üç kərə yumadan, qabın içinə salmasın. Çünki o, əlinin harada gecələdiyindən xəbərsizdir”. (Müslim/278).

## Üçüncü fəsil: “İnsanların yoluna və kölgələndiyi yerə ayaqyoluna çıxmaqın qadağan olması”.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Çox lənət gətirən iki şeydən qorxun.” Onlar: “Ey Allahın Elçisi çox lənət gətirən bu iki şey nədir?” deyə soruşdular. O , onlara belə cavab verdi: “insanların yoluna və kölgələndiyi yerdə ayaqyoluna çıxmaq.” (Müslim / 269).

## Dördüncü fəsil: Ayaq yoluna çıxarkən görünməyən bir yerə çəkilmək.

4- Abdullah ibn Cafarin (Allah onların hər ikisindən razı olsun) belə dediyi rəvayət olunur: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün məni öz tərkinə aldı və mənə heç kimə danışmayacağım bir sir söylədi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaq yoluna çıxmaq istədikdə görünməmək üçün çıxdığı ən sevimli yer hündür bir təpəcik və ya xurma bağı idi.” (Müslim / 342).

## Beşinci fəsil: Ayağ yoluna girərkən nə deməli.

5- Ənəs ibn Məlikdən (Allah ondan razı olsun) belə rəvayət olunur: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaq yoluna girməzdən öncə belə deyərdi: “Allahım Xubs (erkək cin) və Xabaisin (dişi cin) şərrindən sənə sığınıram.“(Buxari/142, Müslim/375).

## Altıncı fəsil: Böyük və kiçik təmizlik üçün ayağ yoluna çıxdıqda qibləyə tərəfə çevrilməz.

6- Əbu Eyyub (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Böyük və kiçik təmizlik üçün ayağ yoluna çıxdıqda üzünüzü və arxanızı qibləyə tərəf çevirməyiniz.

Lakin şərqə və ya qərbə tərəf çevirin.” Əbu Eyyub belə dedi: “Şam vilayətinə gəldikdə ayaq yollarının qibləyə tərəf olduğunu gördük. Biz ayaq yolunun içində qiblədən dönür və Allahdan bağışlanma diləyirdik.” (Buxari/144, Müslim/264).

## Yeddinci fəsil: Tikili binalarda bunun icazəli olması.

7- Vasi ibn Hibban belə rəvayət edir: “Məsciddə namaz qılırdım, Abdullah ibn Ömər kürəyini qibləyə söykəyib oturmuşdu. Namazı bitir dikdən sonra oturduğum yerdən ona tərəf getdim. Abdullah belə dedi: Bəzi İnsanlar deyir ki, ayaq yoluna çıxdıqda Qibləyə və Beyt Əl- Məqdisə tərəf üz çevirib oturma. Mən bir evin damına çıxmışdım, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arxasını Beyt Əl- Məqdisə çevirib iki daşın üzərində oturmuş halda ayaq yoluna çıxdığını gördüm.” (Buxari /145, Müslim / 266).

## Səkkizinci fəsil: Suya bövl etdikdən sonra oradan yuyunmağın qadağan olması.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizdən biriniz daimi bir yerdə qalan (axar olmayan) suya bövl etməsin ki, sonrada oradan yuyunsun.” (Müslim / 282).

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Daimi bir yerdə qalan axarı olmayan bir suya bövl etmə ki, sonrada oradan yuyunasan”. (Büxari / 238. Müslim / 282).

## Doqquzuncu fəsil: Sidiyin üzərivə sıçramasından və düşməsindən qorunmaq.

10- İbn Abbas ( Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki qəbrin yanından keçərkən belə dedi: “Amma bu ikisi əzab çəkirlər. Əzabları böyük bir günaha görə deyildir. Onlardan biri insanlar arasında söz gəzdirən idi, o biri isə bövl edərkən sidiyin onun üzərinə düşməsindən qorunmazdı. Sonra yaş bir xurma budağı istədi. Onu iki yerə bölüb birini buna, o birini də ikincinin qəbrinə sancaraq belə buyurdu: “Bunlar quruyanadək əzablarını yüngülləşəcəyini ümüd edirəm.” (Büxari/216, Müslim/292).

## Onuncu fəsil: Sağ əllə təmizlənməyin qadağan olması.

11- Abdullah ibn Əbu Qatədə , O da atasından Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz bövl edərkən övrətini sağ əli ilə tutmasın. Və sağ əli ilə də silinməsin (təmizlənməsin) və qabın içinə üfürməsin.” (Buxari/153, Müslim / 267).

## On birinci fəsil: Ayaq yolunda su ilə təmizlənmək.

12- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir bostana girdi. əlində su qabı olan bir uşaq onun ardınca getdi. O bizim ən kiçiyimiz idi. Qabı sidr ağacının yanına qoydu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hacətini bitirib su ilə təmizləndikdən sonra yanımıza qayıtdı”. (Müslim \ 270).

## On ikinci fəsil: Daşla tək sayda təmizlənmək.

13-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəql etdiyi rəvayətdə belə deyilir: "Sizlərdən biriniz daşla təmizlənərsə, daşların sayını tək etsin. Və sizlərdən biriniz dəstəmaz alarsa burnuna su alsın və onu yaxalasın." (Buxari /161, Müslim /237).

## On üçüncü fəsil: Daşla təmizlənməyin icazəli, sümük və peyinlə təmizlənməyin qadağan olması.

14-Salman (Allah ondan razı olsun) belə rəvayət edir: "Ona belə deyildi: "Peyğəmbəriniz (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sizə hər şeyi öyrətmişdir. Hətta ayaq yoluna necə çıxmağınızı belə? O: "Bəli! Bizə ayaq yonuna çıxdıqda gibləyə üz çevirməyi, sağ əllə yuyunmağı, üç daşdan az daşla təmizlənməyi və sümük və peyinlə təmizlənməyi qadağan etmişdir" deyə cavab verdi." (Müslim/262).

## On dördüncü fəsil: Ölmüş heyvanın dərisindən faydalanmaq.

15-İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: Meymunənin azad etdiyi bir cariyəsinə sədəqə edilmiş qoyun öldü. "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanından keçərkən belə dedi: "kaş ki, onun dərisini götürüb aşılasanız və ondan faydalansanız". Ona: "O ölmüşdür" deyə cavab verdikdə O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi "Onu , yalnız , yemək haramdır." (Buxari / 2221, Müslim / 363).

## On beşinci fəsil: Dəri aşılanarsa təmizlənər.

16-Yezid ibn Əbi Həbib, o da Əbu Əl-Xeyrin belə dediyini rəvayət edir: İbn Valətin əynində türklü dəridən bir geyim gördüm. Ona əlimi sürtdükdə , o məndən: "Nə üçün əlini sürtdün?" deyə soruşdu. Abdullah ibn Abbasdan belə soruşmuşam: "Biz Məğribdə oluruq. Bizimlə birlikdə bərbərlər və məcuslar yaşayırlar. Bizə kəsdikləri qoyunu gətirdikdə onu yemirik. Həmçinin bizə içərisində yağ saxladıqları su qabları gətirirlər. İbn Abbas ona belə dedi: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu haqda soruşduğumda belə cavab verdi: "Aşılanmağı onun təmizliyidir". (Müslim / 366).

## On altıncı fəsil: Sizlərdən birinizin qabını it yalayarsa onu yeddi dəfə yuyun.

17-Abdullah ibn Əl-Muğaffəl (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə itləri öldürməyi əmr etdi. Sonra isə belə buyurdu: "onların itlərlə nə işi var." Sonra ov və qoyun iti saxlamağa izn verdi və belə buyurdu: "Əgər it bir qabdan yalayarsa onu yeddi dəfə yuyun və səkkizincidə torpaqla silin. Başqa bir rəvayətdə belə deyilir: "Qoyun, ov və əkin itinə izn verdi". (Müslim / 280).

## On yeddinci fəsi: Dəstəmazın fəziləti.

18-Əbu Məlik Əl-Əşari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Təharət

(dəstamaz) imanın yarısıdır, əlhəmdulilləh mizanı (tərəzini) doldurur, sübhən Allah və əlhəmdulilləh yerlə səmanın arasını doldurur, namaz nurdur, sədəqə dəlildir, səbr işıqdır, quran sənin lehinə və ya əleyhinə hüccətdir. Bütün insanlar sabah qalxar, kimsə nəfsini satar, kimsə də onu ya azad ya da həlak edər." (Müslim/223).

## On səkkizinci fəsil: Günahların dəstəmazla yuyulması.

19- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Müsəlman (və ya Mömin) bəndə dəstəmaz alarkən üzünü yuduqda, üzündən gözü il baxdığı bütün günahlar su ilə (və ya suyun axırıncı damlası ilə bərabər ) üzündən çıxar. Əllərini yuduqda əllərinin tutdugu bütün günahlar su ilə (və ya suyun axrıncı damlası ilə bərbər) əllərindən çıxar. Ayaqlarını yuduqda ayaqlarının getdiyi bütün günahlar su ilə (və ya suyun axrıncı damlası ilə bərbər) ayaqlarından çıxar. Hətta günahlardan pak olaraq çıxar." (Müslim / 244).

## On doqquzuncu fəsil: Dəstəmaz alarkən misvak işlətmək.

20- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Bir gecə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında gecələdim. Gecənin sonuna yaxın Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxaraq çıxıb səmaya baxdı sonra Əl–İmran surəsində bu ayədən başlayaraq: "Həqiqətən, göylərin və yerin yaradılmasında, gecə ilə gündüzün bir-birini əvəz etməsində", "Bizi cəhənnəm odunun əzabından qoru!" ayəsinə kimi oxudu. Sonra evə girib dişini misvakladı və dəstəmaz alıb namaz qıldı. Sonra uzandı. Sonra qalxaraq çıxıb səmaya baxdı və bu ayəni oxudu. Sonra evə girib dişini misvakladı və dəstəmaz aldı. Sonra qalxıb namaz qıldı." (Müslim / 256).

21- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evə girdiyində misvakla dişlərini təmizləməyə başlayardı." (Müslim / 253).

## İyirminci fəsil: Dəstəmaz və sair işlərə sağla başlamaq.

22- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəstəmaz almaq istədikdə, saçını daramaq və ayaqqabısını geymək istədikdə sağla başlamağı sevərdi." (Buxari/168, Müslim/2680.)

## İyirmi birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəstəmaz almasının vəsfi.

23- Abdullah ibn Zeyd ibn Asım əl-Ənsari (Allah ondan razı olsun) –və o səhəbələrdən idi- belə rəvayət edir: Ona belə deyildi: "Bizim üçün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəstəməz aldığı kimi dəstəmaz al. O bir qab istədi. Oradan su götürüb əllərini üç kərə yudu. Sonra əlini salıb çıxardaraq ağzını və burnunu bir ovucdan yaxaladı. Bunu üç kərə təkrarladı. Sonra yenə əlini salıb cıxartdi və üzünü üç kərə yudu. Sonra yenə əlini salıb çıxartdı və əllərini dirsəklərə kimi hər birini iki kərə yudu. Sonra əlini salaraq çıxartdı və əlini başının qabağından arxasına apararaq başına məs çəkdi. Sonra ayaqlarını topuğlarına kimi yuyaraq belə dedi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəstəmazı belədir" (Buxari / 185, Müslim / 235).

## İyirmi ikinci fəsil: Burunu yaxalamaq.

24- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz dəstəmaz aldıqda burnunun hər iki dəliynə su alsın sonra onu yaxalasın.” (Müslim / 237).

25-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz yuxudan oyandıqda burnunu üç kərə yaxalasın, çünki şeytan onun burnun içində gecələyir.” (Buxari/161, Müslim/238).

## İyirmi üçüncü fəsil: Dəstəmaz tam şəkildə aldığından dolayı əzaların nurlu olması.

26-Nueym ibn Abdullah Əl-Mucmarın belə dediyi rəvayət olunur: “Əbu Hüreyrəni dəstəmaz alarkən belə gördüm: Üzünü yudu və suyu üzün hər bir yerinə tam bir şəkildə çatdırdı. Sonra sağ əlini bazusu da daxil yudu. Sonra sol əlini bazusu da daxil yudu. Sonra başına məs çəkdi. Sonra sağ ayağını baldırı da daxil yudu. Sonra sol ayağını baldırı da daxil yudu və belə dedi: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dəstəmaz aldığını gördüm.” Sonra isə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini söylədi: “Siz qiyamət günü dəstəmazı tam şəkildə aldığından dolayı əzalarnız nurlu olacaq. Sizdən kim dəstəmaz alarkən əzalarını yuyulması gərəkən yerdən artıq yeri yuya bilirsə yusun.” (Buxari \ 136, Müslim / 246).

27-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qəbirsanlığa gələrək belə dedi: “Salam olsun sizə ey möminlər diyarı. Biz də Allahın izni ilə sizə qovuşacağıq. Qardaşlarmı görməyi çox arzu edirəm.” Onlar ona “Ey Allahın Elçisi , məgər biz sənin qardaşların deyilikmi?” deyə soruşduqda, O, onlara belə cavab verdi: “Siz mənim əshabımsınız, qardaşlarım isə hələ gəlməyiblər.” Onlar yenə ondan: “Ey Allahın Elçisi , ümmətindən hələ gəlməyən kəsləri necə tanıyarsan?” deyə soruşdular. O, onlara belə cavab verdi: “Bir kişinin at sürüsünün içində ətrafları ağ – parıltılı bir atları olsa , onu qap-qara atların içindən tanımazmı?” Onlar: “Tanıyar, Ey Allahın Elcisi dedikdə, O: “Onlar qiyqamət günü dəstəmazı tam şəkildə aldıqlarından , əzaları nurlu olaraq gəldiklərində mən onlardan öncə hovuzun yanına gələcəyəm. Bir dəstə kişini hovuzumun yanından itmiş dəvənin qovulduğu kimi qovacaqlar , onları hey “bura gəlin”- deyə çağırdığımda, mənə: “Onlar səndən sonra dəyişdilər” deyəcəklər və mən də: “Uzaq olsunlar, uzaq olsunlar”- deyəcəyəm.” (Müslim / 246).

## İyirmi dördüncü fəsil: Dəstəmazı gözəl bir şəkildə almaq.

28-Osman ibn Affanın (Allah ondan razı olsun) mövlası (azad etdiyi qulu) Humrandan belə rəvayət olunur: “Osman ibn Affan (Allah ondan razı oslun) dəstəmaz almaq üçün su istədi və dəstəmazı belə aldı: Əllərini biləklərə kimi üç kərə yudu, sonra ağzını və burnunu yaxaladı, sonra üzünü üç kərə yudu, sonra sağ qolunu dirsəyə qədər üç kərə yudu, sonra sol qolunu dirsəyə qədər eyniylə yudu. Sonra başına məs etdi. Sonra sağ ayağını topuğa kimi üç kərə yudu. Sonra sol ayağını eyniylə yudu sonra isə belə buyurdu: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu cür , mənim dəstəmaz aldığım kimi dəstəmaz aldığını gördüm. Dəstəmazdan sonra isə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Kim mənim

dəstəmaz aldığım kimi dəstəmaz alıb sonra könlündən heç bir şey keçirmədən iki rükət namaz qılarsa, onun keçmiş günahları bağışlanar.” İbn Şihab belə demişdir: “Alimlərimiz belə deyirdilər: “Bu , hər hansı bir kəsin Namaz üçün tam bir şəkildə aldığı dəstəmazdır.” (Buxari / 159, Müslim / 226).

29-Hümrandan , o da Osman ibn Affanın (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deditini rəvayət edir: “Kim Allahın əmr etdiyi kimi dəstəmazı tam alarsa, Fərz namazlar arasındakı günahları bağışlanar.” (Müslim / 231).

30-Osman ibn Affanın (Allah ondan razı olsun) belə rəvayət edir. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitdim: “Kim namaz üçün dəstəmaz alarsa və dəstəmazını tam bir şəkildə edərsə, sonra fərz olunmuş namaza gedər və onu insanlarla bir yerdə (camaatla bir yerdə) və ya məsciddə qılarsa , Allah Təala onun günahlarını bağışlayar.” (Müslim / 232).

## İyirmi beşinci fəsil: Çətinliklərə baxmadan dəstəmazı tam şəkildə almaq.

31-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizə Allahın dərəcələri qaldırdığı və günahları sildiyi bir əməli göstərimmi? Onlar: “Bəli , Ey Allahın Elçisi” deyə cavab verdikdə , O , belə buyurdu: “Çətinliklərə baxmadan dəstəmazı tam şəkildə almaq , məscidə çox sayda addımlamaq , bir namazdan sonrakı namazı gözləmək , bunlardır dözumlük (Cihad).” (Müslim/251).

## İyirmi altıncı fəsil: “Nur dəstəmaz suyunun çatdığı yerə qədər çatır.

32-Əbu Həzim belə rəvayət edir: “Əbu Hüreyrə (Allah ondan razı olsun) namaz üçün dəstəmaz alarkən arxasında dayanmışdım. O qollarını qoltuğunun altına çatana kimi yuyurdu. Ondan : “Ey Əbu Hüreyrə , bu nə dəstəmazdır? ” deyə soruşdum. O mənə belə cavab verdi: “Ey bəni Fərrux , siz burdasız. Sizin burda olduğunuzu bilsəydim , belə dəstəmaz almazdım. Xəlilimin belə dediyini eşitmişəm: “Mömінin nuru dəstəmaz suyunun çatdığı yerə qədər çatır.” (Buxari/5953, Müslim/250).

## İyirmi yeddinci fəsil: Kim dəstəmaz yuyulan yerlərdən bir şeyi tərk etsə , o yeri yuyub dəstəmazı təkrarən alar.

33-Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: “Mənə Ömər ibn Əl-Xattab belə xəbər verdi: “Bir kişi dəstəmaz alarkən dabanında dırnaq boyda bir yeri yumadı. Bunu Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gördükdə , ona belə buyurdu: “Qayıt və dəstəmazını düzgün al.” O qayıtdı , sonra namazını qıldı.” (Müslim \243).

## İyirmi səkkizinci fəsil: “Qüsl və dəstəmzda nə qədər suyun kifayət etməsi.”

34-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bir ovuc su ilə dəstəmaz və bir sadan beş ovuca kimi su ilə qüsul alardı.

## İyirmi doqqüzüncu fəsil: Xoffun (dəri corab) üzərindən ayağa məs çəkmək.

35-Həmməm belə rəvayət edir: “Cərir (Allah ondan razı olsun) ayaq yoluna çıxdı , sonra dəstəmaz aldı və xofflarının üzərinə məs çəkdi. Ondan: “Sən belə edirsən?”

deyə soruşuldugda, O: “Bəli Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaq yoluna çıxdığını, sonrada dəstəmaz alıb ayağına xoffun üzərindən məs çəkdiyini gördüm.” Əaməş belə demişdir: “Bu hədis İbrahimin çox xoşuna gələrdi, çünki Cəririn islamı qəbul etməsi Əl- Məidə surəsi nazil olandan sonra idi.” (Buxari / 387, Müslim / 272).

36- Əbu Vail belə rəvayət edir: “Əbu Musa ayaq yoluna çıxmaq məsələsinə çox şiddətlə yanaşardı. Şuşə bir qabın içinə bövl edər və belə deyərdi: “Bəni İsraildən olan bir kəsin üzərinə sidik düşsəydi onu qayçı ilə kəsərdi.” Hüzeyfə (Allah ondan razı olsun) belə buyurdu “Dostunuzun bu dərəcədə şiddət göstərməməsini istərdim. Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bərabər gəzdiyimidə belə görmüşdüm: “Bir divarın arxasında cammaatın zibil tökdüyü bir yerə catdıqda sizlərdən birinin durduğu kimi dayanıb bövl etdi. Mən ondan bir az aralandım. Mənə işarə edərək çağırdı. Onun yanına gəlib, hacətini bitirənə kimi arxasında dayandım.” Başqa rəvayətdə belə əlavə olunur: “dəstəmaz alıb ayağına xoffun üzərindən məs çəkdi.”( Buxari / 226, Müslim / 272).

37- Muğira ibn Şöbə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir gün Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yol gedirdim. Birdən mənə: “Yanında su varmı?” deyə soruşdu. Mən: “Bəli” deyə cavab verdikdə, O , miniyinin tərkindən enib gecənin qaranlığında gözdən itənə kimi uzaqlaşdı. Sonra qayıdıb gəldi və onun əlinə qabdan su tökdüm. Üzünü yudu. əynində yundan bir yapıncıq vardı. Qollarını onun içindən çıxara bilmirdi. Nəhayət yapıncıqın altından çıxarıb qollarını yudu və başına məs çəkdi. Əyilib ayağındakı xofflarını çıxarmaq istədikdə , mənə: “Qoy qalsın onları dəstəmazlı olarkən geymişəm” deyərək onlara məs etdi.” (Buxari /5799, Müslim /274).

## Otuzuncu fəsil: Xoffun üzərindən məsin nə qədər zaman çəkilməsi.

38- Şureyh ibn Həni belə rəvayət edir: “Aişənin (Allah ondan razı olsun) yanına gəldim. Ondan ayağa xofun üzərindən məs etmək haqda soruşmaq istəyirdim. Mənə belə cavab verdi: “İbn Əbu Talibin yanına get , ondan soruş, çünki o, Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərə çıxardı”. Biz ondan bu haqda soruşduqda belə buyurdu: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müsafirə üç gün-üç gecə, daimi bir yerdə məskunlaşana isə bir gün bir gecə məs çəkməyə izn verdi.” (Müslim / 276)

## Otuz birinci fəsil: Alına (Kəkilə) və əmmamənin üzərinə məs etmək.

39- Muğirə ibn Şöbənin belə deidyi rəvayət olunur: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir dəfə geri galdı və mən də geri qalaraq onunla getdim. Hacətini bitirdikdə məndən: “Yanında su varmı?” deyə soruşdu. Ona bir qabda su gətirdim. Üzünü və əllərini biləklərə kimi yudu. Sonra qollarını çırmalamaq istədi lakin yapıncığının qolları dar olduğundan qollarını yapıncığın altından çıxartdı və cübbəni çiyinlərinin üzərinə atdı. Sonra qollarını yudu və alnına və əmmaməsininin üzərinə və xoflarının üzərinə məs etdi. Sonra miniyinin tərkinə mindi. Mən də onun kimi miniyimin tərkinə qalxdım. Gəlib camaatın yanına çatdıq. Namaza durmuşdular. Abdurahman ibn Ouf onlara namazı qıldırırdı. Birinici rükəti artıq qıldırmışdı. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldiyini hiss edib arxaya çəkilmək isdədikidə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona işarə etdi və o onlara namazı qıldırmağa davam etdi. O bitirərək salam verdiyində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı

olsun) qalxdı. Mən də onun kimi qaxıb çatmadığımız bir rükəti tamamladıq." (Müslim / 274).

### Otuz ikinci fəsil: Baş örtüyünün üzərindən məs etmək.

40-Bilal (Allah ondan razı olsun) belə rəvayət edir "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xofflarına və baş örtüyünün üzərinə məs etdi." (Müslim / 275).

### Otuz üçüncü fəsil: Beş namazı bir dəstəmazla qılmaq.

41-Bureydə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkənin fəth olunduğu gün beş namazı ayaqlarına xoffun üzərindən məs edərək bir dəstəmazla qıldı. Ona Ömər ibn Əl- Xattab: "Sən bu gün heç bir zaman etmədiyin bir şeyi etdin?" deyə soruşduqda, O: "Bunu qəsdlə etdim , Ey Ömər" deyə cavab verdi.

### Otuz dördüncü fəsil: Dəstəmazdan sonra deyilən zikirlər.

42-Uqbə ibn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: Bizə dəvələri otarmaq tapşırılmışdı. Axşam çağı dəvələri rahatlayıb özümü Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına çatdırdım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaq üstə dayanmış halda insanlarla danışırdı. Onun bu sözü dediyini eşitdim: "Hər hansı bir müsəlman gözəl bir şəkildə dəstəmaz alar sonra durub qəlbi və üzünü (qibləyə) çevirib iki rükət namaz qılarsa , Cənnət ona vacib olar. Mən: "Bu nə gözəl bir şeydir" dedim. Birdən orada olanlardan biri belə dedi: "Bundan əvvəlki daha da gözəldir" Baxdım ki, Ömər (Allah ondan razı olsun) belə deyir: "Mən sənin bayaq gəldiyini gördüm. Sonra belə dedi: "Sizlərdən hər biriniz tam bir şəkildə dəstəmaz alıb sonra "Allahdan başqa ibadətə layiq İlah olmadığına və Muhəmmədin onun qulu və elçisi olduğuna şəhadət edərsə , ona cənnətin səkkiz qapısı açılar , istədiyi qapıdan girər." (Müslim / 234).

### Otuz beşinci fəsil: Məzini yumaq və ondan sonra dəstəmaz almaq.

43-Əli (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən məndən çox məzi çıxan bir kişi idim. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızına görə bunu soruşmağa utanırdım. Miqdad ibn Əl-Əsvada bunu Ondan soruşmasını əmr etdim. O, belə buyurdu: "Övrətini yuyub dəstəmaz alsın." (Buxari / 269, Müslim / 303).

### Otuz altıncı fəsil: Oturaraq yatmaq dəstəmazı pozmaz.

44-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Namaza iqamə verildi, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə bir kişi üçün sakitcə nəsə danışırdı (Əbd Əl-Varisin hədisində isə belə deyillir: kişiyə sakitcə nəsə deyirdi). Namaza durmadı hətta cammaat yatana kimi (Şöbənin hədisində isə belə deyilir: "Kişi ilə O sakitcə o qədər danışdı ki, hətta səhabələr yatdı. Sonra gəlib onlara namaz qıldırdı")." (Buxari / 642, Müslim / 376).

## Otuz yeddinci fəsil: Dəvə ətindən sonra dəstəmaz almaq.

45-Cabir ibn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Qoyun ətindən sonra dəstəmaz alımmı?" deyə soruşdu. O , "İstəyirsənsə al, istəmirsənsə alma" deyə cavab verdi. O , yenə : "Dəvə ətindən sonra dəstəmaz alımmı?" deyə soruşdu. O: "Bəli dəvə ətindən sonra dəstəmaz al" deyə cavab verdi. O yenə: "Qoyun qalan yerdə (tölədə) namaz qılmaq olarmı" deyə soruşdu? O: "Bəli" deyə cavab verdi. O yenə də: "Dəvə qalan yerdə (tölədə) namaz qılmaq olarmı?" deyə soruşdu. O: "Xeyr" deyə cavab verdi." (Müslim / 360).

## Otuz səkkizinci fəsil: Od dəyən yeməkdən sonra dəstəmaz almaq.

46- Ömər ibn Əbd- Əl-Əziz ona Abdullah ibn İbrahim ibn Qarizin belə xəbər verdiyini rəvayət edir: "Əbu Hüreyrənin məscid üçün dəstəmaz aldığın gördüm. O belə buyurdu: "Mən yediyim kəsmik (qurud) qırıntılarına görə dəstəmaz aldım. Çünki Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Od dəymiş yeməklərdən sonra dəstəmaz alın". ( Müslim / 352).

## Otuz doqquzuncu fəsil: Od dəyən yeməkdən sonra dəstəmaz almağın vacib hökmünün ləğv olunması.

47- Cəfər ibn Amr ibn Umeyyə Əd-Damri Atasının (Allah ondan razı olsun) belə dediyi rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) biçaqla qoyunun qolundan bir parça qoparıb yediyini gördüm. Sonra Namaza çağrıldı. Bıçağı atıb qalxdı, namaz qıldı və dəstəmaz almadı." (Buxari / 208, Müslim / 355).

48-İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) süd içdi sonra su istədi və ağzını yaxalayaraq belə buyurdu: "Bunun yağı vardır".(Buxari /211, Müslim / 358).

## Qırxıncı fəsil: Namazda olan kəsin ondan nəsə çıxdığına şübhə gəlməsi.

49-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): belə dediyini rəvayət edir: "Sizdən biriniz qarnında bir şey hiss edərsə və bu onu ondan bir şey çıxdı və ya çıxmadığı haqda narahat edərsə , məsciddən səs eşitməyincəyə və ya iy düymayıncaya qədər çıxmasın" (Müslim / 362).

# Qüsul

## Birinci fəsil: Su yalnız sudandır.

1- Abdurrahman ibn Əbu Səid Əl-Xudridən, o da atasının (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə birinci gün Quba məscidinə dogru çıxdıq. Bəni Səlim qəbiləsinin ərazisinə çatdıqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Utbanın qapısında dayanıb onu uca səslə çağırdı. O , izarını (bədənin aşağı hissəsini örtmək üçün geyim) darta-darta bayıra çıxdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Kişini  yaman tələsdirdik” Utban ondan: “Ey Allahın Elçisi tələsik qadının üzərindən ondan məni çıxmadan qaldırılan bir kişi nə etməlidir” deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Su yalnız sudandır” deyə cavab verdi.” (Buxari / 180, Müslim /343).

## İkinci fəsil: Suyun sudan olmasının hökmünün ləğv olması və iki övtətin bir-birinə daxil olmasının qüslun  vacib etməsi.

2- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: “Mühacir və Ənsarlardan bir neçəsi bu haqda ixtilafa düşdülər. Ənsarlar belə dedilər: “Qüsül yalnız axdıqda (və ya su (məni) çıxdıqda) vacib olur”. Mühacirlər isə belə dedilər: “Xeyr əgər (iki övrət) bir-birinə qarışsa  qüsl vacib olar. Əbu Musa: “Mən onlara: “mən sizi bu xilafdan qurtararam” deyib qalxdim və Aişənin (Allah ondan razı olsun) yanına girmək üçün izn istədim. Mənə izn verildikdə  Ona belə dedim: “Ey anacan (və ya Ey Möminlərin anası) , səndən bir şey barəsində soruşmaq istəyirəm , lakin utanıram.” O mənə: “Səni doğan anandan utanmadan soruşduğun şeyi məndən soruşmağa utanma , mən də sənin ananam” deyə cavab verdi. Mən: “Qüsl almağı vacib edən nədir” deyə ondan soruşduqda, O: “Bilən bir kəslə qarşılaşdın, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: “Əgər kişi qadının dörd əzasının üzərinə otursa və övrəti övrətinə daxil olsa artıq qüsl almaq vacib olar.” (Müslim / 349).

3- Cabir ibn Abdullahdan , o da Ummu Külsümdən , o da Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişənin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: “Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) “Kişi qadınıyla cinsi əlaqədə olub sonra da ondan məni çıxmadıqda onlara qüsl almaq vacib olurmu?” deyə soruşdu. Aişə oturmuşdu və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Mən bunu onunla (Aişəni göstərərək) edirəm sonra isə qüsl alırıq” deyə cavab verdi.” (Müslim / 350).

## Üçüncü fəsil: Qadın yatakən kişinin yatdıqda gördüyünü görərsə (yəni ondan məni çıxarsa) qüsl almalıdır.

4- İshaq ibn Əbu Talha Ənəsin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: “Ummu Suleym (İshaqın Nənəsi) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi və Aişə Onun yanında ikən ondan: “Ey Allahın Elçisi , qadın yatdıqda kişinin yatdıqda gördüyünü və özündə kişinin öz nəfsində gördüyünü görərsə , nə etməli?” deyə ondan soruşduqda Aişə ona: “Ey Ummu Suleyim , sağ tərəfin qurusun , qadınları rüsvay etdin” dedikdə, Peyğəmbər

(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Xeyr sənin sağın qurusun. Bəli , Ummu Suleyim , əgər belə görsə , onda qüsl alsın” deyə cavab verdi.” (Müslim / 310).

## Dördüncü fəsil: Cənabət qüsulunun necə alınmasının vəsfi.

5- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Meymunənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: “Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) cənabət qüslunu alamağı üçün su gətirdim. Əllərini biləklərə kimi iki və ya üç dəfə yudu. Sonra əlini qabın içinə salaraq su götürüb övrətinin üzərinə tökdü və sol əli ilə onu yudu. Sonra sol əlini torpağa vurub onu möhkəmcə ovuşdurdu. Sonra namaz üçün aldığı kimi dəstəmaz aldı. Sonra başına hər biri bir ovuc miqdarında üç kərə su töktü. Sonra isə bədənin qalan hissəsini yudu. Sonra dayandığı yerdən qırağa çəkilərək ayaqlarını yudu. Sonra mən ona dəsmal gətirdim , lakin o bunu qəbul etmədi.” (Buxari / 249, Müslim /317).

## Beşinci fəsil: Cənabət qüsulu almaq üçün suyun miqdarı.

6- Əbu Sələmə ibn Əbd-Arrahman belə rəvayət edir: “Mən və Aişənin (Allah ondan razı olsun) süd qardaşı Aişənin yanına girdik. Ondan Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) cənəbət qüslunu necə aldığı haqda soruşduq . O, bir saa (2,5 kq) miqdarında bir qabda su istədi və qüsl aldı . Bizimlə onun arasında pərdə var idi. Başına üç kərə su tökdü. Sonra isə belə dedi: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələri saclarını elə kəsərdilər ki, saçları qulaqlarının üzərinə tökülmüş kimi qalırdı.” (Buxari / 251, Müslim / 320).

## Altıncı fəsil: Qüsul alanın (görünməmək üçün) paltarla örtülməsi.

7- Əbu Talibin qızı Ummu Həni Məkkənin fəthi ilində Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi. O , Məkkənin yuxarı yerində dayanıb qüsul alırdı və Fatimə onu görünməsin deyə örtürdü. O paltarını götürüb ona büründükdən sonra səkkiz rükət duha namazını qıldı.” (Buxari / 357, Müslim /336).

## Yeddinci fəsil: Kişinin tək cənabət qüsulu alması və (görünməmək üçün) örtülməsi.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir neçə hədisini xatırladı və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət etdi: “İsrail övladları çılpaq bir şəkildə bir-birinin övrətinə baxaraq qüsul alırdılar. Musa (Ona Allahın salamı olsun) tək qüsul alardı. Onlar aralarında belə danışırdırar: “And olsun Allaha ki, Musanın bizimlə bir yerdə qüsul almamasının səbəbi onun övrətinin şişə (qirija xəstəliyinə) düçar olmasıdır. Bir dəfə o qüsul almaq üçün getdikdə paltarını bir daşın üzərinə qoydu. Daş onun paltarını götürüb qaçdı. Musa onun ardınca “paltarım daş, paltarım daş!” deyə qaçmağa başladı. Hətta bəni İsrail onun övrətini gördü. Onlar: “And olsun ki, Musada bir xələl yoxdur” deyə danışmağa başladılar. Onlar onu gördükdən sonra daş dayandı. O paltarlarını götürüb daşı vurmağa başladı.” Əbu Hüreyrə belə demişdir: “And olsun Allaha ki, Musanın daşa vurmasından daşın altı və ya yeddi yerində iz qalmışdı.” (Buxari/278, Müslim/339).

## Səkkizinci fəsil: Kişi və qadının övrətinə baxmağın qadağan olması.

9- Əbu Səid Əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Kişi kişinin övrətinə baxmasın, həmçinin qadın qadının övrətinə baxmasın. Kişi başqa kişinin yanına tək bir paltarda yaxınlaşmasın, həmçinin qadın başqa bir qadının yanına tək bir paltarda yaxınlaşmasın.” (Müslim /338).

## Doqquzuncu fəsil: İnsanın çılpaq görünməməsi üçün örtünməsi.

10- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əynində izarla onlarla birlikdə Məkkədə daş daşıyırdı. Əmisi Abbas ona belə dedi: “Kaş ki, daşlardan qorunmaq üçün izarını açıb çiynilərinin üzərinə atsaydın” O , onun dediyi kimi izarını açıb çiyinlərinin üzərinə atdıqda özündən gedərək yıxıldı. O gündən sonra onu heç kim bir də çılpaq görmədi.” (Buxari/346, Müslim/340).

## Onuncu fəsil: Kişi və qadının bir qabdan cənabət qüsulu alması.

11- Muazə Aişənin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: “Mən və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim və onun arasında olan bir qabdan qüsul alırdıq. O məndən əvvəl suyu götürdükdə mən “ona mənə də saxla, mənə də saxla” deyirdim.” Muazə belə dedi: “Onlar bunu cənabət qüsulu alarkən edərdilər.” (Buxari/263, Müslim/321).

## On birinci fəsil: Cunub olan kəsin yatmaq və ya yemək istədikdə dəstəmaz alması.

12- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) cünub olarkən yatmaq və ya yemək istədikdə namaz üçün aldığı kimi dəstəmaz alardı”. (Buxari/288. Müslim/305).

## On ikinci fəsil: Cünub olan kəsin qüsul almadan öncə yatması.

13- Abdullah ibn Əbu Qeys belə rəvayət edir: Aişədən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vitr namazı haqda soruşdum. (sonra hədisi rəvayət etdi). Mən ondan Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) cünub ikən nə etdiyini, yatmamışdan qabaq qüsul alıb və yaxud qüsul almadan yatdığı barəsində soruşdum? O mənə belə cavab verdi: “Bütün bunları edərdi. Bəzən qüsul alıb yatardı, bəzən isə dəstəmaz alıb yatardı” Mən belə dedim: “ Bu işdə sərbəstlik verən Alllaha həmd olsun.” (Müslim /307).

## On üçüncü fəsil: Öz əhli (zövcəsi) ilə (cinsi əlaqədə olub) yaxınlıq etdikdən sonra bunu yenidən təkrarlamaq istəsə dəstəmaz alsın.

14- Əbu Səid Əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz əhli ilə yaxınlıq etdikdən sonra bunu yenidən təkrarlamaq istəsə dəstəmaz alsın.” (Müslim/308).

## On dördüncü fəsil: Təyəmmüm və onunla bağlı məsələlər.

15- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Səfərlərin birində Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çıxmışdıq . Beyda və yaxud Zətu Ceyş adlanan bir yerə çatdıqda boyunbağım qırılıb düşdü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlarla birlikdə onu axtarmağa başladılar. Onlar su olmayan bir yerdə idilər və yanlarında da su yox idi. İnsanlar Əbu Bəkrin (Allah ondan razı olsun) yanına gəlib dedilər: "Aişənin nə etdiyini görmürsənmi? Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və insanları yoldan saxlayıb. Onlar su olmayan bir yerdədilər və yanlarında da su yoxdur." Əbu Bəkr (Allah ondan razı olsun) Aişənin yanına gəldikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başını onun dizləri üzərinə qoyaraq yatmışdı. Əbu Bəkr ona belə dedi: Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və insanları saxlamısan, onlar su olmayan bir yerdədilər və yanlarında da su yoxdur." Aişə belə byurdu: "Əbu Bəkr məni Allahın istədiyi bir müddətə qədər bu sözləri deyərək danladı. Əlini böyürümə batırırdı, lakin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başı dizlərimin üzərində olduğundan tərpənmirdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yatdı. Sonra ayıldıqda yanında su olmadı. Buna görə də Allah Təala Təyəmmüm ayəsini nazil etdi, və onlar təyəmmüm aldılar." Baş-bilənlərdən olan Useyd ibn Hudeyr belə demişdir: "Bu sizin ilk bərəkətiniz deyildir Ey Əbu Bəkrin əhli" Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Üzərində oturduğum dəvəni göndərmək istərkən qaldırdıqda boyunbağımı onun altından tapdıq." (Buxari /165, Müslim / 367).

## On beşinci fəsil: Cünub olan kəsin təyəmmüm etməsi.

16- Şəqiq belə rəvayət edir: Abdullah və Əbu Musa (Allah onların hər ikisindən razı olsu) ilə oturmuşdum.Əbu Musa belə dedi: "Ey Əbu Əbd-Ər-Rəhman , bir kişi cunub olarsa və bir ay su tapmazsa namaz üçün nə etməlidir? Abdullah belə dedi: "Bir ay su tapmasa belə təyəmmüm almasın. Əbu Musa ondan belə soruşdu: "Bəs Maidə surəsindəki bu ayəyə nə deyirsən "Su tapmasanız, pak torpaqla təyəmmüm edin" Abullah belə cavab verdi: "Əgər bu ayədə onlara rüxsət verilibsə ,onda su onlara soyuq gəldiyində torpaqla təyəmmüm alamaq istəyəcəklərindən qorxuram." Əbu Musa Abdullaha belə dedi: "Məgər Ammarın belə dediyini eşitməmisən: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni bir iş dalınca göndərmişdi. Yolda cunub oldum və su tapmadım. Torpağın içində bir heyvanın eşələndiyi kimi eşələndim. Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib ona bunu danışdıqda belə buyurdu: "Əllərinlə belə etmən kifayət idi." Sonra əllərini yerə bir dəfə vurub sol əlini sağ əlinə və əlinini üst tərəfinə, həmçinin üzünə sürtdü". Abdullah belə dedi: "Məgər sən Ömərin Ammarın sözü ilə qənaətlənmədiyini görmədinmi?" (Buxari/347, Müslim/368).

## On altıncı fəsil: Salamı qaytarmaq üçün təyəmmüm etmək.

17- İbn Abbasın (Allah onların hər ikisindən razı olsun) azad etdiyi köləsi Umeyr, İbn Abbasdan belə eşitdiyini rəvayət edir: "Mən və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Meymunənin azad etdiyi köləsi olan Abdu Arrahman ibn Yəsar gəldik və Əbu Cəhm ibn Əl-Həris ibn Əs-Sammə Əl-Ənsarinin yanına daxil olduq. Əbu Cəhm belə buyurdu: "Peyğəmbər

(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cəməl quyuları tərəfdən gəlirdi , bir kişi onunla qarşılaşdı və ona salam verdi. Lakin O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun salamını almadı. Bir divara əlllərini vurub üzünə və əllərinə məs çəkdi, sonra isə kişiyə salam verdi.” (Buxari / 337, Müslim / 369).

## On yeddinci fəsil: Mömin nəcis olmaz.

18-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “O cünub ikən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinənin küçələrindən birində qarşılaşdıqda aradan çıxaraq qüsul alamağa getmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu gözdən itirdi. Sonra o Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldikdə ondan belə soruşdu: “Ey Əbu Hüreyrə , hara getmişdin?” O: “Ey Allahın Elçisi , mən səninlə qarşılaşdıqda cünub idim və qüsul almadan səninlə oturmaq istəmədim.” deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə dedi: “Sübhəna Allah , həqiqətən , mömin nəcis olmaz.” (Buxari /368 , Müslim /371).

## On səkkizinci fəsil:  Allah Təalanı hər bir anda xatırlamaq, zikr etmək.

19-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allah Təalanı hər bir anında yada salardı.” (Müslim / 373).

## On doqquzuncu fəsil: Dəstəmazı pozulmuş kəsin dəstəmaz almadan yemək yeməsi.

20-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaq yolundan çıxdıqda ona yemək gətirdilər. Sonra ona dəstəmaz almadığını xatırlatdıqda belə dedi: “Məgər dəstəmaz alıb namaz qılacağam!?” (Müslim /374).

# Heyz

## Birinci fəsil: Allah Təala buyurur: “Səndən heyz (aybaşı) barəsində soruşurlar”.

1- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: “Yahudilər heyz halında olan qadınla bir evdə yemək yeməz , onunla cima (cinsi əlaqə) etməzdilər. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabələri ondan bu barədə soruşduqda Allah Təala bu ayəni nazil etdi: “Səndən heyz (aybaşı) barəsində sual edənlərə söylə: “Heyz əziyyətli bir haldır. Heyz zamanı qadınlardan kənar olun, (heyzdən) təmizlənməyənə qədər onlarla yaxınlıq etməyin, təmizləndikdən sonra isə Allahın sizə əmr etdiyi yerdən onlara yaxınlaşın! Allah tövbə edənləri, pak olanları sevər!” və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Nikahdan (cinsi əlaqədən) başqa hər bir şey edin.” Yahudilər bu xəbəri eşitdikdə belə dedilər: “Bu kişi bizdə olan hər bir işə müxalif olmaq istəyir.” Useyd ibn Əl-Xudeyr və Abbad ibn Bişr Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedilər: “Ey Allahın Elçisi , Yahudilər belə və belə deyirlər, onlarla (heyzli qadınlarla , onlara xilaf olmaq üçün) cima etməyəkmi?” Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzü dəyişkən bir hala düşdü ki, biz onun onlara qəzəbləndiyini zənn etdik. Onlar durub çıxdıqda Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədiyyə süd gətirdilər. O , südü onların ardınca göndərərək onlara içirtdi. Bununla da onlar onun onlara qəzəblənmədiyini bildilər.” (Müslim / 302).

## İkinci fəsil: Qadının cənabət və heyz qüsulunun necə alınmasının vəsfi

.

2- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Əsma (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heyzdən təmizlənən qadının necə qüsul alacağını soruşdu . O , belə buyurdu: “Sizdən biriniz suyunu və sidrini götürüb təmizlənərək tam şəkildə dəstəmaz alsın. Sonra başına su tökərək saçlarının dibinə su çatana qədər onu ovuşdursun. Sonra vücuduna su töksün. Sonra misk (ətir) sürtülmüş bir parça götürüb onunla təmizlənsin.” Əsma ondan: “Bununla necə təmizlənim?” deyə soruşduqda, O: “Sübhan Allah onunla təmizlən” deyə cavab verdi. Aişə (Allah ondan razı olsun) (sanki dediyi sözü gizlətmək istəyərək) “qan izinin yerinə sürərsən” deyə buyurdu. Sonra ondan cənabət qüsulu haqda soruşdu . O , (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Götürüb təmizlənərək tam şəkildə dəstəmaz al. Sonra başına su tökərək saçlarının dibinə su çatana qədər onu ovuşdur. Sonra vücuduna su tök.” Aişə belə buyurdu: “Ənsarların qadınları nə yaxşı qadındırlar, həyaları onlara dinlərində biliklənməyə mane olmur.” (Buxari /314, Müslim /332).

## Üçüncü fəsil: Heyzli qadının baş örtüyünə və paltara əl vurması.

3- Əbu Hüreyrə (Allah ondanrazı olsun) belə rəvayət edir: “Bir dəfə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məsciddə ikən Aişəyə: “Ey Aişə paltarımı ver” deyə buyurdu. O: “Mən heyzliyəm” deyə cavab verdikdə, Ona “Heyz sənin əlində olmayan bir şeydir” deyə cavab verdi. O da ona istədiyini verdi.” (Müslim / 299).

## Dördüncü fəsil: Heyzli qadının ərinin başını yuması və daraması.

4- Aişənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: "Mən evə ehtiyac olduqda girərdim. Evdə xəstə olsaydı , onun halını yalnız keçərkən soruşardım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məsciddə ikən başını içəri salar və mən onun saçını darıyardım. O etikafda (məsciddə qalaraq ibadət etmək) ikən evə yalnız ehtiyac duyduqda daxil olardı." (Buxari/2028, Müslim/279).

## Beşinci fəsil: Heyzli qadının qoynuna söykənmək və quran oxumaq.

5- Aişənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mən heyzli ikən mənim qoynuma söykənib Quran oxuyardı." (Buxari / 297, Müslim / 301).

## Altıncı fəsil: Heyzli qadınla bir yorğan altında yatmaq.

6- Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəfə mən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (məxmər) qalın bir örtüyün altında uzanmışdım. Birdən heyz oldum və tez örtüyün altından çıxıb heyzli olduqda geydiyim paltarı geyindim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən: "Heyz oldun?" deyə soruşdu . Mən: "Bəli" deyə cavab verdikdə. Məni yanına çağırdı və onunla bərabər qalın bir örtüyün altında uzandım." O: "Onun və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir qabdan cənabət qüsulu aldığını" rəvayət etmişdir." (Buxari / 298, Müslim / 296).

## Yeddinci fəsil: Heyzli qadınla izarın (paltarın) üzərindən (cinsi əlaqədə olmadan) yaxınlıq etmək.

7- Aişənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: "Bizdən birimiz heyzli olduqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona heyz olan yeri izarla örtməyi əmr edər sonra isə onunla cinsi əlaqədə olmadan yaxınlıq edərdi." Sonra isə Aişə belə buyrurdu: "Sizdən hansınız Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəfsinə malik olduğu kimi, nəfsə malikdir?" (Buxari / 302, Müslim / 293).

## Səkkizinci fəsil: Heyzli qadınla bir qabdan içmək.

8- Aişənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: "Mən heyzli ikən bir qabdan su içərdim, sonra o qabı Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) uzadar və O , mən ağzımı qoyduğum yerə ağzını qoyub oradan içərdi. Heyzli ikən əti dişlərimlə sümükdən qopարardım sonra ona uzatdğımda, mən ağzımı qoyduğum yerə ağzını qoyub oradan yeyərdi." (Müslim / 300).

## Doqquzuncu fəsil: "Heyzdən sonra (xəstəlik səbəbindən) qan axması olan qadının qüsulu və namazı.

9- Aişənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: "Cəhşin qızı Ummu Həbibə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə

Allahın salavatı və salamı olsun): “Məndə heyzdən sonra qan axma olur, nə edim?” deyə soruşdu . Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) “Bu yalnız damardan axan qandır, qüsul al və namaz qıl” deyə cavab verdi. Və hər bir namaz üçün qüsul alırdı. Əl-Leys ibn Səad belə demişdir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cəhşin qızı Ummu Həbibəyə (Allah ondan razı olsun) hər namaz üçün qüsul almağı əmr etməmişdir bu onun özünün etdiyi feyldir.” (Buxari / 327, Müslim / 334).

## Onuncu fəsil: Heyz olmuş qadın qılmadığı namazların qəzasını qılmaz, tutmadığı orucları isə sonradan tutar.

10- Muazə belə rəvayət edir: “Aişədən (Allah ondan razı olsun) belə soruşdum: “Necə olur ki, heyz olmuş qadın tutmadığı orucları sonradan qəza tutmalı, qılmadığı namazların isə qəzasını qılmamalıdır.” Aışə ondan: “Məgər sən Həruriyyələrdən (xəvaric) sən” deyə soruşdu? O: “Xeyr Həruriyyə deyiləm. Sadəcə soruşuram” deyə cavab verdikdə ona belə buyurdu: “Biz o hala düşərdik. Bizə tutmadığımız orucları sonradan tutmaq, qılmadığı namazların isə qəzasını qılmamaq əmr olundu.” (Buxari / 321, Müslim / 335).

## On birinci fəsil: Beş şey fitrətdəndir.

11- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Beş şey fitrətdəndir: “Sünnət etmək, övrət yerində çıxan tükləri qırxmaq, dırnaqları kəsmək, qoltuğ altındakı tükləri qoparmaq və bığları qısaltmaq.” (Buxari / 5889, Müslim / 257).

## On ikinci fəsil: On şey fitrətdəndir.

12- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “On şey fitrətdəndir: “Bığları qısaltmaq, saqqalı uzatmaq, dişləri misvakla təmizləmək, buruna su apararaq yaxalamaq, dırnaqları kəsmək, barmaqların fəqərələrinin üstünü yumaq, qoltuğ altındakı tükləri qoparmaq, övrət yerində çıxan tükləri qırxmaq və suya qənaət etmək.” Zəkriyyə belə demişdir: “Musab belə buyurdu: “Onuncunu unutdum , yəqin ki , ağızı yaxalamaqdır.” Qüteybə belə əlavə etdi: “Vaki belə demişdir: “suya qənaət etmək , yəni təharətdə suyla təmizlənərkən.” (Müslim / 261).

## On üçüncü fəsil: Misvakı böyük olanın götürməsi.

13- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Özümü yuxuda dişlərimi misvakladığımı gördüm. Birdən məni iki kişi özlərinə tərəf çəkdi. Biri o birinidən böyük idi. Mən misvakı onların ən kiçiyinə üzatdıqda , mənə”böyüyə”- deyə buyruldu. Və mən onu onların böyük olanına verdim.” (Buxari /246, Müslim / 2271,3003).

## On dördüncü fəsil: Bığları qısaldıb saqqalı uzatmaq.

14- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Müşriklərə müxalif olun , bığlarnızı qısaldıb , saqqalınızı uzadın.” (Buxari /5892, Müslim /259).

15-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Bizə bığlarımızı qısaltmaq, dırnaqlarımızı kəsmək, qoltuğ altındakı tükləri qoparmaq və övrət yerində çıxan tükləri qırxmaq üçün, qırx gündən artıq qoymamaq vaxt olaraq təyin olunmuşdur.” (Müslim / 258).

## On beşinci fəsil: Məsciddən sidiyin təmizlənməsi.

16-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir dəfə biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məsciddə ikən bir bədəvi (çöldə yaşayan) ərəb gəlib məscidin içində bövl etməyə başladı. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri ona: “hey, hey!” dedikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: “Onu kəsməyin , qoyun davam etsin” deyə buyurdu. Onu , işini bitirənədək tərk etdilər. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu çağırıb belə dedi: “Bura məsciddir , bura pislik və bövl etmək yaraşmaz. Burada yalnız Allahı zikr etmək, namaz qılmaq və Quran oxumaq olar.” Və ya peygəmbərin dediyi kimi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir kişiyə o yerə bir qab su tökməsini əmr etdi və o , suyu o yerin üzərinə tökdu.” (Buxari / 6024, Müslim /285).

## On altıncı fəsil: Uşağın sidiyini paltarın üzərindən su səpməklə təmizləmək.

17-Mihsanın qızı Ummu Qeys (Allah onadan razı olsun) yemək yeyə bilən həddə çatmamış bir oğlu ilə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi. Ubeydullah belə dedmişdir: “O , mənə oğlunun Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qucağına bövl etdiyini xəbər vermişdir. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) su istəyərək paltarının üzərinə səpmiş, onu yumamışdır.” (Müslim / 287).

## On yeddinci fəsil: Məninin (spermanın) paltardan yuyulması.

18-Abdullah ibn Şihəb Əl-Xovləni belə rəvayət edir: “Aişənin (Allah ondan razı olsun) yanında qonaq idim. İki paltarıma birdən cunub oldum. Onları suya batırdım. Məni Aişənin kənizlərindən biri  görüb ona xəbər verdi. O məni yanına çağırtdırıb soruşdu: “Səni paltarlarını belə etməyə nə sövq etdi?” Mən: “hər bir kəsin yuxuda gördüyü bir şeyi gördüm” deyə cavab verdikdə məndən belə soruşdu: “Paltarlarında nəsə bir şey (iz) gördünmü? Mən “Xeyr” deyə cavab verdim. O belə buyurdu: “Əgər bir şey görsən , onda yuyursan” Mən onu (məni) quruduqdan sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) paltarından dırnağımla təmizləyərdim.” deyə buyurdu.” (Buxari / 223, Müslim /290).

## On səkkizinci fəsil: Heyz qanının paltardan təmizlənməsi.

19-Əbu Bəkrin qızı Əsma (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib belə soruşdu: “Bizlərdən birinin paltarına heyz qanı düşdükdə nə edək?” O

belə buyurdu: “Onu ovub su ilə yusun, sonra üzərinə su səpib onda namaz qılsın.” (Buxari / 227, Müslim / 291).

# Namaz kitabı

## Birinci fəsil: İlk dəfə azanın verilməsi.

1- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Müsəlmanlar Mədinəyə gəldiklərində yığışıb namazların vaxtını təyin edirdilər, heç kim namaz üçün azan vermirdi. Bir gün bu haqda danışdılar. Bəziləri belə dedi: “Nəsranilər kimi zınqırov çalaq” Başqalari isə belə buyurdu: “Yahudilər kimi bir boru olsun” Ömər (Allah ondan razı olsun) belə buyurdu: “Bəlkə namaza çağırmaq üçün bir kişi göndərəsiniz” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Ey Bilal , dur namaza çağır.” (Buxari/604, Müslim/377).

## İkinci fəsil: Azanın vəsfi.

2- Əbu Məhzurə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona azanı belə öyrətdiyini rəvayət edir: “Allahu Əkbər, (Allah Böyükdür), Allahu Əkbər (Allah Böyükdür), Əşhədü Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm), Əşhədu Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm), Əşhədu Ənnə Muhəmmədən Rəsulullah (Muhəmmədin onun elçisi olmağına şəhadət verirəm), Əşhədu Ənnə Muhəmmədən Rəsulullah (Muhəmmədin onun elçisi olmağına şəhadət verirəm), Sonra qayıdıb belə deyir: (İki kəs) Əşhədü Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm), Əşhədu Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm), və (İki kəs) Əşhədu Ənnə Muhəmmədən Rəsulullah (Muhəmmədin onun elçisi olmağına şəhadət verirəm), Əşhədu Ənnə Muhəmmədən Rəsulullah (Muhəmmədin onun elçisi olmağına şəhadət verirəm), (İki kəs) Həyya Əlassalat (haydı namaza), (İki kəs) Həyya Əlalfəlah (haydı nicata), İshaq (yəni İbrahim) belə əlavə etdi: Allahu Əkbər, (Allah Böyükdür), Allahu Əkbər (Allah Böyükdür), Lə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah yoxdur),” (Müslim / 279).

## Üçüncü fəsil: Azanın sözlərini iki, iqamənin sözlərini isə bir dəfə demək.

.

3- Ənəs (Allah ondan razı olsun) belə buyurmuşdur: “Bilala Azanın sözlərini iki, iqamənin sözlərini isə bir dəfə demək əmr olunmuşdu.” Yəhyə İbn Üleyyədən rəvayət etdiyi hədisində belə əlavə etmişdir: “Bunu Eyyuba danışdıqda belə dedi: “İqamə istisna olmaqla.” (Buxari/608, Müslim/378).

## Dördüncü fəsil: İki müəzzin götürmək.

4- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki müəzzini vardı: Bilal və gözləri kor olan İbn Ummu Maktum.” (Müslim / 380).

## Beşinci fəsil: Kor müəzzin götürmək.

5- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “İbn Ummu Maktum Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müəzzini idi və gözləri kor idi.” (Müslim / 381).

## Altıncı fəsil: Azanın fəziləti.

6- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): Sabah namazı girdikdən sonra basqın (Hücum) edərdi. Dayanıb azanı dinləyərdi. Azanı eşitsəydi , o yerə basqın etməz, əks halda isə basqın edərdi. Bir kişinin: "Allahu Əkbər, (Allah Böyükdür), Allahu Əkbər (Allah Böyükdür) dediyini eşitdi və belə buyurdu:" O fitrət üzərindədir". Sonra belə dedikdə: "Əşhədü Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm), Əşhədu Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm)" O , (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Oddan qurtuldu". Baxdıqlarında onun bir çoban olduğunu gördülər." (Müslim / 382).

7- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Namaza azan verildiyi zaman Şeytan azanı eşitməmək üçün çevrilib pis iy buraxaraq qaçar. Azan bitdikdə geri dönər. Namaza çağrıldıqda (iqamə verildikdə) yenə qaçar, namaza iqamə bitdikdən sonra geri qayıdaraq insanın qəlbinə girərək ona vəsvəsə edib: "Bunu xatırla, bunu xatırla deyərək öncə düşünmədiyi şeyləri xatırladar. Beləcə , insan neçə rükət qıldığını bilməz." (Buxari / 608, Müslim / 389).

## Yeddinci fəsil: Müəzzinin fəziləti.

8- İsa ibn Talha (Allah ondan razlı olsun) belə rəvayət edir: "Müavviyə ibn Əbu Sufyanın (Allah onların hər ikisindən razı olsun) yanında idim. Müəzzin gəlib onu namaza çağırdıqda o , belə dedi: Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdim: "Qiyamət günü müəzzinlər insanların ən üzün boynu olanı olacaqlar." (Müslim / 387).

## Səkkizinci fəsil: Müəzzinin dediyini demək (təkrarlamaq).

9- Abdullah ibn Amr ibn Əl-Ass (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavat və salam olsun) belə dediyini eşitmişdir: "Müəzzinin səsini eşitsəz , onun dediyi kimi deyin , sonra mənə salavat və salam deyin. Kim mənə bir salavatı və salamı desə Allah Təala ona on salavat və salam deyər. Sonra Allahdan mənim üçün vəsilə istəyin. Çünki o , Cənnətdə elə bir yer , dərəcədir ki, ona yalnız Allahın bəndələrindən olan bir kimsə layiqdir. Allahdan O kəsin mən olmasını diləyirəm. Kim mənim üçün Allahdan vəsilə diləsə, ona mənim şəfaətim vacib olar." (Müslim / 384).

## Doqquzuncu fəsil: Müəzzinin dediyini deməyin (təkrarlamaq) fəziləti.

10- Ömər ibn Əl Xattab (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavat və salam olsun) belə dediyini rəvayət edir: "Sizdən biriniz qəlbən müəzzin: "Allahu Əkbər, (Allah Böyükdür), Allahu Əkbər (Allah Böyükdür) dedikdə oda: "Allahu Əkbər, (Allah Böyükdür), Allahu Əkbər (Allah Böyükdür)" desə, sonra müəzzin: "Əşhədü Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm), Əşhədu Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm) dedikdə, o da: " Əşhədü Ənlə

İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm), Əşhədu Ənlə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah olmadığına şəhadət edirəm)" desə, sonra müəzzin:"Əşhədu Ənnə Muhəmmədən Rəsulullah (Muhəmmədin onun elçisi olmağına şəhadət verirəm), Əşhədu Ənnə Muhəmmədən Rəsulullah (Muhəmmədin onun elçisi olmağına şəhadət verirəm)" dedikdə, o da: "Əşhədu Ənnə Muhəmmədən Rəsulullah (Muhəmmədin onun elçisi olmağına şəhadət verirəm), Əşhədu Ənnə Muhəmmədən Rəsulullah (Muhəmmədin onun elçisi olmağına şəhadət verirəm)" desə, Sonra müəzzin: "Həyya Əlassalat (haydı namaza) dedikdə, o da: "Lə hövlə və lə qüvvətə illə billəh" (güc və qudrət sahibi yalnız Allahdır)" desə, sonra müəzzin: "Həyya Əlalfəlah (haydı nicata)" dedikdə, o da: "Lə hövlə və lə qüvvətə illə billəh" (güc və qudrət sahibi yalnız Allahdır)" desə, sonra müəzzin: "Allahu Əkbər (Allah Böyükdür), Allahu Əkbər (Allah Böyükdür)" dedikdə, o da:"Allahu Əkbər (Allah Böyükdür), Allahu Əkbər (Allah Böyükdür)" desə, sonra müəzzin:" Lə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah yoxdur) dedikdə, o da: "Lə İləhə İlləllah (Allahdan başqa ibadətə layiq İlah yoxdur)" deyərsə Cənnətə daxil olar." (Müslim/385).

11- Səid ibn Əbu Vaqqas (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim azanı eşitdikdə: "Əşhədu Ənlə İləhə İlləllah vahdə hu lə şərikə ləhu və Ənnə Muhəmmədən əbduhu və Rəsuluhu, Radeytu billəhi Rabbən və bi Muhammədin Rasulən bil İsləmi dinən (Allahdan başqa ibadətə layiq İlah olmadığına, və onun heç bir şəriki olmadığına və Muhəmmədin onun qulu və elçisi olmağına şəhadət verirəm, Allahdan Rəbb, Muhəmmədən Peyğəmbər, İslamdanda din kimi razıyam) deyərsə onun günahları bağışlanar. " (Müslim / 386).

## Onuncu fəsil: Namazın Fərz (Vacib) olması.

12- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Bizə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavat və salam olsun) bir şey soruşmaq qadağan edilmişdi. Ona görə də çöl əhlindən ağlı başında olan bir kəsin gələrək biz eşitmək şərti ilə ondan bir şey soruşması çox xoşumuza gəlirdi. Bir dəfə çöl əhlindən bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavat və salam olsun) yanına gəlib ondan belə soruşdu: "Ey Muhəmməd , sənin elçin bizim yanımıza gəlib iddia etdi ki, Allah Təala səni elçi olaraq göndərdiyini iddia edirsən?" O: "O , düz deyir" deyə cavab verdikdə , o , yenə soruşdu: "Səmanı kim xəlq edib?" O: "Allah" deyə cavab verdikdə, kişi yenə soruşdu: "Yeri kim xəlq edib" O: "Allah" deyə cavab verdi. Kişi yenidən: "Bu dağları ucaldan və onda istədiyini yaradan kimdir?" deyə soruşduqda, O , yenə: "Allah" deyə cavab verdi. Onda kişi belə soruşdu: "Səmanı və yeri xəlq edənə, bu dağları ücaldana səni and verirəm həqiqətən səni Allah Təala göndərib?" O: "Bəli" deyə cavab verdikdə, o belə dedi: "Elçin bizə gecə və gündüz beş namazın fərz olduğunu iddia etdi" O: "Düz deyir" deyə ona cavab verdi. O , yenə soruşdu: "Səni göndərənə and verirəm Allah Təala sənə bunu əmr edib?" O: "Bəli" deyə cavab verdi. O , yenə soruşdu: "Elçin bizə malımızdan zəkat çıxarmağın fərz olduğunu iddia etdi?" O: "Düz deyir" deyə ona cavab verdi. O , yenə soruşdu: "Səni göndərənə and verirəm Allah Təala sənə bunu əmr edib?" O: "Bəli" deyə cavab verdi. O , yenə soruşdu: "Elçin bizə ildə bir dəfə Ramazan ayının orucunu tutmağımızın fərz olduğunu iddia etdi." O: "Düz deyir" deyə ona cavab verdikdə, O , yenə soruşdu: "Səni göndərənə and verirəm Allah Təala sənə bunu əmr edib?" O: "Bəli" deyə cavab verdi. O , yenidən soruşdu: "Elçin bizə bacaran kimsənin Allahın evini Həcc etməsinin fərz olduğunu iddia etdi?" O: "Düz deyir" deyə ona cavab verdi, O , durub gedərkən belə dedi: "Səni Haqqla göndərənə and içirəm ki, bunlara nə əlavə edib , nə də azaldacağam"

Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavat və salam olsun) belə buyurdu: “Əgər dediyində sadiq olsa , Cənnətə daxil olacaq.” (Müslim / 12).

On birinci fəsil: Namazın iki rükət, iki rükət fərz olması.

13-Aişə (Allah ondan razı olsun) belə buyurur: “Namaz ilk öncə iki rükət fərz olunmuşdu. Sonra Səfər namazı iki olaraq qaldı, daimi yaşayış yerində isə Namazı tamamlamaq iqrar olundu” Əz-Zuhri Urvadan belə soruşdu: “Onda , Aişə nə üçün səfərdə namazı tamamlayır?” O belə cavab verdi: “Yəqin ki , Osmanın etdiyi kimi yozub.” (Buxari / 1090, Müslim /685).

On ikinci fəsil: Beç namaz namazlar arasında olan günahları təmizləyər.

14-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Beş namaz və cümə namazı o biri cümə namazına kimi, arasında olan günahları , böyük günahlar olmamaq şərti ilə , silər (təmizləyər).” (Müslim / 233). Başqa rəvayətdə belə deyilir: “Ramazan orucu o biri Ramzana kimi, arasında olan günahları , böyük günahlar olmamaq şərti ilə , silər (təmizləyər).”

On ikinci fəsil: Namazı tərk etmək küfürdür.

15-Cəbir (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “Kişi ilə Şirk və küfr arasında yalnız namazı tərk etmək vardır.” (Mülslim / 82).

On dördüncü fəsil: Namazın vaxtları haqda.

16-Abullah ibn Amr ibn Əl-Ass (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Zöhr namazının vaxtı günəş zeniti keçdikdən , insanın kölgəsi özü boyda olana , yəni  Əsr namazı girənədəkdir. Əsr namazının vaxtı günəş qızarana kimidir. Məğrib namazının vaxtı şəfəq itənə kimidir. İşa namazının vaxtı gecənin tən yarısına kimidir. Sabah namazının vaxtı isə dan yeri ağardıqdan günəşin doğmasına az qalana kimidir. Günəş doğduğu anda namaz qılma, çünki O şeytanın buynuzları arasından doğar.” (Müslim /612).

17-Əbu Musa Əl-Əşari (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına bir kişi gəlib namazın vaxtları haqda soruşduqda, O , ona heç bir şey demədi. Sonra Bilala azan verməyi əmr edərək Sabah namazını dan yeri ağardıqda, insanların bir-birlərini tam şəkildə görüb tanımadıqları vaxtda qıldırdı. Sonra ona yenə əmr etdi və Zöhr namazını günəş zeniti keçdikdən sonra, insanların ən yaxşı biləni gün yarı oldu dediyi vaxtda qıldırdı. Sonra ona yenə əmr etdi və Əsr namazını günəş hündürdə olduğda ikən qıldırdı. Sonra ona yenə əmr etdi və Məğrib namazını gün batdıqdan sonra qıldırdı. Sonra ona yenə əmr etdi və İşa namazını şəfəq itdikdən sonra qıldırdı. Sonra ikinci gün sabah namazını o qədər gecikdirdi ki,  namazı insanın günəş çıxdı və ya çıxmağına az qaldı dediyi vaxtda qurtardı. Sonra Zöhr namazını dünən Əsr namazını qıldığı vaxta yaxın bir vaxta kimi gecikdirərək qıldırdı. Sonra Əsr namazını o qədər gecikdirdiki,  namazı insanın günəş gızardı dediyi vaxtda qurtardı. Sonra Məğrib namazını şəfəqin sökülməsinə az qalmış vaxta qədər gecikdirərək qıldırdı.  Sonra İşa namazını gecənin ilk üçdə birinə qədər gecikdirib

qıldırdı. Sabah sual verən kişini çağırtdırıb ona belə buyurdu: “Vaxt bunların arasındakıdır” (Müslim /614).

### On beşinci fəsil: Sabah namazını sübh alaqaranlıqda qılmaq.

18- Muhəmməd ibn Amr Həccac Mədinəyə gəldiyində , Cabir ibn Abdullahdan soruşduq. O belə cavab verdi: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zöhr namazını günün qızmar olduğu bir vaxtda qılardı, Əsr namazını günəş hələ saf parlaq olduğu bir vaxtda qılardı. Axşamı günəş batdığı vaxtda qilardı. İşa namazını isə bəzən gecikdirər bəzən isə vaxtı girdiyində qılardı. Onların (Səhabələrin) yığışdığını gördükdə namazı tezləşdirər, gecikdiklərini gördükdə namazı gecikdirərdi. Sabah namazını isə (Onlar və ya) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sübh alaqaranlıqda qılardı.” (Buxari/560, Müslim/646).

### On altıncı fəsil: Sabah və Əsr namazlarını qorumaq.

19- Əbu Bəkr ibn Umara ibn Rueybə atasının Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdiyini rəvayət edir: “Gün doğmamışdan və batmamışdan əvvəl (yəni Sabah və Əsr namazını) namaz qılan kəs Cəhənnəmə daxil olmaz.” Bəsrə Əhlindən bir kişi: “Sən bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitmisən? Deyə ondan soruşdu . O: “Bəli” deyə cavab verdikdə, kişi belə dedi: “Mən də şəhadət edirəm ki, mən də bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qulaqlarımla eşitdim qəlbimlə duydum.” (Müslim / 634).

20- Əbu Bəkr ibn Əbu Musa Aşari atasından Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər kim sərinlik namazlarını (Sabah və Əsr) qılarsa , Cənnətə daxil olar.” (Buxari / 574, Müslim / 635).

### On yeddinci fəsil: Günəşin çıxdığı və batdığı vaxtda namaz qılmağın qadağan olması.

21- Aişə (Allah opndan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əsirdən sonra qıldığı iki rükət namazı heç vaxt tərk etməmişdir. Sonra Aişə belə dedi: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: “Günəşin doğub–batmasını gözləyib namazlarınızı o vaxtda qılmayın.” (Müslim / 833).

### On səkkizinci fəsil: Zöhr namazını vaxtı girdikdə qılmaq.

22- Xabbəb (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək qumların istiliyindən ona şikayət etdik. Lakin bizim şikayətmizi qəbul etmədi”. Zuheyr belə buyurdu: “Əbu İshaqdan belə soruşdum: “Zöhr namazını deyirdi?” O: “Bəli” deyə cavab verdikdə , mən yenə: “Namazı teləsdirərək vaxtında qılınması haqda?” deyə ondan soruşdum. O: “Bəli” deyə cavab verdi.

### On doqquzuncu fəsil: Şiddətli istidə namazı sərin vaxtda qılmaq.

23-Əbu Zərr (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müəzzini Zöhr namazına azan verdikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona "sərinlət, sərinlət" (və ya gözlə, gözlə) deyə buyurdu. Sonra isə belə dedi: "Həqiqətən şiddətli isti Cəhənnəmdən yayılır. Əgər isti şiddətlənsə namazı sərin bir vaxtda qılın". Əbu Zərr belə demişdir: "Biz hətta təpəciklərin kölgəsini gördük".

## İyirminci fəsil: Əsr namazının birinci vaxtdı.

24-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əsri günəş hələ yüksəkdə dəyişməmiş vaxtda qıldı. Namazdan sonra Avali məntəqəsinə gedən, günəş hələ yüksəkdə olarkən ora çatırdı." (Buxari /550, Müslim / 621).

25-Alə ibn Abdurrahman (Allah ondan razı olsun) belə rəvayət edir: "Ənəs ibn Məlikin Bəsrə şəhərindəki evinə Zöhr namazından sonra yanına girdik. Evi məscidə yaxın idi. Evə girdikdə bizdən "Əsri qılmısınız?" deyə soruşduqda, biz "Zöhr namazından indi çıxmışıq" deyə ona cavab verdik. O: "Durun namazı qılın" deyə bizə buyurdu. Biz durub Əsri qıldıq. Namazı bitirdikdən sonra belə dedi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "O münafiqin namazıdır, oturub günəşi güdür. Elə ki , şeytanın iki buynuzları arasına çatanda qalxıb qarğa dəni dimdikləyən kimi dörd rükət qılar, Allahı da az zikr edər." (Müslim / 622).

## İyirmi birinci fəsil: Əsr namazını qorumaq və Əsr namazından sonra namaz qılmağın nəhy olması

26-Əbu Bəsratə Əl-Ğifari (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə Əsr namazını Məxməs deyilən yerdə qıldırdı sonra belə dedi: "Bu namaz sizdən əvvəlki ümmətlərə verildikdə , onlar onu qorumadılar. Kim onu qoruyarsa , onun savabı iki kərə verilər. Ondan sonra şahid çıxana kimi namaz yoxdur. (Şahid yəni ulduz)." (Müslim / 830).

## İyirmi ikinci fəsil: Əsr namazını itirənin cəzasının ağır olması.

27-Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Əsr namazını itirən elə bil ki, əhlini və malını itirmiş kimidir."(Buxari / 552, Müslim / 626).

## İyirmi üçüncü fəsil: Orta Namaz haqda varid olan.

28-Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Müşriklər Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əsr namazını qılmaqdan günəş gızarana və ya saralana kimi yayındırdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bizi orta namazdan yayındırdılar. Əsr namazından. Allah Təala onların qarınlarını və qəbirlərini odla doldursun." (Müslim / 628).

## İyirmi dördüncü fəsil: Sabah və Əsr namazından sonra namaz qılmağın qadağan olması.

29-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əsr namazından sonra günəş batana kimi, Sabah namazından sonra günəş doğana kimi namaz qılmağı qadağan etmişdir." (Müslim / 825).

## İyinmi beşinci fəsil: Uç vaxt vardır ki, O vaxtda namaz qılmaq və ölü dəfn etmək qadağandır.

30-Uleyya ibn Rabah belə buyurmuşdur: Uqba ibn Amirin (Allah ondan razı olsun) belə dediyini eşitdim: "Üç vaxt vardır ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə o vaxtda namaz qılmağı və ölülərmizi basdırmağı qadağan etmişdir: "Günəş doğmağa başlayandan yüksələnədək, günəş zenitdə (tam ortada) olduqdan zeniti keçənə qədər və günəş batmağa yaxınlaşandan tam batana qədər." (Müslim / 831).

## İyirmi Altıncı fəsil: Əsr namazından sonra iki rükət haqda

31-Əbu Sələmə Aişədən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əsr namazından sonra qıldığı iki rükət namazı haqqında soruşduğunu rəvayət edir: O , belə cavab verdi: "O , əvvəlcə bu iki rükəti Əsr namazından əvvəl qılırdı , sonra məşğul olduğu üçün və ya unutduğuna görə bu namazı qıla bilmədi. Ona görə də bu namazı Əsrdən sonra qıldı və onu sabit etdi. Əgər O , bir namaz qılardısa , onu sabit edərdi." İsmail ibn Cəfər belə demişdir: "yəni onu davamiyyətli edərdi." (Buxari / 590, Müslim / 835).

## İyirmi yeddinci fəsil: Əsr namazının qəzasını günəş batdıqdan sonra qılmaq.

32-Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: Ömər ibn Əl-Xattab (Allah ondan razı olsun) Xəndək döyüşü günü Qureş Kafirlərini söyməyə başladı. Sonra belə dedi: "Ey Allahın Elçisi , Allaha and olsun ki, günəş batmaq üzrədir mən hələ də Əsr namazını qılmamışam. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allaha and olsun ki, mən də qılmamışam." Sonra Batha adlanan bir yerə endik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəstəmaz aldı. Biz də dəstəmaz aldıq və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əsr namazını günəş batdıqdan sonra qıldı. Ondan sonra isə Məğrib namazını qıldı". (Buxari / 596, Müslim / 631).

## İyirmi səkkizinci fəsil: Günəş batdıqdan sonra, Məğrib namazından qabaq iki rükət namaz haqda.

33-Muxtar ibn Fulful belə rəvayət edir: "Ənəs ibn Məlikdən (Allah ondan razı olsun) Əsr namazından sonra qılınan nafilə namaz barəsində soruşdum? O belə cavab verdi: "Ömər ibn Əl-Xattab (Allah ondan razı olsun) Əsr namazından sonra namaz qılanın əllərinə vurardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vaxtında günəş batdıqdan sonra Məğrib namazından qabaq iki rükət qılardıq." Mən ondan: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu namazı qılıbmı" deyə soruşduqda belə cavab verdi: "O bizim namaz qıldığımızı görər , lakin bizə heç nə əmr edib, qadağan etməzdi." (Müslim/836).

## İtirmi doqquzuncu fəsil: Məğrib namazının vaxtı günəş batdıqdadır.

34- Sələmətə ibn Əl-Akva (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məğrib namazını günəş bataraq pərdə arxasında gizləndikdə qılardı." (Buxari / 561, Müslim / 636).

## Otuzuncu fəsil: İşa namazının vaxtı və gecikdirilməsi.

35- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gecə İşa namazını gecənin bir hissəsi gedənədək gecikdirdi. Hətta Məscid əhli yatdılar. Sonra çıxıb namazı qıldı. Və belə buyurdu: "Bu , onun vaxtıdır, əgər ümmətimə çətin olmasaydı , bu vaxtda qılınmasını əmr edərdim." (Buxari / 566, Müslim / 638).

## Otuz birinci fəsil: İşa namazının adı haqda.

36- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bədəvi çöl ərəbləri İşa namazının adında sizə qələbə çalmasınlar. Allahın kitabında onun adı İşadır. Bu namaz dəvələri sağmaqla məşğul olduqları üçün gecənin qaranlığına qalır (Ona atamə adı verirlər)." (Müslim/644).

## Otuz ikinci fəsil: Namazı vaxtından gec qılmağın qadağan olması.

37- Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən belə şoruşdu: "Üzərində namazların vaxtını gecikdirən, və ya namazların vaxtını öldürən əmirlər olduqda sənin halın necə olacaq görəsən?" Mən: "Mənə nə əmr edirsən?" deyə ondan soruşduqda , O belə dedi: "Sən namazı vaxtında qıl, əgər onlarla namaza çatsan , onlarla da qıl , bu , sənin üçün nafilə olar." (Müslim / 648).

## Otuz üçüncü fəsil: Ən əfzəl əməl vaxtında qılınan namazdır.

38- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hansı əməlin daha əfzəl olduğunu soruşdum. O: "Vaxtında qılınan namaz" deyə cavab verdi. Mən yenə: "Sonra hansı?" deyə soruşdum. O: "Valideyinlərlə yaxşı davranmaq" deyə cavab verdi. Mən yenə: "Sonra hansı?" deyə soruşdum. O: "Allah yolunda Cihad etmək" deyə cavab verdi. Onu yormaq istəmədiyimdən ondan daha cox şey soruşmadım."(Buxari / 527, Müslim /85).

## Otuz dördüncü fəsil: Namazdan bir rükətə çatan namaza çatmış olar.

39- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Namazdan bir rükətə çatan, namaza çatmış olar." (Buxari / 580, Müslim /601).

## Otuz beşinci fəsil: Namazı yatıb qalmış və ya onu qılmağı unutmuş kəs onu xatırladıqda qılsın.

40- Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə xitab edərək belə buyurdu: "Siz

axşam çağı və gecə gedəcəksiniz, sabah isə Allah qoysa suya çatacaqsınız.” Və hər kəs bir-birinə heçnə demədən getməyə başladılar. Əbu Qatədə belə buyurdu: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mən də yanında olmaqla yola davam etdikdə gecənin yarısı oldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mürgüləyib dəvəsinin üzərində yana tərəf əyildi. Onu oyatmadan dəvənin üzərində düz oturana kimi qaldırdım. Sonra yoluna davam etdi. Gecənin çox hissəsi getdiyində yenə dəvəsinin üzərində yana əyildi. Onu oyatmadan dəvənin üzərində düz oturana kimi qaldırdım. Sonra yoluna davam etdi. Səhər vaxtının sonuna yaxın, əvvəlki iki dəfə əyildiyindən daha çox əyildi. Az qaldı ki, düşsün, yanına gəlib onu qaldırdıqda başını qaldıraraq belə soruşdu: “Kimdir?” Mən: “Əbu Qatədə” deyə cavab verdim. O: “Mənimlə bərabər nə zamandan gedirsən?” deyə məndən soruşdu. Mən: “Gecədən bəri” deyə cavab verdiyimdə belə buyurdu: “Peyğəmbərini qoruduğun üçün Allah da səni qorusun”. Sonra belə soruşdu: “İnsanların gözündən itmişik?” Sonra isə belə dedi: “Kimisə görürsənmi?” Mən: “Bu bir atlı, O başqa bir atlı” deyə-deyə yıqışdıqda yeddi atlı olduq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yoldan çıxaraq başını qoyub “Bizə namazı qoruyun” deyərək yatdı. Ən birinci oyanan da Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oldu. Gün belinə düşürdü. Biz təlaş içində qalxdıqda bizə “tərkinizə minin” deyə əmr etdi. Biz miniyə minib getməyə başladıq. Günəş yüksəldikdə, düşdü və yanımda olan , içində bir az su olan qabı istədi. Ondan su götürərək xəfif bir dəstəmaz aldı. Qabın içində bir az su qalmışdı. Mənə: “Bizim üçün qabı saxla, bir azdan onun üçün bir xəbər olacaq.” Sonra Bilal azan verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki rükət namaz qıldıqdan sonra Sabah namazını qıldı və hər gün etdiyi şeyləri bu gün də etdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyinə mindi. Biz də onunla bərabər miniyimizin tərkinə mindik. Bizdən bəziləri bir-birinə sakitcə: “Bizim namaza səhlənkarlığımızın kəffarəsi nədir?” deyə danışdıqda, O belə dedi: “Sizin üçün mən bir numunə deyiləmmı?!” sonra isə belə buyurdu: “Yatmaq səhlənkarlıq deyildir, səhlənkarlıq namazı o biri namazın vaxtı girənədək qılmamaqdır, kimin başına belə gəlsə , onu xatırladıqda qılsın. Əgər o biri gün xatırlasa , onu namazın öz vaxtında qılsın.” Sonra belə soruşdu: “İnsanların nə etdiyini gördünüzmü?” Sonra isə belə buyurdu: “İnsanlar Peyğəmbərlərini itirərək sabahladılar.” Əbu Bəkr və Ömər (Allah onlardan razı olsun) belə dedilər: “Peyğəmbəriniz (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arxada gəlir sizi arxada qoymaz.” İnsanlar belə dedilər: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sizin önünüzdədir, əgər Əbu Bəkr və Ömərə itaət etsəniz sizi doğru yola yönəldərlər. Günün uzandığı və hər şeyin qızdığı bir vaxta gəlib onlra çatdıqda onlar belə dedilər: “Ey Allahın Elçisi , susuzluq bizi həlak etdi” O belə buyurdu: “Sizə həlak yoxdur” sonra isə: “mənə qədəhimi gətirin” dedi və su qabını da istədi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) su süzməyə başladı və Əbu Qətada da onlara onu paylayırdı. İnsanlar qabda olan suyu görərək onun başına yığıldılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: “Camaat , əxlaqlı olun , hamınız doyacaqsınız.” Onlar belə də etdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) su süzürdü , mən də paylayırdım. O qədər payladıq ki, nəhayət mən və Peyğəmbər qaldı. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim üçün süzdü və mənə “iç” deyə buyurdu. Mən ona: “Sən içməyincə içmərəm “dedikdə , O , belə buyurdu: “Su suzən ən sonuncu içər” Mən içdim, sonra isə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içdi. İnsanlar suya dincəlmiş,

doymuş halda çatdılar. Abdullah ibn Rabah belə demişdir: “Bu Hədisi insanlar cəm olan məsciddə danışdığımda , İmran ibn Hüseyn mənə belə dedi: “Ey oğlan , necə danışdığına fikir ver , çünki mən o gecə o karvanda olanlardan biriyəm.” Mən ona: “Elə isə , sən hədisi daha yaxşı bilərsən” dedikdə, o məndən: “Sən kimlərdənsən?” deyə soruşdu. Mən: “Ənsarlardanam” deyə cavab verdikdə, o belə dedi: “Danış siz danışdığınız hədisləri daha yaxşı bilirsiniz.” Mən onu camaata danışdım. Sonra İmran belə dedi: “Mən o gecə oradaydım, sənin əzbərlədiyin kimi kimsənin əzbərləyəcəyni heç hiss etmədim.” (Müslim / 681).

## Otuz altıncı fəsil: Bir tək paltarda namaz qılmaq.

41- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Birisi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bir tək paltarda qılmaq haqda soruşdu”. O belə cavab verdi: “Məgər sizin hər birinizin iki paltarı var?” (Buxari /358, Müslim /515).

42- İmran ibn Əbu Sələmətə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ummu Sələmənin evində tək bir paltara bürünmüş, hər iki tərəfini çiyninə atmış şəkildə namaz qıldığını gördüm.” (Buxari / 356, Müslim /517).

## Otuz yeddinci fəsil: Üzərində nişanələr olan paltarda namaz qılmaq.

43- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərində nişanələr olan bir xalatda namaz qılırdı. Birdən onun nişanlarına baxdı. Namazı qurtardıqda, belə dedi: “Bu paltarımı götürün aparın verin Əbu Cəhm ibn Huzeyfəyə , mənə isə qalın əbamı gətirin, bu paltar məni bir az əvvəl namazımdan məşğul etdi.” (Buxari / 373, Müslim / 556).

## Otuz səkkizinci fəsil: Həsirin üzərində namaz qılmaq.

44- İshaq ibn Abdullah ibn Əbi Talha Ənəs ibn Məlikdən belə rəvayət edir: “Ənəs ibn Məlikin nənəsi Muleykə Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bişirdiyi yeməyə dəvət etdi. O , yedikdən sonra belə buyurdu: “Durun sizə namazı qıldırım.” Ənəs ibn Məlik belə buyurdu: “Qalxıb , qalmaqdan qaralmış həsirimizi götürdüm, onun üzərinə su səpərək təmizlədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üzərində durdu. Mən və yetim uşaq onun arxasında, qoca arvad isə bizim arxamızda səfdə durdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə iki namaz qıldırdıqdan sonra getdi” (Buxari / 380. Müslim / 658).

## Otuz doqquzuncu fəsil: Ayaqqabıda namaz qılmaq.

45- Səid ibn Yezid belə rəvayət edir: Ənəs ibn Məlikdən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaqqabıda namaz qıldığı haqda soruşduqda, O: “bəli qılıb” deyə cavab verdi. (Buxari / 386, Müslim / 555).

## Qırxıncı fəsil: Yer üzündə ən birinci tikilən məscid.

46-Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ey Allahın Elçisi yer üzünndə ən birinci tikilən məscid hansıdır?” deyə soruşdum. O belə cavab verdi: “Məscid Əl-Haram (Kəbə)” Mən yenə: “Sonra hansı?” deyə soruşdum. O: “Əl-Əqsa Məscidi” deyə cavab verdi. Sonra isə mən: “Onların arsındakı müddəti” soruşduqda, O belə buyurdu: “Qırx il” sonra isə belə buyurdu: “Harada olursan ol , namaz vaxtı girdiyində namazını qıl. Çünki ora Məsciddir (səcdəgahdır).” (Buxari/3366. Müslim / 5520).

## Qırx birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məscidinin tikilməsi.

47-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə gəldiyində Mədinənin yuxarı məhəllələrində , Bəni Amr ibn Ovf adlanan qəbilənin yaşadığı yerdə on dörd gün qaldı. Sonra isə Bəni Nəccar qəbiləsinin başçılarını çağırmag üçün elçı göndərdi. Onlar qılınclarına qurşanaraq gəldilər. Mən sanki Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəvəsinin üzərində, Əbu Bəkirin də Onun arxasında , miniyinnin tərkində oturmuşdu, Bəni Nəccar qəbiləsinin başçıları da onun ətrafında dayanmağına baxırdım. Hətta gəlib Əbu Eyyubun həyətinə çatdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Namazı vaxtı girdiyində , harada olurdusa , orada da qılırdı. Qoyunlar qalan yerdə də qılırdı. Sonra məscid tikməyi əmr etdi. Bəni Nəccar qəbiləsinin başçılarına xəbər göndərərək onları çağırtdırdı. Gəldiklərində onlara belə dedi: “Mənə bu torpağınızın qiymətini deyin” Onlar belə cavab verdilər: “Allaha and olsun ki, onun qiymətini yalnız Allahdan istəyirik. Ənəs belə buyurdu: “Orada bu dediklərimin hamısı mövcud idi: “Orada xurma ağacları, müşriklərin qəbirləri, xarabalıqlar idi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əmri ilə orada xurma ağacları kəsildi, müşriklərin qəbirləri çıxarılıb başqa yerə köçürüldü, xarabalıq düzəldildi. Sonra xurmalar qiblə tərəfə düzüldü, qapsının dirəkləri isə daşdan düzəldildi. Onlar Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə belə şeir oxuyurdular: “Allahım , Axirət xeyirindən başqa xeyir yoxdur, Ənsar və Mühacirlərə kömək ol.” (Buxari / 438, Müslim / 524)

## Qırx birinci fəsil: Təqva üzərində qurulan məscid haqda

48-Əbu Sələmə ibn Əbdurrahman belə rəvayət edir: “Abdurahman ibn Əbu Səid Əl-Xudri (Allah onların hər ikisindən razı olsun) yanıma gəlmişdi: Ondan belə soruşdum: “Atanın təqva üzərində qurulan məscid haqda nə söylədiyini eşitmisən? O belə cavab verdi: “Atam belə demişdir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bəzi zövcələrinin evində ikən onun yanına daxil oldum və ondan belə soruşdum: “Ey Allahın Elçisi , təqva üzərində qurulan məscid hansıdır? O , yerdən bir ovuc daş götürərək yerə vurdu və belə dedi: “Sizin bu məscidiniz” Mədinədəki məscidi qəsd edərək.” Mən ona belə dedim: “Şəhadət edirəm ki, sənin atanın belə dediyini eşitmişəm.” (Müslim / 1398).

## Qırx üçüncü fəsil: Mədinə və Məkkə məscidində qılınan namazın fəziləti.

49-İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir qadın belə nəzir etdi: “Allah Təala mənə şəfa versə , gedib Əl-Aqsa məscidində namaz qılacağam.” Qadın sağaldı, yola çıxmaq üçün hazırlaşırdı ki, Peyğəmbərin (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi gəldi və ona salam verdi. Qadın ona nə etmək istədiyini xəbər verdikdə , belə dedi: "Otur bişirdiyin yeməkləri ye və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məscidində namaz qıl. Çünki mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Orada qılınan namaz başqa məscidlərdə qılınan namazdan min dəfə əfzəldir, yalnız Məscid Əl-Kəbədən başqa" dediyini eşitmişəm,"( Müslim /1397).

## Qırx dördüncü fəsil: Quba məscidinə gəlmək və orada namaz qılmaq.

50-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Quba məscidinə bəzən piyada , bəzən isə miniklə gələr və iki rükət namaz qılardı." (Buxari / 1193, Müslim /1399).

## Qırx beşinci fəsil: Allah üçün məscid tikənin fəziləti haqda.

51-Mahmud ibn Ləbid (Allah ondan razı olsun) belə rəvayət edir: "Osman ibn Affan (Allah ondan razı olsun) məscidi yenidən tikmək istəyirdi. İnsanlar bunu bəyənmədilər. Onlar məscidin necə var elə qalmasını istəyirdilər. Osman onlara belə buyurdu: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitmişəm: "Allah üçün bir məscid tikənə, Alllah cənnətdə on ev tikər." (Buxari / 450, Müslim /533).

## Qırx altıncı fəsil: Məscidlərin fəziləti haqda.

52-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təalaya ən sevimli olan yer məscidlərdir. Və ən sevmədiyi yer isə bazarlardır." (Müslim / 681).

## Qırx yeddinci fəsil: Məscidə çox addımlamağın fəziləti.

53-Ubeyy ibn Kaab (Allah ondan razı olsun) belə rəvayət edir: "Ənsarlardan bir kişinin evi Mədinənin ən uzaq yerində idi. Bu kişi Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qılınan heç bir namazı buraxmırdı. Onun üçün ürəyim yandığından ona belə dedim: "Ey filankəs , uzunqulaq alsaydın , səni istidən və yerdə olan həşarat və heyvanlardan qoruyardı. O belə cavab verdi: "And olsun Allaha ki, evimin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evinə bağlanmasını istəmirəm." Onun bu sözu mənə şox ağır gəldi. Hətta gəlib Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu xəbər verdim. Onu çağırtdırdıqda o , mənə dediyi kimi eyni sözləri ona dedi və onun hər bir qoyduğu izdə Allahdan savab umduğunu bildirdi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Sənə umduğun şey (savab) verilmişdir." (Müslim / 663).

## Qırx səkkizinci fəsil: Namaza getmək günahları silir, Allah yanında insanın dərəcəsini qaldırır.

54-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Evində dəstəmaz alıb, sonra Allahın evlərindən birininə gedib orada Allahın fərz etdiyi namazlardan birini

qılanın, atdığı addımının biri günahını silər, o biri isə onun dərəcəsini qaldırar." (müslim / 666).

### Qırx doqquzuncu fəsil: Namaza təmkinlə, tələsməyi tərk edərək gəlmək.

55-Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəfə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılarkən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir səs eşitdi. O , "Sizə nə olub?" deyə soruşduqda, Onlar: "biz namaza tələsirdik" deyə cavab verdilər. O , onlara belə buyurdu: "Belə etməyin! Namaza təmkinlə, sakitcəsinə gəlin. Nəyə çatdınız onu qılın. Nəyə çatmamısınızsa onu tamamlayın." ( Buxari / 635, Müslim /603).

### Əllinci fəsil: Qadınların məscidə getməsi.

56-Zeynəb Əs-Saqafi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə buyurmuşdur: "Sizdən biriniz məscidə getdiyində ətirlənməsin". (Müslim / 443).

### Əlli birinci fəsil: Qadınların məscidlərə çıxmasının qadağan olması.

57-Amrata bintu Abdurrahman: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişənin (Allah ondan razı olsun) belə dediyini eşitmişdir: "Əgər Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınların nə etdiyini görsəydi, onlara məscidə getməyi, Bəni İsrail qadınlarına qadağan etdiyi kimi, qadağan edərdi" Mən ondan: "Məgər Bəni İsrailin qadınlarına məscidə getmək qadağan edilmişdi?" deyə soruşduqda, O: "Bəli" deyə cavab verdi." (Buxari / 869, Müslim / 445).

### Əlli ikinci fəsil: Məscidə girərkən deyilən zikr.

58-Əbu Humeyd (və ya Əbu Useyd) (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən biriniz məscidə girdiyiniz zaman belə desin: "Allahummə iftəhli əbvabə rahmətikə." (Allahım mənə rəhmət qapılarını aç). Çıxdıqda isə belə desin: "Allahummə inni əsəlukə min fadlik." (Allahım sənin Lütfündən diləyirəm)." (Müslim / 713).

### Əlli üçüncü fəsil: Məscidə girən kəsin iki rükət namaz qılması.

59-Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: "Məscidə girdiyimdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanların arasında oturmuşdu. Gəlib oturduğumda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Oturmamışdan qabaq iki rükət namaz qılmağa nə mane oldu?" Mən: "Ey Allahın Elçisi , sənin və insanların oturduğunu gördüm" deyə cavab verdikdə, O belə cavab verdi: "Sizlərdən biriniz məscidə girdiyinizdə , iki rükət namaz qılmamış oturmasın." (Buxari/444, Müslim/714).

## Əlli dördüncü fəsil: Azandan sonra məsciddən çıxmağın qadağan olması.

60-Əbu Şəsə belə rəvayət edir: "Əbu Hüreyrə ilə məsciddə oturmuşduq. Müəzzin azan verdi. Bir kişi qalxıb məsciddən getdikdə , Əbu Hüreyrə onun ardınca məsciddən çıxana qədər baxdı , sonra isə belə dedi: "Bu Əbu Əl-Qasimə (Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)) asi oldu." (Müslim / 655).

## Əlli beşinci fəsil: Məscidə düşən tüpürcəyin kəffarəsi.

61-Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Məscidə tüpürcəyin düşməsi günahdır, kəffarəsi isə onu bastırmaq (təmizləməkdir)." (Buxari / 415, Müslim / 552).

## Əlli altıncı fəsil: Sarımsaq yedikdən sonra məscidə gəlməyin bəyənilməməsi.

62-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybər döyüşündə belə dediyini rəvayət edir: "Kim bu ağacdan (yəni sarımsaqdan) yeyərsə məscidlərə gəlməsin." (Buxari / 853, Müslim / 561).

## Əlli yedinci fəsil: Soğan, kəvər və sarımsağ yeyənin məsciddən uzağlaşması.

63-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sarımsağ və soğan yeyən kəs bizdən (və ya məscidimizdən) uzaqlaşıb evində otursun. Sonra ona içində paxla tərəvəz olan bir qab gətirdilər. Onun iyini his etdikdə, onun nə olduğunu soruşdu. Ona onun paxla olduğunu xəbər verdikdə , onu əshabından birinə yaxınlaşdırmasını buyurdu. O , onun yeməyi bəyənməyib yemədiyini gördükdə belə buyurdu: "Ye , çünki sənin danışmadığınla mən danışıram." (Buxari / 252. Müslim / 564).

## Əlli səkkizinzinci fəsil: Soğan və sarımsağ iyi gələni məsciddən çıxarmaq.

64-Mədən ibn Əbu Talha belə rəvayət edir: Ömər ibn Əl-Xattab (Allah ondan razı olsun) cümə günü xütbədə Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və Əbu Bəkri xatırladı və belə dedi: "Mən , sanki məni bir xoruzun üç kərə dimdiklədiyini görmüşəm. Bunu yalnız əcəlimin yaxınlaşdığına yoza bilirəm. Bəzi insanlar mənə xəlifə seçməmi əmr edirlər. Allah Təala dininin, xilafətinin və Peyğəmbərinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) göndərdiyinin itirilməsinə yol verməz. Əgər ölüm məni tez alsa , xilafət bu altı nəfərin arasından bir məşvərət olunaraq seçilsin. Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdiyində onlardan razı idi. Bilirəm bəziləri bu işə tənə edəcəklər. Mən , bu əllərimlə onları İslama qatmışam. Əgər onlar belə etsələr , onda onlar Allahın düşmənləri, kafir və zəllalətə aparanlardırlar. Sonra , mən özümdən sonra , mənim üçün ən onəmli , övladı olmayan kəslərin mirasından başqa bir şey qoymuram. Bu məsələdə Peyğəmbərə(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müraciət etdiyim qədər heç bir məsələdə müraciət etməmişəm. O , mənə bu məsələdə şiddətli olduğu kimi heç bir məsələdə belə şiddətli olmayıb. Hətta barmağı ilə sinəmə də batırıb və belə deyib: "Ey Ömər , məgər sənə Nisə surəsinin

axırında Seyf ayəsi kifayət etmirmi?” Əgər yaşasam , bu mısələdə elə hökm verəcəm ki, bu məsələdə Quranı oxuyan və oxumayan da hökm verə biləcək. Sonra isə belə dedi: “Allahım Sən vilayətlərin üzərindəki əmrlərə şahid ol. Mən onları o vilayətlərə əmir göndərməkdə səbəb yalnız onların adilliklə hökm etmələri və insanlara dinlərini və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sünnətini öyrətmələri, qəniməti onlar arasında bölmələri, onlara çətin olan məsələləri mənə qaldırmalı idi. Sonra , siz, ey insanlar , bu iki ağacdan yeyirsiniz. Mən onları , soğan və sarımsağı , yalnız pis şey olaraq görürəm. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu iy gələn kişini məsciddə gördükdə, onu Bəqi qəbirstanlığına çıxarılmasını əmr etdiyini görmüşəm. Kim ondan yesə , onun iyini bişirərək öldürsün.” (Müslim / 567).

## Əlli doqquzuncu fəsil: Məsciddə itən bir şeyi yüksək səslə axtarmağın qadağan olması.

65-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Kim məsciddə hər hansı bir kişinin itirdiyi bir şeyi yüksək səslə axdardığını eşidərsə, ona belə desin: “Allah sənə onu qaytarmasın” çünki məscidlər bunun üçün inşa edilməyib.” (Müslim / 568).

## Altımışıncı fəsil: Qəbirlərin məscidə (ibadət yerinə) çevrilməsinin qadağan olması.

66-Aişə və Abdullah ibn Abbas (Allah onlardan razı olsun) belə rəvayət edirlər: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ölüm ayağında ikən paltarlarından birini üzünə atırdı. Özünə gəldikdə onu üzündən çəkib, o halda ikən: “Allahın lənəti Yəhudi və Nəsranilərin (Xiristianların) üzərinə olsun. Peyəmbərlərinin qəbirlərini məscidlərə çevirdilər.” deyə buyuraraq onların etdiyi kimi etməyi qadağan etdi.” (Buxari / 435,436, Müslim / 531).

## Altımış birinci fəsil: Məscidlərin qəbirlərin üzərində tikilməsinin qadağan olunması.

67-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Ummu Həbibə və Ummu Sələmə (Allah onlardan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həbəşistanda ikən içində şəkillər olan kilsəni xatılrlatdıqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Onlar onlardan olan saleh bir kişi öldüyündə , onun qəbrinin üzərində məscid tikərdilər. Sonra isə o şəkilləri orada rəsm edərdilər. Onlar qiyamət günü Allah Təalanın ən şər məxluqlarıdırlar.” (Buxari / 427, Müslim / 531).

## Altımış ikinci fəsil: Yer üzü mənim üçün təmiz (pak) və səcdəgah edildi.

68-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Başqa peyğəmbərlərdən altı şeylə üstün oldum: “Mənə Cəvamü Əl- Kəlim (az kəlimə ilə çox məna ifadə edən sözlərlə danışmaq) verildi. Qorxu ilə (düşmənlərin qəlbinə qorxu salmaqla) kömək olundum, qənimətlər mənə halal oldu, yer üzü mənim üçün pak və səcdəgah edildi, bəşəriyətin hamısı üçün göndərildim, Peyğəmbərlər mənimlə möhürləndi (hətm olundular).” (Buxari / 2977. Müslim / 523).

## Altımış üçüncü fəsil: Namaz qılan kimsəni qabağından keçməsini əngəlləmək üçün qoyduğu maniənin hündürlüyünün miqdarı.

69-Əbu Zər (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən biriniz namaza durmaq istədikdə , qabağından keçilməsini əngəlləmək üçün yəhərin arxa qaşı mislində bir sütrə (maniə) qoysun. Əgər qabağından keçilməsini əngəlləmək üçün yəhərin arxa qaşı mislində bir sütrə (maniə) yoxdursa , onda qabağından eşşək və ya qadın və yaxud qara it keçməsi, namazı batil edər. Əbu Zərdən: "Ey Əbu Zər , qara itinin qırmızı və ya sarı itdən fərqi nədir" deyə soruşdum. O belə cavab verdi: "Ey qardaşım oğlu , mən də Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənin məndən soruşduğun kimi soruşduğumda belə buyurdu: "Qara it şeytandır." (Müslim/510).

## Altımışıncı fəsil: Sütrəyə (maniyəyə) yaxınlaşmaq.

70- Suheyl ibn Sad Əs-Saidi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Namaza durduğu yerlə divar arasındakı məsafə bir qoyunun keçə biləcəyi qədər idi." (Buxari /496. Müslim / 508).

## Altımış beşinci fəsil: Namaz qılanın önündən durub getmək.

71-Aişədən (Allah ondan razı olsun) belə rəvayət olunur: "Ona namaz qılanın qarşısından itin, eşşəyin və qadının keçməsi batil etməsini xatırlatdıqda , belə buyurdu: "Bizi eşşək və itlərə bənzər etdiniz. Allaha and olsun ki, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mən onunla qiblənin arasında yataqda uzanmış ikən , namaz qıldığını görmüşəm. Bəzən ehtiyacım olduqda , Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əziyyət etməmək üçün onun ayaqlarının yanından sızaraq çıxırdım" (Buxari/511 Müslim/512).

## Altımış altıncı fəsil:  Üzü Qibləyə doğru durmağın əmr olunması.

72-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi məscidə girərək namaz qıldı. Peyğəmbər isə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  məscidin bir tərəfində idi....Sonra hədisdə belə deyilir: "Namaza durmaq istədikdə dəstəmazı tam bir şəkildə al. Sonra üzü qibləyə doğru tut və təkbir et."

## Altımış səkkizinci fəsil: Qiblənin Şamdan Kəbəyə tərəf çevrilməsi.

73-Barə ibn Əl- Həzib (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Beyt Əl-Məqdisə (Qüdsə) doğru on altı ay namaz qılmışam. Sonra Əl-Bəqərə surəsindəki bu ayə nazil oldu: "Harada olsanız üzünüzü oraya döndərin!" (Əl-Bəqərə/144). Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (Kəbəyə tərəf) namaz qıldıqdan sonra camaatın arasından olan bir kişi çıxıb , Ənsarlardan olan bir dəstə insan namazda ikən onların yanına gələrək, onlara xəbəri çatdırdı. Onlar da üzlərini Kəbəyə tərəf çevirdilər." (Buxari /  7252, Müslim / 525).

## Altımış səkkizinci fəsil: Namaza iqamə verildikdə Fərz namazından başqa namaz qılınamaz.

74-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Namaza iqamə verildikdə Fərz namazından başqa namaz qılınamaz.” (Müslim / 710).

## Altımış doqquzuncu: İqamə verildikdə insanların nə zaman namaza qalxmaları.

75-Əbu Qatədə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Namaza iqamə verildikdə məni görməyincə qalxmayın.” (Buxari / 638. Müslim /604).

## Yetmişinci fəsil: İmam namaza çıxdığında iqamənin verilməsi.

76-Cabir ibn Samura (Allah ondan razı olsun) :“Bilal , günəş zeniti keçdikdə , azan verərdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza çıxmayınca iqamə verməzdi. Onun namaza çıxdığını gördükdə iqamə verərdi.” (Müslim / 606).

## Yetmiş birinci fəsil: İmamın iqamə verildikdən sonra qüsl alamğa getməsi.

77-Əbu Sələmə ibn Abdurrahman ibn Auf Əbu Hüreyrənin (Allah ondan razı olsun) belə dediyini eşitdiyini rəvayət edir: “Namaza iqamə verildi , durub Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza çıxmamış səfləri düzəltdik, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəlib namazgahda dayandı. Təkbir etməmişdən qabaq (qüsl allacağını) xatırladı və bizə “ yerinizdə qalın “deyərək getdi. Biz ayaq üstə durub onun gəlməsini gözlədik. Nəhayət yanımıza çıxdı. Qüsl almışdı, saçından su damcılayırdı. Təkbir edib bizə namazı qıldırdı.” (Buxari / 275, Müslim / 605).

## Yetmiş ikinci fəsil: Səflərin düzəldilməsi.

78-Əbu Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza durduqda əlini çiyinlərimizə sürtərək belə deyərdi: “Düzəlin. Ayrı durmayın ki, qəlbləriniz də ayrılmasın. Mənim arxamda ağıl sahibləri dursun. Sonraki səfdə onlardan sonrakılar, sorakında isə onlardan sonrakılar dursun.” Əbu Məsud belə buyurmuşdur: “Bu gün isə siz daha şiddətli bir ayrılıqdasınız.” (Müslim / 432).

## Yetmiş ikinci fəsil: Birinci səffin (sıranın) fəziləti haqda.

79-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “İnsanlar azan və birinci səffdə nə olduğunu bilsələr, ona nail olmaq üçün püşk atmaq lazım gəlsə belə, onlar bunu edərlər. Namaza tez gəlmək nə olduğunu bilsəydilər, ona nail olmaq üçün bir-birləri ilə yarışardılar. İşa və sabah namazlarında nə olduğunu bilsəydilər, ona iməkləyərək gələrdilər.” (Buxari / 615. Müslim /437).

80-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Kişilərin ən xeyirli səffləri əvvəlincisi, ən şərlisi isə sonuncusudur. Qadınların ən xeyirli səffləri sonuncusu, ən şərlisi isə əvvəlincisidir.” (Müslim /440).

## Yetmiş dördüncü fəsil: Hər namazda misvakla dişləri təmizləmək.

81-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Möminlərə (Zuheyrin hədisində də isə belədir: Ümmətimə) çətinləşdirmək istəməsəydim , onlara hər namaza durduqda misvakla təmizlənməyi əmr edərdim." (Buxari /887, Müslim /252).

## Yetmiş beşinci fəsil: Namaza başlayarkən deyilən zikrin fəziləti.

82-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir. "Bir kişi gəlib (namaza) təngnəfəs səffə qoşuldu və belə dedi: "Əlhəmdu Lilləhi, həmdən kəsiran, tayyibən mubarəkan fihi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirdikdən sonra: "Sizdən bayaqkı sözləri danışan kim idi?" deyə soruşdu. Camaat sakit durdu. O təkrarən: "Bunları deyən kim idi, o pis bir şey deməmişdir" deyə soruşduqda , kişi belə dedi: "Namaza təngnəfəs gəldim və bu sözləri dedim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "On iki mələkin bunu kimin (səmaya) qaldıracağı haqda bir–biri ilə yarışırdıqlarını gördüm." (Müslim / 600).

## Yetmiş altıncı fəsil: Namazda əlləri qaldırmaq.

83- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza durduqda əllərini çiyinləri bərabərində qaldıraraq təkbir (Allahu Əkbər) edərdi. Rukuya getmək istədikdə də eyniylə əllərini qaldırardı. Rukudadan qalxdıqda da eyniylə edərdi. Səcdədən başını qaldırdıqda isə bunu etməzdi." (Buxari/735. Müslim / 290).

## Yetmiş yeddinci fəsil: Namaza başlayarkən və namazı bitirdikdə deyilən zikirlər.

84-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı təkbir və "Əlhəmdu Lilləhi rəbbil Ələmin"–ni oxuyaraq başlayardı. Rukuya getikdə başını nə yuxarı qaldırar. Nə də aşağı salardı. Onların ortasında bir mövqedə tutardı. Rukudan qalxdıqda isə tam dik durmadan səcdəyə getməzdi. Səcdədən başını qaldırdıqda isə tam düz oturmayınca yenidən səcdəyə getməzdi. Hər iki rükətin sonunda təhiyyatı (əttəhiyyatu liillahi......) oxuyardı. Sol ayağının pəncəsini yerə söykəyib sol ayağının pəncəsini qaldıraraq oturardı. Şeytanın oturuşu kimi oturuşu qadağan edərdi. Həmçinin kişinin dirsəklərini (səcdədə) yırtıcı heyvan kimi yerə qoymasını qadağan edərdi. Namazı salam verməklə bitirərdi." (Müslim / 498).

## Yetmiş dördüncü fəsil: Namazda təkbir etmək.

85-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir:" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza durduqda qiyamda (ayaq üstə duraraq namaz qılmaq) ikən təkbir edərdi. Sonra rukuya gedərkən təkbir edərdi. Rukudan belini qaldırarkən: "Səmi Allahu limən həmidəh" tam dikəlib qiyamda durduğu kimi durduqda isə: "Rəbbənə və ləkəl həmd" deyərdi. Sonra təkbir edib səcdəyə gedərdi. Beləcə namazı bitirənə kimi belə edərdi. Həmçinin ikinci rükətdə oturduqdan sonra qalxdıqdada təkbir edərdi." Sonra Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurdu: "Sizlərdən namazının Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazına ən çox oxşayanı mənəm." (Buxari/789, Müslim /392).

## Yetmiş doqquzuncu fəsil: İmamı (namaz qılarkən) təkbir etməkdə və başqa şeylərdə qabaqlamağın qadağan olması.

86-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizi öyrədir və belə deyirdi: “İmamı qabaqlamayın. Təkbir etdiyində təkbir edin. “Vələddallin” dedikdə, “Əmin” deyin. Rukuya getdikdə rukuya gedin. “Səmi Allahu limən həmidəh” dedikdə, “Rabbənə və ləkəl həmd” deyin.” (Müslim /415).

## Səksəninci fəsil: Məmumun (Namazda imamın arxasında duranın) imama (namazda) tabe olması.

87-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) atından yıxıldı və sağ tərəfini zədələdi. Ona baş çəkmək üçün yanına girdik. Namazın vaxtı gəlib çatmışdı. Namazı oturaraq qıldıqda biz də arxasında namazı oturaraq qıldıq. Namazı bitirdikdən sonra belə buyurdu: “İmam yalnız ona tabe olmaq üçündür, təkbir etdiyində sizdə təkbir edin, səcdəyə getdiyində sizdə səcdəyə gedin, qalxdıqda sizdə qalxın, O: “Səmi Allahu limən həmidəh” dedikdə, siz: “Rabbənə və ləkəl həmd” deyin. Oturaraq namaz qılsa sizdə hamılıqla oturaraq qılın.” (Buxari / 378, Müslim / 411).

## Səksən birinci fəsil: Namazda bir əli o biri əlin üzərinə qoymaq.

88-Vail ibn Hücr (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə etdiyini gördüyünü rəvayət edir: “Namaza başlayarkən əllərini (Həmmam belə vəsf etmişdir: “qulaqları bərabərində”) qaldıraraq təkbir etdi. Sonra paltarına bürünərək sağ əlini sol əlinin üzərinə qoydu. Rukuya getmək istədikdə əllərini paltardan çıxarıb qaldırdı və təkbir edərək rukuya getdi. Sonra: “Səmi Allahu limən həmidəh” dedikdə əllərini qaldırdı. Səcdəyə getdikdə iki əlinin arasına səcdə etdi.” (Müslim / 401).

## Səksən iknci fəsil: Təkbir və qiraət arasında nə deməli.

89- Əli ibn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza başladıqda belə deyərdi: “Vəccəhtu vəchiyə lilləzi fətarassaməvati vəl- arda hənifən  və mə ənə min əl- müşrikin. İnnə saləti və nusiki və məhyəyə və məməti lillə hi Rabbil aləmin, lə şərikə ləhu və  bizəlikə umirtu  və ənə minəl müslimin. Allahummə əntəl məliku lə iləhə ənt. Əntə Rabbu və ənə abdukə zaləmtu nəfsi və təraftu bi zənbi, fəğfirli zunubi cəmian, innəhu lə yağfiruzzunubə illə əntə, vəhdini li əhsənil əxlaqi. Lə yəhdi li əhsəniha illə ənt, vasrif ənni seyyiəhə, lə yasrifu ənni seyyiəhə illə ənt, ləbbeykə və sədeykə vəl- xeyru kulluhu fi yedəyk, vəş-şərru leysə ileykə, ənə bikə və ileykə, təbarəktə və təaleyt, əstəğfirukə və ətubu ileyk. (Üzümü hənif (ixlasla Allaha ibadət edənlərdən) olaraq göyləri və yeri yaradana çevirdim. Mən müşriklərdən deyiləm. Şübhəsiz ki, mənim namazım da, qurbanım da, həyatım da, ölümüm də, Aləmlərin Rəbbi olan Allah üçündür. Onun heç bir şəriki yoxdur. Mənə belə buyurulmuşdur və mən müsəlmanlardanam. Allahım! Hökümdar sənsən.

Səndən başqa məbud yoxdur. Sən mənim Rəbbimsən, mən isə sənin qulun. Özümə zülm etdim və gühahımı etiraf edirəm. Mənim bütün günahlarımı bağışla! Şübhəsiz ki, günahları bağışlaya bilən ancaq Sənsən. Mənə ən gözəl əxlaq nəsib et! Onun ən gözəlini bəxş edə bilən ancaq sənsən. Onun pisindən məni uzaq et. Məni onun pisindən uzaq edə biləcək ancaq sənsən. Buyur , əmrindəyəm. Xeyir bütünlüklə sənin iki əlindədir. Şər isə Sənə aid deyildir. Mən Səninləyəm, Sənə də dönəcəyəm. Mübarək və Ucasan. Səndən bağışlanma diləyir və Sənə tövbə edirəm.)" rukudan getdikdə isə belə deyərdi: "Allahummə ləkə rakatu və bikə əməntu və ləkə əsləmtu xaşəa ləkə səmi və bəsari və muxxi və azmi və əsabi. (Allahım! Sənə ruku etdim. Sənə iman gətirdim, Sənə təslim oldum! Qulağım, gözüm. Beynim, sümüyüm, sinirim sənə tabe oldu!). Rukudan qalxdıqda isə belə deyərdi: "Allahummə rabbənə və ləkəl-həmdu miləs-səmavati və miləl-ardi və milə mə beynəhumə və milə mə şitə min şeyin bədu. (Ey Rəbbimiz! Sənə həmd olsun, göylər dolusu, yer dolusu, onların arasında olanlar və bundan sonra dilədiyin şeylər dolusu həmd olsun.)" Sonra səcdədə belə deyir: "Allahummə ləkə səcədtu və bikə əməntu və ləkə əsləmtu səcədə vachi lilləzi xaləqəhu və sovvarahu və şəqqa səməhu və basarahu, təbərakə Allahu əhsənul xaliqin. (Allahım! Sənə  səcdə etdim, Sənə iman gətirdim, Sənə təslim oldum! Üzüm onu yaradana, ona surət verənə, onda göz və qulaq açana səcdə etdi. Yaradanların ən gözəli olan Allah nə qədər Mübarək və Ucadır.). Sonra Təşəhhüdlə, salam arasında ən son dediyi söz belə idi: "Allahummə iğfir li mə qaddəmtu və mə axxartu və mə əsrartu və mə ələntu və mə əsraftu və mə əntə ələmu bihi minni əntəl muqaddəmu və əntəl muaxxaru lə iləhə illə əntə." (Allahım! Əvvəl etdiyim və sonra edəcəyim, gizlin saxladığım və üzə çıxardığım, xəta etdiyim və məndən daha yaxşı bildiyin əmmələrimi bağışla. Əvvələ çəkən də Sənsən, təxirə salan da Sənsən. Səndən başqa məbud yoxdur.). bəzi rəvayətdə isə belə deyilir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza başlayarkən təkbir edər , sonra isə belə deyərdi: ""Vəccəhtu vəchiyə..." hədisi tamamı ilə" (Müslim / 771).

## Səksən üşüncü fəsil: Namazda "Bismillahır Rahmanir Rahim"-i (Rəhimli və Mərhəmətli Allahın adıyla) səslə oxunmasının tərk edilməsi.

90-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir:"Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), Əbu Bəkrlə, Ömər və Osmanla (Allah onlardan razı olsun) namaz qıldım. Onlarım heç birinin "Bismillahır Rahmanir Rahim"-i (Rəhimli və Mərhəmətli Allahın adıyla) oxuduğunu eşitmədim."(Buxari / 743, Müslim / 399).

## Səksən dördüncü fəsil: "Bismillahır Rahmanir Rahim"-i (Rəhimli və Mərhəmətli Allahın adıyla) haqda

91-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizim aramızda ikən mürgülədi. Sonra gülümsəyərək başını qaldırdı. Biz "Səni güldürən nədir , Ey Allahın Elçisi?" deyə soruşduqda, O belə cavab verdi: "Mənə bir az əvvəl bir surə nazil oldu: "Mərhəmətli, Rəhmli Allahın adı ilə! 1-Həqiqətən, Biz sənə Kövsər bəxş etdik! 2 - Ona görə də Rəbbin üçün namaz qıl və qurban kəs! 3-Sənin düşmənin özü sonsuzdur!" sonra isə belə soruşdu: "Kövsərin nə olduğunu bilirsinizmi?" Biz "Allah və Elçisi bilən yaxşıdır" deyə cavab verdikdə. O belə buyurdu: "O , Allahın mənə vəd etdiyi çaydır. Onda çoxlu xeyr vardır. O qiyamət günü ümətimin yanına yığışdığı hovuzdur. Onun qədəhlərinin sayı ulduzlar qədərdir. bəndələrdən biri ondan çıxarılıb atıldığında mən: "Rəbbim o mənim ümmətimdəndir" deyəcəm ,

onda mənə belə buyurulacaq: “Sən onların səndən sonra nə etdiklərini bilmirsən.” (Müslim/400).

## Səksən beşinci fəsil: Namazda Quranın anası sayılan (Fatihə surəsinin) oxunmasının vacibliyi.

92- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Namaz qılıb namazda Quranın anası sayılan (Fatihə surəsi) oxumazsa , namazı naqisdir! Namazı naqisdir! Namazı naqisdir! Tamam deyidir.” Əbu Hüreyrəyə (Allah ondan razı olsun) belə dedilər: “Biz namazda imamın arxasında oluruq , onda neçə.” O belə cavab verdi: “Onu (Fatihəni) öz nəfsində oxu. Çünki Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: “Allah Təala belə buyurur: “Namazı bəndəmlə öz aramda iki hissəyə böldüm.  Və bəndəmə istədiyi veriləcək. Bəndəm: “Həmd olsun Allaha aləmlərin Rəbbinə” dedikdə. Allah Təala qulum mənə həmd etdi” buyurar. Bəndəm: “Mərhəmətli, (axirətdə isə ancaq möminlərə) Rəhimli olana” dedikdə, Allah Təala “qulum mənə səna etdi” deyə buyurar. Bəndəm: “Haqq-Hesab gününün sahibinə!” dedikdə. Allah Təala qulum məni təriflədi” deyə buyurar. (Bir dəfə isə belə buyurdu: “Qulum (onu) mənə həvalə etdi.) “Biz yalnız Sənə ibadət edirik və yalnız Səndən kömək diləyirik” dedikdə. O: “Bu, mənimlə qulum arasındadır və quluma istədiyi veriləcək.” Deyə buyurdu. “Bizi doğru (düz) yola yönəlt! Nemət verdiyin kəslərin yoluna! Qəzəbə düçar olmuşların və (haqdan) azmışların (yoluna) yox!” dedikdə. O:” Bu, qulum üçündür, quluma istədiyi  veriləcək” deyə buyurdu.” (Müslim / 395).

## Səksən altıncı fəsil: Qurandan bildiyini oxumaq.

93-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məscidə daxil oldu. Onun ardından bir kişi məscidə daxil olub namaz qıldı, sonra gəlib Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) salam verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun salamını alıb ona: “Qayıt namazını qıl, çünki sən namaz qılmadın” deyə ona buyurdu. Kişi qayıdıb əvvəl qıldığı kimi eyniylə namazını qıldı sonra gəlib Peyğəmbərə  (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) salam verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Sənə də salam olsun” dedi. Sonra isə: “Get namaz qıl, çünki sən namaz qılmadın” deyə buyurdu. Bunu üç kərə təkrarladıqdan sonra kişi belə dedi: “Səni haqq dinlə göndərənə and olsun ki, bundan başqasını bacarmıram, mənə öyrət.” O belə buyurdu: “Namaza durduqda təkbir et sonra qurandan bildiyini (əzbərlədiyini) oxu. Sonra ruku et və rukuda tam rahatlaşana kimi qal. Sonra tam düz dayanana kimi qalx. Sonra səcdə et və səcdədə tam rahatlaşana kimi qal. Sonra qalx və tam rahat otur. Bunu bütün namazlarında et.”

## Səksən yeddinci fəsil: İmamın arxasında (Quran) oxumaq.

94-İmran ibn Huseyn (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə Zöhr və ya Əsr namazını qıldırdı. Sonra isə belə soruşdu: “Mənim arxamda “Ən uca olan Rəbbinin adını pak (müqəddəs) tutub şəninə tariflər de!” surəsini oxuyan kim idi?” Bir kişi: “Mən idim. Mən bunu etməkdə xeyirdən başqa bir şey qəsd etmədim.” Deyə cavab

verdikdə, O belə buyurdu: “Bəzilərnizin bunu mənim ağzımdan götürdüyünü anladım.” (Müslim / 298).

## Səksən səkkizinci fəsil: Həmd etmək və Amin demək.

95-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “İmam “Amin” dedikdə siz də “Aminn” deyin. Çünki kimin “Amin” deməsi mələklərin “Amin” deməsinə müvafiq olarsa onun keçmiş günahları bağışlanar.” İbn Şihab belə buyurmuşdur: “Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) “Amin” deyərdi.” (Müslim / 410).

## Səksən doqquzuncu fəsil: Sabah namazının qiraəti haqda.

96-Simək ibn Hərb belə rəvayət edir: “Cəbir ibn Səmuradan (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı haqda soruşdum. O belə buyurdu: “Namazı xəfif (qısa) qılar. Onların etdiyi kimi (uzun) qılmazdı.” Sonra mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sabah namazında “Qaf! Şanlı Qurana and olsun” və ona bənzər surə oxuduğunu xəbər verdi.” (Müslim / 458).

## Doxsanıncı fəsil: Zöhr və Əsr namazlarının qiraəti haqda.

97-Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə Zöhr və Əsr namazlarını qıldırdıqda qiraət edərdi. Əvvəlki iki rükətdə “Fatihə” və Qurandan bir surə oxuyar. Bəzən isə ondan bir ayəni bizə eşitdirərdi. Sonuncu iki rükətdə isə yalnız “Fatihə” surəsini oxuyardı.” (Müslim / 451).

98-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zöhr namazında qiraət edərdi. Əvvəlki iki rükətin hər birində otuz ayə miqdarında, sonuncu iki rükətdə isə (onun yarısı) on beş ayə miqdarında oxuyardı. Əsr namazında isə ilk iki rükətin hər birində on beş. Sonuncu iki rükətdə isə onun yarısı miqdarında ayə oxuyardı.” (Müslim / 452).

## Doxsan birinci fəsil: Məğrib namazının qiraəti haqda.

99- İbn Abbas (Allah onlarlın hər ikisindən razı olsun) belə rəvayət edir: Hərisin qızı Ummu Fadl Onun (ibn Abbasın) “And olsun bir-birinin ardınca göndərilənlərə” surəsini oxuduğunu eşitdi və belə buyurdu: “Ey oğlum , qiraət etdiyin bu surə mənə bir şeyi xatırlatdı. Bu , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ən son Məğrib namazında oxuyarkən eşitdiyim surədir.” (Müslim / 462).

## Doxsan ikinci fəsil: Sonuncu İşa namazının qiraəti haqda.

100- Cəbir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: “Muaz (Allah ondan razı olsun) Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılar sonra isə gedib qövmünə imamlıq edərək onlara namaz qıldırardı. Bir gecə o , Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İşa namazını qıldıqdan sonra gedib qövmünə Əl-Bəqərə surəsi ilə

başlayaraq namazı qıldırdıqda, bir kişi çevrilərək salam verib namazdan çıxdı və tək namazını qılıb getdi. Onlar ona: “Ey filankəs, sən münafiqlik etdin” dedikdə, o belə dedi: “And olsun Allaha ki, Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu xəbər verəcəyəm. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib belə dedi: “Ey Allahın Elçisi , biz dəvələrə su verənik. Gündüzlər işləyirik. Muaz səninlə İşa namazını qıldıqdan sonra gəlib bizə namazı Əl- Bəqərə surəsi ilə başladı.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çevrilib Muaza belə buyurdu: “Ey Muaz , məgər sən fitnəkarsan? Bunu və bunu oxu!” Sufyan belə buyurmuşdur: “Amra belə dedim: “Əbu Əz-Zubey bizə Cabirin belə dediyini rəvayət etdi: “And olsun günəşə və onun işığına”, “And olsun səhərə”, “And olsun (aləmi zülmətə) bürüməkdə olan gecəyə” və “Ən uca olan Rəbbinin adını pak (müqəddəs) tutub şəninə təriflər de!” surəsini oxu.” Amr belə buyurmuşdur: “bunun kimi surələri”).” (Müslim / 456).

### Doxsan üçüncü fəsil: İmamı ruku və səcdədə qabaqlamağın qadağan olması.

101- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə namazı qıldırdı. Namazı bitirdikdən sonra üzünü bizə çevirib belə buyurdu: “Ey insanlar , mən sizin imamınızam. Məni ruku, səcdə, qiyam və namazı bitirməkdə qabaqlamayın. Həqiqətən mən sizi önümdən və arxamdan görürəm. Sonra isə belə buyurdu: “Muhəmmədin nəfsi əlində olana and olsun ki, mənim gördüyümü görsəydiniz az gülüb çox ağlayardınız.” Ondan: “Nə görmüsən , Ey Allahın Elçisi?” deyə soruşduqda, O: “Cənnət və Cəhənnəmi” deyə cavab verdi.” (Müslim /426).

### Doxsan dördüncü fəsil: İmamdan qabaq başın qaldırılmasının qadağan olunması.

102- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Namazında imamdan qabaq başını qaldıran , Allahın onun surətini eşşəyin surətinə çevirməyəcəyinə nə ilə əmin olur?” (Buxari/691, Müslim/427).

### Doxsan beşinci fəsil: Rukuda əllərin bir-birinin üzərinə qoyulması.

103- Əl-Əsvad və Əlqamə belə rəvayət edir lər: “Abdullah ibn Məsud evində ikən yanına gəldik. Bizə: “Arxanızdakılar namaz qılıblar?” deyə soruşdu. Biz: “Xeyr deyə cavab verdikdə , o : “Durun qılın” deyə buyurdu. Bizə azan və iqamə verməyi buyurmadı. Biz onun arxasında durmaq istədikdə, əlimizdən tutub birimizi sağ , o birimizi isə sol tərəfinə qoydu. Rukuya getdikdə , əllərimizi dizimizin üzərinə qoyduqda əllərimizə vurdu. Əllərini bir-birinin üzərinə qoyaraq ayaqlarını arasına saldı. Elə ki, namazı bitirdi belə dedi: “Sizin üzərinizdə elə əmirlər olacaq ki , namazları vaxtında qılmayaraq gecikdikdirib vaxtı çıxdıqdan sonra qılacaqlar. Onların belə etdiyini gördüyünüz zaman , siz namazları vaxtında qılın. Onlarla qıldığınız namaz isə sizim üçün nafilə olsun. Üç nəfər olsanız , bir yerdə namaz qılın. Daha çox olduqda içinizdən biri sizə imamlıq etsin. Sizlərdən biriniz rukuya getdiyi zaman qollarını budlarının üzərinə qoyaraq əyilsin əllərinidə bir-birinin üzərinə qoysun.” Sonra isə belə dedi: “Doğrusu , mən sanki hələ də Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) barmaqlarının hərəkətinə baxır və onları görürəm.” (Müslim /534).

## Doxsan altıncı fəsil: Rukuda əllərin dizlərə qoyulması və əllərin bir-birinin üzərinə qoyulmasının hökmünün ləğvı.

104- Musab ibn Səad belə rəvayət edir: “Atamın yanında namaz qıldım. Əllərimi iki dizimin arasına qoyduğumda, atam mənə belə dedi: “Əllərini dizlərinin üzərinə qoy”. Sonra mən bunu bir dəfə də etdiyimdə, əllərimə vuraraq belə dedi: “Bizə belə etmək qadağan olunub. Bizə əllərimizi dizlərimizin üzərinə qoymaq əmr olunub.” (Buxarı / 790, Müslim / 530).

## Doxsan yeddinci fəsil: Ruku və səcdədə deyilən zikrlər.

105- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ruku və səcdədə bu zikri çox deyərdi: “Subhənəkə Allahummə Rəbbənə və bihəmdik, Allahummə iğfirli (Allahım! Sən pak və müqəddəssən. Sənə həmd olsun. Allahım məni bağışla),”.( Buxari / 817, Müslim / 484).

## Doxsan səkkizinci fəsil: Ruku və səcdədə Quranan oxumağın qadağan olunması.

106- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) pərdəni açdığında , insanlar Əbu Bəkirin arxasında səfdə durmuşdular. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Ey insanlar, peyğəmbərlik müşdəsindən yalnız müsəlman olan bir kimsənin gördüyü və ya ona göstərilən saleh bir yuxudan başqa bir şey qalmamışdır. Mənə ruku və səcdədə Qurandan oxumaq qadağan olunmuşdur, rukuda Allah Təalaya təzim edin, səcdədə isə dua etməyə çalışın, çünki səcdədə duanızın qəbul olunması daha yəqindir.” (Müslim / 479).

## Doxsan doquzuncu fəsil: Rukudan başını qaldırarkən deyilən zikr.

107- Əbu Səid Əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başını rukudan qaldırarkən belə deyərdi: “Allahummə rabbənə və ləkəl-həmdu miləs-səmavati və miləl-ardi və milə mə beynəhumə və milə mə şitə min şeyin bədu Əhləs sənəi vəl-Məcd, Əhaqqu mə qaləl Abd və kullunə Abdun lə məniə limə ateytə və lə mutiyə limə mənətə və lə yənfəu zəl cəddi milkə əlcədd. (Ey Rəbbimiz , sənə həmd olsun, göylər dolusu, yer dolusu, onların arasında olanlar və bundan sonra dilədiyin şeylər dolusu həmd olsun. Ey Tərif və Şərəf sahibi! Bəndənin-hamımımz Sənin qulunduq-söylədiyi ən doğru söz budur. Allahım! Sənin verdiyinə mane olacaq, mane olduğuna da verəcək yoxdur. Heç bir hörmət sahibinə Sənin yanında hörməti fayda verməz.)” (Müslim / 477).

## Yüzüncü fəsil: Səcdə etmənin fəziləti və çox səcdə etməyə rəğbətləndirmək.

108- Mədən ibn Əbi Talha əl-Yamuri belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mövlası Sövbanla qarşılaşdım və ondan: “Allahın , məni o əmələ görə cənnətə salacağı bir əməl haqda (və ya Allahın ən çox sevdiyi əməl haqda) soruşdum. O susdu. Sonra mən yenidən soruşdum. O yenə də susdu. Sonra mən üçüncü dəfə soruşduqda, o belə dedi: “Mən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu haqda soruşduqda mənə belə buyurdu: “Allaha çox sayda səcdə et, çünki Allah

üçün etdiyin hər bir səcdə ilə Allah Təala sənin dərəcəni qaldırar və sənin günahlarını silər.” Mədən belə demişdir: “Sonra Əbu Darda ilə qarşılaşdım ondan bu haqda soruşduqda, mənə eyni Sövbanın dediyi kimi cavab verdi.” ().

## Yüz birinci fəsil: Səcdədə dua etmək.

109- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bəndənin Rəbbinə ən yaxın olduğu an səcdədə olduğu andır. O halda (oluğunuz ikən) çox dua edin.” (Müslim / 482).

## Yüz ikinci fəsil: Neçə əzaların üzərində səcdə edilər.

110- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Yeddi sümük üzərinə səcdə etməyə əmr olundum: “ Alın (əli ilə burnuna işarə etdi), əllər, ayaqlar (dizlər) və ayaqların ucları. Paltar və saçı (çəkməməyə( yığmamağa), toplamamağa əmr olundum.” (Müslim / 490).

## Yüz üçüncü fəsil: Düzgün səcdə etmək və dirsəkləri qaldırmaq.

111- Ənəs (Allah ondan razı olsun) Peyğəmbərin (Ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Səcdəni düzgün ediniz , sizlərdən biri  qollarını itin sərdiyi kimi yerə sərməsin.” (Müslim / 493).

## Yüz dördüncü fəsil: Səcdədə əllərin aralı qoyulması.

112- Abdullah ibn Məlik ibn Buheynə belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz (səcdə) edərkən əllərini o qədər aralı tutardıki onun qoltuqlarının bəyazlığı görünərdi.” (Müslim / 495).

## Yüz beşinci fəsil: Namazda oturuşun vəsfi.

113- Abdullah ibn Zubeyr (Allah onların hər ikisindən razı olsun): belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazda oturarkən sol ayağını sağ budu ilə baldırının arasına salar saq ayağını isə yerə sərərdi. Sol əlini sol dizinin üzərinə, sağ əlini isə sağ budunun üzərinə qoyaraq barmağı ilə işarə edərdi.” (Müslim / 479).

## Yüz altıncı fəsil: Qədəmlərin ucunun üzərinə oturmaq.

114- Tavus belə rəvayət edir: “İbn Abbasdan (Allah onların hər ikisindən razı olsun) qədəmlərin  üzərində oturmaq barəsində soruşduqda , belə buyurdu: “Bu , sünnətdir” biz ona: “Bunu kişi üçün cəfa (əziyyət) sayırıq” dedikdə, O belə buyurdu: “Lakin bu, sizin Peyğəmbərnizin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sünnətidir.” (Müslim / 536).

## Yüz yeddinci fəsil:  Namazda təşəhhüd demək.

115- Həttan ibn Abdullah ər-Raqaşi belə rəvayət edir: “Əbu Musa ilə (Allah ondan razı olsun) birlikdə bir namaz qıldım. Elə ki, təşəhhüdə oturduq camaatdan bir kişi belə dedi: “Namaz, sədəqə və zəkatla birgə iqrar oldu.” Əbu Musa namazı bitirdikdən sonra: çevrilib “Bu və bu kəlimələri deyən kim idi?” deyə soruşdu. Camaat susdu. O yenidən: “Bu və bu kəlimələri deyən kim idi?” deyə soruşdu. Camaatın yenə susduğunu gördükdə: “Ey Həttan , yəqin sən demisən?” deyə məndən söruşdu. Mən belə dedim: “Bunu mən demədim” məni buna görə danlamağından qorxdum.” Camaatdan bir kişi: “Mən dedim, xeyirdən başqa bir şey qəsd etmədim (istəmədim)” deyə cavab verdikdə, Əbu Musa belə buyurdu: “Namazda nə deyəcəyinizi bilmirsiniz? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə xitab edərək bizə sünnətini bəyan etdi, bizə namazımızı öyrətdi və belə buyurdu: “Namaza durduğunuzda səflərinizi düzəldin. Sonra biriniz sizə imamlıq etsin. O, təkbir etdiyində təkbir edin, O “Ğeyril mağdubi aleyhim və ləddalin dedikdə” siz “Amin” deyin ki, Allah Təala sizi sevsin. Təkbir edib rukuya getdiyində, sizdə təkbir edib rukuya gedin. Çünki imam sizdən öncə rukuya gedir. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Bu an bununla bitir. O “Səmi Allahu limən həmidəhu (Allah ona həmd edəni eşitdi)” dedikdə siz “ Allahummə Rəbbənə ləkəl həmd (Ey Rəbbimiz! Sənə həmd olsun)” deyin ki, Allah Təala sizi eşitsin. Çünki Allah Təala Peyğəmbərinin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dili ilə “Səmi Allahu limən həmidəh (Allah ona həmd edəni eşitdi) demişdir. Təkbir edib səcdə etdikdə siz də təkbir edib səcdə edin. Çünki imam sizdən qabaq səcdə edər və sizdən qabaq səcdədən qalxar.” Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Bu an bununla bitir. Oturduqda isə sizin deyəcəyiniz ilk söz bu olsun: “ Əttəhiyyahu ət-tayyibətu əs-salavatu lilləhi. Əs-salamu Əleykə Əyyuhən Nəbiyyu və rahmətullahi və bərəkətuhu. Əs- sələmu aleynə və əla ibədilləhilləhi əs-salihin, Əşhədu ən lə iləhə illəllahu və əşhədu ənnə Muhəmmədən Əbduhu və Rasuluhu. (Salamlar,dualar və gözəl şeylər Allaha aiddir. Ey peyğəmbər, sənə Allahın salamı, mərhəməti və Onun bərəkəti olsun. Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd onun qulı və elçisidir.” (Müslim / 404).

116- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə təşəhhüdü Qurandan bir surə öyrətdiyi kimi öyrədirdi. Və belə buyurdu: “Əttəhiyyatu əlmubarəkət vəs-salavatu ət-tayyibətu liiləhi. Əs-salamu Əleykə Əyyuhən Nəbiyyu və rahmətullahi və bərəkətuhu. Əs-sələmu aleynə və əla ibədilləhilləhi əs-salihin, Əşhədu ən lə iləhə illəllahu və əşhədu ənnə Muhəmmədən Əbduhu və rasuluhu. (Salamlar, mübarək dualar və gözəl şeylər Allaha aiddir. Ey peyğəmbər, sənə Allahın salam mərhəməti və Onun bərəkəti olsun, Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd onun qulı və elçisidir.” İbn Rumeyhin rəvayətində isə belə deyilir: “bizə quranı öyrətdiyi kimi öyrədərdi.” (Müslim / 403).

## Yüz səkkizinci fəsil: Namazda nədən Allaha sığımaq.

117- Urva ibn Zubeyr (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişənin (Allah ondan razı olsun) ona belə xəbər verdiyini rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazda belə dua edərdi: “Allahummə inni əuzu bikə min əzəbil qabri və əuzu bikə min fitnətil məsih Əd-dəccal və əuzu bikə min fitnətil məhyai vəl-məmət. Allahummə! İnni əuzu bikə mih

əl-məsəmi vəl-məğrəmi. (Allahım! Həqiqətən, mən qəbir əzabından və yalançı məsihin (Allahlıq və yə reyğəmbərlik iddiası edən) fitnəsinin, həyatın və ölümün fitnəsindən , şərindən Sənə sığınıram. Allahım , günahdan və cərimədən (borcdan) sənə sığınıram." Bir kişi ondan: "Ey Allahın Elçisi , borca görə nə çox Allaha sığınırsan?" deyə soruşduqda, O belə cavab verdi: "Kişi borca düşdükdə yalan danışar, vəd verdikdə ona xilaf çıxar." (Müslim / 589).

## Yüz doqquzuncu fəsil: "Namazda dua etmək"

118- Əbu Bəkrin (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyi rəvayət olunur: "Mənə elə bir dua öyrət ki, onunla namazda (və evimdə) dua edim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "de: "Allahummə inni zaləmtu nəfsi zulmən kəbiran (bəzi rəvayətlərdə isə: "kəsiran" ) və lə yəğfiruzzunubə illə əntə. Fəğfir li min indikə vərhəmni innəkə Əntəl-Ğafur ər-Rahim." (Allahım mən nəfsimə böyük bir zülm (bəzi rəvayətdə isə: "çoxlu zülm etdim") etdim. Günahları səndən başqa bağışlayan yoxdur. Məni öz dərgahından bir məğfirətlə bağışla. Həqiqətən sən Bağışlayan və Rəhimlisən." (Müslim / 2705).

## Yüz onuncu fəsil: Namazda şeytanı lənətləmək və ondan Allaha sığınmaq.

119- Əbu Dərda (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayağa qalxdı. Onun belə dediyini eşitdik: "Səndən Allaha sığınıram. Sonra isə belə dedi: "Səni Allahın lənəti ilə lənətləyirəm" bunu üç kərə təkrarladı və əlini sanki bir şey götürən kimi uzatdı. Namazı bitirdikdən sonra ondan: "Ey Allahın elçisi , sənin namazda bundan əvvəl heç deməmiyin şeyləri dediyini eşitdik və əli üzatdığını gördük" deyə soruşduqda, O belə cavab verdi: "Alladın düşməni İblis bir şölə alovla gələrək onu üzümə tuturdu. Mən də ona üç kərə "Səndən Allaha sığınıram" dedim. Sonra isə üç kərə: "Səni Allahın lənəti ilə lənətləyirəm" dedim. Lakin o geri çəkilmədi. Sonra onu tutmaq istədim. And olsun Allaha , qardaşım Süleymanın duası olmasaydı , onu bağlayrardım və Mədinə əhlinin övladları onunla oynayardı." (Müslim /542).

## Yüz on birinci fəsil: Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) salavat demək.

120- Əbu Məsud Əl-Ənsari belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanımıza gəldi. Biz Səad ibn Ubadənin məclisində idik . Bəşir ibn Səad ona belə dedi: "Allah Təala bizə sənə salavatı deməyi əmr edib. Sənə salavatı necə deyək?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) susdu. Biz , kaş ki, o bunu soruşmayaydı , deyə arzuladıq. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahummə salli əla Muhəmmədin və əla Ali Muhəmməd, kəmə saleyytə əla əli İbrahim. Ba bərik əla Muhammədin və əla əli Muhəmməd. Kəmə barəktə əla əli İbrahim, fil aləminə innəkə Həmidun Məcid (Allahım! Muhəmmədə və onun ailəsinə də İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi xeyir-dua ver! Muhəmmədə və onun ailəsinə də İbrahimin ailəsinə bərəkət verdiyin kimi bərəkət ver! Sən həqiqətən həmdə layiq və şan-şövkətlisən " salam vermək isə bildiyiniz kimi."(Müslim / 405).\

## Yüz on ikinci fəsil: Namazı bitirərkən salam vermək.

121- Amir ibn Səad atasının belə dediyini rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sağa və sola salam verdiyini görürdüm. Hətta yanaqlarının ağlığını belə görürdüm.” (Müslim / 582).

## Yüz on üçüncü fəsil: “Namazda salam verdikdə əl ilə işarə etməyin beyənilmir”

122- Cəbir ibn Səmura (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılarkən “Əssələmu əleykum və rəhmətullah”, “Əssələmu əleykum və rəhmətullah” deyəndə əl ilə iki tərəfə işarə edərdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Ələrinizi hara uzadırsınız?” başqa bir rəvayətdə isə: “Nə üçün əllərinizi qaldırıb, əhilləşdirilməmiş at quyruğunu tərpəddiyi kimi tərpədirsiniz? Əllərinizi dizinizin üzərinə qoyub qardaşına sağa və sola salam verməyiniz kifayət edər.” (Müslim / 431).

## Yüz on dördüncü fəsil: Namazı bitirərkən salam verdikdən sonra nə deməli.

123- Muğira ibn Şöbənin mövlası Varrad belə rəvayət edir: “Muğirə ibn Şöbə (Allah ondan razı olsun) Müaviyyəyə (Allah ondan razı olsun) belə yazdı: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirib salam verdikdən sonra belə deyərdi: “Lə İləhə illə Allah vahdəhu Lə Şərikə ləhu Ləhul mülku və ləhul həmdu və huvə əla kulli şeyin qadir. Allahummə lə mənia limə Əteytə və lə mutiya limə mənətə və lə yənfəu zəl cəddi minkə əl cədd. (Allahdan başqa ibadətə layiq məbud yoxdur, O təkdir, Onun heç bir şəriki yoxdur. Mülk Onundur və həmd Onadır! O hər şeyə qadirdir. Allahım! Sənin verdiyinə mane olacaq, mane olduğunu verəcək yoxdur. Heç bir hörmət sahibinə, Sənin yanında hörməti fayda verməz.” (Müslim / 93).

## Yüz on beşinci fəsil: Namazdan sonra təkbir etmək.

124- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazının bitməsini, təkbirdən bilirdik.” (Müslim / 583).

## Yüz on altıncı fəsil: Namazdan sonra Təsbih (Subhən Allah), Təhmid (Əlhəmdulilləh), Təkbir (Allahu Əkbər) demək.

125- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər kim namazdan sonra otuz üç dəfə Sübhənallah, otuz üç dəfə Əlhəmdulilləh və otuz üç dəfə Allahu Əkbər desə - hamsı doxsan doqquz edər- və yüzü tamamlayıb bir dəfə “Lə İləhə illə Allah vahdəhu Lə Şərikə ləhu Ləhul mülku və ləhul həmdu və huvə əla kulli şeyin qadir. (Allahdan başqa ibadətə layiq məbud yoxdur, O təkdir, Onun heç bir şəriki yoxdur. Mülk Onundur və həmd Onadır! O hər şeyə qadirdir.)” desə onun günahları dənizin köpükləri qədər olsa belə bağışlanar.” (Müslim / 597).

## Yüz on yeddinci fəsil: Namazı bitirdikdən sonra sol və ya sağ tərəfindən çevrilmək.

126- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: “Sizlərdən biriniz nə badə , namazı bitirdikdən sonra yalnız sağ tərəfindən çevrilməyi haqq

olaraq görüb öz nəfsindən şeytana pay ayırsın. Çünki Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirdikdən sonra ən çox sol təfindən cevrildiyini görmüşəm.” (Müslim / 707).

## Yüz on səkkizinci fəsil: İmam durmağa kimin daha layiq olması.

127- Əbu Məsud Əl-Ansari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bir qövmə onların Quranı ən çox biləni imamlıq etsin. Əgər Quranı bilməkdə eyni səviyyədə olsalar, onda sünnəti daha çox biləni imamlıq etsin. Əgər sünnəti bilməkdə də eyni səviyyədə olsalar, onda ilk hicrət edən imamlıq etsin. Əgər hicrət etməkdə də eyni səviyyədə olsalar, onda ilk islamı qəbul edən imamlıq etsin. Heç bir kişi başqa bir kişiyə onun hakim olduğu yerdə izni olmadan imamlıq etməsin. Və heç kim bir kişinin evində onun izni olmadan onun şərəf verdiyi yerdə oturmasın.” (Müslim / 673).

## Yüz on doqquzuncu fəsil: İmama tabe olmaq və ondan sonra əməl etmək.

128- Bara (Allah ondan razı olsun) belə rəvayət edir: “ Biz Peyğəmbərlə (Ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılarkən, o , ruku etdiyində, ruku edərdik, başını rukudan qaldırıb: “Səmi Allahu limən Həmidəh” dedikdə, biz onun üzünü yerə qoyduğunu görənədək qiyamda dayanardıq , sonra onun ardınca onun etdiyini edərdik.” (Müslim / 474).

## Yüz iyirminci fəsil: İmamlara namazı xəfifləşdirmək əmri.

129- Əbu Məsud əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına bir kişi gələrək belə dedi: “Mən sübh namazına , filankəsin namazı bizə uzun qıldırdığından dolayı , gec çıxıram.” Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o gün xitab edərkən elə qəzəbləndiyi kimi, bundan öncə heç bir xitabında belə qəzəblənməmişdir. Belə buyur: “Ey insanlar , həqiqətən içinizdə həddi aşanlar vardır, sizlərdən kim insanlara imamlıq etsə , namazı xəfif qılsın, çünki arxasında qocalar, zəiflər və ehtiyac sahibləri vardır.” (Müslim /466).

## Yüz iyirmi birinci fəsil: İmam xəstələndikdə onu əvəz edərək insanlara namaz qıldırmaq.

130- Ubeydullah ibn Abdullah belə rəvayət edir: “ Aişənin (Allah ondan razı olsun) yanına daxil olub ondan belə soruşdum: “Mənə Peyğəmbərin (Ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəstəliyi haqda danışarsan?” O: “bəli” deyə cavab verdikdən sonra belə buyurdu: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəziyəti ağırlaşdığında belə dedi: “İnsanlar namazı qıldılar?” biz: “Xeyr , Ey Allahın elçisi, onlar səni gözləyirlər” deyə cavab verdikdə , O dedi: “Mənim üçün bir qabda (ləyəndə) su qoyun” biz onun buyurduğu kimi etdik. O yuyundu , sonra qalxmaq istədi , lakin huşunu itirdi. Sonra ayıldıqda yenə “İnsanlar namazı qıldılar?” deyə soruşdu? Biz yenə: “Xeyr , Ey Allahın elçisi, onlar səni gözləyirlər” deyə cavab verdik. O dedi: “Mənim üçün bir qabda (ləyəndə) su qoyun” biz onun buyurduğu kimi etdik. O yuyundu , sonra qalxmaq istədi , lakin huşunu itirdi. Sonra ayıldıqda yenidıən: “İnsanlar namazı qıldılar?” deyə soruşdu.Biz yenə: “Xeyr , Ey Allahın elçisi, onlar səni gözləyirlər” deyə cavab verdikdə , belə dedi: “Mənim üçün bir qabda (ləyəndə) su qoyun” .Biz

onun buyurduğu kimi etdik. O yuyundu , sonra qalxmaq istədi , lakin huşunu itirdi. Sonra O , yenə ayıldıqada: “İnsanlar namazı qıldılar?” deyə soruşdu. Biz yenə: “Xeyr , Ey Allahın elçisi, onlar səni gözləyirlər” deyə cavab verdik. Aişə (Allah ondan razı olsun) belə buyurdu: “İnsanlar məsciddə oturub Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İşa namazını qılmaq üçün gözləyirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Bəkrin yanına insanlara namazı qıldırmasını söyləmək üçün adam göndərdi. O Əbu Bəkrin yanına gələrək Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona insanlara namaz qıldırmağı əmr etdiyini söylədi. Əbu Bəkr ürəyi yumuşaq bir insan idi. O , Ömərə (Allah ondan razı olsun): “Ey Ömər , insanlara sən namaz qıldır.” dedikdə, Ömər (Allah ondan razı olsun) belə buyurdu: “Xeyr , bu sənin haqqındır.” Aişə (Allah ondan razı olsun) belə buyurdu: “Əbu Bəkr o günlər insanlara namazları qıldırdı. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) öz nəfsində bir az yaxşılaşdığını hiss etdi və birinin Abbas olmaqla iki kişinin arasında zöhr namazına çıxdı. Əbu Bəkr insanlara namazı qıldırırdı. Elə ki, Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gördü geri çəkilmək istədi, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona əli ilə geri çəkilməsin deyə işarə etdi. O ikisinə: “məni onun yanında oturdun” deyə buyurdu. Onlar onu Əbu Bəkrin yanında oturtdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oturmuş halda, Əbu Bəkr ayaq üstə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı ilə, insalar da Əbu Bəkrin namazı ilə namaz qıldılar.” Ubeydullah belə buyurur: “İbn Abbasın yanına girdim və ondan: “Sənə Aişənin (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəstliyi haqda mənə rəvayət etdiyini danışımmı? Deyə soruşduqda, O: “De gəlsin” deyə cavab verdi. Mən ona danışdıqda, o heç bir şey inkar etmədi , sadəcə belə soruşdu: “ O sənə Abbasla bərabər olan ikinci kişinin kim olduğunu söylədimi ?”deyə soruşdu. Mən: “Xeyr” deyə cavab verdikdə, O: “O , Əli idi (Allah ondan razı olsun)” deyə cavbab verdi.” (Müslim /418).

## Yüz iyirmi ikinci fəsil: İmam namaza gəlmədikdə yerinə başqasını qoyması.

131- Muğirə ibn Şöbədən (Allah ondan razı olsun) belə rəvayət olunur: “O , Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Tabuk döyüşündə iştirak edib. Deyir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həcətini ödəmək üçün ayaq yoluna çıxdı. Mən Sabah namazından qabaq onun uçun bir qabda su apardım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma qayıtdıqda qabdan onun əlinə su tökməyə başladım: “O: əllərini biləklərə kimi üç kərə yudu. Sonra isə üzünü yudu. Sonra qollarını yapıncığından çıxarmaq istədi lakin yapıncıq dar olduğundan qollarını yapıncığın altına saldı və nəhayət qollarını yapıncığın altından çıxartdı və qollarını dirsəklərə kimi yudu. Sonra ayaqlarına xofların üzərindən məsh çəkdi və dönüb qayıtdı. Mən də onunla bərabər insanlara çatana kimi gəldim. Onlar Abdurrahman ibn Ovfu imam qoymuşdular. O , onlara namazı qıldırırdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) rükətlərdən birinə çatdı və insanlarla birgə axırıncı rükəti qıldı. Abdurrahman ibn Ovf namazı bitirərək salam verdikdə , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxaraq namazı tamamlamağa başladı. Bu , insanları təlaşa saldı, çoxlu sayda “Sübhənallah” deməyə başladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirdikdən sonra onlara tərəf döndü sonra isə belə dedi: “Yaxşı etdiniz” və ya “Düzgün

etdiniz” deyə onların namazı vaxtında qılmalarına qibtə edirdi.” (Müslim / 421, 274).

## Yüz iyirmi üçüncü fəsil: Azanı eşidənə məscidə gəlməsinin nə dərəcədə vacib olması.

132- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına bir kor kişi gəlib: “Ey Allahın elçisi , məni məscidə apranım yoxdu” deyə , ondan onun məscidə gəlməyib evdə namaz qılmasına izn verməsini istədi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona izn verdi. Kişi dönüm getmək istədikdə ondan: “Azanın səsini eşidirsənmi?” deyə soruşdu. Kişi: “Bəli” deyə cavab verdikdə, O: “Onda cavab ver (namaza gəl)” deyə buyurdu.” (Müslim / 603).

## Yüz iyirmi dördüncü fəsil: Camaat namazının fəziləti.

133- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Camaat namazı sizin birinizin evdə qıldığınız namazdan iyirmi beş dəfə əfzəldir.” (Müslim / 649).

## Yüz iyirmi beşinci fəsil: Camaat namazı hidayətə aparan yollardandır.

134- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: “Mən bizdən yalnız nifaqı bəlli olan bir münafigin və xəstə bir kimsənin camaat namazına gəlmədiyini görürürdüm (hesab edirdim). Xəstə olan belə , iki kişinin arasında namaza gəlirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə hidayət yollarını öyrətmişdi. Onlardan biri də azan verilən məsciddə namaz qılmaq idi.” (Müslim / 654).

## Yüz iyirmi altıncı fəsil: Namazı gözləməyin və camaat namazının fəziləti.

135- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Kişinin camaatla qıldığı namaz , evində və bazarında (dükanında) qıldığı namazdan iyirmi və bir necə dərəcə çoxdur. Əgər o , dəstəmaz alıb və dəstəmazı tam gözəl bir şəkildə edib sonra məscidə yalnız namaz qılmaq üçün gələrsə, məscidə girənə kimi atdığı hər bir addımla onun dərəcəsi qaldırılar və onun günahı silinər. Məscidə girdikdə isə , namaz onu məsciddə həbs edənə (saxlayana) qədər, o , namazda olan kimi sayılır. Və sizlərdən biri namaz qıldığı yerdə, əziyyət etmədikcə və dəstəmazını pozmayınca, mələklər onun üçün dua edərək belə deyərlər: “Allahım! Onu bağışla, ona rəhm et. Allahım! Onun tövbələrini qəbul et.” (Müslim / 649).

## Yüz iyirmi yeddinci fəsil: Sabah və İşa namazını camaatla qılmağın fəziləti.

136- Abdurrahman ibn Əbi Amratə belə rəvayət edir: “Osman ibn Affan (Allah ondan razı olsun) Məğrib namazından sonra məscidə daxil oldu və tək bir kənarda oturdu. Mən gəlib onun yanında oturdum. O mənə belə buyurdu: “Ey qardaşım oğlu , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “İşa namazını camaatla qılan gecənin yarısını ibadətdə keçirmiş (qiyamda) kimidir. Sabah namazını camaatla qılan isə bütün gecəni ibadət etmiş kimidir.” (Müslim / 656).

## Yüz iyirmi səkkizinci fəsil: Sabah və İşa namazlarını camaatla qilmayanın aqibətinin şıddətli olması.

137- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Münafiqlərə ən ağır gələn namaz Sabah və İşa namazıdır. Onda nə (savab) olduğunu bilsəydilər, ona iməkləyərək gələrdilər. Mən namaza iqamə verilməsini , sonra bir kişinin onlara imamlıq etməsini əmr edib, sonra da əllərində odun şələsi olan kişilərlə gedib namaza gəlməyən adamların evlərinə od vurmağa niyətləndim (fikiləşdim). Başqa bir rəvayətdə isə belə əlavə olunur: "onlardan biri ona (İşa namazına) gəldikdə yağlı sümük tapacağını bilsəydi , mütləq gələrdi." (Müslim / 651).

138- Abdullah ibn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cümə namazına gəlməyənlərə belə dediyini rəvayət edir: "Bir kişinin insanlara imamlıq etməsini əmr edib, sonra da gedib Cümə namazına gəlməyən kişilərlərin evlərinə od vurmağa niyətləndim (fikiləşdim)."

## Yüz iyirmi doqquzuncu fəsil: Üzrü olan kəslərin camaat namazına gəlməmələrinə izn verilməsi.

139- Mahmud ibn Rabidan, o da Utban ibn Malikdan belə rəvayət etmişdir: "Mədinəyə gəldiyimdə Utbanla qarşılaşdım. Ona belə dedim: "Sənin haqda belə bir hədis eşitmişəm" Utban dedi: "Gözlərimə (görməyim zəiflləmişdi) nəsə bir şey olmuşdu. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına adam göndərərək ona belə deməsini istədim: " İstəyirəm ki, gəlib mənim evimdə namaz qılasan, mən də oranı özüm üçün namazgah edim". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və Allahın istədiyi səhabələrlə gəldi və evə daxil oldu. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qilarkən səhabələr öz aralarında söhbət edirdilər. Sonra bu işin əzəmətliyini və böyüklüyünü Məlik ibn Duxşuma nisbət edərək belə dedilər: "Kaş ki, ona dua edərdi və o həlak olardı, kaş ki , ona bir şey olardı". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirdikdən sonra belə dedi: "Məgər o, Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və mənim onun Elçisi olduğuma şəhadət etmir?" Onlar: "O qəlbində olmadığı bir şeyi deyir." deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: " Hər kim Allahdan başqa ibadətə layiq haqq ilah olmadığına və mənim onun Elçisi olduğuma şəhadət etsə , cəhənnəmə girməz və ya onu dadmaz" Ənəs belə demişdir: "Bu hədis mənin xoşuma gəldi, oğluma bunu yazmasını söylədim, o da yazdı." (Buxari \ 425, Müslim\33).

## Yüz otuzuncu fəsil: Namazı yaxşı (tam, düzgün) qılmağın əmr olunması.

140- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə namaz qıldırdı , sonra isə çevrilib belə dedi: "Ey filankəs . namazını nə üçün yaxşı qılmırsan? Namaz qılan necə namaz qıldığına baxmırmı? O yalnız öz nəfsi üçün namaz qılır. Allaha and olsun mən arxamda olanı , önümdə olanı gördüyüm kimi gürürəm." (Müslim /423).

## Yüz otuz birinci fəsil: Namazı tam düzgün və tam olaraq qılımaq.

141- Bara ibn Azib (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ilə namaz qıldğıqda , onun namazına diqqət etdim, onun qiyamı, rukuya gedişi, rukudan qalxdıqda tam düz tutması, səcdəsi, iki səcdə arası oturuşu, ikinci səcdəsi, salam verərərək namazı bitirməsi ilə çevrilməsi arsı eyni (müddət) idi." (Müslim / 471).

142- Ənəsin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: "Mən sizə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə namaz qıldırdığı kimi namaz qıldırmaqdan dolayı əlimdən gələni əsirgəmirəm." Hədisi rəvayət edən belə buyurur: "Ənəs sizin etmədiyiniz bir şey edərdi. Rukudan başını qaldıraraq tam düz dayandıqda, o qədər gözləyərdi ki, kimsə: "O yəqin ki, unudub" deyərdi. Səcdədən başını qaldırıb o qədər oturardı ki, kimsə: "O yəqin ki, unudub" deyərdi." (Müslim / 472).

## Yüz otuz ikinci fəsil: Ən əfzəl namaz qunutu uzun olandır.

143- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Hansı namaz daha əfzəldir deyə soruşuldu" O: "Qiyamı uzun olan namaz" deyə cavab verdi. (Müslim / 756).

## Yüz otuz üçüncü fəsil: Namazda sakit (artıq hərəkət etmədən) dayanmaq.

144- Cabir ibn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanımıza çıxıb belə buyurdu: "Nə üçün mən sizin əllərinizi əhilləşdirilməmiş atın quyruğunu yuxarı qaldırdığı kimi qaldırdığını görürəm, namazda sakit durun" Sonra yenə çıxdığında bizi bir yerdə halqa şəkilində oturduğumuzu görüb belə dedi: "Nə üçün sizin dəstə-dəstə parçalanaraq oturduğunuzu görürəm" Sonra bir də çıxdıqda belə buyurdu: "Mələklərin Rəbinin yanında düzülduyu kimi düzülsəniz. Biz: "Ey Allahın elçisi, Mələklər Rəbinin yanında necə düzülürlər? deyə soruşduqda, O belə buyurdu: "Onlar birinci sıranı tamamlayır və səfdə tam düz dururlar" (Müslim / 430).

## Yüz otuz dörd: Namazda işarə edərək salamı qaytarmaq.

145- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni bir iş dalınca göndərdi. Sonra O , yolda gedərkən gəlib ona catdım (Quteybə belə demişdir: O namazda ikən) və salam verdikdə , O mənə işarə etdi. Namazı bitirdikdə məni çağırıb belə dedi: "Sən salam verəndə , mən namaz qılırdım" O , bu zaman məşriqə doğru yönəlmişdi." (Müslim / 540).

## Yüz otuz beşinci fəsil: Namazda danışmağın (nəsx) ləğv olunması.

146- Muaviyə ibn Əl- Həkəm (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəfə mən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılarkən camaatdan bir kişi asqırdı. Mən ona: "Yarhəmuk Allah "(Allah sənə rəhm etsin) dedikdə camaat gözlərini mənə zillədi. Mən: "Vay olsun mənə,

sizə nə olub ki, mənə belə baxırsınız?” dedikdə, onlar əllərini budlarına vurdular. Mən onların məni susdurmaq istəmələrinə qəzəbləndim , lakin susdum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) atam anam ona fəda olsun, ondan yaxşı öyrədən bir müəllim görmədim, məni nə azarladı, nə döydü, nə də söydü. Namazı bitirdikdən sonra belə buyurdu: “Bu , namazdır, onun içində insan danışan sözlərdən heç nə caiz deyildir. Onda yalnız  Təsbih (sübhənallah), Təkbir (Allahu Əkbər) və Quran oxumaq caizdir. Və ya Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurduğu kimi.” Mən: “Ey Allahın elcisi , mən cahillikdən təzə çıxmışam və Allah Təala bizə bu İslam dinini bəxş edib. Bizdən bəzi kişilər kahinlərin yanına gedirlər” dedikdə, O belə buyurdu: “Onların yanına getmə”. Sonra belə dedim: “Bizdən bəzi kişilər işin nəhs gətirməsinə inanırlar.” O belə buyurdu: “Bu onların içindən gələn bir şeydir , nə badə bu, onları ( İbn Sabbah demişdir: “sizi”) düz yoldan azdırmasın.” Mən: “Bizdən bəzi kişilər Xətt çəkirlər” deyə buyurduqda, O belə dedi: “Peyğəmbərlərdən bəziləri də xətt çəkirdilər. Hər kim onların xəttinə müvafiq düşünərsə düzgün etmiş olar.” Sonra isə (Muaviyə  ibn Əl- Həkəm) belə dedi: “ Mənim bir kənizim vardı. Uhud dağı və Cəvvaniyyə deyilən yerdə mənim qoyunlarımı otarırdı. Bir gün baxdım ki, qoyunlarımdan birini canavar aparıb. Mən də adəm ovladıyam , hamın heyfsləndiyi kimi heyfslənirəm. Lakim mən ona bir şillə vurdum. Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim. Bu , mənə çox ağır gəlmışdı. Bu üzdən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ey Allahın elçisi , onu azad edim?” deyə soruşduqda, “Onu  bura gətir” deyə buyurdu. Onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim. Ondan belə soruşdu: “Allah haradadır?”. O: “Səmada” deyə cavverdikdə, O yenə sourşdu: “Mən kiməm?” O: “Sən Allahın elçisi” deyə cavab verdikdə, Mənə: “Onu azad et o, mömindir” deyə buyurdu.” (Müslim / 537).

147- Zeyd ibn Arqam (Allah ondan razı olsun) belə rəvayət edir: “Biz namazda danışırdıq. Kişi namazda yanında duran adamla söhbət edirdi. Sonra isə bu ayə nazil oldu: “Allaha itaət üçün ayağa qalxın (namaza durun).” Və bizə namazda susmağımız əmr olundu və danışmaq qadaqan edildi.” (Müslim / 539).

## Yüz otuz altıncı fəsil: Namazda ehtiyac olduqda Təsbih etmək.

148- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Təsbih etmək kişilərə, əl çalmaq isə qadınlara məxsusdur.” (başqa rəvayətdə isə: Namazda).” (Müslim / 422).

## Yüz otuz yeddinci fəsil: Namazda gözün səmaya tərəf qaldırılmasının qadağan olunması.

149- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Namazda dua edərkən gözlərini səmaya qaldıran kəslər, bunu tərk edəcək ya da ki, gözləri (çaynaqlanacaq) kor olacaq.” (Müslim/429).

## Yüz otuz səkkizinci fəsil: namaz qılanın qabağından keçməyin aqibətinin ağır olması.

150- Busr ibn Said belə rəvayət edir: “Zeyd ibn Xalid Əl-Cühani onu Əbu Cüheymin yanına Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “namaz qılananın qabağından keçən haqda eşitdiyini sorüşmağa göndərmişdi.” Əbu Cühem Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın

salavatı və salamı olsun) belə byuruduğunu rəvayət etdi: “Namaz qılanın qabağından keçən bir kəs necə günah etdiyini bilsəydi, qırx dayanmağı namaz qılanın önündən keçməsindən onun üçün daha xeyirlidir. Əbu Ən-Nadr belə demişdir: “Bilmirəm qırx gün və ya ay və ya il dedi.” (Müslim / 507).

## Yüz oyuz doqquzuncu fəsil: Namaz qılanın qabağından keçənə mane olmaq.

151- Əbu Saleh Əs-Səmmən belə rəvayət edir: “Bir dəfə mən cümə günü Əbu Səid Əl-Xudrilə (Allah ondan razı olsun) bir yerdə idim. O , insanların onun önündən keçə bilməyəcəyi bir şeyin arxasında namaz qılırdı. Birdən Bəni Müəyt qəbiləsindən olan cavan bir oğlan gəldi və onun önündən keçmək istədi. O , onun sinəsinə toxunarq geriyə doğru itələdi. O , ətrafına baxdı və Əbu Səidin önündən başqa keçməyə bir yer tapmadıqda , yenidən onun önündən keçmək istədi. O , onun sinəsinə toxunarq əvvəlkindən daha şiddətlə geriyə doğru itələdi. Ayaq üstə gözlədi. Sonra Əbu Səiddən ağır sözlər eşitdi və insanları itələyə-itələyə çıxıb Marvanın yanına gəldi və başına gələni ona şikayət etdi.” Əbu Səid Marvanın yanına girdikdə, Marvan ondan belə soruşdu: “Səninlə, qardaşım oğlu arsında nə olub? Gəlib səndən şikayət edir.” Əbu Səid belə cavab verdi: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: “Sizdən biriniz insanların onun önündən keçə bilməyəcəyi bir şeyin arxasında namaz qıldıqda , kimsə onun önündən keçmək istədikdə, onun sinəsinə toxunaraq geriyə doğru itələyin, əgər qayıtmazsa , onunla savaşın , çünki o şeytandır.” (Müslim / 505).

## Yüz qırxıncı fəsil: Namaz qılan nəyi sütrə olaraq götürür.

152- Talha ibn Ubeydullah (Allah ondan razı olsun) belə rəvayət edir: “Biz namaz qıldıqda heyvanlar önümüzdən keçirdi. Biz bunu Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xatırlatdıqda belə buyurdu: “Sizlərdən biriniz önünə yəhərin arxa qarşı mislində bir sütrə (maniə) qoysun. Bundan sonra önündən nə keçsə ona zərəri yoxdur.” (Müslim/499).

## Yüz qırx birinci fəsil: Nizəyə doğru namaz qılmaq.

153- İbn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bayram günü namaza çıxdığında nizəsin istəyər və önünə sancaraq onun arxasında namaz qılardı. İnsanlar da onun arxasında durardılar. Bunu səfərə çıxdıqda da edərdi. Sonradan isə əmirlər də belə edirdilər,” (Müslim / 501).

## Yüz qırx ikinci fəsil: Miniyiə tərəf namaz qılmaq.

154- İbn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyini qiblə ilə özü arasında sütrə edərək ona tərəf namaz qılardı.” (Müslim / 502).

## Yüz qırx üçüncü fəsil: Namaz qılanın sütrəsinin arxasından keçmək.

155- Ovn ibn Əbu Cuheyfə atasının Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə gördüyünü rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəridən olan qırmızı bir qübbənin altında idi. Bilal əlində Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə

Allahın salavatı və salamı olsun) dəstəmaz suyunu çıxartdığını gördüm. İnsaların bu suyu neçə qapdıqlarını da gördüm. Kim ondan nəsə götürdüsə onu bədəninə sürtür, götürə bilməyən isə  yoldaşının əlinin nəminə sürtürdü. Sonra Bilal əlində bir nizə çıxaraq onu yerə batırdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əynində  qolları çırmalanmış qırmızı paltarla çıxdı. Nizəyə tərəf insanlara iki rükət namaz qıldırdı. Mən nizənin önündən insanların və heyvanların gəlib keçdiyini gördüm." (Müslim/503).

## Yüz qırx dördüncü fəsil: Namazda əlləri böyürün üzərinə qoymağın qadağan olması.

156- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  kişiyə əllərini böyürün üzərinə qoyaraq namaz qılmasını qadağan etdi." (Müslim / 545).

## Yüz qırx beşinci fəsil: Kişinin namazda ikən qabağına tüfürməsinin qadağan olunması.

157- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məscidin qiblə tərəfində bəlğəm gördü və insanlara tərəf çevrilib belə buyurdu: "Sizlərdən biri nə olur ki, Rəbbinin qibləsinə tərəf dönüb önünə tüfürür? Sizlərdən biriniz ona tərəf dönüb üzünə tüfürülməsini sevərdimi? Sizlərdən biriniz tüfürmək istədikdə sol tərəfinə ayağının altına tüfürsün. Buna imkan tapmasa belə etsin: " (Qasim bunu belə vəsf etdi: "O paltarına tüfürüb, sonra paltarın iki tərəfini bir–birinə sürtdü." (Müslim/550).

## Yüz qırx altıncı: Namazda əsnəmək və onu  necə dəf etmək (boğmaq).

158- Əbu Səid Əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən biriniz namaz qılarkən əsnəsə onu bacardığı qədər dəf etsin (boğsun). Həqiqətən Şeytan daxil (onun ağzına) olur." Başqa rəvayətdə isə belə deyilir: "Əli ilə ağzını tutsun, həqiqətən Şeytan daxil olur." (Müslim / 2990).

## Yüz qırx yeddinci fəsil: Uşaqların namaz qılarkən qucaqda saxlanması.

159- Əbu Qatədə əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlara imamlıq edərək namaz qıldırdığını gördüm. Əbu əl-Asın və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızı Zeynəbin qızı olan Umamə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qucağında idi. Rukuya getdiyində onu yerə qoyar, səcdədən qalxdığında isə onu eyni ilə qucağında tutardı." (Müslim / 543).

## Yüz qırx səkkizinci fəsil: Namazda  xırda daşları (səcdə yerindən) əl ilə kərara çəkmək.

160- Mueyqib (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məsciddə xırda daşları əl ilə kənara çəkmək zikr edildiyində, O belə buyurdu: "Əgər etəməyə məcbur qalsan , bir dəfə et." (Müslim / 546).

## Yüz qırx doqquzuncu fəsil: Tüpürcəyin ayaqqabı ilə silinməsi.

161- Abdullah ibn əş-Şixir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə namaz qıldım. Onun tüpürüb sonra ayaqabısı ilə tüpürcəyini sildiyini gördüm." (Müslim / 554).

## Yüz əllinci fəsil: Namazda başın saçının yığaraq bağlanması.

162- Abdulah ibn Abbasdan (Allah onların hər ikisindən razı olsun) belə rəvayət olunur: "Abdulah ibn Abbas (Allah onların hər ikisindən razı olsun) Abdullah ibn əl-Hərisin namaz qılarkən saçını arxadan yığdığını gördü. Qalxıb onu açmağa başladı. Namazı bitirdikdən sonra çevrilib İbn Abbasdan: "Sənin saçımla nə işin var?" deyə soruşdu . O, belə cavab verdi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Bunun misalı qolları arxasına bağlı olanın misalı kimidir." (Müslim/492).

## Yüz əlli birinci fəsil: Yemək hazır olduqda namaz vaxtının girməsi haqda.

163- Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şam yeməyi hazır olduğunda yeməyə məğrib namazından qabaq başlayın. Tələsib şam yeməyinizi tərk etməyin." (Müslim / 557).

## Yüz əlli ikinci fəsil: Namazda səhf etmək və səhf səcdəsi etməyin əmr olunması.

164- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən biriniz namazda üç və ya dörd rükət qıldığına şəkk edərsə, şəkki tərk edərək yəqin olduğu sayı nəzərə alsın, sonra isə salam verməmişdən öncə iki (səhf səcdəsi) səcdə etsin. Əgər beş rükət qılmış olsa bu (iki səcdə) onu cütləşdirər, əgər dörd rükəti tamamlamış olsa , bu şeytanı üzü üstə süründürməkdir." (Müslim / 571).

165- Əbu Hüreyrə (Allah onan razı olsun) belə rəvayət edir: "Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə gün zeniti keçəndən sonra qılınan namazlardan birini, zöhr və ya əsr namazını qıldırdı. İki rükətdən sonra salam verdi. Sonra məscidin qiblə tərəfində olan bir kötüyün yanına gəlib qəzəbli halda ona söykəndi. Əbu Bəkr və Ömər də (Allah onların hər ikisindən razı olsun) camaatın içində idilər. Onlar danışmağa çəkindilər. İnsanlar: "namaz qısalıb" deyərək tez məsciddən çıxdılar. Zulyədeyin ləqəbli birisi qalxaraq: "Ey Allahın Elçisi , namaz qısalıbmı, yoxsa unutmusan?" deyə ondan soruşdu . Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sağa və sola baxaraq: "Zulyədeyn nə deyir? deyə soruşdu. Onlar: "O düz deyir. Sən yalnız iki rükət qıldın" deyə cavab verdilər. O iki rükət də qılaraq salam verdi və təkbir edərək səcdə etdi. Sonra təkbir edərək qalxdı və yenidən təkbir edərək səcdə etdi. Sonra təkbir edərək qalxdı." Ravi belə demişdir: "İmran ibn Hüseynin belə dediyi mənə rəvayət olunmuşdur: "sonra salam verdi" (Müslim / 573).

## Yüz əlli üçüncü fəsil: Quran səcdəsi. (səcdə ayəsi)

166- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Quran oxuyarkən

səcdə ayəsi olan surəni (səcdə ayəsini) oxuduqda səcdə edər, biz də onunla bərabər səcdəyə gedirdik. Hətta bəzilərimiz alnını qoymağa yer tapmırdı.” (Müslim / 575).

167- Əbu Rafi belə rəvayət edir: “Əbu Hüreyrə (Allah onan razı olsun) ilə İşa namazını qıldım. “Göy yarılacağı,” surəsini oxudu və səcdə etdi. Mən ondan: “Bu nə səcdədir?” deyə soruşduqda, O belə dedi: “Bu səcdəni Əbu əl-Qasimin arxasında (Peyğəmbər) (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etmişəm və hələ də edirəm , onunla qarşılaşana kimi də edəcəyəm.” (Müslim / 578).

## Yüz əlli dördüncü fəsil: Sabah namazında qunut tutmaq.

168- Əbu Hüreyrə (Allah onan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sabah namazında qiraəti bitirdikdən sonra təkbir edər , sonra başını qaldırıb “Səmi Allahu limən həmidəh Rabbənə və ləkəl həmd” dedikdən sonra dayanaraq belə dua edərdi: “Allahım! Valid ibn Validi, Sələmə ibn Hişamı, İyaş ibn Əbu Rabiəyi və zəif möminlərə nicat ver! Allahım! Mudar qəbiləsinə şiddət və basqını artır. Onara Yusifin qıtlığı illəri kimi bir bəla ver. Allahım! Allaha və Rəsuluna qarşı üsyan edən Lihyan, Rilan, Zəkvan və Useyyə qəbilələrini lənətlə.” Sonra , bu ayə nazil olduğunda o bunu etməyi tərk etdi: “Bu işdə sənə dəxli olan bir şey yoxdur. (Allah) ya onların tövbələrini qəbul edər, ya da onlara əzab verər, çünki onlar, həqiqətən, zalım kimsələrdir.” ( Əl-İmran / 675).

## Yüz əlli beşinci fəsil: Zöhr və başqa namazlarda qunut tutmaq.

169- Əbu Hüreyrə (Allah onan razı olsun) belə rəvayət edir: “ And olsun Allaha ki, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) necə namaz qıldığını sizin üçün yaxınlaşdıracağam (sizə göstərəcəkəm). Əbu Hüreyrə (Allah onan razı olsun) Zöhr, İşa və Sabah namazlarında qunut tutar, möminlər üçün dua edib kafirləri lənətləyərdi.” (Müslim/676).

## Yüz əlli altıncı fəsil: Məğrib namazında qunut tutmaq.

170- Bara ibn Əzib (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sabah və Məğrib namazında qunut tutardı.” (Müslim / 678).

## Yüz əlli yeddinci fəsil: Sabah nanamazının iki rükəti haqada.

171- Hafsa (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sabah namazı girdikdə yalnız iki rükət yüngül namaz qılardı.” (Müslim / 723).

## Yüz əlli səkkizinci fəsil: Sabah nanamazının iki rükətinin fəziləti haqda.

172- Aişə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sabah namazının iki rükəti dünya və onda olan hər bir şeydən daha xeyirlidir.” (Müslim/725).

## Yüz əlli doqquzuncu fəsil: Sabah nanamazının iki rükətin qiraəti haqda.

173- Əbu Hüreyrə (Allah onan razı olsun) belə rəvayət edir: ”Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sabah nanamazının iki rükətində: “de: “Ey kafirlər!” (Kafirun) və “de: “O Allah birdir” (İxlas) surələrini oxuyardı.” (Müslim / 726).

## Yüz Altımışıncı fəsil: Sabah namazından sonra dirsəklənərək uzanmaq.

174- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sabah namazından sonra mən oyaq olduğumda mənimlə söhbət edər , əks halda isə dirsəklənərək üzanardı.” (Müslim / 743).

## Yüz Altımış birinci fəsil: Sabah hamazından sonra ibadətgahda (məsciddə) oturmaq.

175- Simək ibn Harb belə rəvayət edir: “Cabir ibn Samuraya (Allah ondan razı olsun) belə dedim: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç oturmusan? O belə cavab verdi: “Bəli çox oturmuşam. Sabah və ya günorta namazını qıldıqdan sonra namaz qıldığı yerdə gün doğana kimi oturardı. Gun doğduqdan sonra durardı. Onlar (sahabələr) cahiliyyə dövründən danışır , söhbət edib gülürdülər. O isə təbəssüm edirdi.” (Müslim/670).

## Yüz altımış ikinci fəsil: Duha namazı.

176- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Duha namazını qıldığını heç görmədim. Mən isə qılırdım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bəzən sevdiyi bir əməli etmək istəyər, lakin insanların bu əməli edib onlara fərz (vacib) olmasından qorxaraq, onu tərk edərdi.” (Müslim / 718).

## Yüz altımış üçüncü fəsil: Duha namazının iki rükət qılınması.

177- Əbu Zər (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Sizdən hər biriniz sabah oyandığı zaman hər bir fəqərəsinə sədəqə düşər. Hər bir təsbih (Subhən Allah) sədəqədir. Və hər bir təhmid (Əlhəmdulilləh) sədəqədir. Və hər bir təhlil (Lə iləhə İllə Allah) sədəqədir. Və hər bir təkbir (Allahu Əkbər) sədəqədir. yaxşılığı əmr etmək sədəqədir. Pis əməllərdən çəkindirmək sədəqədir. Duha namazının iki rükəti isə bütün bunları əvəz edir.” (Müslim / 720).

## Yüz altımış dördüncü fəsil: Duha namazının dörd rükət qılınması.

178- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Duha namazını dörd rükət qılar və Allahın istədiyi qədər əlavə edərdi.” (Müslim / 719).

## Yüz altımış beşinci fəsil: Duha namazının səkkiz rükət qılınması.

179- Abdullah ibn əl-Həris ibn Novfəl belə rəvayət edir: “Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Duha namazını qıldığı haqda insanlardan kiminsə mənə xəbər verə biləcəyini soruşub axtardım. Lakin bunu mənə danışacaq heç kimi tapmadım. Ancaq Əbu Talibin ğızı Ummu Həni mənə belə xəbər verdi: “Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkənin fəthi günü , günorta günəş yüksəldikdən sonra bir paltar gətirdilər və onunla örtünərək yuyundu (Qüsl etdi), sonra isə səkkiz rükət namaz qıldı. Bilmirəm qiyamı , yoxsa rukusu və yaxud səcdəsi , hansı daha uzun çəkdi. Hamsı bir-birinə yaxın idi oldu. Onun bunu nə bundan əvvəl , nə də bundan sonra etdiyini görmədim.” (Müslim/336, 719).

## Yüz altımış altıncı fəsi: Duha namazının qılınmasının, vəsiyyət olunması.

180- Əbu Hüreyrə (Allah onan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üç şeyi vəsiyyət etdi: “Hər ayın üç gününü oruc tutmağı, duha namazının iki rükətini və yatmamışdan öncə vitr namazını qılmağı.” (Müslim \ 721).

## Yüz altımış yeddinci fəsil: Əvvabin (tövbəkarların) namazı.

181- Qasim əş-Şeybəni belə rəvayət edir: “Zeyd ibn Arqam (Allah ondan razı olsun) bir dəstə adamın duha namazını qıldığını gördü və belə buyurdu: “Məgər onlar bu namazın bu saatdan daha əfzəl bir vaxtı olduğunu bilmirlərmi?.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: “Əvvabinlərin namazı istidən dəvə balasının ayaqları yandığı vaxtdır.” (Müslim / 748).

## Yüz altımış səkkizinci fəsil: Allah üçün səcdə edənə cənnət vardır.

182- Əbu Hüreyrə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Adəm övladı səcdə ayəsini oxuyub səcdə etdiyi anda Şeytan uzaqlaşıb ağlayar və belə deyər: “Vay olsun” (Əbu Kureybin rəvayətində isə: “Vay olsun mənə”) Adəm övladına səcdə etmək əmr olundu , o , səcdə etdi və ona Cənnət vardır. Mənə isə səcdə etmək əmr olundu, mən asi oldum və mənə Cəhənnəm vardır.” (Müslim / 81).

## Yüz altımış doqquzuncu fəsil: Gün ərzində on iki rükət namaz qılmanın fəziləti.

183- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Ummu Həbibə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: “Hər gün fərz namazlardan əlavə on iki rükət nafilə namaz qılınarsa, Allah Təala onun üçün Cənnətdə bir ev tikər.” Və yaxud: “Cənnətdə onun üçüç bir ev tikilər”. Ummu Həbibə belə demişdir: “ bundan sonra mən bu namazları qılmağa davam etdim.” Amr ibn Avs belə buyurnuşdur: “Bundan sonra mən də bu namazları qılmağa davam etdim.” ən-Numan ibn Səlim onun kimi demişdir.” Başqa bir rəvayətdə isə belə deyilir: “Gün ərzində” (Muslim/728).

## Yüz yetmişinci fəsil: İki azan (azan və iqamə) arası namaz haqda.

184- Abdullah ibn əl-Müğaffəl əl-Muzəni (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər azan və iqamə arası namaz vardır.” Bunu üç kərə təkrar etdi və üçüncü kərə belə buyurdu: “Kim istəyərsə (qılsın).” (Müslim / 737).

## Yüz yetmiş birinci fəsil: Fərz namazından qabaq və sonra nafilə namazı qılmaq.

185- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Zöhr namazından qabaq və sonra, Məğrib, İşa və Cümə namazından sonra iki rükət namaz qıldım. Amma Məğrib, İşa və Cümə namazından sorakı iki rükəti Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə evində qıldım.” (Müslim / 729).

## Yüz yetmiş ikinci fəsil: Gecə və gündüz nafilə namazları qılmaq.

186- Abdullah ibn Şəqiq (Allah ondan razı olsun) belə rəvayət edir: “Aişədən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nafilə namazı haqda soruşdum. O belə cavab verdi: “Evimdə Zöhürdən qabaq dörd qılar , sonra isə çıxıb camaata namazı qıldırar, sonra isə evə daxil olub iki rükət qılardı. İnsanlara Məğrib namazını qıldırdıqdan sonra , evə daxil olub iki rükət qılardı. İnsanlara İşa namazını qıldırdıqdan sonra da evə daxil olub iki rükət namaz qılardı. Gecə bir vitr olmaqla doqquz rükət namaz qılardı. Gəcəni bəzən ayaq üstə duraraq uzun-uzun namaz qılardı, bəzən də oturaraq uzun-uzun namaz qılardı. Ayaq üstə qiraət etdiyində rukunu və səcdəni ayaq üstə edər, oturaraq qiraət etdiyində, rukunu və səcdəni ayaq üstə edərdi. Fəcr namazı girdiyində də iki rükət namaz qılardı.” (Müslim / 730).

## Yüz yetmiş üçüncü fəsil: Nafilə namazını məsciddə qılmaq.

187- Zeyd ibn Səbit (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xurma yarpağından və ya həsirdən (məsciddə) bir otaqcıq düzəltdi və ora girərək namaz qılardı. Bir dəstə kişi onu təqib edib oraya gələrək onun namazından qılırdılar. Sonra o biri gecə gəldiklərində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların yanına çıxmaqda gecikdi və çıxmadı. Onlar səslərini qaldıraraq qapını daşladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qəzəbli halda onların yanına çıxaraq belə buyrudu: “Etdiyiniz şeyə o qədər davam etdiniz ki, bunun sizə fərz olunacağını zənn etdim. Namazlarınızı evinizdə qılın. Çünki kişin fərz namazlarından başqa qıldığı ən əfzəl namaz , evində qıldığı nafılə namazlardır.” Başqa rəvayətdə isə belə deyilir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məsciddə özü üçün bir otaq düzəltdi.” (Müslim / 781).

## Yüz yetmiş dördüncü fəsil: Nafilə namazlarının evdə qılınması.

188- “Cabir ibn Abdullah (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz məsciddə namazını bitirdikdə evi üçün də namazından pay saxlasın. Çünki Allah Təala evində qıldığı namazından ona xeyir verəcək.” (Müslim / 778).

## Yüz yetmiş beşinci fəsil: Sizlərdən biriniz taqəti çatıncaya kimi namaz qılsın yorulduqda və zəiflədikdə isə otursun.

189- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məscidə daxil olduğunda iki sütunun arasında ip bağlanmışdı. O: "Bu nədir?" deyə şoruşduğunda, Ona: "Zeynəb namaz qılarkən yorulduğunda və zəiflədikdə ondan tutur" deyə cavab verdilər." O belə buyurdu: "Onu açın və sizlərdən biriniz taqəti çatıncaya kimi namaz qılsın yorulduqda və zəiflədikdə isə otursun." (Müslim / 784).

## Yüz yetmiş altıncı fəsil: Allaha ən sevimli olan əməl daimi olandır.

190- Əlqamə (Allah ondan razı olsun) belə rəvayət edir: "Möminlərin anası Aişədən (Allah ondan razı olsun) belə şoruşdum: "Ey möminlərin anası , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) necə əməl edərdi? Hansısa bir günü xüsüsiləşdirirdimi? O belə cavab verdi: "Xeyr , O , əməli daimi edərdi. Sizdən kim Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etdiyini edə bilər?" (Müslim / 783).

## Yüz yetmiş yeddinci fəsil: Əməllərdən taqət etdiyiniz (bacardığınız ) əməli götürün.

191- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Həvlə bintu Tuveyt ibn Həbib ibn əsəd ibn Əbd əl-Üzzə onun yanından geçərkən Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) orada idi. Aişə belə buyurdu: "Həvlə bintu Tuveyt budur! Onun gecələr yatmadığını iddia edirlər? " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Gecələr yatmır? Əməllərdən taqət etdiyiniz (bacardığınız ) əməli götürün. And olsun Allaha ki, siz usanmayınca Allah da usanmaz" (Müslim / 785).

## Yüz yetmiş səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı və duası.

192- İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir gecə xalam Meymunəgildə gecələdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə qalxıb hacətini ödədi , sonra əllərini və üzünü yuyaraq yatdı. Sonra yenə qalxaraq su tuluğunun yanına gəlib ağzının iplərini açdı orta dəstəmaz aldı. Suyu çox işlətməsə də hər bir yerinə su çatdırdı. Sonra durub namaz qıldı. Mən ona diqqət yetirdiyimi bilməsini istəmədiyim üçün gərnəşərək qalxdım və dəstəmaz aldım. O durub namaz qılldı. Mən də gəlib onun sol tərəfində durdum. O əlimdən tutub məni fırladaraq sağına keçirdi. Beləcə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tam on üç rükət gecə namazı tamamlandı. Sonra uzanaraq yatdı və xoruldadı. Onsuz da O yatarkən xoruldayardı. Sonra Billal gələrək ona Sabah namazının girdiyini xəbər verdi. O qalxıb dəstəmaz almadan namaz qıldı. O belə dua edərdi: "Allahummə icəl fi qalbi nuran və fi basari nuran və fi səmi nuran və ən yəmini nuran və ən yasəri nuran və fövqi nuran və təhti nuran və əməmi nuran və xəlfi nuran və azzim li nuran. (Allahım! Qəlbimə, gözümə və qulağıma nur ver. Sağıma, soluma və başımın üstündən və ayağımın altından nur saç. Arxama və önümə nur saç, Mənim üçün böyük bir nur saç." Kureyb belə buyurmuş "Yeddisi isə qəlbimdə idi lakin ünutmuşam. Sonra Abbasın övladlarından bəzisi ilə qarşılaşdım və mənə bunları

xatırlatdı: “Əsəbim, Ətim, qanım, saçım və dərim.” Mənə daha iki xislət xatırlatdı.” (Müslim/763).

193- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə namaz qılmaq üçün qalxdıqda, namazı iki xəfif rükətlə açardı.” (Müslim / 767).

## Yüz yetmiş doqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə durarkən etdiyi dua.

194- İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə ortalarında namaza qalxdıqda bu duanı edərdi: “Allahummə ləkəl həmd əntə Nurassəməvati vəl Ard. Və ləkəl həmd  Əntə Qəyyum əs- Səməvati vəl Ard. Vələkəl həmd Əntə  Rabbus Səmavəti vəl-Ard və mən fihinnə. əntəl Haqqu və vadukə əl-haqqun və qovlukə əl-haqqun və liqaukə əl-haqqun vəl Cənnətu haqqun vən Nəru haqqun vəs Saətu haqqun. Allahummə ləkə əsləmtu. Və bikə Əməntu və aleykə  təvakkəltu və ileykə ənəbtu və bikə xasəmtu və ileykə həkəmtu. Fəğfirli mə qaddəmtu və mə Əxxartu və mə əsrartu və ələntu Əntə İləhi lə iləhə illə əntə. (Allahım , həmd sənə məxsusdur. Göylərlə, yerin nuru Sənsən, həmd, Sənə məxsusdur. Göylərlə, yerin ve onlarda olanların Rəbbî sənsən, sən haqsan, sənin vədin haqdır. Sözün haqdır. Sənə qovuşmaq haqdır. Cənnət haqdır. Cəhənnəm haqdır. Qıyamət haqdır. Allahım! Mən ancaq sənə təslim oldum; ancaq sənə iman etdim; ancaq sənə təvəkkül etdim və yalnız sənə qayıtdım. Mən düşmənimə qarşı ancaq sənin (dəlilin) ilə münaqişə etdim və düşmənimlə aramızda ancaq səni hakim tutdum. Mənim keçmiş və gələcəkdə edəcəyim günahlarımı bağışla!  Mənim İlahım Sənsən, Səndən başqa heç bir məbud yoxdur.” (Müslim/769).

## Yüz səkksənici fəsil: Gecə namazının keyfiyyəti və rükətlərinin sayı haqda.

195- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə on üç rükət qılardı. Onun beşini vitr şəklində qılaraq yalnız sonuncusunda (təşəhhüd üçün) oturardı.” (Müslim / 737).

## Yüz səksən birinci fəsil: Gecə namazı iki rükət, iki rükət, qılınır vitr isə sonuncu rükətdir.

196- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə namazı haqda soruşdu.  Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: “Gecə namazı iki rükət, iki rükət, qılınır. Sizlərdən biriniz Sabah namazının girməsindən qorxsa , onda bir rükət qılaraq onu qıldığı rükətlərə vitr etsin.” (Müslim / 749).

## Yüz səksən ikinci fəsil: Gecə namazını ayaq üstə və oturaraq qılmaq.

197- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə namazlarını oturaraq qiraət etdiyini heç görməmişdim. Yaşlaşdıqda oturaraq qiraət edirdi. Surənin qurtarmasına otuz və ya qırx ayə qalmış qalxıb oxuyardı sonra isə rukuya gedərdi.” (Müslim / 731).

## Yüz səksən üçüncu fəsil: Kişinin namaz qılmadan gecənin bütun hissəsini yatmasının bəyənilməməsi.

198- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecəni səhərə qədər yatan bir kişi xatırlatdıqda belə buyurdu: “O kişinin qulağına şeytan bövl etmişdir.” Başqa rəvayətdə isə: “qulaqlarına”. (Müslim / 774).

## Yüz səkksən dördüncü fəsil: Sizlərdən biriniz namazda mürgüləyərsə otursun.

199- Aişə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz namazda mürgüləyərsə , otursun ki, yüxusu qaçsın. Çünki, sizlərdən biriniz mürgüləyərək namaz qıldıqda , bəlkə bağışlanma diləmək istəyər , lakin (bilmədən yuxulu halda) özünü söyər.” (Müslim / 786).

## Yüz səksən beşinci fəsil:.Şeytanın vurduğu düyünləri nəyin açması.

200- Əbu Hüreyrə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz yatarkən , şeytan onun başının arxasına üç düyün vurur. Hər bir düyünün üzərinə: “səni uzun bir gecə gözləyir” damğasını vurur. Yuxudan oyandıqda Allah Təalanı xatırlarsa , düyünlərdən biri açılar. Dəstəmaz alarsa , ikinci düyün də açılar. Namaz qılarsa , üçüncü düyün açılar və gümrah və nəfsi gözəl bir əhvalda oyanar. Əks halda isə sabah tənbəl, gərgin, pis nəfslə oyanar.” (Müslim / 776).

## Yüz səksən altıncı fəsil: Gecə elə bir saat vardır ki, o vaxtı edilən dua qəbuldur.

201- Cabir ibn Abdullah (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Gecənin elə bir saatı vardır ki, bu vaxta müvəffəq olan müsəlman bir qulun Allahdan dilədiyi xeyir ona əta olunar. Bu (saat) hər bir gecədə vardır.” (Müslim / 757).

## Yüz səksən yeddinci fəsil: Gecənin sonuna yaxın dua, zikr etməyə rəğbətləndirmək və bu vaxtda duanın qəbul olunması.

202- Əbu Hüreyrə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təbarəkə və Təalə hər bir gecənin ilk üçdə biri getdikdə dünyanın səmasına nazil olur (enir) və belə buyurur: “Mülk sahibi mənəm! Mülk sahibi mənəm! Mənə dua edən varmı, mən onun duasını qəbul edim? Məndən istəyən varmı, ona istədiyini verim? Məndən bağışlanma diləyən varmı, onu bağışlayım?” Bu , sabah acılıncaya qədər davam edər.” (Müslim / 758).

## Yüz səksən səkkizinci fəsil: Gecə namazları və ona yatıb qalan və ya xəstə olan haqda.

203- Qatədə (Allah ona rəhmət etsin) Zurarədən belə rəvayət edir: “Sad ibn Hişam ibn Amir Allah yolunda vuruşmaq istədi. Mədinəyə gələrək orada ona məxsus olan ərazini satıb, silah və at (minik) alaraq Rumlularla ölənə kimi cihad etmək istədi. Mədinəyə gəldiyində Mədinə əhlindən bir dəstə insanla qarşılaşdı. Onlar ona belə etməsini qadağan edərək, altı sayda bir dəstənin Peyğəmbərin (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) həyatında belə etmək istədiklərini və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara bunu qadağan edərək , belə buyurduğunu xəbər verdilər: “Məgər məndə sizin üçün ibrət yoxdurmu?” Bunu ona xəbər verdikdə o artıq boşadığı arvadını qaytardı və qaytardığına şahidlik etdirdikdən sonra ibn Abbasın yanın gələrək Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vitr namazı haqda sıruşdu. İbn Abbas (Allah ondan razı olsun) belə buyurdu: “Sənə yer üzündə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vitr namazını ən cox bilən adamın kim olduğunu deyimmi? O: “Kim?” deyə soruşdu. İbn Abbas belə cavab verdi: “Aişədir. Onun yanına get və ondan soruşduqdan sonra gəl , mənə nə cavab verdiyini xəbər ver.” İbn Hişam belə dedi: “Onun yanına getmək üçün çıxıb Həkim ibn Əfləhin yanına gəldim, ondan mənimlə Aişənin yanına getməyi xahiş etdim. O belə dedi: “Mən ona yaxınlaşmaram. Çünki ona bu iki firqə haqda bir şey danışmağı qadağan etmişdim , lakin o buna razı olmayıb bildiyini etdi. Mən onu and – aman edərək razı saldım. Biz Aişənin (Allah ondan razı olsun) yanına gedərək daxil olmaq üçün izn istədik. Bizə izn verdiyində yanına girdik. (Onu tanıyıb) “Hakimdirmi?” deyə soruşdu. O: “Bəli” deyə cavab verdikdə, O: “Yanındakı kimdir?” deyə soruşdu. O: “Sad ibn Hişam” deyə cavab verdikdə, Aişə “Hansı İbn Hişam?” deyə soruşduqda, O: “İbn Amir” deyə cavab verdi. Və O onun üçün Allahdan rəhmət dilədi və “Xeyir olsun İnşəallah” dedi. - Qatədə onun Uhud günü vurulduğunu söyləmişdir-. Ondan: “Ey möminlərin anası , mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əxlaqı haqda xəbər ver” deyə soruşdum. Mənə belə cavab verdi: “Məgər Quran oxumursan? Mən: “Bəli oxuyuram” deyə cavab verdidkdə, belə buyurdu: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əxlaqı Quran idi.” Mən heç kəsdən ölənə kimi heç nə soruşmamağa niyyətlənib qalxmaq istədim. Sonra fikirləşib ona: “Mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qiyamından (gecə namazlarından) xəbər ver.” deyə soruşdum. O belə buyurdu: “məgər “Ey (libasına) örtünüb bürünən!” surəsini oxumamısan?“ Mən: “Oxumuşam” deyə cavab verdikdə belə buyurdu: “Allah Təala gecə qiyamını bu surənin əvvələrində fərz etdi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və əshabı bir il gecə namazı qıldılar. Allah Təala surənin sonlarını on iki ay səmada saxladı və nəhayət , surənin sonlarını nazil etdiyində , qiyamın hökmünü xəfifləşdirərək fərzdən sonra nafilə etdi.” Sonra belə dedim: “Ey möminlərin anası , mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vitr namazını necə qıldığını xəbər ver!” O belə buyurdu: “Biz onun misvak və dəstəmaz suyunu hazırlayardıq. O , gecənin Allah Təalanın istədiyi bir vaxtında oyanar və misvakla dişlərini təmizləyib dəstəmaz alar, sonra doqquz rükət namaz qılardı. Onun yalnız səkkizincisində oturar , Allahı zikr edər, ona həmd edib dua edərdi. Sonra isə salam verərdən qalxar və doqquzuncunu qılardı. Sonra oturaraq Allahı zikr edər, ona həmd edib, dua edərdi. Sonra salam verərək namazı bitirdikdə , salamı bizə eşitdirərdi. Sonra isə oturaraq iki rükət namaz qılardı. Beləcə, ey oğlum ,on bir rükət olardı. Elə ki, yaşlaşdı, əti artdı (kökəldi) yeddi rükət vitr qıldı və bu rükətləri əvəll etdiyi kimi qılardı. Beləcə , ey oğlum , doqquz rükət qılardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir namazı qılardısa , ona davam etməyi sevərdi. Əgər yatıb qalsaydı və ya ağrıları ucbatından gecə namazını qıla bilməsəydi, sabah on iki rükət qılardı. Allahın Peyğəmbərinin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nə Quranı bir gecədə bitirdiyini , nə də səhərə qədər namaz qıldığını heç görmədim. Nə də Ramazandan başqa heç bir ayı tam oruc tutmadı.” Mən ibn Abbasın yanına gələrək ona onun mənə danışdığını danışdım. O , belə buyurdu: “Düz demişdir,

əgər ona yaxınlaşa və ya onun yanına daxil ola bilsəydim , bunu onun ağzından eşitmək üçün onun yanına gedərdim.” Mən ona belə dedim: “Əgər ona yaxınlaşmadığını bilsəydim , onun hədisini sənə danışmazdım.”

### Yüz səksən doqquzuncu fəsil: Vitr namazı.

204- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecənin hər hissəsində əvvəlində, ortasında və sonunda vitr namazı qılmışdır. Vitr namazı sübhə yaxın bir vaxtada bitmişdir.” (Müslim / 745).

### Yüz doğsanıncı fəsil: “Vitr namazı və fəcrin iki rükəti.

205- Ənəs ibn Sirin (Allah ondan razı olsun) belə rəvayət edir: “İbn Ömərdən (Allah onların hər ikisindən razı olsun): “Sabah namazındakı iki rükətdə qiraəti üzatmağa nə deyirsən?” deyə soruşduqda , o , belə cavab verdi: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə namazını iki-iki namaz qılar və bir rükət vitr qılardı.” Mən ona: “Mən bunu soruşmuram” dedikdə, O: “Sən necə də yekə başsan, izn ver ki, hədisi sənə tam danışım.” deyərək hədisə davam etdi: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə namazını iki-iki qılar və bir rükət vitr qılardı. Sabah namazından öncə sanki iqaməyə az qalıbmış kimi (sürətlə) iki rükət qılardı.” (Müslim/749,753).

### Yüz doğsan birinci fəsil: Gecənin sonuna yaxın qalxa bilməycəyindən qorxan (ehtiyat edən) bir kəs vitr namazını gecənin əvvəlində qılsın.

206- Cabir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: ”Gecənin sonuna yaxın qalxa bilməyəcəyindən qorxan (ehtiyat edən) bir kəs vitr namazını gecənin əvvəlində qılsın. Gecənin sonuna yaxın qalxa biləcəyini bilən bir kəs vitr namazını gecənin sonuna yaxın qılsın. Çünki gecənin sonuna yaxın qılınan namaza (mələklər) şahidlik edər. Və bu vaxt daha əfzəldir.” (Müslim / 755).

### Yüz doxsan ikinci fəsil: “Sabahlamadan öncə Sabah namazını qılın”

207- Əbu Səid əl-Xudri (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sabahlamadan öncə vitr namazını qılın” (Müslim / 754).

### Yüz doxsan üçüncü fəsil:  Namazda qiraətin fəziləti.

208- Əbu Hüreyrə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz əhlinin yanına qayıtdıqda evində üç iri sümüklü, kök, hamılə dəvə görmək istəməzmi? Biz: “İstəyər” deyə cavab verdikdə, O belə buyurdu: “Sizlərdən birinizin namazda oxuduğu üç ayə sizin üçün üç iri sümüklü, kök, hamılə dəvədən daha xeyirlidir.” (Müslim / 802).

### Yüz doxsan dördüncü fəsil: Bir rükətdə iki surə oxuyanın misalı.

209- Əbu Vail (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir gün sübh namazını qıldığdan sonra Abdullah ibn Məsudun yanına getdik. Qapıda durub ona salam verdik. Bizə daxil olmağa izn verdikdə , biz bir müddət qapının qabağında dayandıq. Kənizi çıxaraq bizə içəri geçməyəcəyimizi soruşduqda biz içəri daxil olduq. O oturub “Subhənallah” deyə zikr ediridi. O bizdən: “Sizə izn verildikdən sonra evə daxil olmağa nə mane oldu?” deyə soruşdu. Biz: “Ev əhlinin bəzilərinin yatdığını zənn etdik.” deyə cavab verdikdə belə buyurdu: “Siz ibn Ummu Əbdin əhlinin qafil olduğunu zənn etdiniz?” Sonra o , biz günəşin çıxdığını zənn edənə qədər “Sübhənallah” deyə zikr etməyə davam etdi. Sonra kənizinə: “Ey kəniz , bax gör gün çıxıbmı?” deyə buyurdu. Kəniz baxdığında gün hələ çıxmamışdı və o zikrinə davam etdi. Biz günəşin çıxdığını zənn edənə qədər “Sübhənallah” deyə zikr etməyə davam etdi. Sonra kənizinə: “Ey kəniz , bax gör gün çıxıbmı?” deyə buyurdu. Kəniz baxdığında gün artıq çıxmışdı. O belə buyurdu: “Bizi bu gündə qaldıran Allaha həmd olsun.” (Mehdi rəvatətində belə demişdir: “onun belə dediyini zən edirəm: “bizi gühahlarımıza görə həlak etməyənə”). Camaatdan bir kişi belə dedi: “Mən dünən Müfəssəl surələrinin hamsını oxudum.” Abdullah ondan: “Bunu şer oxuyarkən tələsmək kimi eşitdinmi” And olsun ki biz qiraəti eşitmişik. Həm mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vaxtı ilə oxutduğu bir-birinə yaxın surələri bilirəm. Bu müfəsslər surələdən on səkkiz və Əlif və ləm (Hə, mim) sulərdən ikisidir.” (Müslim / 722).

## Yüz doxsan beşinci fəsil: Ramazan ayında qılınan namaz haqda.

210- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecənin yarısı məscidə çıxaraq namaz qıldı. Bir dəstə insan da onun namazı ilə namaz qıldılar. Sonra insanlar bu haqda danışmağa başladılar. Gecə əvvəlkindən də cox adam yığışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ikinci gecə də onların yanına çıxaraq namaz qıldı. Onlar da Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı ilə namaz qıldılar. Sonra insanlar yenə bu haqda bir-biri ilə danışdılar. Üçüncü gecə məsciddə daha çox adam yığışdı. O yenə məscidə gəldi və onlar onun namazı ilə namaz qıldılar. Dördüncü gecədə məsciddə insanlara yer olmadı və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların yanına çıxmadı. Bəzi insanlar: “Namaz” deməyə başladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə Sabah namazına kimi onların yanına çıxmadı. Sabah namazını bitirdikdə insanlara tərəf çevrildi və şəhadət gətirərək belə buyurdu: “Gecə sizin əhvalınızdan xəbərsiz deyildim. Lakin namazın sizə fərz olmasından və sizin bundan aciz olacağınızdan qorxdum” Başqa bir rəvayətdə isə belə deyilir: “Bu Ramazan ayında idi” (Müslim/761).

## Yüz doxsan altıncı fəsil: Ramazan ayında qiyama durmaq (gecə namazlara durmaq) və ona rəğbətləndirmək.

211- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir:”Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan ayında qiyama durmağı onlara heç bir şeyi əzm, əmr etmədən rəğbətləndirər və belə buyurardı: “Kim Ramazan ayını imanla və savabını Allahdan umaraq keçirərsə (namaz və sairə əməllər nəzərdə tutulur) bütün keçmiş qünahları bağışlanar.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdiyində bu iş üzərində idi. Sonra Əbu Bəkrin xilafətində və Ömərin xilafətinin əvvələrində də bu belə minvalla idi.” (Müslim / 759).

# Cumə namazı.

## Birinci fəsil: Bu Ümmətin cümə günü hidayət olması.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Biz dünyada ən son, qiyamət günü isə ən tez gələnlərik. Biz Cənnətə ilk girənlərik. Baxmayaraq ki, onlara bizdən öncə kitab verilmişdir. Bizə isə onlardan sonra verilmişdir. Onlar xilafa düşdülər. Bizi isə Allah Təala onların xilafa düşdükləri şeydən haqqa hidayət etdi. Bu gün onların xilafa düşdükləri, bizim isə hidayət olunduğumuz gündür. Cümə günü: bu gün bizim , sabah Yəhudilərin , birigün isə Nəsranilərindir." (Müslim / 855).

## İkinci fəsil: Cümə gününün fəziləti.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Günəşin doğduğü ən xeyirli gün cümə günüdür. Adəm bu gün yaradılmışdır. Bu gündə Cənnətə daxil edilmişdir. Bu gündə oradan çıxarılmışdır və qiyamət günü də yalnız cümə günü qopacaq." (Müslim / 854).

## Üçüncü fəsil: Cümə günündəki saat haqda.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Əbu əl-Qasimin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cümə günü elə bir saat vardır ki, bu vaxtda durub dua edən müsəlman bir kimsə ona müvəffəq olsa və Allahdan xeyir diləsə , Allah Təala ona istədiyini əta edər." O , əli ilə işarə edərək onun az bir vaxtda olduğunu göstərdi." (Müslim / 852).

4- Əbu Burda Əbu Musə Əşarinin (Allah onların hər ikisindən razı olsun) belə dediyini rəvayət edir: "Abdullah ibn Ömər (Allah ondan razı olsun) mənə belə dedi: "Atanın Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cümə günündəki saat haqda danışdığı hədisi eşitmisənmi? Mən belə cavab verdim: "Bəli, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "O vaxt İmamın (minbərə) oturuşu ilə, namazı bitirənə kimi olan bir vaxtdır." (Müslim / 853).

## Dördüncü fəsil: Cümə günü sabah namazında oxunan surə.

5- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cümə günü Sabah namazında: "Əlif, Lam, Mim! "Səcdə". və "əl-İnsan" surəsini oxuyardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cümə namazında isə: "əl-Cumuə" və "əl-Munafiqun" surəsini oxuyardı." (Müslim /879).

## Beşinci fəsil: Cümə gününün qüsulu haqda.

6- Əbu Hüreyrə (Allah onan razı olsun) belə rəvayət edir: "Bir dəfə Ömər (Allah ondan razı olsun) cümə günü insanlara Xütbə verərkən Osman ibn Affan (Allah ondan razı olsun) (məscidə) daxil oldu. Ömər onu qəsd edərək "Bəzi kişilərə nə olub ki, azandan sonra məscidə qəlirlər?" deyə buyurdu. Ocman belə buyurdu "Ey möminlərin əmiri , azanı eşidərək dəstəmaz almaqdan əlavə bir şey etmədən məscidə gəldim." Bunu eşidərək Ömər belə buyurdu: "Həmçinin dəstəmaz! Məgər Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini duymamısan: " Sizlərdən biriniz cüməyə gəldiyi zaman qüsl alsın." (Müslim/845).

## Altıncı fəsil: Cümə günü ətir və misvak işlətmək.

7- Əbu Səid əl-Xudri (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cümə günü qüsl almaq hər bir həddi buluğa catmiş kəsə vacibdir. Misvakla dişlərini təmizləsin və bacardığı qədər ətir vursun." (Müslim / 846).

## Yeddinci fəsil: Cümə günü (məscidə) tez gəlmənin fəziləti.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cümə günü gəldiyində , məscidin hər bir qapısında bir mələk dayanar və məscidə kimin daha əvvəl gəldiyini yazarlar. İmam minbərə oturduğunda , səhifəni büküb zikri dinləməyə gələrlər. Məscidə ilk öncə ğələnin misalı bir dəvə qurban etmiş kimidir. Sonrakının misalı inək, ondan sonrakının misalı qoyun, ondan sonrakının misalı toyuq, ondan sorakının misalı isə yumurta qurban etmiş kimidir."(Müslim / 850).

## Səkkizinci fəsil: Cümə namazının vaxtı günəş zeniti keçdikdə olmasıdır.

9- Sələmə ibn əl Əkva (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə günəş zeniti keçdikdən sona Cümə namazını qılar sonra ətrafı yoxlayaraq qayıdardıq." (Müslim / 860).

## Doqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbər götürməyi və onun üzərində namaz qılmağı.

10-Əbu Həzim (Allah ondan razı olsun) belə rəvayət edir: "Səhl ibn Sədin (Allah ondan razı olsun) yanına bir neçə nəfər gəldi. Onlar Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərinin hansı ağacdan olduğunu münaqişə etmişdilər. O , onlara belə cavab verdi: "Allaha and olsun ki, mən onun hansı ağacdan olduğunu və kimin düzəltdiyini bilirəm. Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üzərində ilk dəfə nə zaman oturduğunu da görmüşəm. Mən ona: "Ey Abu Abbas bizə danış" deyə söylədikdə, o belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir qadına (Əbu Həzim belə demişdir: "O zaman onun adını şöyləmişdir) xəbər yollamış və belə buyurmuşdur: "Dülgər oğluna buyur ki, mənim üçün ağacdan üzərində dayanaraq insanlarla danışacağım bir pillə düzəltsin." O , üç pilləli bir minbər düzəltdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın

salavatı və salamı olsun) onu bu yerinə qoymağı əmr etdi. O , Mədinənin ətrafında bitən ağacdan  düzəldilmişdi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üzərində təkbir edərək namaza başladığını gördüm. O minbər üzərində insanlar da (aşağada) onun arxasında təkbir etdilər. Sonra rukudan qalxdığınnda arxasını çevirmədən geriyə endi və minbərin dibinə səcdə etdi. Sonra yerinə qayıdaraq namazı bitirdi və insanlara  tərəf cevrilib belə buyurdu: “Ey insanlar , mənim belə etməkdə məqsədim sizin mənin namazıma uyğun namaz qılmanız və namazı necə qıldığımı öyrənməniz üçündür.” (Müslim / 544).

## Onuncu fəsil: Xütbədə nə deyildiyi haqda.

11-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Dimad Məəkəyə gəldi. O Əzd Şunaə qəbiləsindən idi və insanı cin girməsindən (dəlilikdən) müalicə edirdi Məkkə əhlinin Muhəmmədin dəli olduğunu dediklərini eşitdikdə belə dedi: “O kişini görsəydim , bəlkə Allah Təala ona mənim əlimlə şəfa verərdi.”  Gəlib onunla qarşılaşdığında belə dedi: “Ey Muhəmməd , mən dəlilikdən müalicə edirəm. Allah Təala mənim əlimlə istədiyinə şəfa verir , istəsən səni də müalicə edərəm.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Həqiqətən, həmd-sənalar Allaha məxsusdur. Biz Ona həmd-səna edir, Ona sığınır, Ondan bağışlanma və hidayət diləyirik. Nəfsimizin şərindən və pis əməllərdən Allaha sığınırıq. Allahın hidayət verdiyi şəxsi heç kim doğru yoldan azdıra bilməz, haqq yoldan azdırdığı kimsəni də heç kim hidayət yoluna yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, O təkdir və Onun heç bir şəriki yoxdur və şəhadət edirəm ki, Muhəmməd (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Onun qulu və Elçisidir. Və sonra.” O bunu eşidikdə ona:”Mənə dediyin bu kəlmələri yenidən təkrar et” deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu onun üçün üç kərə təkrar etdi. O belə dedi: “Mən kahinlərin, sehirbazların, şairlərin dedikləri sözləri eşitmişəm , lakin sənin dediyin bu kəlmələr kimi heç bir söz eşitməmişəm. Bunlar həqiqətən dənizin dibinə çatdı.” Sonra Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: “Əlini uzat sənə İslama girməyimi beyət edim.”  O Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) beyət etdiyində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Qövmün üçün də beyət et” deyə buyurdu. O: “Qövmüm üçün də beyət edirəm” dedikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun qövmünə atlılar göndərdi.  Qoşunun başçısı  dəstədən: “Onlardan nəsə götürdünüzmü?” deyə sual verdikdə onlardan bir kişi: “Mən bir (dəstəmaz suyu üçün) qab götürmüşəm” dedikdə, O ona: “Onu qaytar, onlar Dimadın qövmüdür” deyə buyurdu”  (Müslim/868)

## On birinci fəsil: Xütbədə səsin qaldırılması və nə deyildiyi haqda.

12-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xütbə verərkən gözləri qızarar, səsini qaldırar qəzəbi artardı. Sanki qoşuna (düşmən) axşam sabah basqın edəcək deyə xəbərdərlıq edir kimi belə buyurardı: “Mən və giyamət günü (yaxın olduğuna işarə edərək) ,işarə və baş barmaqlarını birləşdirərək, bu qədər bir (vaxta) göndərildim.” Həmçinin belə deyərdi: “və sonra: “Həqiqətən ən doğru kəlam Allahın kitabıdır, ən doğru yol Muhəmməd Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yoludur. Ən pis

əməllər dinə edilmiş yeniliklərdir. Hər bir yenilik bidət, hər bir bidət isə zəlalətdir” Sonra isə belə buyurdu: “Mən hər bir möminə öz nəfsindən irəliyəm. Özündən sonra mal qoyub getsə, bu onun yaxınlarınındır. Özündən sonra borc və ya oğul uşaq qoyub getsə mənədir və mənim üzərimdədir.” (Müslim/868).

## On ikinci fəsil: Xütbəni qisa vermək.

13-Əbu Vail (Allah ondan razı olsun) belə rəvayət edir: “Ammar (Allah ondan razı olsun) bizə xütbə verdi. Onu qısa lakin tam bir şəkildə çatdırdı. Aşağı endikdə ona: “Ey Əbu əl-Yaqazan xütbəni qısa lakin tam etdin , bir az üzatsaydın , yaxşı olardı.” dedik. O belə buyurdu: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: “Kişinin uzun namaz və qısa xütbəsi, onun fighinə (İslam əhkamlarını bildiyinə) dəlalət edir. Və məm namazı uzun, xütbəni isə qısa edirəm. Həqiqətən bəyan etmənin sehir olanı da vardır.” (Müslim / 869).

## On üçüncü fəsil: Xütbə verərkən nəyi pozmağın caiz olmadığı haqda.

14-Adiy ibn Hatim (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında xütbə verərək belə dedi: “Allah və Rəsuluna itaət edən hər bir kəs artıq düz yoldadır və onlara asi olan isə , artıq düz yoldan azmışdır.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Sən nə pis bir xətibsən, de: “ Allaha və Rəsuluna asi olan hər bir kəs” İbn Numeyr belə əlavə etmişdir: “artıq azmışdır.” (Müslim/870).

## On dördüncü fəsil:  Minbərdə xütbə verərkən Quranın oxunması.

15-Ummu Hişam bintu Hərisə ibn Numan belə rəvayət edir: “İki və ya bir ildən biraz çox bir müddətdə bizimlə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təndiri, bir idi. “Qaf! Şanlı Qurana and olsun!” surəsini yalnız Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağzından əzbərləmişəm. Onu İnsanlara xütbə verdiyi hər cümədə oxuyurdu.” (Müslim/873).

## On beşinci fəsil: Xütbədə barmaqla işarə etmək.

16-Huseyn ibn Umara ibn Rueybədən onun Bişr ibn Marvanın minbərdə əllərini göyə qaldırarkən, belə dedi: “Allah Təala bu əlləri qaraltsın, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç bir şey əlavə etmədən (barmağı ilə işarə edərək) yalnız əli ilə belə etdiyini görmüşəm.” (Müslim / ).

## On altıncı fəsil: Allah Təala buyurur: Onlar bir alış-veriş, yaxud bir əyləncə gördükləri zaman səni ayaq üstə (minbərdə xütbə oxuduğun halda) qoyub ona tərəf cumdular.

17-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cümə günü  ayaq üstə duraraq xütbə verərkən  Şamdan bir karvan gəldi və inasanlar ona tərəf  getdilər. Hətta Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında on iki kişi qaldı. Və Cümə  surəsindəki bu ayə nazil oldu:

“Onlar bir alış-veriş, yaxud bir əyləncə gördükləri zaman səni ayaq üstə qoyub ona tərəf cumdular.” (Müslim / 863).

## On yeddinci fəsil: Cumə namazında oxunan surə haqda.

18- Nomən ibn Bəşir (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki bayram namazında (Qurban və Ramazan) və Cümə namazında: “Ən uca olan Rəbbinin adını pak (müqəddəs) tutub şəninə tariflər de!” (əl-Əla) və “(Ya Peyğəmbər! Dəhşəti aləmi) bürüyəcək qiyamətin xəbəri sənə gəlib çatdımı?”( əl-Ğaşiyə) surələrini oxuyardı. Və Əgər Cümə və Bayram namazı üst-üstə düşsəydi bu surələri iki namazda da oxuyardı.” (Müslim / 878).

## On səkkizinci fəsil: Xütbə verərkən elm öyrətmək.

19-Əbu Rifaə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xütbə verərkən gəlib onun yanına çatdım və belə dedim: “Ey Allahın elçisi qərib bir kişi gəlib dini haqda soruşur. Dinin nə olduğunu bilmir.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xütbəni tərk edərək mənə tərəf gəlməyə başladı. Nəhayət gəlib mənim yanıma çatdı. Ona bir kürsü gətirildi. Mən onun dayaqlarının dəmirdən olduğunu zənn etdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üzərində oturaraq , Allahın ona öyrətdiyindən mənə öyrətməyə başladı. Sonra qayıdaraq xütbəsinə davam edərək bitirdi.” (Müslim / ).

## On doqquzuncu fəsil: Cümə xütbəsində iki xütbə arası oturmaq.

20-Cabir ibn Səmura (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaq üstə xütbə verir, sonra oturar, sonra isə qalxaraq xütbə verərdi. Və hər kim sənə onun oturaraq xütbə verdiyini söyləsə, bil ki, o yalançıdır. And olsun Allaha, onunla birgə mindən çox namaz qılmışam.” (Müslim/876).

## İyirminci fəsil: Xütbəni və namazı xəfif qılmaq.

21-Cəbir ibn Səmura (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə namaz qılırdım, namazı və xütbəsi nə çox uzun , nə də çox qısa idi.” (Müslim / 866).

## İyirmi birinci fəsil: Cümə günü İmam xütbə verdiyi zaman məscidə girənin iki rükət namaz qılması.

22-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Cümə günü Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərdə oturduğu zaman Süleyk əl-Ğatafani gəldi və namaz qılmadan oturdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: “İki rükət namaz qıldınmı?” deyə soruşdu. O: “Xeyr” deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Qalx qıl” deyə buyurdu.” (Müslim / 875).

## İyirmi ikinci fəsil: Xütbə üçün susmaq.

23-Əbu Hüreyrə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Cümə günü imam xütbə verdiyi zaman yoldaşına "sus" desən, artıq boş bir iş tutmuş olarsan." (Müslim / 851).

### İyirmi üçüncü fəsil: Cümə günü xütbəni susub dinliyənin fəziləti.

24-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qüsul alıb cüməyə gələn və orada bacardığı qədər namaz qılan , sonra isə xütbə verənin xütbəsini bitirənə qədər ona qulaq asan, sonra isə onunla namaz qılan hər bir kəs bu cümə ilə başqa bir cümə arası və üç gün də əlavə olan günahları bağışlanar." (Müslim / 857).

### İyirmi dördüncü fəsil: Cümə namazından sonra məsciddə namaz qılmaq.

25-Əbu Hüreyrə (Allah onan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cümədən sonra namaz qılsanız , dörd rükət qılın." Başqa bir rəvayətdə isə belə deyilir: "Əgər səni nəsə tələsdirərsə , onda məsciddə iki rükət qıl və qayıtdığında da iki rükət qıl." (Müslim / 881).

### İyirmi beşinci fəsil: Cümə namazından sonra evdə namaz qılmaq.

26-Abdullah ibn Ömərin (Allah onların hər ikisindən razı olsun) belə etdiyi rəvayət edilir: "O , Cümə namazı qıldıqdan sonra evdə iki rükət namaz qıldı, sonra isə belə buyurdu: "Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə edərdi." (Müslim /882).

### İyirmi altıncı fəsil: Cümə namazını qıldıqdan sonra danışmadan və ya bayıra çıxmadan namaz qılmamaq haqda.

27-Ömər ibn Ata belə rəvayət edir: "Nəfi ibn Cubeyr onu Nəmirin bacısı oğlu olan əs-Səibin yanına göndərdi. Ondan Müaviyyənin onun namazında nə gördüyü haqda soruşmasını istədi. O , belə cavab verdi: "Bəli , mən Cüməni məsciddə olan otağın içində namaz qıldım. İmam salam verdikdən sonra qalxıb durduğum yerdə namaz qıldım. O , daxil olduğunda , yanıma bir nəfər göndərib belə buyurdu: "Bir də belə etdiyin kimi etmə. Cümə namazını qıldıqdan sonra danışmadan və ya bayıra çıxmadan namaz qılma. Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə əmr etmişdir: " Bir yerdə namaz qıldıqdan sonra danışmadan və ya bayıra çıxmadan namaz qılmayaq." (Müslim /883).

### İyirmi yeddinci fəsil: Cümə namazını tərk edənin aqibətinin şiddətli olmağı.

28-əl-Həkəm ibn Meynə Abdullah ibn Öməın və Əbu Hüreyrənin (Allah onlardan razı olsun) ona belə rəvayət etmişlər: "Onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərinin pilləsində dayanaraq belə dediyini eşitmişlər: "Cümə namazlarını tərk edən kimsələr , ya bu əməllərindən əl çəkəcəklər, ya da Allah Təala onların qəlblərini möhürləyəcək və onlar qafillərdən olacaqlar." (Müslim/465).

# İki bayram (namazı)

## Birinci fəsil: Bayram namazlarında azan və iqamə verməmək.

1- Cabir ibn Səmura (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bayram namazını bir neçə dəfə azan və iqaməsiz qıldım." (Müslim/887).

## İkinci fəsil: Bayram namazlarının xütbədən qabaq olması.

2- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), Əbu Bəkir, Ömər və Ösmanla Ramazan bayramı namazını birgə müşahidə etmişəm. Hamısı bayram namazını xütbədən öncə qılar , sonra isə xütbə verərdilər. Bir dəfə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (minbərdən) endi. Mən sanki onun əli ilə bəzi kişiləri oturtduğunu görürəm. Sonra onları aralayaraq qadınların səflərinə yaxınlaşdı. Bilal da onunla idi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu ayəni oxudu: "Ya Peyğəmbər! Mömin qadınlar Allaha heç bir şərik qoşmayacaqları, beyət etmək üçün yanına gəldikləri zaman" (əl-Mumtəhinə/12) sonra isə qadınlardan: "Sizdə bunun üzərindəsinizmi?" deyə soruşdu. İçlərindən sadəcə bir qadın dinlənərək: "Bəli , Ey Allahın elçisi" deyə cavab verdi. O an bu qadının kim olduğu bilinmirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: "Elə isə sədəqə verin" deyə buyrudu və Bilal paltarının ətəyini açdı və belə dedi: "Hə , verin , atam - anam sizə fəda olsun" və onlar üzükləri və bilərzikləri Bilalın paltarına atmağa başladılar." (Müslim/884).

## Üçüncü fəsil: Bayram namazlarında oxunan surələr haqda.

3- Ubeydullah ibn Abdullah belə rəvayət edir: "Ömər ibn əl-Xattab (Allah ondan razı olsun) Əbu Vaqid əl-Leysidən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan və Qurban bayramlarında (bayram namazında) hansı surələri oxuduğu haqda söruşdu. O, belə cavab verdi: "O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), bayram namazlarında: "Qaf! Şanlı Qurana and olsun!" (Qaf) və "O saat yaxınlaşdı və ay parçalandı." (əl -Qəmər) surələrini oxuyardı." (Müslim/891).

## Dördüncü fəsil: Bayram namazından öncə və sonra başqa namazların qılınmaması haqda.

4- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qurban və ya Ramazan bayramı günü çıxdı və iki rükət namaz qıldı. Nə ondan öncə nə də sonra başqa bir namaz qılmadı. Sonra Bilal da yanında olmaqla qadınların yanına gəldi və onlara sədəqə vermələrini əmr etdi. Və qadınlar qızıl və gümüşdən olan bilərzik və boyunbağlarını atmağa başladılar." (Müslim/884, 890)

## Beşinci fəsil: Qadınların hər iki bayramda nama çıxmaları.

5- Ummu Atiyyədən (Allah ondan razı olsun) belə rəvayət olunur: «Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bayram günü bizə çıxmağı, heyzli və bakirə qızları da bayram namazına çıxartmağı əmr etdi. Heyzli

(aybaşı) olan qadınlar namaz qılmadan (namazgaha daxil olmadan) müsəlmanların dualarını müşahidə edərdilər. Mən Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın elçisi , bizdən birimizin baş örtüyü olmasa necə etsin" deyə soruşduqda, O: "Bacısının örtüyünü geyinsin" deyə buyurdu." (Müslim / 890).

### Altıncı fəsil: Kənizlərin və ya kiçik qızların bayram günü nə dedikləri haqda.

6- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma daxil olduğunda , yanımda iki kəniz Buas döyüşü haqda bir mahnı oxuyurdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yatağa uzanaraq üzünü çevirdi. Birdən Əbu Bəkir içəri daxil olaraq məni danladı və belə buyrdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında şeytanın tütəyinə uyursunuz." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona tərəf çevrilərək belə buyurdu: "Burax onları". Onun fikri yayındıqda mən onları dümsükləyərək işarə etdim və onlar bayıra çıxdılar. Bu gün bayram günü idi. Zəncilər nizə və qalxanla oyun göstərirdilər. Bilmirəm Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mən soruşdum və ya O mənə: "Baxmaq istəyirsənmi?" deyə soruşdu . Mən: "Bəli" deyə cavab verdikdə, məni arxa tərəfinə keçirdi. Üzüm onun üzünə dəyirdi. O , onlra belə buyrudu: "Haydı , ey bəni Arfidə (oynayın)". Nəhayət bezdiyimdə məndən: "Bəs edərmi?" deyə soruşdu. Mən "Bəli" deyə cavab verdiyimdə, mənə: "Elə isə get" deyə buyurdu."(Müslim \ 892).

## Müsafirin namazı

### Birinci fəsil: Əmin amanlıq vaxtı müsafirin namazı qısaltması.

1- Yaələ ibn Umeyyə belə rəvayət edir: "Ömər ibn əl-Xattaba (Allah ondan razı olsun) belə dedim: "Səfərə çıxdığınız zaman kafirlərin sizə zərər yetirəcəklərindən qorxarsınızsa, namazı qısaltmaq sizə günah hesab edilməz" Artıq insanlar əmin amanlıqdadır" O mənə belə cavab verdi: "Mən də sənin təəccübləndiyin şeyə təəccüblənmişdim və Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu barədə söruşduğumda, belə cavab verdi: " Bu , Allahın sizə bəxş etdiyi bir sədəqədir. onu qəbul edin". (Müslim / 686).

2- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Allah Təala Peyğəmbərinizin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) diliylə namazı daimi məskunlaşdığınız yerdə dörd, səfərdə oldunuzda iki, qorxu olduqda isə bir rükət qılmanızı fərz etmişdir." (Müslim \ 687).

### İkinci fəsil: Səfərdə namazın necə qısalması.

3- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinədə Zöhr dörd rükət qıldım. Zül hüleyfədə isə Əsr namazını iki rükət qıldım." (Müslim / 690).

### Üçüncü fəsil: Həcdə namazın qısalması.

4- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinədən Məkkəyə doğru yola çıxdıq. Namazları yol boyu qayıdana kimi iki rükət, iki rükət qıldı. Hədisi rəvayət edən ravi belə demişdir: “Ənəsdən onun Məkkədə nə qədər qaldığını soruşdum. O: “On gün” deyə cavab verdi.” Başqa bir rəvayətdə belə deyilir: “Mədinədən Həccə getmək üçün yola çıxdıq.” (Müslim / 693).

## Dördüncü fəsil: Minada namazın qısaldılması.

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Minada müsafir namazı qıldı. Həmçinin Əbu Bəkr, Ömər və Osman da səkkiz və ya altı il Minada müsafir namazı qıldılar. Hafs (yəni ibn Asim) belə demişdir: “İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Minada iki rükət namaz qılar , sonra yatağına girərdi. Ona: Ey əmi , ondan sonra da iki rükət qılsaydın” dedikdə, belə buyurdu: “Bunu etsəm , namazı tam qılmış olardım.” (Müslim / 694).

## Beşinci fəsil: Səfərdə iki namazı cəm etmək.

6- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərə çıxarkən tələsərdirsə , Zöhr namazını Əsrin birinci vaxtına gecikdirər və iki namazı cəm edərək qılardı. Məğrib namazını şəfəq itənə kimi gecikdirərək İsa namazı ilə cəm edərdi.” (Müslim / 704).

## Altıncı fəsil: Namazın daimi məskunlaşan yerində cəm edilməsi.

7- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zöhürlə Əsr namazını və Məğriblə İşa namazını Mədinədə ikən yağış və qorxu olmadan cəm etmişdir.” Vakinin hədisində isə belə rəvayət edilir: İbn Abbasdan: “Bunu nə üçün etdi?” deyə soruşdum. O: “Ümmətinə çətinləşdirmək istəmədiyi üçün” deyə cavab verdi.” Əbu Müaviyyənin hədisində isə: “ İbn Abbasa belə deyildi: “Belə etməklə nə qəsd edirdi?” O belə cavab verdi: “Ümmətinə çətin olmasın.” (Müslim / 705).

## Yeddinci fəsil: Yağış vaxtı evdə namaz qılmaq.

8- İbn Ömərdən (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edilir: “yağışlı və küləkli bir gecədə namaza azan verdi. Namazın sonunda belə çağırdı: “Namazı evlərinizdə qılın! Namazı evlərinizdə qılın!” Sonra isə belə dedi: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə soyuq olduğunda və ya səfərdə ikən yağışlı bir gecə olsaydı , müəzzinə belə deməyi əmr edərdi: “Namazı evlərinizdə qılın.” (Müslim / 697).

## Səkkizinci fəsil: Səfərdə nafilə namazların qılınmaması.

9- Hafs ibn Asim belə rəvayət edir: “İbn Ömərə (Allah ondan razı olsun) Məkkə yolunda yoldaşlıq etdim. Bizə Zöhr namazını iki rükət qıldırdı , sonra qalxaraq

getdi. Biz də onunla bərabər qalxdıq. Nəhayət gəlib miniyinin yanına çatdı. O , oturdu , biz də onunla bərabər oturduq. Birdən gözü namaz qıldığı yerə sataşdı və bir neçə insanın ayaqda durduğunu gördü. “Onlar nə edirlər?” deyə bizdən soruşdu. Biz: “Nafilə namaz qılırlar” deyə cavab verdikdə. O , belə buyrudu: “Mən nafilə qılsaydım , namazı tamamlardım” deyə cavab verdi” Sonra isə belə buyurdu: “Ey qardaşım oğlu , Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərində yoldaşlıq etdim .Allah Təala onun ruhunu alana kimi bu iki rükətdən artıq namaz qılmayıb. Həmçinin Əbu Bəkirlə səfərində yoldaşlıq etdim. O da Allah Təala onun ruhunu alana kimi bu iki rükətə əlavə etmədi. Ömərə də yoldaşlıq etdim və o da Allah Təala onun ruhunu alana kimi bu iki rükətə heç nə əlavə etmədi. Sonra Osmana da yoldaşlıq etdim O da Allah Təala onun ruhunu alana kimi bu iki rikətə heç nə əlavə etmədi. Allah Təala buyurur: “Həqiqətən, Allahın Rəsulu, qiyamət gününə ümid bəsləyənlər və Allahı çox zikr edənlər üçün gözəl örnəkdir!” (Müslim / 689).

## Doqquzuncu fəsil:  Minikdə nafilə namazı qılmaq.

10-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  dəvəsinin onu yönəltdiyi tərəfə doğru oturmuş halda nafilə və vitr namazını qılardı. Lakin miniyinin üzərində fərz namazları qılmazdı.” (Müslim / 700).

## Onuncu fəsil: Səfərdən qayıtdıqda məsciddə iki rükət namaz qılmaq haqda.

11- Cəbir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşlərinin birində bərabər idim. Dəvəm məni yavaşlatdı və ondan uzaq saldı. Ona görə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən qabaq çatdı. Mən isə gəlib səhər çatdım. Məscidə girdiyimdə , onu məscidin qapısında gördüm. Məndən: “Hələ indi çatmısan?” deyə soruşdu. Mən: “Bəli” deyə cavab verdikdə. O: “Dəvəni qoy və məscidə daxil olub iki rükət namaz qıl.” Mən məscidə daxil olaraq iki rükət namaz qıldım , sonra qayıtdım” (Müslim / 715).

## On birinci fəsil: Qorxu namazı haqda varid olan hədis.

12-Cəbir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Mən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Cüheynə qəbiləsindən olan bir qövmlə vuruşurduq. Döyüş çox şiddətli idi. Zöhr namazını qıldıqdan sonra müşrüklər belə dedilər: “Əgər onların üzərinə bir həmlə etsək , onları pərişan edərik.” Cəbrail (Ona Allahın salamı olsun) gəlib bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə müşriklərin belə dediklərini söylədi: “Bir azdan onlara uşaqlarından da çox sevdikləri namazın vaxtı gələcək.” Əsr namazının vaxtı daxil olduğunda , biz iki səff durduq. Müşriklər bizimlə qiblənin arasında idilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təkbir etdiyində , biz də təkbir etdik, ruku etdiyində, biz də ruku etdik, səcdəyə getdiyində , onunla birinci səff səcdəyə getdi, onlar qalxdığında , ikinci səff səcdəyə getdi.  Sonra birinci səff geriyə çəkildi və ikinci səff qabağa çıxaraq birinci səfin yerinə keçdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təkbir etdi və biz də təkbir etdik. Sonra rukuya getdiyinində , biz də rukuya getdik. Sonra O , səcdəyə getdi və birinci

səff onunla səcdə etdi , ikinci səff isə ayağa qalxdı. İkinci səff səcdə etdiyində , səfflərin ikisi də oturdu və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) salam verərək namazı bitirdi.” Əbu Zubeyr belə demişdir: “sonra Cabir xaslaşdıraraq belə buyurdu: “Bu gün onların əmirlərinin etdiyi kimi” (Müslim / 840)

## On ikinci fəsil: Kusuf namazı.

13- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əhdində günəş tutuldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxaraq namaz qıldı. Qiyamı çox uzatdı və sonra rukuya getdi və rukunu çox uzatdı. Sonra rukudan başını qaldırdı və qiyama durdu və qiyamı cox uzatdı. Bu , birinci qiyamdan daha qısa bir qiyam idi. Sonra rukuya getdi və rukunu cox uzatdı. Bu ruku birincidən daha qısa idi. Sonra səcdəyə getdi. Sonra qalxaraq qiyama durdu və qiyamı uzatdı. Bu birinci qiyamdan daha qısa idi. Sonra rukuya getdi və rukunu uzatdı. Bu birinci rukudan daha qısa idi. Sonra başını rukudan qaldıraraq qiyama durdu və qiyamı uzatdı. Bu birinci qiyamdan daha qısa idi. Sonra rukuya getdi və rukunu uzatdı bu birinci rukudan daha qısa idi. Sonra səcdəyə getdi. Sonra namazı bitirdiyində günəş artıq açılmışdı. İnsanlara xütbə verərək Allaha həmd sənalar dedi, sonra isə belə buyurdu: “Həqiqətən günəş və ay Allahın ayətlərindəndir (möcüzələrindəndir). Onlar kiminsə ölümü və həyatına görə tutulmaz. Onların tutulduğunu gördükdə təkbir edin, Allaha dua edib namaz qılın, sədəqə verin. Ey Muhəmmədin ümməti , qulunun və ya köləsinin zina etməsinə Allah Təalanın ğısqançlığı (qeyrəti) kimi heç kəsin qısqançlığı (qeyrəti) olmaz. Ey Mühəmmədin ümməti , əgər mənim bildiyimi bilsəydiniz , az gülüb şox ağlayardınız. Şahid olun ki , mən sizə çatdırdım.! (Müslim / 901).

14- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) günəş tutulduğunda səkkiz rükətli və dörd səcdəli bir namaz qılmışdır.” (Müslim / 908).

## On üçüncü fəsil:İstisqa (yağış) namazı.

15- Abdullah ibn Zeyd əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ibadətgaha çıxaraq yağış duası etdi. Dua etdikdə qibləyə tərəf çevrildi və əbasını tərsinə çevirdi.” Başqa bir rəvayətdə isə belə deyilir: “Arxasını insanlara çevirib üzünü qibləyə tərəf tutdu vəAllaha dua etdi. Sonra əbasını çevirib iki rükət namaz qıldı.” (Müslim / 894).

16- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə olduğumuz bir vaxtda bizi yağış tutdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) paltarını yağış suyunun ona dəyməsi üçün açdı. Biz ondan: “Ey Allahın elçisi nə üçün belə etdin?” deyə soruşduqda, O: “Bu yağış Rəbbimin yanından təzə enir” deyə cavab verdi”(Müslim / 898).

## On dördüncü fəsil: Küləklə bulud gördükdə Allaha sığınmaq. Yağış gördükdə isə sevinmək.

17- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şiddətli külək gördüyü vaxt belə deyərdi: “Allahım , səndən onun xeyirini, onda olanın xeyrini və onunla birlikdə

göndərilənin xeyrini diləyirəm. Onun şərindən , onda olanın şərindən və onunla birlikdə göndərilənin şərindən sənə sığınıram.” Səmanın dəyişdiyində və yağışın yağmağa başlamağa hazırlaşdığında rəngi dəyişər, evə girib-çıxar, gəlib gedərdi. Yağış yağdıqda isə sevinərdi. Mən bunu onun üzündən bilirdim.” Aişə (Allah ondan razı olsun) belə demişdir: “Bunun səbəbini ondan soruşduğumda , O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Ey Aişə , bəlkə bu bulud Ad qövmünün dediyi kimi (bir əzab) olur. Onlar vadilərində buludu gördüklərində, “bu bulud bizə yağış yağdıracaq “dedilər.” (Müslim / 899).

### On beşinci fəsil: Səba (Şərq) və  Dubur (Qərb) küləyi haqda.

18- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Mənə Səba küləyi ilə kömək edildi. Ad qövmü isə Dubur kuləyi ilə həlak edildi.” (Müslim / 900).

## Cənazələr kitabı

### Birinci fəsil: Xəstəni ziyarət etmək.

1- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə oturmuşduq. Birdən Ənsarlardan olan bir kişi Peyğəmbərin yanına gəldi, ona salam verdi. Sonra Ənsar çevrilib getdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu “Ey Ənsarların qardaşı , qardaşım Saad ibn Ubada necədir?“ Ənsar “Salehdir” deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Sizlərdən kim onu ziyarət edəcək?” O qalxdığında bizdə onunla birgə qalxdıq. On və bir neçə sayda kişi idik. Ayağımızda  nə çəkmə, nə xoff, başımızda nə təsək, əynimizdə də nə köynək var idi. Şoran torpaqda gedirdik. Nəhayət gəlib onun yanına çatdıq. Qövmü onun ətrafıdan çəkildi, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və onunla birgə gələnlər ona yaxınlaşdılar.” (Müslim / 925).

### İkinci fəsil: Meyit və xəstənin yanında deyilən zikr.

2- Ummu Sələmə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə  dediyini rəvayət edir: “Xəstəni və meyiti ziyarət etdiniyinizdə , xeyir söyləyin. Həqiqətən , mələklər sizin dediklərinizə “amin” deyirlər. Əbu Sələmə öldüyündə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək  belə dedim: “Ey Allahın elçisi , Əbu Sələmə vəfat etdi” O belə buyurdu: “Belə de: Allahım , məni və onu bağışla! Allahım , mənə ondan sonra gözəl bir əvəz nəsib et.” Və Allah Təala mənə ondan daha xeyirlisi ilə  Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əvəz etdi.” (Müslim /919).

### Üçüncü fəsil:  Ölənə “Lə İləhə İllə Allah”  deməsini təlqin etmək.

3- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ölüllərinizə “Lə İləhə İllə Allah” demələrini təlqin edin.” (Müslim / 916).

## Dördüncü fəsil: Hər kim Allahla qarşılaşmağı sevərsə, Allah da onunla qarşılaşmağı sevər.

4- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Hər kim Allahla qarşılaşmağı sevərsə, Allah da onunla qarşılaşmağı sevər. Və hər kim Allahla qarşılaşmağı ikrah edərsə, Allah da onunla qarşılaşmağı ikrah edər. Mən ondan: “Ey Allahın elçisi, ölümə ikrah etməyi deyirsənsə, hamımız ölümə ikrah edirik” O belə buyurdu: “ Elə deyil. Mömin bir bəndə Allahın Rəhməti, Razılığı və Cənnəti ilə müjdələndikdə, Allahla qarşılaşmağı sevər və Allah da onunla qarşılaşmağı sevər. Kafir bəndə isə Allahın əzabı və qəzəbi ilə müjdələndikdə, Allahla qarşılaşmağı ikrah edir və Allah da onunla qarşılaşmağı ikrah edir.”

Başqa bir rəvayətdə isə belə deyilir: “Şurey ibn Həni Əbu Hüreyrədən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər kim Allahla qarşılaşmağı sevərsə, Allah da onunla qarşılaşmağı sevər. Və hər kim Allahla qarşılaşmağı ikrah edərsə, Allah da onunla qarşılaşmağa ikrah edər.” Mən Aişənin (Allah ondan razı olsun) yanına gəlib ona belə dedim: “Ey möminlərin anası , Əbu Hüreyrənin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini zikr etdiyini eşitmişəm. Əgər onun dediyi kimidirsə, onda həlak olduq.” O belə buyurdu: “Həlak olmuş yalnız Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dediyi kimsədir. O nə demişdir?” Mən: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: “Hər kim Allahla qarşılaşmağı sevərsə, Allah da onunla qarşılaşmağı sevər. Və hər kim Allahla qarşılaşmağı ikrah edərsə, Allah da onunla qarşılaşmağı ikrah edər.” Bizdən elə bir kəs yoxdur ki , ölümə ikrah etməsin” deyə söylədikdə, O belə buyurdu: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə demişdir, lakin sənin anladığın kimi deyildir. Bu yalnız ölüm ayağında ikən gözlər səmaya dikildikdə, sinə xırıldadıqda, dərisinin tükləri biz –biz olanda, barmaqları qıc olduqda, bax o zaman “hər kim Allahla qarşılaşmağı sevərsə, Allah da onunla qarşılaşmağı sevər. Və hər kim Allahla qarşılaşmağı ikrah edərsə, Allah da onunla qarşılaşmağı ikrah edər.” (Müslim / 2684 - 2685).

## Beşinci fəsil: Ölüm ayağında ikən Allah Təala haqda yaxşı zənndə olmaq.

5- Cəbir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ölməmişdən üç gün öncə belə dediyini eşitdim: “Sizlərdən biriniz Allah Təala haqda yaxşı zənn etməyincə, ölməsin.” (Müslim / 2877).

## Altıncı fəsil: Ölünün gözlərini bağlanması və orada olan kimsənin onun üçün dua etməsi.

6- Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Sələmənin yanına daxil olduğunda , artıq onun gözləri çevrilmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun gözlərini bağladıqdan sonra belə buyurdu: “Həqiqətən Ruh bədəndən çıxdıqda , göz onun arxasınca baxar.”

Onun əhlidən olan bəzi insanlar fəryad etdikdə , O belə buyurdu: “ Nəfsinizə xeyirdən başqa bir sey söyləməyin. Həqiqətən mələklər sizin söylədiklərinizə “amin” deyirlər.” Sonra isə belə buyurdu: “Allahım , Əbu Sələməni bağışla, onu doğru yola yönəltiklərinin dərəcəsinə yüksəlt! Arxasında qoyduğu kimsələrə sən sahib çıx. Ey Aləmlərin Rəbbi bizi və onu bağışla! Onun qəbrini geniş və nurlu et!” (Müslim / 920).\

## Yeddinci fəsil: Meyitin üzərinin örtülməsi.

7- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdiyində , yəmən parçası olan bir parça ilə örtüldü.” (Müslim / 942).

## Səkkizinci fəsil: Möminlərin və kafirlərin ruhları haqda.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Möminin ruhu çıxdığında onu iki mələk götürər və yuxarı qaldırar.” Həmməd belə demişdir: “Onun gözəl ətir və misk iyini zikr edərək səma əhli belə deyər: “Yerdən gələn gözəl ruh. Sənə və içində yaşatdığın cəsədə Allahın salamı və salavatı olsun.” Onu götürüb rəbbinin yanına apararlar. Sonra onlara belə deyilir: “onu sonuncu əcəlinə aparın” Kafirin ruhu çıxdığında Həmməd belə demişdir: “Onun pis qoxusunu zikr edərək və lənətləyərək, Səma əhli belə deyər: “Yer üzündən gəlmiş xəbis ruh. Sonra: “onu götürüb axır əcəlinə aparın” deyərlər.” Əbu Hüreyrə belə buyurmuşdur: “Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) burnunu üzərində olan nazik paltarı götürdü.” (Müslim / 2872).

## Doqquzuncu fəsil: Müsübət baş verdiyi anda səbr etmək.

9- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ölmüş uşağı üçün ağlayan bir qadının yanına gələrək ona belə buyurdu: “Allahdan qorx və səbr et”. Qadın ona: “Mənim müsibətim sənin nə vecinədir?” O getdiyində qadına onun Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) olduğunu xəbər verdilər. Qadın içinə ölüm acısı çökmüş kimi oldu və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qapısına gəldi. Onun qapsında qapıçıların olmadığını gördü və Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ey Allahın Elçisi , səni tanımadım.” Deyə söylədikdə, O belə cavab verdi: “Müsübət baş verdiyi anda səbr edilir”. Başqa bir rəvayətdə isə belə deyilir: “İlk anında baş verdikdə.” (Müslim / 926).

## Onuncu fəsil: Övladı ölən kimsənin səbr etməsinin savabı haqda.

10- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarlardan olan qadınlara belə dediyini rəvayət edir: “Sizlərdən hər hansınızın üç övladı ölər və ona səbr edərsə , Cənnətə daxil olar.” Qadınlardan biri ona: “Ey Allahın Elçisi , ikisi ölənə də?” deyə soruşduqda, O: “İkisi ölənə də” deyə cavab verdi.” Ondan başqa isnadla belə rəvayət olunur: “Sizlərdən hər hansınızın üç övladı ölərsə , cəhənnəmə girməz, yalnız o and verib , andını pozduğu qədər.” (Müslim / 2632)

## On birinci fəsil: Müsibət baş verdiyinində deyilən zikr haqda.

11- Umu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “Hər hansı bir qul ona bir müsübət baş verdiyində: “İnnə lilləhi və innə ileyhi raciun. Allahummə əcirni fi musibəti. Vaxlufli xeyran minha ” (Biz Allaha məxsusuq və Ona da qayıdacağıq! Allahım! Başıma qələn müsibət sayəsində məni mükafatlandır və əvəzinə ondan da xeyirlisini ver!) deyərsə, Alah Təala ona müsibətinə görə əcr verər və ona bundan daha xeyirlisi ilə əvəz edər.” Əbu Sələmə vəfat etdiyində Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə öyrətdiyi kimi dedim və Allah Təala mənə ondan da xeyirlisi ilə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əvəz etdi.” (Müslim / 918).

## On ikinci fəsil: Meyitin arxasınca ağlamaq.

12-Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Saad ibn Ubadə xəstəliyi üzündən şikayətləndi (rahatsız oldu). Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Abdurrahman ibn Ovf, Sad ibn əbu Vaqqas və Abdullah ibn Məsudla birgə onu ziyarətə gəldi. Yanına daxil olduğunda, özündə deyildi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Öldümü?” deyə soruşdu. Ona: “Xeyr , Ey Allahın Elçisi” deyə cavab verdiklərində , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağladı. Camaat Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağlamağını gördükdə, onlar da ağlamağa başladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Allah Təala göz yaşlarına və qəlbin kədərlənməsinə görə əzab verməz - əli ilə dilinə işarə edərək - Lakin buna görə ya əzab və ya rəhm edər.” (Müslim / 924).

## On üçüncü fəsil: Şivən qoparmağın şiddətli olması.

13-Əbu Malik əl-Əşari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ümmətimdə cahiliyyə adətlərindən qalma dörd şey vardır ki, onları tərk etməzlər: Nəsl–nəcabəti ilə öyünmə, nəsəblərə tənə etmə, ulduzlardan yağış diləmək və şivən qoparmaq. Sonra isə belə buyurdu: “Şivən qoparan etdiyi əmələ görə tövbə etməzsə, qiyamət günü (qəbrindən) qalxdığında əyninində qətrandan şalvar və ağrı verici bir zireh olacaqdır.” (Müslim / 934).

## On dördüncü fəsil: Üzünü döyən və cibini cıran bizdən deyil.

14-Abdullah ibn Məsud (Allah ondan razı olsun) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Üzünü döyən və ya cibini cıran və ya cahilliyə adətlərinə çağıran bizdən deyildir.” Başqa bir rəvayətdə isə: “cıran və çağıran” (Müslim / 103).

## On beşinci fəsil: Meyit diri olan kimsələrin göz yaşlarına görə əzab olunur.

15- Umara bintu Abdurrahman (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Aişəyə (Allah ondan razı olsun) Abdullah ibn Ömərin: “Meyit diri olan kimsələrin göz yaşlarına görə əzab olunur” deməsini xatırlatdıqda, onun belə dediyini eşitmişdim: “Allah Təala Əbu Abdurrahmanı bağışlasın , o yalan danışmaz , lakin unudar və ya xəta edər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), üzərində ağlayan bir yəhudi qadının qəbrinin yanından keçdiyində belə buyurdu: “Onlar onun üçün ağlayırlar , halbu ki, o , qəbrində əzab olunur” (Müslim / 932).

## On altıncı fəsil: Rahat olan və ondan rahatlanan haqda.

16- Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir cənazənin yanından keçdikdə belə buyurdu: “Rahat olan və ondan rahatlanan”. Ona: “Ey Allahın Elçisi , rahat olan və ondan rahatlanan nədir?” deyə soruşdular. O belə cavab verdi: “Mömin bəndə dünyanın yorğunluğundan rahat oldu. Facir (kafir) bəndədən isə başqa bəndələr, ölkələr, ağac və heyvanlar rahat oldular.” (Müslim \ 950).

## On yeddinci fəsi: Meyiti yumaq haqda.

17- Ummu Atiyyə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızı Zeynəb vəfat etdiyində, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə buyurdu:”Onu tək sayda olmaqla üç və ya beş kərə yuyun. Beşincisində isə ona kəfur və ya kəfur kimi bir şey vurun. Yuyub qurtardığınızda mənə xəbər verin.” Biz ona xəbər verdikdə , bizə parçadan bir örtuyunu verərək “Bunu onun bədəninə sarın” deyərək əmr etdi.” (Müslim / 939).

## On səkkizinci fəsil: Meyitin kəfənlənməsi haqda.

18- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) pambıqdan olan üç düm ağ parçayla kəfənləndi. Onda nə köynək, nədə əmmamə var idi. Hülləyə (yəmən parcasından olan bədənin yuxarı və aşağı hissəsini örtmək üçün istifadə olunan geyim) gəlincə isə insanlar onun Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kəfənləmək üçün alınmasına şübhəyə düşdüklərində tərk olundu və O üç ağ pambıqdan olan bir parçayla kəfənləndi. Hülləni Abdullah ibn Əbu Bəkir götürərək: “Bunu özümü kəfənləsinlər deyə , saxlayacağam” dedi. Lakin sonra: “Allah Təala bunu Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün razı olsaydı, onda kəfənləyərdi” deyib onu satdı və pulunu sədəqə etdi.” (Müslim / 931).

## On doqquzuncu fəsil: Meyitin kəfəni yaxşı olması haqda.

19- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün xütbə verərkən , əshabından olan bir kişinin naqis, pis bir kəfəndə kəfənlənərək gecə dəfn edildiyini xatırlatdı. Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kişinin cənazə namazı qılınmadan gecə basdırılamsını qadağan etdi. Yalnız insanın bunu , zərurət olduğunda , etməsinə izn verdi. Və belə

buyurdu: “Sizlərdən biriniz qardaşını kəfənlədikdə, onun kəfənini yaxşı bir kəfəndən etsin.” (Müslim / 943).

### İyirminci fəsil: Cənazənin basdırılmasında tələsmək.

20- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Cənazəni basdırmağa tələsin , çünki saleh bir bəndə olsa , ona xeyirli bir şeyi yaxınlaşdırırsınız, əgər saleh deyilsə , şər bir şeyi çiyinlərinizdən atırsnız.” (Müslim / 944).

### İyirmi birinci fəsil: Qadınlara cənazənin ardınca getməyin qadağan olması.

21-Ummu Atiyyə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bizə cənazənin ardınca getmək qadağan edildi , lakin əzm (təkid) olunmadı.” (Müslim / 937).

### İyirmi ikinci fəsil: Cənazə üçün durmaq.

22-Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: “Yanımızdan bir cənazə keçdi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayağa qalxdı. Biz də onunla birgə qalxdıq. Ona: “Ey Allahın Elçisi , bu yəhudi bir qadının cənazəsidir” deyə söylədikdə , belə buyurdu: “Həqiqətən ölüm birdən gəlir, cənazə gördüyünüzdə onun üçün qalxın.” (Müslim / 970).

### İyirmi üçüncü fəsil: Cənazə üçün durmağın hökmünün ləvğ olunması.

23-Əli (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) durduğunu görüb durduq. Oturduğunu görüb oturduq. Yəni Cənazə üçün.” (Müslim / 962).

### İyirmi dördüncü fəsil: Cənazə namazında imamın cənazənin hansı tərəfində durması.

24-Samura ibn Cundub (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arxasında nifas halında ölmüş Ummu Kəbəyə cənazə namazı qıldım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza onun bədəninin orta hissəsi tərəfdə durdu.” (Müslim / 964).

### İyirmi beşinci fəsil: Cənazə namazında edilən təkbir haqda.

25-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Nəcaşi öldüyü gün insanlara onun öldüyünü xəbər verdi və onlarla birgə ibadətgaha çıxaraq dörd təkbir edib ona cənazə namazı qıldı.” (Müslim / 951).

### İyirmi altıncı fəsil: Cənazə namazında beş dəfə təkbir etmək haqda.

26- Abdurrahman ibn Əbu Leylə (Allah ondan razı olsun) belə rəvayət edir: “Zeyd cənazəyə namaz qılarkən dörd dəfə təkbir edərdi. Bir dəfə cənazədə beş dəfə təkbir etdi. Ondan bu haqda soruşduğumda, mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə təkbir etdiyini söylədi.” (Müslim / 957).

## İyirmi yeddinci fəsil: Meyit üçün oxunan dua.

27-Auf ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir cənazəyə namaz qıldı. Onun belə dua etdiyini əzbərlədim: “Allahım! Onu bağışla, ona rəhm et, ona salamatlıq ver, onu əfv et. Onu gözəl tərzdə qarşıla, onun yerini geniş et! Onu su, qar və dolu ilə yu. Ağ paltarı kirdən təmizlədiyin kimi onu da günahlarından təmizlə! Ona evinin əvəzinə daha xeyirli bir ev, ailəsinin əvəzinə daha xeyirli bir ailə, zövcəsinin əvəzinə daha xeyirli bir zövcə ver. Onu cənnətə daxil et! Onu qəbr və Cəhənnəm əzabından qoru!” Hətta mən o cənazənin yerində olmağı arzuladım.” (Müslim / 963).

## İyirmi səkkizinci fəsil: Cənazə namazını məsciddə qılınması.

28-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Sad ibn əbu Vaqqas (Allah ondan razı olsun) vəfat etdiyində Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələri onun cənazəsinin məscidə daxil olunması və ona orada namaz qılmaları üçün adam göndərdilər. Onu gətirdilər və iki otağın qabağına qoydular. Onlar namaz qıldıqdan sonra onu oturacağa yaxın cənazə qapısından çıxarıb apardılar. Onlara insanların bunu eyb edərək: “Bundan öncə cənazə məscidə salınamazdı” xəbəri çatdı. Aişə (Allah ondan razı olsun) bu xəbəri eşitdikdə belə buyurdu: “İnsanlar haqqında elmləri olmadıqları şeyi eyb etməyə tələsiblər. Bizə cənazəyə məsciddə namaz qılmağımızı eyb etdilər, məgər Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Suheyl ibn Beydəyə məscidin içində namaz qılmamışdır?” (Müslim/973).

## İyirimi doqquzuncu fəsil: Qəbirin üzərində cənazə namazı qılmaq.

29-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Qara bir qadın və ya cavan bir oğlan məscidi təmizləyirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün onu görmədiyində , onun haqda soruşdu. Onun öldüyünü ona xəbər verdiklərində , belə buyurdu: “Mənə xəbər verə bilməzdiniz? “ Sanki onlar bunu kiçik bir şey saydılar. O: “Mənə onun qəbrini göstərin” deyə buyurdu. Ona onun qəbri göstərildikdə , ona (cənazə) namazı qıldı, sonra isə belə buyurdu: “Bu qəbirlər əhli üçün zülümətlərlə doludur. Allah Təala mənim onlara qıldığım namazımla onların qəbrlərini nurlandırır.” (Müslim / 956).

## Otuzuncu fəsil: Özünə qəsd edən haqda.

30- Cabir ibn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına özünü qayçı ilə öldürən birini gətirdilər , ona cənazə namazı qılmadı.” (Müslim / 978).

## Otuz birinci fəsil: Cənazə namazının və cənazənin ardınca getmənin fəziləti.

31-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Cənazəni, ona namaz qılınana kimi müşayət edən kəsə Qirat (savab) vardır. Cənazə namazını qılıb , onu basdırana kimi müşayət edənə isə , iki Qirat (savab) vardır.” Ondan: “İki Qirat

nədir?” deyə soruşulduqda, O: “İki böyük, əzəmətli dağ” deyə cavab verdi.” (Müslim / 945).

## Otuz ikinci fəsil: Cənazəsinin yüz nəfərin qılması onun üçün şəfaət olması.

32- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər hansı bir meyitə yüz nəfər cənazə namazı qılsa , və onun üçün şəfaət (dua etsə) istəsə, onların şəfaəti qəbul olar.” (Müslim / 947).

## Otuz üçüncü fəsil: Cənazəsinin qırx nəfərin qılması onun üçün şəfaət olması.

33- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Onun oğlu (Qudeyd və ya Usfan) öldüyündə belə buyurdu: “Ey Kureyb , çıx bir bax gör onun üçün nə qədər adam yığışıb?” Mən çıxıb baxdığımda insanlar toplaşmışdı. Bunu gəlib ona xəbər verdiyimdə, məndən: “Onlar qırx nəfər olarmı?” deyə soruşdu. Mən “Bəli” deyə cavab verdiyimdə, O belə buyurdu: “Onu çıxardın! Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: “Ölmüş hər hansı müsəlman bir kişinin cənazə namazını, Allaha şərik qoşmayan qırx kişi qılarsa, Allah Təala onları onun üçün şəfaətçi edər.” (Müslim/948).

## Otuz dördüncü fəsil: Ölənlərdən kimi xeyir, kimi isə şərlə xatırlanması.

34- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Yanımızdan bir cənazə keçdi. Onu xeyir ilə xatırladıqda , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) “Vacib oldu! Vacib oldu! Vacib oldu!” deyə buyurdu. sonra başqa bir cənazə keçdiyində , onu şər ilə xatılladıqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) “Vacib oldu! Vacib oldu! Vacib oldu!” deyə buyurdu. Ömər (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Atam, anam sənə fəda olsun , bir cənazə keçdi , onu xeyirlə xatırladılar ,”Vacib oldu! Vacib oldu! Vacib oldu!” dedin. Sonar başqa bir cənazə keçdiyində, onu şərlə xatırladıqlarında “Vacib oldu! Vacib oldu! Vacib oldu!” dedin” deyərək ondan bu haqda soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə cavab verdi: “Kimi xeyirlə xatırladınız , ona Cənnət vacib oldu. Kim də şərlə xatırladınız , ona Cəhənnəm vacib oldu. Siz Allahın yer üzərindəki şahidlərisiniz. Siz Allahın yer üzərindəki şahidlərisiniz. Siz Allahın yer üzərindəki şahidlərisiniz.” (Müslim / 949).

## Otuz beşnci fəsil: Cənazə namazı qılan kimsənin namazdan sonra miniyə minməsi.

35- Cabir ibn Səmura (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İbn əd-Dəhdəhəyə cənazə namazı qıldı , sonra isə ona çılpaq bir at gətirdilər. Atı tutaraq Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun tərkinə mindi. O atının üzərində düzələrək gedirdi biz də onun arxasından tez-tez gedirdik. Camaatdan bir kişi belə dedi: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “İbn Dəhdəh üçün cənnətdə nəqədər asılmış və sallanmış xurmalar vardır.” (Müslim / 965).

## Otuz altıncı fəsil: Qəbrə məxmər bir parça qoymaq.

36-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qəbrinə qırmızı bir məxmər qoyuldu.” (Müslim / 967).

## Otuz yeddinci fəsil: Ləhd (qəbrin içinin meyit qoymaq üçün yan tərəfinin qazılması) və qəbrin üzərində daş lövhə qoyulması.

37-Amir ibn Sad (Allah ondan razı olsun) belə rəvayət edir: “Sad ibn Əbu Vaqqas (Allah ondan razı olsun) vəfat etdiyi xəstəliyi ərəfəsində belə buyurdu: “Mənim qəbrimi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) edilən kimi ləhd qazın və üzərimə daş lövhə qoyun” (Müslim / 966).

## Otuz səkkizinci fəsil: “Qəbirin yerlə bir səviyyədə olması.”

38-Əbu əl-Həyyac əl-Əsədi belə rəvayət edir: “Əli ibn Əbu Talib (Allah ondan razı olsun) mənə belə buyurdu: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə əmr edərək göndərdiyi kimi sənə də bir şeyi əmr edərək göndərməyimi istəyirsənmi? Dağıtmadığın heç bir heykəl və yerlə bir səviyyədə etmədiyin heç bir yüksək qəbir qoyma.” (Müslim / 969).

## Otuz doqquzuncu fəsil: Qəbrin gipslənməsi və üzərinə bina edilməsinin qadağan olunması.

39-Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qəbrin gipslənməsini, üzərində oturulmasını və onun üzərinə bina edilməsini qadağan etdi.” (Müslim / 970).

## Qırxıncı fəsil: Ölmüş bir kəsə (Cənnət və ya Cəhənnəmdə ki) yerinin səhər və axşam göstərilməsi.

40-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buturdu: “Sizlərdən biriniz öldüyü zaman , səhər və axşam ona (Cənnət və ya Cəhənnəmdəki) yeri göstərilər. Əgər Cənnət əhlinəndirsə, deməli Cənnət əhlinəndir. Əgər Cəhənnəm əhlindəndirsə, deməli Cəhənnəm əhlindəndir. Ona: “Bu , Allah Təalanın qiyamət günü yenidən dirildiyindən sonra ki, yerindir.” deyiləcək.” (Müslim / 2866).

## Qırx birinci fəsil: Bəndə qəbrə qoyulduqda iki mələyin ona verəcəyi sual haqda.

41-Ənəs ibn Məlik (Allah ondan razı olsun) “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bəndə qəbrə qoyulduqdan sonra , əhli ondan uzaqlaşdığında onların ayaq səslərini eşidir (başqa bir rəvayətdə isə belə dedyilir: “onlar getdiyi zaman). Sonra iki mələk gələrək oturduqda ondan belə soruşurlar: “Bu kişi haqda nə deyirdin?” Mömin olan bir kəs olsa , belə deyəcək: “Şəhadət edirəm ki , O , Allahın qulu və Elçisidir.” Sonra isə ona belə deyilir: “Cəhənnəmdə olan yerinə bax! Artıq Allah Təala sənin üçün onu Cənnətdən bir yerlə əvəz etmişdir.” Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “O , onların hamsını görəcəkdir.” Qatədə belə buyurmuşdur: “ bizə belə söyləndi: “Qəbri onun üçün

yetmiş dirsək genişlənər və qiyamət gününə kimi onun üçün yaşıl nemətlərlə doldurular." (Müslim / 2870).

## Qırx ikinci fəsil: Allah Təala buyurur: "Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə sabitqədəm edər." Yəni qəbirdə

42- Bara ibn Azib (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah Təala buyurur "Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə (kəlmeyi-şəhadətlə) sabitqədəm edər.» Sonra isə belə dedi: "Bu (ayə) qəbir əzabı haqda nazil olmuşdur. Ona: "Sənin Rəbbin kimdir?" deyə soruşulduqda, O belə cavab verəcək: "Rəbbim Allahdır. Muhəmməd (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) peyğəmbəridir. Allah Təalanın ayədə buyurduğuda budur: "Allah iman gətirənləri dünyada da, axirətdə də möhkəm bir sözlə (kəlmeyi-şəhadətlə) sabitqədəm edər" (Müslim / 2871).

## Qırx üçününcü fəsil: Qəbir əzabı və ondan Allaha sığınmaq.

43-Zeyd ibn Səbit (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəfə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qatırın üzərində Bəni Nəccar qəbiləsinin ərazisindəikən biz də onunla bərabər idik. Birdən qatır yoldan çıxıb qaçdı , az qaldı ki , onu üzərindən atsın. Və O altı , və ya beş , və ya dörd qəbir gördü. (əl- Cureyri belə danışırdı) O: "Bu qəbir sahiblərini kim tanıyır?" deyə soruşduqda, bir kişi: "Mən" deyə cavab verdi." O yenidən: "Onlar nə zaman ölmüşlər?" deyə soruşduqda, O: "Cahilliyə (şirk) zamanında" deyə cavab verdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən , bu ümmət qəbirlərində imtahan olunur. Əgər basdırmağı tərk edəcəyinizdən qorxmasaydım, Allaha dua edib sizə də mənim eşitdiyim qəbir əzabını eşitdirməsini diləyərdim." Sonra üzünü bizə çevirib belə dedi: "Cəhhənnəm əzabından Allaha sığının!" Onlar: "Cəhənnəmin əzabından Allaha sığınırıq" dedikdə, O belə dedi: "Qəbir əzabından Allaha sığının!" Onlar: "Qəbir əzabından Allaha sığınırıq" dedilər. Sonra O belə dedi: "Aşkar və gizli fitnələrdən Allaha sığının." Onlar: "Aşkar və gizli fitnələrdən Allaha sığınırıq" dedikdə, O belə buyurdu: "Dəccalın fitnəsindən Allaha sığının!" Onlar: "Dəccalın fitnəsindən Allaha sığınırıq" dedilər." (Müslim/2867).

## Qırx dördüncü fəsil: Yahudilərin qəbirdə əzab olmaları.

44-Əbu Eyyub (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) günəş batdıqdan sonra bayıra çıxdığında bir səs eşitdi və belə buyurdu: "Yəhudilərə qəbirlərində əzab verilir." (Müslim / 2869).

## Qırx beşinci fəsil: Qəbirləri ziyarət etmək və onlar üçün bağışlanma diləmək.

45-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) anasının qəbrini ziyarət etdiyində ağladı və ətrafındakıları da ağlatdı. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Rəbbimdən onun üçün bağışlanma diləmək üçün izn istədim, mənə izn vermədi. Sonra onun qəbrini ziyarət etmək

üçün izn istədim, mənə izn verdi. Qəbirləri ziyarət edin, çünki bu , axirəti xatırladır.” (Müslim / 976).

46-Bureydə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Mən sizə qəbirləri ziyarət etməyi qadağan etmişdim, artıq (izn verdim) qəbirləri ziyarət edin! Sizə qurban ətlərini üç gündən artıq saxlamağı qadağan etmişdim, artıq istədiyiniz qədər saxlayın! Sizə dəri su qablarından başqa qablarda nəbiz (xurma şirəsi) düzəltmənizi qadağan etmişdim. Artıq bütün qablarda nəbiz düzəldin. Sərxoşedici içkiləri də içməyin.” (Müslim / 977).

## Qırx altıncı fəsil: Qəbirisanlıq əhlinə salam vermək, onlara rəhmət diləmək və onlar üçün dua etmək.

47-Muhaməd ibn Qeys (Allah ondan razı olsun) bir gün belə buyurdu: “Sizə anam və mənim haqda bir şey xəbər verimmi? Biz onun onu dünyaya gətirən anasını qəsd etdiyini zənn etdik. O belə dedi: “Aişə (Allah ondan razı olsun) belə demişdir: “Sizə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və mənim haqda danışımmı?” deyə bizdən soruşduqda, biz: “Bəli” deyə cavab verdik.” O belə buyurdu: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim növbəm olan bir gecədə əbasını çıxarıb yerə qoydu. Sonra ayaqqablarını çıxararaq ayaqlarının yanına qoydu və izarının (bədənin aşağı tərəfini bağlayan geyim) bir ucunu yatağına sərərək uzandı. Çox keçmədən mənim yatdığımı zənn edərək yavaşca əbasını götürdü və sakitcə ayaqqablarını götürərək qapını yavaşca açdı çıxdı və yavaşca örtdü. Mən paltarımı başıma keçirərək başımı bağladım və izarıma bürünərək onun dalınca getdim. Gəlib Bəqi qəbiristanlığına çatdım. O dayanmışdı. Ayaq üstə uzun bir müddət dayandı. Sonra üç kərə əllərini yuxarı qaldırdı və sonra geri qayıtığında mən də geri qayıtmağa başladım. Sürətini artırdıqda, mən də sürətimi artırdım. O qaçmağa başladığında, mən də qaşmağa başladım. O dahada sürətlə qaçmağa başladığında mən də daha da surətlə qaçaraq ondan qabaq evə girdim və yalnızca yerimə uzandım. O evə daxil olaraq məndən: “Ey Aişə , sənə nə olub təngnəfəssən, dərindən nəfəs alırsan” deyə soruşduqda, mən: “Heç bir şey” deyə cavab verdim. O belə buyurdu: “Ya sən mənə xəbər verəcəksən , ya da ki , hər şeydən xəbərdar olan , lütf sahibi olan Allah mənə xəbər verəcək. Mən: “Ey Allahın Elçisi , atam anam sənə fəda olsun” deyə ona xəbər verdiyimdə, mənə: “Qabağımda gördüyüm qaraltı sən idin?” deyə soruşdu. Mən: “Bəli” deyə cavab verdikdə, əli ilə sinəmi sığdı və sinəmi ağrıtdı sonra belə buyurdu: “Allahın və Rəsullunun sənə zülm edəcəyinimi zənn etdin?” Mən belə dedim:” İnsanlar nə gizlədirlərsə , hər bir şeyi Allah Təalə bilir, doğrudu.” O belə buyurdu: “Sən gördüyn zaman Cəbrail (ona Allahın salamı olsun) yanıma gəldi və məni çağırdı və bunu səndən gizltətdi. Mən ona cavab verdim və bunu səndən gizlətdim. Sən soyunduğun halda ikən yanına girəməzdi ki. Yatdığını zənn etdim. Yuxuda qorxmağından qorxdum və səni oyatmaq istəmədim. Rəbbim mənə Bəqi qəbiristanlğına gəlib onun əhli üçün bağışlanma diləməmi əmr etdi.” Mən ondan: “Ey Allahın Elçisi , onlara nə deyim?” deyə soruşduqda, O belə buyurdu: “De: “Ey bu diyarın mömin və müsəlman sakinləri! Sizə salam olsun. Allah bizdən əvvəl genlərə və qalanlara rəhmət etsin. Allahım istəsə , biz də sizə qovuşacayıq.” (Müslim/974).

## Qırx yeddinci fəsil: Qəbirlərin üzərində oturmaq və onlara tərəf namaz qılmaq.

48-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən birinizin

közün üzərində oturub paltarını yandırması və (yanığın) dərisinə keçməsi onun üçün hansısa bir qəbirin üzərində oturmasından daha xeyirlidir.” (Müslim / 971).

49-Əbu Mərsəd əl-Ğanəvi (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Qəbirlərin üzərində oturmayın və onlara tərəf namaz qılmayın.” (Müslim / 972).

### Qırx səkkizinci fəsil: Təriflənən saleh bir kişi haqda.

50-Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşuldu: “Ey Allahın elçisi , bir kişi xeyirli bir əməl etdiyində, insanların onu tərifləməsinə nə deyirsən?” O: belə cavab verdi: “Bu , mömin üçün bu dünyada bir müjdədir.” (Müslim / 2642).

## Zəkat kitabı

### Birinci fəsil: Zəkatın vacib olması.

1- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Muaz (Allah ondan razı olsun) belə demişdir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni (Yəmənə) elçi olaraq göndərdiyində belə buyurdu: “Sən Kitab əhli olan bir qövmün yanına gedirsən. Onları Allahdan başqa ibadətə layiq məbud olmadığına və mənim Onun Elçisi olduğma şəhadət vetməyə dəvət et. Əgər onlar buna itaət etsələr, Allah Təalanın onlara gün ərzində beş namazı fərz buyurduğunu xəbər ver. Əgər onlar buna itaət etsələr, onda Allah Təalanın onların varlılarından götürülərək kasıblarına verilən bir sədəqə (zəkat) vacib buyurduğunu xəbər ver. Əgər onlar buna itaət etsələr , onda malın ən nəfis olanını götürməkdən çəkin! Habelə məzlumun duasından qorx. Həqiqətən Allahla məzlumun duası arasında pərdə yoxdur.” (Müslim/19).

### İkinci fəsil: Zəkat çıxarılan mal: “ticarətmalı, qızıl, gümüş, bitki və mal-qara” haqda.

2- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: “dənli bitkilər və xurma beş vəsəq (çəki vahidi) olmayınca onda zəkat yoxdur. Üç yaşdan yuxarı olmaqla beş dəvədən azda zəkat yoxdur. Beş uqiyyə (gümüş pul vahidi) gümüşdən azda zəkat yoxdur.” (Müslim / 979).

### Üçüncü fəsil: hansı şeydən onda bir və ya onda birin yarısı qədər zəkat çıxarılması.

3- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitdim: “çay və bulud suyu ilə suvarılmış məhsullarda onda bir, heyvanla suvarılan məhsullardan onda birin yarısı qədər zəkat çıxarılır.” (Müslim /981).

### Dördüncü fəsil: Müsəlmana sahib olduğu quluna və atına görə zəkat yoxdur.

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Müsəlmana sahib olduğu quluna və atına görə zəkat yoxdur.” (Müslim / 982).

## Beşinci fəsil: Zəkatın tezləşdirilməsi və heç verilməməsi haqda.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Oməri zəkat yığmağa göndərdi: İbn Cəmilin, Xalid ibn Validin və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əmisi Abbasın zəkat verməddiyi deyidiyində, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “İbn Cəimili qəzəblədirən (Zəkat yıqana) nədir ki, halbu ki, o kasıb ikən Allah Təala onu varlı etdi. Xalidə gəlincə isə , siz Xalidə zülm edirsiniz, o zirehini və döyüş alətlərini Allah yonunda saxlamışdır. Abbasa gəlincə isə , onun zəkatı və onun misli bərabərində olanı mənim üzərimdədir. “Sonra isə belə buyurdu: “Ey Ömər , məgər kişinin əmisi, atası misalında olduğunu bilmirsənmi?”. (Müslim / 983).

## Altıncı fəsil: Zəkat verməyən haqda.

6- Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Kəbənin kölgəsində oturmuş ikən onun yanına gəldim. Məni görəndə: “Kəbənin Rəbbinə and olsun ki, xəsarət içindədirlər” - dedi. Gəlib onun yanında əyləşdim. Yerimdə qərar tutmamışdım ki, durdum və ona belə dedim: “Ey Allahın Elçisi , atam anam sənə fəda olsun , onlar kimdir? O belə buyurdu: “Onlar çox mal-mülk sahibləridir. Yalnız bu və bu və bu ( deyənlərdən başqa (Önümdən və arxamdan, sağımdan və solumdan) onlar necə də azdılar. Sonra isə belə buyurdu: “elə dəvə və inək sahibi olan bir kəs yoxdur ki, malının zəkatını verməzsə, qiyamət günü onun heyvanı olduğundan daha əzəmətli və daha kök bir şəkildə gələcək və onu buynuzları ilə vuracaq, bütün dırnaqları ilə tapdalayacaqdır. Sonuncu heyvan qurtardıqda əvvəlki heyvanlar yenidən ona qayıdacaq və bu insanlar arasında hököm bitənə qədər davam edəcəkdir.” (Müslim / 990).

7- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Elə bir qızıl və gümüş sahibi yoxdur ki, onun (malının) haqqını verməddikdə, qiyamət günü onlar onun üçün oddan lövhələrə cevrilib və cəhənnəm odunda qızardılaraq sahibinin yanı, alnı və kürəyi damğalanmasın. Bu lövhələr hər dəfə soyuduqda miqdarı bir günü əlli min il olan, insanlar arasında hökm verilən günə kimi sahibinə əzab üçün yenidən əvvəlki halına qaytarılar. Sonra nəhayət ona gedəcəyi Cənnət ya da Cəhənnəm yolu göstərilər.” Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ey Allahın Elçisi , dəvə sahibləri də?” deyə soruşulduqda, O belə buyurdu: “Elə dəvə sahibi yoxdur ki , dəvəsinin haqını verməddikdə - dəvənin haqqı süd başına gəldiyi gün sağılması - qiyamət günu o , üzü və ya beli üstə sərilib duz və geniş olan bir sahəyə atılmasın. Bir dəvə balası belə qalmamaq şərti ilə onu ayaqları ilə əzib, ağızları ilə dişləyəcəklər. Sonuncular qurtardıqda, əvvəlkilər qayıdacaq, beləcə miqdarı bir günü əlli min il olan bəndələr arasında hökm verilən günə kimi, sahibinə əzab üçün yenidən əvvəlki halına qaytarılar. Sonra nəhayət , ona gedəcəyi Cənnət ya da Cəhənnəm yolu göstərilər. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ey Allahın Elçisi , inək və qoyun sahibləri də?” deyə soruşulduqda.” O belə buyurdu: “Elə inək və qoyun sahibi yoxdur ki , malının haqqını verməddikdə , qiyamət günu o üzü və ya beli üstə sərilib duz və geniş olan bir sahəyə atılmasın. Bir buynuzu əyri, buynuzsuz və buynuzu sınıq heyvan qalmamaq şərti ilə onu buynuzları ilə vuracaq, və bütün dırnaqları ilə

tapdalayacaqdır. Sonuncular qurtardıqda, əvvəlkilər qayıdacaq, beləcə miqdarı bir günü əlli min il olan bəndələr arasında hökm verilən günə kimi, sahibinə əzab üçün yenidən əvvəlki halına qaytarılar. Sonra nəhayət , ona gedəcəyi Cənnət ya da Cəhənnəm yolu göstərilər. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi at sahibləri də?" deyə soruşulduqda." O belə buyurdu: "At üç cürdür. At var ki, kişiyə günah gətirər. At vardır ki, kişi üçün sipərdir. At var ki, kişyə savab gətirər. Amma kişiyə günah gətirən ata gəlincə: "O kişi ki, onu riyakarlıq, fəxr və islam əhlinə düşməçilik üçün bağlayar , bu ona günah gətirər. Kişiyə sipər olan ata gəlincə: "O kişi ki, atını Allah yolunda bağlayar və onun belində və boynunda olduqda Allahın haqqını unutmaz, bu at ona sipər olar. Amma kişiyə savab gətirən ata gəlincə isə: bir kişinin Allah yolunda otluqlarda və bağça-bağda müsəlmanlar üçün bəslədiyi atdır. Atın otluqlarda və bağça-bağda yediyi ota və atın nəcisi və sidiyi sayınca, kişiyə savab yazılar. At ipini qoparıb bir və ya iki dövrə vurarsa, getdiyi iz və nəcisi qədər sahibinə savab yazılar. Sahibi onu çay kənarına gətirər və ona su içirmək niyyəti olmadan at özü o çaydan su içərsə, içdiyi hər qurtum su miqdarında sahibinə savab gətirər. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , eşşək sahibləri də?" deyə soruşulduqda." O belə buyurdu: "Mənə bu haqda yalnız bu az və umumi bir ayədən başqa bir şey nazil olmamışdır: "Kim zərrə qədər yaxşı iş görmüşdürsə, onu görəcəkdir. Kim də zərrə qədər pis iş görmüşdürsə, onu görəcəkdir." (Müslim / 987).

## Yeddinci fəsil: Mal-mülk yığanlar və onların aqibətinin pis olması.

8- Əhnəf ibn Qeys belə rəvayət edir: Qureyş qəbiləsindən olan bir neçə nəfərlə idim. Əbu Zər (Allah ondan razı olsun) yanımızdan keçdiyində belə buyurdu: "Mal–mülk yığanları, bellərinə vurularaq yanından çıxan damğa ilə və başlarına vurularaq alınlarından çıxan damğa ilə müjdələ." Sonra kənara çəkilərək oturdu. Mən: "Bu kimdir deyə soruşdum?" Onlar mənə onun Əbu Zər (Allah ondan razı olsun) olduğunu xəbər verdiklərində , onun yanına gəlib: "Bir az əvvəl səndən eşitdiyim nədir?" O belə cavab verdi: "And olsun ki, yalnız Peyğəmbərlərindən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyim şeyi dedim." Ona: "Bəs bir kəsin nə isə əta etməsinə nə deyirsən?" deyə soruşduqda , belə cavab verdi: "Onu götür , çünki bu , o günün üçün bir sədəqədir (köməkdir). Yox əgər dinin əvəzinə verilən bir şeydirsə , onu tərk et." (Müslim / 992).

## Səkkizinci fəsil: Sədəqə məmurlarını razı salmağın əmr olunması.

9- Cərir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Bədəvi çöl ərəblərdən bir neçə insan Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedilər: "Yanımıza sədəqə məmurları gəlir və bizə zülm edirlər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: "Siz sədəqə məmurlarını razı salın" ibn Cərir belə demişdir: Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu eşitdiyim gündən bəri yanımdan elə sədəqə məmuru çıxmadı ki, o məndən razı olmasın." (Müslim / 989).

## Doqquzuncu fəsil: Zəkatını gətirənə dua edilməsi.

10- Abdullah ibn Əbu Avfa (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına bir qövm

zəkatını gətirdikdə belə deyərdi: "Allahım! Salamın və Salavatın onların üzərinə olsun." Bir dəfə Əbu Avfa da ona zəkatını gətirdiyində belə dedi: "Allahım! Salamın və Salavatın Əbu Avfanın ailəsinin üzərinə olsun." (Müslim /).

## Onuncu fəsil: İmanının zəiflənməsindən qorxulan kumsəyə nəsə bir şey əta etmək.

11- Səid ibn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qəniməti böldüyündə Ona: "Ey Allahın Elçisi , filan kəsə ver o , mömindir" deyə söylədimdə , O: "Bəlkə müsəlmandır" deyə cavab verdi. Mən bunu üç kərə təkrar etdim və o mənə bu sözü eyni ilə "Bəlkə müsəlmandır" deyə üç kərə rədd etdi. Sonra isə belə buyurdu: "Allahın onu üz üstə oda salmasından qorxduğum üçün, bu kişiyə və ya başqasına qənimətdən nəsə verməyim mənim üçün daha sevimlidir." (Müslim / ).

## On birinci fəsil: Qəlbləri islama dəvət üçün qənimətdən və ya zəkatdan əta etmək, imanı möhkəm olan kəslərə isə səbr etmələrni tövsüyə etmək.

12- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Huneyn döyüşü günü Havazin və Qatafən və başqa qəbilələrin adamları ailə və heyvanları ilə bizi qarşıladılar. Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o gün on iki min nəfər və azad edilmiş məkkəlilər vardı. Nəhayət onlar çevrilib getdiklərində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tək başına qaldı. O gün aralarında heç bir şeyi qarışdırmamaqla iki dəfə cağırdı. Sağına çevrilərək: "Ey Ənsar (Mədinə əhli) camaatı" deyə səslədi. Onlar:" Eşidirik , əmrindəyik , Ey Allahın Elçisi, müjdələn səninləyik" deyə cavab verdilər. Sonra soluna çevrilərək: "Ey Ənsar camaatı" deyə səslədi. Onlar:"Eşidirik , əmrindəyik , Ey Allahın Elçisi, müjdələn səninləyik" deyə cavab verdilər. O , ağ qatırının üzərində idi. Ondan enib belə buyurdu: "Mən Allahın qulu və Elçisiyəm." Sonra müşriklər məğlub oldular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çox sayda qənimət ələ keçirmişdi. Qəniməti Mühacir (Məkkədən Mədinəyə hicrət edənlər) və azad edilmiş məkkəlilərin arasında bölüşdürdü. Ənsarlara isə heç bir şey vermədi. Ənsarlar belə dedilər: "Çətin vaxtlarda biz çağırılırıq , qəniməti isə qeyriləri alır." Bu xəbər Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çatdıqda , onları bir qübbənin altına cəm edərək belə buyurdu: "Ey Ənsar camaatı , sizin nələr dediyinizi eşitdim" Onlar susdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenidən belə buyurdu: "Ey ənsar camaatı razı deyilmisiniz ki, insanlar evlərinə dünya malı ilə qayıtdıqlarında , siz evinizə Mühəmmədi cəkib aparasınız." Onlar: "Razıyıq , ey Allahın Elçisi" deyə cavab verdiklərində, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Əgər insanlar bir vadiyə enən yolu tutsalar və Ənsarlar isə bir dağ yoluna üz tutsalar , mən Ənsarların tutduğu dağ yoluna üz tutardım." Hişəm ibn Zeyd ibn Məlik ibn Ənəs belə buyurur: "Mən Əbu Həmzədən onun buna şahid olduğunu soruşduğumda, O belə buyurdu: " Mən Onun yanından hara itə bilərdim." (Müslim /1059).

13- Rafi ibn Xədic (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Sufyan ibn Hərb, Safan ibn Umeyyə, Uyeynə ibn Huseyn və Aqra ibn Habis də daxil olmaqla bu insanların hər birinə yüz dəvə verdi. Abbas ibn Mirdasa isə onlardan az verdikdə, Abbas ibn Mirdas bu şeri ona oxudu: "Mənimlə payımı Ubeydin və Aqranın

arasında bölürsənmi. Midras, Bədr və Habis cəmiyyətindən hec də aşağı deyildir. Mən onların hec birindən aşağı deyiləm. Lakin bu gün sənin alçaltdığın bir daha yüksəlməz.” Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onün üçün yüzü tamamladı.” (Müslim / 1060).

14- Əbu Səid əl- Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: “Əli ibn Əbu Talib (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Yəməndən aşlanmış qabda hələ torpaqdan ayrılmamış qızıl bir külçə göndərdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu dörd nəfərin arasında böldü. Bunlar: Uyeynə ibn Huseyn, Aqra ibn Həbis, Zeyd əl-Xeyl və dördüncüsü isə ya Alqama ibn Uləsə və ya Amir ibn ət-Tufeyil idi. Əshabından olan bir kişi belə dedi: “Bizim ona, onlardan daha çox haqqımız var.” Bu xəbər Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çatanda belə buyurdu: “Xəbər mənə səhər və axşam gələn səmadan əmin olduğum halda, siz məndən əmin deyilsiniz? Batıq gözlü, parlaq yanaqlı, açıq alınlı, sıx saqqallı, keçəl başlı izarına bürünmüş bir kişi qalxaraq belə dedi: “Ey Allahın Elçisi , Allahdan qorx!” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Vay olsun sənə , məgər yer üzünün Allahdan qorxmağa ən layiqlisi mən deyiləmmi?” Sonra kişi dönüb getdiyində , Xalid ibn Valid (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ey Allahın Elçisi , onun boynunu vurummu?” deyə soruşduqda, O: “Yox , bəlkə namaz qılandır” deyə cavab verdi. Xalid ona : “O qədər namaz qılan var ki , dili ilə dediyi qəlbində deyil.” deyə söylədikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Mən insanların qəlblərində olanı açmağa və qarınlarını yarmağa əmr olunmadım.” Sonra getməkdə olan adama baxaraq belə buyurdu: “Həqiqətən bu adamın sülaləsindən bir qövm çıxacaq ki, Allahın kitabını rahatlıqla oxuyacaqlar lakin , oxuduqları qırtlaqlarından keçməyəcək. Dindən ox yayından çıxdığı kimi çıxacaqlar”. Və zənn edirəm o belə dedi: “Əgər onlarla qarşılaşsaydım , onları səmud qömvü qətlə yetirildiyi kimi qətlə yetirərdim.” (Müslim / 1064).

## On ikinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və əhli beytinə sədəqənin halal olmaması.

15-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Həsən ibn Əli (Allah onların hər ikisindən razı olsun) sədəqə xurmasından bir dənə xurma götürərək ağzına qoydu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “ Kix! Kix! Onu at! Məgər bizim sədəqə yemədiyimizi bilmirsən?” deyə buyurdu.” (Müslim /).

## On üçüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəslindən olan kimsələrin sədəqə, zəkat yığmaqda işlətməyin bəyənilməməsi.

16-Abd əl-Muttalib ibn Rabiə ibn əl-Haris belə rəvayət edir: “Rabiə ibn əl-Haris və Abbas ibn Abd əl-Muttalib bir yerə yığışıb belə dedilər: “And olsun Allaha ki, bu iki oğlanı (məni və Fadl ibn Abbası) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına sədəqə yığmaqda işlətmələrini söyləmələri üçün göndərəcəyik ki, onlar da başqa məmur insanların etdiyi vəzifəni etsinlər və onların aldığın alsınlar. Onlar bu halda ikən Əli ibn Əbu Talib onların yanına gəlib çıxdı. Ona nə etmək istədiklərini danışdıqda, o belə buyurdu: “Belə etməyin , and olsun Allaha ki, o bunu etməyəcək” Rabi ibn əl-Haris ona etiraz edərək belə dedi: “And olsun Allah ki , sən bunu bizə həsəd apardığından dolayı deyirsən. And olsun Allaha ki , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı

olsun) kürəkəni olduğunda sənə həsəd aparmadıq.” Əli onlara: “Elə isə göndərin” deyə söylədi. Onlar getdiklərində o uzandı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zöhr namazını bitirdikdə , ondan qabaq gəlib evinin qabağında O gələnədək dayandıq. O qulaqlarımızı çəkərək: “Tez , nə istədiyinizi deyin görüm” deyə bizə buyurdu və içəri keçdi.” Biz də onun yanına daxil olduq. O gün O , Zeynəb bintu Cəhşin evində idi. Biz sözü bir-birimizə həlavə etdik və nəhayət birimiz danışdı və belə buyurdu: “Ey Allahın Elçisi , sən insanların ən yaxşısı və ən xeyir istəyənisən. Biz artıq yetginlik yaşınan çatmışıq. Gəlmişik ki, bizi sədəqə yığmağa məmur olaraq göndərəsən ki, başqa məmur insanların etdiyi vəzifəni edək və onların aldığından alaq.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) uzun bir müddət susdu ,hətta biz onu danışdırmaq istədikdə , Zeynəb (Allah ondan razı olsun) bizə onu danışdırmamağımız üçün örtüyün arxasından işarə etdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Muhəmmədin əhlinə sədəqə götürmək layiq deyil. Bu , insanların kiridir.” Sonra isə belə buyurdu: “Qənimətin bölüşdürməsinə məmur olan Muhamıyəni və Nofəl ibn əl-Harisi yanıma çağırın.” Onlar gəldiklərində , Muhamiyəyə: “Bu oğlanı (Fadl ibn Abbası) qızınla evləndir.” deyə buyurdu. Və o evləndirdi. Sonra Nofəl ibn əl-Harisə: “Bu oğlanı (yəni məni) qızınla evləndir” deyə buyurdu. Və o evləndirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Muhamiyəyə bu iki qıza qənimətdən bu və bu qədər ver” deyə buyurdu.” Zuhri belə demişdir: “O mənə mehrin (başlığın) miqdarını söyləmədi.” (Müslim / 1072).

## On dördüncü fəsil: Sədəqəndən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ailəsinə hədiyə olmasının mübah olması haqda.

17-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Bərirə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), ona sədəqə verilmiş bir əti hədiyyə etdikdə O belə buyurdu: “O , ona sədəqə , bizə isə hədiyyədir.” (Müslim / )

18-Ummu Atiyya (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə sədəqə qoyununlarından birini göndərdi. Ondan bir hissəsini Aişəyə (Allah ondan razı olsun) göndərdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Aişənin yanına gəldiyində ondan “Yeməyə nəyinsə var?” deyə soruşdu . Aişə belə cavab verdi: “Sənin Ummu Atiyyəyə göndərdiyin qoyundan, onun da bizə verdiyi bir parça sümüklü ətdən başqa bir şey yoxdur.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “O , artıq yerinə çatmışdır.” (Müslim/1073).

## On beşinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədiyyəni qəbul etməsi və sədəqəni götürməməsi haqda.

19-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir yemək gətirdiyində soruşardı. Əgər hədiyyədir, deyərdilərsə qəbul edərdi və ondan yeyərdi. Yox əgər sədəqədir deyərdilərsə , ondan yeməzdi.” (Müslim /)

## On Altıncı fəsil: Müsəlmanların fitrə zəkatını xurma və ya buğdadan çıxarmağı.

20-İbn Omar (Allah onların hər ikisindən razı olsun) dedi: «Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ramazanın fitrə zəkatını 2,5 kq

xurma və ya buğda çıxarmağı hər bir müsəlman kimsəyə, qadın və kişiyə, azad və qula fərz etmişdir.” (Müslim).

## On yeddinci fəsil: Fitrə zəkatının kişmiş və pendirdən (kəsmik) çıxarılması.

21-Əbu Səid Əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: «Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanı hər bir böyük və kiçik, azad və ya qul fitrə zəkatını 2,5 kq yeməkdən çıxarardıq. Və ya 2,5 kq pendirdən (kəsmik), və ya 2,5 kq buğdadan, və ya 2,5 kq xurmadan, və ya 2,5 kişmişdən cıxarardıq. Beləcə bu şeylərdən fitrə zəkatı çıxarmağa Muaviyyə ibn Əbu Sufyan Həcc və ya Umrə üçün yanımıza gələnədək davam etdik. O gəldiyində minbərdən insanlarla danışdı və belə dedi: “Şam əhlinin iki mud (çəki vahidi) buğdası bir saa (2,5 kq) xurmaya bərabərdir.” Və insanlar da buna əməl etməyə başladılar.” Əbu Səidin belə demişdir: “Amma mən necə cıxarırdımsa , eləcədə cıxarıram və ömrümün sonuna kimidə belə çıxaracam.” (Müslim /)

## On səkkizinci fəsil: Fitrə zəkatının namazdan qabaq çıxarılmasının əmr olunması.

22-Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Fitrə zəkatının insanlara bayram namazından qabaq çıxarılıb verilməsini əmr etdi.” (Müslim).

## On doqquzuncu fəsil: Sədəqə verməyə rəğbətləndirmək.

23-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Mənim Uhud dağı boyda qızılım olsa , ondan üç gün sonra məndə ondan borcumu ödəmək üçün ayırdığım bir dinardan başqa bir dinar qalmasını istəmərəm.” (Müslim / 391).

24-Abdullah ibn Ömar (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ey qadınlar , sədəqə verin və bağışlanma diləməyi artırın , həqiqətən mən Cəhənnəm əhlinin çoxunun sizdən olduğunu gördüm.” Ağıl sahibi bir qadın ondan: “Ey Allahın Elçisi , bizə nə olub ki, Cəhənnəm əhlinin ən çox olanı bizik?” deyə soruşdu . O belə cavab verdi: “Çünki siz çox lənət edər və ərinizin sizə etdiyi nemətləri danırsınız. Sizidən daha çox dininin və ağlının naqis olan bir kəsi görmədim.” Qadın Ondan: “Ey Allahın Elçisi , dinin və ağlın naqis olması nədir?” deyə soruşduqda, O belə cavab verdi: “Amma ağlın naqisliyi: “İki qadının şahidlik etməsi bir kişinin şahidliyinə bərabər olmasıdır.” Amma dinin naqisliyi isə budur: “Neçə bir vaxt oturar namazını qılmaz və Ramazan ayında orucunu açar.” (Müslim/).

## İyirminci fəsil: Allah yolunda mal sərf etməyə rəğbətləndirmək.

25-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təala belə buyurur: “Ey Adəm oğlu , Məmim yolumda malından sərf et ki, mən də sənə sərf edim.” Sonra isə belə buyurdu: “Allahın sağı doludur. Onun gecə və gündüzü onun səxavətini azaltmaz.” (Müslim / 393).

## İyirmi birinci fəsil: Sədəqəni qəbul edilməsi rədd olunmamışdan öncə verilməsinə rəğbətləndirmək.

26-Hərisətə ibn Vahb (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “Sədəqə verin. Qorxulur ki (Elə bir vaxt gələcək) Kişi sədəqəsi ilə gəzəcək , sədəqə verdiyi adam ona belə deyəcək: “Dünən gəlsəydin qəbu edərdim , bu gün mənim ona ehtiyacım yoxdur.” O , sədəqəsini qəbul edən adam tapmayacaq.” (Müslim /)

27-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Yer özünün ən nəfis qızıl və gümüş sərvətlərini dayaqlar şəklində çıxaracaq. Qatil olan bir kəs gələcək və belə deyəcəkdir: “Mən buna görə öldürdüm.” Sonra qohumluq əlaqələrini qıran gələcək və belə deyəcəkdir: “Mən buna görə qohumluq əlaqələrimi qırdım.” Sonra oğru gələcək və belə deyəcəkdir: “Əllərim buna görə kəsilmişdir.” Və onu (yerin çıxartdığı sərvəti) tərk edərək ondan heç bir şey götürməyəcəklər.” (Müslim / ).

## İyirmi ikinci fəsil: Ər və evində olan yetim övlada sədəqə vermək.

28-Abdullah ibn Məsudun zövcəsi Zeynəb (Allah onlardan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ey qadınlar , zinət əşyalarınızdan olsa belə , sədəqə verin.” Mən Abdullahın yanına gələrək ona belə dedim: “Sən kasıb bir kişisən . Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə sədəqə verməyimizi əmr etdi. Onun yanına get və ondan soruş , sənə sərf etməyin mənə sədəqəni əvəz edir , yoxsa mən başqalarına sədəqə edim.” Abdullah mənə “özün get” deyə buyurdu. Mən gedib ora çatdığımda , Ansarlardan olan bir qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qapısının önündə dayanmışdı , onun sualı mənim sualım kimi idi. O zaman Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heybət bürümüşdü. Bilal bizim yanımıza çıxdı. Ona Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizim kim olduğumuzu söyləmədən qapıda iki qadının durduğunu və zövcələrinə və evlərində tərbiyə etdikləri yetimlərinə mallarından sərf etmələri onların sədəqə verən kəslərdən olmaları üçün kifayət edirmi deyə soruşduqlarını xəbər verməsini söylədik. Bilal Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına daxil olaraq ondan soruşduqda , belə buyurdu: “Onlar kimdir?” O: “Ənsarlardan bir qadın və Zeynəb” deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Hansı Zeynab?” deyə soruşdu. O: “Abdullah ibn Məsudun zövcəsi” deyə cavab verdikdə, O belə buyurdu: “Onlara iki savab vardır: “Qohumluq əlaqələrinə görə və sədəqəsinə görə” (Müslim / 1000).

## İyirmi üçüncü fəsil: Yaxın qohumlara sədəqə vermək.

29-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Əbu Talha Mədinə Ənsarlarından ən varlı olanı idi. Və ən çox sevdiyi malı məscidlə üz-üzə olan Beyraha adlanan bostanı idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) O bostana daxil olar və oradakı olan gözəl sudan içərdi.” Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: “Bu ayə nazil olanda: “Sevdiyiniz şeylərdən (haqq yolunda) sərf etməyincə , savaba çatmazsınız.” Əbu Talha Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: “Allah Təala belə buyurur: “Sevdiyiniz şeylərdən (haqq yolunda) sərf etməyincə savaba çatmazsınız.” Mənə ən sevimli olan malım Beyraha adlanan bostandır. Onu Allah üçün sədəqə edirəm. Onun savabını və axirət tədarükünü

Allahdan diləyirəm. Ey Allahın Elçisi , onu istədiyin yerə sərf et." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəh–bəh necə də gözəl qazancdır. Mən sənin onun haqqında dediklərini eşitmişəm. Onu qohumlarına ver." Və Əbu Talha onu qohumları və əmisi uşaqları arasında bölüşdürdü." (Müslim/998).

## İyirmi dördüncü fəsil: Sədəqəni dayılara vermək.

30-Meymuna bintu əl-Haris (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında bir oğlançığı azad etdim və bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) söylədikdə , mənə belə buyurdu: "Əgər onu dayılarına versəydin , savabın daha böyük olardı." (Müslim /).

## İyirmi beşinci fəsil: Müşrük olan anayla qohumluq əlaqələrini saxlamaq.

31-Əsmə bintu Əbu Bakr (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): Ey Allahın Elçisi , anam yanıma gələrək məndən kömək istəyir və ya çəkinir. Ona kömək edimmi?" deyə soruşduğumda belə buyurdu: "Bəli" (Müslim / 1003).

## İyirmi altıncı fəsil: Vəfat etmiş ananın adından sədəqə vermək.

32- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrərk belə soruşdu: "Ey Allahın Elçisi , anam gözlənilmədən vəfat edib və vəsiyyət etmədi. O danışsaydı sədəqə vermək istədiyini zənn edirəm. Onun adından sədəqə versəm , ona savab yazılar." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli" deyə cavab verdi." (Müslim / )

## İyirmi yeddinci fəsil: Ehtiyacı olan kimsələrə sədəqə etməyə həvəsləndirmək və yaxşı bir işə sövq edənin savabı haqda.

33- Cərir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Günorta vaxtı Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında idik. Onun yanına ayaqyalın, aslan dərisi rəngli yun əbalarını başlarından keçirərək geyinmiş, qılıncları əllərində olan və əksəriyyəti Mudar qəbiləsindən və ya hamsı Mudardan olan bir dəstə adam gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların bu halını görəndə üzü dəyişdi. İçəri daxil oldu , sonra çıxaraq Bilala azan verməsini əmr etdi. İqamə verildi və namazı qıldı sonra xütbə verərək belə buyurdu: "Ey insanlar! Sizi tək bir şəxsdən xəlq edən, ondan zövcəsini (Həvvanı) yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun!" Ayəni sonuna kimi oxudu: "Şübhəsiz ki, Allah sizin üzərinizdə gözətçidir!" və Həşr surəsindəki : "Ey iman gətirənlər! Allahdan qorxun! Hər kəs sabah üçün nə etdiyinə nəzər salsın." ayəsini oxudu. Sonra belə dedi: "Kişi dinarından, dirhəmindən, Paltarından, bir Saa buğdasından , bir Saa quru xurmasından sədəqə verməlidi. Yarım xurma olsa belə , sədəqə versin." Bunu demişdi ki, Ənsarlardan olan bir kişi əlində güclə daşıdığı , hətta gücü çatmadığı bir kisə ilə gəldi. Sonra onun ardınca insanlar da gətirməyə başladılar. Nəticədə yemək və geyimdən ibarət iki təpə yığıldığında , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzünün qızıl

parıltısı kimi parıldadığını gördüm.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Kim İslamda yaxşı bir işə (yol açarsa, Sövq edərsə dəlalət edərsə) cığır açarsa , ona onun savabı və ondan sonra bu əməli edənin savabından heç bir şey naqıs etmədən bir savab yazılar. Və kim İslamda pis bir cığır açarsa , ona onun günahı və ondan sonra bu əməli edənin günahından heç bir şey naqis olmadan bir günah yazılar.” (Müslim / 1017)”.

### İyirmi səkkizinci fəsil: Miskin və Allah yolunda (cihada) çıxan kəslərə sədəqə vermək.

34- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bir kişi düzənlik bir yerdə dayanmışdı. Birdən göydəki bir buluddan belə bir səs gəldiyini eşidir: “Filankəsin baxçasını sula” və həmin bulud qaradaşlı bir sahəyə yönələrək suyunu oraya boşaltdı. Orada olan kanallardan biri suyun hamsını özünə çəkdi. Kişi suyun ardınca gedərək gəlib bir kişinin bostanın içində əlindəki alətlə suyun yönünü dəyişdirdiyini gördü. Kişi ondan : “Ey Allahın qulu , adın nədir?” deyə soruşdu. O: “filankəs” deyə buluddan eşitmiş olduğu adı ona xəbər verdi.” Ondan: “Adımı nə üçün soruşdun?” deyə soruşduqda kişi belə dedi: “Mən suyunu işlətdiyin bir buluddan filankəsin bağçasını sula” sənin adın çəkilən bir səs eşitdim. Sən burada nə edirsən?” O , kişiyə belə cavab verdi: “Belə deyirsənsə , mən ondan alınan məhsula baxıb , onun üçdə birini sədəqə verirəm. Üçdə birini isə mən və ailəm yeyirik. Qalan üçdə birini isə ona (Torpağa) qaytarıram.” Başqa bir rəvayətdə isə belə deyilir: “üçdə birini Miskinlərə, İstəyənlərə və Allah yolunda çıxan kimsələrə verirəm” (Müslim/2984).

### İyirmi doqquzuncu fəsil: Cəhənnəmin odundan yarım xurma dənəsi ilə olsa belə qorunmaq.

35-Adiy ibn Hatim (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə cəhənnəm odunu xatırlatdı və üzünü çevirdi , qorundu sonra isə belə buyurdu: “Oddan qorunun” sonra üzünü çevirdi , qorundu. Biz sanki onun ona (Cəhənnəmə) baxırdı deyə zənn etdik. Sonra isə belə buyurdu: “Cəhənnəmin odundan yarım xurma dənəsi ilə olsa belə qorunun! Kim bunu da tapmasa onda gözəl sözlə qorunsun”. (Müslim / 1016).

### Otuzuncu fəsil: Muneyyaha (yəni dəvəni kimə isə südündən istifadə olunması üçün verilməsi sonra isə geri qaytarılması) sədəqəsinin verilməsinə rəğbətləndirmək.

36-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bilin ki, sabah gedəndə axşam gələndə bir qab süd verən bir dəvəni, bir ailəyə Müneyyah verən kimsənin əcri əzəmətlidir.” (Müslim / 1019).

### Otuz birinci: Sədəqəni gizli vermənin fəziləti.

37-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Yeddi sinif insan vardır ki, Allah Təala onları kölgə olmayan qiyamət günündə öz kölgəsində kölgələndirəcəkdir: (Bunlar) Adil olan imam (Rəhbər), ömrünü Allaha ibadət edərək keçirən cavan, qəlbi məscidlərlə bağlı olan bir kəs, Allah xatirinə bir-birini sevən ona görə garşılaşıb və ayrılan iki kişi, gözəl və şərəf sahibi bir qadının onu zina etməyə çağırdığında, mən Allahdan qorxuram deyən bir kəs, sədəqə, sağ əlinin

verdiyini sol əli görməsin deyə sədəqəsini gizlində verən bir kəs, Allahı qizlində xatırlayıb gözləri yaşaran bir kəsdir.” (Müslim /1031).

## Otuz ikinci fəsil: Sağlam olan bir kəsin sədəqə verməsinin fəziləti.

38-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına bir kişi gələrək belə soruşdu: “Ey Allahın Elçisi , hansı Sədəqə daha əzəmətlidir (əfzəldir)? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Sağlam olduğun halda, kasıbçılıqdan qorxduğun və varlılığı daddığın anda sədəqə vermək. Və Bu işi canının qırtlağından çıxdığı və filankəsə bu qədər və filankəsə bu qədər verilsin, deyəcəyin ana kimi gecikdirmə. O zaman onusuz da (o mal) filankəsin olmuşdur.” (Müslim / 1032).

## Otuz üçüncü fəsil: Halal qazancdan verilən sədəqənin qəbulu və (savabının) artırılması.

39-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən elə biriniz yoxdur ki, halal qazancından sədəqə verdikdə Allah Təala onu sağı ilə götürərək dağ qədər və ya daha da əzəmətli olana qədər, sizin birinizin dayçasını və ya dişi dəvəsini böyütdüyü kimi büyütməsin.” (Müslim/1014).

40-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ey insanlar həqiqətən Allah Təala gözəldir və gözəl olan bir şeyi qəbul edər. Allah Təala Elçilərinə əmr etdiyini möminlərə də əmr etmiş və belə buyurmuşdur: “Ey Peyğəmbərlər! Təmiz nemətlərdən yeyin və yaxşı işlər görün! Mən, həqiqətən, sizin nə etdiklərinizi bilirəm!” (əl-Muminun 51). Həmçinin: “Ey iman gətirənlər! Sizə verdiyimiz rüzilərin (təmiz və) halalından yeyin!” ( əl-Bəqarə / 172) Sonra belə buyurdu: “Üzün bir səfərə çıxarmış bir kişi saçları dağınıq, paltarı tozlu halda əllərini səmaya uzadaraq: “Ey Rəbbim! Ey Rəbbim” deyər, lakim yediyi haram, içdiyi haram, geydiyi haram, haramla bəslənən olsa , beləsinin duası necə qəbul olunsun?” (Müslim / 1015).

## Otuz dördüncü fəsil: Az bir şeyi sədəqə verməyin eyb görməyin tərk olunması.

41-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ey müsəlman qadınlar , nə badə qonşunun qonşu qadına bir qoyun parçasından (ət) olsa belə, sədəqə etməsinə eyb edəsiniz.” (Müslim/1030).

## Otuz beşinci fəsil: Allah Təala buyurur: “Könüllü surətdə sədəqə verən möminlərə tən edənlər”

42-Əbu Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: “Bizə sədəqə vermək əmr olundu. Biz də bu məqsədlə hamballıq edirdik. Əbu Əqil yarım Saa sədəqə verdi. Sonra bir insan ondan çox bir şey gətirdiyində, Münafiqlər belə dedilər: “Allah Təala bunun gətirdiyi sədəqədən varlıdır. O biri isə ancaq riyakarlıq üçün etdi,” Və bu ayə nazil oldu: “Könüllü surətdə sədəqə verən möminlərə tənə edənləri və güc-bəla ilə əllərinə düşəni təsəddüq edən kəsləri məsxərəyə qoyanlar” (Tövbə/79)” (Müslim /1018).

## Otuz Altıncı fəsil: Sədəqə ilə  xeyir olan əməlləri bir araya cəm etmək.

43- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşduğunu rəvayət edir: “Sizdən kim bu gün oruc tutaraq sabahladı? Əbu Bəkr (Allah ondan razı olsun): “Mən” deyə cavab verdi. O yenə soruşdu: “Sizdən kim bu gün cənazəni müşayət edib? Əbu Bəkr (Allah ondan razı olsun): “Mən” deyə cavab verdi. O yenə: “Sizdən kim bu gün bir kasıbı doyurub?” Əbu Bəkr (Allah ondan razı olsun): “Mən” deyə cavab verdi. O yenidən soruşdu: “Sizdən kim bu gün xəstəni ziyarət edib?” Əbu Bəkr (Allah ondan razı olsun) yenə: “Mən” deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Hər kimdə bu xislətlər cəm olarsa, o Cənnətə daxil olar.” (Müslim /1028).

44- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Kim Allah yolunda iki şey sərf edərsə , Cənnətdə: “Ey Allahın bəndəsi , bu xeyirdir” deyə çağrılacaq. Və hər kim Namaz əhlindəndirsə , o Namaz qapsından çağırılacaq . Və kim Cihad əhlindəndirsə , o Cihad qapsından çağırılacaq. Və kim Sədəqə əhlindəndirsə , Sədəqə qapsından çağırılacaq. Və kim Oruc əhlindəndirsə , o Rayyan adlanan qapıdan çağırılacaq.” Əbu Bəkir əs_Siddiq (Allah ondan razı olsun) Ondan: “Bir kimsənin bu qapıların hamısından çağrılmasında bir zərər yoxdursa , bu qapların hamsından çağırılacaq?” deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  belə buyurdu: “Bəli! Və diləyirəm ki, (arzulayıram) sən onlardan olasan” (Müslim/1027).

## Otuz yeddinci fəsil: Hər yaxşı iş sədəqədir.

45-Hüzeyfə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər yaxşı iş sədəqədir.” (Müslim / 1005).

## Otuz səkkizinci fəsil: Sübhənallah , Lə iləhə İllallah və Xeyirli olan əməllər sədəqədəndir.

46- Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  səhabələrindən bir neçə insan Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedilər: “Ey Allahın Elçisi , sərvət sahibləri savabın hamsını alıb getdilər. Bizim kimi namaz qılır, orucumuz kimi oruc tutur və mallarının artığını sədəqə verirlər.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  belə buyurdu: “Məgər Allah Təala sizə sədəqə etməniz üçün bir şey verməyibmi? Hər bir Sübhənallah sədəqədir. Və hər bir Allahu Əkbər sədəqədir. Və hər bir Əlhəmdulilləh sədəqədir. Və hər bir Lə iləhə illallah sədəqədir. Və yaxşı işləri əmr etmək sədəqədir. Və pis işlərdən çəkindirmək sədəqədir. Hətta qadınıyla cinsi əlaqədə olmanız sədəqədir.” Onlar: “Ey Allahın Elçisi , bizdən birimizin şəhvətini öldürməsində,  bunda onun üçün əcr vardır?” deyə soruşduqda, O belə cavab verdi: “Məgər şəhvətini haramda öldürdüyündə , ona günah yazıldığını hesab etmirsiniz? Eləcədə halalda öldürdüyündə ona savab vardır.” (Müslim / 1006).

## Otuz doqquzuncu fəsil: Sədəqə və onun hər bir fəqərəyə vacib olması.

47-Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz hər bir Adəm övladı üç yüz altımış fəqərə ilə xəlq olunub. Hər bir kəs üç yüz altımış fəqərə saymaqla Allahı təkbir etdiyində, Allahı həmd etdiyində, ləiləhə illallah dediyində, Allahdan bağışlanma dilədikdə, insanların yolunun üzərində olan daşı və ya tikanı və ya sümüyü götürməyində, yaxşi işləri əmr etməsi və ya pis işlərdən çəkindirməsində o gün o , özünü Cəhənnəmdən üzaqlaşdıraraq gəzər." Əbu Tuba belə demişdir: "bəlkə də: "uzaqlaşdıraraq gecələyər." demişdir." (Müslim / 1007).

Qırxıncı fəsil: Sədəqə sədəqə əhli olmayan kəsə verilsə belə qəbul olunması.

48-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir kişi: "bu gecə sədəqə verəcəm" deyərək , sədəqəsi ilə çıxır və sədəqəsin zinakar qadına verir. Səhər olduqda gecə zinakara sədəqə verildiyi haqda danışmağa başlayırlar. Kişi: "Allahım , sənə zinakara görə həmd edirəm. Sədəqə verəcəm" deyərək , sədəqəsi ilə çıxaraq sədəqəni varlı olan bir kəsə verir. Səhər olduqda varlıya sədəqə verildiyi haqda danışmağa başlayırlar. Kişi: "Allahım , sənə varlıya görə həmd edirəm. Sədəqə verəcəm" deyərək sədəqəsi ilə çıxaraq , sədəqəni oğru olan bir kəsə verir. Səhər olduqda gecə oğruya sədəqə verildiyi haqda danışmağa başlayırlar. Kişi belə dedi: "Allahın sənə zinakara, varlıya və oğruya görə həmd edirəm." (Qiyamət günü) Gətirildiyində ona belə deyiləcək: "Sədəqən artıq qəbul olunmuş . Zinakar sədəqənlə zina etməkdən çəkindi. Varlı yəqin ki, sədəqəndən ibrət alıb malından sədəqə verdi. Oğru isə sədəqənlə yəqin ki, oğurluq etməkdən çəkindi." (Müslim / 1022).

Qırx birinci fəsil: "Sədəqə verən və xəsis haqda."

49- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Xəsislə, sədəqə verənin misalı əynində dəmir zireh olan iki kişinin misalındadır. Sədəqə verən sədəqə vermək istədikdə zireh onun izini (Addımını ) örtəcək genişliyində genişlənəcək. Xəsis isə sədəqə vermək istədiyində zireh büzülərək əllərini körpücük sümüyünə yapışdırılar. Və hər bir halqa o biri halqaya yapışar." Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "zirehi genişlətməyə çalışsa da bacarmır." (Müslim / 1021).

Qırx ikinci fəsil: Malından Allah yolunda sərf edən və etməyən haqda.

50-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bəndələrin sabahladıqları elə bir gün yoxdur ki , o gün iki mələk enməsin. Onlardan biri deyir Allahım , sərf edənə əta et (ver)! O birisi isə deyir: "Allahım saxlayanın (Sərf etməyənin) malını tələf et" (Müslim / 1010).

Qırx üçüncü fəsil: Əmin bir xəzinədar sədəqə verənlərdən biridir.

51-Əbu Musə əl-Əşari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Əmin müsəlman bir xəzinədar olan, ona əmr olunanı edən , (bəlkədə: "verən" demişdir) könül xoşluğuyla ona əmr olunmuş seyi əmr olunan kəsə çatdıran kəs sədəqə verənlərdən biridir." (Müslim / 1023).

## Qırx dördüncü fəsil: Sərf et, sayma və simiclik etmə.

52-Əsmə bintu Əbu Bakr (Allah onlardan razı olsun) belə rəvayət edir: “O , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə demişdir: “Ey Allahın Peyğəmbəri , Zubeyrin mənə gətirdiyi şeylərdən başqa bir şeyim yoxdur. Mənə verilən şeylərdən cuzi bir şey versəm mənə günah olmaz ki? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “ Bacardığını ver simiclik etmə ki , Allah Təala da səndən nemətlərini əsirgəməsin.” (Müslim 1029).

## Qırx beşinci fəsil: Qadın ərinin evdəki malından sədəqə edərsə.

53- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Qadın evindən ərinin malından israf etmədən Allah yolunda sərf edərsə , ona sərf etdiyi şeyə, ərinə isə qazandıqı şeyə görə savab yazılar. Xəzinədara da onun mislində verilər. Onlar bir birlərinin savabını naqis etməzlər.” (Müslim /1024).

## Qırx altıncı fəsil: Qulun ağasının malından sərf etməsi.

54-Əbu əl-Ləhmin mövlası olan Umeyr belə rəvayət edir: “Sahibim mənə ət doğramağı əmr etdi. Yanıma bir kasıb gəldi və mən onu ətlə yedirdim. Sahibim bundan xəbər tutaraq məni döydü. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək bunu ona xəbər verdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu çağırtdırıb belə soruşdu: “Nə üçün onu döymüsən? ” O: “Mən əmr etmədən yeməyimi verir.” deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Savabı ikinizin arasındadır.” (Müslim /1025).

55-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Qadın ərinin yanında ikən onun izni olmadan oruc tutmasın! O evdə ikən onun izni olmadan heç bir kəsə evə girməsinə izn verməsin. Onun izni olmadan qazancından bir şeyi Allah yolunda sərf edərsə , savabının yarısı onundur.” (Müslim / 1026).

## Qırx yeddinci fəsil: İstəməmək (dilənməmək) və səbr etmək.

56- Əbu Səid əl- Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: “Ənsarlardan olan bir neçə insan Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (Yardım, mal) istədilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara istədiklərini verdi. Sonra onlar yenə tələb etdilər. Hətta O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlində olanı onlara sərf etdikdən sonra belə buyurdu: “Məndə olan bir xeyiri sizdən gizlətmərəm. Kim dilənməkdən çəkinərsə , Allah Təala ona haramdan çəkinməyi əta edər. Kim qani olmaq istəyərsə , Allah Təala onu qani edər. Və kim səbr etmək istəyərsə Allah Təala onu səbrli edər. Heç bir kimsəyə səbirdən daha geniş və daha xeyirli bir şey əta olunmamışdır.” (Müslim / 1053).\

## Qırx səkkizinci fəsil: Ehtiyaca yetəcək qədər ruzi və qənaət haqda.

57- Abdullah ibn Amr ibn əl–Ass (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Müsəlman olub ona ehtiyacı qədər ruzi verilən və Allahın verdiyi ilə qənaətlənən kəs artıq zəfərə çatmışdır.” (Müslim / 1054).

## Qırx doqquzuncu fəsil: Dilənməkdən (istəməkdən) əl çəkmək.

58- Muaviyyə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “İstəməkdə israr etməyin! And olsun Allaha ki, sizdən biriniz məndən bir şey istəyərsə və razı olmadığım halda məndən bir şey qopararsa ona verdiyim şeyin bərəkətini əsla görməz.” ( Müslim / 1038).

## Əllinci fəsil: İnsanlardan dilənməyin bəyənilməməsi.

59- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz dillənçiliyində o qədər davam edəcək ki, hətta Allah Təala ilə qarşılaşdığında üzündə ət parçası da qalmayacaq.” (Müslim / 1040).

60- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “Sizlərdən birinizin hər səhər belində odun daşıyaraq ondan sədəqə verməsi və onunla insanlardan bir şey istəməməsi ilə kifayətlənməsi , ona kimdənsə ona verib və ya verməməyindən daha xeyirlidir. Həqiqətən yüksək əl alçaq əldən daha əfzəldir. Sən sədəqəni əhlinə verməklə başla.” (Müslim/1042).

## Əlli birinci fəsil: Yüksək əl alçaq əldən daha xeyirlidir.

61- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərdə ikən sədəqə verməyi və kimdənsə dilənməməyi xatırlayaraq belə buyurdu: “Yüksək əl alçaq əldən daha xeyirlidir. Yüksək əl verən, alçaq əl isə dilənən əldir.” (Müslim / 1033).

62- Həkim ibn Hazim (Allah ondan razı olsun) “ Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (Yardım, Mal) istədim, mənə verdi. Sonra yenidən istədim. Yenə verdi. Sonra yenə istədim , yenə verdi. Sonra isə belə buyurdu: “Həqiqətən bu mal şirin və dadlıdır. Kim ondan xoş nəfslə götürərsə , ona onda bərəkət verilər. Və hər kim ona göz dikərək alarsa , ona onda bərəkət verilməz. Onun misalı yeyən , lakin doymayan bir kəs kimidir. Yüksək əl alçaq əldən daha xeyirlidir.” (Müslim / 1035).

## Əlli ikinci fəsil: Gündəlik keçinməyə bir şey tapmayan və insanlardan bir şey istəməyən haqda.

63- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “İnsanların ətrafında fırlanan bir və ya iki loxma ilə və ya bir və ya iki xurma dənəsi ilə rədd olunan kəs kasıb deyildir.” Onlar: “Ey Allahın Elçisi , bəs kasıb kimdir?” O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Kasıb gündəlik keçinməyə bir şey tapmayan, halına yanıb ona sədəqə verən tapılmayan və insanlardan bir şey istəməyən kəsdir.” (Müslim / 1039).

## Əlli üçüncü fəsil: Dünya malının çox olması zənginlik deyildir.

64-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dünya malının çox olması zənginlik deyildir. Lakin zənginlik nəfsin varlı olmasıdır." (Müslim / 1051).

## Əlli dördüncü fəsil: Dünyaya həris olmağın bəyənilməməsi.

65- Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Adəm övladı yaşlaşdıqca onda iki şey cavanlaşar: Mala və yaşamağa hərislik" (Müslim /1047).

## Əlli beşinci fəsil: Adəm övladının iki vadi malı olsa , üçüncüsünü də istəyər.

66-Əbu əl-Əsvad (Allah ondan razı olsun) belə rəvayət edir: "Əbu Musə əl-Əşari Bəsrənin qarilərinə (Quran hafizləri) xəbər göndərdi. Onun çağrışına üç yüz quran oxuya bilən hafiz onun yanına gəldi. O , onlara belə buyurdu: "Siz Bəsrənin ən xeyirli Quran oxuyanlarısınız , onu oxuyun. Onu uzun müddət oxumadan tərk etməyin ki, qəlbləriniz, sizdən əvvəlkilərin qəlbləri daşlaşdığı kimi daşlaşmasın. Biz uzun və şiddətli olmasını Bəraət (surəsinə) oxşatdığımız bir sürə oxuyurduq. Lakin sonradan mənə bu sürə unutduruldu. Ondan yalnız bunu əzbərləmişəm: "Adəm övladının iki vadi malı olsa , üçüncüsünü də istəyər. Adəm övladının qarnını yalnız torpaq doldurar." Biz Müsəbbihət (sübhanə ilə başlayan) adlannan surələrə bənzətdiyimiz bir sürə də oxuyurduq. Sonradan onu unutduruldum. Lakin Ondan bunu əzbərləmişəm: "Ey iman gətirənlər , etməyəcəyiniz şeyi niyə deyirsiniz. Bu sizin boynunuzda bir şahiddir, qiyamət günü onun haqda soruşulacaqsınız." (Müslim / 1050).

## Əlli aıtıncı fəsil: Allah Təalanın verdiyi dünya nemətləri.

67-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün insanlara xütbə verdiyində belə buyurdu: "Ey insanlar , Allah Təalanın sizin üçün çıxartdığı dünya nemətlərindən başqa bir şeydən qorxmuram." Bir kişi ona: "Ey Allahın Elçisi , məgər xeyir şər gətirir? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən , xeyir ancaq xeyir və ya ondan daha da xeyirlisini gətirər. Həqiqətən , bahar yetişdirdiyi nə varsa ya köpdürərək öldürür ya da həlaka yaxınlaşdırır. Yalnız yaşıl otları yeyən heyvanlardan başqa. Qarnını dolduranadək yeyər , sonra üzünü günəşə tərəf çevirərək yavaşca ehtiyacını ödəyər, bövl edər və gövşəyərək yenidən yeməyə davam edər. Kim haqqı olan bir malı götürərsə , ona onda bərəkət verilər və hər kim haqqı olmayan bir malı götürərsə , onun misalı yeyib doymayana bənzəyir." (Müslim / 1052).

## Əlli yeddinci fəsil: dilənmədən və göz dikmədən verilən malı almaq.

68-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ömər ibn əl-Xattaba bir şey verdiyində, O: "Ey Allahın Elçisi , bunu məndən daha kasıb olan kimsəyə ver" deyə ona söylədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Sən bunu götür , istərsən özünə mal et,

istərsənsə də sədəqə et. Sən bu maldan ona göz dikmədikcə və onu dilənmədikcə onu götür. Belə olmayan bir mala isə, göz tikmə. Səlim belə demişdir: “Buna görə də İbn Ömər heç bir kəsdən heç nə istəməz və ona veriləni də geri qaytarmazdı.” (Müslim/1045).

### Əlli səkkizinci fəsil: Kim istəyə (dilənə) bilər.

69- Qabisə ibn Muxariq əl–Hilali belə rəvayət edir: “Birinə kəfil oldum və buna görə də Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (yardım, mal) istədim.” Mənə bizə sədəqə gələnə kimi gözləməmi, və sədəqə gəldiyində mənə ondan verəcəyini söylədi sonra isə belə dedi: “Ey Qabisə , üç şeydən başqa istəmək halal olmaz: “Kəfalət altına girən kəsə , o malı əldə edincəyə kimi dilənmək halal olar , sonra isə ondan əl çəkər. Bütün malını itirən kəsə özünün yaşam təminatını və ehtiyacını ödəyənə kimi dilənmək halal olar. Kasıbçılığa düçar olan və qövmündən üç ağıl sahıbi onun kasıb olduğuna səhadət verən kəsə , yaşam təminatını və ehtiyacını ödəyənə kimi dilənmək halal olar. Ey Qabisə , bundan başqa dilənərək yeyən , haram yeyər.” (Müslim / 1044).\

### Əlli doqquzuncu fəsil: Kobud sözlərlə dilənən bir kimsəyə vermək.

70-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gedirdim . Əynində kənarları qalın Nəcran əbası var idi. Bədəvi çöl ərəblərindən biri onun əbasını şıddətlə çəkdi. Mən baxdığımda əbanın qalın kənarları kişinin onu dartmasından Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əziyyət verdiyini gördüm. Sonra kişi belə dedi: “Ey Muhamməd , Allahın səndə olan malından mənə verilməsini əmr et.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona baxdı və güldü sonra ona (Maldan) verilməsini əmr etdi.” (Müslim/1057).

71-Misvar ibn Məxrəma (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir neşə geyimi bölüşdürdü. Məxrəməyə isə heç nə vermədi. Məxrəmə mənə: “Ey oğlum , məni Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına apar.” deyə buyurdu. Mən onunla getdim. Mənə: “Gir onu çağır” deyə buyurduqda, mən onu çağırdım. Yanımıza çıxdığında , əynində o paltarlardan biri var idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) “Bunu sənin üçün saxladım” deyə buyurdu. Maxramə paltara baxdı və belə dedi: “Məxramə razı qaldı”. (Müslim / 1058).

## Oruc kitabı

### Birinci fəsil:Orucun fəziləti.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təala buyurur: Adəm övladının hər bir əməli onun üçündür , yalnız orucdan başqa. Həqiqətən o mənim üçündür və mükafatını da mən verəcəm. Oruc qalxandır. Sizlərdən biriniz oruc tutduğunuz gündə pis söz söyləməsin və səs-küy salmasın. Əgər kimsə onu söysə və ya onunla vuruşmaq istəsə, onda belə desin: “Mən oruc tutmuş bir kəsəm” Muhəmmədin nəfsi əlində olana and olsun ki, Allah dərgahında Oruc tutanın

ağzının iyi Misk (ətir) iyindən daha xoşdur. Oruc tutan kəsin iki sevinc anı vardır: Orucunu açdığı (iftar) zaman və Rəbbi ilə qarşılaşdıqda , orucu üçün sevinəcək." (Müslim / 1151).

## İkinci fəsil: Ramazan ayının fəziləti.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ramazan ayı gəldiyində Cənnətin qapıları açılar, Cəhənnəmin qapıları isə bağlanar və şeytanlar zəncirə vurular." (Müslim / 1079).

## Üçüncü fəsil: Ramazan ayının girməsinə bir iki gün əvvəl qalmış oruc tutmamaq.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ramazan ayının girməsinə bir və ya iki gün qalmış oruc tutmayın. Yalnız bir kəs (adət etdiyi) daimi tutduğu orucu tutursa , onda tutsun." (Müslim /1082).

## Dördüncü fəsil: Hilalı (təzə ayı) gördükdə oruc tutmaq.

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə Hilalı xatırladaraq belə buyurdu: "Onu gördükdə , orucunuzu tutun və yenə gördükdə orucunuzu açın. Əgər sizə görünməzsə , onda (ayı) otuz (gün) hesablayın." (Müslim / 1081).

## Beşinci fəsil: Ayın iyirmi doqquz gün olması.

5- Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bəzi qadınlarının yanına bir ay gimməyə and içdi. İyirmi doqquz gün keçdikdən sonra sabah və yaxud axşam çağı yanlarına daxil oldu. Ona: "Ey Allahın Elçisi , yanımıza bir ay girməməyə and içmişdin!" deyildikdə, O belə buyurdu: "Ay iyirmi doqquz gün də olur." (Müslim / 1085).

6- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Biz Ummi bir (yazıb oxuya bilməyən) ümmətik. İki əlini açaraq "Ay belə, belə və belədir" üç kərə göstərərək , sonuncuda bir əlinin baş barmağını yumdu. Sora isə və ya belədir deyib , iki əlini açaraq "Ay belə, belə və belədir " üç kərə göstərdi." (Müslim / 1080).

## Altıncı fəsil: Allah Təala onun (Ramazan ayının) vaxtını (girməsini) hilalın görünməsi ilə bağlamışdır.

7- Əbu əl-Baxtari belə rəvayət edir: "Ümrəyə çıxmışdıq. Batnu Nahla deyilən yerə endik. Hilal bizə görsəndi. Bizdən bəziləri "o üç günlük", bəziləri isə "o iki günlük bir aydır " dedilər. Sonra ibn Abbasla qarşılaşdıqda ona: "Biz hilalı gördük" deyə xəbər verdik. Bəzimiz onun üç, bəzimiz isə onun iki günlük ay olduğunu söylədilər. O: "onu hansı gecədə gördünüz? " deyə soruşdu . Biz: "Filan və filan gecədə" deyə cavab verdikdə, İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə

buyurdu: “Allah Təala onun (Ramazan ayının) vaxtını (girməsini) hilalın görünməsi ilə bağlamışdır. O , gördüyünüz gündə girmişdir.” (Müslim/1088).

## Yeddinci fəsil: Hilalı hər bir ölkənin özünün görməsi.

8- Kureyb belə rəvayət edir: “Ummu Fadl bintu əı-Həris Onu Şama Müaviyyənin yanına göndərdi. Şama gəldiyimdə onun işini yerinə yetirdim. Mən orada ikən Ramazan hilalı göründü. Mən onu cümə gəcəsi gördüm. Sonra ayın axırında Mədinəyə qayıtdığımda , İbn Abbas mənə hilalı xatırladaraq belə soruşdu: “Onu nə zaman gördünüz?” Mən: “Biz onu Cümə gecəsi gördük” deyə cavab verdiyində, O məndən: “Sən onu gördünmü?” deyə soruşdu . Mən: “Bəli mən gördüm. İnsanlar da gördülər və oruc tutdular. Müaviyyə də onlarla birgə oruc tutdu.” O belə buyurdu: “Biz isə onu Şənbə gecəsi gördük və hələ də onu tuturuq və hilalı görənə qədər və ya otuz günü tamamlayana kimi tutacağıq.” Mən ondan: “Məgər Müaviyyənin görməyi və oruc tutmağı ilə kifayətlənə bilməzsən?” O belə buyurdu: “Yox! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə əmr etmişdir.” (Yəhya ibn Yahya şəkk etmişdir: “Kifayətlənə bilməzsən və ya kifayətlənə bilmərik” deməsində.) (Müslim 1087).

## Səkkizinci fəsil: İki bayram ayı naqis olmaz.

9- Əbu Bakra (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “iki bayram ayı naqis olmaz. Ramazan və Zül–Hicca ayı.” (Müslim / 1089).

## Doqquzuncu fəsil: Oruc tutarkan Səhur (sabah facr doğmadan yemək) etmək.

10- Ənəs (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Səhurda yeyin , (həqiqətən) çünki Səhurda bərəkət vardır.” (Müslim / 1095).

## Onuncu fəsil: Səhuru gecikdirmək.

11- Zeyd ib Səbit (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhur etdik sonra namaza durduq.” Ondan: “Onların arasındakı vaxt nə qədər idi?” deyə soruşduqda, O: “Əlli ayə miqdarında” deyə cavab verdi.” (Müslim/1097).

## On birinci fəsil: Oruc tutana yeməsinin haram olan vaxtının vəsfi.

12- Samura ibn Cundub (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Diqqət edin . Bilalın azanı və üfüqün bu uzanan ağartısı sizi Səhurunuzdan yayındırmasın. Hətta bu şəkildə yayılana gədər.” Həmmad Bunu iki əli ilə göstərərək: “yəni genişləndiyini dediyini” rəvayət etmişdir.” (Müslim 1094).

## On ikinci fəsil: “Sübh açılınca, ağ sap qara sapdan fərqlənincəyə qədər yeyin için”

13- Sahl ibn Saad (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Bu ayə nazil olduğunda: “ağ sap qara sapdan fərqlənincəyə qədər yeyin için” bir kişi oruc tutmaq istədikdə , ayağına qara və ağ sap bağlayar , onları bir –birindən seçincəyə qədər yeyib içərdi.” Sonra Allah Təala bu ayəni nazil etdi: “sübh açılınca” bundan sonra bildilər ki, burada gecə və gündüz nəzərdə tutulur.” (Müslim / 1091).

On üçüncü fəsil: Bilal gecə azan verir , yeyin için.

14- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki müəzzini var idi: Bilal və gözləri görməyən İbn Ummu Maktum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Bilal azanı gecə verir , İbn Ummu Maktumun azanını eşidənə kimi yeyin için.” Abdullah belə demişdir: “Onların arasındakı müddət ançaq bunun enməyi və onun isə qalxmağı qədər idi,” (Müslim / 1092),

On dördüncü fəsil: Cunub halında ikən fəcrə çatan (qalxan) kimsənin oruc tutması.

15- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələri Aişə və Ummu Sələmə (Allah onlardan razı olsun) belə rəvayət edirlər: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan ayında sabah cinsi əlaqə səbəbindən-ihtilam səbəbindən deyil- cunub olaraq qalxar və Orucunu tutardı.” (Müslim / 1109).

16- Aişə (Allah ondan razı olsun)bir kişinin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək sual soruşduğunu və o qapının arxasından belə eşitdiyini rəvayət edir: “Ey Allahın Elçisi , namaz vaxtı girdiyinində mən cunub oluram. Elə olduqda orucumu tutum?” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə cavab verdi: “Mən də namaz vaxtı daxil olduğu zaman cunub oluram və orucumu tuturam.” O yenə: “Ey Allahın Elçisi , sən bizim kimi deyilsən. Allah Təala sənin keçmiş və gələcək günahlarını bağışlayıb” deyə söylədikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Allaha and olsun ki, mən sizin Allahdan ən çox qorxanı və nədən qorxulacağını biləninizəm.” (Müslim /1110).

On beşinci fəsil: Oruc tutan kəsin bilmədən yeyib içməsi.

17- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər kim Oruclu ikən yaddan çıxararaq yeyib və ya içərsə orucunu tamamlasın. Çünki onu Allah Təala yedirib içirmişdir.” (Müslim /1150).

On altıncı fəsil: Oruclu ikən yeməyə dəvət olunan kəsin mən orucam deməsi.

18- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz oruclu ikən yeməyə dəvət olunsa , mən orucam desin.” (Müslim / 1150).

On yeddinci fəsil: Ramazan ayında qadını ilə cinsi əlaqədə olanın kəffarəsi.

19-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir : “Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: “Ey Allahın Elçisi , həlak oldum” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Səni həlak edən nədir?” deyə soruşduğunda, O: “Ramazan ayında qadınımla əlaqədə oldum” deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan “Azad edə biləcəyin bir qulun varmı?” deyə soruşdu. O: “Xeyr” deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan yenə: “İki ay dalbadal oruc tuta bilərsən?” deyə soruşdu. O: “Xeyr” deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan yenidən: “Altımış kasıbı yedizdirə biləcəyin bir şeyin var?” O: “Xeyr” deyə cavab verdi , sonra isə oturdu. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir zənbil xurma gətirildi. Onu kişiyə verərək: “Bununla sədəqə ver” deyə buyurdu. Kişi belə dedi: “Məndən də kasıb olana? Bu iki qaradaşlı iki ərazi arasında mənim əhlimdən kasıb olanı yoxdur” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülümsədi hətta dişləri göründü. Və ona: “Get əhlini yedizdir.” deyə buyurdu.” (Müslim / 1111).

20-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi və belə dedi: “yandım” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: “Nə üçün?” deyə soruşduqda, O: “Qadınımla Ramazan ayında günorta vaxtı əlaqədə oldum” deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “Sədəqə ver! sədəqə ver!” deyə buyurdu. Kişi: “Mənim sədəqə verməyə bir şeyim yoxdur” deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona oturmağını əmr etdi. Sonra Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içində yemək olan iki zənbil gətirildi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kişiyə onu götürərək sədəqə verməsini əmr etdi.” (Müslim / 1112).\

## On səkkizinci fəsil: Oruc olan kəsin qadınını öpməsi.

21-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oruclu ikən (qadını) öpər və cinsi əlaqədə olmadan yaxınlıq edərdi. Lakin o sizin nəfsinə ən hakim olanı idi.” (Müslim /1106).

## On doqquzuncu fəsil: Gecə girdiyində və günəş batdıqda orucun açılması.

22-Abdullah ibn Əbu Avfa (Allah ondan razı olsun) belə rəvayət edir: “Ramazan ayında Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə səfərə çıxmışdıq. Günəş batdıqda (itdikdə) O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir kişiyə: “Ey filankəs , düş , bizim üçün yeməyi qarışdır” deyə əmr etdi. Kişi: “Ey Allahın Elçisi , hələ üzərində günortadır.” Deyə cavab verdikdə, Ona yenidən: “Düş , bizim üçün yeməyi qarışdır” deyə əmr etdi. Kişi enərək yeməyi hazır edərək Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gətirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan içərək əli ilə işarə edərək belə buyurdu: “Günəş burada batdıqda və gecə buradan gəldikdə oruc tutan iftarını açmış olar.” (Müslim / 1101).

## İyirminci fəsil: İftarı tezləşdirmək.

23-Səhl ibn Saad (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İnsanlar iftarı tezləşdirdikcə , xeyir içində olacaqlar" (Müslim / 1098).

24-Əbu Atiyyə belə rəvayət edir: "Mən və Məsruq Aişənin yanına daxil olduq. Məsruq ona belə dedi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabından olan iki kişi vardır ki, onlar xeyirdən qalmazlar. Onlardan biri Məğrib namazını və iftarını tezləşdirir. O biri isə həm Məqrib namazını həmdə İftarı gecikdirir." Aişə (Allah ondan razı olsun) ondan: "Məqrib namazını və iftarını tezləşdirən kimdir" deyə soruşdu. O: "Abdullah" deyə cavab verdiyində, O: "Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə edərdi" deyə cavab verdi." (Müslim / 1099)

## İyirmi birinci fəsil: Orucu iftar açmadan davam etməyin qadağan olması.

25-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Oruca iftar açmadan davam etməyi qadağan etdi. Müsəlmanlardan olan bir kişi ondan: "Ey Allahın Elçisi , sən özün davam edirsən" deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizdən hansınız mənim kimidir? Mən yatdığımda Rəbbim məni yedirir , içirir." Onların bundan əl çəkmədiklərini gördükdə, onlarla birgə bir və ya iki gün oruca davam etdi. Sonra hilalı gördülər və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara bundan əl çəkmədiklərinə görə ibrət olsun deyə belə buyurdu: "hilal geciksəydi , orucu sizə daha da artırardım". (Müslim / 1103).

## İyirimi ikinci fəsil: Səfərdə ikən oruc və iftar.

26-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan ayında səfərə çıxdı. Usfan adlanan yerə çatana kimi orucuna damam etdi. Ora çatdıqda içərsində su olan bir qab istədi və insanlar onu görsün deyə , günorta vaxtı onu içdi və iftarını açaraq , Məkkəyə getməyə davam etdi." İbn Abbas belə demişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oruc tutmuş və iftarını açmışdır. Kim istərsə , orucunu tutsun və kim də istərsə iftar etsin." (Müslim / 1113).

27-Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan ayında Məkkənin fəthi ili Məkkəyə səfərə çıxdı. Kiraa əl-Ğamim adlanan yerə qədər orucuna davam etdi. Sonra içərisində su olan bir qədəh istədi və onu insanlar görsün deyə , qaldırarq içdi." Sonradan ona bəzi insanların oruc tutduqları deyildikdə , O belə buyurdu: "Onlar asidilər! Onlar asidilər!" (Müslim /1114).

## İyirmi üçüncü fəsil: Səfərdə oruc tutmaq heç də yaxşı əməl deyildir.

28-Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərdə ikən camaatın bir kişinin başına yığışaraq onu kölgələndirdiklərini gördü. Onlardan: "Ona nə olub?"

deyə soruşdu . Onlar: “Kişi oruc tutub” deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Səfərdə oruc tutmaq heç də yaxşı əməl deyildir.” (Müslim / 1110).

### İyirmi dördüncü fəsil: Oruc tutana və iftarını açana eyb etməyin tərk olunması.

29-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazandan 16 gün keçdiyi bir vaxtda döyüşlərin birində idik. Bəzilərimiz oruc tutmuş. Bəzilərimiz isə oruclarını açmışdılar. Oruc tutan orucunu açana, Orucunu açan isə Oruc tutana bunu eyb etməzdi.” (Müslim / 1116).

### İyirmi beşinci fəsil: Səfərdə orucunu açan kəsin etdiyi əməlinin savabı.

30-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə səfərdə idik. Bizdən bəzilərimiz oruc tutmuş, bəzilərimiz isə orucunu açmışdı. İsti bir gündə bir yerdə dayanmalı olduq. Bizdən ən çox kölgələnən paltarı olan idi. Bəzilərimiz isə əli ilə günəşdən qorunurdu. Oruc tutanlar halsız düşdülər və orucunu açanlar qalxaraq çadırlar qurdular və dəvələri suladılar.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  belə buyurdu: “Orucunu açanlar bu gün savabların hamsını apardılar.” (Müslim /1119).

### İyirmi  altıncı fəsil: Düşmənlə qarşılaşdıqda qüvvətli olmaq üçün orucu açmaq.

31-Qazaə (Allah ondan razı olsun) belə rəvayət edir: “Əbu Səid əl-Xudrinin (Allah ondan razı olsun) yanına getdim. Başına insanlar yığışmışdı. Onlar aralandıqdan sonra ona yaxınlaşaraq belə dedim: “Mən səndən bunların soruşduqları haqda soruşmuram.” Ondan səfərdə ikən oruc tutmaq haqda soruşdum. O belə cavab verdi: “Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oruclu ikən Məkəyə doğru səfərə çıxdıq. Bir yerədə dayandığımızda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  belə buyurdu: “siz düşmənlərinizə yaxınlaşmışsınız orucunuzu açmağınız qüvvətli olmanız üçün daha yaxşıdır. Bu bir rüxsət idi. Bizdən bəziləri oruc tutmuş bəziləri isə orucunu açmışdı. Sonra başqa bir dayanacaq yerininə gəldikdə belə  buyurdu: “Sizlər sabah düşmənlə qarşılaşacaqsınız , orucunu açmağınız sizə qüvvətli olmanız üçün daha yaxşıdır. Bu dəfə orucu açmağımızı əzmlə əmr etdi.” Sonra O belə dedi: “Bundan sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  səfərə çıxdığında orucu tuturduq.” (Müslim /1120).

### İyirmi yedinci fəsil: Səfərdə ikən orucu tutmaq və açmaq arasında seşim etmək.

32-Həmzə ibn Amr (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ey Allahın Elçisi ,  səfərdə oruc tutmağa özümdə qüvvət hiss edirəm , belə etməyimdə mənə günah varmı?” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Bu Allahdan bir rüxsətdir. Kim onu qəbul etsə , yaxşıdır və kim oruc tutmaq istərsə , ona günah yazılmaz.” (Müslim/1121).

33-Əbu əd-Darda (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan ayında çıxmışdıq.  Şiddətli bir isti idi. Hətta bizdən biri istinin şiddətindən əlini başına

qoyurdu. İçimizdə oruc tutan yalnız Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və Abdullah ibn Ravaha idi.” (Müslim /1122).

### İyirmi səkkizinci fəisil: “ Ramazan ayının qəzasını Şaban ayında tutmaq.

34- Əbu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: “Aişənin (Allah ondan razı olsun) belə dediyini eşitdim: “Ramazan ayından orucumun qəzası qalırdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məşğul etdindən və ya Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məşğul olduğumdan , onu ancaq Şaban ayında tuta bilirdim.” (Müslim / 1146).

### İyirmi doqquzuncu fəsil: Ölən kəsin orucunun qəzası.

35- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər kim öldükdə boynunda orucun qəzası qalarsa, vəlisi onun əvəzinə qəzasını tutar.” (Müslim / 1147).

36- Bureydə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir dəfə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında oturmuşdum. Onun yanına bir qadın gələrək belə dedi: “Anama bir kəniz sədəqə etmişdim , indi isə anam vəfat edib.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Savabın vacib oldu (yazıldı) və miras onu (kənizi) sənə qaytardı.” Qadın yenə soruşdu: “Ey Allahın Elçisi , anamın boynunda bir ay orucu qalıb , onun əvəzinə oruc tutummu?” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: “onun əvəzinə oruc tut” deyə buyurdu? Qadın yenə: “Anam həcc etməmişdir. Onun əvəzinə həcc edimmi?” deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə cavab verdi: “Onun əvəzinə həcc et.” (Müslim / 1149).

### Otuzuncu fəsil: Allah Təala buyurur: “Oruc tutmağa taqəti olmayanlar isə”.

37- Sələmə ibn əl- Əkva (Allah ondan razı olsun) belə rəvayət edir: “bu ayə nazil olduqda: “oruc tutmağa taqəti olmayanlar isə (hər günün əvəzində) bir yoxsulu doyuracaq qədər fidyə verməlidirlər” kim orucunu açmaq istəyirdisə , fidyə verirdilər. Hətta ondan sonrakı ayə nazil oldu və onun hökmünü ləğv etdi.” (Müslim)

### Otuz birinci fəsil: Ramazandan başqa aylarda oruc və iftar.

38- Abdullah ibn Şaqiq belə rəvayət edir: Aişəyə (Allah ondan razı olsun) belə dedim: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayın hamsını oruc tutardı? Aişə belə cavab verdi: “Vəfat edənə qədər Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazandan başqa bir ayı tam oruc tutduğunu, və ya ondan oruc tutmadan tam bir ay iftar etdiyi bir ayın olduğunu bilmirəm.” (Müslim / 1156).

### Otuz ikinci fəsil: Allah yolunda oruc tutmağın fəziləti.

39- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Kim

Allah yolunda bir gün oruc tutarsa , Allah Təala onun üzün o günə görə Cəhhənəmdən yetmiş il uzaq salar.” (Müslim/1153).

## Otuz üçüncü fəsil: Məhərrəm ayının orucunun fəziləti.

40-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ramazan ayından sonra ən əfzəl oruc Allahın Məhhərəm ayının orucudur. Vacib namazlardan sonra ən əfzəl namaz gecə namazıdır.” (Müslim / 1163).

## Otuz dördüncü fəsil: Aşura gününün orucu.

41-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Qureyş müşrikləri cahilliyə dövründə Aşura orucunu tutardılar. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan orucu fərz olana kimi , onu tutmağı əmr etdi. Ramazan orucu fərz olandan sonra isə belə buyurdu: “Kim istərsə , onu tutsun və kim istəmirsə tutmasın.” (Müslim/1125).

## Otuz beşinci fəsil: Aşurə orucunu hansı gündə tutmaq.

42-əl-Həkəm ibn əl-Ərac belə rəvayət edir: İbn Abbasın yanına gəldiyimdə , o ridasını başının altına qoymuş halda , zəm-zəmin yanında uzanmışdı. Ona: “Mənə Aşurə orucundan xəbər ver” deyə söylədim. O belə dedi: “Məhərrəm ayının hilalını gördükdə , say və doqquzuncu gün oruc tutaraq sabahla.” Mən ondan: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə oruc tutardı?” deyə soruşduqda, O: “Bəli” deyə cavab verdi. (Müslim / 1133).

## Otuz altıncı fəsil: Aşurə gününün orucunun fəziləti.

43-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə gəldiyində Yahudilərin Aşurə orucunu tutduqlarını gördü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlardan: “Oruc tutduğunuz bu gün, nə günüdür?” deyə soruşdu . Onlar: “Bu gün Allah Təalanın Musanı və qövmünü xilas etdiyi, Firovnu və qövmünü suda qərq etdiyi bir gündür ki, Müsa bu günü şükr əlaməti olaraq oruc tutmuşdur. Biz də buna görə bu gün oruc tuturuq.” Deyə cavab verdiyində, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Biz Müsaya sizdən daha layiq və daha haqlıyıq.” Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oruc tutdu və o günu oruc tutmağı əmr etdi.” (Müslim /1130).

44-Ubeydullah ibn Əbu Yəzid İbn Abbasdan (Allah ondan razı olsun) belə eşitdiyini rəvayət edir: “Ondan Aşurə günün orucu barəsində soruşulduqda, O belə cavab verdi: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu gündən başqa sair gönlərin üzərinə fəzilətini diləyərək oruc tutduğu bir günün və Ramazan ayından başqa üzərinə fəzilət diləyərək oruc tutduğu bir ayın olduğunu bilmirəm.” (Müslim / 1132).

## Otuz yeddinci fəsil: Aşurə günü yemək yeyən günün qalan hissəsini yeməsin (oruc tutsun).

45- ər-Rubeyı bintu Muavviz ibn Afra (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Aşurə gününün səhəri Mədinə ətrafında yaşayan ənsar kəndlərə belə xəbər göndərdi: “Bu gün hər kim oruc tutaraq sabahladısa orucuna davam etsin. Və hər kim yeyibsə günün qalan hissəsini oruc tutaraq tamamlasın.” Bundan sonra biz o günü oruc tutar və kiçik uşaqlarımıza da Allahın izniylə oruc tutdurardıq. Onları məscidə aparar oynamaları üçün onlara yundan oyuncaq düzəldərdik, yemək üçün ağladıqlarında , iftarda yeməklərini verərdik.” (Müslim / 1136).

## Otuz səkkizinci fəsil: Şaban ayının orucu.

46-Əbu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: “Aişədən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) orucu barəsində soruşdum . Belə buyurdu: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o qədər oruc tutardı ki, biz artıq “həmişə oruc tutacaq” deyərdik. Və o qədər oruc tutmadan gəzərdi ki, biz “daha oruc tutmayacaq “ deyərdik. Şaban ayında tutduğu kimi başqa aylarda oruc tutduğunu görmədim. Şaban ayını bütün oruc tutardı. Şaban ayının orucunu az hallarda buraxardı.” (Müslim /1156).

## Otuz doqquzuncu fəsil: Şaban ayının ortası oruc tutmaq.

47-İmran ibn Huseyn (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona və ya başqa bir kəsə belə buyurdu: “Şaban ayının ortası oruc tutmusan? O: “Xeyr” deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Yemisənsə , iki gün oruc tut.” (Müslim/1161).

## Qırxıncı fəsil: Ramazan ayından sonra Şəvval ayında altı gün oruc tutmaq.

48-Əbu Eyyub əl-Ənsari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər kim Ramazan ayının orucunu tutar və ardınca Şəvval ayında altı gün oruc tutarsa , il boyu oruc tutmuş kimi olar.” (Müslim / 1164).

## Qırx birinci fəsil:  Zil-Hiccə ayının on günün orucunun tərk olunması.

49-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) on gündə oruc tutduğunu heç görmdəim.” (Müslim/1176).

## Qırx ikinci fəsil: Ərafa günün orucu.

50-Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək “Necə oruc tutursan?” deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun bu sözündən qəzəbləndi. Ömər (Allah ondan razı olsun) onun qəzəbləndiyini gördükdə , belə deməyə başladı: “Allahdan Rəbb, İslamdan din, Muhəmmdən isə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kimi razıyam. Allaha, Allahın və Elçisinin qəzəbindən şığınıram. Ömər bu sözləri Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın

salavatı və salamı olsun) qəzəbi soyuyana kimi təktarladı. Sonra Ömər ondan: “Ey Allahın Elçisi , il boyu oruc tutan necə olar” deyə soruşduqda, O belə buyurdu: “Nə oruc tutub nə də iftar açıb” və ya “Oruc tutmayıb, iftar da açmayıb” Ömər yenidən soruşdu: “İki gün oruc tutub, iki gün isə iftar edən necə?” O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: “Buna kiminsə taqəti olarmı?” Sonra Ömər yenidən soruşdu: “Bir gün oruc, bir gün iftar edən necə?” O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Bu Davudun (Ona Allahın salamı olsun) orucudur” deyə cavab verdi. Ömər yenidən: “Bir gün oruc, iki gün iftar etsə necə?” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  belə buyurudu: Bunun üçün mənə taqət verilməsini dilərdim.” Sonra isə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  belə dedi: “Hər ayın üç günü, Ramazandan Ramazana kimi, bu il boyu olan orucdur. Və Allahın Ərafa günün orucun ondan bir il əvvəli və bir il sonranın günahlarını silməsini diləyirəm. Və Allahdan Aşurə gününün orucunun bir il əvvəlki günahlarını silməsini diləyirəm.” (Müslim /1162).

### Qırx üçüncü fəsil: Həcdə olan kəsin Ərafa günü oruc tutmaması.

51-Ummu Fadl bintu əl–Haris (Allah ondan razı olsun) belə rəvayət edir: “İnsanlar Ərafa günü Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Oruc tutub tutmamasında ixtilafa düşdülər. Bəzi insanlar onun oruc olduğunu, bəziləri isə onun oruc olmadığını dedilər. Ərafada dəvəsinin üzərində ikən Ummu Fadl bintu əl–Haris (Allah ondan razı olsun) ona bir qədəh süd göndərdi və o , onu içdi.” (Müslim /1123).

### Qırx dördüncü fəsil: Ramazan və Qurban bayramı günü oruc tutmağın qadağan olması.

52-İbn Zuheyrin mövlası olan Əbu Ubeyd belə rəvayət edir: “Ömər ibn əl-Xattabla bayram namazında oldum. O , gələrək namazı qıldı sonra çevrilib insanlara xütbə verdi və belə buyurdu: “Bu iki gündə oruc tutmağı Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadağan etmişdir: Orucunuz bitdikdən sonra , Fitrə verdiyiniz gün və o biri isə , Qurban kəsdiyiniz heyvanın ətindən yediyiniz gündür.” (Müslim/1137),

### Qırx beşinci fəsil: Təşriq (Zil Hiccə ayının 11- ci, 12 –ci və  13-cü) günləri oruc tutmağın bəyənilməməsi.

53-Nubeyşətə əl-Huzəli (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Təşriq günləri yeyib içmək günüdür. (Başqa rəvayətdə isə: “Allahı zikr etmək günüdür).” (Müslim/ 1147).

### Qırx altıncı fəsil: İkinci günün (miladı ilə həftənin birinci günü) orucu.

54-Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  ikinci günün orucu haqda soruşulduqda, belə buyurdu:  “O gündə doğulmuşam və o gündə mənə vəhy nazil olub.” (Müslim / 1162).

### Qırx yeddinci fəsil: Cumə gününü fərdləşdirərək oruc tutmağın qadağan olması (haram olması).

55-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz Cümə günü , ondan əvvəlki və ya sonrakı gündə oruc tutmadan , (cümə günü) oruc tutmasın.” (Müslim /1144).

56-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Cümə gecəsi sair gecələrin içindən qiyamla xüsusiləşdirilməyin. Cümə günü sair günlərin içindən orucla xüsiləşdirilməyin. Yalnız biriniz daimi tutduğu bir oruc olduqda, onu tutsun.” (Müslim /1144).

## Qırx səkkizinci fəsil: Hər ayın üç günü oruc tutmaq.

57-Muaza əl-Adəviyya belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişədən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hər ayın üç günü oruc tutduğu haqda soruşdum . O: “Bəli” deyə cavab verdikdə, ondan: “Ayın hansı günlərini?” deyə soruşdum. O belə buyurdu: “Ayın hansı günləri olduğuna əhəmiyyət verməzdi,” (Müslim 1160).

## Qırx doqquzuncu fəsil: İftar etmədən davamlı şəkildə oruc tutmağın qadağan olması.

58- Abdullah ibn Amr ibn əl–Ass (Allah ondan razı olsun) belə rəvayət edir: “Mənim İftar etmədən davamlı şəkildə oruc tutmağımın və gecə yatmadan namaz qılmağımım xəbəri Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çatdı. Arxamca xəbər göndərdi və ya onunla qarşılaşdıqda , Mənə belə dedi: “Sənin iftar etmədən davamlı şəkildə oruc tutmağının və gecə yatmadan namaz qılmağının xəbəri mənə çatmadığını sanırsan? Belə etmə! Həqiqətən gözünün haqqı vardır. Nəfsinin haqqı vardır. Ailənin haqqı vardır. Oruc tut və iftar et! Namaz qıl və yat! On gündən bir oruc tut və sənə doqquz günün savabı var. Mən “Ey Allahın Elçisi özümdə bunlardan da çox etməyə qüvvətim olduğunu hiss edirəm” deyə cavab verdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Elə isə Davud (Ona Allahın salamı olsun) orucunu tut!” Ondan: Ey Allahın Elçisi Davudun orucu necə idi?” deyə soruşduqda, O belə buyurdu: “O bir gün oruc tutar, bir gün isə iftar edərdi və düşmənlə qaşılaşdığı zamanda qaçmazdı. Mən Ondan: “Ey Allahın Elçisi , bu orucu mənə kim zamin durar?” deyə soruşdum. Əta belə demişdir: “Əbədi orucu necə xatırlatdığını bilmirəm.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Əbədi oruc tutan kimsə oruc tutmamışdır! Orucu əbədi tutan kimsə oruc tutmaz.” (Müslim / 1159).

## Əllinci fəsil: Ən əfzəl oruc Davudun orucudur. Bir gün oruc tutar, bir gün isə iftar edərdi.

59-Abdullah ibn Amr (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allaha ən sevimli oruc Davudun orucudur. Və ən sevimli namaz Davudun namazıdır. O gecənin yarısını yatar, üçdə birini qalxaraq namaz qılar və altıda birini yatardı. Bir gün oruc tutar , bir gün isə yeyərdi.” (Müslim / 1159).

## Əlli birinci fəsil: Nafilə orucu tutaraq sabahlayan sonra isə iftar edən haqda.

60- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma girdi və: “Sizdə yeməyə bir şey varmı?” deyə soruşdu . Biz: “Xeyr” deyə cavab verdikdə, O belə dedi: “Elə isə mən orucam.” Sonra başqa bir gün yanımıza gəldiyində ona: “Ey Allahın Elçisi , bizə xurma halvası hədiyyə olunub” deyə söylədikdə, O: “Onu mənə göstər” deyə buyurdu. Sonra isə: “Mən oruc olaraq sabahladım” dedi və yedi.” (Müslim / 1154).

# Etikaf (Məsciddə ibadətə çəkilmək) kitabı

## Birinci fəsil: Etikafa girmək istəyənin nə vaxt etikaf etdiyi yerə qirəcəyi.

1- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etikafa girmək istədikdə , sabah namazını gıldıqdan sonra etikaf etdiyi yerə girərdi. Bir dəfə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan ayının axır on günündə etikafa girmək istədi. Məsciddə ona çadır qurulmasını əmr etdi və quruldu. Sonra Zeynəb də özü üçün cadır qurulması əmr etdi və quruldu. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başqa zövcələri də onlar üçün çadır qurulmasını əmr etdi və quruldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sabah namazını qıldıqdan sonra baxdığında çadırları gördü və: “Bunu etməklə xeyirmi istədiniz?” deyərək çadırların sökülməsini əmr etdi və Ramazan ayında etikaf etməyi tərk etdi. Hətta etikafını Şəvval ayının əvvəl on günündə etdi.” (Müslim / 1173).

## İkinci fəsil: Ayın ilk on günündə və orta on gündə etikafa girmək.

2- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ramazan ayının ilk on günündə etikaf etdi. Sonra ayın orta on günüdə qapısı həsirdən olan bir türk çadırında etikaf etdi. Əli ilə həsiri çadırın bir tərəfinə çəkərək başını bayıra çıxartdı və insanlarla danışdı. Onlar ona yaxınlaşdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: “Mən Ramazanın ilk on günündə etikaf etdim. Sonra bu gecəni (qədr gecəsi) axtardım. Sonra orta on gündə etikaf etdim. Sonra gəldiyimdə , mənə onu son on gündə axtamağım buyuruldu. Sizlərədn kim etikaf etmək istəyirsə , etsin!” İnsanlar da onunla birgə etikafa girdilər. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “O gecə mənə yuxumda göstərildi. Sabahladığımda palçıq və suya səcdə edirdim”. İyirmi birinci gecə sabahladı. Sabah namazına durduğunda səmadan yağış yağmağa başladı. Məscid dammağa başladı . Palçıqlı suyu gözümlə gördüm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sabah namazını bitirdikdən sonra çıxdığında alnında və burnunun ucunda palçıq vardı. Baxdığımda həmin gecənin iyirmi birinci gecə olduğunu gördüm.” (Müslim / 1167).

## Üçüncü fəsil: Ramazan ayının axır on günündə etikaf etmək.

3- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), Allah Təala onu vəfat edənə kimi Ramazan ayının axır on günündə etikaf etmişdir. Ondan sonra zövcələri də belə etmişlər.” (Müslim / 1172).

## Dördüncü fəsil: Son on gündə ibadətdə daha çox səyy göstərmək.

4- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (Ramazan ayının) son on günü daxil olduğunda gecəni dirilər, ailəsini oyadar, ibaddətdə daha çox səyy göstərər və izarını möhkəm sıxardı." Müslim / 1174).

## Beşinci fəsil: Qədir gecəsi və onun Ramazan ayının axır on günündə axtarılması.

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Onu – yəni qədr gecəsi- axır on gündə axtarın. Sizlərdən biriniz zəifləsə və ya aciz olsa, nə badə özünü qalan yeddi gündən məhrum etsin." (Müslim / 1165).

## Altıncı fəsil: Qədir gecəsinin iyirmi birinci gündə olması.

Qabaqda keçən Əbu Səid əl-Xudrinin 632-ci hədisi.

## Yeddinci fəsil: Qədir gecəsinin iyirmi üçüncü gecədə olması.

6- Abdullah ibn Uneys (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qədr gecəsi mənə göstərildi sonra isə unutduruldu. Onun səhəri palçıq və suya səcdə etməyim mənə göstərildi." İyirmi üçüncü gecə yağış yağdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə namazı qıldırdıqdan sonra çevrilərək getdiyində alnında və burnunun ucunda palçığın və suyun izi qalmışdı. Ravi : "Abdullah ibn Uneysin iyirmi üçü" olduğunu söyləmişdir." (Müslim / 1168).

## Səkkizinci fəsil: Onu doqquzuncu, yeddinci və beşinci də axtarmaq.

7- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qədr gecəsini ona hələ bildirilmədən öncə Ramazan ayının orta on günüdə etikaf etdi. Etikaf günləri bitdiyində çadırının sökülməsini əmr etdi. Sonra ona onun axır on gündə olması bildirildi. Çadırının yenidən qurulmasını əmr etdi və quruldu. Sonra insanların yanına çıxıb belə buyrdu: "Ey insanlar mənə qədir gecsi bildirilib. Mən bunu sizə xəbər vermək üçün çıxmışdım. Yanıma haqlarını tələb edən iki kişi gəldiyində yanlarında olan şeytan mənə onu unutdurdu. Onu Ramazan ayının axır on günündə axtarın. Onu doqquzuncu, yeddinci və beşinci günündə axtarın." Mən Əbu Səidə (Allah ondan razı olsun) belə dedim: "Ey Əbu Səid ədədi sən bizdən daha yaxşı bilərsən." O: "Bəli biz buna sizdən daha haqlıyıq" deyə cavab verdiyində, Ondan: "doqquzuncu, yeddinci və beşinci nədir? Deyə soruşdum. O belə cavab verdi: "İyirmi birinci gecə keçdikdə ondan sonra gələn iyirmi ikinci gecə doqquzuncudur. İyirmi ücüncü gecə keçdikdə ondan sonra gələn yeddincidir, iyirmi beşinci gecə keçdiyində ondan sonra gələn beşincidir" deyə cavab verdi," (Müslim / 1167).

## Doqquzuncu fəsil: Qədr gecəsinin iyirmi yeddinci olması.

8- Zirr ibn Hubeyş belə rəvayət edir: "Ubey ibn Kəabdən (Allah ondan razı olsun) belə soruşdum: "Qardaşın ibn Məsud belə deyir: "İl boyu gecə namazına duran qədir

gecəsinə müvəffəq olar" O belə dedi: "Allah ona rəhm etsin , insanlar arxayınlaşmasın deyə deyib. Amma onun Ramazan ayında olduğunu və onun axır on gündə olmasını və onun iyirmi yeddinci gecə olduğunu bilir. Sonra onun istisnasız iyirmi yeddinci gecə olmasına and içdi." Ondan: "Bunu nəyə əsəsən deyirsən , Ey Əbu Munzir?" deyə soruşduğumda, belə cavab verdi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdiyi əlaməti ilə və ya ayəsi( nişanəsi) ilə: "O gecənin səhəri günəş şuasız olaraq doğar." (Müslim / 762).

# Həcc kitabı

## Birinci fəsil: Həccin (insanın) ömründə bir dəfə vacib olması.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə xütbə verərək belə buyurdu: "Ey insanlar , artıq sizə həcc vacib olmuşdur, Həcc edin!" Bir kişi ondan: "Ey Allahın Elçisi , hər il?" deyə soruşdu . Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) susdu. Kişi bunu üç kərə təkrar etdikdən sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəli desəm vacib olacaq. Və siz də bunu bacarmayacaqsınız." Sonra isə belə buyurdu: "Məni tərk edin , mən sizi tərk etdiyim müddətcə. Həqiqətən , sizdən əvvəlki ümmətlər çox sual verdikləri, və peyğəmbərlərinə müxalif olduqları ücbatından həlak oldular. Sizə nə əmr etdimsə , ona bacardığınız qədər əməl edin. Sizə bir şeyi qadağan etdiyimdə isə , onu tərk edin." (Müslim / 133).

## İkinci fəsil: Həcc və ümrənin savabı.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir ümrə ilə başqa ümrə arsasındakı olan günahlar silinər. Qəbul olmuş həccin savabı (əcri, cəzası) isə yalnız cənnətdir." (Müslim/1349).

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim bu evə ziyarətə gələr, günah və pis söz söyləməzsə , (və ya qadını ilə əlaqədə olmazsa) qayıtdığında anasından yeni doğulmuş kimi olar." (Müslim/1350).

## Üçüncü fəsil: Böyük həcc günü.

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Əbu Bəkr (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu Vida Həccindən öncə Həccdə insanlara əmirlik etməsi üçün göndərdiyi ildə , məni Qurban bayramı günü insanlara xəbər çatdırması üçün göndərdiyi elçilərin içində yolladı və belə deməyimizi buyurdu: "Bu ildən sonra nə müşrik Həcci, nə də çilpaq olan kimsə Kəbəni tavaf etməsin." İbn Şihab belə rəvayət edir: "Hümeyd ibn Abdurrahman Əbu Hüreyrənin (Allah ondan razı olsun) bu hədisinə görə belə deyərdi: "Qurban bayramı günü Böyük Həcc günüdür." (Müslim /1347).

## Dördüncü fəsil: Ərafa gününün fəziləti.

5- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ərafa günü kimi Allah Təalanın ən çox bəndəsini cəhənnəmdən azad etdiyi bir gün yoxdur. O yaxınlaşar və mələklərə onların fəzilətləri ilə fəxr edər və: "Onlar nə istəyirlər?" deyə buyurar." (Müslim / 1342).

## Beşinci fəsil: Həcc və qeyri səfərə çıxarkən miniyə minərkən deyilən dua.

6- Əli əl-Əzdi belə rəvayət edir: "İbn Ömər (Allah ondan razı olsun) onlara belə öyrətmişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərə çıxdığında dəvəsinin üzərinə qalxaraq oturduqda üç kərə "Allahu Əkbər" deyər sonra isə belə deyərdi: "Subhənəlləzi saxxara lənə həzə Va mə kunnə ləhu Muqrinin və innə ila Rabbinə lə munqalibun. Allahummə innə nəsəluka fi səfərinə həzə əl-Birra vat-Taqva  və min əl-Əməli Mə tarda. Allahummə həvvin aleyna  səfərənə həzə vatvi ənna budəh. Allahummə əntə sahibu fissafəri vəlxəlifətu fil əhli. Allahummə inni Əuzu bikə min vəsai əs-səfəri və kəəbətil manzari və suə əl-munqaləbi fi əl-məli və əl-əhli. (Bunu bizə tabe edən pak və müqəddəsdir. Bizim ona gücümüz yetməzdi. Şübhəsiz ki biz Rəbbimizə qayıdacayıq. Allahım! Bu səfərimizdə səndən yaxşılıq, Allah qorxusu və razı qalacağın əməl diləyirəm. Allahım! Bu səfərimizi bizim üçün rahat et. Və onun uzaqlığını bizə yaxın et. Allahım! Səfərdə dost və ailəmizə himayədar sənsən. Allahım! səfərin ağırlığından, məyus edən mənzərədən, malda və ailədə xoşagəlməz dəyişikliklərdən Sənə sığınıram.) səfərdən qayıtdıqda isə belə deyərdi: "Ayibunə, təibunə, Abiduna ilə Rabbinə Hamidunə." (geri dönənlər, tövbə edənlər. İbadət edənlər, Rəbbimizə həmd edənlərik)." (Müslim/1342).

## Altıncı fəsil: Qadının məhrəmi ilə Həccə səfərə çıxması.

7- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allaha və axirət gününə inanan qadının yanında atası və ya oğlu və ya əri və ya qardaşı və ya ona məhrəm sayılan kimsələrdən biri istisna olmaqla, tək başına üç günlük və daha artıq səfərə çıxması halal olmaz." (Müslim / 1340).

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allaha və axirət gününə inanan qadının yanında məhrəmi olmadan, tək başına bir günlük məsafəni səfərə çıxması halal olmaz." (Müslim/1339).

9- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  xütbə verərkən belə dediyini eşitdim: "Kişi yanında məhrəmi olmayan bir qadınla xəlvət yerdə olmasın. Həmçinin qadın məhrəmi olmadan səfərə çıxmasın." Bir kişi qalxaraq: "Ey Allahın Elçisi , arvadım həccə çıxmışdır, mən isə bu və bu döyüşlərdə döyüşənlərdənəm." dedikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona "Get və qadınınla həcc et!" deyə buyurdu." (Müslim/1341).

## Yeddinci fəsil: Uşağın həcc etməsi. Və onu həcc etdirənin savabı.

10-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ər-Ravha adlanan yerdə bir dəstə atlı ilə qarşılaşdı. Onlardan: "Kimsiniz?" deyə soruşduqda, onlar: "Müsəlmanıq" deyə cavab verdilər və: "Sən kimsən?" deyə ondan soruşdular. O: "Allahın Elçisi" deyə cavab verdikdə, bir qadın əlindəki uşağı qaldıraraq: "Buna həcc varmı?" deyə soruşdu? O: "Bəli və sənə də savab var" deyə cavab verdi" (Müslim / 1336).

## Səkkizinci fəsil: "Miniyin tərkində oturarmağa qadir olmayan kimsənin əvəzinə həcc etmək.

11-Abdullah ibn Abbas (Allah onların razı olsun) belə rəvayət edir: "Fadl ibn Abbass Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyinin tərkində idi. Xaşəmdən olan bir qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına fitva almaq üçün gəldi. Fadl qadına, qadın da ona baxmağa başladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Fadlın üzünü başqa tərəfə çevirməyə başladı. Qadın Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , Allah Təalanın bəndələrinə vacib etdiyi Həcc gəlib çatıb, atam yaşlı kişidir , miniyin üzərində qala bilmir, onun əvəzinə həcc edimmi?" deyə soruşdu? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli" deyə cavab verdi. Və bu vida həccində idi." (Müslim/1134).

## Doqquzuncu fəsil: "Heyz və nifas halında olan qadının həcc etmək istədikdə nə etməsi."

12- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Əsma bitu Umeysə ağacın altında Muhamməd ibn Əbu Bəkri doğduğunda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Bəkrə Əsmanın yuyunaraq təlbiyə etməsini söyləməsini buyurdu," (Müslim/1209).

## Onuncu fəsil: Həcc və Umrənin Miqatları (Ehrama girmə yeri və zamanı) haqda.

13-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinə əhli üçün Zul-Hüleyfəni, Şam əhli üçün Cuhfəni, Nəcd əhli üçün Qarnə əl-Mənazili, Yəmən əhli üçün Yələmləmi Miqat təyin etdi və belə buyurdu: "Bu , o yerlərdə yaşayan və oranın əhlindən olmayan , lakin oradan Həcc və Ümrə niyyəti ilə keçənlər üçündür. Və Məkkəyə yaxın yaşayanlar isə evlərindən ehrama girər. Hətta Məkkə əhlinin miqatı elə Məkkədir." (Müslim / 1181).

14-Əbu Zubeyr belə rəvayət edir: "Cabir ibn Abdullahdan ehrama girmə yeri haqda soruşulduğunu eşitdim. O (hesab edirəm ki , Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəql edərək) belə cavab verdi: "Mədinə əhlinin ehrama girmə yeri Zul Hüleyfə, Başqa yol isə Cuhfədir. İraq əhlinin ehrama girmə yeri Zətu İrq, Nəcd əhlinin ehrama girmə yeri Qarn, Yəmən əhlinin ehrama girmə yeri isə Yələmləmdir." (Müslim / 1183).

## On birinci fəsil: Ehrama girməzdən əvvəl ətir vurmaq.

15- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ehrama girməzdən əvvəl və evi

(Kəbəni) tavaf etməzdən gabaq ehramdan çıxdıqdan sonra öz əllərimlə ətir sürdüm." (Müslim /1189).

16- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən sanki hələ də Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ehramda ikən sacını ayırdığı yerdəki ətirin par–par parıldamağına baxıram," (Müslim / 1190).

## On ikinci fəsil: Misk ətirlərin ən yaxşısıdır.

17- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bəni İsraildən olan bir qadınının üzüyünə misk doldurduğunu xatırlatdı və belə dedi: "Misk ətirlərin ən yaxşısıdır." (Müslim / 2252).

## On üçüncü fəsil: Ud (Yandırıldıqda gözəl ətir verən ağac qırıntısı) və Kafur ətri.

18- Nəfi belə rəvayət edir: "İbn Ömər (Allah ondan razı olsun) ətirləndikdə qarışıqsız ud və udla qarışdırılmış kafur sürtdü və belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə ətirlənərdi" (Müslim / 2254).

## On dördüncü fəsil: Reyhan haqda.

19- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kimə Reyhan təklif olunsa , onu rədd etməsin. Çünki o daşınması yüngül , ətri isə gözəldir." (Müslim / 2253).

## On beşinci fəsil: Zül Hüleyfə məscidinin yanından ehrama girmək.

20- Səlim ibn Abdullah atsınından belə eşitdiyini rəvayər edir: "Sizin bu Beydanız (Mədinənin kənarında bir yer) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iftira etdiyiniz bir yedir. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yalnız bu məscidin yanından ehrama gırib. Yəni Zul Hüleyfədən." (Müslim/1186).

## On altıncı fəsil: Təlbiyəyə (Ləbbeykə Allahummə həccən; Ləbbeykə Allahummə ləbbeykə. Ləbbeykə lə şəriykə ləkə ləbbeykə. İnnəl-həmdə vən-nemətə ləkə vəl-mulk. Lə şəriykə lək) miniyin qalxdığı yerdən başlamaq.

21- Ubeyd ibn Cureyc belə rəvayət edir: "O Abdullah ibn Ömərə (Allah onların hər ikisindən razı olsun) belə demişdir: "Ey Əbu Abdurrahman , sənin səndən başqa əshabının etmədiyi dörd şeyi etdiyini gördüm" O: "Ey İbn Cureyc , onlar hansı şeyləridi?" deyə soruşduqda, O belə dedi: "Sənin Kəbənin yalnız iki Yəmən küncünə əl sürtdüyünü, yalnız Sibtiyyə (tüksüz) deyilən ayaqqabını geyindiyini, Sarıya (paltarı) boyadığını və nəhayət Məkkədə olduğunda insanlar Hilalı gürdüklərində təlbiyə edərkən sənin Təlviyə (Zil Hiccə ayının səkkizi) təlbiyə etdiyini görmüşəm." İbn Ömər (Allah ondan razı olsun) belə cavab verdi: "Amma , Kəbənin künclərinə əl sürtməyə gəlincə , mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu iki Yəmən küncündən başqasına əl sürtdüyünü görməmişəm. Sibtiiyə ayaqqablarına gəlincə isə , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tüksüz ayaqqabı geyindiyini və onunla dəstəmaz aldığını görmüşəm və onu geyməyi sevirəm.

Amma Sarıya boyanmağa gəlincə isə , Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onunla boyadığını görmüşəm və mən də onunla boyamağı sevirəm. Təlbiyəyə gəlincə isə , mən Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyinə minməyincə təlbiyə etdiyi görməmişəm." (Müslim / 1187).

## On yeddinci fəsil: Həccə Məkkədən təlbiyə etmək.

22- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İfrad Həccinə təlbiyə etdik. Aişə (Allah ondan razı olsun) Umrəyə (təmmətu həcci üçün) təlbiyə etdi. Sərif adlana yerə çatdığımızda heyz oldu. Məkkəyə gəldiyimizdə Kəbəni təvaf edib və Səfa və Mərva (dağları) arasında səy (gedib, gəlmək) etdikdən sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizdən yanında heyvan gətirməyən kimsələrə ehramdan çıxaraq halal olmağını əmr etdi." Biz ondan bizə nəyin halal olduğunu soruşduqda, O: "hər şey" deyə cavab verdi." Və biz qadınlarmızla olduq, ətirlə ətirləndik və paltarlarımızı geydik. Bizimlə Ərafa günü arasında yalnız dörd gecə vardı. Sonra tərviyyə günü təlbiyyə etdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Aişənin yanına daxil olduğunda onun ağladığını gördü və ondan: "Sənə nə olub" deyə soruşdu? O belə cavab verdi: "Mən heyz olmuşam insanlar təlbiyə edib ehrama girirlər mən isə təlbiyə edə bilmirəm. Mən Kəbəni hələ tavaf etməmişəm. İnsanlar isə Həccə gedirlər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu Allah Təalanın bütün Adəm qızlarına yazdığı bir işdir. Qüsl al və Həccə təlbiyə (niyyət) et." O belə etdi və Ərafada da durdu. Təmizləndikdə isə Kəbəni tavaf etdi və Səfa və Mərva arasında səy etdi." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ona: "Artıq Həcc və Umrədən halal olaraq ehramdan çıxdın" deyə söylədikdə, Ona belə dedi: "Ey Allahın Elçisi , mən nəfsimdə sanki Həccə girib Kəbəni tavaf etməmiş kimi hiss edirəm" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Abdurrahman , Onu Ümrə etmək üçün Tənimə apar, orada ehrama girsin" deyə buyurdu. Bu onların Həsbə gecəsi (yəni Muhassab adlana yerə gəldikləri gecə) idi." (Müslim / 1213).

## On səkkizinci fəsil: Təlbiyə.

23- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zül Hüleyfə məscidinin yanında miniyinə qalxarkən təlbiyə edər və belə deyərdi: "Ləbbeykə Allahummə həccən; Ləbbeykə Allahummə ləbbeykə. Ləbbeykə lə şəriykə ləkə ləbbeykə. İnnəl-həmdə vən-nemətə ləkə vəl-mulk. Lə şəriykə lək. "(Hüzurundayam! Allahım! Hüzurundayam! Hüzurundayam! Sənin şərikin yoxdur, hüzurundayam! Həmd Sənədir. Nemət və mülk Sənə məxsusdur. Sənin şərikin yoxdur." Deyirlər ki: "Abdullah İbn Ömər belə deyərdi: "Bu , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təlbiyəsidir." Nəfi Abdullahın buna belə əlavə etdiyini söyləyərdi: "Ləbbeyk! Ləbbeyk! Ləbbeyk! və Səadeykə vəl Xeyru bi yədeykə və Rağbəu iləykə vəl Əməl." Hüzurundayam! Hüzurundayam! Hüzurundayam! Əmrindəyəm! Xeyr sənin əlindədir. Dilək və əməl sənədir." (Müslim / 1184).

## On doqquzuncu fəsil: Ümrə və həcc üçün təlbiyə.

24-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Ləbbeykə Həccən və Umratən! Ləbbeyk Həccən və Umratən” deyərək bunların iksinə bir yerdə təlbiyə etdiyini eşitdim” (Müslim / 1251).

25-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Nəfsim əlində olana and olsun ki, Məryəm oğlu Həcc, Ümrə və ya hər ikisi birdən etmək üçün Fəcc ər-rəvhə adlanan yerdən təlbiyə edəcəkdir.” (Müslim / 1252).

## İyirminci fəsil: İfrad həcci.

26-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İfrad Həccinə Təlbiyə etdik.” Başqa bir rəvayətdə isə: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İfrad həccinə təlbiyə etdi.” (Müslim / 1231).

27-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İfrad həccinə təlbiyə etdi.” (Müslim /1211).

## İyirmi birinci fəsil: Həcc və Ümrəni Qiran (ehramdan çıxmadan bir yerdə) etmək.

28- Bakr ibn Abdullah Ənəs ibn Məlikin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həcc və Ümrəyə ikisini də birgə təlbiyə etdiyini eşitdim.” Bakr belə demişdir: “Mən bunu İbn Ömərə danışdığımda O: “yalnız Həccə təlbiyə etdi” deyə buyurdu. Ənəslə qarşılaşıb ona İbn Ömərin dediklərini xəbər verdiyimdə , belə dedi: “Siz bizi uşaq sayırsınız . Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) “Ləbbeykə Haccən və Umratən” dediyini eşitdim.” (Müslim / 1232).

## İyirmi ikinci fəsil: Təməttü (umrədən sonra həccə kimi ehramdan çıxdıqda hər şeyin halal olması) Həcci.

29-İmran ibn Huseyn (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə təməttü etdik. Bu haqda Quran nazil olmadı. Yalnız bir kişi Allahın izniylə öz rəyini söylədi.” (Müslim / 1226).

30-İmran ibn Huseyn (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Təməttü etdi biz də onunla birqə təməttü etdik.” (Müslim\1226).

31-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həccə “Ləbbeyk Allahummə Həccən” deyərək gəldik. Bizə onu umrəyə çevirməyimizi əmr etdi.” (Müslim / 1216).

## İyirmi üçüncü fəsil: Yanında qurbanlıq heyvanı olan kimsənin Həccə təlbiyə etməsi.

32-Musa ibn Nəfi belə rəvayət edir: “Məkkəyə Təməttü həccinə niyət edərək Tərviyə gününə dörd gün qalmış ümrə etmək üçün gəldim. İnsanlar mənə Həccimin Məkkə əhlinin Həcci kimi olacağını söylədikdə, Ata ibn Əbu Rabahın yanına daxil oldum

və ondan bu haqda mənə fitva verməsini istədim. O belə buyurdu: “Cabir ibn Abdullah əl-Ənsari mənə belə rəvayət etdi: “O (Allah ondan razı olsun) Özü ilə Heyvan apardığı il Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həcc etdi. Onlar İfrad həccinə təlbiyə etdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: “Kəbəni təvaf, Səfa və Mərvanı səy edtikdən sonra saçınızı qısaldıb ehramdan çıxın və Tərviyə gününə kimi Hallal olaraq qalın və Tərviyə günü Həccə təlbiyə edin! Həcc üçün etdiyinizi (niyyəti) Təməttü edin” deyə buyurdu. Onlar: “Onu necə Təməttü edək, axı biz onu Həcc deyə səsləndirmişik?”deyə soruşduqda , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Sizə əmr etdiyimi edin. Əgər mən özümlə qurbanlıq heyvan gətirmiş olmasaydım , mən də sizə əmr etdiyim kimi edərdim. Lakin mənə ehramda haram olan şeylər , qurban yerinə çatana kimi halal olmaz.” onlar onun əmr etdiyi kimi etdilər.” (Müslim /1216).

## İyirmi dördüncü fəsil: Ehramdan çıxmağın hökmünün ləğvi və Həccin tamamlanmasının əmri.

33-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Batha adlanan yerdə dincəlmək üçün dayandıqda yanına gəldim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən: «Hansı Həccə təlbiyə etdin» deyə soruşdu? Mən: «Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təlbiyə etdiyinə təlbiyə etdim» deyə cavab verdikdə, belə soruşdu: «Özünlə qurbanlıq nəsə bir heyvan gətirmisən?» Mən: «Xeyr» deyə cavab verdikdə belə buyurdu: «Kəbəni Tavaf et, Səfa və Mərva asarsında səy et və ehramdan çıx!» Mən kəbəni Tavaf, Səfa və Mərvanı səy etdikdən sonra , qövmümdən olan qadının yanına gəldim , başımı daradı və mən başımı yudum.» Mən Əbu Bəkrin və Ömərin xilafətində insanlara bu fitvanı verirdim.» Həcc mövsümündə yanıma bir kişi gələrək mənə: «Sən Möminlərin Əmirinin Həcc ehkamlarını nə etdiyini bilirsənmi?” deyə şikayət etdiyində, belə deyirdim: «Ey insanlar , bir kimsəyə bir şeyi fitva verdiyində tələsməsin , sizin yanınıza gələn möminlərin əmiridir , onun etdiyinə tabe olun. O gəldiyində ondan: «Ey möminlərin əmiri , Həccin ehkamlarına nə etmisən?» deyə soruşdum . O belə cavab verdi: «Biz onu Allahın kitabından götürürük. Allah təala buyurur: «Allahdan ötrü həcc və ümrə (kiçik həcc) əməllərini tam yerinə yetirin» həmçinin onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sünnətindən götürürük. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurur: «Qurbanı kəsməyincə , ehramdan çıxmayın.» (Müslim/1221).

34-Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: «Təmmətu Həcci Muhəmmədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əshabına xas idi.» (Müslim /1224).

## İyirmi beşinci fəsil: Qiran Həccində Qurbanlıq heyvan haqda.

35-Nafi belə rəvayər edir: «İbn Ömər (Allah onların hər ikisindən razı olsun) fitnə (Həccacın Abdulla ibn Zubeyri öldürmək üçün Məkkəyə gəldiyi il) baş verən ildə Ümrəyə çıxdıqda belə dedi: “Əgər Kəbəyə daxil olmaq mümkün olmazsa Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etdiyi kimi edəcəm.» Və çıxaraq Ümrəyə təlbiyə etdi. Beyda adlanan yerə çatdığında əshabına təraf çevrilərək belə dedi: «Bunların ikisinin hökmü birdir. Sizi Şahid

qılıram ki, Mən Ümrə və Həccə niyyət etdim.» Sonra gəlib Kəbəyə çatdığında Onu yeddi kərə tavaf etdi və Səfa və Mərva arasında yeddi dəfə səy etdi. Və bunun ona kifayət edəcəyini görüb ona əlavə etmədi. Və Qurbanını kəsdi.» (Müslim / 1230).

## İyirmi altıncı fəsil: Təməttu Həccində Qurban kəsmək.

36-Səlim ibn Abdullah belə rəvayət edir: "Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə demişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Vida Həccində Ümrədən Həccə təməttü etdi və qurbanlıq heyvanını kəsdi. Qurbanlıq heyvanı özü ilə Zül Hüleyfədən sürərək gətirmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birinci ümrəyə başlayaraq təlbiyə etdi sonra isə Həccə təlbiyə etdi. İnsanlar da Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Ümrədən təməttü edərək Həcc etdilər. İnsanlardan bəziləri özlərilə qurbanlıq heyvanlarını gətirdilər. Bəziləri isə gətirmədilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkəyə gəldikdə insalara belə dedi: "Sizdən kim qurbanlıq heyvanı gətiribsə, ehramda ona haram olan şeylər Həcci tam bitirənə kimi hallal olmaz. Sizdən kim qurbanliq heyvanı gətirməyibsə, Evi (Kəbəni) tavaf etsin, Səfa və Mərva arasında səy etsin və saçını qısaldıb ehramdan çıxsın. Sonra isə Həccə təlbiyə edib qurban kəssin. Qurban kəsə bilməyən üç gün Həcc ərəfəsində və yeddi gün də əhlinə döndükdə oruc tutsun. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkəyə çatdıqda Kəbəni Tavaf etdi. Birinci olaraq qara daşa əl sürtdü sonra iri adımlarla yavaşca qaçaraq yeddinin üç dövrəsini tavaf etdi və dördünü isə gəzərək tavaf etdi. Tavafı bitirdikdən sonra İbrahim məqamında iki rükət namaz qıldı. Salam verərək , çıxıb Səfaya gəldi. Səfa və Mərva arasında yeddi dəfə tavaf etdi. Sonra isə ehramda ona haram olan şeylər Həcci tam bitirənə kimi halal olmadan ehramdan çıxmadı. Qurbanını qurban bayramı günü kəsdi. Kəbəyə gəlib İfada (Ziyarət) tavafını etdi. Sonra ona haram olan şeylər halal oldu və ehramdan çıxdı. İnsanlardan özü ilə qurbanını gətirən kimsələr də Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etdiyi kimi etdilər." (Müslim / 1227).

## İyirmi yeddinci fəsil: Həcci Ümrəyə çevirmək.

37-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Vəda Həccinə çıxmışdıq. Bizdən bəziləri Ümrəyə təlbiyə, bəziləri isə Həccə təlbiyə etmişdi. Məkkəyə gəldiyimizdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hər kim Umrə niyyəti ilə ehrama girmişdirsə və Qurbanlıq heyvanı yoxdursa , ehramından çıxsın. Və hər kim Ümrə niyyəti ilə ehrama giribsə və özü ilə Qurbanlıq heyvan gətiribsə , onu kəsməyincəyə kimi ehramından çıxmasın. Və hər kim Həccə təlbiyə etmişsə Həccini tamamlasın." Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Mən Ərafa gününə kimi Heyizli qaldığım üçün ancaq ümrəyə təlbiyə etmişdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə saçımı açıb daramağımı və ümrəni tərk edərək Həccə təlbiyə etməyimi əmr etdi. Mən onun dediyi kimi etdim. Həcci bitirdikdə , Abdurahman ibn Əbu Bəkri mənimlə göndərərək, Tənimdən Həcc girdiyində edə bilmədiyim Ümrənin əvəzinə Ümrə etmək üçün ehrama girməmi əmr etdi." (Müslim / 1211),

## İyirmi səkkizinci fəsil: Həcc və ümrəyə ehrama girərkən şərt qoymaq.

38-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Dubəət bintu əz-Zubeyr ibn Abd əl-Muttalib Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə soruşdu: "Mən ağır bir qadınam və Həccə getmək istəyirəm , mənə nə əmr edərsən?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurudu: "Həccə niyyət et və aciz qaldığın yerdə ehramdan çıxacağına şərt kəs." Hədisi rəvayət edən belə demişdir: "O, Həccə çatdı." (Müslim / 1208).

## İyirmi doqquzuncu fəsil: Ehrama girən kimsənin əynində ətir izi olan əba geyməsi.

39-Yəələ ibn Munəyyətə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Cirанə adlanan yerdə ikən əynində ətir izi olan və ya sarıya boyanmış əba geymiş bir kişi onun yanına gəldi və belə soruşdu: "Mənə Ümrəmdə nə etməmi əmr edirsən?" Bu an Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəhy nazil oldu və onun üzərini paltarla örtdülər. Yəələ belə deyirdi: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəhy nazil olduğunda ona baxmağı cox istəyirdim." Ona: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  vəhy edildiyində ona baxmaq səni sevindirərmi?" deyə soruşuldu və ona paltarın bir tərəfi qaldırıldı. Yəələ belə dedi: “Mən ona baxdığımda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xorultusu eşidilirdi. (Ravi belə demişdir: "onun belə dediyini hesab edirəm”) Sanki gənc dəvənin xorultusuna bənzəyirdi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərindən vəhyin təsiri getdiyində: "Ümrə haqqında soruşan kim idi" deyə soruşdu və belə dedi: "Sarı boyanın izini yu!” Və ya belə dedi: "ətirin izini sil və əbanı çıxart sonra Həccdə etdiyin kimi Ümrəndə də eyni ilə et" deyə buyurdu." (Müslim /1180).

## Otuzuncu fəsil: Ehrama girən kəsə geyinməsi qadağan olan şeylər.

40-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ehrama girən kəsin hansı paltarları geyə biləcəyi haqda soruşdu? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ehrama girən kəs köynəklər, əmmamələr, şalvarlar, başlıqlı paltarlar, xoflar (dəri corablar) geyinə bilməz. Yalnız ayağına geyməyə bir şey tapmayan kəs xof geysin və onun topuqdan aşaqı hisəsəindən kəssin! Zəfəran və sarıya boyamaq üçün işlədilən xoş ətirli Varas bitkisi boyanmış paltarlardan heç bir şey geyməsin." (Müslim / 1177).

41-İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  xütbə verərkən belə dediyini eşitdim: "Şalvar geyəməyə izar, Xof isə geyməyə ayaqqabı tapmayan üçündür." Yəni Ehramda olan kəs üçün." (Müslim / 1178).

## Otuz birinci fəsil: Ehramda olan kəsin ov etməsi.

42-əs-Saab ibn Cəssəmə əl-Leysi (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Əbvədə və ya Vaddan adlanan yerdə ikən Vəhşi bir Eşşəyi hədiyyə etdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu qəbul etmədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzümdəki kədəri gördükdə, belə buyurdu: "Bizim onu rədd etməmiz yalnız ehramda olduğumuzdan dolayı idi." (Müslim /1193).

43- Tavus (Allah ona rəhmət etsin) İbn Abbasdan (Allah ondan razı olsun) belə rəvayət edir: "Zeyd ibn Arqam gəldiyində , Abullah ibn Abbas ona xatırlatmaq istəyərək belə dedi: "Mənə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ehramda ikən ov ətinin hədiyyə etdiyini necə xəbər verdin?" O belə cavab verdi: "Ona ov ətindən bir parça hədiyyə olundu və onu rədd edərək belə buyurdu: "Biz onu yemirik! Biz ehramdayıq!" (Müslim/1195).

## Otuz ikinci fəsil: Ehramda olan kəs üçün eharama girməyən kəsin, ov etməsi.

44- Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həccə çıxdı. Biz də onunla birgə Həccə çıxdıq. İçlərində Əbu Qatədə olmaqla bəzi əshabələrini ayıraraq onlara belə dedi: "Dənizin Sahili ilə mənimlə qarşılaşana kimi gedin!" Onlar dənizin sahili ilə getməyə başladılar. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qabaq ayrılınca Əbu Qətadədən başqa hamısı ehrama girdi. O , ehrama girmədi. Onlar yollarına davam etdiklərində , birdən vəhşi eşşəklər gördülər. Əbu Qatədə onların üzərinə hücüm edərək onlardan dişi bir eşşəyi ovladı. Onlar enərək onun ətindən yedilər. Sonra isə: "Biz ehramda ikən ət yedik "deyə söylənərək ətin qalanın özləri ilə götürdülər. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldikdə ona belə dedilər: "Ey Allahın Elçisi , biz ehramda idik, Əbu Qatədə isə ehrama girməmişdi. Birdən vəhşi eşşəklər gördük. Əbu Qatədə onların üzərinə hücüm edərək onlardan dişi bir eşşəyi ovladı. Enərək onun ətindən yedik. Sonra isə ehramda ikən ov əti yediymizi düşündük və qalan hissəsini özümüzlə gətirdik." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sizdən kimsə ona bunu əmr və ya işarə etdi?" deyə onlardan soruşdu? Onlar: "Xeyr" deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ondan qalan əti də yeyin" deyə buyurdu.." (Müslim / 1196).

## Otuz üçüncü fəsil: Ehramda olan kimsənin öldürməsi caiz olan heyvanlar.

45-Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Beş fasiq (pis) şey vardır ki , bunları Ehramda da, halal olanda da (ehramda olmayanda) öldürmək olar: "İlan, ala qarğa, siçan, yırtıcı (vəhşi) it, çalağan." (Müslim / 1198).

46-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Beş şey vardır ki, onları Ehramda da, halal olanda da öldürməkdə bir günah olmaz: "Siçan, əqrəb, qarğa, çalağan və yırtıcı (vəhşi) it." (Müslim / 1199).

## Otuz dördüncü fəsil: Ehramda olan kəsin qan aldırması.

47-İbn Buheynə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkə yolunda ehramda ikən başının ortasından qan aldırdı." (Müslim / 1203).

## Otuz beşinci fəsil: Ehramda olan kimsənin gözlərini dərmanla müalicə etməsi.

48-Nubeyh ibn Vahb belə rəvayət edir: "Əban ibn Osmanla çıxmışdıq. Mələl adlanan yerə çatdıqda Ömər ibn Abeydullah (Allah ondan razı olsun) gözlərindən şikayət etdi. Ravha adlana yerə çatdıqda ağrıları şiddətləndi. O , bu haqda soruşmaq üçün Əbən ibn Osmanın yanına adam göndərdi. O cavab olaraq Sabr adlı acı dərmanı

qözlərinə sürt deməsi üçün adam yolladı və belə buyurdu: "Osman (Allah ondan razı olsun) Peyğəmbərdən belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ehramda olan bir kəs gözlərindən şikayət etdikdə , onlara Sabr adlı acı dərmanı sürtərdi." (Müslim / 1204).

## Otuz altıncı fəsil: Ehramda olan bir kəsin başını yuması.

49- Abdullah ibn Huneyn, Abdullah ibn Abbasdan və əl-Misvar ibn Maxramdan (Allah onlardan razı olsun) belə rəvayət edir: "Onlar əl-Əbva deyilən yerdə ixtilaf etdilər. Abdullah ibn Abbas Ehramda olan kəsin başını yuya bilməsini, əl-Misvar “Ehramda olan kəs başını yuya bilməz" deyirdi. İbn Abbas məni Abu Eyyub əl-Ansarinin yanına ondan bu haqda soruşmam üçün göndərdi. Onu paltarla örtülərək , quyunun iki dirəyi arasında yuyunarkən , tapdım. Ona salam verdiyimdə: "Kimsən?" deyə soruşdu Mən: "Abdullah ibn Huneynəm.Məni Abdullah ibn Abbas səndən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ehramda ikən başını necə yuduğu haqda soruşmam üçün göndərib." Əbu Eyyub əlini paltarın üzərinə qoyub onu başı görünənə kimi aşağı saldı. Sonra su tökənə: "Su tök" deyə buyurdu. Başına su tökdü. Sonra onu əlilərini başının arxasına , qabağına çəkərək ovaladı. Sonra isə belə dedi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə etdiyini gördüm." (Müslim / 1205).

## Otuz yeddinci fəsil: Ehramda olan kəsin fidyə verməsi.

50- Abdullah ibn Maaqil belə rəvayət edir: "Kaab (Allah ondan razı olsun) məsciddə ikən onun yanına oturdum. Və ondan bu ayə haqda soruşdum: "Fidyə olaraq (üç gün) oruc tutmalı və ya sədəqə verməli, yaxud da bir qurban kəsməlidir." Kaab belə cavab verdi: "Bu ayə mənə görə nazil olub. Başımdan əziyyət çəkirdim. Bit başımdan üzümə tökülən vəziyyətdə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına aparıldım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sənin əziyətinin bu dərəcəyə gəlib çatacağını zənn etməzdim.” Sonra isə: “Qoyunun varmı?” deyə soruşdu. Mən: "Xeyr" deyə cavab verdiyimdə , bu ayə nazil oldu: "Fidyə olaraq (üç gün) oruc tutmalı və ya sədəqə verməli, yaxud da bir qurban kəsməlidir." Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə : "Üç gün oruc tut və ya altı kasıbı , hər kasıba yarım Saa (1 Saa=2.5kq) miqdarında , yeməklə doydur." deyə buyurdu." Sonra Kaab belə dedi: "Bu mənə xas olaraq nazil olmuşdur, ümumən sizədə aiddir." (Müslim / 1201).

## Otuz səkkizinci fəsil: Ehramda olan kəs öldüyündə (onunla) nə etməli.

51- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Bir kişi dəvəsinin üzərindən yıxıldı və boynu sınaraq öldü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onu su və sidirlə yuyun və ehram paltarıyla kəfənləyin, başını örtməyin, çünki Allah Təala onu qiyamət günü təlbiyə edərək dirildəcəkdir." (Müslim / 1206).

## Otuz doqquzuncu fəsil: zu-Tuva (Məkkə yaxınlığında) adlanan yerdə gecələmək və Məkkəyə daxil olmadan öncə Qüsul (yuyunmaq) almaq.

52- Nəfi belə rəvayət edir: "İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Məkkəyə gəldiyi hər dəfəsində səhərə kimi zu-Tuva (Məkkə yaxınlığında) adlanan yerdə

geceləyər və qüsul alar. Sonra günorta Məkkəyə daxil olardı və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə etdiyini söyləyərdi." (Müslim / 1259).

### Qırxıncı fəsil: Məkkə və Mədinəyə bir yolla daxil olub, başqa bir yolla çıxmaq.

53- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (Mədinədən) çıxdıqda ağac (Zül Hüleyfə) olan yoldan çıxar, daxil olduğunda isə əl-Muarris adlanan yerdən daxil olardı. Məkkəyə daxil olduqda əs-Sənəyə əl-Ulyə adlanan yerdən (Məkkənin yuxarısından) daxil olar, çıxdıqda isə əs-Sənəyə əs-Suflə adlanan (Məkkənin aşağısından) çıxardı." (Müslim / 1257).

### Qırx birinci fəsil: Həcc etmək istəyənin Məkkəyə enməsi.

54-Üsamə ibn Zeyd ibn Harisə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdum: "Ey Allahın Elçisi , Məkkədəki evinə enəcəksən?" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "Məgərə Aqil bizə bir ev, yer qoydu ki?" Aqil və Talib Abu Talibin varisləri idi. Cəfər və Əli isə onun mirasından müsəlman olduqları üçün pay almamışdılar. Aqil və Talib isə kafir idilər." (Müslim / 1351).

### Qirx ikinci fəsil: Tavafda və Səydə iti addımlarla yürümək (qaçmaq).

55- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həcc və Ümrədə tavaf etdikdə birinci tavafında Evi (Kəbəni) üç tavafını iti addımlarla yürüyərək, qalan dördünü isə gəzərək tavaf edərdi. Sonra iki rükət namaz qılar, sonra isə Safa və Mərva arasında səy edərdi.” (Müslim / 1261).

56-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qara daşdan başlayaraq yenə Qara daşa çatana kimi Tavafın üç dövrəsini qaçaraq etdiyini gördüm." ( Müslim / 1363).

57-Əbu Tufeyl belə rəvayət edir: "İbn Abbasa (Allah onların hər ikisindən razı olsun) belə dedim: "Evin (Kəbənin) ətrafında üç dövrəni iti addımlarla, dördünü isə gəzərək tavaf etməyi sünnədən olduğunu görürsənmi? Çünki qövmün onun sünnə olduğunu iddia edir." O belə cavab verdi: "Onlar həm düz həm də yalan dedilər." Mən ondan: "Sənin "Onlar həm düz həm də yalan dedilər." deməyin nə deməkdir?" deyə soruşduqda, O belə cavab verdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkəyə gəldikdə müşrüklər ona paxıllıq edərək: "Muhamməd və əshabı yorulduqları üçün Kəbəni Tavaf edə bilməyəcəklər." Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara Tavafın üç dövrəsini qaçaraq, dördünü isə gəzərək tavaf etmələrini əmr etdi." Sonra mən ona: "Mənə minik üzərində Safa və Mərva arasında Təvaf etmək haqda danış! Bu sünnətdirmi? Çünki qövmün bunun sunnə olduğunu iddia edir. O belə cavab verdi: "Onlar həm düz həm də yalan dedilər." Mən ondan: "sənin "Onlar həm düz həm də yalan dedilər." deməyin nə deməkdir?" deyə soruşduqda, belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına insanlar çox gəlməyə başladı. Onlar "bu Muhəmməddir, bu Muhəmməddir "deyə o qədər danışırdılar ki, hətta həddi buluğa çatmış qızlar da evlərindən çıxdılar. Onun hüzurundan insanlar qovulmazdı (döyülməzdi). Başına çox insan yığışdıqda

miniyinə qalxdı. Amma yürüyərək gəzərək səy etmək daha əfzəldir." (Müslim /1264).

## Qırx üçüncü fəsil: Tavaf zamanı qara daşı öpmək.

58-Abdullah ibn Sarcəs belə rəvayət edir: " Mən Keçəli (Yəni Öməri (Allah ondan razı olsun) qara daşı öpərkən gördüm , belə deyirdi: "And olsun Allaha ki, mən səni öpürəm , lakin bilirəm ki, sən daşsan. Sən nə fayda , nə də zərər verə bilirsən . Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səni öpdüyünü görməsəydim , səni öpməzdim." (Müslim /1270).

## Qırx dördüncü fəsil: Tavafda iki Yəmən küncünə əl sürtmək.

59-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Bu iki yəmən küncünə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl sürtdüyünü gördüyüm andan, çətin və ya rahat olsa belə , ona əl sürtməyi tərk etmədim." (Müslim/ 1268).

60-İbn Abbas :(Allah onların hər ikisindən razı olsun) "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu iki yəmən küncündən başqasına əl sürtdüyünü görmədim." (Müslim / 1268).

## Qırx beşinci fəsil: Minik üzərində tavaf etmək.

61-Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Vida həccində Evi , (Kəbəni) insanlar onu görsün, sual soruşsun deyə, minik üzərində tavaf etdi və qara daşa əsası ilə toxundu. O gün insanlar onun ətrafını sarımışdı." (Müslim /1273).

## Qırx altıncı fəsil: Üzr olduqda minik üzərində tavaf etmək.

62-Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağrayıram deyə şikayətləndim" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "İnsanların arxasında miniklə tavaf et.” deyə buyurdu." Mən Tavafı etdiyimdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Evin (Kəbənin) yanında bu surəni oxuyaraq namaz qılırdı: "And olsun Tur dağına. And olsun yazılmış kitaba." (Müslim / 1276).

## Qırx yeddinci fəsil: Səfa və Mərva arasında səy etmək. Allah Təalə buyurur: "Həqiqətən, Səfa və Mərva Allahın əlamətlərindəndir"

63-Urva belə rəvayət edir: "Aişəyə (Allah ondan razı olsun) belə dedim: "Mən Səfa ilə Mərva arasında tavaf etməməyimi günah saymıram." O məndən: "Nə üçün?" deyə soruşduqda, belə dedim: "Çünki Allah Təala belə buyurur: "Həqiqətən, Səfa və Mərva Allahın əlamətlərindəndir" O (Allah ondan razı olsun) belə buyurdu: "Sənin dediyin kimi olsa idi , onda belə deyərdi: "Bunları təvaf etməməsində (ətrafına dolanmasında) heç bir günah yoxdur" Bu ayə Ənsarlardan olan bir neçə insana görə nazil olmuşdur. Onlar cahillikdə təlbiyə etdiklərində Mənat (büt adı) üçün təlbiyə edərdilər və Səfa və Mərvanı tavaf etmək halal olmazdı. Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həccə gəldiklərində bunu ona

xatırlatdılar. Və Allah Təala bu ayəni nazil etdi. Ömrüm Allaha and verirəm ki, Səfa və Mərva arasında səy etməyənin Həccini Allah Təala tam saymaz (qəbul etməz)." Başqa bir rəvayətdə isə belə deyilir: "Səfa və Mərva arasında səy etməyənin Həccini , nə də Ümrəsini Allah Təala tam saymaz (qəbul etməz)." (Müslim/1277).

### Qırx səkkizinci fəsil: Səfa və Mərva arasında yeddi dəfə səyin bir dəfəyə edilməsi.

64- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və səhabələri Səfa və Mərva arasında bir dəfədən çox səy etmədilər." (Müslim / 1279).

### Qırx doqquzuncu fəsil: Həccə niyyət edərək ehrama girən kəsin Məkkəyə gəldikdən sonra Tavaf və Səy kimi etməsi lazım olan əməllər.

65- Vabra belə rəvayət edir: "İbn Ömərin (Allah onların hər ikisindən razı olsun) yanında oturmuşdum. Yanına bir kişi gələrək belə soruşdu: "Mən Ərafaya gəlmədən öncə Tavaf edə bilərəm?" O: "Bəli" deyə cavab verdikdə, kişi belə dedi: "İbn Abbas Ərafaya gəlməmiş Tavaf etməməyimi söyləyir" İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həcc etdi və Ərafaya gəlmədən öncə Tavaf etdi. Əgər dediyində sadiqsənsə , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sözünü götürmən daha doğru olar , yoxsa İbn Abbasın?" Başqa bir rəvayətdə isə belə deyilir: "Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həccə niyət edərək ehrama girdiyini gördük. Kəbəni Tavaf etdi və Səfa və Mərva arasında səy etdi." (Müslim / 1233).

66-Amr ibn Dinar belə rəvayət edir: "İbn Ömərdən (Allah onların hər ikisindən razı olsun) " bir kişinin ümrəyə gələrək Tavaf edib Səfa və Mərva arasında səy etmədən qadınıyla əlaqəyə girə bilərmi" deyə soruşduq." O belə cavab verdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldiyində Kəbəni yeddi dəfə tavaf etdi, sonra İbrahim məqamının arxasında iki rükət namaz qıldı və Səfa və Mərva arasında yeddi dəfə səy etdi. Sizə Allahın Elçisində gözəl Nümünə (örnək) vardır." (Müslim 1234).

### Əllinci fəsil: Kəbəyə daxil olmaq və orada namaz qılmaq və dua etmək.

67-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkənin fəthi günü Kəbənin önünə gəldi və Osman ibn Talhanın ardınca adam göndərdi. O Kəbənin açarı ilə gələrək qapsını açdı. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), Bilal, Usamə ibn Zeyd və Osman ibn Talha Kəbəyə daxil oldular və əmr etdi qapıları bağladılar. Orada bir müddət qaldılar. Sonra qapılar açıldı. Abdullah belə dedi: "İnsanlardan qabaq özümü ora çatdırdım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) artıq bayıra çıxmışdı və onun arxasınca Bill gəlirdi. Bilaldan: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Kəbənin içində namaz qıldımı?" deyə soruşdum. O: "Bəli" deyə cavab verdikdə, Mən "Harada?" deyə yenidən soruşdum. O belə cavab verdi: "Üzbəüz olan iki dirək arasında". Lakin ondan neçə rukət qıldığı haqda soruşmağı unutdum." (Müslim /1329).

68-İbn Cureyc belə rəvayət edir: Atadan belə soruşdum: "İbn Abbasın (Allah onların hər ikisindən razı olsun) "sizə yalnız onu tavaf etmək əmr olunub onun içinə girmək yox" deməsini eşitmisənmi? " belə cavab verdi: "Onun içinə girməyi

qadağan etmir, lakin onun belə dediyini eşitmişəm: "Usamə ibn Zeyd mənə belə xəbər verdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun içinə daxil olduqda , onun hər bir tərəflərində dua etdi və çıxıncaya kimi orada namaz qılmadı. Çıxdığında isə ona tətrəf namaz qıldı və "Qiblə budur" deyə buyurdu. Mən ondan: "Onun tərəfləri dedikdə küncləri qəsd olunur?" deyə soruşduğda belə dedi: "Xeyr üzbə-üz hər bir tərəfində." (Müslim / 1330).

## Əlli birinci fəsil: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həcci.

69- Cəfər ibn Muhamməd atasından belə rəvayət edir: "Cabir ibn Abdullahın (Allah ondan razı olsun) yanına daxil olduq. İçəri girənlərin kimlər olduğunu soruşdu və nəhayət növbə mənə çatanda, Mən Muhamməd ibn Əli ibn Hüseyn olduğumu söylədikdə, əlini başıma qoydu sonra köynəyimin yuxarı düyməsi, sonra isə aşağı düyməsini açdı və əlini iki sinəmin arasına qoydu. O zaman gənc oğlan idim. Sonra o mənə belə dedi: "Salam olsun sənə , ey qardaşım oğlu , istədiyini soruş. Onun gözləri görmürdü. Mən istədiyimi soruşdum. Sonra namazın vaxtı girdi. Toxunmuş bir paltara sarınaraq namaza qalxdı. Onu hər dəfə çiyninə atdığında , o balaca olduğundan , dala qayıdırdı. Ridası (əbası) yan tərəfində asılqanda asılmışdı. Namazı bizə qıldırdıqdan sonra ona belə dedim: "Mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həcci haqda xəbər ver! O: "Əli ilə doqquz deyə işarə edərək belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) doqquz il gözlədi və Həcc etmədi. Sonra onuncu il insanlara Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həcc edəcəyi xəbəri verildiyində , Mədinəyə çoxlu insan axışdı. Onların hamısı Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) uyaraq onun etdiyi əməli edərək Həcc etmək istəyirdi. Onunla çıxaraq Zul Hüleyfə deyilən yerə gəldik. Əsma bintu Umeyis orada Muhamməd ibn Əbu Bəkri (Allah ondan razı olsun) dünyaya gətirdi və "necə edim" deyə soruşmaq üçün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına adam göndərdi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Yuyun və paltarla bağlan (uyəni bir parça əski ilə qan gələn yeri möhkəmcə bağla) sonra ehrama gir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) orada məsciddə iki rükət namaz qıldıqdan sonra dəvəsi əl-qasvanın tərkinə mindi. Dəvəsi onu Beyda düzünə çıxardıqda , gözüm görəcək uzağlığa qədər baxdığımda , önündə minikdə və piyada olan insanlar vardı. Eyni ilə sağında, solunda və arxasında da insanlar gedirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) aramızda gedir , ona Quran nazil olur. Açıqlamasını da O bilirdi. Etdiyi hər bir əməli biz də etdik. Tövhidlə (Allahı ibadətdə fərdləşdirməklə) təlbiyə etdi: "Ləbbeykə Allahummə ləbbeykə. Ləbbeykə lə şəriykə ləkə ləbbeykə. İnnəl-həmdə vən-nemətə ləkə vəl-mulk. Lə şəriykə lək. " "(Hüzurundayam! Allahım hüzurundayam! Hüzurundayam! Sənin şərikin yoxdur, hüzurundayam! Həmd Sənədir. Nemət və mülk Sənə məxsusdur. Sənin şərikin yoxdur." İnsanlar da niyyət etdikləri Həccə təlbiyə etdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buna görə onlara bir şey demədi. O öz təlbiyəsinə davam etdi. Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə deyir: "Biz yalnız Həccə təlbiyə etmişdik, Ümrəyə təlbiyə etməyi bilmirdik. Ta ki , onunla Evə (Kəbəyə) gəldikdə, qara daşa əl sürtdü , tavafın üç dövrəsini iti adımlarla, dördünü isə gəzərək tavaf etdi. Sonra İbrahim məqamına gəldi və bu ayəni oxudu: "İbrahimin durduğu yeri namazgah edin!". Sonra Məqamı Evlə özü arasında qoyaraq (Atam belə deyirdi, və bunu ancaq Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitmiş olduğuna şübhə

etmirəm.) iki rukət namazı "De: "Ey kafirlər!" və "De: "O Allah birdir" surələrini oxuyaraq qıldı. Sonra qara daşın yanına qələrək ona əl sürtdü və Səfa qapsından (məsciddən) çıxdı. Səfaya gəldikdə bu ayəni oxudu: "Həqiqətən, Səfa və Mərvə Allahın əlamətlərindəndir" Allahın başladığı ilə başlayıram deyib Səfadan başladı və Kəbə görünənə qədər Səfa dağının ətəyinə qalxdı. Qibləyə üzünü tutub Allahı ibadətdə təkləşdirərək Təkbir etdi. Sonra belə dedi: "Lə ilahə İlləl Allah Vahdəhu lə Şərikələh ləhul Mülkü və Ləhul Həmdu Və Huva əla Kulli Şeyin Qadır. Lə ilahə Vahdə Əncazə Vadəhu və Nasarə əbdəhu və Həzəməl Əhzəbə Vəhdəhu." (Allahdan ibadətə layiq başqa məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Mülk onundur və Həmd Onadır. O hər şeyə qadirdir. Allahdan başqa haqq məbud yoxdur, O təkdir, vədini yerinə yetirdi, quluna kömək etdi və düşmən dəstələri məğlub etdi.) Sonra bunun ortasında istədiyi duanı etməklə üç kərə təkrarladı. Sonra Mərvaya tərəf endi, vadinin ortasına çatdıqda qaçaraq səy etdi. Elə ki qalxdıq gəzərək səy etməyə başladı və gəlib Mərvaya çatdı. Mərvada da Səfada etdiyini etdi. Elə ki, Mərvada səyinin sonuna çatdı belə buyurdu: "Keçmişdə etdiyim iş yenidən qarşıma çıxsaydı , heyvanı sürməzdim, və (Həccə təlbiyə əvəzinə) ümrəyə təlbiyə edərdim. Sizlərdən kimin qurbanlıq heyvanı yoxdursa , ehramından çıxsın və həccini ümrəyə çevirsin." Suraq ibn Məlik ibn Cuşam ayağa qalxaraq belə soruşdu: "Ey Allahın Elçisi , bu ilimiz üçündür , yoxsa əbədiyyən belə olacaq?” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) barmaqların bir-birinə birləşdirib belə buyurdu: "Ümrə Həccə daxil oldu, Ümrə Həccə daxil oldu, xeyr , əbədi olaraq davam edəçəkdir.” Bu vaxt Əli Yəməndən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qurbanlıq heyvanları ilə gəldi. Fatimənin (Allah ondan razı olsun) ehramdan çıxaraq boyanmış paltar geydiyini və sürmələndiyini gördükdə , ona bunu inkar etdi. Fatimə: "Bunu etməyi mənə atam söyləyib" deyə cavab verdi." Əli İraqda ikən belə deyərdi: "Fatiməni etdiyinə görə danlaması üçün və ondan Fatimənin onun adından dediyi haqda soruşmaq üçün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdim. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənin Ona bunu inkar etdiyimi xəbər verdim." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) : "Düz demişdir, düz demişdir" deyə cavab verdi. Sonra məndən: "Sən Həccə girdiyində nə deyə niyyət etmişdin?" deyə soruşdu. Mən: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etdiyinə niyyət edərək giririəm ehrama" deyə cavab verdikdə, belə buyurdu: "Mənim qurbanlıq heyvanim var , ona görə ehramdan çıxma!" Əlinin Yəməndən gətirdiyi ilə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) özü ilə gətirdiyi qurbanlıq heyvanın sayı yüz idi." İnsanlar hamsı saçlarını qısaldaraq ehramdan çıxdılar , yalnız Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və yanlarında heyvan gətirən kimsələr istisna olaraq ehramda qaldılar. Elə ki, Tərviyə (Zül hiccə ayının səkkizinci) günü oldu , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyinə qalxdı , onlar həccə niyyət edərək Minaya üz tutdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) orada Zöhr, Əsr, Məğrib, İşa və Sabah namazını qıldı. Sonra günəş doğana kimi bir az oturdu və sonra Nəmira adlanan yerdə çadırının qurulmasını əmr etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yoluna davam etdi. Qüreyş cahillikdə onların dayandığı Məşhər əl-Haram adlı yerdə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dayanacağına heç şübhə etmirdi. Halbu ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) orada durmadan bir başa Ərafata gəldi və artıq çadırının Nəmira adlanan (vadi) yerdə qurulduğunu gördü və orada dayandı. Orada günəş zeniti keçənə qədər qaldı. Sonra əl-Qəsva adlı dəvəsini əmr etdi və onu yəhərlədilər.

Gəlib vadinin ortasına çatdı və insanlara Xütbə verdi və belə buyurdu: "Şübhəsiz qanlarınız və mallarınız bir–birinizə bu şəhəriniz, bu ayınız və bu gününüzün hörməti (haramlığı) kimi haramdı. Diqqət edin , cahillik işlərinə aid hər bir əməl ayağımın altına qoyulmuşdur. Cahilliyə dövründən qalan qan düşməçiliyi yoxdur (qüvvədən düşmüşdür). Və üzərimizdə olan ən birinci düşmənçiliyini ləğv etdiyim İbn Bəni Saad qəbiləsi ilə süd qohumluğu olan Hüzeyl qəbiləsinin öldürdüyü Rabia ibn əl-Həris qanıdır. Cahiliyyə dövründən qalan sələmçilik (faizə pul və mal vermə) yoxdur (qüvvədən düşmüşdür). Və ləğv etdiyim ən birinci sələm Abbas ibn Əbd əl-Muttalibin sələmidir. Bu Sələm yoxdur (qüvvədən düşmüşdür). Qadınlara görə Allahdan qorxun, siz onları Allahın əminliyi ilə aldınız və onları özünüzə Allahın kəliməsi ilə halal qıldınız. Lakin döşəklərinizə sizin istəmədiyiniz bir kimsələrin ayaq basdırmamaları, sizin onların üzərində olan haqqınızdır. Bunu etsələr, onlara zərər verməmək şərti ilə döyün. Onların sizin üzərindəki haqqı isə onları gözəl şəkildə olmaqla yedirməniz və geyindirmənizdir. Sizə özümdən sonra ondan tutunduğunuzda heç vaxt zəlalətə düşməyəcəyiniz bir şey qoyuram: "Allahın kitabını". Mən sizdən dolayı sorğu sual olunacağam. Siz nə deyirsiniz?" Onlar: "Biz Şəhadət edirik ki, Sən catdırmısan, üzərində olanı demisən və nəsihət etmisən." deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şəhadət barmağını səmaya uzatdı və onunla insanlara işarə edərək belə buyurdu: "Allahım , şahid ol, Allahım , şahid ol" deyə bunu üç kərə təkrarladı. Sonra azan verildi və Zöhr namazını qıldı. Sonra qalxaraq Əsr namazını qıldı və onların arasında heç nə qılmadı. Sonra miniyinə minərək Ərafata gəldi. Dəvəsi Əl-Qasvanın qarnını qayalığa söykədi, insanlar cəm olan yeri önünə saldı və qibləyə tərəf üz çevirdi. Ta gün batana kimi dayandı. Elə ki, səma qızartısı getdi və gün itdi Usmanı tərkinə aldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yola düşdükdə əl-Qəsvanın (dəvənin) yüyənini o qədər çəkmişdiki az qala dəvənin başı üzəngiyə toxunurdu və sağ əli ilə işarə edərək: "Ey insanlar , sükünətlə, sükunətlə" deyirdi. Qumluğ yerə gəlincə rahat qalxsın deyə dəvənin yüyənni boşaldardı. Nəhayət gəlib Müzdəlifəyə çatdı. Orada Məğrib və İşa namazlarını bir azan və iki iqamə ilə qıldı. Və onların arasında heçnə qılmadı. Sonra uzanaraq Sabah namazına kimi yatdı. Sabah namazının girdiyi bəlli olduqda , Sabah namazını bir azan və bir iqamə ilə qıldı. Sanra əl-Qasvənin tərkinə qalxıb Məşər əl-Haram deyilən yerə gəldi. Qibləyə üzünü çevirib dua etdi. Ona (Allaha) Təkbir (Allahu Əkbər), Təhili (Lə iləhə İlləllallah), etdi və onu ibadətdə fərdləşdirdi. Hava tam işıqlanana kimi dayandı və günəş doğmadan yola düşdü. Fadl ibn Abbassı da öz tərkinə aldı. O gözəl saçlı , ağ , kök bir kişi idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yola düşdükdə , yanından üzərində qadınlar olan qaçan dəvələr keçdi. Fadl onlara baxmağa başladığında Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun uzünü baxmasın deyə əli ilə tutdu. Fadl yenidən üzünü çevrib baxmağa başladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə əlini onun üzünə qoydu. Fadl yenə üzünü çevirib baxırdı. Nəhayət Muhassır adlanan vadinin ortasına çatanda bir az sürətlə hərəkət etməyə başladı , sonra Böyük Cəmaraya (onuncü gün daşlanal Böyük Cəmara və ya Cəməratul Aqabə) çıxan orta yolu tutdu. Nəhayət ağacın yanında olan Cəmaraya çatdı və ona yeddi daş atdı. Atdığı daşlar kiçik idi və hər daşı atdığında təkbir etdi. Daşları vadinin ortasından atdı. Sonra qurban kəsilən yerə gəldi və altımış üç qurbanı öz əli ilə kəsdi. Yüz qurbandan qalan digər qurbanları kəsməsi üçün Əliyə verdi və Onu özünə şərik etdi. Sonra hər qurbandan bir parça qazana qoyduraraq bişitdirdi və ətindən yeyib yeməyin suyundan içdi. Sonra miniyinə qalxaraq Evə (Kəbəyə) endi. Məkkədə Zöhr namazını qıldı. Bəni Əbd əl-Muttalib Zəmzəm suyu insanlara paylamağa başladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və

salamı olsun) onlara belə buyurdu: "Suyu çıxarın , başqalarının bunu sizin əlinizdən alacağından qorxmasaydım , sizinlə birgə çıxarardım." Sonra ona bir qab su verildi və ondan içdi." (Müslim /1218).

## Əlli ikinci fəsil: Minadan Ərafata gedərkən Təlbiyə və Təkbir etmək.

70- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Minadan Ərafata getdik. Bizdən bəziləri Təlbiyə edir, bəziləri isə Təkbir edirdi." (Müslim / 1284).

71- Muhammad ibn Əbi Bəkr əs-Səqafi (Allah ondan razı olsun) belə rəvayət edir: "O Ənəs ibn Məliklə (Allah ondan razı olsun) Minadan Ərafata getdiyinidə ondan belə soruşdu: "Bu gündə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) necə edirdiniz? O belə cavab verdi: "Bizdən bəzilləri Təlbiyə edir , ona bu inkar edilmirdi. Bəziləri isə Təkbir edir , ona bu inkar olunmurdu." (Müslim / 1285).

## Əlli üçüncü fəsil: Ərafatda dayanmaq. Allah Təala buyurur: "Sonra camaatın döndüyü yerdən siz də dönün!"

72- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Qureyş və onların dinində olanlar Müzdəlifədə dayanardılar. Özlərininə əl-Humus deyirdilər. Başqa ərəblər isə Ərafata gedirdilər. İslam dini gəldiyində , Allah Təala Peyğəmbərinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ərafata gəlməsini və orada dayanmasını sonra isə oradan dönməsini (getməsini) əmr etdi. Bu , AllahTəlalanın buyurduğudur: "Sonra camaatın döndüyü yerdən siz də dönün!" (Müslim/1219).

73- Cubeyr ibn Mutim (Allah ondan razı olsun) belə rəvayət edir: " Dəvəmi itirmişdim. Ərafat günü onu axtarmağa getdiyimdə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlarla Ərafatda durduğunu gördüm. (Təəccüb edərək) belə dedim: "And olsun Allaha ki, bu (Peyğəmbər) əl-Humus adlanan kəslərdəndi. Bubun burada nə işi var." O zaman Qureyş əl-Humus adlanan kəslərdən sayılırdı." (Müslim / 1220).

## Əlli dördüncü fəsil: Ərafatdan çıxmaq və Müzdəlifədə namaz haqda.

74- Kureyb belə rəvayət edir: "O Üsamə ibn Zeyddən (Allah ondan razı olsun) belə soruşdu: "Siz Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ərafat axşamı miniyinin tərkinə mindiyində nə etdiniz?" O belə cavab verdi: "İnsanların Məğrib namazı üçün dəvələrini çökdürdükləri dağ yoluna gəlib çatdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəvəsini çökdürüb kiçik ehtiyacından dolayı ayaq yoluna çıxdı. (su tökməyi zikr etmədi) Sonra gəldiyində dəstəmaz almaq üçün su istədi və xəfif bir dəstəmaz aldı. Mən ona: "Ey Allahın Elçisi , haydı namaza" deyə söylədikdə, belə buyurdu: "Namazı qabağda qılacağıq". Sonra miniyinə minərək Müzdəlifəyə gəldi və Məğrib namazını qıldı. Sonra insanlar dəvələrini cökdürdülər və dəvələrinin yükünü gecələdiyi yerə sərmək üçün açmamış , sonuncu namazı , İşa namazını qıldırdı. Sonra onlar dəvələrinin yükünü açdılar." Mən ondan: "Sabahladığınız zaman nə etdiniz?" deyə soruşdum. O belə cavab verdi: "Fadl ibn Abbası tərkinə aldı. Mən isə Qüreyşin öndə gedənləri ilə piyada getdim." (Müslim / 1280).

## Əlli beşinci fəsil: Ərafadan çıxdıqda necə getməyin vəsfi.

75- Urva belə rəvayət edir: "Üsamədən (və ya Üsamə ibn Zeydən soruşdum) belə soruşulduğuna şahid oldum: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ərafatdan çıxdığında necə gedərdi?" O belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gedərkən bir az sürətlə gedərdi. Boş meydan olduqda isə sürəti artırardı." (Müslim / 1286).

## Əlli altıncı fəsil: Məğrib və İşa namazların Müzdəlifədə qılmaq.

76- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məğrib və İşa namazlarını Müzdəlifədə cəm etdi və onlar arasında nafilə qılmadı. Məğrib namazını üç, İşa namazını iki rükət qıldı." Abdullah da (Allah ondan razı olsun) Allaha qovuşana kim belə qılırdı." (Müslim / 1288).

## Əlli yeddinci fəsil: Məğrib və İşa namazlarını Müzdəlifədə bir iqamə ilə qılmaq.

77- Səid ibn Cubeyr belə rəvayət edir: "İbn Ömərlə birgə Ərafadan çıxdıqda və Müzdəlifəyə gəldikdə , bizə Məğrib və İşa namazlarını bir iqamə ilə qıldırdı. Sonra çevrilib belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu yerdə bizə namazı belə qıldırdı" (Müslim / 1288).

## Əlli səkkizinci fəsil: Müzdəlifədə Sübhi toran vaxtı qılmaq.

78- Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki namaz istisna , hər hansı bir namazı öz vaxtından başqa bir vaxtda qıldığını görmədim. Məğrib və İşa namazlarını cəm edərək və Sübh namzını o gün vaxtından əvvəl qıldı." (Müslim / 1288).

## Əlli doqquzuncu fəsil: Müzdəlifədən qadın və zəiflərin gecə çıxması.

79- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Sövda Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Müzdəlifə gecəsi ondan və insanların çıxmasından qabaq çıxmağa izin istədi. O , ağır hərəkət edən bir qadın idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona izn verdi və o , ondan qabaq çıxdı. Biz isə Səhərə kimi qaldıq və onunla birgə çıxdıq. Mənin ondan Södanın izn istəməsi kimi izin istəyərək çıxmağım mənim üçün sevinəcəyim hər bir şeydən yaxşı olardı." (Müslim /1290).

## Altımışıncı fəsil: Müzdəlifədən Qadınların insanlardan öncə çıxarılması.

80- Əsmanın (Allah ondan razı olsun) mövlası olan Abdullah belə rəvayət edir: "Əsma (Allah ondan razı olsun) Müzdəlifə sahəsində ikən məndən: "Ay batdımı?" deyə soruşdu . Mən : "Xeyr" deyə cavab verdikdə, bir saat (vaxt) namaz qıldı , sonra isə: "Ey oğlum , Ay batdımı?" deyə yenə soruşdu. Mən "Bəli" deyə cavab verdikdə, belə buyurdu: "Məni apar." Onunla gəldik və O Cəmaranı daşladı sonra qalmaq üçün endiyi yerdə namaz qıldı. Mən ona "Ey kəs , namazı toran vaxtı qıldıq." deyə söylədikdə, O belə buyurdu: "Xeyr , oğlum , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlara bunu izn vermişdir." (Müslim/1291).

## Altımış birinci fəsil: Müzdəlifədən zəiflərin insanlardan öncə çıxarılması.

81-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni ağır yük və ya zəiflərlə birgə gecə Müzdəlifədən göndərdi." (Müslim / 1293).

82-Səlim ibn Abdullah belə rəvayət edir: "Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) ailəsindən olan zəifləri insanlardan öncə yola salardı. Gecə Məşər əl-Haramda dayanar , Allahı bacardıqları kimi zikr etdikdən sonra , İmam qalxıb yola düşməmiş , yola düşərdilər. Onlardan bəziləri Minaya Sabah namazından öncə, bəziləri isə namazdan sonra çatardı. Gəldiklərində Cəmaranı daşlayardılar. İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə deyərdi: "Onlara Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) izn vermişdir." (Müslim / 1295).

## Altımış ikinci fəsil: Cəmərətu əl-Aqəbəni daşlayana kimi təlbiyə etməyi davam etmək.

83-Əata (Allah ona rəhmət etsin) İbn Abbasdan (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Fadlı Müzdəlifədən çıxarkən tərkinə aldı." İbn Abbas mənə Fadlın Ona belə xəbər verdiyini danışdı: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cəmərətu əl-Aqəbəni daşlayana kimi təlbiyə etməyi davam etdi." (Müslim / 1281).

## Altımış üçüncü fəsil: Cəmərətu əl-Aqəbənini vadinin ortasından daşlamaq və daşı atarkən Təkbir gətirmək.

84-əl-Əməş belə rəvayət edir: "Həccac ibn Yusifin minbərdə xütbə verərkən belə dediyini eşitdim: "Quranı Cəbrayıl yazdığı kimi yazın. Hansında ki, İnək zikr edilən surə (əl-Bəqara) , sonra qadınlar zikr edilən surə (ən-Nisə) , sonra isə İmran ailəsi zikr edilən surə (Əli İmran) var." İbrahimlə qarşılaşdığımda ona bunu xəbər verdim. O , onu söydü və belə dedi: "Abdurrahman ibn Yezid Abdullah ibn Məsuddan belə rəvayət edir: “Abdullah ibn Məsudla birgə idik. Cəmərətu əl-Aqəbəyə gələrək onun , vadinin ortasında dayandı. Ona tərəf çevrilərək onu yeddi daşla və hər daşı atarkən Təkbir edərək vadinin ortasından daşladı." Mən ona: "Ey Əbu Abdurrahaman insanlar onu yuxarısından daşlayır" deyə söylədikdə, O belə buyurdu: "Ondan başqa haqq məbud olmayana and olsun ki, bu , ona (Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Bəqarə surəsinin nazil olduğu məqamdır. (yerdir)." (Müslim / 1283).

85-Abdurrahman ibn Yezid belə rəvayət edir: "Abdullah Müzdəlifədən çıxarkən Təlbiyə etdi. "Bu , çöl bədəvi ərəblərindəndir?" deyildiyi eşidincə belə buyurdu: "İnsanlar unudublar , yoxsa zəlalətə düşüblər. Ona əl-Bəqara surəsi nazil olanın bu yerdə belə dediyini eşitmişəm: "Ləbbeyk Allahummə Ləbbeyk." (Müslim / 1296).

## Altımış dördüncü fəsil: Cəmərətu əl-Aqəbənini Qurban bayramı günü minik üzərindən daşlamaq.

86-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qurban bayramı günü minik üzərindən daşladığında belə dediyini gördüm:

"Həccinizin ehkamlarını məndən götürün , çünki mən bu Həcdən sonra gələn il Həcc edəcəyimi bilmirəm." (Müslim / 1297).

## Altımımış beçinci fəsil: Atılan daşların həcmi haqda.

87-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Camaratı xırda noxud dənəsi kimi daşlarla daşladığını gördüm." (Müslim /1299).

## Altımış altıncı fəsil: Daşın atılma vaxtı.

88- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cəmaratu əl-Aqəbəni Qurban bayramı günü Duha (Sabah gün çıxdıqdan sonra) vaxtı, başqa günlər isə günəş zeniti keçdikdən sonra daşladı." (Müslim / 1299).

## Altımış yeddinci fəsil: Cəmaralara daşı daşlar tək sayda olmaqla atmaq.

89-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İsticmarın (Ayaq yoluna çıxdıqdan sonra daşla təmizlənmək) daşlarının sayı tək saydadır. Cəmaralara atılan daşların sayı tək saydadır. Səfa və Mərva arasında səyin sayı tək saydadır. Tavaf tək saydadır. Sizlərdən birininz isticmar etdiyinində , onu tək sayda etsin," (Müslim / 1300).

## Altımış səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), etdiyi Həcdə başını qırxması.

90-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Vida Həccində başını qırxdı." (Müslim / 1304).

## Altımış doqquzuncu fəsil: Saçın qırxılması və qısaldılması.

91-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allahım , saçlarını qırxdıranları bağışla." Onlar ona: "Ey Allahın Elçisi , qısaldanları da" deyə söylədikdə, belə buyurdu: "Allahım , saçlarını qırxdıranlarını bağışla." Onlar yenə ona: "Ey Allahın Elçisi , qısaldanları da" deyə söylədikdə, O belə buyurdu: "Allahım, saçlarını qırxdıranları bağışla." Onlar yenidən ona: "Ey Allahın Elçisi , qısaldanları da" deyə söylədikdə, O belə buyurdu: "Allahım , saçlarını qısaldanları da bağışla."

## Yetmiş ikinci fəsi: Daş atmaq, sonra qurban kəsmək, sonra başı qırxmaq və başı qırxdırarkən sağ tərəfdən başlamaq.

92-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Camaratu əl-Aqabəni daşladı. Sonra Qurban kəsiləcək heyvanların yanına gələrək qurbanını kəsdi.

Həccam (qan almaqla məşğul olan) oturmuşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əli ilə başına işarə etdi və başının sağ tərəfini qırxdırdı və yanında olanlar arasında saçının tükünü bölüşdürdü. Sonra: "O biri tərəfi də qırx" deyə buyurdu və Əbu Talhanı çağıtdıraraq saçının tükünü ona verdi." (Müslim / 1305).

## Yetmiş birinci fəsil: Başı qırxdırmamadan qurban kəsən və ya qurban kəsmədən daş atan.

93- Abdullah ibn Amr ibn əl-Ass (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyinin üzərində ikən dayandı. İnsanlar ondan soruşmağa başladılar. Onlardan bəzisi belə dedi: "Ey Allahın Elçisi , mən daşlamağın Qurban kəsməkdən qabaq olduğunu bilmədim və daş atmadan qurbanımı kəsdim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Get , daş at , heç bir zərəri yoxdu." Başqa biri isə belə dedi: "Mən qurbanın başı qırxdırmaqdan qabaq olduğunu bilmirdim və qurbanı kəsmədən başımı qırxdırdım." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Get , qurbanını kəs , heç bir zərəri yoxdu." Ondan o gün insanın unutduğu və ya bilmədən bəzi əməlləri o birindən qabağa salmağı və ya buna oxşar haqda nə soruşuldusa , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Et , heç bir zərəri yoxdu" kəlməsindən başqa bir şey dediyini eşitmədim." (Müslim/1306).

94- Abdullah ibn Amr ibn əl-Ass (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qurban bayramı günü Cəmaratın yanında dayanarkən , yanına bir kişi gələrək ondan belə şoruşduğunu eşitmişəm: "Ey Allahın Elçisi , mən daş atmadan başımı qırxmışam" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "Get , at , heç bir zərəri yoxdu." Sonra başqa biri gəlib belə dedi: "Mən daş atmadan qurbanımı kəsmişəm." Peyğəmbər belə dedi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Get , at , heç bir zərəri yoxdu." Sonra başqa biri gəlib belə dedi: "Mən daş atmadan Tavafı etmişəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Get , at , heç bir zərəri yoxdu." deyə cavab verdi O gün nə haqda soruşuldusa, "onu edin , heç bir zərəri yoxdu" kəlməsindən başqa bir şey dediyini görmədim." (Müslim / 1306).

## Yetmiş ikinci fəsil: Ehrama girərkən Qurbanlıq heyvanı seçilsin deyə boynundan bir parça dəri asmaq və hörgücünün sağ tərəfini cızmaqla qan axıdaraq nişanə qoymaq.

95- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zöhr namazını Zül Hüleyfədə qıldı , sonra dəvəsinin gətirilməsini tələb etdi və hörgücünün sağ tərəfini cızmaqla qan axıdaraq , nışanə qoydu və boynundan bir parça dəri asdı. Sonra miniyinə qalxdı və Beyda düzünə qalxdıqda Həccə təlbiyə etdi."

## Yetmiş üçüncü fəsil: Ehrama girmədən öncə Qurbanlıq heyvanı seçilsin deyə boynundan bir parça dəri asarag göndərmək.

96- . Umara bintu Abdurrahman belə rəvayət edir: "İbn Ziyad Aişəyə (Allah ondan razı olsun) məktub göndərərək belə dedi: "Abdullah ibn Abbasın (Allah onların hər ikisindən razı olsun) Qurbanlıq heyvanı göndərən kimsənin Ehramda olan kəs kimi

Qurbanını kəsmədən ona Ehramdan qabaq halal olan şeylərin haram olduğunu söyləyir. Mən artıq qurbanımı göndərmişəm , mənə bu haqda bildiyini yaz." Umara belə demişdir: "Aişə (Allah ondan razı olsun) belə buyurdu: "İbn Abbasın dediyi kimi deyildir. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qurbanlıq heyvanının öz əllərimlə boynuna seçilsin deyə , bir parça dəri bağladım , sorna Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu öz əli ilə nişanələyərək atamla göndərdi. Onun qurbanı kəsilənə qədər Allahın ona hallal etdiyi heç bir şey ona haram olmadı." (Müslim / 1306).

97- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir dəfə Kəbəyə qoyun Qurban göndərdi və onu nişanələdi." (Müslim /1331).

## Yetmiş dördüncü fəsil: Qurbanlıq dəvənin tərkinə minmək.

98- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir kişinin qurbanlıq dəvəni apardığını gördü və ona : "Ona min" deyə buyurdu? Kişi: "Ey Allahın Elçisi , o qurbanlıq bir dəvədir" deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ikinci və ya üçüncü dəfəsində "Vay olsun sənə , min onu" deyə buyurdu." (Müslim / 1322).

99- Əbu əz-Zubeyr belə rəvayət edir: "Cabir ibn Abdullahdan Qurbanlıq dəvənin minilməsi haqda soruşularkən , belə dediyini eşitdim: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Möhtac qaldığın vaxt , başqa minik tapana kimi , ona yaxşıqla rəftar edərək min!" (Müslim / 1324).

## Yetmiş beşinci fəsil: Qurbanlıq heyvanın qurban yerinə çatmamış tələf olması.

100- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Zueyb Əbu Qabisə ona Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu qurbalıq dəvələrlə göndərdikdə , belə buyurduğunu rəvayət etdi: "Onlardan hər hansının tələf olmasından və öləcəyindən qorxduğunda , onu kəs və boynuna asılmış nişanəni qanına batır və sağ hörgücünə sürt. Sən və səninlə birgə yol yoldaşı olan heç bir kəs ondan yeməsin." (Müslim / 1326).

## Yetmiş altıncı fəsil: Qurbanlıq heyvan kəsərkən şərik olmaq.

101- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həccə niyyət edərək çıxmışdıq. Bizə hər yeddi nəfərin bir inək və ya dəvə kəsməkdə şərik olmağmızı əmr etdi." (Müslim / 1318).

## Yetmiş yeddinci fəsil fəsil: İnək qurban etmək.

102- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qurban bayramı günündə Aişənin adından bir inək qurban kəsdi." (Müslim / 1319).

## Yetmiş səkkizinci fəsil: Qurbanlıq dəvənin ayaq üstə (bir ayağı) bağlı kəsmək (bıçağı ürəyinə sancaraq).

103- Ziyad ibn Cubeyr belə rəvayət edir: "İbn Ömər (Allah onların hər ikisindən razı olsun) bir kişinin yanına gəldiyində onun qurbanlıq dəvəni yıxaraq kəsdiyini görür. Ona belə buyurur: "Onu ayaq üstə (bir ayağı) bağlı kəs, bu Peyğəmbərinizin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sünnəsidir." (Müslim / 1320).

## Yetmiş doqquzuncu: Qurbanlıq heyvanın ətini, yununu və dərisini sədəqə vermək.

104- Əli ibn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni qurbanlıq dəvələrə baxmamı, onların ətini, yununu və dərisini sədəqə verməmi və qəssaba ondan heç nə verməməmi əmr etdi və belə buyurdu: "Biz ona özümüzdən verərik." (Müslim / 1317).

## Səksəninci fəsil: Qurban bayramı günündə Ziyarət tavafı (əl-İfada tavafı) etmək.

105- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qurban bayramı günündə Ziyarət tavafını (əl-İfada tavafı) etdi. Sonra qayıdaraq Zöhr namazını Minada qıldı." Nəfi belə rəvayət etmişdir: "İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Qurban bayramı günündə Ziyarət tavafını (əl-İfada tavafı) edər , sonra Zöhr namazını Minada qılardı. Və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə etdiyini xatırladardı."(Müslim / 1308).

## Səksən birinci fəsil: Evi (Kəbəni) tavaf edən artıq ehramdan çıxmışdır.

106- İbn Cüreyc belə rəvayət edir: "Aəta (Allah ona rəhmət etsin) mənə İbn Abbasın (Allah onların hər ikisindən razı olsun) belə dediyini xəbər verdi: "Həcc edən və ya etməyən , hər kim olursa olsun , Kəbəni Tavaf edərsə ,ehramdan çıxmış olar." Mən Aətadan: "O bunu nəyə əsaəsən deyir?" O belə cavab verdi: "Allah təalanın buyurduğu bu ayəyə əsasən "Sonra onların gətirilib kəsiləcəyi yer qədim ev (Kəbə) istiqamətindədir." Mən: "Bu , Ərafatda durduqdan sonradır" dedikdə, O: " İbn Abbas (Allah onların hər ikisindən razı olsun) onun Ərafatdan həm sonra , həm də qabaq olduğunu deyirdi. Həmçinin , bunu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara Vida Həccində Ehramdan çıxmalarını əmr etməsindən götürür." (Müslim / 1245).

## Səksən ikibci fəsil: Qiran Həcc edənə Həcci və Ümrəsi üçün bir tavaf kifayətdi.

107- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "O Sarif adlanan yerdə heyz oldu və yalnız Ərafatda təmizləndi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sənə bir dəfə Tavaf etmən və Səfa və Mərvada bir dəfə səy etmən Həccin və Ümrən üçün kifayətdi" (Müslim / 1211).

## Səksən üçüncü fəsil: Həcc və Ümrəyə birgə niyyət edərək ehrama girən nə zaman ehramdan çıxır.

108- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Vida həccində çıxmışdıq. Bizdən

bəzimiz Ümrəyə, bəzimiz Ümrə və Həccə, bəzilərimiz isə Həccə niyət edərək ehrama girmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə Həccə niyyət etdi. Ümrəyə niyyət edənlər ehramdan çıxdılar. Amma Həccə və Ümrəyə və ya Həccə niyət edənlər isə qurban günə kimi ehramda qaldılar." (Müslim / 1211).

## Səksən dördüncü fəsil: Təşriq günləri (Zül hiccənin On bir, on iki, on üçüncü gün) əl-Muhassab (əl-Əbtah, Xeyf) adlanan yerə gəlmək və orada namaz qılmaq.

109- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Bəkr və Ömər (Allah onlardan razı olsun) əl-Əbtah adlana yerə gələrdilər " (enərdilər). (Müslim / 1310).

110- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "əl-Əbtah adlanan yerə enmək sünnət deyildir. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ora yanlız (Məkkədən) çıxmaq istədikdə , oradan çıxmağın rahat olduğu üçün endi." (Müslim / 1311).

111- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Minada ikən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə buyurdu: "Biz sabah Bənu Kinanə qəbiləsinin Xeyf adlanan Küfr üzərində Əhd peyman etdikləri yerə enəcəyik. Çünki Bəni Kinanə və Qureş qəbiləsi Bəni Həşim və bəni Əbd əl-Muttalib qəbiləsi ilə Mühhəmmədi təslim etməyənə kimi , onlarla evlililik və alış veriş əlaqələri qurmayacaqlarina əhd verdikləri yerdir." Yəni əl–Muhassab adlanan yer." (Müslim / 1314).

## Səksən beşinci fəsil: Məkkədə su paylayan kəslərin Mina gecələri harada gecələmələri haqda.

112- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Abbas ibn Əbdul Muttalib (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mina gecələrini insanlara su paylamaq məqsədilə Məkkədə gecələməsi üçün izn istədi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona izn verdi." (Müslim / 1315).

113- Bəkr ibn Abdullah əl–Müzəni belə rəvayət: "Abdullah ibn Abbasla (Allah onların hər ikisindən razı olsun) Kəbənin yanında oturmuşduq. Bir çöl bərəvi ərəb onun yanına gələrək belə dedi: "Bu nədir görürəm, sizin əmi üşaqlarınız süd və bal paylayır , siz isə nəbiz (Xurmadan hazırlanan içki, sirə) paylayırsınız, bunu ehtiyacınız olduğundan dolayı və ya paxıllıqdan edirsiniz?" İbn Abbas belə buyuyrdu: "Allaha Həmd olsun. Bunu nə ehtiyacdan dolayı , nə də paxıllıqdan edirik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyi ilə gəldi və Üsamə də onun tərkində idi. Su istədi. Ona içərsində nəbiz olan bir qab gətirdilər. Ondan içdi və qalanını Üsaməyə verdi. Sonra isə belə buyurdu: "Yaxşı, gözəl etdiniz , beləcə də edin" Biz də Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əmr etdiyi şeyi dəyişmək istəmirik." (Müslim / 1316).

## Səksən altıncı fəsil: Mühacirin Həcc və Ümrədən sonra Məkkədə qalması.

114- Abdurrahman ibn Humeyd belə rəvayət edir: "Ömər ibn Əbdul Əzizin yanındakılara belə dediyini eşitdim: "Məkkədə sakinləşmək haqda nə bilirsiniz?

Saib ibn Yezid ona belə dedi: "Ala və ya Ala ibn əl-Hadrami Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə nəql etdiyini eşitdim: "Mühacir ziyarətini bitirdikdən sonra Məkkədə üç gün qala bilər." (Müslim /1252).

## Səksən yeddinci fəsil: Evi (Kəbəni) Vida tavafı etmədən heç bir kimsə (Məkkədən) ayrılmasın.

115- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: İnsanlar hər tərəfə dağılıb gedirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizlərdən biriniz , vidalaşdığı son yer ev (Kəbə) olmadan , heç bir yerə getməsin" (Müslim / 1327).

## Səksən səkkizinci fəsil: Qadının Vida təvafını etmədən heyz olması.

116- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Safiyyə bintu Huyey Ziyarət tavafından sonra heyz oldu. Mən onun heyz olduğunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdiyimdə , belə buyurdu: "Bizim getməyimizi saxlayacağmı?" Mən ona: "Ey Allahın Elçisi , o , ziyarət tavafını edib və ondan sonra heyz olub" deyə söylədikdə, O belə buyurdu: "Elə isə (Məkkədən) çıxsın" (Müslim / 1211).

117- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "İnsanlara vidalaşdığları son yerin ev (Kəbə) olması əmr olundu. Yalnız heyz olan qadınlara asanlaşdırıldı." (Müslim/1328).

## Səksən doqquzuncu fəsil: Həcc aylarında Ümrə etməyin Mübah əməl olbası.

118- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Cahilliyə dövrüdə ərəblər Həcc aylarında ümərə etməyi yer üzündə edilən ən pis əməllərdən sayar, Məhərrəm ayını Səfər ayı ilə əvəz edərdilər və belə deyərdilər: "Dəvənin (yük daşımaqdan belində əmələ gələn) yarası sağaldıqda, ayaq izləri (torpaqdan) itdikdə, Səfər ayı çxdıqda Ümrə etmək istəyənə , Ümrə Halal olar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabı ilə dördüncü gecənin sabahı gəldiyində , Həccə təlbiyə etmişdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara onu Ümrəyə çevirməyi əmr etdikdə , onlara bu , ağır (bunu əzəmətləşdirərək) gəldi və belə soruşdular: "Nə halal olacaq?" O: "Halal olan hər bir şey" deyə cavab verdi." (Müslim / 1240).

## Doxsanıncı fəsil: Ramazan ayında Ümrə etməyin fəziləti.

119- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarlardan olan Ummu Sinan adlı bir qadına belə buyurdu: "Sənə bizimlə Həcc etməyə mane olan nədir?" Qadın belə cavab verdi: "Ərini qəsd edərək- Əbu Filankəsin iki su daşıyan dəvəsi var , onun biri ilə o və oğlu Həcc edir , o biri ilə isə qulumuz su daşıyır" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Ramazan ayında Ümrə etmək , Həccin və ya Mənimlə edilən Həccin əvəzini verər." (Müslim / 1256).

## Doxsan birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) neçə Həcc etməsi.

120- Əbu İshaq belə rəvayət edir: “Zeyd ibn Arqabdan Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) neçə döyüşdə oldun?" deyə soruşdum. O: "On yeddi" deyə cavab verdi. Zeyd ibn Arqam: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) on doqquz döyüş, Hicrət etdikdən sonra isə bir Vida Həcci sayılan həcc etdiyini xəbər vermişdir." Əbu İshaq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkədə ikən də başqa bir Həcc etdiyini söyləmişdir," (Müskim / 1254).

## Doxsan ikinci fəsil: Peyğəmbərin(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) neçə Ümrə etməsi.

121- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dörd ümrə etmişdir. Həcdəki ümrəsi istisna olmaqla , qalanları Zül-Qadə ayında olmuşdur. Hüdeybiyyədən və ya Hüdeybiyyə zamanı Zül-Qadə ayındakı, onun Gələn ili Zül-Qadə ayındakı, Hüneyn qənimətlərini bölüşərkən Ciranədən etdiyi Zül-Qadə ayındakı və Həcdə etdiyi ümrə." (Müslim / 1253).

## Doxsan üçüncü fəsil: Ümrədə saçı qısaltmaq.

122- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Müaviyyə ibn Əbu Sufyan (Allah onların hər ikisindən razı olsun) ona belə rəvayət etmişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mərvada ikən, qayçı ilə onun saçını qısaltdım. Və ya O Mərvada ikən, saçını qayçı ilə qısaltdığını gördüm." (Müslim / 1246).

## Doxsan dördüncü fəsil: Heyz olan qadının Ümrənin qəzasını etməsi.

123- Möminlərin anası Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: İnsanlar iki ehkamı yerinə yetirərək gedirlər , mənsə birini etmişəm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Gözlə təmizlənəsən , Tənim adlanan yerə get , və oradan ehrama gir. Sonra isə bizə bu və bu yerdə çat." Ravi belə demişdir: Mən onun "sabah" dediyini zənn edirəm. "lakin bu sənin qatlanacağın çətinlik müqabilindədir və ya sənin sərf edəcəyinin müqabilində olacaq." (Müslim / 1211).

## Doxsan beşinci fəsil: Həcc və başqa səfərlərdən dönən kimsələrin edəcəyi dua.

124- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəbayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qoşundan, dəstədən, Həccdən , Ümrədən qayıdarkən dağ ətəyinə və ya açıq bir sahəyə çıxdıqda , üç kərə təkbir edər , sonra isə belə deyərdi: "Lə ilahə İlləl Allah Vahdəhu lə Şərikələh ləhul Mülkü və Ləhul Həmdu Və Huva əla Kulli Şeyin Qadir. ( Allahdan başqa ibadətə layiq məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Mülk onundur və Həmd Onadır. O hər şeyə qadirdir.) "Ayibunə,təibunə, Abiduna ilə Rabbinə Hamidunə. Sədəqə Allahu Vadəhu və Nasarə əbdəhu və Həzəməl Əhzəbə Vəhdəhu." (geri dönənlər, tövbə edənlər. İbadət edənlər, Rəbbimizə həmd edənlərik. Allah vədini yerinə yetirdi, quluna kömək etdi və düşmən dəstələrini məğlub etdi)." (Müslim /1344).

## Doxsan altıncı fəsil: Həcc və Ümrədən döndükdən sonra Zül Hüleyfədə dincəlmək üçün dayanmaq , orada namaz qılmaq.

125- Abdullah ibn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zül Hüleyfədə olan əl-Batha adlanan yerdə dayandı (dincəldi) və orada namaz qıldı." İbn Ömər (Allah onların hər ikisindən razı olsun) onun etdiyi kimi edərdi. (Müslim / 1257).

126- Nafi belə rəvayət edir: "Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) Həcc və Ümrədən döndükdə , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dayandığı  Zül Hüleyfədə olan əl-Batha adlanan yerdə dayandı." (Müslim / 1257).

127- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zül Hüleyfədə olan Vadininin ortasında dincəldiyi yerdə ikən, ona belə deyildi: "Sən mübarək Bəthadasan." Musa belə rəvayət edir: "Səlim bizi Abdullahın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qaldığı yeri axtararaq , orada qaldığı Məscidin yanındakı yerə endirdi.  Bu yer Vadinin otrasındaki Məscidin aşağısında idi. Onunla Məscid arasındakı məsafə ortadır." (Müslim /1257).

## Doxsan yeddinci fəsil: Məkkədə ov etməyin, ağac qırmağın və tapılan əşyaların haram olması haqda.

128- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Allah Təala Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkənin Fəthini verdikdən sonra O , qalxaraq Allaha həmd sənalardan sonra, insanlara belə xitab etdi: "Allah təala Məkkəni fillərdən qorudu və onu tutmağı Elçisinə və möminlərə izn verdi. O (Məkkə) məndən qabaq heç kəsə halal olmayıb. O mənə günün bir saatı halaldı. Məndən sonra heç kəsə halal olmaz. Onun ovu (Ov heyvanları) hürkütülməz,  tikanı sındırılmaz (qoparılmaz), orada itirilən halal olmaz , yalnız elan məqsədi ilə götürəndən başqa. Kimin bir yaxını öldürülərsə , o , iki şeydən birini seçsin: "Ya ona fidyə veriləcək, ya da ki, qatil öldürüləcək." İbn Abbas ona "Ey Allahın Elçisi , yalnız əl-İzxirdan (ətirli ot) başqa (yəni onu qırmağa izn ver). Çünki biz onu qəbirlərimizə və evlərimizə qoyuruq." deyə söylədikdə , O , belə cavab verdi: "Yalnız əl-İzxirdan (ətirli ot) başqa (yəni onu qırmağa izn var)" Yəməndən olan Əbu Şah qalxaraq: "Onu mənim üçün yazın , ey Allahın Elçisi" deyə söylədikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onu Əbu Şah üçün yazın." Valid belə demişdir: "əl-Əvzaiyədən belə soruşdum: "Onu mənim üçün yazın , ey Allahın Elçisi" nə deməkdir?" O belə cavab verdi: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyi bu xütbəni" (Müslim / 1355).

129- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Heç birinizə Məkkədə silah daşımaq halal deyildir." (Mülsim / 1356).

## Doxsan səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ehramsız Məkkəyə girməsi.

130- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)

Məkkəyə daxil olduğunda (Quteybə belə demişdir: Məkkənin Fəthi günündə) ehramda deyildi və əynində qara əmmamə vardı." (Müslim / 1358).

131- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkənin Fəthi günündə Məkkəyə daxil olduğunda başında zirehli dəbilqə vardı. Onu çıxartdığında bir kişi onun yanına gələrək: "İbn Xatalın Kəbənin örtüsündən yapışdığını" xəbər verdikdə, belə buyurdu: "Öldürün onu" (Müslim /1357).

## Doxanıncı doquzuncu fəsil: Kəbənin hicri (divarı) və qapısı haqda.

132- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdum: "Divar evdəndirmi (hicr kəbədəndirmi)? O: "Bəli" deyə cavab vedikdə, mən yenə: "Niyə evə daxil olunmayıb" deyə soruşdum? O belə cavab verdi: "Qövmünün bunu etməyə vəsaiti az olub." Mən yenidən soruşdum: "Bəs qapısı niyə hündürdədir?" O belə dedi: "Qövmün bunu istədiklərini ora daxil edib, istədiklərini də qadağan etmək üçün belə edib." Əgər qövmün cahiliyə dövrünə yaxın olmasaydı , və mən onların qəlblərinin bunu inkar etməsindən qorxmasaydım , divarın evə daxil edilməsinə və qapının torpağa dəyməsinə yenidən baxardım" (Müslim / 1333).

## Yüzüncü fəsil: Kəbənin dağıdılıb yenidən tikilməsi.

133- Ata (Allah ona rəhmət etsin) belə rəvayət edir: "Yezid ibn Müaviyyənin zamanında Şam əhli hücüm etdiyi və Kəbənin yandığı və olan olduğu zamanda İbn Zubeyr onu (Kəbəni) camaat həcc mövsümünə gələnə kimi olduğu vəziyyətdə buraxdı. Bununla o , camaatı Şam əhlinin üzərinə qaldırmaq, onlarla müharibə etməyə çağırmaq istəyirdi. İnsanlar Həcci bitirdikdən sonra Onlara belə xitab etdi: "Ey İnsanlar! Mənə Kəbə haqda rəyinizi söyləyin ki, onu dağıdıb yenidən tikim? Yoxsa ki, ondan xarab olanı təmir edim? " İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə buyurdu: "Mən belə fikirdəyəm ki, ondan xarab olan təmir olunsun və insanlar İslama girərkən olan ev kimi, olan daşlar kimi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) göndərilən zaman olduğu kimi qalsın." İbn Zubeyr belə buyurdu: "Sizlərdən birinizin evi yansa onu təmizləməyincəyə könlü rahat olmaz. Bəs Rəbbinizin evi necə olur!? Mən Rəbbimə üç kərə İstixarə edəcəm , sonra istədiyim işə əzm edəcəm." Üç gecə keçdikdən sonra Evi dağıdmaq qərarına gəldi. Xalq bu Evin üzərinə ilk çıxan adamın başına səmadan bir bələ enər deyə onu bu əməldən çəkindirməyə çalışdı. Nəhayət bir kişi onun üzərinə qalxaraq ondan bir daş atdıqda , ona heç bir şey olmadığını görən xalq tökülərək onu torpağa çatana kimi dağıtdılar. O tikilənə qədər (Qiblə) əvəzinə dirəklər qoydurdu və üzərinə örtü salındı. Nəhayət tikilib qürtadıqda İbn Zubeyr belə dedi: "Aişədən (Allah ondan razı olsun) belə rəvayət etdiyini eşitdim: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "İnsanlar Küfürdən yenicə çıxmış olmasaydılar , mən divardan beş dirsək qədərini Kəbəyə daxil edərdim. İnsanların girib çıxa bilməsi üçün giriş və çıxış qapsı qoyardım. Lakin Məndə bu gün bunu etməyə vəsait yoxdur." Sonra İbn Zubeyr belə buyurdu: "Məndə isə bu gün bunu etməyə vəsait var və insanlardan da qorxmuram." Kəbəyə Hicirdən beş dirsək artırdı evin bünövrəsini qoyaraq insanlara göstərdi və onun üzərinə Evi inşa etdi. Kəbənin hündürlüyü on səkkiz dirsək idi , ona daş artırdıqda kiçik hecab edərək , on dirsək də artırdı. Ona iki qapı, biri girmək üçün, o biri isə çıxmaq üçün. İbn Zubeyr öldürüldüyündə Həccac Əbd əl-Məlik ibn Marvana bu xəbəri yazdı. Və İbn Zubeyrin Məkkə əhlindən adil kimsələrin rəyi ilə Kəbəni bir təməl üzərinə bina etdiyini də xəbər verdi. Əbd əl-

Məlik ona belə yazdı: "Biz Zubeyrin xarab etdiyi heç bir şeydə yoxuq. Hündürlüyündəki dəyişdiyini iqrar et. Amma Hicirdən etdiyi əlavəni yerinə inşa et və açdığı qapını bağla." O da onu sökərək əvvəlki şəklində bina etdi." (Müslim / 1333).

134- Əbu Quzaa belə rəvayət edir: "Əbd əl-Məlik ibn Mərvan Kəbəni tavaf edərkən belə dedi: "Allah ibn Zubeyri öldürsün . Möminlərin anasının adından yalan danışaraq deyir ki: "O (Aişə) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitmişdir: "Ey Aişə , əgər qövmün küfürdən yeni ayrılış olmasaydı , Evi dağıdıb , hicrdən ona artıraraq tikərdim , çünki qövmün onu alçaq tikmişlər". əl-Həris ibn Abdullah ibn Rabiə belə dedi: "Ey Möminlərin əmiri , belə demə , mən möminlərin anasının belə danışdığını eşitmişəm." O belə buyurdu: "Kaş ki, bunu onu sökməmişdən qabaq eşitsəydim və onu İbn Zubeyrin tikdiyi kimi tərk edərdim." (Müslim / 1333).

## Yüz birinci fəsil: Mədinədə ov etməyin, ağac qırmağın və haram olması və onun üçün dua edilməsi haqda.

135- Abdullah ibn Zeyd ibn Asim (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "İbrahim (Ona Allahın salamı olsun) Məkkəni haram etmış və onun üçün dua etmişdir. Mən də Mədinəni İbrahim Məkkəni haram etdiyi kimi haram edirəm. Mən də , Onun Saasına və Mudduna İbrahim Məkkə əhli üçün etdiyi duanın iki mislində olsun deyə , dua edirəm." (Müslim / 1360).

136- Sad ibn Əbu Vaqqas (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mən Mədinənin iki daşlı ərazisindəki yerdə ağac kəsilməsini və ov üçün heyvan öldürülməsini (ov edilməsini) haram etdim. Sonra isə belə buyurdu: " Kaş ki , onlar Mədinənin onlar üçün daha xeyrli olduğunu bilsəydilər. Bir kimsə ondan üz döndərərək onu tərk etsə , Allah təala ona ondan daha xeyirlisini gətirər. Onun çətinliyinə, açlığına dözən hər bir kəs üçün qiyamət günü mən şəfaətçi və ya şahid olacağam." (Müslim /1363).

137- Amir ibn Saad belə rəvayət edir: " Saad (Allah ondan razı olsun) Aqiq adlanan yerdə olan qəsrinə gəldiyində , bir qulun ağac qırdığını və ya silkələdiyini gördü və ondan üzərində olanları götürdü. Saad qayıtdığında qul sahibləri gələrək ondan qullarından götürdüklərini onlara və ya qula qaytarmasını ondan tələb etdilər. O onlara belə cavab verdi: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qənimətdən verdiyi bir şeyi dala gaytarmaqdan Allaha sığınıram." Və onlara götürdüyünü qaytarmağı rədd etdi." (Müslim / 1364).

138- Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allahım! Mədinəyə Məkkəyə verdiyin bərəkətin iki mislini ver!" (Müslim / 1369).

139- İbrahim ət-Teymi atasının belə dediyini rəvayət edir: "Əli ibn Əbu Talib (Allah ondan razı olsun) xütbədə belə dedi: "Hər kim bizdə Allahın Kitabından və bu səhifədən başqa (bu səhifə onun qılıncının qınından asılmışdı) bir şey olduğunu və onu oxuduğumuzu iddia edərsə , o yalançıdır. Burada dəvələrin yaşları, və yaralar haqda olan şeylər vardır. Həmçinin , onda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyi vardır: "Mədinə Hey dağından Sövr dağına kimi haramdır. (haram olan ərazidir). Hər kim orada bir Bidəət (günah) etsə və ya bidəət edənə sığınacaq versə , Allahın, Mələklərin və bütün insanların lənəti onun üzərinə olsun! Allah Təala ondan qiyamət günü nə vacib nə də nafilə ibadətlərindən heç nə qəbul etməz. Müsəlmanların verdikləri

əhd-peyman birdir. Bu əhd-peyman uğruna onların ən zəifi olsa belə , cəhd göstərər. Kim atasından başqa bir kəsin oğlu olduğunu iddia edərsə və azad olunmuş qul mövlasından başqasına özünü nisbət edərsə , ona Allahın, Mələklərin və bütün insanların lənəti olsun. Allah Təala ondan qiyamət günü nə vacib nə də nafilə ibadətlərindən heç nə qəbul etməz." (Müslim / 1370).

140- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ilk nübar gətirildiyində , belə deyərdi: "Allahım , bizə Mədinəmizdə, ilk nübarımızda, saamızda və bərəkətimizin üzərinə bərəkət əta et!" Sonra həmən meyvəni orada olan uşaqların ən kiçiyinə verərdi." (Müslim / 1373),

## Yüz ikinci fəsil: Mədinədə məskulaşmağa və onun çətinliyinə və aclığına səbr etməyə rəğbətləndirmək.

141- əl-Mehrinin mövlası olan Əbu Səid belə rəvayət edir: "O isti gecələrin birində Əbu Səid əl-Xudriniin yanına gələrək onunla Mədinədə sıxıntısı olduğunu və ondan getmək istədiyi haqda məsləhələşərək ona Mədinədəki bahalığdan, ailəsinin sayının çox olmasından şikayətləndi. Ona onun cətinliyinə və açlığına səbr edə bilmədiyini xəbər verdikdə, Əbu Səid ona belə buyurdu: "Vay olsun sənə! Sənə bunu əmr edə bilmərəm. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Onun çətinliyini və aclığına səbr edərək ölən müsəlman bir kimsə üçün qiyamət günü mən şəfaətçi və ya şahid olacağam." (Müslim 174).

142- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Mədinəyə gəldiyimizdə , orası vəbalı bir yer olduğundan , Əbu Bəkr və Bilal şikayətləndi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabının şikayətləndiyini gördükdə belə buyurdu: "Allahım! Bizə Məkkəni sevdirdiyin kimi və ya ondan da artıq Mədinəni sevdir! Və onu sağlam qıl (Et)! Bizə onun saasinda və muddunda bərəkət ver. Və onda olan qızdırmanı (xəstəliyi) əl-Cuhfaya (yer adı) çevir." (Müslim / 1376).

## Yüz üçüncü fəsil: Mədinəyə Taun və Dəccal girməz.

143- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mədinənin yollarını Mələklər qoruyur. Ona Taun və Dəccal girməz." (Müslim / 1379).

## Yüz dördüncü fəsil: Mədinə onda olan pislikləri kənarlaşdırar.

144- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İnsanlara elə bir zəmanə gələcək ki, kişi əmisi oğluna və ya qohumuna: "Haydı rahatlıq olan yerlərə (gedək), Haydı rahatlığa" deyəcək. Kaş ki , onlar Mədinənin onlar üçün daha xeyrli olduğunu bilsəydilər. Nəfsim əlində olana and olsun ki, onlardan bir kimsə ondan üz döndərərək onu tərk etsə , Allah Təala ona (Mədinəyə) ondan daha xeyirlisi ilə əvəz edər. Həqiqətən , Mədinə onda olan pislikləri körüyün pisliyi çıxartdığı kimi çıxarır. Mədinə onda olan şər insanları körüyün dəmirin pisliklərini təmizlədiyi kimi təmizləməyincə , qiyamət qopmaz." (Müslim / 1381).

145- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allat Təala Mədinəni Taba (gözəl ətirli) adlandırmışdır." (Müslim / 1385).

### Yüz beşinci fəsil: Mədinə əhli üçün bir pislik istəyəni Allah Təala əridər.

146- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Onun - Mədinənin - əhli üçün bir pislik istəyəni , Allah Təala duzu suda əritdiyi kimi əridər." (Müslim / 1386).

### Yüz altıncı fəsil: Şəhərlər fəth olunduqda , Mədinədə qalmağa rəğbətləndirmək.

147- Sufyan ibn Əbu Zuheyir belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Yəmən Fəth olunacaq. Bir qövm gələcək ki, dəvələrini ora getmək üçün sürətlə çapacaqlar. Özləri ilə ailələrini və onlara tabe olanları da götürəcəklər. Kaş ki, onlar Mədinənin onlar üçün daha xeyrli olduğunu bilsəydilər. Sonra Şam fəth olunacaq. Bir qövm gələcək ki, dəvələrini ora getmək üçün sürətlə çapacaqlar. Özləri ilə ailələrini və onlara tabe olanları da götürəcəklər. Kaş ki, onlar Mədinənin onlar üçün daha xeyrli olduğunu bilsəydilər. Sonra İraq fəth olunacaq Bir qövm gələcək ki , dəvələrin ora getmək üçün sürətlə çapacaqlar. Özləri ilə ailələrini və onlara tabe olanları da götürəcəklər. Kaş ki, onlar Mədinənin onlar üçün daha xeyrli olduğunu bilsəydilər." (Müslim / 1388).

### Yüz yeddinci fəsil: Mədinə əhli onu tərk etdiyi vaxt.

148- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Mədinəni əhli olduğu xeyr üzərində tərk edəcəklər. Orada yalnız ruzu axtaran yırtıcı heyvan və quşlar dolaşacaq. Sonra Muzeynədən iki çoban çıxaraq Mədinəyə gəlmək istəyəcək. Ora gəldiklərində , qoyunlarına səslənəcəklər , lakin onu bom boş görəcəklər. Nəhayət , Səniyyətu əl-Vəda deyilən yerə gəlib çatacaqlar və orada üzü üstə düşərək öləcəklər." (Müslim / 1389).

### Yüz səkkizinci fəsil: Qəbirlə minbər arasındakı yer cənnət bağçalarından bir bağçadır.

149- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Evimlə minbərim arasındakı yer cənnət bağçalarından bir bağçadır. Minbərim hovzumun üzərindədir." (Müslim / 1391).

### Yüz doqquzuncu fəsil: Uhud dağdır. Bizi sevir, biz də onu sevirik.

150- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uhuda baxdı və belə buyurdu: "Həqiqətən , Uhud dağdır. Bizi sevir, biz də onu sevirik." (Müslim / 1397).

### Yüz onuncu fəsil: Üç məscid istisna, başqa heç bir məscidə ziyarət üçün səfərə çıxılmaz.

151- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəql etdiyi (çatdırdığı) hədisdə belə rəvayət edir: "Üç məscid istisna , başqa heç bir məscidə ziyarət üçün səfərə çıxılmaz: Bu Məscidim, Məscid əl-Haram (Kəbə) və əl-Əqsa məscidi." (Müslim / 1397).

### Yüz on birinci fəsil: İki şərəfli Haram (Məkkə və Mədinə) məscidində qılınan namazın fəziləti.

152- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bu məscidimdə qılınan namaz, başqa məscidlərdə qılınan namazdan min dəfə əfzəldir, yalnız Məscid Əl-Haramdan başqa" (Müslim/1394).

### Yüz on ikinci fəsil: Təqva üzərində qurulan (təsis) olunan məscid haqda.

153- Əbu Sələmətə ibn Əbd ər-Rahman belə rəvayət edir: "Əbd ər-Rahman ibn Əbu Səid əl-Xudri yanımdan keçdi. Ondan: "Atanın təqva üzərində qurulan Məscidi necə xatırladığını eşitmisən?" O belə cavab verdi: "Atam mənə belə dedi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlarının bəzisinin evində ikən ondan belə soruşdum: "Ey Allahın Elçisi , təqva üzərində qurulan məscid hansıdır?" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir ovuc xırda daş götürərək yerə vurdu sonra isə Mədinə məscidini qəsd edərək: "O , sizin bu məscidinizdir." deyə buyurdu. Mən belə dedim: "Şəhadət edirəm ki atanın belə dediyin eşitmişəm" (Müslim / 1398).

### Yüz on üçüncü fəsil: Quba Məscidi və onun fəziləti haqda.

154- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Quba məscidinə bəzən minik və bəzən isə piyada gələr və orada iki rukət namaz qılardı. " (Müslim / 1399).

155- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Quba məscidinə hər həftə gələr və belə deyərdi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hər həftə bura gəldiyini görmüşəm." (Müslim / 1399).

# Nigah Kitabı

### Birinci fəsil: Nigaha rəğbətləndirmək.

1- Alqama (Allah ondan razı olsun) belə rəvayət edir: Abdullah ilə Minada gəzərkən o , Osmanla (Allah ondan razı olsun) qarşılaşdı və onunla danışmağa başladı. Osman ona belə buyurdu: "Ey Əbu Əbd ər-Rahman , gəl səni gənc bir qızla evləndirək, bəlkə sənə keçmişində olub keçəni xatırladar." Sən belə deyirsənsə , səndən əvvəl bizə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Ey cavanlar zümrəsi! Sizlərdən kimin evlənməyə gücü yetirsə, evlənsin! Çünki evlilik gözünü (haramdan) daha çox qoruyar, və namusu (iffətini)

qoruyar. Hər kim evlənməyə qadir deyilsə , oruc tutsun! Çünki bu , onun şəhvətini söndürən bir şeydir." (Müslim /1401).

2- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabından bir neçəsi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrindən onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gizlində etdiyi əməlləri (ibadəti) haqda soruşdular və nəticədə onlardan bəzisi belə dedi: "Mən heç vaxt qadınlarla evlənməyəcəyəm." Başqa biri isə belə dedi: "Mən heç vaxt ət yeməyəcəm.” Başqa biri isə belə dedi: "Mən heş vaxt döşəyin üzərində yatmayacam." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həmd səna etdikdən sonra belə buyurdu: "Bəzi kimsələrə nə olub belə və belə deyirlər. Lakin mən namaz qılıram və yatıram, oruc tuturam və yeyirəm və qadınlarla da evlənirəm. Hər kim mənim sünnətimdən üz cevirərsə , məndən deyildir." (Müslim / 1401).

3- Saad ibn Əbu əl-Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Osman ibn Mazuna özünü axtalmağı rədd etdi. Ona izn verilsəydi , biz də özümüzü axtalayardıq." (Müslim / 1402).

## İkinci fəsil: Dünyanın ən xeyirli malı ve zinəti saleh qadındır.

4- Abdullah ibn Ömər (Allah ondan razı olsun): "Dünya mal və zinətdən ibarətdir. Dünyanın ən xeyirli malı və zinəti saleh qadındır."

## Üçüncü fəsil: Din sahibi olan qadınla nigah qılmaq.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qadınla dörd şeyə görə nigah qılınar: "Malına, nəsəbinə, gözəlliyinə və dininə görə. Sən din sahibi olanını seç, əllərin torpaqlansın." (Müslim /1466).

## Dördüncü fəsil: Bakirə ilə nigah qılmaq.

6- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Abdullah öldüyündə özündən sonra doqquz və ya yeddi qız qoydu. Mən bir arvadla evləndim. Sonra Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qarşılaşdığımda , məndən belə soruşdu: "Ey Cabir , evlənmisən?" Mən: "bəli" deyə cavab verdikdə , o belə soruşdu: "Bakirə ya dul" Mən: "Yox , dul almışam , Ey Allahın Elçisi." deyə cavab verdim. O belə buyurdu: "Kaş ki, bakirə qız alsaydın , sən onunla və o da sənlə oynaşardınız." Və ya: "sən onu və o da səni güldürərdiniz.” Cabir belə dedi: "Abdullah öldüyündə , özünən sonra doqquz və ya yeddi qız qoyub. Mən onlara özləri kimi birini gətirməkdən çəkindim və onların qayğısına qalan, onları islah edən bir qadın gətirmək istədim." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Allah sənə bərəkət və ya xeir versin" deyə dua etdi." (Müslim /715).

## Beşinci fəsil: Qardaşınızın nigahlandığı qadınına nigahlanmayın (elçi göndərməyin).

7- Əbd ər-Rahman ibn Şəməsə Uqba ibn Amirin (Allah ondan razı olsun) Minbərdə belə deyərkən eşitdiyini rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə

Allahın salavatı və salamı olsun) belə demişdir: "Mömin möminin qardaşıdır. Mömin olan bir kəsə qardaşının ticarətinin üzərinə ticarət etməsi halal deyildir. Həmçinin qardaşının nigahlandığı qadını (birinci özü onu nigahılanmağı izn vermədikcə) tərk etməyincə , nigahlana bilməz." (Müslim / 1414).

## Altıncı fəsil: Evlənmək istəyənin evlənəcəyi qadına baxması.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Mən Ənsarlardan olan bir qadınla evlənmişəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Ona baxdınmı, çünki Ənsarların gözlərində nəsə olur?" deyə soruşduqda, O: "Ona baxdım" deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Onunla nə qədər mehrə nigahladın?" deyə soruşdu. O: "Dörd Uqiyyəyə" deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Dörd Uqiyyəyə? Sanki siz gümüşü bu dağın ətəyindən yonursunuz! Bizdə sənə veriləcək bir şey  yoxdur, lakin səni bir yürüşə göndərə bilərəm və oradan qənimət əldə edərsən!"  və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bəni Abəsə qəbiləsinə bir ordu göndərdi və o kişini də onlarla yolladı" (Müslim / 1424).

## Yeddinci fəsil:  Dul qadınının və Bakirə qızın nigaha  izninin alınması.

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə rəvayət edir: "Dul qadın razılığı olmadan nigah olunmaz. Bakirə qızın izni soruşulmadan nigah olunmaz." Ondan : "Ey Allahın Elçisi, izni necə olur?" deyə soruşulduqda, belə buyurdu: "Susmaqla." (Müslim /1419).

10- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dul öz nəfsinə vəlisindən daha artıq haqq sahibidir. Bakirədən isə özü haqda izn istənilir və izni susmasıdır." (Müslim 1421).

## Səkkizinci fəsil: Nigahda olan şərtlər.

11- Uqba ibn Amir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz ki, vəfalı olunması olan şərt , sizin (onunla) qadınları halal etdiyiniz şərtdir." (Müslim / 1418).

## Doqquzuncu fəsil: Kiçik qızı evləndirmək.

12- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə  evləndiyində altı yaşında idim. Doqquz yaşimda isə mənimlə gərdəyə girdi.  Mədinəyə gəldiyimdə bir qızdırmaya tutuldum.  (Bundan dolayı saçlarım tökülmüşdü) və nəhayət saçlarım uzanıb çiyinlərimə töküldü. Belə vaxtda Ummu Rumman  yanıma gəldi. Mən rəfiqələrimlə taxtadan yelləncəkdə oynayarkən mənə səsləndi. Mənə nə edəcəyini bilmədən onun yanına gəldim. Əlimdən tutaraq bir qapının önünə gətirdi. Nəfsim kəsilmiş halda

"həh" "həh" deyə nəfəs alırdım. Nəhayət nəfəsim sakitləşdi. O məni evə daxil etdi. İçəridə Ənsar qadınlar: "Xeyirli bərəkətli olsun! Xeyirli olan nəsib olusun." Ummu Rumman məni onlara təslim etdi , başımı yudular və məni bəziyib hazırladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma yalnız Duha vaxtı gəldi və məni ona təslim etdilər." (Müslim /1422).

## Onuncu fəsil: Kənizi azad etmək sonra isə onunla evlənmək.

13-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybərə hücüm etdi. Orada Səhər namazını ala qaranlıqda qıldıqdan sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyinə qalxdı. Əbu Talha da miniyinə qalxdı və mən onun tərkinə mindim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heyvanını Xeybər yoluna sürdü. Mənim dizlərim Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) baldırına toxunurdu və izar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) baldırının üzərindən açıldı. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) baldırlarının bəyazlığını görürdüm. Kəndə daxil olduqda belə dedi: "Allahu Əkbər Xeybər xaraba qaldı. Biz bir qövmə yetişdikdə (evlərində ikən başlarının üstünü aldıqda) qorxudulanların (lakin yola gəlməyənlərin) sabahı necə də pis olacaq." Bunu üç kərə təkrar etdi. Xeybər camaatı öz işləri üçün "çıxmışdılar bizi görəndə: "Allaha and olsun , Muhəmmədir" deməyə başladılar. (Əbd əl-Əziz belə demişdir: "yoldaşlarımızın bəziləri belə demişdir: "Muhəmməd və beşlik qoşun") Biz onu qəsb edərək ələ keçirdik. Əsirləri cəm etdikdə Dihyə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi , mənə əsirlərdən bir kəniz ver!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Get kənizi götür!" deyə buyurdu. O Safiyyə bintu Huyeyəni götürdükdə , bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib belə buyurdu: "Ey Allahın Elçisi , sən Dihyəyə Qureyzə və ən-Nadir qəbiləsinin ağası Safiyyə bintu Huyeyəni cariyə (kəniz) olaraq vermisən. O , yalnız sənə layiqdir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Onu Safiyyə ilə birlikdə çağırın" deyə buyurdu və onu gətirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona baxdıqda Dihyəyə "özünə başqa kəniz götür " deyə buyurdu. Sonra onu azad edərək onunla evləndi." Səbit Ənəsdən: "Ey Əbu Həmzə , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona mehr olaraq nə verdi " deyə soruşduqda, O: "Nəfsini." deyə cavab verdi, sonra isə belə buyurdu: "Onu azad etdi , sonra isə onunla evləndi. Nəhayət , yolda ikən Ummu Suleym onu hazırlayaraq gecə onunla gərdəyə saldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bəy olaraq sabahladı və belə buyurdu: "Kimin yanında nəyi varsa , mənə gətirsin!" Və dəridən bir süfrə sərdi. Bir kişi (quru süd) kəsmik, o biri quru xurma, başqa biri isə yağ gətirdi və xurma halvası hazırladılar. Və bu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) toy ziyafəti oldu." (Müslim / 1365).

14- Əbu Musə əl-Əşari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kənizini azad edib onunla evlənmək haqda belə dediyini rəvayət edir: "Onun iki savabı vardır," (Müslim / 154).

## On birinci fəsil: Şiğar nigahı haqda.

15-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəva yət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Şiğar nigahını qadağan etdi. Şiğar aralarında mehir olmamaq şərti ilə bir kişinin qızını başqasına, onun da qızını ona verməsi müqabilində nigah qılmasıdır." (Müslim / 1415).

## On ikinci fəsil: Muta (Siğə. Müvəqqəti) nigahı haqda.

16-Qeys belə rəvayət edir: "Abdullah ibn Məsudun (Allah ondan razı olsun) belə dediyini eşitdim: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşə çıxardıq. Bizim qadınlarımız yox idi. Bu səbəblə özümüzü axtalayaqmı , deyə soruşduqda bizə bu qadağan edildi. Sonra bizə bir paltar müqabilində , müəyyən bir müddətə , bir qadınla evlənməyə izn , rüxsət verildi. Sonra Abdullah bu ayəni oxudu: "Ey iman gətirənlər! Allahın sizə halal buyurduğu pak nemətləri haram etməyin və həddi aşmayın. Doğrudan da, Allah həddi aşanları sevməz!" (Müslim/1405).

17- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) , Abu Bəkir zamanında bir ovuc xurma və un müqabilində muta edirdik. Hətta , Ömər ibn əl-Xattab öz əmirliyi dövründə Amr ibn Hureysə görə bunu qadağan etdi." (Müslim / 1405).

## On üçüncü fəsil: Muta (Siğə. Müvəqqəti) nigahının hökmünün ləğvi.

18-Əli ibn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybər günü Muta (Siğə. Müvəqqəti) nigahını və ev eşşəyinin ətini yeməyi qadağan etdi." (Müslim / 1408).

19-ər-Rabi ibn Səbra belə rəvayət edir: "Atası Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Məkkənin fəthi günü döyüşə çıxmışdı. Orada on beş (gecələri də saysa , otuz) gün qaldıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə qadınlarla siğə etməyə izn verdi. Mən ğövmümdən olan bir kişi ilə çıxdım. Mən ondan gözəlliyimə görə üstün idim. Onda bir az çirkinlik vardı. Bizim hər birimizin əynində əbası vardı. Lakin mənim əbam köhnə , əmim oğlunun əbası isə təptəzə bir şey idi. Nəhayət Məkkənin aşağı və ya yuxarı küçələrinin birində uzun boylu dişi dəvə kimi bir qızla rastlaşdıq. Ondan: "Bizdən birimizlə siğə edərsənmi?" deyə soruşduq. O: "Nə verəcəksiniz?" dedikdə, hər birimiz öz əbasını çıxarıb sərdi. Qadın hər iki kişiyə baxmağa başladı. Yoldaşım qadının mənim yanıma baxdığını görüncə: "Onun əbası köhnədi , mənim əbam isə təptəzədir" dedi. Qadın isə iki və ya üç kərə: “Onun əbasında bir eyb yoxdur” dedi. Sonra mən onunla siğə etdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu haram edincəyə qədər yanından çıxmadım." (Müslim /1406).

20- Səbura əl-Cuhani (Allah ondan razı olsun) belə rəvayət edir: "O , Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə ikən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey insanlar , mən sizə qadınlarla siğə etməyə izn vermişdim, artıq Allah Təala onu qiyamətə kimi haram etmişdir. Bu gün sizlərdən kiminsə yanında bu cür qadın varsa , onu buraxsın və ona verdiyiniz şeylərdən heç nəyi götürməsin." (Müslim / 1406).

## On dördüncü fəsil: Ehramda olan kimsəyə nigahlanması və nişanlanmasının haram olması.

21-Nubeyh ibn Vahb belə rəvayət edir: "Ömər ibn Ubeydullah Talha ibn Öməri Şeybə ibn Cubeyrin qızı ilə evləndirmək istədi və Əban ibn Osmanın bu niğahda olması üçün dalınca adam göndərdi. O , həccdə əmir idi. Əban belə buyurdu: "Osman ibn Affanın belə dediyini eşitmişəm: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ehramda olan kəsə nə nigah qılınnaz, nə də ki , o nigah qıla bilər və nə də nişan (elçi) göndərə bilər." (Müslim / 1409).

22-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Meymunə ilə ehramda ikən evləndi." (Müslim/1410).

23-Yezid İbn əl-Əsam belə rəvayət edir: "Meymunə bintu əl-Həris mənə belə danışdı: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onunla halal olaraq (ehramdan çıxdıqdan sonra) evləndi." O , mənim və İbn Abbasın xalası idi." (Müslim / 1411).

## On beşinci fəsil: Qadınla bibisini və ya xalasını (birgə cəm edərək) evlənməyin haram olması.

24- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dörd qadını cəm edərək evlənməyi qadağan etdi: "Qadınla bibisini və qadınla xalasını." (Müslim / 1408).

## On altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlarına verdiyi mehr haqda.

25-Əbu Sələmə ibn Abdurrahman belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişədən (Allah ondan razı olsun): "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mehri nə qədər idi?" deyə soroşdum. O: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrinə mehri on iki Uqiyyə və bir Nəşş idi" deyə buyurdu və məndən: "Nəşşin nə olduğunu bilirsənmi?" deyə məndən soruşdu. Mən: "Xeyr" deyə cavab verdiyimdə , belə buyurdu: "yarım Uqiyyə. Və onunla beş yüz dirhəmdir. Bu , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrinə verdiyi mehrdir." (Müslim / 1426).

## On yeddinci fəsil: Nüvat (Ərəblərdə miqdar bildirrən bir ölçü) miqdarında qızılla nigah gılmaq.

26-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbd ər-Rahman ibn Ovfun üzərində sarı boya izini gördü və ondan belə soruşdu: "Bu nədir?" O: "Ey Allahın Elçisi , bir qadınla Nüvat (Ərəblərdə miqdar bildirrən bir ölçü) miqdarında qızılla nigah gılmışam." deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə dedi: "Allah sənə bərəkət versin (Allah mübarək etsin) Bir qoyun da olsa belə toy ziyafəti ver!" (Müslim / 1427).

## On səkkizinci fəsil: Mehrin Quran öyrətmək olması şərti ilə evlilik.

27-Səhl ibn Saad əs-Saidi (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə bedi: "Ey Allahın Elçisi , nəfsimi sənə hədiyyə etmək üçün gəlmişəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başını qaldıraraq qadını yuxarı , aşağı süzdükdən sonra başını aşağı saldı. Qadın onun haqda bir hökm verilmədiyini gördükdə , oturdu. Əshabından bir kişi qalxaraq ona belə dedi: "Ey Allahın Elçisi , əgər sənin ona ehtiyacın yoxdursa , məni onunla evləndir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Sənin (mehr verməyə) nəsə bir şeyin varmı?" deyə soruşdu. O: "Allaha and olsun ki, yox , ey Allahın Elçisi" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Əhlinin yanına get , bax gör nəsə tapırsan!" deyə buyurdu. Kişi getdi və qayıtdıqda: "And olsun Allaha ki, heç nə tapmadım" deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona : "bax , heç olmasa , dəmir bir üzük olsun!" deyə buyurdu. Kişi getdi və qayıtdıqda belə bedi: "Ey Allahın Elçisi , Allaha and olsun ki, dəmir üzük də yoxdur. Lakin bu , mənim izarımdır , (Səhl: "onun Ridası yox idi" demişdir) yarısını onun olsun." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "İzarınla nə edəcək? Sən onu geysən , onun əynində ondan bir şey olmaz. O onu geysə , sənin əynində ondan bir şey olmaz." Kişi oturdu , məclis uzandıqda durdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun çönüb getdiyini gördükdə, onu çağırmağı əmr etdi və onu çağırdılar. Gəldiyində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Qurandan nə bilirsən?" deyə soruşdu. Kişi: "Bu surəni və bu surəni" deyərək saydı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Onları əzbərdən bilirsən?" deyə yenə soruşdu. O: "Bəli" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Get , sənə əzbər bildiyin Quranla qadını (verdim, sahib etdim) evləndirdim." (Müslim / 1425).

## On doqquzuncu fəsil: Allah Təala buyurur: "Onlardan istədiyini təxirə salar"

28-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən özlərini Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədiyə edən qadınları ayıblayar, “Qadın da özünü hədiyyə edər?” deyərdim. Allah Təala bu ayəni nazil etdiyində: "Onlardan (zövcələrindən) istədiyini təxirə salar, istədiyini də öz yanına ala bilərsən. Ayırdığın övrətlərindən də istədiyini öz yanına qaytarmaqdan sənə heç günah gəlməz." ona belə dedim: “And olsun Allaha ki, Rəbbinin sənin arzunu həmən yerinə yetirdiyini görürəm." (Müslim /1464).

## İyirminci fəsil: Şəvvall ayında evlənmək.

29-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənimlə Şəvval ayında eyvləndi və mənimlə gərdəyə Şəvval ayında girdi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hansı qadını məndən daha xoşbəxt idi?" Ravi: "Aişə qohumlarından olan qadınların Şəvval ayında gərdəyə girmələrini sevərdi." (Müsluim /1423).

## İyirmi birinci fəsil: Nigahda toy ziyafəti.

30-Ənəs ibn Məlik (Allah ondan razı olsun) "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zeynəb üçün etdiyi kimi, heç bir qadınına daha əfzəl , daha çox toy ziyafəti vermədi." Səbit əl-Bunəni ondan: "Nə ziyafəti verdi?" deyə soruşduqda , o belə buyurdu: "Onlara çörək və ət ikram etdi , hətta doyub tərk etdilər və artıq qaldı." (Müslim / 1428).

31-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evlənərək ailəsinin yanına girdi. Bu münasibətlə anam xurma halvası düzəldərək bir qaba qoydu və mənə belə buyurdu: "Ey Ənəs , bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) apar və belə de: "Bunu sənə anam göndərdi və sənə salam deyir. Və deyir ki , bu bizim sənə verdiyimiz az bir şeydir." Mən onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) apararaq belə dedim: "anam sənə salam deyir. Və deyir ki, Ey Allahın Elçisi , bu bizim sənə verdiyimiz az bir şeydir " O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Onu yerə qoy! Get bir neçə kişinin adınını sayaraq filan kəsi və filan kəsi və filan kəsi və kiminlə rastlaşsan onları çağır gəlsinlər." Mən onun adlarını çəkdiyi və qarşılaşdığım kəsləri çağırdım." Mən Əsənsdən: "Sayınız nə qədər idi?" deyə soruşduqda, O "Üç yüzə qədər" deyə cavab verdi sonra isə belə dedi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə : "Ey Ənəs , qabı gətir!" deyə buyurdu. Dəvət olunanlar içəri daxil oldular , hətta dəhliz ilə otaq doldu." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara on-on halqa şəklində oturmalarını və hər kəsin öz qabağından yeməsini buyurdu. Onlar doyunca yedilər , və bir dəstə çıxdıqda , başqa bir dəstə daxil oldu və hamısı yedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə "Ey Ənəs , qabı qaldır!" deyə buyurdu. Mən qabı qaldırdığımda , yoxsa ki, qoyduğumda daha ağır olduğunu bilmədim. Bir dəstə insan Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evində oturaraq söhbət etməyə başladılar. Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oturmuşdu, zövcəsi isə üzünü divara çevirmişdi. Onlar Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əziyyət edirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bayıra çıxaraq qadınlarına salam verdi , sonra içəri qayıtdı. Onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qayıtdığını gördükdə , ona əziyyət etdiklərini anlayaraq qapıya doğru yürüyərək hamsı birdən çıxdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gələrərək pərdəni endirdi. İçəri daxil olduqda mən otaqda oturmuşdum. Bir az keçmədi ki, yanıma çıxdı və bu ayə nazil olmuşdu: "Ey iman gətirənlər! Peyğəmbərin evlərinə sizə yeməyə icazə verilmədən girib onun bişməsini gözləməyin. Lakin dəvət olunduqda gedin və yedikdən sonra söhbətə qapılmayıb dağılın. Bu , Peyğəmbərə əziyyət verir, amma o sizdən utanırdı. Lakin Allah doğru sözdən çəkinməz. Onlardan bir şey soruşduqda, pərdə arxasından soruşun. Bu həm sizin, həm də onların ürəklərinə daha çox təmizlik bəxş edər. Sizə Allahın Peyğəmbərini incitmək, özündən sonra onun zövcələri ilə evlənmək əsla yaraşmaz. Həqiqətən, bu, Allah yanında böyük günahdır!" Caad belə rəvayər edir: "Ənəs belə demişdir: "Mən bu ayələrin birinci görənlərdən idim və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələri örtündülər." (Müslim / 1428).

## İyirmi ikinci fəsil: Nigaha dəvət olunduqda çağırışa cavab vermək (gəlmək).

32-Nəfi İbn Ömərdən (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deyərdi: "Bir toy ziyafətinə və ya başqa bir ziyafətə qardaşınz sizi çağırdıqda , həmən onun dəvətinə cavab verin." (Müslim / 1429).

33-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən biriniz dəvət olunarsa , dəvət olunan yərə getsin. Əgər oruc tutmuşsa (dəvət edən üçün) dua etsin, oruclu deyilsə , yesin" (Müslim/1431).

34-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ən şər yemək toy ziyafətinin yeməyidir. Ona gəlmək istəyənlər (kasıblar) çağrılmaz, gəlməyənlər (varlılar) dəvət olunar. Kim dəvəti qəbul etməzsə , artıq Allah və Rəsuluna asi olmuş olar." (Müslim / 1432).

## İyirmi üçüncü fəsil: Cima (cinsi əlaqə) etməzdən əvvəl edilən dua.

35-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizdən biriniz qadınına yaxınlaşmaq istədikdə belə desin: "Bismilləh! Allahummə Cənnibnə əş-Şeytan və Cənnib əş-Şəytanə mə razaqtənə" (Allahın adı ilə! Allahım , bizi şeytandan uzaqlaşdır! Şeytanıda bizə bəxş etdiyindən uzaqlaşdır!") bu əlaqədən övlad doğulması Allahın qədəri ilə təqdir olsa, ona şeytan əbədiyyən zərər verə bilməz." (Müslim / 1434).

## İyirmi dördüncü fəsil: Allah Təla buyurur: "Qadınlarınız sizin tarlanızdır"

36- İbn Munkədir Cabirin (Allah ondan razı olsun) belə deyərkən eşitdiyini rəvayət edir: "Yahudilər: "Kişi qadınının arxa tərəfdən qabağına (övrətinə) cima edərsə , ondan döğulan övladın çəpgöz olacağını deyirdilər və bu ayə nazil oldu: "Qadınlarınız sizin (övlad əkdiyiniz) tarlanızdır. İstədiyiniz vaxtda öz tarlanıza gəlin!" (Müslim /1435).

## İyirmi beşinci fəsil: Ərinin döşəyinə gəlməsindən imtina edən qadın haqda.

37-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kişi qadınını döşəyinə çağırdıqda, qadın imtina edərsə və kişi gecəni ona gəzəbli halda keçirərsə, qadını mələklər sabaha qədər lənətlər." (Müslim / 1436).

## İyirmi altıncı fəsil: Qadının sirrini yaymaq.

38-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qiyamət günü Allah dərgahında ən şərli olan, bir kişinin qadınına, qadının da ona açındıqdan (əlaqə, yaxınlıq etdikdən) sonra onun sirrini yayan kəsdir." (Müslim / 1437).

## İyirmi yeddinci fəsil: Allah Təalanın qulunun (pis) əməlini (eybini) örtməsi, qulun isə özünü onu açması haqda.

39-Əbu Hüreyrə (Allah ondan razı olsun) rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdim: "Ümətimin hamısı

bağışlanacaqdır. Yalnız izhar edənlərdən başqa. Qulun izhar etdiyindən də, gecə etdiyi bir əməldir ki, sabahladıqda Rəbbi onun eybini örtər. O isə: "Ey filankəs dünən gecə belə və belə etmişəm" deyər. Artıq Rəbbi onu örtdüyü halda gecələmişdir. Rəbbi onu örtdüyü halda gecələyir. Sabahladıqda isə Allahın onun üçün örtdüyünü açıb danışır." (Müslim / 2290).

## İyirmi səkkizinci fəsil: Qadından və kənizdən Əzl (övlad olmaması məqsədi ilə cinsi əlaqə zamanı spermanı bayıra tökmək) etmək.

40- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əzl zikr edildiyində, O belə soruşdu: "Onu niyə edirsiniz?" onlar belə cavab verdilər: "Qadını süd əmizdirən olan bir kişi qadını ilə cinsi əlaqədə olduqda , ondan hamilə qalmasını istəmir, həmçinin kənizi olan bir kişi onunla cinsi əlaqədə olduqda ondan hamilə qalmasını istəmir." O belə buyurdu: “Sizin belə etməməyiniz üçün heç bir şey yoxdur. Çünki , bu qədərdir." İbn Ovn belə demişdir: "Bu hədisi əl-Həsənə danışdıqda belə buyurdu: "And olsun Allaha , bu söz sanki qadağan etməyə bənzəyir." (Müslim / 1438).

41-Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Mənim bir kənizim var və mən ondan əzl edirəm" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə cavab verdi: "Sənin belə etməyin Allahın istədiyi heç nəyin qabağını almaz." (Bir müddət sonra) Kişi gələrək Ona belə dedi: "Ey Allahın Elçisi , kənizim hamilə qaldı" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Mən Allahın qulu və Elçisiyəm" dedi (Müslim / 1439).

## İyirminci doqquzuncu fəsil: Ğeylə (kişi , qadını hamilə ikən onunla cinsi əlaqəyə girməsi) haqda.

42- Ukaşanın (Allah ondan razı olsun) bacısı Cudamə bintu Vahb əl-Əsədiyyə belə rəvatət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir dəstə insanın arasında danışarkən orda idim. O belə buyurdu: "Könlümdən ğeyləni qadağan etmək keçdi, amma rumlulara və farslara baxdım, gördüm ki, onlar övladlarını (ana bətnində ikən) ğeylə edirlər lakin bu onların övladlarına zərər toxundurmur." Sonra ondan Əzl haqda soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu , uşağı gizlicə məzara soxmaqdır." (Müslim / 1442).

## Otuzuncu fəsil: Əsir olan hamilə qadınla cinsi əlaqədə olmaq.

43-Əbu əd-Dərda (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir çadırın qapısında doğmaq üzərə olan bir qadının yanına gəldi. Və: "Deyəsən , bu adam onunla cinsi əlaqədə olmaq isdəyir?” Deyə soruşdu. Əshabından: "Bəli" cavabı verildikdə, belə buyurdu: "Könlümdən onu qəbrinə girəcək bir lənətlə lənətləmək keçdi. Bu adam , ona halal olmadığı halda , onu (uşağı) özünə necə mirasçı edər. Ona halal olmadığı halda onu özünə necə xidmətçi edər." (Müslim / 1441).

44-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Huneyn günü Evtasa ordu göndərdi. Düşmənlə qarşılaşdıqda onlarla döyüşə girdilər və onlara gələbə çaldılar. Və onlardan əsirlər qənimət olaraq götürdülər. Sanki Peyğəmbərin (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) əshabından bir dəstə insan müşrik ərləri olan əsir qadınlarıyla əlaqədə olmaqdan çəkinmişdilər. Və Allah Təala bu ayəni nazil etdi: "Sahib olduğunuz (cariyələr) müstəsna olmaqla, ərli qadınları almaq Allahın yazısı (hökmü) ilə sizə (haram edildi)." Yəni iddələri (gözləmə müddəti, heyzdən pak olma müddəti) bitdikdən sonra sizə halaldır."

### Otuz birinci fəsil: Qadınlar arasında ədalət (bölgü).

45-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) doqquz zövcəsi vardı. Onlar arasında bölgü etdikdə , birincinin yanına ancaq doqquzuncudan sonra gələrdi. Biz hər gün onun olduğu bir evədə yığışardıq. Bir gün Aişənin (Allah ondan razı olsun) evində idik. Zeynəb gəldi və əlini ona tərəf uzatdı. Aişə ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu , Zeynəbdir , dedikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlini çəkdi. Onlar (iki qadın) yüksək səslə danışmağa başladıqda səsləri qarışdı. Bu sırada azan oxundu. Əbu Bəkr (Allah ondan rzı olsun) onların yanından keçərkən səslərini eşitdi və Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , namaza çıx və onların ağzına torpaq tök" dedi. Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza çıxdı. Aişə (Allah ondan razı olsun) belə dedi: "İndi Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirəcək və Əbu Bəkir (Allah ondan razı olsun) gəlib mənə etdiyini edəcək." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazını bitirdikdə Əbu Bəkir (Allah ondan razı olsun) gəlib: "Sən belə edirsən?” deyə onu ağır sözlərlə acıladı." (Müslim / 1462).

### Otuz ikinci fəsil: Dul və bakirənin yanında (gərdəyə girdikdən sonra nə qədər) qalmaq.

46-Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ummu Sələmə ilə evləndikdə , onun yanında üç gün qaldı və belə buyurdu: "Şübhəsiz ki, sən əhlimdən əksik deyilsən, istərsən , səninlə də yeddi gün qalaram. Amma səninlə yeddi gün galsam , digərləri üçün də yeddi gün edərəm." (müslim / 1460).

47- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "(bir adam) Bakirəni dulun üzərinə alarsa , onun yanında yeddi gün qalar, dulu bakirənin üzərinə alarsa , onun yanında üç gün qalar." Xalid belə buyurmuşdur: "Bunu Mərfu olaraq (yəni Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)) nəql etdiyini desəm , düz demiş olaram. Lakin o: "Sünnət belədir" deyə buyurdu" (Müslim \ 1461).

### Otuz üçüncü fəsil: Qadının öz gününü başqasına hədiyyə etməsi.

48-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Mənim onun yerində olmağımı istədiyim və mənə ən sevimli , möhkəm iradəli (qüvvətli) olan Sovda bintu Zəmət kimisini görmədim. O , yaşlaşdıqda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında olduğu öz gününü Aişəyə vermişdi. O: "Ey Allahın Elçisi , günümü Aişəyə vermişəm" deyə buyurdu. Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Aişə üçün iki gün ayırardı: "Aişənin və Sovdanın gününü." (Müslim / 1463).

### Otuz dördüncü fəsil: Bəzi qadınlar arasında bölgü etməyin tərk olunması.

49-Ata belə rəvayət edir: "İbn Abbasla (Allah onların hər ikisindıən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Meymunənin (Allah ondan razı olsun) Sarif deyilən yerdə cənazəsində iştirak etdim. İbn Abbas belə buyurdu: "Tabutu qaldırdığınız zaman silkələməyin , yellətməyin, yumüşaq (rahat) tutun. Sübhəsiz , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) doqquz zövcəsi vardı , onlar arasında bölgü edər , yalnız birinə bölgü etməzdi." Ata: "Arasında bölgü etmədiyi :"Safiyyə bintu Huyeyyə ibn Axtab idi.” (Səhih budur ki , bu , xatadır bölgü etmədiyi Sovda idi.)." (Müslim / 1465).

## Otuz beşinci fəsil: Qadın görmüş bir kimsə , nəfsində olanı dəf etmək üçün , qadınına gəlsin (qadını ilə yaxınlıq etsin).

50-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir qadın gördü və zövcəsi olan Zeynəbin ona aid olan bir dərini sürtdüyü (aşıladığı) zaman yanına gəldi və ehdiyacını ödədikdən sonra çıxaraq belə buyurdu: "Həqiqətən , qadın Şeytan simasında gələr və Şeytan simasında gedər. Sizlərdən biri bir qadın gördükdə, əhlinin yanına gəlsin! Çünki , bu , nəfsində olanı dəf edər."

## Otuz altıncı fəsil: Qadılarala müamələ və onlarla yaxşı rəftar etməyi tövsiyyə etmək.

51-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər kim Allaha və Axirət gününə iman etmişşə , bir işə şahid olduqda ya xeyir desin , yada ki, sussun. Qadınlarla yaxşı rəfrtar etməniz haqda vəsiyyətimi qəbul edin! Çünki qadın əyri bir qabığadan xəlq edilmişdir. Qabırğanın ən əyri yeri də ən üst yeridir. Onu düzəltmək istəsən , sındırarsan. Elə tərk etsən də əyri qalar. Qadınlarla yaxşı rəfrtar etməniz haqda vəsiyyətimi qəbul edin!" (Müslim / 1466).

## Otuz yeddinci fəsil: Mömin kişi, mömin qadına nifrət etməsin.

52- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Mömin kişi, mömin qadına nifrət etməsin! Onun əxlaqından (xasiyyətindən) bir şeyi bəyənməzsə , başqa bir əxlaqını (xasiyyətini) bəyənər." Yaxud "başqa birini bəyənər" buyurdu." (Müslim / 1469).

## Otuz səkkizinci fəsil: Əgər Həvva olmasaydı ,(yəni ağacdan yediyi üçün ,burada zina nəzərdə tutulmur) indi heç bir qadın ərinə xəyanət etməzdi.

53-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Əgər bəni İsrail olmasaydı , yemək xarab olmazdı və ət iylənməzdi. Və əgər Həvva olmasaydı , indi heç bir qadın ərinə xəyanət etməzdi." (Müslim / 1471).

## Otuz doqquzuncu fəsil: Səfərdən qayıdan kəs ailəsinin dağılmış saçlarını darayıb düzən verməsini gözləsin və yanına girməyə tələsməsin.

54- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşlərin birində idik. Qayıtdığımız zaman mən yavaş gedən bir dəvəmə minərək tələsik davrandım. Arxamda bir suvari mənə çataraq dəvəmi əlindəki nizə ilə dürtdü. Bunun üzərinə dəvəm , görmüş olduğun ən yaxşı dəvələr kimi getməyə başladı. Çevrildiyimdə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çatdığımı gördüm. Məndən: "Ey Cabir , səni tələsdirən nədir?" deyə soruşdu . Mən: "Ey Allahın Elçisi , mən təzə evlənmişəm" deyə cavab verdikdə, belə soruşdu: "Bakirə , ya dul almısan?" Mən: "Yox , dul almışam , Ey Allahın Elçisi." deyə cavab verdim. O belə buyurdu: "Kaş ki , bakirə qız alsaydın , sən onunla və o da sənlə oynaşardınız." Mədinəyə çatdığımızda əhlimizin yanına girmək istədik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə buyurdu: "Tələsməyin və yanlarına gecə girin ki, dağılmış saçlarını darayıb düzən versinlər, əri evdə olmayan qadın övrətini təmizləsin." Sonra isə belə buyurdu: "Gəldiyində ağılla davran, ağılla davran (yəni cinsi əlaqəyə girməzdən əvvəl bax ki , heyz halında olmasın)."

# Talaq (böşanma) Kitabı

## Birinci fəsil: Kişi qadını heyz halında ikən onu böşaması.

1- Nəfi belə rəvayət edir: "İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Arvadını heyz halında ikən böşadı. Ömər (Allah ondan razı olsun) bu haqda Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruşduqda , O , ona arvadını qaytarmağı və yenidən heyz olacağı vaxta kimi saxlamsını, sonra təmizlənəcəyi vaxta kimi saxlamasını , sonra onunla cinsi əlaqədə olmadan boşamasını əmr etdi. "Qadınları boşayarkən Allah Təalanın əmr etdiyi İddə budur" dedi. İbn Ömərdən bir kişinin qadınını heyz halında böşadığını soruşduqda belə buyurdu: "Amma sən onu bir və ya iki kərə boşamısan. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona arvadını qaytarmağı və yenidən heyz olacağı vaxta kimi saxlamsını, sonra təmizlənəcəyi vaxta kimi saxlamasını , sonra onunla cinsi əlaqədə olmadan boşamasını əmr etdi. Sən isə arvadını boşamaqda Rəbbinin əmrinə asi olmusan və qadının səndən ayrılmışdır artıq." (Müslim / 1471)

2- İbn Sirin belə rəvayət edir: "(yalançılıqda) ittiham etmədiyim biri mənə iyirmi ildir danışır ki, İbn Ömər (Allah onların hər ikisindən razı olsun) arvadını heyizli ikən üç Talaqla boşayıb və ona onu qaytarmaq əmr olunub." Mən onları ittiham etmir və hədisi də bilmirdim. Hətta Əbu Ğəlləb ibn Yunus ibn Cubeyr əl-Bəhili ilə qarşılaşdım. O düzgün (sabit) biri idi. Mənə bunu İbn Ömərdən soruşduğunu və ona belə dediyini danışdı: "O , arvadı heyz halında ikən , onu bir talaqla boşamış və ona onu qaytarmaq əmr olundu." Ondan: "Məgər bu halda ona talaq sayılırmı?" deyə soruşduqda belə buyurdu: "Nə demək! Məgər insan aciz və axmaq olduğunda , ondan talaq qalxarmı?!" (Müslim / 1471).

## İkinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında talağın üç olması.

3- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında , sonra Əbu Bəkrin və iki il Ömərin xilafətində üç talaq bir sayılırdı. Sonra Ömər ibn əl-

Xattab belə buyurdu: "İnsanlar onlara möhlət verilmiş bir işdə tələsirlər. Kaş ki, bunu onlara tətbiq etsək də" deyib, onlara bunu tətbiq etdi." (Müslim / 1472).

## Üçüncü fəsil: Bir kişinin zövcəsini boşadıqdan sonra başqası onunla evlənərək onunla cinsi əlaqədə olmadan (böşarsa) qadın birinci ərinə qayıda bilməz.

4- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Rifaə əl-Qurazi arvadını üç Talaqla boşadı və gözləmə müddəti bitdikdən sonra qadın Əbd ər-Rahman ibn Zubeyrlə evləndi. Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi mən Rifaənin nigahının altında idim, məni üç talaqla boşadı. Ondan sonra Əbd ər-Rahman ibn Zubeyrə ərə getdim. Amma ondakı paltarın bir saçağı kimidir" deyib paltarının ətəyindən bir saçaq qopartı." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülümsəyərək ona: "Yəqin sən Rifayəyə qayıtmaq istəyirsən?! Xeyr , hətta , o sənin ballıcandan, sən də onun ballıcasından dadmıyınca , olmaz" deyə buyurudu! Əbu Bəkir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında oturmuşdu. Xalid ibn Valid və Səid ibn əl-Ass isə girməsinə icazə verilmədiyi üçün otağın qapsında oturmuşdu. Xalid Əbu Bəkiri çağıraraq belə deməyə başladı: "Ey Əbu Bəkir , niyə bu qadını Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) önündə açıq aşkar danışmaqdan çəkindirmirsən!" (Müslim / 1433).

## Dördüncü fəsil: Zövcəni özünə haram etmək, Allah Təala buyurur: "Ya Peyğəmbər! Zövcələrinin (səndən) razı qalmasını diləyərək Allahın sənə halal etdiyi şeyi (dünya ləzzətini) niyə özünə haram (qadağan) edirsən?" və onun ixtilaf olmağı.

5- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) qadınını özünə haram etmiş bir kişi haqda belə buyurmuşdu: "Bu , bir anddır və kəffarəsini verir! Həqiqətən, Allahın Rəsulu sizin üçün gözəl örnəkdir!" (Müslim / 1473).

6- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zeynəb bintu Cəhşin yanında dayanaraq bal içərdi. Mən və Hafsa Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hansımızın yanına girdiyində "səndən Məgafir (şirin lakin pis iyli bir şey) iyi gəlir, Məgafir yemisən?" deməyə razılaşdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ikimizdən birinin yanına giridiyində ona bu söz deyildi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) " Zeynəb bintu Cəhşin yanında bal içmişəm. Bir də buna qayıtmaram." deyə buyurdu və Allah Təala bu ayəni nazil etdi: "Ya Peyğəmbər! Zövcələrinin razı qalmasını diləyərək Allahın sənə halal etdiyi şeyi niyə özünə haram edirsən?" bu ayəyə kimi: "Əgər ikiniz də Allaha tövbə etsəniz" yəni Aişə və Hafsa." Bir zamanda Peyğəmbər öz zövcələrindən birinə gizli bir söz demişdi" yəni: "Bal içmişəm deməsi" (Müslim / 1473).

7- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şirin şey və bal xoşlayardı. Əsr namazını qıldıqdan sonra qadınlarını dolaşar onlarla yaxınlıq edərdi. Bir dəfə Hafsanın yanına daxil oldu və onun yanında əvvəl qaldığından çox dayandı. Bu barədə soruşduğumda mənə: "Hafsaya qövmündən olan bir qadın bir qab bal hədiyyə etmişdir , o da bundan Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir şərbət təqdim etmişdir." Bunun üzərinə mən: "Allaha and olsun ki, mən ona bir hiylə işlədəcəyəm" deyərək bunu Sövdaya xatırlatdım və belə etməsini buyurdum:"O , yanına girdiyində sənə yaxınlaşmaq istədikdə ona:

"Ey Allahın Elçisi, sən Məgafir yemisən? " deyə soruş. O: "Xeyr" deyə cavab verəcək. Onda sən ondan: "Bu pis iy nədir?" deyə soruş. Çünki Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) pis iy ağır gəlir. Sənə: "Mən Hafsanın yanında bal şərbəti içmişəm" deyəcək. Onda sən: "Yəqin arı bu balı əl-Urfatdan (Məğqafir kimi pis iyli ağac) yığmışdır. Mən də ona bu cür deyəcəm. Sən də belə söylə , Ey Safiyyə." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sövdanın yanına girdi. Sövda belə deyir: "Ondan başqa haqq məbud olmayana and olsun ki, sənin qorxun olmasaydı , O hələ qapıda ikən , sənin mənə dediyini ona deyəcəkdim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona yaxınlaşdığında Sövda ona belə dedi: "Ey Allahın Elçisi , sən məgafir yemisən? O: "Xeyr" deyə cavab verdi. O: "Bu pis iy nədir?" deyə soruşdu? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "mən Hafsanın yanında bal şərbəti içmişəm "deyə cavab verdi. O: "Yəqin arı bu balı əl-Urfatdan (Məğqafir kimi pis iyli ağac) yığmışdır" deyə söylədi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim yanıma girdiyində , mən də eyni ilə dedim. Sonra Safiyyənin yanına girdiyində , o da eyni ilə dedi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hafsanın yanına daxil olduğunda , Hafsa ona: "Sənə bundan süzümmü" deyə soruşduqda , o: "Mənim ona ehtiyacım yoxdur!" deyə buyurdu. Aişə: "Sövda: "Subhən Allah! Ona bunu haram etdik" dedikidə mən ona: "Sakit qal" deyə buyurdum." (Müslim/1474).

## Beşinci fəsil : Kişinin qadına seçim verməsi.

8- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Əbu Bəkr (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına girməyə izn almaq üçün içəri daxil oldu. Qapıda oturmuş bir dəstə adam gördü. Onların heç birinə izn verilməmişdi. Əbu Bəkrə izn verildi və O içəri keçdi. Sonra Ömər (Allah ondan razı olsun) gəldi və ona izn verildi. Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ətrafında qadınları olduğu halda , kədərli , susmuş oturduğunu gördükdə o : "Elə bir şey söyləyəcəyəm ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bununla güləcək." deyib belə buyurdu: "Ey Allahın Elçisi , Xaricənin qızını görsəydin , məndən ona nəfəqə (mal –mülk sərf etməmi) verməmi istəyir. Mən də onun boğazını sıxdım" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülümsünərək “Bu ətarafımdakılar da məndən nəfəqə verməmi istəyir." deyə buyurdu. Əbu Bəkr qalxaraq Aişənin, Ömər də qalxaraq Hafsanın boğazından yapışıb sıxaraq ikisi də belə dedilər: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onda olmayan bir şeyi istəyirsiniz." Onlar: "Allaha and olsun ki, biz Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onda olmayan bir şeyi istəmərik." dedilər və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlardan bir ay və ya iyirmi doqquz gün ayrı qaldı. Sonra isə bu ayə nazil oldu: "Ya Peyğəmbər! zövcələrinə belə de" hətta bu ayəyə çatdı: "Allah içərinizdən yaxşı işlər görənlər üçün böyük bir mükafat hazırlamışdır." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Aişədən başlayaraq belə buyurdu: "Ey Aişə , sənə ata və ananla müşavirə etmədən tələsik cavab verməni istəmədiyim bir məsələni sənə ərz etmək istəyirəm." Aişə: “Ey Allahın Elçisi , o nədir?" deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona bu ayəni oxudu. Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Sənin haqda , Ey Allhın Elçisi , ata və anamlamı məsləhətləşəcəm? Xeyr , mən Allahı, onun Rəsulunu və axirət həyatını seçirəm. Və səndən dediyin bu şeyi qadınlarının

heç birinə xəbər verməməni istəyirəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Onlardan hər hansı bir qadın məndən bunu soruşsa , ona xəbər verəcəm , çünki Allah Təala məni çətinləşdirən və aldadan (bəhanə gətirən olaraq) göndərməyib. Lakin məni asanlaşdıran və öyrədən biri olaraq göndərmişdir." (Müslim / 1478).

9- Məsruq belə rəvayət edir: "Arvadım məni seçəndən sonra onu bir, yüz və ya min kərə seçim qarşısında qoymağım vecimə deyildir. Artıq bu haqda Aişədən (Allah ondan razı olsun) soruşduğumda , belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə seçim ərz etdi, məgər talaq idi?!" (Müslim / 1477).

## Altıncı fəsil: Allah Təala buyurur: “Əgər ona qarşı bir-birinizə kömək etsəniz”

10- Abdullah ibn Abbas (Allah onların hər ikisndən razı olsun) belə rəvayət edir: "Bir il Ömərdən bu ayə haqda soruşmaq üçün oturub gözlədim , lakin onun heybətindən qorxaraq bunu etmədim , nəhayət , o həccə çıxdığında onunla bərabər mən də çıxdım. Qayıdarkən  yolların birində ehtiyacını ödəmək üçün bir misvak ağacına tərəf üz tutdu. Mən onun ehtiyacını bitirməsini  gözlədim. Sonra onunla bərabər gedərkən ondan: "Ey möminlərin əmiri , Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrindən ona qarşı bir-birinə kömək edən kimlərdir? " deyə soruşdum . O: "Hafsa və Aişə " deyə cavab verdikdə, belə dedim: "Allaha and olsun ki, mən səndən bunu düz bir ildir ki, soruşmaq istəyirəm , lakin sənin heybətindən qorxaraq etməmişəm." O belə cavab verdi: "Belə etmə , məndə olacağını zənn etdiyin bir elm haqda məndən soruş. Onun haqda elmim varsa , sənə xəbər verərəm." Sonra isə belə buyurdu: "Allaha and olsun ki, biz cahillikdə qadınlara bir önəm qoymazdıq. Hətta Allah Təala onlar haqda endirdiyini endirdi və onlar üçün istədiyi bölgünü böldü. Bir dəfə mən özümdə bir işi fikirləşərkən , zövcəm "məni belə və ay belə etsən nə olar? " deyə söyləndi. Mən ona: "Sənə nə var bu işə qarışırsan! Mənim istədiyim işə niyə soxulursan! " dedikdə , belə dedi: "Sənə təəccüb edirəm , sən səninlə kəllə-kələyə gəlməsini istəmirsən. Halbuki, qızın Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o qədər kəllə-kələyə gələrdi ki, həmən günü o gəzəbli keçirərdi." Ömər (Allah ondan razı olsun) belə buyurdu: "Ridamı götürüb evimdən çıxdım və Hafsanın yanına gələrək ona belə dedim: "Ey qızcığazım , sən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kələ -kələyə gəlirsən , hətta bütün günü gəzəbli dolaşır?" Hafsa: "Allaha and olsu ki, biz ona cox müraciət edirik" deyə cavab verdikdə ona belə buyurdum: "Bilirsən ki , mən səni Allahın əzabından və Elçisinin qəzəbindən çəkindirirəm , qızcığazım! Nə badə səni , onun bəyəndiyi gözəlliyin və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənə olan sevgisinə güvənmən , aldatsın." Sonra çıxaraq  qohumlarımdan olan Ummu Sələmənin yanına girdim və mənə Ummu Sələmə belə buyurdu: "Sənə təəccüb edirəm , ey İbn əl-Xattab , hər bir şeyə garışdın. İndi də Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrinin arasında olana garışmaq istəyirsən?!” Onun sözü mənə elə təsir etdi ki ,özümdə hiss etdiyim hirsimi yatırtdım və mən onun yanından dərhal çıxdım. Mənin Ənsarlardan olan bir yoldaşım vardı mən olmayanda mənə xəbər gətirər, o olmayanda isə , mən ona xəbər çatdırardım. O günlər biz Ğassan hakimlərindən birindən qorxurduq. Bizə onun üzərimizə hücüm etmək istəməsi xəbəri gəlmişdi və sinəmiz ondan qorxu ilə dolmuşdu. Ənsar dostum gələrək qapını döydü və "Aç! Aç1! " deyə söyləndikdə, Mən: "Ğassan gəlib?" deyə ondan soruşdum. O, "Bundan daha pis bir şey olub , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrindən ayrılıb" dedikdə, Mən: "Aişə və Hafsanın burnu yerə sürünsün"

deyib paltarımı götürüb çıxdım və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim. Bir də baxdım ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yataq odasına nərdivanla qalxır. Qara köləsi isə nərdivanın başında dayanıb. Mən "Bu , Ömərdir" deyib izn istədim və ona hekayəni anlatdım. Ummu Sələmənin sözlərinə çatdıqda O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülümsədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həsirin üzərində oturmuşdu. Mənimlə onun arasında bir şey yox idi, başının altında içi lif dolu dəri bir yastıq vardı. Ayaqlarının yanında bir Qaraz (dərini aşlamaq üçün istifadə olunnan yarpaq) yığını vardı. Başının üzərində isə aşlanmamış dərilər asılmışdı. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yan tıərəfində həsirin qoyduğu izi görüncə ağladım. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən: "Niyə ağlayırsan? "deyə soruşduqda , belə dedim: "Ey Allahın Elçisi , Kisra və Geysar (hökümdar titulları) nələr içində yaşayırlar, sənsə nələr içində yaşayırsan?!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Dünya onlar üçün , axirət sənin üçün olmasına məgər razı deyilsən?" deyə buyurdu." (Müslim / 1479).

## İddə (gözləmə müddəti) Kitabı

### Birinci fəsil: Ərinin ölümündən sonra doğan hamilə qadın haqda.

1- Ubeydullah ibn Abdullah ibn Utba belə rəvayət edir: "Atası Ömər ibn Abdullah ibn əl-Arqam əz-Zuhriyə yazaraq ona Subeyə bintu əl-Həris əl-Əsləmiyyənin yanına girərək , ondan Onun hədisini və Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) fitva istədiyi zaman ona dediyi haqda soruşmasını əmr etdi! Və Ömər ibn Abdullah Abdullah ibn Utbəyə Səbuyyənin ona belə xəbər verdiyini yazdı: "O , Saad ibn Xovlənin nigahı altında idi. O , Bəni Amir ibn Luey qəbiləsindən idi. Bədir döyüşündə iştirak edənlərdən idi. Vida Həccində vəfat etdiyində , zövcəsi hamilə idi. Çox keçmədən o , doğmuşdu. Nifas müddəti bitdikdən sonra o , onu almaq üçün gələcək olan elçilər üçün bəzəndi. Yanına Bəni Əbdudar qəbiləsindən olan Əbu əs-Sənəbil ibn Bəkah daxil olduqda , onu bəzənmiş görüb belə dedi: "Bu nədi , səni bəzənmiş görürəm. Yəqin ki, nigahlanmaq istəyirsən? Allaha and olsun ki, sənin üçün dörd ay on gün keçməmiş nigah yoxdur!" Səbbiyə belə buyurdu: "Bunu mənə dedikdə gecə ikən paltarımı çıxartdım və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək , ondan bu haqda soruşdum. Mənə doğduğum andan halal olduğuma fitva verdi və mənə istərsəm ərə getməyimi əmr etdi." İbn Şihəb belə buyurmuşdur: "Qadın doğduğu andan , nifası içində olsa belə , ərə getməsində bir şey görmürəm. Lakin əri ona təmizlənənə kimi yaxınlaşmasın" (Müslim/1484).

### İkinci fəsil: Boşanmış qadının xurma ağacının bəhrəsini dərmək üşün çıxması.

2- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Xalamdan boşandılar. O xurma ağacının bəhrəsini dərmək üçün çıxmaq istədikdə bir kişi onu çıxmaqdan çəkindirdi. O da Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək , bu haqda soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Əlbəttə ki, çıx , xurma ağacının bəhrəsini dər. Bəlkə sən sədəqə verər və ya xeyirli bir iş tutmuş olarsan." (Müslim / 1483).

### Üçüncü fəsil: başanmış qadının öz nəfsi üçün qorxduqda evindən çıxması.

3- Fatimə binutu Qeys belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Ey Allahın Elçisi , ərim məni üç talaqla boşayıb. Zorla evə girərlər deyə , qorxuram" və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona oradan başqa evə köçməsini əmr etdi və o da köçdü." (Müslim / 1482).

4- Əbu Sələmə ibn Əbd ər-Rahman ibn Ovf Fatimə bintu Qeysin ona belə xəbər verdiyini rəvayət edir: "O Əbu Amr ibn Hafs əl-Mugiranın nigahı altında idi. Onu sonuncu üçüncü talaqla boşadıqdan sonra , o evindən çıxıb çıxmamaq haqda Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruşduğunu və o da ona gözləri görməyəm İbn Ummu Məktumun evinə köçməsini əmr etdiyini iddia etdi." Marvan boşanmış qadının evindən çıxması xəbərini təsdiq etməkdən imtina etdi." Urva belə demişdir: "Aişə (Allah ondan razı olsun) Fatimə bintu Qeysə bunu inkar etmişdir" (Müslim / 1480).

## Dördüncü fəsil: Boşanmış qadının iddə müddəti bitdikdən sonra evləndirilməsi.

5- Fatimə bintu Qeys (Allah ondan razı olsun) belə rəvayət edir: "Əri onu üç kərə boşadı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün nə yaşayış yeri , nə də bir nəfəqə (mal sərf etmək) vermədi. "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə halal olduğum vaxt ona bildirməmi buyurdu və mən də ona bildirdim." Müaviyə, Əbu Cəhm və Usamə ibn Zeyd ona elçi göndərdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Amma Müaviyyə kasıb kişidir, Əbu Cəhim isə qadınları çox döyəndir. Lakin sən Usama ibn Zeydi seç." O , əli ilə işarə edərək Usama İbn Zeydin yaxşı olmadığını bildirdi (çünki O qureyşdən Usama isə azad olunmuş qullardan idi). Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Allaha və Elçisinə itaət sənin üçün daha xeyirlidir" deyə buyurdu!" Fatimə belə buyurdu: "Mən onunla evlənərək qibtə olundum." (Müslim 1480).

## Beşinci fəsil: Ölən üçün yas tutamaqla İddə müddətini gözləmək və sürmə çəkməyi tərk etmək haqda.

6- Humeyd ibn Nəfi Zeynəb bintu Əbu Sələmənin ona bu üç hədisi belə xəbər verdiyini rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Ummu Həbibənin atası Əbu Sufyan vəfat etdiyində , yanına daxil oldum. Ummu Həbibə sarı boya qatışıqlı bir ətir, Xaluq (qatışıq ətir) və ya başqa bir şey istədi. Və ondan əvvəlcə bir cariyəyə sonra isə öz yanağına sürtdü və belə buyurdu: "Allaha and olsun ki, mən ətirə elə bir ehtiyac duymuram , lakin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərin üzərində belə dediyini eşitdim: "Allaha və qiyamət gününə iman etmiş qadına üç gündən artıq yas saxlamaq halal olamaz. Yalnız əri üçün dörd ay on gün saxlar." Sonra Zeynəb belə buyurdu: "Sonra Zeynəb bintu Cəhşin qardaşı vəfat etdiyidə , yanına daxil oldum. Ətir istəyərək ondan özünə sürtdü və belə buyurdu: "Allah and olsun ki, mən ətirə elə bir ehtiyac duymuram , lakin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərin üzərində belə dediyini eşitdim: "Allaha və qiyamət gününə iman etmiş qadına üç gündən artıq yas saxlamaq halal olamaz. Yalnız əri üçün dörd ay on gün saxlar." Sonra anam Ummu Sələmənin belə dediyini eşitdim: "Bir qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi , qızımın əri vəfat edib və gözündən şikayət edir. Ona sürmə çəkə

biləremmi? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə cavab verdi: "Xeyr" (bunu iki və üç kərə təkrar etdi və hər dəfə də, xeyr, dedi). Sonra isə belə buyurdu: "Bu iddə dörd ay on gündür. Halbu ki, sizlərdən biriniz cahiliyyə dövründə təzəki ilin sonunda atardı." Humeyd: "Mən Zeynəbdən: "Təzəki ilin sonunda atardı , nə deməkdir?" deyə soruşduqda, o belə buyurdu: "Qadın əri öldüyü zaman kiçik bir evə girər və ən pis paltarını geyərdi. Bir il keçənə kimi özünə ətir və ya başqa bir şey sürtməzdi. Bir ildən sonra isə , bir heyvan , eşşək və ya qoyun , yaxud da bir guş ilə ətirilər və onunla sürtünərdi. Əksər halda heyvan ölərdi. Sonra çıxar və ona təzək gətirilər və o onu atardı. Bundan sonra  istədiyi ətiri və ya başqa bir şeyi sürtə bilərdi" (Muslim / 1486, 1487,1488,1489).

### Altıncı fəsil: Yas saxlayan qadının ətir və boyanın tərk etməsi.

7- Ummu Atiyyə belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Qadın üç gündən artıq yas saxlamaz. Yalnız əri üçün dörd ay on gün saxlar. Yəmən parçası müstəsna , boyanmış paltar geyinməz, sürmə çəkməz və ətirlənməz. Yalnız təmizləndiyi vaxt (yəni heyzdən təmizləndiyi vaxt qanın iyini aparmaq üçün) bir parçacıq Qıst və əl-Əzfar (. Tüstü şəklində olan buxurlu ətirlər) sürtə bilər." (Müslim / 1491).

## Lənətlər Kitabı

### Birinci fəsil: Arvadının yanında başqa bir kişi görən haqda.

1- Sahl ib Saad əs-Saidi (Allah ondan razı olsun) belə rəvayət edir: "Uveymir əl-Əcləni Asim ibn Adiy əl-Ənsarinin yanına gələrək ona belə dedi: "Ey Asim , bir kişinin qadının yanında başqa bir kişini gördüyü zaman onu öldürməsinə necə baxırsan? Siz də onu öldürərsiniz, başqa nə etsin? Ey Asim , mənim üçün bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruş." Asim bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu sualları bəyənməmiş və onu eyb etmişdir. Hətta Asimə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdikləri ağır gəlmişdi. Asim əhlinin yanına qayıtdıqda , Uveymir onun yanına gələrək ondan: "Ey Asim , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nə söylədi?" deyə soruşduqda, Asim ona belə demişdir: "Sən mənə xeyir gətirmədin. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənin soruşduğun sualı bəyənmədi." Uveymir belə buyurdu: "Allaha ahd olsun ki, bunu ondan soruşmamış əl çəkməyəcəm." Uveymir yola qoyularaq gəlib insanların ortasında Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına çatdı və belə dedi: "Qadının yanında başqa bir kişini gördüyü zaman onu öldürməsinə necə baxırsan? Siz də onu öldürərsiniz, başqa nə etsin?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Artıq sən və zövcən haqda (ayə) nazil olub get onu gətir." Səhl belə demişdir: "Mən insanlarla Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında ikən onlar lənətləşdilər. Qurtardıqda Uveymir: "Ey Allahın Elçisi , mən onu saxlayacam desəm , ona yalan demiş olaram" deyib Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona əmr etmədən zövcəsini üç talaq deyərək boşadı." İbn Şihəb belə demişdir: "Bu , artıq lənət edənlərin sunnəti (adəti) olmuşdur." (Müslim /1492).

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Saad ibn Ubada (AlLah ondan razı olsun) belə soruşdu: "Ey Allahın Elçisi , əhlimin yanında başqa kişi tutduğumda dörd şahid gətirmədən ona toxunmayımmı?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Bəli" deyə cavab verdikdə, O belə buyurdu: "Əsla yox! Səni haqla göndərə and olsun ki, onu ondan qabaq qılıncımla doğrayaram." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ağanızın dediklərinə qulaq asın , o , qeyrətlidir. Mən ondan da qeyrətliyəm. Allah məndən də qeyrətlidir." (Müslim /1498).

3- Səid ibn Cubeyr belə rəvayət edir: "Musabın əmirliyi dövründə "lənətləşən kişi və qadının arasını ayıraqmı?" deyə soruşuldum . Mən nə deyəcəyimi bilmədim və İbn Ömərin (Allah onların hər ikisindən razı olsun) Məkkədəki evinə getdim. Xidmətçidən mənim üçün izn istəməsini söylədim! O: "O , yataraq dincəlir" deyə cavab verdikdə, səsimi eşitdi və belə soruşdu: "İbn Cubeyrsən?" Mən: "Bəli" deyə cavab verdikdə, O: "İçəri keç , Allaha and olsun ki, səni bu saatda gəlmənə vadar edən ehtiyacındır." deyə buyurdu və mən içəri daxil oldum. Onun altında yəhərin altına sərinilən bir keçə və başının altında isə içərisi liflə dolu bir yastıq vardı. Ondan: "Lənətləşən kişi və qadının arasını ayıraqmı?" deyə soruşdum . O belə cavab verdi: "Sübhən Allah! Bəli! Bu haqda ən birinci filankəsi oğlu filankəs soruşub və belə dedi: "Ey Allahın Elçisi , necə buyurursan , bizlərdən biri qadınını fahiş bir iş görərkən tutsa , onda nə etsin? Əgər bu haqda danışarsa böyük bir şey haqda danışmış olar, yox susarsa , yenə də belə bir şey haqda susmuş olar." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) susdu və ona cavab vermədi. Bir müddət sonra gələrək Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Səndən soruşduğum artıq başıma gəlib" və Allah Təala Nur surəsindəki bu ayələri nazil etdi: "Arvadlarına zina isnad edib" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona bu ayəni oxudu və nəsihət edib xatırlatdı. Dünya əzabının axirət əzabından yüngül olduğunu ona xəbər verdi. Kişi belə dedi: "Səni haqla göndərənə and olsun ki, onun haqda yalan demirəm." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadını çağıraraq ona nəsihət edib xatırlatdı. Dünya əzabının axirət əzabından yüngül olduğunu ona xəbər verdi." Qadın belə dedi: "Səni haqla göndərənə and olsun ki, o , yalan deyir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kişidən başladı və o Allaha sadiq olduğuna dörd kərə şəhadət etdi. Beşincidə isə , yalan deyirsə , Allahın lənəti onun üzərinə olmasını dedi." Sonra ikinci olaraq qadın başladı və Allaha dörd kərə şəhadət etdi ki o (kişi) yalan deyir. Beşincidə isə , o (kişi) dediyində sadiqdirsə , Allahın lənəti onun (qadının) üzərinə olmasını dedi." Sonra isə onları ayırdı." (Müslim / 1493).

4- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) lənətləşənlər haqda belə dediyini rəvayət edir: "İkinizində hesabatı Allahadır. İkinizdən biriniz yalançıdır. Sənin ona qarşı heç bir yolun (dəlilin) yoxdur. Kişi: "Ey Allahın Elçisi , bəs mənim malım nə olacaq?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Sənə malın yoxdur! Onun haqda dediyində sadiqsənsə , bu malın onunla aranda halal etdiyin əlaqənin əvəzidir. Yox yalan demisənsə , sənə bu mal ondan daha uzaqdır." (Müslim / 1493).

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında qadınını lənətlədi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onları ayırdı və övladı anaya verdi." (Müslim / 1494).

6- Muhamad-yəni İbn Sirin-belə rəvayət edir: "Bu işdən məlumatı olduğunu bildiyim üçün Ənəs İbn Məlikdən belə soruşdum və belə buyurdu: "Hilal ibn Umeyyə

arvadını Şureyk ibn Səhmə ilə zinada ittiham etdi. O əl-Bərə ibn Məlikin ana tərəfdən qardaşı idi. Və o , islamda ən  birinci lənətləşən adam idi. Onlar (kişi və qadın) lənətləşdilər və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Qadını izləyin , əgər ağ və düz saçlı, xarab (zəif) gözlü bir övlad dünyaya gətirərsə , o , Hilal ibn Umeyyənindir. Yox əgər sürmə gözlü, cılız, incə baldırllı bir uşaq dünyaya gətirərsə , O Şureyk ibn Səhmənindir." Belə xəbər aldım ki, o sürmə gözlü, çılız, incə baldırllı bir uşaq dünyaya gətirmişdir."  (Müslim / 1496).

## İkinci fəsil: Övladdan imtina etmək və irsin səbəb olması.

7- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir bədəvi ərəb Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi , qadınım qara oğlan doğub və mən onun mənim olmasından imtina etdim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Sənin dəvələrin varmı? Kişi: "Bəli" deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Onun rəngi nədir?" deyə soruşdu. Kişi: "Qırmızı" deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə: "Onun içərisində boz rənglisi varmı?" deyə soruşdu. Kişi yenə: "Bəli" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan yenə: "Bu onlara haradan keçib?" deyə soruşdu. Kişi: "Ey Allahın Elçisi , yəqin irs səbəbkardı" deyə ona cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyrdu: "Buna da yəqin irs səbəbkar olmuşdur." (Müslim / 1500).

## Üçüncü fəsil:  Övlad yataq sahibinə aiddir.

8- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Saad ibn Əbu Vaqqas və Əbd ibn Zəmə uşağa görə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında iddiaçı mubahisə etdilər. Saad belə buyurdu: "Ey Allahın Elçisi , bu uşaq qardaşım Utba ibn Əbu Vaqqasın oğludur. Onun oğlu olduğunu mənə vəsiyyət etmişdir. Onun  oxşarlığına bir bax. Əbd ibn Zəmə isə belə dedi: "Bu mənim qardaşımdır , atamın yatağında olan anasından doğulub." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun oxşarlığına baxdı və onunla Utba arasındakı bənzərliyi gördü , sonra isə belə buyurdu: "Ey Əbd , o sənindir , çünki övlad yataq sahibinindir. Zinakara isə daş vardır. Ey Sövda bintu Zəmə , sən də ona görünmə (onun yanında hicab geyin)!" Aişə (Allah ondan razı olsun): "O uşaq Sövdanı bir daha görmədi" deyə buyurdu" (Müslim / 1457).

## Dördüncü fəsil: Əl-Qafənin (Qafə- oxşarılq, iz bilən bənzərliyi seçən) sözünün qəbul olunması.

9- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sevinc içində yanıma daxil oldu və mənə belə buyurdu: "Ey Aişə , Mucəzzir əl-Mudcəlini görürsənmi , yanıma daxil olduqda Usama və Zeydi gördü. Onlar başlarını bir məxmər parça ilə bağlamışdılar. Başları örtülmüş ayaqları isə açıq qalmışdı. O (onları gördükdə) belə dedi: "Bu ayaqlar bir birindən əmələ gəlmişdir." (Müslim/1459).

# Süd əmizdirmək Kitabı.

Birinci fəsil: Doğum etibarı ilə haram olan şeylərin süd etibarı ilə də haram olması.

1- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanında ikən , o bir kişinin Hafsanın evinə girmək üçün izin isrədiyini eşitdi və Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , bu kişi sənin evinə girməyə izn istəyir" deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hafsanın süd əmisini qəsd edərək: "Onun Filankəs olacagını zənn edirəm" deyə buyurdu." Bunu üzərinə Aişə öz Süd əmisini qəsd edərək:" Ey Allahın Elçisi , filankəs sağ olsa idi , yanıma girə bilərdimi?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Bəli! Çünki süd doğumun haram qıldığı şeyləri haram qılar." deyə buyurdu." (Müslim / 1444).

İkinci fəsil: Südün haram etdiyinin kişinin mənisi etibarından olması.

2- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Süd əmim gələrək yanıma girməyə izn istədi. Mən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruşmadıqca onun yanıma girməsinə razılıq vermək istəmədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldiyində ona: "Süd əmimin gəldi və yanıma girmək üçün izn istədi. Mən onun yanıma girməsinə razılıq vermək istəmədim." deyə söylədim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Əmin Yanına girsin!" Mən: "Məni qadın əmizdirib , kişi yox" dedikdə, O belə dedi: "Həqiqətən , o əmindir və yanına girsin!" (Müslim /1445).

Üçüncü fəsil: Süd qardaşının qızı haram olması haqda.

3- Əli (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Ey Allahın Elçisi , nə üçün bizi buraxıb Qureyşi daha çox seçirsən? " (yəni onlardan evlənirsən) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sizdə bir şey varmı?" deyə soruşdu? Mən: "Bəli , Həmzənin qızı" deyə cavab verdiyimdə, O belə buyurdu: "O mənə halal deyildir. O mənin süd qardaşımın qızıdır." (Müslim/1446).

Dördüncü fəsil: Ögey qız ilə baldızın haram olması.

4- Ummu Həbibə bintu Əbu Sufyan (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma daxil oldu. Mən ona belə dedim: "Əbu Sufyanın qızı , bacımı istərsən?" O: "Onu nə edəcəm? " deyə soruşdu. Mən: "Evlənərsən" deyə cavab verdiyimdə, belə buyurdu: "Məgər bunu istəyirsən?" Mən: "Mən sənin bir dənən deyiləm və mənə xeyirdə bacımın şərik olmasını istərdim" deyə cavab verdim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O mənə halal deyil" deyə buyurdu! Mən: "Amma mən sənin Durrə bintu Əbu Sələməni istəmək istədiyini xəbər aldım." deyə söylədikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Ummu Sələmənin qızını deyirsən?" deyə soruşdu. Mən: "Bəli!" deyə cavab verdiyimdə belə buyurdu: "O mənim tərbiyəm altımda olan

ögey qızım olmasa belə , mənə halal deyildir. Çünki O  mənim süd qardaşımın qızıdır. Məni və atasını Suveybə əmizdidmişdir. Daha mənə qızlarınızı və bacılarınızı ərz etməyin!" (Müslim/1449).

## Beşinci fəsil: Bir və iki dəfə əmmək haqda.

5- Ummu Fadl (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evimdə ikən bədəvi bir çöl ərəbi yanına daxil oldu və belə dedi: "Ey Allhın Elçisi , mənim bir zövcəm vardı , onun üzərinə ikincisini aldım. Birinci arvadım ikincini bir və ya iki dəfə əmizdirdiyini söylədi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Bir və iki dəfə əmizdirmək haram etməz!" (Müslim/1451).

## Altıncı fəsil: Beş dəfə əmizdirmək.

6- Aişə (Allah ondan razı olsam) belə rəvayət edir: "Qurandan ən əvvəl nazil olan on dəfə əmizdirmək haram edərdi. Sonra isə beş dəfə ilə nəsx (hökmü ləğv oldu) olundu. Hətta Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdiyində , bu ayələr oxunurdu." (Müslim /1452).

## Yeddinci fəsil: Böyük adamın əmizdirilməsi.

7- Aişə (Allah ondan razı olsam) belə rəvayət edir: "Əbu Hüzeyfənin mövlası Səlim, Əbu Hüzeyfə və əhli ilə bir evdə qalırdı. Səhlə bintu Suheyl Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Səlim artıq yetkinlik yaşına çatıb və kişilərin ağlı dərk etdiyi şeyləri dərk edir və hələ də yanımıza daxil olur. Mən bundan Hüzeyfənin nəfsində nəsə bir şey olduğunu zənn edirəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Onu əmizdir (yəni Südündən ver) , sənə haram olsun və Əbu Hüzeyfənin nəfsindəki də bitsin!" deyə buyurdu." Sonra qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına qayıdaraq: "Mən onu əmizdirdim (yəni südümdən verdim) və Əbu Hüzeyfənin nəfsindəki də getdi" deyə buyurdu." (Müslim / 1453).

8- Zeynəb  bintu Ummu Sələmə belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi olan anası Ummu Sələmə belə deyərdi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) digər zövcələri bu cür süd əmmə ilə yanlarına kiminsə girməsinə razı olmadılar və Aişəyə belə dedilər: "Allaha and olsun ki, bu , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Səlimə verdiyi bir rüxsət idi və onun kimi kimsə yanımıza girə bilməz nə də bizi görə bilməz."

## Səkkizinci fəsil: Südün hökmü ancaq aclıq etibarı ilə sabit olar.

9- Aişə (Allah ondan razı olsam) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma daxil oldu. Yanımda bir kişinin olmağını görməsi ona ağır gəldi. Mən onun gözlərində qəzəbini gördükdə: "Ey Allahın Elçisi , o mənim süd qardaşımdır" deyə buyurdum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Süd qardaşlarınızı düzgün tanıyın, çünki südün hökmü ancaq aclıq etibarı ilə sabit olar." (Müslim / 1455).

# Nəfəqələr (mal sərf etmək) Kitabı.

Birinci fəsil: İnsanın öz nəfsindən, əhli və qohumlarından başlaması.

1- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi (başqa bir rəvayətdə onun Ənsarlardan olan Əbu Məzkur adlı birinin olduğu rəvayət olunur) Bəni Uzara qəbiləsindən olan qulunu (kişinin) ölümündən sonra azad olduğunu bildirdi. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu xəbər çatdıqda belə buyurdu: "Sənin ondan başqa malın var?" Kişi: "Xeyr" deyə cavab verdikdə, O belə buyurdu: "Onu məndən kim alar?" Onu Nueym ibn Abdullah səkkiz yüz dirhəmə alaraq , pulu gətirib Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təslim etdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Əvvəlcə nəfsindən başla , ona sərf et! Sonra bir şey qalsa əhlinə, əhlindən sonra nəsə qalsa , qohumların üçün sərf et. Qohumlarından sonra nəsə qalsa , belə və belə sərf et və önündəki, sağındakı və solundakılara (kasıblara) ver!" deyə buyurdu." (Müslim / 997).

İkinci fəsil: Qullara maldan sərf etmək və onların yeməklərini verməyənin günahı haqda.

2- Xeysəmə belə rəvayət edir: "Abdullah ibn Amrla (Allah onların hər ikisindən razı olsun) bircə oturmuşduq. Onun xəzinədarı gəldi. Onun yanına daxil olduqda ondan: "Qulların yeməyini verdinmi?" deyə soruşdu . O: "Yox" deyə cavab verdikdə, ona: "Get , onların yeməyini ver! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Bir kimsəyə günahı naminə sahib olduğu kimsələrin yeməyini verməməsi yetərlidir." (Müslim\996).

Üçüncü fəsil: Ailə və əhlinə mal sərf etmənin fəziləti.

3- Sövban (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Kişinin sərf etdidiyi ən əfzəl dinar əhli üçün sərf etdiyi, Allah yolunda miniyinə sərf etdiyi və Allah yolunda yoldaşları üçün sərf etdiyi dinardır." Əbu Qiləbə belə demişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ailədən başladı." Sonra isə belə dedi: "Kiçik uşaqlarının namuslu böyüməsinə, Allah onlarla onu mərifətləndirməsinə və onları varlı etməsi üçün mal sərf edən bir kişidən daha savablı kim ola bilər?" (Müslim / 994).

4- Əbu Məsud əl-Bədri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Savabını Allahdan umaraq ailəsinə malından sərf edən kişi üçün bu , bir sədəqədir." (Müslim / 1002).

Dördüncü fəsil: Qadın ərinin malından ailəsinə yaxşıcasına (israf etmədən, tələf etmədən) sərf edə bilər.

5- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Hind Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi, yer üzündə sənin Əhlinin (Xalqının) məskənini Allahın zəlil etməsindən mənə ən sevimli bir xalq yox idi. İndi isə yer üzündə sənin Əhlinin (Xalqının) məskəninə Allahın izzət verməsindən mənə ən sevimli bir xalq yoxdur." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ona:

"Nəfsim əlimdə olana and olsun ki, Həmçinin (imanın artırılacaqdır).”  Sonra isə Hind belə dedi: "Ey Allahın Elçisi , Əbu Sufyan əlini çox sıxan (xəsis, mal sərf etməyən) bir adamdır. Mənim onun malından onun izni olmadan ailəmə sərf etməmdə nəsə bir günah varmı? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Sənə ailənə yaxşıcasına (israf etmədən, tələf etmədən) mal sərf etməkdə bir şey yoxdur." deyə buyurdu." (Müslim/1714).

### Beşinci fəsil: Üç talaqla boşamış qadına Nəfəqənin olmaması.

6- Fatımə bintu Qeys belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)"Üüç talaqla boşamış qadına nəfəqə və məskən (ev) yoxdur!" deyə buyurdu." (Müslim /1480).

7- Aişə (Allah ondan razı olsun) belə buyurmuşdur: "bunu zikr etməkdə Fatimə üçün nə xeyir var?" Yəni: "nəfəqə və məskən (ev) yoxdur!" deməsində."

8- Əbu İshaq belə rəvayət edir: "əl-Əsvad ibn Yezidlə böyük Məsciddə oturmuşdum. Şabi də bizimlə idi. Şəbi bizə Fatimə bintu Qeysin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona nəfəqə və məskən vermədiyi hədisi danışdı. Sonra əl-Əsvad bir ovuc xırda daş götürərək ona atdı və belə dedi: "Bu kimi şeyləri danışırsan. Ömər (Allah ondan razı olsun) belə buyurmuşdur: "Allahın kitabını və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sünnətini, ona məskən və nəfəqə olub olmadığını əzbərləmiş və ya yaddan çıxarmış olduğunu bilmədiyimiz bir qadının sözü ilə tərk edəcəyik! Allah Təala buyurur: "Onları açıq-aşkar bir pis iş (zina) etməyənə qədər yaşadıqları evlərdən çıxartmayın və onlar özləri də çıxmasınlar." (Müslim /1480).

## Qul azad etmə Kitabı.

### Birinci fəsil: Mömin bir qulu azad edənin fəziləti haqda.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Hər kim mömin bir qul azad edərsə , Allah Təala o qulun hər bir üzvü müqabilində onun bir əzasını, hətta övrəti müqabilində üvrətini Cəhənnəmdən azad edər." (Müslim / 1509).

### İkinci fəsil: Övladın atanı azad etməsi.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Heç bir övlad atanın haqqını ödəyə bilməz , yalnız onu qul olaraq tapıb satın alıb azad eləyərsə." (Müslim / 1510).

### Üçüncü fəsil: Şərik olduğu qulun bir hissəsini azad etmək.

3- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bir kimsə köləsindən bir hissəni azad edər və onun köləni tam azad edəcək qədər malı varsa , ona adilcəsinə bir qiymət biçib şərikləri arasında hər birinin hissələrini verir və beləcə o qulu azad edir. Əks halda isə qulundan azad etdiyi hissəni azad etmiş olar." (Müslim / 1001).

## Dördüncü fəsil: Qulun ağır işlərdə işlədilməsi.

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər kim qulundan ona aid payını azad edərsə , qulun qurtuluş malı varsa , onun malındadır. Yox əgər malı yoxdursa , qul ağır işlər yükləməmək şərti ilə qul işlədilir." (Müslim /1503).

## Beşinci fəsil: Qul azad edərkən qura (çöp) çəkmək.

5- İmran ibn Huseyn (Allah ondan razı olsun) belə rəvayət edir: Bir kişi (başqa rəvayətdə isə:"Ənsarlardan bir kişi") ölüm ayağında ikən altı qulunu azad etdi. Onun onlardan başqa malı yox idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onları çağıraraq onları iki nəfər olmaqla üç hissəyə ayırdı sonra aralarında qura çəkdi. Qullardan ikisini azad edib dördünü qul kimi saxladı və kişiyə ağır söz dedi." (Müslim / 1668).

## Altıncı fəsil: Vəlilik azad edən kəsindir.

6- Aişə (Allah ondan razı olsu) belə rəvayət edir: "Bərira yanıma daxil olaraq belə dedi: "Mənim sahiblərim məni azad etmək müqabilində doqquz il müddətində hər ildə bir uqiyyə verməyimi şərt kəsdilər. Mənə kömək et!" Mən ona belə dedim: "Əgər sahiblərin razıdılarsa , mən onlara bu məbləği bir dəfəyə ödərəm və səni azad edərəm. Yalnız sənin vəlin mən olmaq şərti ilə." O bunu sahiblərinə söylədikdə, onlar bu şərti qəbul etmədilər və vəliliyin onların haqqı olmasını istədilər. Elə olduqda , Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Allaha and içirəm ki, belə olsa , etmərəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni eşitdi və bu haqda məndən soruşdu. Mən ona xəbər verdikdə , mənə belə buyurdu: "Onu azad et , və vəlilik haqqının səndə qalmasını şərt qıl! Həqiqətən vəllilik haqqı azad edən kəsindir." Mən onun dediyi kimi etdim. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həmin axşam xütbə verdi. Allaha layiq olduğu şəkildə həmd səna etdi sonra isə belə buyurdu: "Bəzi kimsələrə nə olub ki, Allahın kitabında olmayan şərtlər qoyurlar. Allahın kitabında olmayan hər bir şərt batildir. Yüz şərt olsa belə! Allahın kitabı haqdır! Allahın şərti daha sağlamdır. Sizlərdən bəzi kişilərə nə olub ki, onlardan biri belə deyir: "Filankəsi azad et , vəlilik haqqı mənim olsun." Vəlilik haqqı , yalnız azad edən kəsə aiddir." (Müslim / 1504).

## Yeddinci fəsil: Azad edilmiş kənizin əri ilə qalıb qalmayacağında seçim vermək.

7- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bərira azad olduqda üç sünnət vardı: " Bərira azad edildikdə , ərində qallıb qalmayacağında seçim edildi. Ona ət hədiyyə edilmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evə daxil olduqda , odun üzərində qazan vardı. O yemək istədi. Ona çörək və evdə olan ədviyyatlardan bir ədviyyat gətirildiyində belə buyurdu: "Məgər odun üzərində içərisində ət olan qazanı görmürəm?!" Onlar: "Ey Allahın Elçisi , bu əti Bəriraya sədəqə veriblər , sənə ondan verməyə çəkindik (bəyənmədik). O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyur: "Bu ona sədəqə, ondan bizə isə hədiyyə idi." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun haqqında belə buyurdu: "Vəlilik haqqı azad edən kəsə aiddir." (Müslim / 1504).

### Səkkizinci fəsil: Vəlilik haqqının satılması və hədiyyə edilməsinin qadağan olması.

8- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəlilik haqqının satılması və hədiyyə edilməsinin qadağan etdi." (Müslim / 1506).

### Doqquzuncu fəsil: Azad olunmuş qulun özünü vəlisinə deyil , başqa bir qövmə nisbət etməsi.

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər kim vəlisinin izni olmadan özünü başqa bir qövmə nisbət edərsə , ona Allahın, Mələklərin və bütün insanların lənəti olsun! Allah Təala ondan qiyamət günü nə vacib nə də nafilə ibadətlərindən heç nə qəbul etməz." (Müslim / 1508).

### Onuncu fəsil: Qulu döyən kəsin onu azad etməsi.

10-Əbu  Məsud əl- Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Qulumu döyürdüm. (başqa bir rəvayətdə belə deyilir: "O isə belə deyirdi: "Səndən Allaha sığınıram. O isə onu vururdu. O," Allahın Elçisinə sığınıram" dedikdə onu buraxdı.) Arxamdan belə bir səs eşitdim: "Ey Əbu Məsud , Allah Təala sənə sənin kölənin üzərinə qadir olduğundan daha da qüdrətlidir" Mən çevrildim və Onun Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) olduğunu gördüm. Mən: "O , Alah xatirinə azaddır" dedikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Əgər belə etməsəydin , od səni yandırardı və ya sənə toxunardı." (Müslim / 1659).

11- Zəzən belə rəvayət edir: "İbn Ömər (Allah onların hər iki sindən razı olsun) bir qulunun  kürəyində qalmış izi gördü və belə buyurdu: "Səni incitidm?" O: "Xeyr" deyə cavab verdikdə, belə buyurdu: "Sən azadsan" sonra yerdən nəsə götürərək belə buyurdu "Mənə onda bunun çəksi miqdarında bir savab yoxdur. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Hər kim köləsini əmr etdiyini gətirmədiyinə görə döyərsə , və ya sillələrsə , onun kəffarəsi onu azad etməkdir." (Müslim / 1657).

12-Suveyd ibn Muqrin (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir insan onun kənizlərindən birini sillədi." Suveyd ona belə dedi: Məgər üzün haram olduğunu bilmirsən? sonra isə belə buyurdu: "Mən özümü qardaşlarımın içində Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə olan yeddinci oğul görürdüm. Bizim yalnız bir xidmətçimiz vardı. Bizlərdən biri onu sillələdi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu azad etməyi əmr etdi!" (Müslim /  1658).

### On birinci fəsil: Köləsini zinada ittiham edənin (Ona böhtan atanın) aqibətinin ağır olacağı haqda.

**13-**Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim bir köləsini zinada ittiham edərsə , (Ona böhtan atanın) qıyamət günü cəzalandırılacaq , yalnız dediyində haqlı olduğu hal istisna olmaqla." (Müslim / 1660).

### On ikinci fəsil: Kölələrə yemək və geyiminində yaxşı davranmaq, onları taqət edə bilmədikləri bir işə mükəlləf etməmək.

14- əl-Mərur ibn Suveyd belə rəvayət edir: "Əbu Zərlə (Allah ondan razı olsun) (ər-Rabəzə adlanan yerdə) qarşılaşdım. Əynində cizgili bir əba vardı. Eyni əbadan köləsinin də əynində vardı. Ona: "Ey Əbu Zər , bu iki əbanı bir yerə cəm etsən bir qat paltar olar" deyə söylədiyimdə, belə buyurdu: "Mənim qardaşlarımdan olan bir kişi ilə sözümüz çəp gəldi. Onun anası əcəmilərdən idi. Mən onu anasına görə ayıbladım və məni Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şikayət etdi. Sonra Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qarşılaşdığımda mənə belə buyurdu: "Ey Əbu Zər , sən nəfsində cahiliyyə adətləri qalmış bir kimsəsən." Mən: "Ey Allahın Elçisi , kişiləri (ailəni) söyəndə, onların ata anasını söyərlər." deyə söylədikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Əbu Zər , sən nəfsində cahiliyyə adətləri qalmış bir kimsəsən. Onlar sizin qardaşlarınızdır. Allah Təala onları sizin əlinizin altında edib. Onlara yediklərinizdən yedirin, geydiklərinizdən geydirin! Onları bacarmadıqları işlərlə mükəlləf etməyin! Əgər mükkəlləf etsəniz , onda onlara kömək edin!" (Müslim / 1661).

15-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizin xidmətçiniz sizə yemək hazıladıqda , onun istisi və tüstüsü ona toxunar. Yeməyi sizə gətirdikdə , o da sizinlə otursun! Əgər yemək cuzi və azdırsa , onda ondan ovcuna bir və iki udumluq qoysun! Davud ibn Qeys belə demişdir: "Yəni bir və ya iki loxma" götürsün." (Müslim / 1663).

## On üçüncü fəsil: Ağasına səmimi nəsihət edən və Allaha gözəl bir şəkildə ibadət edən qulun savabı və əcri olmağı haqda.

16- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Həqiqətən , qul ağasına səmimi nəsihət edərsə və Rəbbinə gözəl bir şəkildə ibadət edərsə , ona iki savab vardır." (Müslim/1665).

17- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Səmimiyətlə (ağasına) nəsihət edən (islah edən) bir kölənin iki savabı vardır." Sonra Əbu Hüreyrə belə buyurdu: "Əbu Hüreyrənin nəfsi əlində olana and olsun ki Allah yolunda vuruşmaq, Həcc və anamla yaxşı davranmaq olmasaydı , mən qul olaraq ölməyi arzulayardım!" Ravi deyir ki: "Mənə Əbu Hüreyrənin anası ölənə kimi onun yanında daim olduğundan dolayı (nafilə) Həcc etməmişdir." (Müslim / 1665).

## On dörüncü fəsil: Sahibinin ölümündən sonra azad olunacaq qulun satılması haqda.

18- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi (başqa bir rəvayətdə onun Ənsarlardan olan Əbu Məzkur adlı birinin olduğu rəvayət olunur) Bəni Uzara qəbiləsindən olan qulunu (kişinin) ölümündən sonra azad olduğunu bildirdi. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu xəbər çatdıqda belə buyurdu: "Sənin ondan başqa malın var?" Kişi: "Xeyr" deyə cavab verdikdə, O belə buyurdu: "Onu məndən kim alar?" Onu Nueym ibn Abdullah səkkiz yüz dirhəmə alaraq pulu gətirib Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təslim etdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Əvvəlcə nəfsindən başla ona sərf et! Sonra bir şey qalsa əhlinə, əhlindən sonra nəsə qalsa , qohumların üçün sərf et. Qohumlarından sonra nəsə qalsa , belə və belə

sərf et" və önündəki, sağındakı və solundakılara (kasıblara) ver!" deyə buyurdu." (Müslim / 997).

# Alış – veriş Kitabı.

### Birinci fəsil: Yeməyi misli (müqbilində onun) mislinə satmaq.

1- Mamar ibn Abdullah kölәsini bir saa dolu buğda ilə göndərərək: "Onu sat , sonra isə dəyərində arpa al" deyə buyurdu! Kölə gedərək bir saa və ondan bir az da artıq əlavə olaraq alıb gətirdi." Mamar gəldiyində , bunu ona xəbər verdikdə, Mamar belə buyurdu: "Bunu niyə etdin? Get onu qaytar və yalnız misli müqabilində mislini götür. Çünki, mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyrduğunu eşidərdim: "Yemək yeməklə misli (müqbilində) mislinə dəyişdirilir." O zaman bizim yeməyimiz arpa idi." Ona : "Bu onun kimi deyildir" deyildikdə, O belə buyurdu: "Mən ona oxşamasından qorxuram." (Müslim / 1592).

### İkinci fəsil: Yeməyin (satılıq mal) təslim alınmadan satışının qadağan olması.

2- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: “Sizlərdən biriniz yemək aldıqda , onu təslim almadan satmasın!" İbn Abbas: "Mən hər bir şeyin onun kimi olduğunu hesab edirəm." (Müslim / 1525).

3- Əbu Hüreyrənin (Allah ondan razı olsun) Marvana belə buyurduğu rəvayət edilir: "Ribanın satışını halal etdin" Marvan: "Nə etmişəm?!" deyə soruşdu" Əbu Hüreyrə ona: "Sən (borc) sənədlərin satışını halal etmisən. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yeməyin (satılıq mal) təslim alınmadan satışını qadağan etmişdir." Marvan insanlara xütbə verərək onun satışını qadağan etdi!" Süleyman belə demişdir: "Mən mühafizələrin bu sənədləri insanların əlindən aldığını gördüm." (Müslim / 1528).

### Üçüncü fəsil: Gözə yarı alınmış yeməyin (malın) başqa yerə nəql olunması.

4- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizlərdən biriniz yemək aldıqda , onu təslim almadan satmasın!" Biz miniklə mal gətirənlərdən yeməyi (malı) gözə yarı alırdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə malı başqa yerə nəql etməmiş satmağı qadağan etdi." (Müslim / 1526).

### Dördüncü fəsil: Çəki ilə olan yeməyin gözə yarı (baxaraq) satılması.

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Muzəbənəni qadağan etdi. "Muzəbənə" dedikdə: "Yəni kişinin baxçasının bəhrəsi xurmadırsa, quru xurma müqabilində olçü ilə, üzüm bağıdırsa üzümünü, quru üzüm (kişmiş) müqabilində ölçü ilə, əkindirsə, çəkilən yemək (buğda, arpa) müqabilində satılmasını qadağan etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunların hamsını qadağan etdi." (Müslim / 1542).

## Beşinci fəsil: Xürmanı misli müqabilində satmaq.

6- Əbu Hüreyrə və Əbu Səid (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edirlər: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bəni Ədiy əl-Ənsarinin qardaşını Xeybərə vali göndərmişdi. Oradan gəldiyində özü ilə "Cənib" (Xurmanın əla növlərindən olan) xurması gətirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Xeybərin bütün xurması belədir?" deyə soruşdu. O: "Xeyr , Ey Allahın Elçisi! Allaha and olsun ki! Biz bir saa müqabilində iki qatışıq saa alırıq" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Belə etməyin! Lakin Misli müqabilində mislinə satın! Və ya bunu satın və qiymətinə bundan alın." Çəki ilə olan nə varsa da beləcədir." (Müslim / 1593).

## Altıncı fəsil: Miqdarı məchul olan xurma yığını satmaq haqda.

7- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miqdarı məchul, çəkisi bəlli olmayan xurma yığınını, çəkisi bilinən xurmaya satmağı qadağan etdi." (Müslim /1593).

## Yeddinci fəsil: Meyvə (bəhrə) keçməmiş satılmaz.

8- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) meyvə (bəhrə) yetişməmiş satmağı qadağan etdi." (Müslim / 1536).

9- Əbu əl-Bəxtari (Allah ondan razı olsun) belə rəvayət edir: "İbn Abbasdan xurmanın satışı haqda soruşduğumda, belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sahibi xurmanı yeyincə və ya ondan yeyilincə və çəkilincəyə qədər satmağı qadağan etdi." Mən İbn Abbasdan: "Çəkilincə nə deməkdir?" deyə soruşdum. Yanında olan bir kişi: "onu gözə yarı ölçməsidir." dedi." (Müslim / 1537).

## Səkkizinci fəsil: Meyvənin (bəhrənin) yetişməsi görününcəyə qədər satılmasının qadağan olması.

10- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xurmanı qızarmamış buğdanı isə ağararaq (bitkiyə düşən) xəstəlikdən əmin olmayınca satmasını qadağan etdi. Bunu satıcı və müştəriyə qadağan etdi." (Müslim / 1535).

## Doqquzuncu fəsil: Muzəbənə (yəni kişinin baxçasının bəhrəsini xurmadırsa, quru xurma müqabilində ölçü ilə, üzüm bağıdırsa üzümünü, quru üzüm (kişmiş) müqabilində ölçü ilə, əkindirsə, çəkilən yemək (buğda, arpa) müqabilində satmaq) satışı.

11- Bəni Həris qəbiləsinin mövlası Buşeyr ibn Yasar belə rəvayət edir: "Rafi ibn Xədic və Səhl ibn Əbi Heysəmə ona belə danışmışlar: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Müzəbənə satışını: bəhrəni xurmaya sartmağı qadağan etdi. Yalnız Arayə (Arayə: ağacın meyvəsini hələ ağacın başında olarkən onu quru xurma müqabilində satılması). sahiblərinə (satıcılarına) izn vermişdi." (Müslim / 1540).

## Onuncu fəsil: Arayəni gözə yarı satmaq.

12-Zeyd ibn Səbit (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Arayə satışına rüxsət verdi. Bir ailə xurmanı gözə yarı alıb Rutab (təzə yaş xurma) şəklində yeyirdilər." (Müslim / 1539).

## On birinci fəsil: Arayədən satılmasına icazə verilən miqdar haqda.

13-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Arayədən gözə yarı olmaqla beş vasaqdan (altımış saa miqdarında çəki vahidi) az və ya beş vasaq (ravi onun beş və ya beşdən az olmasında şəkk etmişdir) satmağa rüxsət verdi." (Müslim / 1541).

## On ikinci fəsil: Alış verişdə bəhrəyə (meyvəyə) xəstəlik düşməsi.

14-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Din qardaşına bir bəhrə (meyvə) satdıqdan sonra , ona xəstəlik düşərsə sənin ondan bir şey alman halal olmaz. Qardaşının malını nə haqla alırsan?" (Müslim / 1554).

## On üçüncü fəsil: Alacağı olan kəslərin tapdıqlarını götürmələri.

15-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında bir kişinin bəhrəsinə xəstəlik düşdü və kişinin borcu çoxaldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ona sədəqə verin" deyə buyurduqda, insanlar ona sədəqə etdilər , lakin bu , onun borcunu qaytarmaq üçün kifayət olmadı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan alacağı olan kimsələrə belə buyurdu: "Tapdığınızı götürün! Sizə bundan başqa heç nə yoxdur!" (Müslim / 1556).

## On dördüncü fəsil: Üzərində bəhrəsi olan xurma ağacını satan kəs haqda.

16-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitdim: "Tozlandırdıqdan sonra alınan xurma ağacının bəhrəsi satanındır. Yalnız müştərinin şərt qoyduğu istisna olmaqla." (Müslim /1543).

## On beşinci fəsil: əl-Muxabara və əl-Muhaqələ satışı haqda.

17-Zeyd ibn Əbu Uneysə belə rəvayət edir: "Əbu Valid əl-Məkki Əta ibn Əbu Rabəhin yanında oturmuş ikən bizə Cabir ibn Abdullahdan belə rəvayət etdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Muhaqalə, əl-Muzəbənə və əl-Muxabərə satışını, həmçinin xurmanı qızarmamış və ya saralmamış və yaxud yeyilməyincə almağı qadağan etdi. "əl-Muhaqələ" - əkinin məlum bir yemək (buğda, arpa) müqabilində çəki ilə satmaqdı. "əl-Muzəbənə" – Xurma ağacındakı təzə xurmanı bir neçə vasaq quru xurma muqabilində satmaqdır. əl- Muxabarə isə üçdə bir, dördə bir və buna bənzər şeylərdir." Mən Əta ibn Rabahdan: "Cabir ibn Abdyullahın bunu Peyğəmbərdən (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) danışdığını eşidibsənmi?" deyə soruşduğda, O: "Bəli" deyə cavab verdi." (Müslim / 1536).

## On altıncı fəsil: əl- Muavamə satışı.

18-Əbu Zubeyr və Səid ibn Meynə belə rəvayət edirlər: "Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Muhaqalə, əl-Muzəbənə, əl–Muavamə və əl-Müxabara satışını qadağan etdi." (Əbu Zubeyr və Səid ibn Meynə ikisindən biri "əl – Muavəmənin" bir neçə il müddətinə satmaq olmasını açıqlamşdır" Həmçini Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əs-Sunyə (istisnalı satış məsələn: "Sənə bu bağı bəzi ağaclar istisna olmaq şərti ilə satıram") satışını qadağan etdi və Ərayə satışına izn verdi." (Müslim / 1536).

19-Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir neçə il müddətlik satışı qadağan etdi." İbn Əbu Şeybənin rəvayətində isə belə buyurulur: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağacın bəhrəsini bir neçə il müddətinə satmağı qadağan etdi." (Müslim/1336).

## On yeddinci fəsil: Bir köləni iki kölə müqabilində satmaq.

20-Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kölə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona hicrət edəcəyinə beyət etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun kölə olduğunu hiss etmədi. Sonra kölənin sahibi gələrək onu tələb etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Onu mənə sat" deyə buyurdu və iki qara qul müqabilində satın aldı. Bundan sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona beyət etmək istəyən kəslərdən onun qul olub olmadığını soruşmadan , onun beyətini qəbul etmədi." (Müslim / 1602).

## On səkkizinci fəsil: əl–Müsarrahın (heyvanın südünü çox olmasını göstərmək üçnü bir neçə müddət sağmayaraq südü həbs etmək sonra satmaq) satışının qadağan olması.

21- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər kim əl-Musarrah bir qoyun alarsa , onun üç gün seçim müddəti var. İstərsə heyvanı saxlayar. İstərsə də heyvanı qaytarar və onunla bərabər bir Saa xurma verər." (Müslim / 1524).

## On doqquzuncu fəsil: Yeyilməsi haram olan şeyi satmağın qadağan olması.

22-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Ömərə (Allah ondan razı olsun) Samuranın araq satdığı xəbəri çatdıqda belə buyurdu: "Allah Samuranı öldürsün! Məgər Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitməyibmi: "Allah yəhudilərə lənət etsin! Onlara piy haram olduqda onu əridib satdılar." (Müslim / 1582).

## İyirminci fəsil: Araq satmağın qadağan olması.

23-Abdurrahman ibn Valə əs – Səbii (Misir əhlindən idi) belə rəvayət edir: "O İbn Abbasdan (Allah onların hər ikisindən razı olsun) üzümdən sıxılan haqda

soruşduqda ona belə cavab verdi: "Bir kişi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir qabda araq hədiyyə etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Məgər sən Allah Təalanın onu haram etdiyini bilimirsən?" deyə soruşdu. Kişi: "Xeyr" deyə cavab verdi və bir insanın qulağına gizlicə nə isə pıçıldadı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Ona nə pıçıldadın?" deyə soruşdu. O: "Ona onu satmasını əmr etdim" deyə cavab verdikdə , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onu içməyi haram edən , satışını da haram etmişdir." Kişi qabın ağzını açdı və içindəki axıb getdi." (Müslim / 1579).

### İyirmi birinci fəsil: Meyit, büt və donuz satmanın qadağan olması.

24-Cabir ibn Abdullah (Allah onların hər ikisindənrazı olsun) belə rəvayət edir: "O Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkənin fəthi günü Məkkədə ikən belə dediyini eşitmişdir: "Allah Təalə araq, meyit, donuz və büt satmağı qadağan etmişdir." Ondan: "Ey Allahın Elçisi , meyitin piyi necə , bilirsən onunla gəmilər (su keçməsin deyə) sürtülür, dərilər yağlanır və insanlar ondan şam düzəldir?" deyə soruşulduqda. O: "Xeyr , o , haramdır!" deyə buyurdu, sonra belə dedi: "Allah Təala yəhudiləri öldürsün! Allah Təala onlara onun piyini haram etdikdə onlar onu əridib satdılar və pulunu yedilər." (Müslim / 1581).

### İyirmi ikinci fəsil: İtin qiymətinin (pulunun, onu satmağın), zinakar qadının mehrinin (ona verilən pulun) və kahinin haqqının (Ona verilən pulun) haram olması.

25-Əbu Məsud əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İtin qiymətini, zinakar qadının mehrini və kahinin haqqını qadağan etdi." (Müslim / 1567).

### İyirmi üçüncü fəsil: Pişiyin qiymətinin (satmağın) haram olması.

26-Əbu Zubeyr belə rəvayət edir: "Cabirdən (Allah ondan razı olsun) itin və pişiyin qiyməti (yəni satışı) haqda soruşdum. O belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu qadağan etdi." (Müslim / 1568).

### İyirmi dördüncü fəsil: Hicamədən (qan almaq) qazanılan pulun pis xəbis olması.

27-Rafi ibn Xədic (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "İtin qiyməti xəbisdir! Zinakar qadının mehri xəbisdir. Hicamə edənin qazancı xəbisdir." (Müslim / 1568).

### İyirmi beşinci fəsil: Hicamə edənin qazancının mübah olması.

28-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bəni Beyada qəbiləsinin köləsi hicamə etdi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona haqqını ödədi və ağası ilə danışdı. O da qulunun vergisini azaltdı. Əgər hicamə edənin qazancı haram olsa idi , Peyğəmbər (ona,

ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona verməzdi." (Müslim / 1202).

29-Humeyd belə rəvayət edir: "Ənəs ibn Məlikdən (Allah ondan razı olsun) hicəmədən gələn qazanc haqda soruşuldu. O belə buyurdu: "Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Teybə hicəmə etdi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona iki saa yemək (buğda, arpa) verilməsini əmr etdi. Sontra onun sahibləri ilə danışdı və vergisini azaltdılar." Sonra isə belə buyurdu: "Ən əfzəl müalicə olunduğunuz şey , hicəmədir və ya müalicə olunduğunuz şeylər kimidir." (Müslim / 1577).

## İyirmi altıncı fəsil: Boylu dəvənin doğduğu balasının boylu qalana kimi satması.

30-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: Cahiliyyə əhli "Həblil əl - Həbələ" nin: "Boylu dəvənin doğduğu balasının boylu qaldığının ətini alıb satırdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara bunu qadağan etdi." (Müslim / 1514).

## İyirmi yeddinci fəsil: əl-Muləməsə və əl-Munəbəzə satışının qadağan olması.

31-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə iki satışı və iki geyimi qadağan etdi: "Bizə əl-Mulaməsə və əl-Münəbəzə satışını qadağan etdi. "əl-Muləməsə": "bir kimsənin gecə və yaxud gündüz başqa bir kəsin paltarına əlini toxunduraraq onu yalnız bu şəkildə qəbul etməsidir." "əl- Munəbəzə" isə: "Bir kişinin o birinə paltarını atması, o biri kəs də öz paltarını ona tərəf atmasıdır. Beləcə aralarında (malı) görmədən , razılıq olmadan alış veriş olmasıdır." (Müslim/1512).

## İyirmi səkkizinci fəsil: Daş atma (yəni daşı atadıqda artıq satış vacib olduğunu etiqad edirdilər) və məchul (hər hansı bir ticarətdə aldatma varsa , o ticarət batildir) satışı.

32-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) daş atma və məchul satışını qadağan etdi." (Müslim/1513).

## İyirmi doqquzuncu fəsil: Nəcəşin (mal almaq niyəti ilə deyil, başqasını aldadıb onu almağa sövq etmək üçün bir kəsin qışqıraraq qiyməti qaldırması) qadağan olması.

33- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Nəcəşi qadağan etdi." (Müslim /1516).

## Otuzuncu fəsil: Kişinin qardaşının ticarəti üzərinə ticarət etməsi haqda.

34-Əbd ər-Rahman ibn Şəməsə Uqba ibn Amirin (Allah ondan razı olsun) Minbərdə belə deyərkən eşitdiyini rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə demişdir: "Mömin möminin qardaşıdır. Mömin olan bir kəsə , qardaşının ticarətinin üzərinə ticarət etməsi halal deyildir.

Həmçinin , qardaşının nigahlandığı qadını (birinci özü onu nigahılanmağı izn vermədikcə) tərk etməyincə , nigahlana bilməz." (Müslim / 1414).

## Otuz birinci fəsil: Gələn malları qarşılamağın qadağan olması.

35-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Gələn (şəhərə daxil olan) malları qarşılamayın. Sizlərdən biriniz onu qarşılarsa və ondan bir şey alarsa , mal sahibi bazara girdiyində seçim qarşısında olar (istərsə qaytarar, istərsə yox)." (Müslim / 1519).

## Otuz ikinci fəsil: Şəhərli çöl ərəbi üçün satış etməz.

36-İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bazara miniklə mal gətirənləri qarşılamağı və şəhərlinin çöl ərəbi üçün satış etməsini qadağan etdi." Tavus belə demişdir: "İbn Abbasa belə dedim: "şəhərlinin çöl ərəbi üçün" nə deməkdir? O belə buyurdu: "Yəni onun üçün dəllallıq etməsin." (Müslim/1521).

## Otuz üçüncü fəsil: İhtikar (şəhərdən və yə gətirdiyi yerdən yeyinti, ərzaq və sair kimi şeylər alaraq bahalaşana kimi həbs etmək , sonra satmaq) etmənin qadağan olaması.

37-Mamar ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "İhtikar edən günah sahibidir." Səid ibn Müseyyibə: "Sən ihtikar edirsən." deyəndə, O belə buyurdu: "Bu hədisi rəvayət edən Mamar özü İhtikar edərdi." (Müslim / 1605).

## Otuz dördüncü fəsil: Satış zamanı seçim.

38-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "İki kişi bir biri ilə alış veriş edərsə , onlardan hər biri birgə ikən bir birindən aralanmayıncaya kimi seçim qarşısındadırlar. Və yaxud birisi o birinə seçim verər. Biri o birinə seçim verdikdən sonra ticarət etsələr , artıq satış vacib olar. Ticarət etdikdən sonra ayrılarlarsa və onlardan hər hansı biri ticarəti tərk etməzsə , artıq satış vacib olar." (Müslim / 1531).

## Otut beşinci fəsil: Alış verişdə sadiqlik (düzgünlük) və bəyan etmə.

39- Həkim ibn Hizəm (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Bir biri ilə alış veriş edən iki kişi bir birindən aralanmayıncaya kimi seçim qarşısındadırlar. Əgər sadiq (düzgün) və bəyan edən olarlarsa, onlara ticarətlərində bərəkət verilər. Yox , əgər yalançıdırlarsa və gizlədərlərsə , ticarətlərinin bərəkəti gedər." (Müslim / 1532).

## Otuz altıncı fəsil: Ticarətdə aldadılan kəs haqda.

40-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun ticarətdə aldandığını xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Kiminləsə alış veriş etsən belə de: "Lə xiləbə (yəni aldatmaq yoxdur)." Kişi (pəltək olduğundan) alış veriş edərkən belə deyərdi: "lə xiyəbə" (Müslim / 1533).

## Otuz yeddinci fəsil: Kim aldadarsa , bizdən deyildir.

41- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir toplu yeməyin (buğdanın) yanından keçərkən əlini onun içinə saldı və barmağları nəm oldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mal sahibinə: "Ey yemək sahibi , bu nədir?" deyə buyurdu. O: "Ey Allahın Elçisi , ona yağış dəyib" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Onu insanların görməsi üçün üst tərəfə goysan necə olardı?! Kim aldadarsa , bizdən deyildir" deyə buyurdu." (Müslim / 102).

## Otuz səkkizinci fəsil: Pul dəyişmə və gızılı nəqd yolla vəriqə (dirhəmə) satmaq.

42-Məlik ibn Əvs ibn əl–Hədəsən belə rəvayət edir: "Mən: "(Qızılı) dirhəmə dəyişəcək kimsə varmı?" deyə səslənərək gəldim. Ömər ibn əl-Xattabın yanında olan Talha ibn Ubeydullah mənə: "Bizə qızılını göstər , sonra xidmətçimiz gəldiyində bizə gəl , sənə vəriqini (dirhəmini) verək" deyə buyurdu. Ömər ibn əl-Xəttab ona belə buyurdu: "Xeyr , Allaha and olsun ki, olmaz, ya onun vəriqini (dirhəmini) nəqd olaraq ödəyəcəksən yada ki, onun qızılını qaytaracaqsan. Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "vəriqi (dirhəmi) gızılla dəyişmək (satmaq) ribadır , yalnız bu ikisi nəqd yolla olarsa , müstəsnadır. Buğdanı buğdaya satmaq ribadır , yalnız bu ikisi nəqd yolla olarsa , müstəsnadır. Arpanı arpaya dəyişmək (satmaq) ribadır , yalnız bu ikisi nəqd yolla olarsa , müstəsnadır. Xurmanı xurmaya dəyişmək (satmaq) ribadır , yalnız bu ikisi nəqd yolla olarsa , müstəsnadır." (Müslim/1586).

## Otuz doqquzuncu fəsil: Qızılı qızılla, gümüşü gümüşlə, buğdanı buğdayla və bütün ribaya daxil olan şeyləri misilini mislinə və əldən ələ (yəni nəqd) olmaq şərti ilə satmaq (dəyişmək).

43-Ubadə ibn Samit (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Qızılı qızılla, gümüşü gümüşlə, buğdanı buğdayla, arpanı arpayla, xurmanı xurmayla, duzu duzla, mislini mislinə bərabərcə və əldən ələ (yəni nəqd) olmaq şərti ilə. Əgər müxtəlif növlər olarsa nəqd olmaq şərti ilə istədiyiniz kimi satın." (Müslim / 1587).

## Qırxıncı fəsil: Qızılı vəriqə , nisyə satmağın qadağan olması.

44-Əbu əl–Minhəl belə rəvayət edir: "Şərikim mövsümə və ya həccə kimi vəriqi nisyə satdı. Gəlib mənə bunu xəbər verdiyində, ona: "Bu iş caiz deyil!" deyə ona söylədim. O: "Mən onu bazarda satdım və mənə bunu heç kimsə inkar etmədi." Deyə buyurduqda, əl-Barə ibn Azibin yanına gəldim və ondan bu haqda soruşdum . O belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə gəldiyində , biz bu cür ticarət edirdik. bizə belə buyurdu: "Əldən ələ (yəni nəqd yolla) olan şeydə bir şey yoxdur. Nisyə satılan isə ribadır!"

Sonra Bəra mənə belə buyurdu: "Sən Zeyd ibn Arqamın yanına get , o ticarət haqda məndən daha yaxşı bilir!" Mən onun yanına gəldim və ondan bu haqda soruşduğumda, mənə eyni şəkildə cavab verdi." (Müslim / 1589).

## Qırx birinci fəsil: Bir dinarı iki dinara və bir dirhəmi iki dirhəmə satmayın.

45-Osman ibn Affan (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Bir dinarı iki dinara və bir dirhəmi iki dirhəmə satmayın!" (Müslim / 1585).

## Qırx ikinci fəsil: Üzərində qızıl və muncuq olan boyunbağının satılması.

46-Fadalə ibn Ubeyd əl- Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybərdə ikən , ona üzərində qızıl və muncuq olan boyunbağı gətirdilər. Bu , satış üçün olan qənimət mallarından idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üzərində olan qızılın çıxarılmasını əmr etdi və yalnız gızıl çıxarılaraq ayrıldı. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Qızıl , qızılla çəkisi misli müqabilində satılar." (Müslim/1591).

## Qırx üçüncü fəsil: Nəqd sayılan şeylərdə riba (faiz) olması haqda.

47- Əta ibn Əbu Rabəh belə rəvayət edir: "Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) İbn Abbasla (Allah ondan razı olsun) qarşılaşdıqda ona belə buyurdu: "Sənin sərf (pul, gızıl və sair kimi dəyişmək, satmaq) haqda dediklərini görürsənmi? Bu şeylər Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiklərindir , yoxsa ki , bunlar Allahın kitabında tapdıqlarındır?” İbn Abbas belə cavab verdi: "Xeyr , sənə əsla bunu deməırəm! Amma Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) siz məndən daha yaxşı bilirsinsinz. Allahın kitabına gəlincə isə , onu da bilmirəm. Lakin Üsama ibn Zeyd (Allah ondan razı olsun) mənə belə rəvayət etmişdir: "Diqqət ediniz! Riba nisyə alış-verişdədir." (Müslim/1596).

48-Əbu Nadra belə rəvayət edir: "İbn Ömər və İbn Abbasdan (Allah onlardan razı olsun) Sərf (pulu, gızılı dəyişmək) haqda soruşdum. Onlar onda heç bir şeyin (qadağan) olmadığını gördülər. Mən Əbu Səid əl-Xudrinin (Allah ondan razı olsun) yanında oturduğumda , ondan Sərf haqda soruşdum . O belə cavab verdi: "Ziyadə (əlavə, artıq) olan ribadır. Onun bu sözünü İbn Abbas və Ömərin sözünə görə inkar etdim. O belə buyurdu: "Sənə yalnız Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyimi danışıram. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xurma bağının bağbanı ona bir Saa miqdarında yaxşı xurma gətirdi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bağının xurması bu (yaxşı olmayan) növdən idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Bunu haradan almısan?" deyə soruşdu. O: "Mən iki Saa ilə gedib bu bir Saa xurmanı almışam. Çünki bazarda bunun qiyməti budur. Bunun qiyməti isə budur." deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Vay olsun sənə , ribaya girmisən. Ondan almaq istədiyində xurmanı öz qiymətinə sat! Sonra o pula istədiyin xurmanı al! Əbu Səid belə buyurdu: "xurmanı xurma müqabilində satmaq ribaya daha yaxındır , yoxsa gümüşü gümüş müqabilində satmaq?" Sonra İbn Ömərin yanına gəldim , mənə qadağan etdi. İbn Abbasın yanına getmədim. Əbu əs-Sahbau mənə Məkkədə İbn

Abbasdan bu haqda soruşduqda , o da bunu bəyənmədiyini danışdı." (Müslim/1594).

## Qırx dördüncü fəsil: Riba yeyənin və yedizdirənin lənətlənməsi.

49-Cabur ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) riba yeyəni, yedizdirəni, (onların arasında) yazanı və şahidlərini lənətlədi. Və dedi ki: "Onlar bərabərdir." (Müslim / 1598).

## Qırx beşinci fəsil: Açıq aydın halal olanı götürüb şübhələi olanı tərk etmək.

50-Noman ibn Beşir (Allah ondan razı olsun) əllərini qulaqlarına tərəfə uzadaraq belə buyurdu: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Şübhəsiz ki, halal da bəllidir, haram da bəllidir. Lakin bu iksi arasında şübhəli şeylər vardır. İnsanların əksəriyyəti bunu bilməzlər. Hər kim bu şübhəli şeylərdən uzaq olarsa , dinini və namusunu qorumuş olar. Və hər kim bu şübhəli şeylərə düşərsə harama düşər. Onun misalı qoruğun ətrafında (qoyunlarını) otaran çobana bənzəyir. O (qoyunlarının) bu bölgəyə girməməsindən əmin deyil. Həqiqətən , hər bir hökmüdarın qoruğu vardır. Allahın qoruğu isə haramlarıdır. Və həqiqətən , hər bir insanın bədənində bir ət parçası vardır ki, o islah (sağlam) olarsa , bütün bədən islah (sağlam) olar. Yox əgər o xəstə olarsa , bütün bədən xəstə olar. Həqiqətən , bu ət parçası qəlbdir." (Müslim / 1599).

## Qırx altıncı fəsil: Bir kimsənin borc aldıqda onu ondan daha xeyirli bir şəkildə ödəməsi və sizin ən xeyirliniz borcunu yaxşı ödəyəndir.

51-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişinin.Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) alacağı haqqı vardı. Buna görə də ona, ağır sözlər söylədi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri onun üzərinə gəlməyə niyətləndikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: "Həqiqətən , haqq sahibinin danışma haqqı vardır." Sonra isə onlara: "Bu adam üçün bir baş yaxşı dəvə alın və ona verirn." deyə buyurdu. Onlar: "Biz onun dəvəsindən yaxşı dəvə tapmırıq" deyə söylədikdə. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: "Ondan onu alın , sonra isə ona verin .Həqiqətən , sizin ən xeyirliniz borcunu yaxşı ödəyəndir." (Müslim / 1601).

## Qırx yeddinci fəsil: Ticarətdə and içmənin qadağan olması.

52- Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: "O , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitmişdir: "Alış-verişdə çox and içməkdən çəkinin! Çünki bu , (malı) tez satır sonra isə (pulunun bərəkətini) silir (aparır)." (Müslim/1607).

53- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Üç kəslərlə Allah Təala danışmaz, onlara baxmaz və onları təzkiyə (zamin durmaq, tövsiyyə) etməz. Onlar üçün ağrı verici əzab vardır. Onlar: "Boş bir sahədə suyu olan , lakin onu yoldan keçənə verməyən. Əsr namazından sonra malını satmaq üçün müştəriyə bu

malı bu və bu qiymətə aldım deyə , Allaha and içən, həqqiqətdə isə , andına xilaf olan bir kimsə. Və bir rəhbərə yalnız dünya malı üçün beyət edən, ona dünya malından verildikdə itaət edər , verilmədikdə isə asi olan kimsədi." (Müslim / 108).

## Qırx səkkizinci fəsil: Dəvəni satarkən tərkini istisna etmək.

54- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə döyüşə çıxdım. Mən altımda xəstə olan və az qala yeriyə bilməyən , su daşayan bir dəvənin üzərində ikən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəlib mənə çatdı və belə buyurdu: "Dəvənə nə olub?" mən: "Xəstədir" dedim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) irəlləyərək heyvanı sürdü və onun üçün dua etdi. Bundan sonra dəvəm dəvələrin önündə getməyə başladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən: "Dəvəni necə görürsən?" deyə soruşdu . Mən: "Yaxşıdır. Sənin bərəkətin ona toxundu" deyə cavab verdim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onu mənə satarsan?" deyə buyurdu." Mən utandım. O gün bizim ondan başqa su daşıyan dəvəmiz yox idi. Mən: "Bəli” deyib Mədinəyə çatana kimi tərki mənim olmaq şərti ilə onu ona satdım. Nəhayət gəlib çıxdıqda dayımla qarşılaşdım. Məndən dəvəmi soruşdu. Mən ona nə etdiyimi xəbər verdikdə məni buna görə danladı." Mən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) izn istədiyim vaxtda məndən bakirə ya dul qadınla evləndiyimi soruşdu . Mən: "Yox , dul almışam" deyə cavab verdim. O belə buyurdu: "Kaş ki, bakirə qız alsaydın , sən onunla və o da sənlə oynaşardınız." Ona belə dedim: " Ey Allahın Elçici , atam vəfat edib və ya şəhid olub. Mənim kiçik baçılarım var. Mən onlara özləri kimi birini gətirməkdən və onları ədəbləndirməyəcəyindən, qayğılarına qalmayacağından çəkindim və onların qayğısına qalan bir qadın gətirmək üçün evləndim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə gəldiyində dəvəni ona apardım. Mənə onun qiymətini ödədi , sonra isə dəvəni mənə qaytardı." (Müslim / 715).

## Qırx doqquzuncu fəsil: Borcun bir qisminin silinməsi.

55-Kaab ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "O , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında ona borcu olan İbn Əbu Hadradan məsciddə borcunu istəmiş. Səsləri o qədər ucadan imiş ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evində ikən onların səslərini eşitmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) otağının pərdəsini açaraq onların yanına çıxdı və Kaab ibn Məlikə belə səsləndi: "Ey Kaab" O: "Eşidirəm , əmrindəyəm , Ey Allahın Elçisi" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona əli ilə işarə edərək borcun bir qismini silməsini buyurdu." Kaab: "Ey Allahın Elçisi , artıq sildim" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Dur borcunu ödə!" (Müslim / 1558).

## Əllinci fəsil: Varlı olan kəsin borcunu verməyi uzatması zülümdür və Həvalə (yəni borcu ödəmək üçün həvalə) etmək haqda.

56-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Varlı olan kəsin

borcunu verməyi uzatması zülümdür. Sizlərdən biriniz varlı olan bir kəsə həvalə olunarsa , həvaləliyini qəbul etsin." (Müslim/1564).

## Əlli birinci fəsil: Kasıba möhlət vermək və (borcu) bağışlamaq.

57-Hüzeyfə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Bir kişi vəfat etdi və Cənnətə daxil oldu. Ona belə deyildi: "Sən nə edirdin?" O (Ravi belə demişdir: "O xatırladı və ya xatırladıldı) belə buyurdu: "Mən insanlarla alış veriş edirdim. Kasıblara möhlət verib , para-pul xüsusunda bağışlayırdım. Və mən də bağışlandım." Əbu Məsud belə demişdir: "Mən bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdim." (Müslim / 1560).

58-Abdullah ibn Əbu Qatədə belə rəvayət edir: " Əbu Qatədə ona borclu olan bir kişini axtardı. Kişi ondan gizlənirdi. Sonra kişini tapdığında kişi ona: "Mən çətinlik içərsindəyəm" dedikdə, Ona: "Allaha and içirsən?" deyə ondan soruşdu. Kişi: "Allaha and olsun" deyə cabab verdikdə, Əbu Qatədə ona belə dedi: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Hər kim Allah Təalanın onu Qiyamət gününün dəhşətindən qurtarmasına sevinmək istəyirsə , kasıba (çətinlik içində olana) nəfəs aldırsın (möhlət versin) və ya borcundan silsin." (Müslim / 1563).

## Əlli ikinci fəsil: Bir kişinin malını iflas etmiş bir adamın yanında görməsi haqda.

59-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir kişi iflasa uğradığında , başqa bir kişi onun yanında özünə məxsus malını görərsə, malını götürməyə daha layıqdır (haqlıdır)." (Müslim/1563).

## Əlli üçüncü fəsil: Ticarət və rəhn (qirov) haqda.

60-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir yahudidən müəyyən bir müddətə kimi yemək götürdü. Və dəmirdən olan zirehini onda girov qoydu." (Müslim / 1603).

## Əlli dördüncü fəsil: Bəhrəni (meyvəni) sələf (yəni pulunu əvvəlcədən vermək) ilə almaq.

61-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə gəldiyində Mədinə əhli bir və iki ilin bəhrəsinin pulunu əvvəlcədən ödəyirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: "Hər kim sələf edirsə onda məlum çəkidə, məlum miqdarda və məlum olan müddətə kimi sələf etsin," (Müslim / 1604).

## Əlli beşinci fəsil: əş- Şufa (Şərikli mal) haqda.

62-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bölünməmiş hər bir ev və ya bağça haqda əş-Şufa hökmünü qıldı. Kişiyə şərikinə xəbər vermədən şərikli maldan bir şey satmaq halal deyildi. (Şəriki) istərsə götürər,

istərsə isə tərk edərdi. Kişi şərikinin izni olmadan ondan bir şey satarsa, şərikin o mala daha çox haqqı vardır." (Müslim / 1608).

### Əlli Altıncı fəsil: Qonşunun divarına taxta salmaq haqda.

63-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən biriniz qonşusuna onun divarına (damını qoyma üçün) taxta salmasına mane olmasın. Sonra Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurdu: "Sizləri niyə bundan üz döndərən görürəm? Allaha and olsun ki, bunu sizin çiyinlərinizin üzərinə atacağam." (Müslim / 1609).

### Əlli yeddinci fəsil: Hər kim zülm edərək bir qarış torpaq qəsb edərsə , yeddi qat yerlə boynuna dolanar.

64-Urva ibn Zubeyr (Allah ondan razı olsun) belə rəvayət edir: "Arva bintu Uveys Səid ibn Zeydin (Allah ondan razı olsun) onun torpağından bir hissəsini götürdüyünü iddia etdi və Marvan ibn əl-Həkəmə aralarında hökm kəsməsi üçün müraciət etdilər. Səid belə dedi: "Mən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyim şeydən sonra onun torpağından nəsə alarammı ki?! Marvan ona "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nə eşitmisən?" deyə buyurdu. O belə cavab verdi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Hər kim zülm edərək bir qarış torpaq qəsb edərsə , yeddi qat yerlə (torpaq) boynuna dolanar." Marvan ona: "Mən səndən bundan sonra sübüt tələb etmirəm" deyə buyurdu. Sonra Səid belə dedi: "Allahım , əgər yalan deyirsə , onun gözünü kor et! Onu öz torpağında öldür!" Qadın gözləri kor olmamış ölmədi. Nəhayət gözləri kor oldu və bir dəfə öz torpağında gəzərkən çuxura düşdü və öldü." (Müslim/1610)

### Əlli səkkizinci fəsil: Yol haqqında ixtilafa düşdükdə , onun enini yeddi dirsək etmək.

65-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Yol haqqında ixtilafa düşdükdə , onun eni yeddi dirsək edilsin." (Müslim / 1613).

# əl-Muzaraə (torpaq sahibi əkindən bir şey götürmək müqabilində tarlanı kirayə verməsi) Kitabı

### Birinci fəsil: Torpağı (onda bitən şeydən müəyyən bir miqdar götürmək şərti ilə) kirayə verməyin qadağan olması.

1- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Kimim torpağı varsa , onu əksin və ya qardaşına əkdirsin! Onu kirayə verməsin!" (Müslim / 1536).

## İkinci fəsil: Torpağı (onda bitən şeydən müəyyən bir miqdar götürmək şərti ilə) kirayə vermək.

2- Rafi ibn Xadic (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında torpağı onda bitən üçdə bir , dörd də bir yemək (buğda, arpa və sair) müqabilində kirayə verərdik. Bir gün əmilərimizdən bir kişi gələrək bizə faydalı olan bu işi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadağan etdiyini, Allaha və Peyğəmbərinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) itaətin daha faydalı olduğunu, bizə torpağı onda bitən üçdə bir , dörddə bir yemək (buğda, arpa və sair) müqabilində kirayə verməyi qadağan etdiyini və yerin Rəbbi bizə torpağı əkməyi və ya əkdirməyi əmr etdiyini və bundan başqa nə varsa, həmçinin onu kirayə verməyi , bəyənmədiyini xəbər verdi." (Müslim/1548)

## Üçüncü fəsil: Torpağı qızıl və vəriq (gümüş) müqabilində kirayə vermək.

3- Hanzala ibn Qeys əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Rafi ibn Xədicdən (Allah ondan razı olsun) torpağı qızıl və gümüş müqabilində kirayə vermək haqda soruşdum . O belə buyurdu: "Onda heç bir şey yoxdur , (yəni olar) yalnızca insanlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında torpağı çay (su), arx kənarları torpaq sahibində qalmaqla və əkindən bir şey götürmək müqabilində kirayə verərdilər. Buna aid yer tələf (həlak) olur, o birisinin yeri salamat qalır, yaxud bunun yeri salamat , o birisinin ki, isə həlak olurdu. İnsanlar yalnız belə kirayə verirdilər. Buna görə də o qadağan oldu. Amma məlum olan zəmanətli bir şey olarsa , onda bir şey yoxdur " (Müslim / 1547).

## Dördüncü fəsil: İcarə vermək.

4- Abdullah ibn əs-Səib (Allah ondan razı olsun) belə rəvayət edir: "Abdullah İbn Məqəlin yanına daxil olduq və ondan Müzarə (əkin) haqda soruşduq . O belə cavab verdi: "Sabit iddia edir ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl- Müzarəni (torpaq sahibi əkindən bir şey götürmək müqabilində tarlanı kirayə verməsi) qadağan etdi və onu (pul müqabilində) icarə verməyi əmr etdi və: "Onda bir şey yoxdur" deyə buyurdu." (Müslim / 1549).

## Beşinci fəsil: Torpağın müəyyən müddətə hədiyyə verilməsi

5- Amr belə rəvayət edir: " Tavus bir zaman əl- Muxabara satışı edirdi. Mən ona: "Ey Əbu Əbd ər-Rahman , bunu bəlkə tərk edəsən? Çünki onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Müxabara satışını qadağan etdiyini iddia edirlər." deyə söylədim. O belə buyurdu: “Mənə onların ən yaxşı biləni – yəni İbn Abbas (Allah ondan razı olsun) - Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu qadağan etmədiyini və yalnız belə buyurduğunu xəbər verib: "sizlərdən birinizin qardaşına hədiyyə verməsi onun üçün ondan məlum bir miqdarda xərac almasından daha xeyirlidir." (Müslim/1550).

## Altıncı fəsil: əl- Musaqat (bağ baxçaya onda bitən məhsulun bir qismi müqabilində baxmaq) və torpaqla meyvə və əkin məhsulunun bir qismi müqabilində müamələ etmək.

6- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybəri , onda bitən meyvə və əkin məhsullarının yarısı müqabilində geri qaytardı. Onun qadınlarına hər il yüz vasaq (çəki vahidi) məhsul: "səksən vasaq xurma və iyirmi vasaq buğda verilirdi. Ömər (Allah ondan razı olsun) xilafətə gəldikdə Xeybəri (ona haqqı olanlar arasında) bölüşdürdü və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrinə belə seçim verdi: ərazi və su, və ya hər il onlara aldıqları vasaqların verilməsinə zəmanət. Onlardan bəziləri ərazi və suyu seçdi, bəziləri isə hər il vasaqların verilməsini. Aişə və Hafsa (Allah onlardan razı olsun) ərazi və suyu seçənlərdən oldu." (Müslim / 1551).

Yeddinci fəsil: Ağac və bir bitki əkən haqda.

7- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Müsəlman olan hər hansı bir kəs bir ağac (ot, bitki) əkərsə , ondan yeyilən hər bir şey onun üçün sədəqə olar. Ondan oğurlanan hər bir şey onun üçün sədəqə olar. Vəhşi heyvanların ondan yediyi hər bir şey onun üçün sədəqə olar. Quşun ondan yediyi hər bir şey onun üçün sədəqə olar. Ondan hər kim nəsə əskiltsə , bu , onun üçün sədəqə olar." (Müslim / 1552).

Səkkizinci fəsil: Artıq qalan suyu satmağın qadağan olması.

8- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) artıq qalan suyu satmağı qadağan etdi." (Müslim/1565).

Doqquzuncu fəsil: Atrıq suyu verməmək və yaş və ya quru ot haqda.

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "yaş və ya quru otları (yeyilməsini) qadağan etmək üçün artıq suyu verməyi qadağan etməyin." (Müslim / 1566).

## Vəsiyyət, sədəqə, bağışlama və əl-Umra (yəni övlada bir şeyi ömürlük bağışlamaq) Kitabı.

Birinci fəsil: Vəsiyyət etməyə bir şeyi olan kimsənin vəsiyyətini etməyə rəğbətləndirmək.

1- Səlim belə rəvayət edir: "İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitdi: "Müsəlman olan bir kimsənin evində vəsiyyət etməyə bir şeyi olduğu halda , onun üzərindən üç gecə keçərsə , onun haqqı vəsiyətinin başının altında olmasıdır." Abdullah ibn Ömər belə buyurmuşdur: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu eşitdikdən bəri elə gəcə keçmədi ki , vəsiyyətim üzərimdə olmasın." (Müslim / 1627).

İkinci fəsil: Malın üçdə birindən artıq vəsiyyət etmənin caiz olmaması.

2- Sad ibn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni Vida həcci zamanı az qala öləcəyim bir xəstəliyim ərəfəsində ziyarət etdi. Ona belə dedim: "Ey Allahın Elçisi , xəstəliyin məni nə hala saldığını görürsən. Mən mal , mülk sahibiyəm və mənim varisim yalnız bir qızımdır. Mən malımın üçdə iksini sədəqə verimmi? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Xeyr" deyə cavab verdikdə, mən ondan: "Malımın yarısını sədəqə verimmi?" deyə soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Xeyr! Üçdə birini, üçdə biri də çoxdur. Sənin ailəni varlı olaraq tərk etmən , onları insanlardan dilənərək yaşamasına tərk etməkdən daha xeyirlidir. Sən Allah rizasını diləyərək malından sərf etdiyin hər bir şeydə sənə əcr vardır, hətta qadının ağzına qoyduğun bir loxmada belə, savabın vardır." Mən belə soruşdum: "Ey Allahın Elçisi , mən yoldaşlarımdan (xəstəliyi və ya hicrət etdiyindən sonra Məkkədə qalmasınndan dolayı) geri qalacağam?" O belə buyurdu: "Sən Allah rizasını diləyərək geri qalıb etdiyin hər bir əmələ görə sənin dərəcən və yüksək məqamın artar. Bəlkə sən geri qalarsan , bir dəstə insanlar fayda , digərləri isə zərər görər. Allahım! Əshabıma hicrətini tamalla , onları gerı göndərmə , lakin Saad ibn Xovlə yazıqdır." Sad ibn Xovlə Məkkədə öldüyü üçün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yasını tutdu (göz yaşı tökdü)." (Müslim / 1662).

3- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə buyurmuşdur: "Kaş ki, insanlar üçdə birdən dördə birə keçərdilər. Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Üçdə birini! Üçdə bir də çoxdur." (Müslim /1629).

## Üçüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allahın kitabını vəsiyyət etməsi.

4- Talha ibn Musarrif belə rəvayət edir: "Abdullah ibn Əbu Avfadan (Allah ondan razı olsun) belə soruşdum. "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəsiyyət edibmi?" O: "Xeyr" deyə cavab verdiyində, belə soruşdum: "Elə isə müsəlmanlara vəsiyyət niyə fərz oldu və ya niyə onlara vəsiyyət etmək əmr olundu?" O belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allahın kirtabını vəsiyyət etdi." (Müslim/1634).

5- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) özündən sonra nə dinar , nə də dirhəm, nə qoyun , nə də ki dəvə qoydu və heç bir şey vəsiyyət etmədi." (Müslim / 1635).

6- əl-Əsvad ibn Yezid belə rəvayət edir: "Aişəyə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əlinin (Allah ondan razı olsun) mirasçısı (yəni xəlifə) olduğu xatırlatdıqda, o belə buyurdu: "Ona nə zaman vəsiyyət etdi: mən onu sinəmə (və ya qucağıma) söykəmişdim. Ləyən istəmişdi ki, sinəmə düşüb qaldı. Ölümünü belə hiss etmədim. Ona nə zaman vəsiyyət etdi?!" (Müslim / 1636).

## Dördüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müşriklərin ərəb yarmadasından çıxarılmasını və (bura gələn) karvanlarla yaxşı davranmağı vəsiyyət etməsi haqda.

7- Səid ibn Cubeyr (Allah ondan razı olsun) belə rəvayət edir: "İbn Abbas (Allah ondan razı olsun) belə buyurdu: "Xəmis (hicri təqvimi ilə beşinci gün, miladi ilə həftənin dördüncü günü) günü , nədir xəmis günü?" Sonra o qədər ağladı ki, göz yaşları daşları islatdı. Mən ondan: "Ey İbn Abbas! Xəmis günü nədir?" deyə soruşdum. O belə buyurdu: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəstəliyi şiddətləndi və belə buyurdu: "Mənə bir kağız gətirin , məndən sonra zəlalətə düşməməyiniz üçün sizə bir namə (vəsiyyət) yazım. Oradakılar aralarında münaqişə etməyə başladılar. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında münaqişə etmək yaraşmaz. Onlar "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nə olur: sayıqlayır? Onun Özündən soruşun" dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu "Buraxın məni, içində olduğum hal mənim üçün daha xeyirlidir. Sizə üç şeyi vəsiyyət edirəm: Müşrikləri Ərəbistan yarmadasından çıxarın. Gələn karvanlarla mənim yaxşı davrandığım kimi davranın. " Ravi (Səid) belə buyurdu: (ibn Abbas) "Üçüncünü isə susdu və ya dedi mən isə onu unutdum" (Müslim / 1637).

## Beşinci fəsil: Sədəqənin qeri alınmasının qadağan olması.

8- Ömər ibn əl-Xattab (Allah ondan razı olsun) belə rəvayət edir: "Yaxşı cins bir atımı Allah yolunda vuruşan birinə sədəqə (hədiyyə) verdim. Sahibi ona yaxşı baxmadı. Mən onun onu ucuza satacağını zənn edib onun hökmünü Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onu alma və sədəqəni geri götürmə! Çünki sədəqəsini geri alan bir kimsə , qusduqdan sonra qusduğunu yalayan bir it kimidir." deyə buyurdu." (Müslim / 1620).

9- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Hədiyəsini geri alan kəs , qusduqdan sonra qusduğunu yalayan bir it kimidir." (Müslim / 1622).

## Altıncı fəsil: Bir kimsənin hədiyyə bağışlamaqda övladlarının içərisindən birini üstün tutması.

10- ən-Numan ibn Beşir (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Atam mənə bəzi malını bağışladı. Anam Umra bintu Ravaha: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şahidlik etməyincə razı olmaram" dedi və atam məni, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sədəqəsinə şahidlik etsin deyə onun yanına apardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Sən övladlarının hamısına belə etmisən.?" deyə soruşdu. O: "Xeyr" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Allahdan qorxun və övladlarınız arasında adil olun." Atam qayıtdı və verdiyi sədəqəni geri aldı." (Müslim/1623).

11- ən-Numan ibn Beşir (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: Atam məni Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına apardı və belə buyurdu: "Ey Allaın Elçisi , şahid ol ki, mən ən-Numana malımdan bu və bunu bağışladım." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Başqa övladlarına da ən-Numana bağışladığın kimi bağışlamısan?" O: "Xeyr" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Buna məndən başqasını şahid tut!" Sonra isə belə buyurdu: "Məgər sən onların sənə yaxşı

davranmalarında bir səviyyədə olmasına sevinməzsən? O: "Bəli , sevinərəm" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O halda , olmaz." deyə buyurdu." (Müslim / 1623).

### Yeddinci fəsil: Bir kişinin başqa bir kişiyə ömürlük bir mal verməsi.

12- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Hər hansı bir kişi başqa bir kişiyə və övladlarına ömürlük bir mal verərsə və: "Bunu sənə və övladlarından bir kimsə qalana kimi verdim deyərsə, bu mal verilən kimsənin və övladlarının olar. Bu mal sahibinə qayıtmır. Çünki o elə bir şey vermişdir ki , onu mirasa salmışdır." (Müslim / 1625).

13- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mallarınızı əlinizdə saxlayın , onları ifsad (tələf) edərək dağıtmayın. Çünki, hər kim bir kəsə ömürlük bir mal verərsə , o mal o ölü və ya diri ikən onun və üşaqlarının olar." (Müslim / 1625).

## Miras kitabı.

### Birinci fəsil: Müsəlman kafirin, kafir də müsəlmanın varisi ola bilməz.

1- Usamə ibn Zeyd (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Müsəlman kafirin, kafir də müsəlmanın varisi ola bilməz." (Müslim / 1614).

### İkinci fəsil: Miras hissələrini əhlinə verin.

2- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Miras hissələrini əhlinə verin. Qalanı isə ən yaxın (qohumluq əlaqəsi) olan kişinindir." (Müslim / 1615).

### Üçüncü fəsil: Kələlənin (Atası və övladı olmayan şəxs) mirası haqda.

3- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Mən xəstə, heç bir şey dərk etməyən (huşsuz) bir halda ikən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma daxil oldu. Dəstəmaz aldı və dəstəmaz suyundan üzərimə səpdilər. Ayıldım və belə dedim: "Ey Allahın Elçisi , mənim mirasçım ancaq kələlədir." və miras ayəsi nazil oldu."
Muhamməd ibn Munkədirə belə dedim: "Səndən fətva istəyirlər. de: "Atası və övladı olmayan şəxs (şəxsin mirası) haqqında Allah sizə belə fətva verir" O: "ayə bu cür nazil olmuşdur" deyə buyurdu." (Müslim / 1616).

4- Madan ibn Əbu Talha belə rəvayət edir: "Ömər ibn əl-Xattab cümə günü xütbə verərək Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sonra isə Əbu Bəkri xatırladı sonra isə belə buyurdu: "Mən özümdən sonra kələlə məsələsindən başqa mühim bir şey qoymuram. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç bir məsələ haqda kələlə haqında soruşduğum qədər soruşmamışam. O da mənə heç bir şeydə buna görə dediyindən ağır bir söz deməmişdi. Hətta barmağını sinəmdə batırdı və belə buyurdu: "Ey Ömər , sənə (ən-Nisə surəsindəki) yay fəsli ayəsi (yayda nazil olduğu üçün belə

adlanır) kifayət deyilmi." əgər sağ qalsam , bu məsələdə elə hökm verəcəm ki, bu hökmü Quranı oxuya bilən və oxuya bilməyən də onunla hökm edə bilsin." (Müslim / 1617).

### Dördüncü fəsil: Ən son nazil olan ayə Kələlə ayəsidir.

5- əl-Barə ibn Azib (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Ən son tam şəkildə nazil olan surə tövbə surəsidir. Və ən son nazil olan ayə Kələlə ayəsidir." (Müslim / 1618).

### Beşinci fəsil: Hər kim özündən sonra bir mal tərk edərsə bu mal mirasçısınındır.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına üzərində borc olan bir kişinin cənazəsi gətirildiyində soruşardı: "Borcunu ödəmək üçün bir şey qoydumu?" Ona borcunu ödəmək üçün bir şey tərk etdiyi deyildikdə, ona cənazə namazı qılardı, əks halda isə: "Yoldaşınıza cənazə namazını qılın" deyə buyurardı. Elə ki, Allah Təala onun üçün fəthlər etdi, belə buyurdu: "Mən möminlərə öz nəfslərindən irəliyəm. Onlardan kim vəfat etdiyində üzərində borcu varsa , onu mən ödəyəcəyəm. Hər kim özündən sonra bir mal tərk edərsə , bu mal varislərindir." (Müslim/1619).

## Vəqf (məscidlərə dini idarələrə və sair.. bağışlanan, verilən yer və ya əmlak) kitabı.

### Birinci fəsil: Təməli vəqf üçün gəliri isə sədəqə üçün.

1- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Ömər (Allah ondan razı olsun) Xeybərdə bir yer əldə etdi və onun əmrini almaq üçün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi və belə dedi: "Ey Allahın Elçisi , mən Xeybərdən bir torpaq əldə etişmişəm. Mənə bundan qiymətli olan heç bir mal əldə etməmişəm. Mənə bununla nə etməmi əmr edərsən?" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "İstərsən təlini vəqf et və ondan (gələn gəliri) sədəqə et." Bunun üzərinə Ömər O yeri: "Təməli satılmaz və alınmaz, miras olunamaz və hədiyyə verilməz" şərti ilə sədəqə etdi. Ömər bu yeri, kasıblar, qohumlar, kölələr, Allah yolunda çıxanlar, yolçular və qonaqlar üçün sədəqə etdi. O yerə vali olan , ondan yaxşılıqla yeməsində, ondan mal sahibi olmaq istəməmək şərti ilə dostuna yedirməsində bir günah yoxdur." (Müslim /  1632).

### İkinci fəsil: İnsan (öldükdə) özündən sonra çatacaq savabı haqda.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: İnsan öldükdə onun bütün əmmələri (savabı) ondan kəsilər. Yalnız üç şeydən: qoyduğu daimi olan bir

sədəqədən, faydalanan bir elmdən və onun üçün dua edən saleh bir övladdan başqa." (Müslim / 1631).

### Üçüncü fəsil: Vəfat etdikdə vəsiyyət etməyən kəsin əvəzindən sədəqə vermək.

3- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrərk belə soruşdu: “Ey Allahın Elçisi , anam gözlənilmədən vəfat edib və vəsiyyət etmədi. O danışsaydı sədəqə vermək istədiyini zənn edirəm. Onun adından sədəqə versəm , ona savab yazılar?” O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Bəli” deyə cavab verdi.”

# Nəzirlər kitabı.

### Birinci fəsil: Allahın itaəti olan bir nəzirə vəfalı olmaq (yerinə yetirmək).

1- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Ömər ibn əl-Xattab (Allah ondan razı olsun) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Taifdən qayıtdıqdan sonra əl-Ciranə adlanan yerdə ikən ondan belə soruşdu: "Ey Allahın Elçisi , mən cahiliyyə dövründə Məscid əl-Haramda bir gün etikaf etməyə (ibadət etmək üçün qalmaq) nəzir etmişəm , necə bilirsən, edim? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Get bir gün etikaf et!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona qənimətdən bir kəniz vermişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xalqın əsirlərini azad etdikdə, Ömər ibn əl-Xattab (Allah ondan razı olsun) onlar belə deyərkən səslərini eşitdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizi azad etdi." O: "Bu nədir? " deyə soruşduqda, ona belə dedilər: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xalqın əsirlərini azad etdi." Ömər: "Ey Abdullah , get o kənizi azad et , getsin" deyə buyurdu." (Müslim/1656).

### İkinci fəsil: Nəzirin qəzası (yəni qalmış nəzrin) yerininə yetirməyin əmr olunması.

2- İbn Abbas (Allah onlarn razı olsun) belə rəvayət edir: "Saad ibn Ubada Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) anasının vəfat etmədən əvvəl etdiyi və ona vəfa etmədiyi nəziri haqda fitva istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Sən ona vəfa et!" (Müslim / 1638).

### Üçüncü fəsil: Kəbəyə getməyə nəzir edən haqda.

3- Uqba ibn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: "Bacım ayaqyalın Allahın Evinə getməyə nəzir edib və mənə bu haqda Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) fitva almamı əmr etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Həm piyada, həm də miniklə getsin." deyə buyurdu." (Müslim / 1644).

4- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir qocanı iki oğlunun arasında gətirildiyini gördü və belə soruşdu: "Buna nə olub?" Onlar: "O piyada

getməyə nəzir edib" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Allah Təala bunun özünə əzab verməsindən varlıdır (ehtiyacı yoxdur).” deyə buyurdu və ona miniyə minməsini əmr etdi." (Müslim / 1642).

## Dördüncü fəsil: Nəzir etməyin qadağan olması və nəzirin heç bir şeyi rədd etmədiyi (qabağını almaması) haqqda.

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəzir etməyi qadağan etdi və belə buyurdu: "O bir xeyir gətirməz, onunla yalnız simicdən mal çıxardılır." (Müslim / 1639)

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Nəzir , Adəm övladına Allahın onun qədərinə yazmadığı heç bir şeyi yaxınlaşdırmaz. Lakin nəzir qədərə müvafiq olur (ust-ustə düşür) və simicin çıxarmaq istəmədiyi malı çıxarar."(Müslim / 1640).

## Beşinci fəsil: Allaha asi olan şeylərdə və bəndənin əlində olmayan bir nəzirə vəfa edilməz.

7- İmran ibn əl-Huseyn (Allah ondan razı olsun) belə rəvayət edir: "Saqif qəbiləsi Bəni Uqeyl qəbiləsinin müttəfiqi idi. Saqif Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabından iki nəfəri əsir götürdü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabı isə Bəni Uqeyl qəbiləsindən bir kişini və bir əl-Adbə adlı dəvəni əsir aldılar. Adam qandalda ikən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanına gəldi. Kişi: "Ey Muhəmməd" deyə cağırdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanına gələrək: "Nə istəyirsən?" deyə soruşdu. O: "Məni nə üçün tutdun? Səbiqatul əl-Həcc adlı dəvəmi nə üçün tutdun?" deyə soruşdu? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məsələni böyütmək üçün belə buyurdu: "Müttəfiqiniz olan Səqifin cinayətinə görə" sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çevrilib getdikdə, kişi: "Ey Muhamməd! Ey Muhamməd!” deyə səslədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) rəhimli və ürəyi yumuşaq bir kimsə idi. Onun yanına qayıdaraq: "Nə istəyirsən?" deyə soruşdu . O: "Mən müsəlmanam" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Əgər bu sözü əmrinə malik ikən (azad) desəydin , tam qurtuluşa çatardın." Sonra çevrilib getdikdə, kişi: "Ey Muhamməd! Ey Muhamməd!” Deyə səslədi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanına qayıdaraq: "Nə istəyirsən?" deyə soruşdu. Kişi: "Mən acam , məni yedizdir! Susuzam içir!” deyə söylədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Sənin ehtiyacın budur" deyə buyurdu sonra bu kişi iki kişiylə dəyişdirildi."

İmran ibn əl-Huseyn sözünə belə davam etdi: "Ənsarlardan bir qadın əsir düşdü. Onunla bərabər əl-Adbə" adlı dəvə də əsir alındı. Qadın qandalda idi. İnsanlar dəvələrini evlərinin önündə rahatlayıdılar. Gecələrin birində qadın qandanlarından qurtularaq dəvələrə yaxınlaşdı. Hansı dəvəyə yaxınlaşdısa dəvə böyürməyə başlayırdı. Nəhayət əl-Adbənin yanına gəldi. O böyürmədi , həm öyrədilmiş bir dəvə idi. Qadın onun belinə mindi və onu sürərək yola düşdü. (qaçdığını hiss edərək) onu arayıb axtardılar, lakin tapmağa aciz qaldılar. Qadın Allaha, Allah

Təala onu bu dəvənin belində ikən xilas etsə , onu qurban kəsəcəyinə nəzir etdi. Mədinəyə çatdığında insanlar onu gördülər və "əl-Adbə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəvəsi" deyə səsləndilər. Qadın onun Allaha, Allah Təala onu bu dəvənin belində ikən xilas etsə , onu qurban kəsəcəyinə nəzir etdiyini dedi" Onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək bunu ona xəbər verdilər. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sübhənallah əvəzini necə də pis qaytarmışdır. Allaha, Allah Təala onu bu dəvənin belində ikən xilas etsə , onu qurban kəsəcəyinə nəzir etmişdir. Allah asi olan şeylərdə və bəndənin əlində olmayan bir nəzirə vəfa edilməz." (Müslim /1641).

### Altıncı fəsil: Nəzirin kəffarəsi.

8- Uqba ibn Amir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Nəzirin kəffarəsi, andın kəffarəsi kimidir." (Müslim / 1645).

# Andlar kitabı

### Birinci fəsil: Ataya and içmənin qadağan olması.

1- Ömər ibn əl-Xattab (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Allah Təala sizə atalarınıza and içmənizi qadağan edir." Ömər (Allah ondan razı olsun) belə buyurdu: "Allaha and olsun ki, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu qadağan etdiyini eşitdiyimdən bəri nə öz adımdan , nə də başqasının adından (onun adından nəql edərək) buna and içmədim." (Müslim / 1646).

2- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Hər kim and içəcəksə , yalnız Allaha and içsin!" Qureyş atalarına and içərdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Atalarınıza and içməyin!" (Müslim /1646).

### İkinci fəsil: Tağuta (bütlərə) and içməyin qadağan olması.

3- Əbd ər-Rahman ibn Samra (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Tağutlara , nə də atalarınıza and içməyin." (Müslim / 1648).

### Üçüncü fəsil: Hər kim əl-Lat və əl-Uzzəyə and içərsə Lə iləhə İlləallah desin.

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərəndən kim and içər və andında əl-Lata haqqı deyərsə, həmən Lə iləhə illəallah desil. Və hər kim dostuna gəl qumar oynayaq deyərsə , sədəqə versin." Başqa bir rəvayətdə isə "kim əl-Lat və əl-Uzzaya and içərsə." (Müslim / 1647).

### Dördüncü fəsil: And içərkən istisna etmənin (İnşə Allah demənin) müstəhəb olması.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Süleyman ibn Davud (onlara Allahın salamı olsun) belə buyurdu: "Bu gecə yetmiş qadınımı dolaşacağam və hər biri mənə Allah yolunda vuruşacaq bir oğlan bəxş edəcək." Dostu və ya Mələk ona: "İnşə Allah de." deyə buyurdu. O isə unutdu və demədi. Nəticədə qadınlarından heç biri doğmadı. Yalnız biri , o da şikəst bir oğlan doğdu." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O İnşə Allah desəydi, andından dönməz və ehtiyacına nail olardı." (Müslim / 1654).

## Beşinci fəsil: And içənin andı and içdirənin niyyətinə görədir.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "And and içdirənin niyyətinə görədir." (Müslim/1563).

## Altıncı fəsil: Hər kim and içərək bir müsəlmanın haqqına girərsə (haqqını götürərsə) Cəhənnəm ona vacib olar.

7- Əbu Umamə əl-Hərisi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hər kim And içərək bir müsəlmanın haqqına girərsə , Allah Təala Cəhənnəmi ona vacib, Cənnəti ona haram edər." Bir kişi ondan belə soruşdu: "Ey Allahın Elçisi , əgər kiçik bir şey olsa belə?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Arak ağacının budağı olsa belə." (Müslim/137).

8- Vail ibn Hucr (Allah ondan razı olsun) belə rəvayət edir: "Hadramövtdan (yəməndə yer adı) və Kində adlanan yerdən iki kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi. Hadramövtdan olan kişi belə dedi: "Ey Allahın elçisi, bu mənə aid torpağımı əlimdən alıb. Bu torpaq atamın olub." Kindili kişi isə belə dedi: "Bu torpaq məmin əlimdədir onu əkirəm. Onun bunda haqqı yoxdur." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hadramövtdan olana: "sənin dəlilin varmı?" deyə soruşdu. O: "Xeyr" deyə cavab verdikdə, ona: "Sənə and içdirmək düşər" deyə cavab verdi. Hadramövtdan olan belə dedi: "Ey Allahın Elçisi , kişi facirdir (yalançıdır) nəyə and içdiyi vecinə deyil. Heç bir şeydən qorxub ehtiyat etmir. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Sənə ondan bu vardır." Kişi and içdirməyə getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kişi çevrilib getdiyində, belə buyurdu: "Əgər o malına , onu zülm ilə yemək üçün and içərsə, Allahla qarşılaşdıqda Allah Təala ondan üz çevirər." (Müslim / 139).

## Yeddinci fəsil: Hər kim bir şeyə and içər , sonra ondan xeyirlisini görərsə, xeyirli olanı edib , andını pozaraq kəffarəsini versin.

9- Əbu Musa əl-Əşari (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən Əşari qəbiləsindən olan bir camaatla yüklərimizi daşımaq üçün Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir dəvə istəməyə gəldim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə: "Allaha and olsun ki, sizə (yüklərinizi daşımaq üçün) dəvə verməyəcəyəm. Məndə onsuz da sizin (yükü) daşıyacaq dəvə yoxdur." Biz Allahın istədiyi qədər gözlədik. Sonra dəvələr gətirildi və bizə üç ağ hörgüclü dəvə verilməsini əmr etdi. Yola düşdükdə, belə dedik (və ya bir-birimizə belə dedik): "Allah Təala bizə bərəkət

verməyəcək. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldik və (yükümüzü) daşıması üçün dəvə istədik, and içdi ki, bizə dəvə verməyəcək , sonra isə verdi." Onlar gəlib bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdikdə, belə buyurdu: "Mən sizə (yükünüzü daşımaq üçün) heyvanı vermədim. Lakin Allah verdi. Allaha and olsun ki, mən Allah isətədikdə , bir şeyə and içər , sonra ondan xeyirlisini görərəmsə, xeyirli olanı edib , andımı pozaraq kəffarəsini verərəm." (Müslim / 1649).

10- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında zülmət qaranlıq düşənə kimi oturdu sonra ailəsinin yanına gayıtdıqda uşaqlarını yatmış gördü. (Zövcəsi) əhli ona yeməyini gətirdikdə , uşaqları yatdığına görə yemək yeməməyə and içdi. Sonra fikrini dəyişərək yedi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xatırlatdıqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hər kim bir şeyə and içər , sonra ondan xeyirlisini görərsə, onu etsin və andını pozaraq kəffarəsini versin." (Müslim / 1650).

### Səkkizinci fəsil: Andın kəffarəsi.

11- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allaha and olsun ki, sizlərdən birinizin ailəsi haqda andınına israr etməsi, onun üçün Allah qatında Allaha olan andını pozub , fərz qıldığı kəffarəni verməkdən daha günahkar edər." (Müslim / 1655).

## Qan tökmənin haram olması, Qisas və əd- Diyə (qan pulu) haqda.

### Birinci fəsil: Qanın, malın və namusun haram olması.

1- Əbu Bakra (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən , zaman (yani il) Allahın göyləri və yeri yaratdığı gündəki (şəklinə) halına qayıtmışdır. İl on iki aydır , onun dördü haramdır. Üçü dalbadal: "Zülqəidə, Zülhiccə və Məhərrəm" və Mudar qəbiləsinin ayı olan Rəcəb ayıdır ki O Cəmədi ayı ilə Şabam ayının arasındadır." Sonra O belə soruşdu: "Bu hansı aydır?" Biz: "Allah və Elçisi bilər" dedik. O elə uzun bir müddət susdu ki, biz onun ayı başqa adla adlandıracağını zənn etdik. O belə buyurdu: "Məgər bu Zülhiccə deyil?" deyə soruşdu . Biz: "Bəli" deyə cavab verdikdə, O belə buyudu: "Bu hansı diyardır?" Biz: "Allah və Elçisi bilər?" dedik . O elə üzün bir müddət susdu ki, biz onu başqa adla adlandıracağını zənn etdik. O belə buyurdu: "Məgər məlum bir diyar deyilmi?" Biz: "Bəli" deyə cavab verdik. Sonra O: "bu hansı gündür?" deyə soruşdu. Biz: "Allah və Elçisi bilər" dedik. O elə üzün bir müddət susdu ki, biz onu başqa adla adlandıracağını zənn etdik." O: "Məgər bu , Qurban günü deyil?" deyə soruşdu. Biz: "Bəli , ey Allahın Elçisi" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizin qanınız, mallarınız, namusunuz sizə bu ayınızın, bu şəhərinizin və bu gününüzün hörməti kimi haramdır. Sonra Rəbbinizlə qarşılaşacaqsınız və əməlləriniz barəsində, sizdən soruşacaqdır. Məndən sonra bir birinizin boyunlarını vuran , düz yoldan azmış

olmağa qayıtmayın. Burada olan (iştirak edən) olmayana (eşitdiyni) təbliğ etsin (çatdırsın). Ola bilsin ki, təbliğ edən var ki , o , eşidəndən daha yaxşı qavrayandır." Sonra isə belə buyurdu: "Diqqət edin! təbliğ etdimmi (sizə çatdırdımmı)?" (Müslim/1679).

## İkinci fəsil: Qiyamət günü ən birinci mühakəmə qanla bağlı məsələlərdə olacaq.

2- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Qiyamət günü insanlar arasında ən birinci qan məsələsi mühakəmə olunacaq." (Müslim / 1678).

## Üçüncü fəsil: Müsəlman olan bir kəsin qanını halal edən şeylər haqda.

3- Abdullah ibn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allahdan başqa haqq məbud olmadığına və Mənim onun rəsulu olduğuma şəhadət edən bir müsəlmanın qanı ancaq üç şeydən biri ilə halal olar: zinakar evli (və ya boşanmış kişi və qadın), cana qarşı can və dini tərk edən , camaatı parçalayan." (Müslim / 1676).

## Dördüncü fəsil: Dini tərk edib (mürtəd olanın), öldürən və müharibə edənin hökmü.

4- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Ukal qəbiləsindən səkkiz nəfər Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldilər və ona islam beyəti etdilər. Yalnız Mədinənin havası onlara ağır gəldi və cisimləri xəstələndi. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu şikayət etdiklərində, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Çobanımızla dəvələrin yanına çıxsaydınız, onun südündən, sidiyindən içərdiniz?! " Onlar: "Bəli çıxarıq" deyə cavab verdilər və çıxdılar , (dəvələrin) südündən , sidiyindən içdilər , sağaldılar və çobanı öldürüb dəvələri oğradılar. Xəbər Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çatdıqda , onların arxasınca göndərdi. Onlara çatdılar və tutub gətirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əmr etdi, onların əlləri və ayaqlarını kəsdilər , gözlərinə isti mismar çəkdilər , sonra ölənə kimi günəşin altına atdılar." (Müslim / 1671).

## Beşinci fəsil: Qətli icad (özündən sonra bu işi qoyub gedənin) edən kimsənin günahı.

5- Abdullah ibn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Zülümlə qətll edilmiş hər bir nəfsin qanından ilk Adəm övladına pay var. Çünki o , ən birinci qətl törədəndir. (Müslim / 1677).

## Altıncı fəsil: Özünü hər hansı bir alətlə qətlə yetirənin Cəhənnəmdə ona bu alətlə əzab verilməsi haqda.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər kim özünü bir dəmir parçası ilə qətlə yetirərsə, dəmiri əlində onu öz qarnına batırmış halda Cəhənnəmdə əbədi və daimi olaraq qalacaqdır. Hər kim zəhər içərək özünü

öldürərsə, zəhərini Cəhənnəmdə əbədi və daimi olaraq dadacaqdır və hər kim özünü dağdan ataraq öldürərsə, Cəhənnəmdə əbədi və daimi olaraq (dağdan) yuvarlanacaqdır." (Müslim / 109),

7- Səhl ibn əs-Saidi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müşriklərlə qarşılaşaraq onlarla vuruşdu. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) öz qoşun qərargahına, müşriklər də öz qoşunun qərargahına qayıtdıqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən bir kişi var idi ki, düşmən qoşunundan kimsə ayrılsaydı , onun dalınca düşər , qılıncı ilə onu vurmamış əl çəkməzdi." Səhabələr: "Bu gün bizdən heç kim filankəs kimi yararlı olmadı." dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O adam Cəhənnəm əhlindəndir." Camaatdan bir kişi belə buyurdu: "Mən daima onunla birgə olacağam." Və onunla birgə çıxdı. O hər dəfə dayandıqda o da dayanar , sürətlə adımladıqda, o da surətlə addımlayardı. Kişi ağır yaralandı və ölümü tezləşdirmək üçün qılıncının dəstəyini yerə, ucunu isə sinəsinə qoydu və qılıncın üzərinə yıxılaraq özünü öldürdü. Kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Allaha şəhadət edirəm ki, sən onun elçisisən." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O nə?" deyə soruşdu. Kişi belə cavab verdi: "Keçən dəfə kişinin Cəhənnəm əhlidən olmasını xatırlatdığında insanlara bu (bunu qəbul etmək) ağır gəlmişdi. Mən onlara: "Sizin üçün onun xəbəri məndədir" dedim və onu axtarmaq üçün çıxdım. Nəhayət , o ağır yaralandı və ölümü tezləşdirmək üçün qılıncının dəstəyini yerə, ucunu isə sinəsinə qoydu və qılıncın üzərinə yıxılaraq özünü öldürdü." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəzən kişi Cəhnnəm əhlindən olduğu halda , insanların gözündə Cənnət əhlinin əməlini edər. Bəzən isə Cənnət əhlindən olduğu halda , insanların gözündə Cəhənnəm əhlinin əməlini edər." (Müslim / 112).

## Yeddinci fəsil: Daşla qətlə yetirənin eyni misli ilə qətlə yetirmək.

8- Ənəs İbn Malik (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir cariyə (qız) başı iki daş arasında əzilmiş halda tapıldı. Ondan: "Bunu sənə kim etdi? Filankəs? Filankəs?" Deyə soruşuldu. Nəhayət bir yahudini xatırlatdıqda, başını əyərək onun olduğunu bildirdi. Yahudini tutdular. O bunu etiraf etdi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun da başının iki daş arsında əzilməsini əmr etdi." (Müslim / 1672).

## Səkkizinci fəsil: Bir kişinin əlini dişləyən və dişini sındıran haqda.

9- İmran ibn Huseyn (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi başqa bir kişinin əlini dişlədi, O da əlini çəkdi və kişinin bir və ya bir neçə dişi çıxıb düşdü. Və Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona zülm edənə qarşı kömək istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mənə nə əmr edirsən? Mənə ona əlini sənin ağzına qoymasını əmr etməmi və sənin də onu ayğır kimi gəmirməni istəyirsən?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Ver əlini dişləsin sonra çək" deyə buyurdu." (Müslim / 1673).

## Doqquzuncu fəsil: Yaralamağa görə qisas almaq , yalnız diyə (qan puluna) almağa razı olmaq müstəsna.

10-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Ummu Hərisə ər-Rabinin baçısı bir insanı yaraladı. Onlar Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şikayətçi oldular və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  "Qisas! Qisas!" deyə buyurdu. Ummu ər-Rabi ona: "Ey Allahın Elçisi , filankəsdən qisa alınacaq? Allaha and olsun ki, ondan qisas alınmayacaq." Deyə buyurdu.  Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ona belə buyurdu: "Sübhanallah , Ey Ummu ər-Rabi , Allahın kitabı qisas deyir!" O belə cavab verdi: "Xeyr , Allaha and olsun ki, ondan əbədiyyən qisas alınmayacaq." Bu sözləri təkrarlaya-təkrarlaya, nəhayət onlar diyəni qəbul etdilər və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahın bəndələrindən eləsi vardır ki, Allaha and içsələr , Allah Təala onları andlarında sadiq çıxarar." (Müslim/1675).

## Onuncu fəsil: Qətli etiraf edən və valiyə təsil edildikdən sonra onu bağışlaması haqda.

11-Əlqamə ibn Vail atasından (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə oturduğum bir ərəfədə bir kişi  başqa bir kişinin boynunu dəri bir kəndirlə bağlamış halda dartıb gətirdi və belə dedi: "Ey Allahın Elçisi,  bu , qardaşımı öldürüb. " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  ondan: "Onu öldürmüsənmi?" deyə soruşdu. (Onu dartarq gətirən kişi belə dedi: "Əgər o etiraf etməsəydi , əlehinə sübüt gətirəcəkdim.") O: "Bəli öldürdüm" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Onu necə öldürdün?" deyə soruşdu. O belə dedi: "Mən və o bir ağacdan yarpaq kəsirdik. Və o məni söyüb qəzəbləndirdi. Əlimdəki balta ilə onun başının yan tərəfindən vurub öldürdüm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Nəfsinin əvəzinə verə biləcəyin bir şeyin varmı?" O belə cavab verdi: "Yalnız paltarım və baltam var." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Necə bilirsən gövmün səni satın alarlarmı?" deyə soruşdu. O: "mənim onların yanında bir dəyərim yoxdur." deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ipi (sanki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu xilas etmək üçün onun boynundakı ipdən yapışmışdı) kişiyə atdı və belə buyurdu: "yoldaşını götür!" kişi çevrilib getdi. O aralaşdıqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  belə buyurdu: "Əgər onu öldürsə , o da onun kimidir." Kişi qayıdaraq belə dedi: "Ey Allahın Elçisi, mənə sənin: "Əgər onu öldürsə , o da onun kimidir" deməyinin xəbəri çatdı və mən onu sənin əmrinlə apardım?! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  belə buyurdu: "Məgər onun sənin və yoldaşının (öldürdüyü kəsin) günahlarını üzərinə almasını istəmirsənmi? Kişi: "Ey Allahın Elçisi, (yəqin ki belə dedi) Bəli" deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən , bu onun kimdir" və kişi əlindəki kəndiri ataraq onu buraxdı." (Müslim / 1680).

## On birinci fəsil: Qarnına vurulan və bətnindəki uşağı düşüb ölən qadının və cənin (uşağın) diyəsi.

12-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Huzeyl qəbiləsindən iki qadın dalaşdı. Onlardan biri o birini daşla vurub bətnindəki uşağı öldürdü. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mühakimə etdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və

salamı olsun): "Cəninin (uşağın) diyəsinin Ğurra (yəni) bir kölə və ya kəniz olduğunu hökm kəsdi. Qadının diyəsini isə (diyə ödəyən, cani) qadına hökm kəsdi. Qadın, üşaqları və onunla bərabər olanlar ona mirasçı olacaq." Həml ibn Nəbiğa əl-Huzəli Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Ey Allahın Elçisi, heç bir yemək yeməyən, içməyən, danışmayan və doğulub nəfəs almayan bir kəsin (diyəsini) necə odəyim. Bunun kimisi ancaq hədərdir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu adamın gətirdiyi qafiyə yalnız kahinlərlə qardaşlıqdan irəli gəlir." (Müslim / 1681).

### On ikinci fəsil: Hədər olan şeydə diyə yoxdur.

13- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Quyunun yaralaması hədərdir. Mədənin yaralaması hədərdir. Heyvanın yaralaması hədərdi. (cahilliyə dövründən qalan və tapılan) Xəzinədən isə beşdə bir vardır. (Götürülər.)" (Müslim / 1710).

## Qasəmə (and içənlərə verilən ad) Kitabı.

### Birinci fəsil: And içən kimsə haqda.

1- Səhl ibn Əbu Həsmə qövmünü bəzi böyüklərindən belə rəvayət edir: "Abdullah ibn Səhl və Muheyyasa başlarına gələn sıxıntıdan dolayı Xeybərə getdilər. Az sonra Muheyyasaya gəlib Abdullah ibn Səhllin öldürülüb bir quyu və ya bir çuxurun içinə atıldığını xəbər verdilər. O , yəhudilərin yanına gələrək belə dedi: "Allaha and olsun ki, onu siz öldürmüsünüz." Onlar: "Allaha and olsun ki, biz öldürməmişik." deyə cavab verdilər. Sonra qayıdaraq qövmünün yanına gəldi və bunu onlara xəbər verdi. Sonra o , böyük qardaşı Huveysa və Abdurrahman ibn Səhlə getdi. Muheyyasa - Xeybərdə olan da O idi- danışmaq istədikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Muheyyasaya yaşı qəsd edərək: "Boyüt! Böyüt" deyə buyurdu. Və Huveysa danışdı, sonra isə Muheyyasa danışdı." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ya qardaşınızın diyəsini verirlər , ya da ki, müharibəyə hazır olduqlarını bizə xəbər verirlər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara məktub göndərdi. Onlar da cavab olaraq: "Allaha and olsun ki, biz öldürmədik" deyə ona yazdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Huveysa və Muheyyasaya belə buyurdu: "And içib qardaşınızın qanını haqq edərsiniz?" Onlar: "Xeyr." deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlardan: "Yəhudilər sizin üşün and içsələr?" deyə soruşdu. Onlar: "Onlar Müsəlman deyillər" deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara diyəni özü verdi və onlara yüz dişi dəvə verdi və evlərinə daxil olana kimi sürdürdü. Səhl belə buyurmuşdur: "Bu dişi dəvələrdən qırmızı bir dəvə məni şıllaqladı." (Müslim / 1669).

### İkinci fəsil: And içənlərin (and içdikləri) şeylərdə iqrar edilməsi haqda.

2- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ənsarlardan olan səhabi bir kişi (Allah ondan razı olsun) belə rəvayət edir:

"Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) cahiliyyə dövründə and içənləri and içdikləri şeylərdə qalmalarını iqrar etdi." (Müslim / 1670).

## Cəzalar Kitabı

Birinci fəsil: Zina etmiş bakirə və evli olan kəsin cəzası.

1- Ubada ibn əs-Samit (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəhy nazil olduqda kədərlənər və üzünün rəngi ağdan başqa bir rəngə dəyişərdi. Bir gün ona yenə vəhy nazil olduqda eyni hala düşdü. Ondan bu hal ötüb keçdikdə, belə buyurdu: "Məndən öyrənin! Artıq Allah Təala onlar (qadınlar) üçün çıxış yol vermişdir. Evli ilə evli, bakirə ilə bakirə. Evliyə yüz qamçı vurular sonra isə daşqalaq olunar. Bakirəyə isə yüz qamçı vurular və bir il uzaqlaşdırılar." (Müslim / 1690).

İkinci fəsil: Zina edən evlinin daşqalaq olunması.

2- Ubeydullah ibn Abdullah ibn Utba Abdullah ibn Abbasdan (Allah onlardan razı olsun) belə eşitdityini rəvayət edir: "Ömər ibn əl-Xattab Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərində oturmuş halda belə buyurdu: "Allah Təala Muhəmmədi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) haqlla yolladı və ona kitab nazil etdi. Allahın Ona nazil etdiyi şeylərdən biri də Rəcm (daşqalaq) ayəsidir. Onu oxuduq , əzbərlədik və dərk etdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) daşqalaq etdi və bizdə ondan sonra daşqalaq etdik. Qorxuram ki, zamanə uzandıqca kimsə: "Allahın kitabında daşqalaq etməyi tapmadıq deyər və Allahın vacib buyurduğunu tərk etdiklərinə görə zəlalətə düşərlər. Muhsan (evli) olan və zina etmiş hər bir kişi və qadına sübüt edilərək, hamilə və etiraf etməsi ilə daşqalaq olunması Allahın kitabında haqdır." (Müslim/1691).

Üçüncü fəsil: Zina etdiyini etiraf edən kimsənin cəzası.

3- Cabir ibn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına qısa boylu, qarışıq saçlı, əzələli , izar geymiş bir kişi gətirdilər. O zina etmişdi. Onu iki kərə geri qaytardı , sonra isə daşqalaq olunmasını əmr etdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Biz hər dəfə Allah yolunda döyüşə çıxdığımız zaman sizlərdən biri qalır , çəpişin mələdiyi kimi mələyir və onlardan (qadınlardan) birinə süd verir. Allah Təala onlardan birini mənə izn vermir ki, onu başqalarına ibrət edim."
Şöbə belə dedi: “Bu Hədisi Səid ibn Cubeyrə danışdım və o "Onu dörd dəfə geri qaytardı" deyə buyurdu.” Başqa rəvayətdə isə onu iki və ya üç dəfə qaytardı." (Müslim / 1692).

Dürdüncü fəsil: Zina etdiyini etiraf edənin dörd dəfə qaytarılması, daşqalaq olunan üçün çuxur qazılması, hamilənin daşqalaq olunmasının təxirə salınması və daşqalaq olunana cənazə namazının qılnması haqda.

4- Bureydə (Allah ondan razı olsun) belə rəvayət edir: "Məiz ibn Məlik əl-Əsləmi (Allah ondan razı olsun) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi və belə buyurdu: "Ey Allahın Elçisi, mən nəfsimə zülm etdim və zina etdim. Mən istəyirəm ki, məni təmizləyəsən." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu geri qaytardı. Sabah açıldıqda o yenə gəldi və belə dedi: "Ey Allahın Elçisi, mən nəfsimə zülm etdim və zina etdim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu ikinci kəs geri qaytardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun qövmünə adam göndərərək: "Onun ağlında nəsə bir şey (çatışmamazlıq) olduğunu bilirsinizmi?" deyə soruşdu. Onlar: "Biz onu sağlam ağıllı bir adam olaraq bilirik və onu bizim salehlərimizdən sayırıq." Deyə cavab verdilər. Sonra o üçüncü dəfə gəldi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə onlardan soruşmaq üçün adam göndərdi. Onlar ona onun özünün və ağlının sağlam olduğunu xəbər verdilər." Dördüncü dəfə gəldiyində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün çuxur qazdırdı. Sonra əmr etdi və o daşqalaq olundu." Sonra Ğamidiyyə (qadın) gəldi və : "Ey Allahın Elçisi, mən zina etmişəm məni təmizlə" deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu geri qaytardı. Səhəri gün gəldiyində belə dedi: "Ey Allahın Elçisi, məni niyə qaytardın. Yəqin sən məni Məizi qaytardığın kimi qaytarmaq istəyirsən. Allaha and olsun ki, mən hamiləyəm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əgər yox deyirsənsə (yəni təmizləmək istəyin və tövbə edib Allahın sənin eybini örtmənə yox deyirsənsə) get , hamiləyin bitdikdən sonra gəl. Doğduqdan sonra əlində körpəsi əskiyə bələnmiş halda gəldi və: "Onu doğdum" deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Get onu süddən kəsilincəyə qədər əmizdir." Deyə buyurdu. Onu süddən ayırdıqdan sonra uşaqla gəldi. Uşağın əlində çörək parçası vardı. Qadın belə dedi: "Ey Allahın Elçisi, onu süddən ayırdım , artıq yemək yeyir." Uşağı müsəlmanlardan bir kişinin yanında qoydu. Sonra əmr edildi və onun üçün sinəsinə kimi çuxur qazıldı və insanlara əmr olundu, onlar da onu daşqalaq etdilər. Xalid ibn Valid bir daş götürərək onun başına vurdu və qanı onun üzünə sıçradıqda onu söydü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun söydüyünü eşitdikdə, belə buyurdu: "Yavaş ol , Ey Xalid! Nəfsim əlində olana and olsun ki, o elə bir tövbə etmişdir ki , əgər bac-xərac yığan belə tövbə etsəydi , bağışlanardı." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əmr etdi və ona cənazə qıldı və basdırıldı." (Müslim / 1695).

## Beşinci fəsil: Zimmət əhliindən olan Yahudilərdən zina etmiş kimsənin daşqalaq olunması.

5- Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına zina etmiş bir yəhudi kişi və qadın gətirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çıxaraq yəhudilərin yanına gəldi və belə buyurdu: "Tövratda zina edənin cəzası haqda nə tapmısınız?" Onlar belə dedilər: "Onların üzlərini qaraldırıq, sonra onları (eşşəyin) üzərinə tərsinə mindirik və onları (şəhərdə) dolaşdırırıq." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: "Əgər dediyinizdə sadiqsinizsə , tövratı gətirin" deyə buyurdu. Onlar onu gətirib oxudular. Daşqalaq ayəsinə çatdıqda tövratı oxuyan oğlan əlini daşqalaq ayəsinin üzərinə qoydu və qabaq və sonra olan ayəni oxudu. Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)

birgə olan Abdullah ibn Salam Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ona əmr et əlini çəksin" deyə buyurdu. O əlini qaldırdı və əlinin altında daşqalaq ayəsi göründü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əmr etdi və onlar daşqalaq edildilər." Sonra Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Mən də onları daşlqalaq edənlərdən biri idim. Onu (kişini) bədəni ilə qadını daşlardan qoruduğunu gördüm." (Müslim/1699).

Altıncı fəsil: Kölə zina etdikdə onun şallaqlanması.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evlənməmiş köləyə zina etdikdə cəsının nə olduğu soruşuldu?" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "Zina etsə , şallaqlayın! Sonra yenə zina etsə şallaqlayın! Sonra yenə zina etsə şallaqlayın! Sonra onu bir ip əvəzinə olsa da satın." İbn Şihab belə buyurmuşdur: "Bilmirəm bunu üçüncü və ya dördüncüdən sonra dedi." (Müslim / 1705).

Altıncı fəsil:  Ağanın öz köləsini cəzalandırması.

7- Əbu Əbd ər-Rahman (Allah ondan razı olsun) belə rəvayət edir: "Əli (Allah ondan razı olsun)  xütbə verdi və belə buyurdu: "Ey insanlar, kölələrnizdən evlənmiş və evlənməmiş olanlara (zina etsələr) cəzanı tətbiq edin. Çünki Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir köləsi (qadın) zina etdi və O mənə onu şallaqlamağı əmr etdi. O (qadın) nifas (doğumdan sonra olan) halından təzə çıxmışdı onu şallaqlasam , öldürərəm deyə qorxdum və bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Düz etdin" deyə buyurdu." Başqa rəvayətdə isə belə əlavə olunur: "Onu sağalana kimi burax!" (Müslim/1705).

## Oğurluğun cəzası.

Yeddinci fəsil: Əlin hansı şeylərə görə kəsilməsi haqda.

8- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Oğrunun əli dördə bir dinardan və daha çox bir (qiymətli) şeyə görə kəsilər. (bundan az olan bir şeyə görə kəsilməz)" (Müslim / 1684).

Doqquzuncu fəsil: Əli qiyməti üç dirhəm olan şeyə görə kəsmək.

9- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qiyməti üç dirhəm olan qalxana görə oğrunun əlini kəsdi." (Müslim / 1686).

Onuncu fəsil: Yumurtaya görə kəsmək.

10- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Allah Təala oğruya

lənət etsin , yumurta oğurlayır və əli kəsilir. Kəndir oğurlayır və əli kəsilir." (Müslim /1687).

### On birinci fəsil: Cəzada şəfaətçi olmağın qadağan olması.

11-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında Fəth döyüşündə oğurluq edən (Məxzumiyyə qəbiləsindən olan) qadının halı qureyşi narahat etmişdi (üzmüşdü). Onlar: "Onun haqda Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kim şəfaətçi ola bilər? Buna ancaq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sevimlisi olan Usamə ibn Zeyd cürət edə bilər." dedilər. Usamə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək qadına görə onunla danışdı. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzünün rəngi dəyişdi və belə buyurdu: "Allahın qoyduğu cəzalardan birində şəfaətçi olursan?!" Usamə ona: "Ey Allahın Elçisi, mənim üçün bağışlanma dilə!" Axşam olduğunda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxaraq xütbə verdi, Allaha gərəkdiyi kimi həmd-səna etdi sonra isə belə buyurdu: "Və sonra sizdən əvvəlki ümmətlərin həlak olma səbəblərindən bu idi ki: onlardan şərəfli olan bir kimsə oğurluq etsəydi , onu tərk edərdilər (ona toxunmazdılar), onlardan olan zəif bir kimsə oğurluq edərdisə onu cəzalandırardılar. Mən nəfsim əlində olana and içirəm ki, əgər Muhamməd qızı Fatimə oğurluq etsəydi , onun əlini kəsərdim." Sonra əmr etdi və oğurluq edən qadının əlini kəsdilər." Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Sonra bu qadın tövbə etdi və ərə getdi. Bundan sonra bizə gələrdi və mən də onun ehtiyacını Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ərz edərdim." (Müslim / 1688).

## İçki (sərxoşedici maddə) içənin cəzası.

### On ikinci fəsil: İçki içənə neçə şallaq vurulması haqda.

12- Hudeyr ibn əl-Münzir Əbu Səsən belə rəvayət edir: "Valid Osman ibn Affanın yanına gətirildi. Valid sabah namazını iki rukət qılandan sonra belə demişdi: "Sizin üçün namazı artırımmı?" İki kişi onlardan biri Humran olmaqla onun içki içdiyinə şahidlik etdi. Başqa biri isə onu qusarkən gördüyünə şahidlik etdi. Osman ibn Affan (Allah ondan razı olsun) belə buyurdu: "Bu içki içməsəydi qusmazdı. Ey Əli , qalx onu şallaqla!" Əli Həsənə: "Ey Həsən , qalx onu şallaqla!" Həsən isə belə dedi: "Sən onun cəfasını səfasını sürənə yüklə!" Sanki o Osmana küsgün idi. Nəhayət Əli: "Ey Abdullah ibn Cəfər, qalx onu şallaqla." Deyə buyurdu və o da qalxdı , onu şallaqladı və Əli isə sayırdı. Nəhayət qırxa çatdıqda: "Dur!" deyə buyurdu sonra belə dedi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qırx vurdu, Əbu Bəkr qırx vurdu, Ömər isə səksən vurdu və hamısı sünnətdir , mənə isə bu , daha sevimlidir." (Müslim 1707).

13-Əli (Allah ondan razı olsun) belə buyurmuşdur: "Bir kimsəyə cəzasını tətbiq etdiyimdə , ölməsi məni üzməz , yalnız içki içən müstəsna. Əgər o ölərsə , onun diyəsini verərəm. Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu sünnət etməmişdir." (Müslim/1707).

On üçüncü fəsil: Çəkindirmək üçün şallaqlamaq.

14- Əbu Burdə əl-Ənsari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deyərkən eşitdiyini rəvayət edir: "Heç bir kimsəyə on qamçıdan artıq vurulmaz , yalnız Allah Təalanın qoyduğu cəzalar müstəsnadır." (Müslim / 1708).

On dördüncü fəsil: Cəzalandırılan kəsə bu cəzanın onun üçün kəffarə olması. (günahının bununla silinməsi).

15- Ubadə ibn Samit (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizdən qadınlardan aldığı kimi söz (beət) aldı: "Allaha heç bir şeyi şərik qoşmamağa, oğurluq, zina etməməyə, övladlarımızı öldürməməyə, bir birimizə böhtan (yalan) atmamağa. Sizlərdən hər kim verdiyi sözə vəfalı olarsa , savabı Allahdadır. Sizlərdən hər hansınızın üzərinə cəza düşərsə və ona cəza tətbiq olunsa , bu , onun üçün kəffarə olar. Və hər kimin eybini (günahını) Allah Təala örtərsə , onun hesabı Allahdadır. İstərsə ona əzab verər , istərsə də bağışlar." (Müslim /1709).

# Qazilik (hököm vermə) və Şahidlik Kitabı.

Birinci fəsil: Zahirə görə hökm vermək və hüccəti (sübut) düzgün çatdırmamaq.

1- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evinin qapsında mühakəmə üçün gələnlərin bir birinə qarışmış səslərini eşitdi və onların yanına çıxaraq belə buyurdu: "Mən yalnız bir bəşər övladıyam. Mənim yanıma mühakəmə üçün gəlirlər. Ola bilsin bəziləri o birilərindən daha inandırıçı danışır (bəyan edir) və mən onun sadiq olduğunu hesab edib onun lehinə hökm verirəm. Mən kimin lehinə hököm kəsərək müsəlman olan kəsin haqqına girmiş olsam, şübhəsiz ki , bu , Cəhənnəmdən bir parça oddur. İstərsə onu üzərinə alsın və ya tərk etsin." (Müslim / 1713).

İkinci fəsil: Şiddətli düşmənçilik haqda.

2- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz ki, kişilərin Allaha ən sevimsiz olanı şiddətli düşmənçilik edənidir." (Müslim / 2668).

Üçüncü fəsil: Ona qarşı iddia sürülənə and içmək hökmü kəsmək.

3- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Əgər insanlara hər iddia etdikləri şey verilsəydi, bir dəstə insan bəzi kişilərin qanlarını və mallarını iddia edərdilər. Lakin ona qarşı iddia sürülənə and içmək düşər." (Müslim / 1711).

Dördüncü fəsil: And içmək və şahidlə hökm kəsmək.

4- İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) and içmək və şahid gətirməklə hökm kəsdi." (Müslim \ 1712).

## Beşinci fəsil: Qazi qəzəbli halında ikən höküm kəsməsin.

5- Əbd ər-Rahman ibn Əbu Bəkra belə rəvayət edir: "Atam Ubeydullah ibn Əbu Bəkraya o , Sicistanda qazi ikən məktub yazdı. Məktubu onun üçün yazan mən idim. O belə deyirdi: "Qəzəbli halda olduqda iki nəfərin arasında höküm kəsmə! Çünki mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Heç kim qəzəbli ikən iki nəfərin arasında höküm kəsməsin." (Müslim / 1717).

## Altıncı fəsil: Hakim höküm verdikdə özündən ictihad edərsə, düzgün və ya səhv höküm verməsi haqda.

6- Amr ibn əl-Ass (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişdim: "Hakim höküm verdikdə özündən ictihad edərsə və düzün hökm kəsərsə , onun iki savabı vardır. Yox , ictihad edib səhv höküm kəsərsə , ona bir savab vardır." (Müslim / 1716).

## Yeddinci fəsil: İctihad edənlərin hökümdə ixtilafı haqda.

7- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir dəfə iki qadın uşaqları ilə birgə ikən, canavar gələrək onlardan birinin uşağını apardı. Qadınlardan biri o birinə: "Canavar sənin uşağını apardı. O biri isə ona: "Xeyr , sənin uşağını aparıb" dedilər və Davuddan onlar arasında hökm kəsməsini istədilər." Davud uşağı onların yaşda böyük olanına verilməsinə hökm kəsdi. Onlar Süleyman ibn Davudun (onların hər ikisinə Allahın salamı olsun) yanına gələrək ona bu xəbəri verdilər. O belə buyurdu: "mənə bıçaq gətirin , onu sizin aranızda bölüm." Onlardan yaşda balaça olanı: "Xeyr! Allah sənə rəhm etsin. Uşaq (yaşda böyük olan qadını qəsd edərək) onundur." Deyə söylədikdə, Süleyman uşağın ona (yaşda balaca olana) verilməsinə hökm kəsdi." Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurmuşdur: "Allaha and olsun ki, əs-Sikkin (bıçaq) sözünü heç eşitməmişdim yalnız bu gün eşitdim. Biz ona (bıçağa) yalnız əl-Mudyə deyirdik." (Müslim/1720).

## Səkkizinci fəsil: Hakimin (Qazının) münaqişə edən iki şəxsin arasını islah etməsi.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bir kişi başqa bir kişidən ona məxsus torpaq aldı. Torpağı alan kişi onun (satanın) torpağında bir küp qızıl tapdı. Qızılı götürərək satanın yanına gələrək: "Qızılını götür , mən səndən yalnız torpağını almışam." deyə buyurdu. Torpağı satan ona belə cavab verdi: "Mən sənə torpağı və onda olanı satmışam." Onlar bir kişiyə onları mühakimə etməsini söylədilər. Onlara höküm kəsən kişi belə buyurdu: "Sizin uşaqlarınız varmı?" onlardan biri: "Mənim oğlum var." O biri isə: "Mənim qızım var" dedi. Kişi belə dedi: "Oğlanı qızla evləndirin və bundan (qızıldan) hər ikiniz sərf edin və sədəqə verin." (Müslim /1721).

## Doqquzuncu fəsil: Ən xeyirli şahidlər haqda.

9- Zeyd ibn Xalid əl-Cuhani (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "sizə ən xeyirli şahidlik edənləri xəbər verimmi? O, ondan soruşulmadan qabaq şahidlik edəndir." (Müslim /1719).

# Tapıntı Kitabı

## Birinci fəsil: Tapıntının hökmü haqda.

1- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabəsi olan Zeyd ibn Xalid əl-Cuhani (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tapılan qızıl və ya gümüş haqda soruşuldu. O belə cavab verdi: "Onun ipini və qabını bəlli et. Sonra onu bir il elan et. Əgər sahibi çıxmazsa , onu sərf edə bilərsən. Tapılan şey əlində bir əmanət olsun. Bir gün sahibi gələr və səndən onu tələb edərsə , onu sahibinə qaytar." Sonra ondan itmiş dəvə haqda soruşdular və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ondan sənə nə! Onun (dəvənin) yanında çarıqları və suyu var. Sahibi onu tapana kimi suya gəlir və ağaclardan yeyir." Sonra ondan qoyun haqda soruşdular, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onu Götür! O ya sənindir, ya qardaşının, ya da canavarın." (Müslim / 1722).

## İkinci fəsil: Həcdə tapılan.

2- Əbd ər-Rahman ibn Osman ət-Təmimi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həcdə tapılanı (götürməyi) qadağan etdi." (Müslim/1724)

## Üçüncü fəsil: Azmış heyvanı evində gizlədən özü azmışdır.

3- Zeyd ibn Xalid əl-Cühəni (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Azmış heyvanı elan etməyib evində gizlədən , özü azmışdır." (Müslim / 1725).

## Dördüncü fəsil: Sahibinin izni olmadan insanların heyvanını sağmağın qadağan olması.

4- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən biri sahibinin izni olmadan başqasının heyvanını sağmasın! Sizlərdən kimə, onun anbarına kiminsə girərək xəzinəsini sındırması və yeməyini (azuqəsini) aparması xoş gələr? Xalqın heyvanları döşlərində onlar üçün yemək saxlayır. Nə badə sizlərdən biri sahibinin izni olmadan başqasının heyvanını sağsın!" (Müslim/1726).

# Qonaq qəbul etmək kitabı.

### Birinci fəsil: Qonaqları qəbul etməyənlərin hökmü haqda.

1- Uqba ibn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedik: "Ey Allahın Elçisi , sən bizi bir qövmə elçi olaraq göndərdiyində, onlarda qonaq kimi qaldığımız zaman bizi yaxşı qəbul etmirlər. Buna nə deyirsən?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə buyurdu: "Əgər bir qövmə qonaq olsanız , sizin üçün qonağa layiq olan şeylərin (yemək, hörmət) verilməsini əmr etsələr, onu qəbul edin. Əgər belə etməsələr , onlardan onlara layiq olan qonağın haqqını götürün." (Müslim / 1727).

### İkinci fəsil: Qonağı qəbul etməyin əmr olunması.

2- Əbu Şureyh əl-Xuzai (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qonaqlıq üç gündür (qonaq üç gün qəbul edilər). Caiz olanı (yəni üç gün qəbul edə bilməyən üçün) bir gün və bir gecədir. Müsəlman bir kişiyə qardaşının yanında onu günaha salacağı qədər (çox) qalması halal olmaz." Onlar: "Ey Allahın Elçisi, onu necə günaha salar?" deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ona veriləcək bir şeyi olmaya-olmaya onun yanında oturub qalır." (Müslim / 1726).

### Üçüncü fəsil: Malın artıq qalanı ilə yardım etmək.

3- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəfə biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə səfərdə ikən, bir kişi miniyinin üzərində gəldi və gözünü sağa və sola yönəltməyə başladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Kimin yanında artıq heyvanı vardırsa, onu olmayana versin. Kimin yanında artıq azüqəsi varsa , onu azuqəsi olmayana versin." Ravi belə demişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mal çeşitlərindən o qədər söylədi ki, hətta biz artıq malda bizim heç haqqımız olmadığını fikirləşdik." (Müslim / 1728).

### Dördüncü fəsil: Azuqə azaldıqda onu bir yerə cəm edərək yardım etməyi əmr etmək.

4- İyas ibn Sələmə atasından (Allah ondan razı olsun) belə rəvayət edir: "Döyüşlərin birində Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə idik. Bizə qıtlıq üz verdi. Hətta biz bəzi minik heyvanlarımızı kəsmək istədik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə azuqələrimizi cəm etməyi əmr etdi və bunun üçün bir dəri süfrə sərdi. Camaatın azuqəsi süfrənin üzərinə toplandı. Mən onun nə qədər olmağını bilmək üçün boylandım və onun ancaq keçinin oturarkən olan cəsədi boyda olduğunu gördüm. Bizim sayımız isə, yüz on dörd nəfər idi. Biz ondan doyuncaya qədər yedik. Sonra biz kisələrimizi yığışdırdıq. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Dəstamaz almaq üçün su varmı?" deyə soruşdu və bir kişi içərsində bir az su olan qabını gətirdi və onu bir qədəhin içinə boşaltı. Biz yüz on dörd kişi ondan şırıl şırıl su tökə- tökə hamımız dəstəmaz

aldıq. Sonra səkkiz nəfər gəldi və "dəstəmaz üçün su varmı?" deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəstəmaz suyu qurtardı" deyə buyurdu." (Müslim / 1729).

# Cihad Kitabı

Birinci fəəsil: Allah Təala buyurur: "Allah yolunda öldürülənləri (şəhid olanları) heç də ölü zənn etmə!" və şəhidlərin ruhları haqda.

1- Məsruq belə rəvayət edir: "Abdullah İbn Məsuddan (Allah ondan razı olsun) bu ayə haqda soruşduq: "Allah yolunda öldürülənləri (şəhid olanları) heç də ölü zənn etmə! Əsl həqiqətdə onlar diridirlər. Onlara Rəbbi yanında ruzi (cənnət ruzisi) əta olunur." O belə cavab verdi: "Biz bu haqda artıq Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soruşmuşuq , o belə buyurdu: "Onların ruhları yaşıl quşların qarınlarındadır. Onların Ərşdən asılmış bir çıraqları vardır. Cənnətdə istədikləri yeri dolaşar sonra bu çıraqla enərlər. Onların Rəbbi onlara baş çəkir və onlardan: "Nəsə istəyirsinizmi?" deyə soruşdu. Onlar: "Nə istəyək ki, Cənnətdə istədiyimiz yerdə dolaşırıq." Bunu onlara üç kərə təkrarladı. Onlardan soruşmaqdan əl çəkməyəcəklərini gördükdə, belə buyurdular: "Ey Rəbbimiz , bizim ruhlarımızı cəsədlərimizə qaytar ki, sənin yolunda vuruşaraq yenə öldürülək." Onların başqa ehtiyacları olmadıqlarını gördükdə tərk olundular." (Müslim / 1887).

İkinci fəsil: Cənnətin qapıları qılıncların kölgəsi altındadır.

2- Əbu Bakir ibn Abdullah ibn Qeys atasının belə dediyini rəvayət edir: "Düşmənlə üz-üzə gələn bir vaxtda atamdan belə eşitidim: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən , Cənnətin qapıları qılıncların kölgəsi altındadır. Cır-cındır paltarlı bir kişi qalxaraq belə dedi: "Ey Əbu Musa , sən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmisən?" O: "Bəli" deyə cavabverdikdə, kişi yoldaşlarının yanına qayıtdı və onlara "Sizə Salam olsun " dedi və qılıncının qınını sındıraraq atdı. Sonra qılıncı ilə düşmənlərlə vuruşmağa getdi və nəhayət öldürüldü." (Müslim / 1902).

Üçüncü fəsil: Cihadın fəziləti və ona rəğbətləndirmək haqda.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təala onun yolunda cihada (döyüşə) çıxana belə zəmanət vermişdir: "Yalnız mənim yolumda cihada çıxan, mənə iman edən, Peyğbərimi təsdiqləyənə onu Cənnətə salmağıma və ya onu əldə etdiyi savab və qənimətlə çıxdığı məskəninə qaytarmağa zəmanəti mən verirəm." Muhəmmədin nəfsi əlində olana and olsun ki, Allah yolunda yaralanmış elə bir yara yoxdur ki, qiyamət günü o , yaralandığı heybətində gəlməsin. Rəngi qan rəngi, iyi misk ətrinin iyi olacaq. Muhəmmədin nəfsi əlində olana and olsun ki, müsəllmanlara çətin olmasaydı , Allah yolunda vuruşan bir dəstənin arxasında oturmazdım. Lakin onları, üzərində daşayacaq bir heyvan tapmıram və onlar da onu tapmağa qadir deyillər. Onlara məndən geri qalmaq ağır gəlir. Muhəmmədin nəfsi əlində olana and olsun ki, Mən Allah yolunda vuruşaraq öldürülməyi, sonra yenə

vuruşaraq öldürülməyi, sonra yenə vuruşaraq öldürülməyi arzu etdim." (Müslim / 1886).

## Dördüncü fəsil: Bəndənin cihadla dərəcəsinin qaldırılması.

4- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allahdan Rəbb, İslamdan din, Muhəmmədən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) olaraq razı olana cənnət vacib olar. Əbu Səidi bu təəccüb etdi və ona: "Ey Allahın Elçisi , mənim üçün onu təkrar et." deyə söylədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun istədiyini etdi , sonra isə belə buyurdu: "Başqa bir şey var ki, onunla bəndə cənnətdə yüz dərəcə (mərtəbə) qaldırılar. Və hər dərəcənin arası yerlə səmanın arası qədərdi." O: "O nədir, Ey Allahın Elçisi?" deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah yolunda cihad etmək, Allah yolunda cihad etmək." (Müslim/1884).

## Beşinci fəsil: İnsanların ən əfzəli, malı və canı ilə Allah yolunda cihad edəndir.

5- əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə soruşdu: "İnsanların ən əfzəli kimdir?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "Malı və canı ilə Allah yolunda cihad edən." O: "Sonra kim?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Vadilərdən birinə çəkilərək Allaha ibadət edən və insanları onun şərrindən uzaq tutan mömin." (Müslim / 1888).

## Altıncı fəsil: Allah yolunda vuruşmayan və nəfsində Allah yolunda vuruşmağı düşünməyərək ölən haqda.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah yolunda vuruşmayan və nəfsində Allah yolunda vuruşmağı düşünməyərək ölən kəs münafiqliyin şöbələrindən biri üzərində ölmüş olar." Abdullah ibn Mübarak belə demişdir: "Biz bunun Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanına məxsus olduğunu zənn edirik." (Müslim/1910).

## Yeddinci fəsil: Dənizdə cihad etməyin fəziləti.

7- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ummu Haramı bintu Mulhanin (Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məhrəmlərindən idi) yanına daxil olarkən o ona yemək verərdi. Ummu Haram Ubadə ibn Samitin nigahının altında idi. Bir gün yenə onun yanına daxil oldu və o da ona yemək verdi. Sonra o Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başını daramaq üçün oturdu və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yuxuya getdi. Sonra ayılaraq güldü. Qadın belə dedi: "Mən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi, səni güldürən nədir?" deyə soruşdum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mənə ümmətimdən olan bir dəstə insanın bu dənizin

ortasında taxtalar üzəridə şahlar olaraq və ya (hansını dediyini şəkk edərək) taxtalar üzərindəki şahlar kimi vuruşduqları ərz edildi (göstərildi)." Qadın belə dedi: "Mən: "Ey Allahın Elçisi, Allaha məni onlardan etməsi üçün dua et!" deyə ona söylədim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün dua etdi və sonra yenə başını qoyaraq yatdı. Sonra ayılaraq güldü. Qadın belə dedi: "Mən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi, səni güldürən nədir?" deyə soruşdum." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mənə ümmətimdən olan bir dəstə insanın, bu dənizin ortasında vuruşduqları ərz edildi (göstərildi)." Birincidə dediyi kimi dedi." Qadın belə buyurdu: "Mən: "Ey Allahın Elçisi, Allaha məni onlardan etməsi üçün dua et!" deyə ona söylədim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sən birincilərdənsən" deyə cavab verdi." Ummu Haram bintu Mulhan Müaviyyənin zamanında gəmiyə mindi və dənizdən çıxdığı an heyvanının tərkindən yıxılıb vəfat etmişdir." (Müslim / 1912).

## Səkkizinci fəsil: Allah yolunda  keşik çəkənin fəziləti.

8- Salman (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Allah yolunda bir gün və bir gecə keşik çəkmək , bir ay oruc tutmaqdan və qiyama (gecə namazlarından) durmaqdan daha xeyirlidir. Əgər ölərsə , dünyada etdiyi əməli və ruzisi onun üçün cərayan edər (davam edər). Fəttandan da (Şeytandan və ya qəbirdə ondan soruşulan iki mələkdən) əminlikdə olar." (Müslim / 1913).

## Doqquzuncu fəsil: Allah yolunda  gecə və ya gündüz atılan bir addım dünya və onda olanlardan daha xeyirlidir."

9- Ənəs (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah yolunda gecə və ya gündüz atılan bir addım , dünya və onda olanlardan daha xeyirlidir." (Müslim / 1880).

## Onuncu fəsil: Allah Təala buyurur: "Məgər siz hacılara su verməyi."

10-ən-Noman ibn Bəşir (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərinin yanında idim. Bir kişi belə dedi: "Mən islama girdikdən sonra həcdə su paylamaqdan başqa əməl etməməyimə fikir vermərəm. Başqa biri isə belə dedi: "Məscid əl-Haramı təmir etdikdən sonra başqa əməl etməməyimə fikir vermərəm. Başqa biri isə belə dedi: "Allah yolunda cihad sizin dediyinizin hər bir şeydən əfzəldir." Ömər (Allah ondan razı olsun) onlara  acıqlanaraq belə buyurdu: "Bu gün cümə günüdür: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərinin yanında səsinizi qaldırmayın. Cüməni qıldıqdan sonra girib sizin ixtilaf etdiyiniz barəsində ondan fitva alaram." Və Allah Təala bu ayəni nazil etdi: "Məgər siz hacılara su verməyi və Məscidül həramı təmir etməyi Allaha və qiyamət gününə iman gətirib Allah yolunda cihad edənlərlə eynimi tutursunuz? Onlar Allah yanında eyni olmazlar. Allah zalım tayfanı doğru yola yönəltməz!" (Müslim / 1879).

## On birinci fəsil: Şəhid olmağı istəməyə rəğbətləndirmək.

11-Səhl ibn Hüneyf (Allah ondan razı olsun) belə rəvayət edir: "Hər kim Allahdan sidq qəlblə şəhidlik istəyərsə , Allah Təala onu , o döşəyində ölsə belə , şəhidlik dərəcəsinə çatdırar." (Müslim/1909).

On ikinci fəsil: Allah yolunda şəhid olmağın fəziləti.

12-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Yalnız şəhid müstəsna olmaqla , elə bir nəfs yoxdur ki, Cənnətə daxil olduqdan sonra dünyaya dönməyi və dünyada onun üçün nəsə bir şey olmasını arzu etsin. Çünki, şəhid şəhidliyin kəramətini (fəzilətini) gördükdən sonra , dünyaya dönərək on kərə (Allah yolunda) öldürülməyi arzu edər." (Müslim /1877).

On üçüncü fəsil: Əməllər niyətlərə görədir.

13-Ömər ibn Xəttab (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən , əməllər niyətlərə görədir. Bir kəsə niyyət etdiyi şey vardır. Kimin hicrəti Allaha və Elçisinədirsə, onun hicrəti Allaha və Elçisinədir. Və kimində hicrəti əldə edəcəyi bir dünya və ya evlənəcəyi bir qadına görədirsə, onun hicrəti, hicrət etdiyi şeyə görədir." (Müslim / 1907).

On dördüncü fəsil: Allah Təalanın Şəhidlərdən, onların da Allahdan razılığı haqda.

14-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəstə insan Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gələrək belə dedilər: "Bizimlə bizə Quran və Sünnəni öyrədəcək bir neçə kişi göndər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlarla Ənsarlardan qarilər adlanan yetmiş kişi göndərdi. Dayım Haram da onların içində idi. Onlar gecə Quranı oxuyar, öyrənər və öyrədərdilər. Gündüzlər isə məscidə su daşıyar, odun toplayıb satar və bu pulla suffa əhli və qarilər (quran oxuyanlar) üçün yemək alardılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onları göndərdi. Lakin getdikləri yerə çatmamış onların qabağına çıxaraq öldürüldülər. Onlar da: "Ey Allahım , peyğəmbərimizə çatdır ki, biz sənə qovuşduq, biz səndən, sən də bizdən razı oldun." Bir kişi Ənəsin dayısının arxasından gələrək nizəni onun kürəyinə batıraraq (önündən) çıxatdı. Haram: "Kəbənin Rəbbinə and olsun ki, zəfərə çatdım" deyə buyurdu. Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: “Şübhəsiz ki, qardaşlarınız öldürülmüşdür. Və onlar öldürülərkən belə dedilər: "Ey Allahım , peyğəmbərimizə çatdır ki, biz sənə qovuşduq, biz səndən, sən də bizdən razı oldun." (Müslim / 677).

On beşinci fəsil: Şəhidlər beşdir.

15-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir kişi yolla getdiyində tikanlı bir budaq gördü və onu yoldan qaldırdı. Allah Təala ona buna görə təşəkkür etdi və onu bağışladı." Sonra belə buyurdu: "Şəhidlər beşdir: Taundan ölən, qarın xəstəliyindən ölən, suda boğulub ölən, dağıntı altında qalıb ölən, Allah yolunda vuruşaraq şəhid olan." (Müslim / 1914).

On altıncı fəsil: Taun hər bir müsəlman üçün şəhidlikdir.

16- Hafsa bintu Sirin belə rəvayət edir: “Ənəs ibn Məlik (Allah ondan razı olsun) məndən belə soruşdu: "Yəhya ibn Əbu Umara nədən vəfat etdi?" Mən: "Taundan" deyə cavab verdikdə, O belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Taun hər bir müsəlman üçün şəhidlikdir." (Müslim / 1916).

### On yeddinci fəsil: Şəhidin borcdan başqa hər bir günahı bağışlanacaqdır.

17- Abdullah ibn Amr ibn əl-Ass (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Şəhidin borcdan başqa hər bir günahı bağışlanacaqdır." (Müslim / 1886).

18- Əbu Qətada (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara Allah yolunda cihad və Allaha iman etməyin ən əfzəl əməl olduğunu xatırlatdı. Bir kişi qalxaraq ondan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdu: "Ey Allahın Elçisi, necə bilirsən Allah yolunda ölsəm , bu mənim günahlarımı bağışlarmı?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Əgər Allah yolunda səbr edərək, savabını Allahdan umaraq, irəli gedib, çevrilib qaçmadıqda öldürülsən, bəli bağışlanar.” Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: “Necə dedin?” soruşdu. O: “Necə bilirsən , Allah yolunda ölsəm , bu mənim günahlarımı bağışlarmı?” dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Əgər Allah yolunda səbr edərək, savabını Allahdan umaraq, irəli gedib, çevrilib qaçmadıqda öldürülsən, bəli bağışlanarsan , boynunda borc olmazsa. Bunu mənə Cəbrail (ona Allahın salamı olsun) demişdir." (Müslim/1885).

### On səkkizinci fəsil: Malını qoruyaraq ölən şəhiddir.

19- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə soruşdu: "Ey Allahın Elçisi, bir kişi gəlib malımı götürmək ustəsə , nə etməmi buyurursan?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Vermə!" deyə cavab verdi. Kişi: "Mənimlə vuruşsa , necə?" deyə soruşduqda, O belə buyurdu: "Sən də onunla vuruş!" Kişi: "Məni öldürsə , necə?" deyə ondan soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onda , sən şəhidsən" deyə cavab verdi. Kişi: "Əgər mən onu öldürsəm necə?" deyə soruşdu və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onda , o Cəhənnəmdədir." (Müslim / 140).

### On doqquzuncu fəsil: Allah Təala buyurur: "Möminlər içərilərisində elələri də vardır ki, Allaha etdikləri əhdə sadiq olarlar."

20- Səbit belə rəvayət edir: "Ənəs (Allah ondan razı olsun) belə buyurmuşdur: "Mənə adı verilən əmim Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Bədr döyüşündə iştirak etməmişdi. Bu ona ağır gəlirdi və belə deyirdi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iştirak etdiyi ən birinci döyüş və mən onda yox idim. Əgər Allah Təala bundan sonra mənə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə bir döyüş nəsib edərsə, Allah Təala mənim nə etdiyimi görəcəkdir.” Bundan başqa söz söyləmədən çəkildi. Sonra Peyğəmbərlə (ona,

ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uhud döyüşünə çıxdı. Qarşısına Saad ibn Muaz çıxdı və ondan: "Ey Əbu Amr , hara gedirsən?" deyə soruşduqda, O belə cavab verdi: "Ah , Cənnətin iyini Uhud dağının arxasından hiss edirəm." Və (kafirlərlə) öldürülənə kimi vuruşdu. Onun bədənində səksəndən çox qılınc zərbəsi və nizə yarasının izi tapıldı. Bacısı-Xalam olan ər-Rubəyə belə dedi: "qardaşımı ancaq barmağının ucundan tanıdım." Və Allah Təala bu ayəni nazil etdi: "Möminlər içərilərisində elələri də vardır ki, Allaha etdikləri əhdə sadiq olarlar. Onlardan kimisi (bu yolda) şəhid olmuş, kimisi də (şəhid olmasını) gözləyir. Onlar (verdikləri sözü) əsla dəyişməzlər ki." Onlar bu ayənin onun və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) digər səhabələrinə görə nazil olduğunu görərdilər." (Müslim / 1903).

## İyirminci fəsil: Allahın kəliməsi yüksəlsin deyə vuruşan haqda.

21-Əbu Musa əl-Əşari (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir bədəvi çöl ərəbi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi, bir kişi qənimət üçün, başqa bir kişi xatırlansın deyə, başqa bir kişi isə mövqeyi görülsün (bilinsin) deyə vuruşur. Bunların hansı Allah yolunda cihad edən sayılır?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahın kəliməsi yüksəlsin deyə vuruşan Allah yolunda cihad etmiş sayılır." (Müslim / 1904).

## İyirmi birinci fəsil: Riya və şöhrət üçün döyüşən haqda.

22-Süleyman ibn Yasar (Allah ondan razı olsun) belə rəvayət edir: "İnsanlar Əbu Hüreyrənin (Allah ondan razı olsun) yanından dağıldıqdan sonra, Şam Əhlinin Natili (adam adı Natuil ibn Qeys) belə buyurdu: "Ya Şeyx! Mənə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyin hədisi danış." Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurdu: "Bəli , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Qiyamət günü ən birinci hesaba çəkiləcək olan insan şəhid olan bir kişidir. O gətiriləcək və Allah Təalanın ona verdiyi nemətlər tanıtdırılacaq və o onları tanıyacaq. Sonra ondan: "Sən bunlara görə nə etdin?" deyə soruşulacaq. O: "Mən sənə görə vuruşdum və şəhid oldum" deyəcək. Ona belə deyiləcəkdir: "Sən yalan deyirsən! Sən yalnız: "cürətlidir" desinlər deyə vuruşdun. Və sənə (bunu) dedilər." Sonra əmr olunacaq və onu üzü üstə sürüyərək cəhənnəmə atacaqlar." Sonra elm öyrənib , öyrədən və Quran oxuyan bir kişi gətiriləcək. Allah təalanın ona verdiyi nemətlər tanıtdırılacaq və o onları tanıyacaq. Sonra ondan: "Sən bunlara görə nə etdin?" Deyə soruşulacaq. O: "Mən elm öyrənib öyrətdim. Sənə görə Quran oxudum" deyəcək. Ona belə deyiləcəkdir: "Sən yalan deyirsən! Lakin sən elmi: "O alimdir" desinlər deyə öyrəndin. Quranı: "O qaridir" desinlər deyə oxudun. Və sənə (bunu) dedilər." Sonra əmr olunacaq və onu üzü üstə sürüyərək Cəhənnəmə atacaqlar." Sonra Allah Təalanın ona rahatlıq (genişlik), və hər bir növ mal–mülk verdiyi bir kişi gətiriləcək. Allah Təalanın ona verdiyi nemətlər tanıtdırılacaq və o onları tanıyacaq. Sonra ondan: "Sən bunlara görə nə etdin?" Deyə soruşulacaq. O: "Mən sənin uğrunda (mal) sərf edilməsini sevdiyin elə bir yol buraxmadım. Bu yolda sənin uğruna mal sərf etdim." Ona belə deyiləcəkdir: "Sən yalan deyirsən! Lakin sən: "O səxavətlidir" desinlər deyə belə etdin. Və sənə (bunu) dedilər." Sonra əmr olunacaq və onu üzü üstə sürüyərək Cəhənnəmə atacaqlar." (Müslim / 1905),

## İyirmi ikinci fəsil: Döyüşün savabının cox olması haqda.

23-əl-Bara (Allah ondan razı olsun) belə rəvayət edir: "Ənsarlardan olan Bəni Nəbit qəbiləsindən bir kişi gərələrək belə dedi: "Şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur və sən Onun qulu və elçisisən. Sonra döyüşə atıldı və nəhayət öldürüldü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (onun haqda) belə buyurdu: "Az əməl etdi , lakin cox əcir qazandı." (Müslim / 1900).

## İyirmi üçüncü fəsil: Döyüşdükdə qənimət götürən və götürməyən (öldürülən, və ya qənimət əldə etməyən) haqda.

24-Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah yolunda vuruşaraq qənimət götürən və salamat qalan elə bir vuruşan və ya ordu yoxdur ki, axirətdə alacaqları savablarının üçdə birisini (bu dünyada) peşin almasınlar. Və Allah yolunda vuruşaraq qənimət götürmədən ələ keçən (öldürülən) elə bir vuruşan və ya ordu yoxdur ki, onların savabları tamamlanmasın." (Müslim / 1906).

## İyirmi dördüncü fəsil: Cihada gedəni təchiz edənin savabı haqda.

25-Zeyd ibn Xalid (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah yolunda cihada gedəni təchiz edən cihad etmiş kimidir. Və hər kim onun geridə qoyduğu ailəsinə xeyirlə sahib çıxarsa (yardım edərsə) , cihad etmiş kimidir." (Müslim / 1895).

## İyirmi beşinci fəsil: Cihada çıxmaq üçün hazıldıq görən lakin xəstələn kimsənin hazırladığını başqasına verməsi.

26-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Əsləm qəbiləsindən bir oğlan Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Ey Allahın Elçisi, mən cihada çıxmaq istəyirəm lakin onun üçün heç bir hazırlığım yoxdur." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Filankəsin yanına get! O hazırlıq görüb lakin xəstələnib." Onun yanına getdi və belə dedi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənə salam göndərir və deyir ki: "Cihada hazır etdiyini mənə verəsən." O belə buyurdu: "Ey filankəs , (Cihad üçün) hazırlıq gördüyün şeyləri ona ver və heç bir şeyi əsirgəmə. Allaha and olsun ki, ondan heç bir şeyi əsirgəmə ki, sənə onda bərəkət verilsin." (Müslim / 1894).

## İyirmi altıncı fəsil: Mücahidlərin (Allah yolunda vuruşanların) qeyrətin (namusunun) hörməti haqda.

27-Salman ibn Bureydə atasından (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mücahidlərin qadınlarının namusu cihada çıxmayanlar üçün analarının namusunun hörməti kimidir. Elə bir cihada cıxmayan (evində oturan) bir kəs yoxdur ki, mücahidlərdən kimsə onu ailəsinə sahib çıxması (yardım etməsi) üçün qoysun və o ona xəyanət etsin, və qiyamət günü onun qabağında duraraq onun əməlindən istədiyini almasın! Siz necə zənn edirsiniz?!" (Müslim/1897).

## İyirmi yeddinci: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: "Ümmətimdən bir dəsrtə qiyamət qopana kimi haqq üzərində olacaqdır.

28- Sovbən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ümmətimdən bir dəsrtə qiyamət qopana kimi haqq üzərində olacaqdır. Onlara Müxalif olanlar zərər verə bilməyəcəkdir. Nəhayət , Allahın əmri onlar bu halda ikən gələcəkdir." (Müslim / 1920).

29- Əbd ər-Rahman ibn Şuməsətə əl-Məhri belə rəvayət edir: "Məslımə ibn Məxlədin yanında idim. Abdullah ibn Amr ibn Ass da onun yanında idi. Abdullah belə buyurdu: "Qiyamət yalnız məxluqların ən şərliləri üzərində qopacaqdır. Onlar cahilliyə əhlindəndə şərlidilər. Allaha nə dua etsələr , onların istədikləri özlərinə rədd olunar." Onlar bu halda ikən Uqbə ibn Amir gəldi. Məsləmə ona belə dedi: "Ey Uqba, dinlə gör Abdullah nə deyir!" Uqba belə buyurdu: "O daha yaxşı bilir. Amma mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Ümmətimdən bir dəstə düşmənlərini məğlub edərək Allah yolunda vuruşmaqda davam edərlər. Onlara müxalif olanlar onlara bir zərər yetirə bilməzlər. Qiyamət qopana kimi onlar bu hal üzərində olarlar." Abdullah belə buyurdu: "Bəli! Sonra Allah Təala Misk (ətir) iyli bir külək göndərəcək , onun toxunuşu ipək kimi olacaq. Qəlbində buğda zərrəsi qədər iman olanın canını alacaq. Sonra ən şərli insanlar qalacaqdır və Qiyamət onların üzərində qopacaqdır." (Müslim / 1924).

30- Saad ibn Əbu Vaqqas (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qərb (Şam) Əhli qiyamət qopana kimi haqq üzərində olacaqdır." (Müslim / 1925).

## İyirmi səkkizinci fəsil: Birinin o birisini öldürən və Cənnətə girən iki kişi haqda.

31- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təala birinin o birini öldürən və hər ikisi də Cənnətə girən iki kişiyə gülər." Onlar: "Ey Allahın Elçisi, necə?" deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu onu öldürər və o Cənnətə girər. Sonra Allah Təala bunun tövbəsini qəbul edər və onu islam dininə girməsinə hidayət edər. Sonra o Allah yolunda vuruşar və şəhid olar." (Müslim / 1890).

## İyirmi doqquzuncu fəsil: Bir kafiri öldürüb sonra doğru yolu tutan kimsə haqda.

32- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Biri o birinə zərər verərək Cəhənnəmdə cəm olmazlar." Ondan: "Ey Allahın Elçisi onlar kimlərdir?" deyə soruşulduqda, O belə cavab verdi: "Bir mömin kafiri öldürər sonra doğru yolu tutar." (Müslim / 1891).

## Otuzuncu fəsil: Allah yolunda (kimisə) dəvəsinin tərkinə mindirənin fəziləti.

33- Əbu Məsud əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi yüyənli bir dəvəsini gətirdi və belə dedi: "Bunu Allah yolunda edirəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Qiyamət günü sənə bunun əvəzinə hər biri yüyənli olmaqla yeddi yüz dəvə var." (Müslim /1891).

34- Əbu Məsud əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına

gələrək belə dedi: "Mənim miniyim həlak oldu məni tərkinə al." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Məndə (səni tərkinə alacaq) bir şey yoxdur." Bir kişi: "Ey Allahın Elçisi , mən onu tərkinə alacaq kimsəni göstərə bilərəm." deyə buyurduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Xeyrə yol açana (göstərənə, dəlalət edənə) xeyri edənin misli qədər savab vardır." (Müslim / 1893).

## Otuz birinci fəsil: Allah Təala buyurur: "Onlara qarşı bacardığınız qədər qüvvə tədarük edin."

35-Uqba ibn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərin üzərində ikən belə dediyini eşitdim: "Onlara qarşı bacardığınız qədər qüvvə tədarük edin." Həqiqətən , qüvvə (ox və ya nizə) atmaqdadır! Həqiqətən , qüvvə (ox və ya nizə) atmaqdadır! Həqiqətən , qüvvə (ox və ya nizə) atmaqdadır!" (Bunu üç kərə təkrar etdi). (Müslim / 1917).

## Otüz ikinci fəsil: (Ox və ya nizə) atmağa rəğbətləndirmək.

36-Uqba ibn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Sizə torpaqlar (fəth ediləcək) açılacaq. Allah sizə kifayət edər. Sizlərdən biriniz oxları ilə oynamaqdan aciz qalmasın." (Müslim / 1918).

37-Abdurahman ibn Şuməsə belə rəvayət edir: "Fuqim əl-Ləhmi Uqbə ibn Amirə (Allah ondan razı olsun) belə dedi: "Sən bu iki hədəf arasında gedib gətirsən. Halbu ki, sən yaşlısan , sənə bu çətin gəlir." Uqbə belə buyurdu: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyim bu söz olmasaydı , buna heç tab gətirməzdim.” əl_Həris belə demişdir: “İbn Şuməsədən: “Bu nə sözdür?” deyə soruşdum?” O belə buyurdu: “O belə dedi: “Kim ox atmağı öyrənər , sonra onu tərk edərsə , bizdən deyildir! Və  yaxud: “O asidir!” (Müslim / 1919).

## Otuz üçüncü fəsil: Xeyir, qiyamət gününə kimi atların alınlarındadır.

38-Cərir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) barmağı ilə atın alnını ovxalayarkən gördüm. O belə buyururdu: "Xeyir, qiyamət gününə kimi atların alına qənimət və əcr olaraq düyünlənib!" (Müslim/1872).

39-Ənəs (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bərəkət atların alınlarındadır." (Müslim 1874).

## Otüz dördüncü fəsil: Atın ayaqlarında “əş-Şikal” ağ (ləkə, xal) olmasının bəyənilməməsi.

40-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) atda olan əş-Şikalı xoşlamazdı." Başqa bir rəvayətdə isə belə deyilir: "əş-Şikal: "Atın Sağ arxa və sol qabaq ayağında və ya sağ qabaq sol arxa ayağında ağlıq olmasıdır." (Müslim / 1875).

## Otuz beşinci fəsil: Atlarla yarışmaq və atlara təlim keçmək.

41-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Heyfə adlanan yerdən təlim keçmiş atla yarışa çıxdı. Yarışın qurtaracağı yer Səniyyə əl-Vəda adlanan yer idi. Həmçinin Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təlim keçməmiş atla Səniyyədən Bəni Zureyq qəbiləsinin məscidinə kimi yarışdı.” İbn Ömər də yarışanların içində idi." (Müslim/1870).

Otuz altıncı fəsil: Üzürlə cihaddan qalanlar haqda Allah Təala buyurur: "Əyləşən möminlərlə Allah yolunda öz malları və canları ilə cihad edən kimsələr bir olmazlar."

42-Əbu İshaq belə rəvayət edir: "O əl-Bəranın (Allah ondan razı olsun) bu ayə haqda belə dediyini eşitmişdir: "Əyləşən möminlərlə Allah yolunda öz malları və canları ilə cihad edən kimsələr bir olmazlar." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zeydə əmr etdi və o da bir kürək sümüyü gətirdi və onu (ayəni) onun üzərində yazdı. İbnu Ummu Məktum ona korluğundan şikayət etdi və bu ayə nazil oldu: "Zərər çəkmədən (üzürsüz səbəbə görə evlərində) əyləşən möminlərlə Allah yolunda öz malları və canları ilə cihad edən (vuruşan) kimsələr bir olmazlar." (Müslim / 1898).

Otuz yeddinci fəsil: Xəstəliyi onu Cihada çıxmasına mane olan haqda.

43-Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə bir döyüşdə idik. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mədinədə elə kişilər vardır ki, siz bir yol getdiyinizdə, bir vadi qət etdiyinizdə , onlar da sizlərlədir. Onları xəstəlik həbs etmişdir." (Müslim / 1911).

# Sira kitabı

Birinci fəsil: Ordunun, dəstənin üzərinə əmir təyin etmək və onlara lazımı tövsiyyələr etmək haqda.

1- Bureydə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir orduya və ya dəstəyə əmir təyin etdikdə xas olaraq ona və onunla olan müsəlmanlara Allah Təaladan qorxmağı xeyirlə tövsiyə edər sonra isə belə buyurardı: "Allahın adıyla Allah yolunda vuruşun. Allaha küfr edənlərə qarşı vuruşun. Cihad edin lakin qənimətə xəyanət etməyin. Əhdi pozmayın, ölülərin burunlarını, qulaqlarını kəsməyin. Uşaqları öldürməyin! Müşriklərdən olan düşməninizlə qarşılaşdıqda onları üç xislətə (və ya üç gözəl şeyə) dəvət et. Bunların hansına cavab versələr onlardan qəbul et və onları burax. Sonra onları İslama dəvət et. Bunda sənə cavab versələr onlardan qəbul et. Sonra onları sərbəst burax (əl çək). Sonra onları öz diyarlarından mühacirlərin diyarına köçməyə dəvət et. Və onlara xəbər ver ki, bunu etsələr mühacirlərin lehinə olan onlarında lehinə, əleyhinə olan onlarında əleyhinə olacaqdır."  Əgər onlar köçməkdən (hicrət etməyə) imtina etsələr onda onlara xəbər ver ki, onlar çöl ərəblərindən olan müsəlmanlar kimi olacaqlar. Onlara Mömünlər üzərində cərayən edən Allahın hökümləri tətbiq ediləcək. Onlara qənimətdən yalnız müsəlmanlarla Cihada çıxdıqlarında pay olacaqdır. Əgər onlar bunu qəbul etməsələr (İslama girməyə) onlardan cizyə istə. Əgər onlar sənə bunda cavab versələr, ondan qəbul et və onları sərbəst burax. Yox əgər  onlar qəbul etməkdən imtina etsələr Allahdan

kömək dilə və onlarla vuruş. Bir qala əhalisini mühaşirə etsən və səndən Allahın əhdini və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əhdini tələb etsələr, onlara nə Allahın nə də Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əhdini ver, lakin özünün və yoldaşlarının əhdini ver. Çünki siz özünüzün və yoldaşlarınızın əhdini pozmağınızın günahı Allahın və Peyğəmbərinin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əhdini pozmağdan daha yüngüldür. Əgər siz qala əhlini mühaşirə etdikdə, səndən onları Allahın hökmünün altına salmanı tələb etsələr, onları Allahın hökmünün altına salma! Lakin onları öz hökmünün altına sal! Çünki sən onları Allahın hökmünün altına düzgün salıb salamyacağını bilmirsən." Əbd ər–Rahman ibn Mehdi belə demişdir: "Bu və ya bunun kimi" (Müslim / 1731).

## İkinci fəsil: (bir yerə dəvət üçün) Göndərilənə asanlaşdırmasını əmr etmək.

2- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu və Muazı Yəmənə göndərəndə belə buyurdu: "Asanlaşdırın, çətinləşdirməyin, müjdələyin (sevindirin), nifrət etdirməyin, bir olun ixtilaf etməyin." (Müslim/173).

## Üçüncü fəsil: Dəvət üçün göndərilən və çıxan kəsin qalanın əvəzinə olması haqda.

3- Əbu Səid əl- Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həssanı bəni Ləhyana göndərərək: “Hər iki kişidən biri çıxsın" deyə buyurdu. Sonra isə qalanlara belə dedi: “Sizlərdən hər hansınız (dəvətə və ya cihada) çıxan kəsin ailəsinə xeyirlə sahib çıxarsa ona çıxan kəsin savabının yarısı qədər savab vardır." (Müslim / 1896).

## Dördüncü fəsil: Böyüklə kiçik arasında olan yaş həddi və döyüşə kimim çıxa biləcəyi və bilməyəcəyi haqda.

4- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Uhud döyüşü günü Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə (döyüşə yarayıb yaramadığımı bilmək üçün) baxdı. Mən on dörd yaşında idim və mənə döyüşə çıxmağa icazə vermədi. Sonra xəndək döyüşündə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə (döyüşə yarayıb yaramadığımı bilmək üçün) baxdı. Mən on beş yaşında idim və mənə icazə verdi." Nəfi belə demişdir: "Ömər ibn Əbd əl-Əziz (Allah ondan razı olsun) xəlifə ikən yanına daxil oldum və ona bu hədisi danışdım. O belə buyurdu: "Bu böyüklə kiçik arasında olan yaş həddidir. Sonra məmurlarına on beş yaşında olan üçün (əsgər) aylığı ayırmalarnı (yazmağı) və ondan aşağı olanları isə, uşaqlara aid etmələrini əmr etdi." (Müslim / 1868).

## Beşinci fəsil: Müsafirə Quranla düşmən torpaqlarına səfər etməyin qadağan olması.

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müsafirə düşmənlərin əlinə keçməsindən qorxaraq Quranla düşmən torpaqlarına səfər etməyi qadağan edərdi." (Müslim / 1869).

## Altıncı fəsil: Səfərdə otluq, quraqlıq olan yedən keçmək və gecə yolda dincəlmək haqda.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Səfərdə otluq yerdən keçdikdə, dəvələrinə torpaqdan payı verin! Quraqlıqda səfər etdikdə o yerldən sürətlə keçin. Gecə dincəlmək istədikdə yoldan çıxın! Çünki yol, gecə həşaratlar üçün sığınacaqdır." (Müslim / 1926).

## Yeddinci fəsil: Səfər əzabdan bir parçadır.

7- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Səfər əzabdan bir parçadır. Sizlərə yatmağı, yeməyi və içməyi qadağan edər. Sizlərdən biriniz, ehtiyacını olduğu kimi ödədikdən sonra əhlinin (ailəsinin) yanına qayıtsın." (Müslim / 1927).

## Səkkizinci fəsil: Səfərdən gecə gələn kimsənin (gecə evin) qapsını döyməsinin bəyənilməməsi haqda.

8- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kişiyə gecə xəyanətini axtarmaq üçün və ya qüsurlarını araşdırmaq üçün ailəsinin qapsını döyməsini qadağan etdi." (Müslim / 1928).

9- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ailəsinin qapsını gecə döyməzdi. Onların yanına sabah və ya axşam gələrdi." (Müslim / 1928).

## Doqquzuncu fəsil: döyüşdən qabaq (İslama) dəvət və qəflətən düşmənlərə hücum etmək.

10- İbn Ovn belə rəvayət edir: "Nəfiyə döyüşdən qabaq (İslama) dəvət haqda soruşmaq üçün məktub yazdım. Mnə belə cavab yazdı: "Bu İslamın əvvəl çağlarında belə idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bəni əl-Mustaliq qəbiləsinə, onlar bundan qafil bir şəkildə heyvanlarını suyun ətrafında apararkən qəflətən hücum etmişdir. Onlardan döyüşənlərini öldürmüş və qalanlarını isə əsir almışdı. Yəhya belə demişdir: "Zənn edirəm O belə buyurdu: "O gün Cüveyriyəni və yaxud yüzdə yüz Hərisin qızını (Cüveyriyəni) aldı." Bu Hədisi mənə o orduda olan Abdullah ibn Ömər (Allah onların hər ikisindən razı olsun) rəvayət etmişdir." (Müslim / 1730).

## Onuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Şahlara (hakimlələ) onları islama dəvət etmək üçün yazdığı məktubları haqda.

11-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Kisraya, Qeysara, ən-Nəcaşiyə və hər bir hökümdara məktub göndərərək, onları Allahın dininə dəvət edirdi." Burada ən-Nəcaşi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona namaz qıldığı ən-Nəcaşi deyildir." (Müsli/1774).

## On birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) islama dəvət etməsi üçün Herakla yazdığı məktubu haqda.

12-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Əbu Süfyan (Allah ondan razı olsun) ona ağızdan ağıza belə xəbər vermişdir: "Mən

Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizim aramızda (sülh) olan müddətdə səyahətə çıxdım. Mən Şamda (şəhər) ikən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Böyük Rum dövlətinin hökmüdarı Herakla bir məktub gəldi. Məktubu Dihyə əl-Kəlbi gətirmişdi. Onu basranın hökmüdarına vemiş, o da onu Herakla vermişdi. Herakl belə dedi: "Burada bu Peyğəmbərlik (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iddia edən bu kişinin qövmündən kimsə varmı?" Ona: "Bəli var" deyə cavab verdilər. Mən bir neçə Qureyşli ilə birgə dəvət olunaraq Heraklın yanına daxil olduq. Bizi önündə oturtdu və belə dedi: "Sizdən hansınız Peyğəmbərlik (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iddia edən bu kişinin nəsəbinə daha yaxındır? Əbu Sufyan Mən: "Mənəm" dedim. O məni önündə oturdu və əshabımı isə mənim arxamda oturtdu sonra isə tərcüməçi çağırdı. Tərcüməçiyə belə buyurdu: "Onlara (mənim arxamda oturan yoldaşlarıma) belə de mən bundan Peyğəmbərlik (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iddia edən bu kişi haqda soruşacağam əgər mənə yalan danışsa onu təkzib edin." Əbu Sufyan  belə buyurdu: "Allaha and olsun ki, əgər mənim yalançı olduğum yayılmasından qorxmasaydım yalan deyərdim." Sonra O (Herakl) tərcüməçisinə belə buyurdu: "Ondan: "İçinizdə onun nəsəbi necədir, deyə soruş.” Mən: "O bizdə şərəfli nəsəbə malikdir."  Sonra belə soruşdu: "Onun babalarından hökmüdar olan varmı?” Mən: "Xeyr" deyə cavab verdim. O belə dedi: "Siz onu o bu dediyikərinini deməmişdən öncə yalançılıqda ittiham etmisinizmi?" Mən: "Xeyr" deyə cavab verdim. O: "Onun ardıcılları şərəfli yoxsa zəif insanlardır?" Deyə soruşdu. Mən: "Xeyr zəiflər" deyə cavab verdim.  O: "Onlar artır ya azalır" deyə soruşdu? Mən: "Xeyr, əksinə onlar artırlar." Deyə cavab verdim. O: "Onlardan kimsə onun dininə girdikdən sonra ondan razı qalmayaraq bu dini tərk edibmi?" deyə soruşdu? Mən: "Xeyr" deyə cavab verdim. O: “Siz onunla vuruşursunuzmu?" deyə soruşdu? Mən: "Bəli"  deyə cavab verdikdə, O belə soruşdu: "Sizin onunla döyüşünüz necə olur?" mən belə cavab verdim: "Bizimlə onun aramızda qarşılıqlı müharibə olur. Bəzən O bizi, bəzəndə biz onu məğlub edirik." O: "O heç əhdini pozarmı?” Deyə soruşdu. Mən belə cavab verdim: "Xeyr! Lakin indi bizimlə onun arasında bir müddət sülh bağlanıb. Bu müddətdə onun nə edəcəyini bilmirik. Allaha and olsun ki, O mənə dediklərimə bu sözlərdən başqa bir şey əlavə etməmə şərait yaratmadı." O belə soruşdu: "Ondan öncə onun dediklərini deyən kimsə olubmu?" Mən: "Xeyr" deyə cavab verdikdə, O tərcüməçiyə belə buyurdu: "Ona de ki, mən səndən onun nəsəbi haqda soruşdum və sən iddia etdin ki, O bizdə şərəfli nəsəbə malikdir. Həmçinin Peyğbərlər qövümlərinin şərəfli nəsəblərinin içərisindən göndərilir. Səndən, Onun babalarından hökmüdar olubmu? Deyə soruşdum və sən iddia etdin ki, xeyr. Məndə olmadığını düşündüm və dedim ki, əgər olsa idi onda deyərdim ki, atalarnın mülkünü tələb etmək üçün gəlib." Səndən onun ardıcıları haqda soruşdum: "Onlar zəiflər yoxsa şərəfli (Varlı) insanlardır?" dedin ki: "Əksinə zəiflərdir! Məhz onlar Peyğəmbərlərin ardıcıllarıdır." Mən səndən: "Siz onu o bu dediyikərinini deməmişdən öncə yalançılıqda ittiham etmisinizmi? Deyə soruşdum və sən: "Xeyr" deyə iddia etdin. Bundan mənə aydın oldu ki, O insanlara qarşı yalan danışmağı tərk edibsə Allaha qarşıda yalan danışmaz." Mən səndən: “Onlardan kimsə onun dininə girdikdən sonra ondan razı qalmayaraq bu dini tərk edibmi? Deyə soruşdum və sən: "Xeyr" deyə iddia etdin. Məhz Həqiqi imanda da qəlbdə kök sakldıqda belə olar." Və səndən: "Onlar artır ya azalır deyə soruşdum və sən: "Onlar artır" deyə iddia etdin. İmanda tatam oluncaya qədər belədir. Səndən: "Onunla heç müharibə etdinizmi" deyə soruşdum və sən iddia etdin ki: "Siz onunla vuruşdunuz və aranızda qarşılıqlı müharibə olur. Bəzən o sizə, bəzəndə siz ona qalib gəlirsiniz. "Peyğəmbərlərdə belədir. Onlar Allah tərəfindən bəlalara dükar sonra isə yaxşı aqibət onların lehinə olur." Səndən: "O əhdi pozurmu" deyə

soruşdum və sən: "Xeyr" deyə cavab verdin." Peyğəmbəlrlərdə əhdi pozmazlar. Səndən: "Ondan öncə onun dediklərini deyən kimsə olubmu?" deyə soruşdum və sən: "Xeyr" deyə iddia etdin. Mən belə düşündüm ki, ondan öncə kimsə bu sözləri desəydi belə qərara gəlmək olardı ki, kişi ondan qabaq olanın sözünü təkrar edir." Sonra O belə soruşdu: "O sizə nəyi əmr edir?" Mən belə cavab verdim: "Bizə namaz qılmağı, Zəkat verməyi, qohumluq əlaqələrini qırmamağı və İffətli olmağı əmr edir." O belə buyurdu: "Onun haqqında dediklərin doğrudursa o peyğəmbərdir. Onun çıxacağını bilirdim. Lakin onun sizlərdən olacağını bilməzdim. əgər mən ona çata biləcəyimi bilsəydim onunla görüşmək istərdim və onun yanında olsa idim onun ayaqlarını yuyardım. Şübhəsiz ki, Onun mülkü mənim ayaqlarımın altında olana kimi çatacaqdır." Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məktubunu istədi və onu oxudu. Orada belə yazılmışdı: "Rəhman və Rəhim olan Allahın adıyla. Allahın Elşisi olan Muhamməddən Böyük Rum hökmüdarı Heraqla. Doğru yolda olanlara salam olsun. Sonra Mən Səni İslama dəvət edirəm. İslamı qəbul et və canını qurtar, Allah sənin əcrini iki qat versin. Əgər sən imtina etsən ətrafında olan (xristian) ardıcıllarının günahı sənin boynundadır. "(Ya Rəsulum!) Söylə: "Ey kitab əhli, sizinlə bizim aramızda eyni olan (fərqi olmayan) bir kəlməyə tərəf gəlin! (O kəlmə budur:) "Allahdan başqasına ibadət etməyək. Ona şərik qoşmayaq və Allahı qoyub bir-birimizi (özümüzə) Rəbb qəbul etməyək!" Əgər onlar yenə də üz döndərərlərsə, o zaman (onlara) deyin: "İndi şahid olun ki, biz, həqiqətən, müsəlmanlarıq (Allaha təslim olanlarıq)!" Məktubu oxuyub qurtardıqdan sonra onun yanında səs küy qopdu və gürultu çoxaldı. Bizim çıxarılmağmızı əmr etdi və bizdə cıxarıldıq." Biz çıxarıldıqda yoldaşlarıma belə dedim: "Əbu Kəbşə (yəni Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə mühüm insandır ki, ondan Bəni Əsfar (ərəblər Rumu belə adlandırırdılar) hökmüdarı qorxur. O vaxtan Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalib gələcəyinə əmin oldum və Allah Təala İslamı qəlbimə saldı." (Müslim / 1773).

## On ikinci fəsil: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allaha (yoluna ) dəvət etməsi və Münafiqlərin əziyyətinə səbr etməsi haqda.

13-Usamə ibn Zeyd (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərində palan olan eşşəyin tərkininə mindi. Altında Fidak (yer adı) məxməri var idi. Usamənidə tətkinə aldı. O Bəni əl-Həris ibn Xəzrək qəbiləsin olan Saad ibn Ubadəni ziyarətə gedirdi. Bu Bədr döyüşündən əvvəl idi. Nəhayət Müsəlmanlar, bütlərə ibadət edən müşriklər, yahudilər. Abdullah ibn Ubey və Abdullah ibn Ravaha olan bir məclisin yanından keçdi. Heyvanın qaldırdığı toz duman məclisi bürüdükdə Abdullah ibn Ubey ridası ilə burnunu tutaraq belə dedi: "Üzərimizi tozlamayın!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara salam verdi. Sonra dayandı və minikdən düşdü. Onları Allahın (dininə, yoluna) dəvət etdi və onlara quran oxudu." Abdullah ibn Ubey Belə dedi: "Ey Adam! Bundan gözəl bir şey yoxdu! Əgər dediklərin haqdırsa bizə məclismizdə əziyyət etmə! Yerinə (evinə) dön! Bizdən kim yanına gəlsə ona danışarsan." Bunun müqabilində Abdullah ib Əbu Ravaha (Allah ondan razı olsun) belə buyurdu: "Məclisimizə gəl! Çünki biz bunu istəyirik." Belə ikən Müsəlmanlar, yahudi və müşriklər biri birlərini söyməyə başladılar. Hətta bir birinin üzərinə atılmaq istədilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə onları sakitləşdirməyə çalışırdı. Sonra O miniyinə mindi. Nəhayət O Saad ibn Ubadənin yanına daxil oldu və belə buyurdu: "Ey Saad sən Əbu Hibabın (Abdullah ibn Ubey) nə dediyini eşitmirsən? O belə və belə dedi! Saad belə buyurdu: "Ey Allahım Elçisi, onu əfv et, bağışla!

Allaha and olsun ki, Allah Təala sənə verdiyini artıq verib və həqiqətən bu yerin əhalisi ona tac geydirməyə, sarğı sarımağa (padşahları olsun deyə) razılığa gəlmişdi. Allah sənə verdiyi haqq ilə onu rədd etdikdə, bu onu qəzəbləndirdi (paxıllıq etdi). Ona görədə gördüyünü etdi. Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu bağışladı." (Müslim / 1798).

## On üçüncü fəsil: Əhdi pozmağın qadağan olması.

14-Əbu Səid (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Əhdi pozan hər bir kəs üçün əhdini pozduğu miqdarda bir bayraq qaldırılacaq. Diqqət edin əhdi pozmaq etibarı ilə ən böyük vəfasız olan camaatı idarə edən əmirdir." (Müslim / 1738).

## On dördüncü fəsil: Əhdə fəvalı olmaq.

15-Hüzeyfə ibn əl-Yəmən (Allah ondan razı olsun) belə rəvayət edir: "Mənə Bədr döyüşünü çıxmağıma mane olan səbəb mən və Əbu Huseylin çıxdığmızda Qureyş kafirlərin bizi tutması oldu. Bizə: "Muhamməd istəyirsiniz" dedilər. Biz: "Onu istəmirik. Ancaq Mədinəyə getmək istəyirik." dedik. Bizdən yalnız mədinəyə gedəcəyimizə və onlarla vuruşmamağa Allaha əhd peyman aldılar. Biz Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona xəbəri çatdırdıq. O belə buyurdu: "Gedin biz onlara verdiyimiz vədi tutar və onlara qarşı, Allahdan yardım diləyərik." (Müslim / 1787).

## On beşinci fəsil: Düşmənlə qarşılaşmağı arzulamamaq və onlarla qarşılaşdıqda səbr etmək haqda.

16-Əbu ən-Nadr Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən islamı qəbul etmiş Abdullah ibn Əbu Əvfa adlanan bir kişinin kitabından belə nəql edir: "Ömər ibn Ubeydullah əl-Hururiyə üzərinə yürüş etdiyi vaxtda Abdullah ona məktub yazaraq belə xəbər verdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) düşmənlə qarşılaşdığı bir gündə günəş zeniti keçənə kimi gözləyərdi. Sonra durub belə buyurdu: "Ey insanlar, düşmənlə qarşılaşmağı arzu etməyin. Allahdan salamatlıq diləyin. Əgər onlarla qarşılaşsanız səbr edin və bilin ki, Cənnət qılıncların kölgəsi altındadır." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxaraq belə buyurdu: "Allahım! Ey kitab endirən, buludu hərəkət etdirən, dəstələri məğlubiyyətə uğradan onları məğlub et! (zəl-zələ ilə) darmadağın et!" Başqa bir rəvayətdə isə belə deyilir: "Bizə onlara qələbə çalmağa yardım et!" (Müslim / 1742).

## On altıncı: Düşmənə qarşı dua etmək.

17-Əbu ən-Nadr Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən islamı qəbul etmiş Abdullah ibn Əbu Əvfa adlanan bir kişinin kitabından belə nəql edir: "Ömər ibn Ubeydullah əl-Hururiyə üzərinə yürüş etdiyi vaxtda Abdullah ona məktub yazaraq belə xəbər verdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) düşmənlə qarşılaşdığı bir gündə günəş zeniti keçənə kimi gözləyərdi. Sonra durub belə buyurdu: "Ey insanlar, düşmənlə qarşılaşmağı arzu etməyin. Allahdan salamatlıq diləyin. Əgər onlarla qarşılaşsanız səbr edin və bilin ki, Cənnət qılıncların kölgəsi altındadır." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)

qalxaraq belə buyurdu: "Allahım! Ey kitab endirən, buludu hərəkət etdirən, dəstələri məğlubiyyətə uğradan onları məğlub et! (zəl-zələ ilə) darmadağın et!” Başqa bir rəvayətdə isə belə deyilir: "Bizə onlara qələbə çalmağa yardım et!" (Müslim / 1742).

18-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uhud döyüşü günü belə deyərdi: "Allahım sən istərsən yer üzərində sənə ibadət edən heş kim qalmaz." (Müslim / 1743).

## On yeddinci fəsil: Hərb hiylədir.

19-Cabir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hərb hiylədir." (Müslim / 1739).

## On səkkizinci fəsil: Döyüşdə kafirlərdən kömək götürmək (istəmək) haqda.

20-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bədrə tərəfə yola çıxdı. əl-Vabra adlanan daşlıq sahəyə çatdıqda, cürət və cəsarətlə tanınan bir kişi ona yetişdi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabı onu gürdükdə sevindilər. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çatdıqda Ona belə dedi: "Mən sənə tabe olmaq və səninlə bərabər (döyüşdən) yararlanmaq üçün gəlmişəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Allah və Peyğəmbərinə iman edirsənmi?” Deyə soruşdu. Kişi: "Xeyr" deyə cavab verdikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Qayıt mən müşrikdən kömək istəmərəm" deyə buyurdu. Aişə belə buyurdu: "O yoluna davam etdi. Biz əş-Şəcəra adlanan yerdə ikən bir kişi ona çataraq ona birincidə dediyi kimi söylədi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona biricidə dediyi kimi: "Qayıt mən müşrikdən kömək istəmərəm" deyə buyurdu. Sonra O Ona əl-Beyda adlan yerdə ikən yetişdi və ona birinci dəfə dediyi kimi: "Sən Allaha və Peyğəmbərinə iman edirsənmi? Deyə söylədi. O: "Bəli" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "O halda gəl" deyə buyurdu. (Müslim / 1817).

## On doqquzuncu fəsil: Qadınların mücahidlərlə çıxması haqda.

21-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Ummu Süleym Hüney döyüşü günü özü ilə bir xəncər götürdü. Əbu Talha bunu gördükdə, Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi, Ummu Süleymdə xəncər var" deyə xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Bu xəncər nədir?" deyə soruşdu. O belə cavab verdi: “Mən bunu Müşriklərdən kimsə mənə yaxınlaşarsa onun qarnını yarmağ üçün götürmüşəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülməyə başladı. Ummu Süleym belə buyurdu: "Ey Allahın Elçisi, bizdən bəzi səni tərk edib qaçan Məkkənin fəthində azad olunmuş kəsləri öldür." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Ummu Süleym Allah Təala kifayət və yaxşı etdi." (Müslim \ 1809).

22-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Uhud döyüşü günü insanlardan bəziləri Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanından qaçdılar. Əbu Talha Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) önündə onun üzərinə dəridən bir qalxan tutmuşdu. Əbu Talha şiddətlə (güclü) ox atan idi. O gün iki və ya üç yay qırmışdı. Yanlarında torbası oxla dolu bir adam keçdiyində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Onu Əbu Talha üçü düz!" deyə buyururdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxaraq düşmənə baxdığında Əbu Talha ona: "Ey Allahın Elçisi, atam anam sənə fəda olsun baxma! Qövmün atdığı oxlarından sənə bir ox dəyməsin. Sinəm onlara sənin sinəndən qabaq olsun." Ənəs belə deyir: "Aişə bintu Əbu Bəkrin və Ummu Süleymin (Allah onlardan razı olsun) ayaqları çırmalanmış halda baldırlarında ki, bilərzikləri gördüm. Çiyinlərində su tuluqları (qab) daşıyır və onu döyüşənlərin ağzına boşaldır, sonra qayıdaraq onu doldurur, sonra qayıdaraq onların ağzına boşaldırdılar. Əbu Talha xəfif bir yuxuya daldığından qılınc əlindən iki və ya üç kərə düşdü."

23-Ummu Atiyyə əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yeddi kərə Cihada çıxdım. Onlar getdikə arxada qalar, onlara yemək hazırlar, yaralıları müalicə edər, xəstələrə baxardım." (Müslim /1812).

## İyirminci fəsil: Döyüş zamanı qadın və uşaqların öldürülməsinin qadağan olması.

24-Abdullah ibn Amr (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Bu döyüşlərin birində bir qadın öldürülmüş halda tapıldı və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadın və uşaqları öldürməyi qadağan etdi." (Müslim / 1744).

## İyirmi birinci fəsil: Gecə basqın etdikdə düşmənin qadın və uşaqlarının öldürülməsi haqda.

25-əs-Saab ibn Cəsəmə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gecə basqınında müşriklərin qadın və uşaqlarının bəzilərinin öldürüldüyü haqda soruşuldu? O belə buyurdu: "Onlarda (atalarındandır) onlardandır." (Müslim / 1745).

## İyirmi ikinci fəsil: Düşmən xurmalıqlarının kəsilməsi və yandırılması.

26-Abdullah ibn Ömər (Allah onların hər ikisndən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bəni Nadirin xurmalığını kəsdi yandırdı." Bu haqda Həssən (Allah ondan razı olsun) bu beyti deyir:
"əl-Bueyrədə uçuşan yanğın, Bəni Lueyin şərəfli adamlarına əhəmiyyətsiz gəldi."
Buna görədə bu ayə nazil olmuşdur: "(Ey möminlər! Sizin kafirlərə məxsus olan) hər hansı bir xurma ağacını kəsməyiniz, yaxud (toxunmayıb) onu kökü üstündə salamat qoymağınız Allahın iznilədir." (Müslim / 1746).

## İyirmi üçüncü fəsil: Düşmənlərin torpağından yemək götürmək.

27-Abdullah ibn Muğaffəl (Allah ondan razı olsun) belə rəvayət edir: "Xeybər günü içi piy dolu dəri bir qab ələ keçirdim. Onu götürərək: "Bu gün bundan heç kəsə bir şey

vermərəm dedim. Çevrildiyimdə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təbəssümünü gördüm." (Müslim 1772).

### İyirmi dördüncü fəsil: Qənimətin bu ümmətə xüsusi ilə halal olması.

28-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Peyğəmbərlərdən biri döyüşə çıxdı və qövmünə belə buyurdu: "Nigahla bir qadına malik olan və onunla gərdəyə girmək istəyən, hələ girməyən, başqa biri isə bir ev tikən lakin damını qaldırmayan bir kimsə, başqa biri isə qoyun və ya boğaz bir dəvə almış və doğmasını gözləyən kimsə mənim ardımca gəlməsin! Beləcə döyüşə çıxdı. Əsr namazı vaxtı və ya ona yaxın bir vaxtda kəndə yaxınlaşdı. Sonra günəşə belə buyurdu: "Sən əmr olunmuşsan, məndə əmr olunmuşam. Allahım mənim üçün günəşi saxla! Beləcə kəndi fəth edənə kimi kimi günəş yerində saxlanıldı. Onlar əldə etdikləri qəniməti topladıqda od gələrək onu götürmək istədi lakin onu yeməkdən imtina etdi. O (peyğəmbər) onlara belə buyurdu: "Sizdən kimsə qənimətdən oğurlayıb! Hər qəbilədən bir kişisi mənə beyət etsin! Ona beyət etdiklərində bir kişinin əli onun əlinə yapışıb qaldı. Ona qənimətdən oğurlayan sizdəndir. Sizin qəbiləniz mənə beyət etsin! İki və ya üç kişinin əli onun əlinə yapışdı. O belə buyurdu: "Qənimətdən siz oğurlamısınız." Ona inək başı kimi bir qızıl çıxartdılar. Onu torpağın üzərindəki malın üzərinə qoydular və od gələrək onu yedi. Bizdən qabağ qənimət heç kəsə halal deyildi. Allah Təala bizim zəifliymizi və acizliyimizi gördükdə onu bizim üçün halal etmişdir." (Müslim/1747).

### İyirmi beşinci fəsil: Ənfal (qənimət) surəsi haqda.

29-Musab ibn Saad atasından (Allah ondan razı olsun) belə rəvayət edir: "mənə görə dörd ayə nazil olmuşdur: Bir qılınc əlimə keçdi onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gətirdilər. Ona: "Ey Allahın Elçisi, onu mənə ver!" deyə söylədikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Burax onu!" Sonra qalxdı və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Onu götürdüyün yerə qoy!" Sonra qalxdım və: "Ey Allahın Elçisi, onu mənə ver!" deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Burax onu" deyə buyurdu. Sonra qalxaraq: "Ey Allahın Elçisi, onu mənə ver! Mən (bu döyüşdə) yetərli olmayan kəslər kimi olunacağam?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onu aldığın yerə burax!" Deyə buyurdu və bu ayə nazil oldu: "Ya Peyğəmbərim! Səndən (müharibədə əldə edilmiş) qənimətlər (onların kimə çatması) haqqında soruşarlar. De: "Qənimətlər Allahın və Peyğəmbərinindir (onun bölünməsi Allaha və Peyğəmbərinə aiddir)." (Müslim/1748).

### İyirmi altıncı fəsil:  Orduya (ələ keçirilmiş qənimətdən) vermək.

30-İbn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Nəcd istiqmətinə ordu göndərdi. Məndə bu orduda çıxdım. Biz dəvə və qoyun ələ keçirdik. Hərəmizin payına on iki dəvə düşürdü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  bizə dəvələri bir-bir verdi." (Müslim / 1749).

### İyirmi yeddinci fəsil: Qənimətdən beşdə bir götürmək.

31-İbn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) göndərdiyi ordudan bəzilərinə (qənimətdən) ümümi ordunun payından xüsusi olaraq əlavə pay verərdi. Xumus (beşdə bir) isə bunların hamsında vacib idi." (Müslim/1750).

## İyirmi səkkizinci fəsil: Qatilə qətlə yetirdiyi kəsin əşyalarını vermək haqda.

32-Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: "Huneyn döyüşü olan ildə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə idim. Biz qarşılaşdıqda müsəlmanların sıraları pozuldu (qaçdılar). Mən müşriklərdən bir kişini müsəlmanlardan olan bir kişini alt etdiyini gördüm və onun ətrafından fırlanaraq arxa tərəfinə gəldim və onun boyun damarından vurdum. Mənə tərəf çevrilərək məni elə sıxdı ki, ondan gələn ölümün iyini hiss etdim. Sonra o öldü və məni buraxdı." Mən Ömər ibn əl-Xattabla (Allah ondan razı olsun) qarşılaşdıqda o belə soruşdu: "İnsanlara nə olub?" Mən: "Allahın əmri." Deyə cavab verdim. Sonra insanlar qayıtdılar və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oturaraq belə buyurdu: "Kim bir kəsi qətlə yetirərsə və onu sübüta yetirərsə, ölənin üzərində olan onun olar. Mən qalxdım və: "Mənim üçün kim şahidlik edər?" dedim. Sonra isə oturdum. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə dediyi kimi buyurdu. Mən yenə qalxdım və: "Mənim üçün kim şahidlik edər?" dedim. Sonra oturdum. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçüncü dəfə dediyini təkrarladı. Mən yenə qalxdığımda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən: "Sənə nə olub ey Əbu Qatədə? "deyə soruşdu və mən Ona hekayəni anlatdım. Camaatdan bir kişi: "O düz deyir Ey Allahın Elçisi. Bu öldürənin üzərindən aldığlarım məndədir. Onu haqqı olanla razı sal." deyə buyurdu. Əbu Bəkr (Allah ondan razı olsun) belə buyurdu: "Allaha and olsun ki, əsla olmaz. Allahın aslanlarından bir aslan Alllah və Elçisinin uğrunda vuruşsun sonra onun haqqı sənə verilsin! Əsla olmaz!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O düz deyir, onu ona ver!" deyə buyurdu. Və o onu mənə verdi. Zirehi satıb Bəni Sələmə qəbiləsindən bir bostan aldım. Bu mənim İslamda nail olduğum birinci malım idi." (Müslim/1751).

## İyirmi doqquzuncu fəsil: Qətl olunanın üzərindən götürüləni ictihad edərək iki qatildən (döyüşçüdən) birinə vermək haqda.

33-Əbd ər-Rahman ibn Ovf (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən Bədr döyüşü günü sırada durduğum bir vaxtda sağıma və soluma baxdım. Hər iki tərəfimdə Ənsarlardan olan iki gənc uşaq vardı. Mən: "Kaş ki, iki əzələli güclü olan adamların arasında olaydım" deyə arzuladım ki, onlardan biri əli ilə vurdü və belə dedi: "Ey əmi, sən Əbu Cəhli tanıyırsan? Mən belə dedim: "Bəli. Ey qardaşım oğlu sənin onunla nəsə işin var?" O belə cavab verdi: "Mənə belə xəbər veriblərki O Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) söyür. Nəfsim əlində olana and olsun ki, onu görsəm ikimizdən birinin əcəli gələrək ölməyincə nəfsim onun nəfsindən əl çəkməyəcək." Mən buna təəcübləndim ki, o birisidə məni vurdu və eyni onun kimi dedi. Cox keçmədən Əbu Cəhli camaatın arasında hərəkət etdiyini gördüm. Onlara: "Onu görürsünüzmü? Bu, haqqında soruşduğunuz kəsdir." Dedim. Onlar ona hücum edərək qılıncları ilə onu vurdular və qətlə yetirdilər. Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sizdən hansınız onu

öldürdü?" deyə soruşdu. Onların hər biri: "Mən öldürdüm" deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Qılınclarınızı sildinizmi?" deyə soruşdu. Onlar: "Xeyr" deyə cavab verdikdə, Onların qılınclarına baxdı və: "İkinizdə öldürdünüz" deyə buyurdu. Və onun üzərindən götürüləni Muaz ibn Amr ibn əl-Cumahaya verilməsini əmr etdi. Bu iki kişi: "Muaz ibn Amr ibn əl-Cumah və Muaz ibn Afra idi." (Müslim / 1752).

## Otuzuncu fəsil: Qətl edən (qətl etdiyinin) üzərindəkiləri götürməyini ictihadla qadağan etmək.

34- Ovf ibn Malik (Allah ondan razı olsun) belə rəvayət edir: "Himyerdən olan bir kişi düşmənlərdən birini öldürdü. Onun üzərindəkilərini götürmək istədikdə, Xalid ibn Valid ona bunu qadağan etdi. O onların üzərində vali (əmir) idi. Ovf ibn Malik Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xalidən: "Sənə onun üzəridəkiləri ona verməyə nə mane oldu?" deyə soruşdu. O belə cavab verdi: "O gözümə çox göründü Ey Allahın Elçisi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Onu ona ver!" deyə buyurdu. Sonra Xalid Ovfun yanından keçdikdə, O onun ridasından (paltarından) dartaraq belə dedi: "Necədi sənə, Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) söylədiyimi yerinə yetirdimmi?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu eşitdi və qəzəblənərək belə buyurdu: "Ey Xalid ona vermə! Ey Xalid ona vermə! Siz mənə mənim əmir təyin etdiyim kəsləri tərk edirmisiniz? Onlarla sizin misalınız qoyun və dəvə alan bir kişinin misalıdır. Onu otarar. Sonra sulama vaxtı onları qovalayıb hovuzun kənarına gətirər, oraya girib suyun təmizini içib onu kirli buraxarlar. Təmizi sizin olur, kirli olanı isə onlara (əmirlərə) qalar!" (Müslim /1753).

## Otuz birinci fəsil: (Öldürülənin) üzərindən götürülənin hamsını qətl edənə vermək haqda.

35- Səlmə ibn əl-Əkva (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Havazinə döyüşə çıxdıq. Biz duha vaxtı Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yemək yeyərkən qırmızı bir dəvənin üzərində bir kişi gəldi. Dəvəsini çökdürdü və sonra xurcunundan bir ip çıxardaraq dəvəsini onunla bağladı. Sonra gəlib camaatla yemək yeməyə başladı. Sonra baxmağa başladı. Bizdə heyvan xüsusunda zəiflik və yüngüllük vardı. Bəzilərimiz isə piyada idi. Birdən qaçaraq çıxdı və dəvəsinin yanına gələrək onu açdı. Sonra çükdürərək üzərinə mindi və dəvə onu sürətlə aprmağa başladı. Bir kişi boz bir dişi dəvənin üzərində onun ardınca düşdü. Sələmə belə buyurdu: "Mən çıxıb qaçmağa başladım və gəlib dişi dəvənin dal alayaqları bərabərinə çatdım. Sonra önə keçərərək (qırmızı) dəvənin arxa ayaqları bərabərinə çatdım. Sonra qabağa keçərək dəvənin ipindən tutdum və onu çökdürdüm. Dizlərini yerə qoyunca qılıncımı çəkərək kişinin başını üzdüm. Başı dərhal qopdu. Sonra dəvəni götürərək qayıtdım. Üzərində onun silahı və yükü var idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlarla birgə məni qarşıladı və: "Kişini kim öldürdü?" Deyə soruşdu. Onlar: "İbn əl-Əkva" deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onun üzərindən götürdüyü hamsı onundur." (Müslim / 1754).

### Otuz ikinci fəsil: Qənimətdən vermək və müsəlmanların əvəzinə əsirlərin fidyə (pul) olaraq vermək.

36-İyas ibn Sələmə atasından (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Fizara qəbiləsinə qarşı döyüşə çıxdıq. Əbu Bəkr üzərimizdə əmir idi. Onu Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərimizə əmir olaraq təyin etmişdi. Bizimlə su arasında bir saatlıq məsafə qaldığında Əbu Bəkr bizə gecənin sonunda dincəlmə əmri verdi. Sonra suvariləri (hücüm üçün) dağıtdı (böldü). Sonra suya çatdı və onun başında olanlardan öldürdüyünü öldürdü və bəzilərini isə əsir aldı. Mən içlərində qadın və uşaqlar olan bir dəstə insana baxırdım, onların məndən öncə dağa çatacaqlarından qorxduğum üçün onlarla dağ arasına bir ox atdım. Oxu görüncə durdular. Mən onları (çəkərək) sürərək gətirdim. Onların içində Fizara qəbiləsindən bir qadında var idi. Üzərində dəridən bir Qaşı vardı. (Qaşı yayılmış deməkdir). yanında bir qızıda var idi ki, ərəblərin ən gözəllərindən idi. Mən onları çəkərək Əbu Bəkrin yanına gətirdim. Əbu Bəkr onun qızını mənə verdi. Mədinəyə gəldim və hələdə qızın paltarını açmamışdım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənimlə bazarda qarşılaşdı və belə buyurdu: "Ey Sələma bu qadını mənə hədiyyə et!” Mən: "Ey Allahın Elçisi, Allaha and olsun ki, o mənim xoşuma gəlir lakin hələdə onun paltarını açmamışam. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhərsi gün yenidən bazarda mənimlə qarşılaşdı və belə buyurdu: "Atan Allah əmanət, ey Sələmə, bu qadını mənə hədiyyə et!" Mən: "O sənindir ey Allahın Elçisi. Allaha and olsun ki, hələdə onun paltarını açmamışam.” Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu qadını Məkkə əhlinə göndərərək onu Məkkədə əsir olan bir neçə müsəlmanın əvəzinə fidyə olaraq verdi." (Müslim/1755).

### Otuz üçüncü fəsil: (Qənimətdən) pay (hissə) və döyüş ilə fəth olunmuş kəndlərdən (götürülən qənimətdən) beşdəbir götürmək haqda.

37-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Hər hansı bir kəndə (əyalətə) gəlsəniz və orada qalsanız payınız oradadır. Hər hansı bir kənd Allaha və Elçisinə asi olarsa onun beşdə biri Allah və Elçisinindir. Sonra isə o sizindir!" (Müslim / 1756).

### Otuz dördüncü: Döyüşsüz əldə edilmiş qənimətin hara sərf edilməsi haqda.

38-Məlik ibn Ovs belə rəvayət edir: "Ömər ibn əl-Xattab (Allah ondan razı olsun) mənə xəbər yolladı və mən günəş yüksələn bir vaxtda onun yanına gəldim. Onu evində çarpayısında xurma lifindən olan bir döşəyin üzərinə üzanmış halda gördüm. Dəridən bir yastığa söykənmişdi. Mənə belə buyurdu: "Ey Malu (yəni Məlikin kiçildilmiş forması)! Məsələ budur ki, sənin qövmündən olan bəzi ev sahibləri tələsik gəldilər. Mən onlara az bir şey verilməsini əmr etdim. Bunu götür onlar arasında böl!” Mən ona belə dedim: "Bəlkə bunu məndən başqasına buyurasan?! O belə dedi: "Bunu götür Ey Malu!" bu vaxt onun keşikçisi girərək belə dedi: "Ey möminlərin əmiri, sən Osman, Əbd ər-Rahman ibn Ovf, Zubeyr və Saadə izn verirsən?" O: "Bəli" deyə buyurdu və onların girməsinə izn verdi. Onlar içəri daxil oldular. Sonra keşikçi yenə gələrək belə dedi: "Abbas və Əliyədə izn verirsən?" O: "Bəli" deyə buyurdu və onların girməsinə izn verdi. Abbas belə buyurdu: "Ey Əmir əl-Muminin, mənimlə bunun (ağır söz dedi: "yalançı günahkar, vəfasız”) arasında hökm kəs." Camaat belə dedi: "Bəli Ey möminlərin əmiri onlar arasında hököm kəs

və onları rahata qovuşdur." (Məlik ibn Ovs belə demişdir: "Mənə elə gəlir ki, onlar bu camaatı buna görə əvvəlcədən göndərmişdilər) Ömər (Allah ondan razı olsun) belə buyurdu: "İkinizdə durun! Sizi yer və göy onun izni ilə duran (var olan) Allaha and verirəm: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu bilirsinizmi: "Biz miras qoymarıq. Özümüzdən sonra tərk etdiyimiz sədəqədir?" Onlar: "Bəli" deyə cavab verdikdə, O Abbas və Əliyə tərəf çevrilərək belə buyurdu: "Sizi yer və göy onun izni ilə duran (var olan) Allaha and verirəm: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu bilirsinizmi: "Biz miras qoymarıq. Özümüzdən sonra tərk etdiyimiz sədəqədir?" Onlar: "Bəli" deyə cavab verdikdə, Ömər (Allah ondan razı olsun) belə buyurdu: "Allah Təala Peyğəmbərinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) elə bir xüsusiyyət bəxş etmişdirki, bunu ondan başqa heç bir kəsə bəxş etməmişdir. Allah Təala buyurur: "Allah Öz Peyğəmbərinə məmləkətlərin əhalisindən verdiyi qənimət Allaha, Peyğəmbərə, (Muhəmməd əleyhissəlama yaxın olana) məxsusdur." Mən bilmədim O bundan əvvəlki ayəni oxudu və ya oxumadı. Sonra belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bəni ən-Nadir qəbiləsinin malını sizin aranızda böldü. Allaha and olsun ki, sizdən heç nəyi əsirgəmədi. Nədə sizi tərk edib, onu özünə götürmədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan yalnız illik nəfəqəsini (ehtiyacı olduğunu) alır və qalanını isə Beyt əl-Mala (müsələmanların ümumu malı olan xəzinə) qoyurdu. Sizi Allaha and verirəm məgər bunu bilirsinzmi?” Onlar: "Bəli bilirik" deyə cavab verdilər. Sonra Abbas və Əliyədə camaata and verdiyi kimi etdi. Onlarda: "Bəli" deyə cavab verdikdə, belə buyurdu: "Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdikdə Əbu Bəkr (Allah ondan razı olsun) belə buyurdu: "Mən onun vəlisiyəm." Və siz gəldiniz. Sən qardaşın oğlundan mirasını istəyirdin. Bu isə arvadının ata mirasını istəyirdi. Əbu Bəkr belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Biz miras qoymarıq. Nə tərk etdiksə, O sədəqədir!" Siz onu da yalançı günahkar, vəfasız saydınız! Halbu ki, Allah Təala onun sadiq, ağlı başında, haqqa tabe olan olduğunu bilir. Sonra Əbu Bəkr vəfat etdi və ondan sonra mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və Əbu Bəkrin vəlisi oldum. Siz məni yalançı günahkar, vəfasız görürsünüz! Allah Təala mənim sadiq, ağlı başımda, haqqa tabe olan olduğumu bilir. Sonra mən bu işi (xəlifəliyi) üzərimə aldım. Sonra sən və bu yanıma gəldiniz. Siz ikiniz birsiniz və işinizdə birdir. Məndən onun (mirası) sizə verməmi istədiniz. Mən sizə: "İstəyirsinizsə onu sizə verərəm lakin bir şərtlə ki, onunla Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etdiyi kimi edəcəksiz! Siz onu bu şərtlə alırsınız! Eləmi!” Onlar: "Bəli" dedilər. O belə buyurdu: "İndi isə gəlmisiniz ki sizin aranızda hökm kəsim. Xeyr Allaha and olsun ki, qiyamət qopana kimi bundan qeyri bir hüküm kəsməyəcəm. əgər bundan acizsinizsə onu mənə qaytarın." (Müslim / 1757).

39- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızı Fatimə Əbu Bəkrin yanına adam göndərərək ondan Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalan Allahın ona Mədinə və Fidəkdən verdiyi maldan və Xeybərdən qalan beşdə birindən olan mirasını istədi. Əbu Bəkr Ona belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Biz miras qoymarıq. Nə tərk etdiksə sədəqədir. Lakin Muhammədin ailəsi isə bu maldan yeyər." Və Allaha and olsun ki, mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında olduğu sədəqəsinin halından bir şey dəyişdirmərəm. Onunla Peyğəmbər (ona, ailəsinə və səhabələrinə

Allahın salavatı və salamı olsun) etdiyi şeyi edəcəyəm." Və Fatiməyə ondan bir şey verməkdən imina etdi. Buna görədə Fatimənin Əbu Bəkrə qarşı nəfsində bir şey qaldı. Ondan uzaq oldu və ölənə kimidə onu danışdırmadı. O Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sonra altı ay yaşadı. O öldüyündə əri Əli ibn Əbu Talib (Allah ondan razı olsun) gecə ikən dəfn etdi. Və Əbu Bəkrə xəbər vermədi. Onun cənazə namazını Əli qıldı. Fatimənin həyatda olduğu ərəfədə Əli xalqın etibarını qazanmışdı. Fatimə öldükdən sonra isə Əli insanlara olan etibarını itirdi və Əbu Bəkrin məsləhətini istədi və ona beyət etməyi düşündü. O bu aylarda ona beyət etməmişdi. Əbu Bəkrin yanına adam göndərək belə buyurdu: "Yanımıza gəl lakin yanında heç kəs gəlməsin." (Ömərin (Allah ondan razı olsun) onunla gəlməsidən çəkindi). Ömər (Allah ondan razı olsun) belə buyurdu: "Allaha and olsun ki, sən onların yanına tək girməyəcəksən." Əbu Bəkr ona belə buyurdu: "Mənə nə edəcəklər ki, Allaha and olsun ki, mən onların yanına gedəcəyəm." Əbu Bəkr onların yanına daxil oldu. Əli şəhadət gətirərək belə buyurdu: "Ey Əbu Bəkr biz sənin fəzilətini və Allahın sənə verdiyinidə bilirik. Bunu Allahın sənə verdiyi bu xeyrə göz qoyduq deyə etmirik. Lakin sən bu işdə bizi uzaqlaşdırdın. Biz Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yaxın qohum olduğumuz üçün bunda bizim haqqımız olduğunu görürdük." O Əbu Bəkrlə o qədər danışdı ki, Əbu Bəkrin gözləri yaşardı. Əbu Bəkr danışdıqda belə buyurdu: "Nəfsim əlində olana and olsun ki, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qohumları ilə əlaqə qurmağım mənə öz qohumlarımla əlaqə qurmağımdan daha sevimlidir. Amma bizimlə sizin aranızda bu mallara görə olan söz-söhbətlərdə mən haqqdan yayınmamışam. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu malla etdiyini gördüyüm heç bir işi tərk etməmişəm Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nə edibsə onu etmişəm." Əli (Allah ondan razı olsun) belə buyurdu: "Beyət (sədaqət andı) üçün günortadan sonrakı vaxtı sənə vəd verirəm." Əbu Bəkr Zöhr namazını qıldıqdan sonra minbərə qalxdı. Şəhadət gətirdikdən sonra Əlinin halını beyət üçün gecikdiyini və ona gətirdiyi üzürünü xatırlatdı sonra Allahdan bağışlanma dilədi. Sonra Əli şəhadət gətirərək Əbu Bəkrin haqqını əzəmətləşdirdi və bu etdiyinin AllahıTəalanın Əbu Bəkri fəzilətlədirdiyi şeydə gözünün olduğu və ya ona inkar etdiyi üçün olmadığını bildirdi. (sonra belə dedi) "Lakin biz bu paydan haqqımız olduğunu gördük və onlar bundan uzaqlaşdırıldıqda nəfsimizdə buna görə bir şey hiss etdik." Deyə buyurdu. İnsanlar bu xəbərə sevindilər və belə dedilər: "Düz dedin" O yaxşılığı əmr edib pis şeylərdən çəkindirməyə qayıtdıqda insanlar Əliyə yaxın oldular." (Müslim / 1759).

40- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mənim mirasçılarım (aralarında) bir dinar belə olsun bölünməz. Özümdən sonra arvadlarıma ehtiyaclarına sərf ediləcək maldan və məmurlarımın maaşlarından başqa nə tərk etdimsə o sədəqədir." (Müslim / 1760).

## Otuz beşinci fəsil: Atlı və piyadaların payı haqda.

41- Abdullah ibn Amr (Allah onların hər ikisnidən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qənimətdən atlıya iki, piyadaya isə bir pay ayırdı." (Müslim /1762).

## Otuz altıncı fəsil: Qadınlara qənimətdən pay ayrılmaz. Onlar nəsə bir şey bəxşiş olaraq verilər və döyüşdə uşaqları öldürmək haqda.

42-Yezid ibn Hurmuz: "Nəcdə İbn Abbasa məktub yazaraq ondan beş şey haqda soruşdu? İbn Abbas belə buyurdu: "Elmi gizlədən olacağımdan qorxmasaydım ona yazmazdım." Nəcdə ona belə yazmışdı: "Və sonra mənə bunları xəbər ver: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlarla birgə cihada çıxdımı? Onlara qənimətdən pay ayırdımı? Uşaqları öldürərdimi? Yetimin yetimlik müddəti nə zaman bitər? Xumus (beşdə-bir) kimindi?" İbn Abbas ona belə cavab yazdı: "Sən yazmısan ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlarla birgə cihada çıxardımı? Bəli onlarla birgə döyüşə çıxardı. Onlar yaralıları müalicə edər, onlara qənimətdən nəsə bir şey bəxşiş olaraq verilərdi. Amma onlara ondan pay ayrılmazdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) uşaqları öldürməzdi. Səndə üşaqları öldürmə! Mənə yazmısan ki, yetimin yetimlik müddəti nə zaman bitir? Ömrüm üzərinə and olsun ki, adam vardır ki, saqqlı bitər, O öz nəfsi üçün bir şey almağa və ondan bir şey verməyə zəifdir. O öz nəfsi üçün insanlar aldığı əlverişli seylərdən almağa başladığında yetimlik ondan gedər. Mənə yazıb Xumusun kimin olduğu haqda soruşursan. Biz: "Bu bizim haqqımızdır" deyərdik. Lakin qövmümüz bunu bizdən qəbul etmədi." (Müslim/1812).

Otuz yeddinci fəsil: Əsirləri tərk etmək və onlara yaxşı davranmaq haqda.

43-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Nəcd istiqamətinə atlı dəstə göndərdi. Onlar Bəni Hənifə qəbiləsindən olan adı Suməmə ibn Usəl adlı əl-Yəmamə qəbiləsinin ağası onan bir kişini gətirdilər və onu məscidin dirəklərindən birinə bağladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanına çıxaraq belə buyurdu: "Nə xəbər Ey Suməmə?" O belə cavab verdi: "Məndə xeyir xəbərdir Ey Muhammad. Əgər məni öldürürsən qan sahibi birini öldürmüş olarsan, yox mənə yaxşılıq edərsən, şükr edən birinə yaxşılıq etmiş olarsan. əgər mal istəyirsənsə dilə! Sənə istədiyin hər şey veriləcəkdir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu tərk edib getdi. Birisigün olduğundan ondan belə soruşdu: "Nə xəbər Ey Suməmə?" O belə cavab verdi: "Məgər sənə demədim ki, əgər mənə yaxşılıq edərsən, şükr edən birinə yaxşılıq etmiş olarsan yox məni öldürərsən qan sahibi birini öldürmüş olarsan, yox əgər mal istəyirsənsə dilə! Sənə istədiyin hər şey veriləcəkdir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu tərk edib getdi. Sabahsı gün olduqda ona belə buyurdu: "Nə xəbər Ey Suməmə?" O belə cavab verdi: "Məndə yalnız sənə dediyim xəbər var. Əgər mənə yaxşılıq edərsən, şükr edən birinə yaxşılıq etmiş olarsan yox məni öldürərsən qan sahibi birini öldürmüş olarsan, əgər mal istəyirsənsə dilə! Sənə istədiyin hər şey veriləcəkdir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Suməməni açıb buraxın!" O məscidə yaxın bir xurmalığa girdi orada yuyunub məscidə daxil oldu və belə dedi: "Allahdan başqa ibadətə layiq məbud olmadığına və Muhəmmədin onun qulu və Elçisi olduğuna şəhadət edirəm. Ey Muhammad, Allaha and olsun ki, yer üzündə mənim üçün ən nifrət etdiyim üzlərdən biri sənin üzün idi. İndi isə sənin üzün mənim üçün bütün üzlərdən ən sevimli bir üz olmuşdur. Allaha and olsun ki, yer üzündə mənim üçün ən nifrət etdiyim dinlərdən biri sənin dinin idi. İndi isə sənin dinin mənim üçün bütün dinlərdən ən sevimli bir din olmuşdur. Allaha and olsun ki, yer üzündə mənim üçün ən nifrət etdiyim şəhərlədən biri sənin şəhərin idi. İndi isə sənin şəhərin mənim üçün bütün şəhərlərdən ən sevimli bir şəhər olmuşdur. Sənin atlı dəstən məni tutduğunda mən ümrə etmək istəyirdim buna necə baxırsan?" Peyğəmbər (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) onu müjdələyərək ümrə etməsini əmr etdi. O Məkkəyə gəldiyində ona bir kişi: "Sən dinindən döndün" deyə söylədikdə, O belə dedi: "Xeyr lakin mən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə islamı qəbul etdim və Allaha and olsun ki, Muhəmməd izn verməyincə sizə Yəmənmədən bir buğda dənəsi belə gəlməyəcəkdir." (Müslim / 1764).

## Otuz səkkizinci fəsil: Yahudiləri Mədinədən sürgün edilməsi haqda.

44-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz məsciddə ikən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanımıza çıxaraq belə buyurdu: "Yahudilərin yanına gedin!” Biz onunla çıxdıq. Nəhayət gəlib onların yanına çatdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onları çağırmağa başladı və belə buyurdu: "Ey yahudi toplumu islamı qəbul edin canınızı qurtarın." Onlar: "Artıq istədiyini çatdırmısan Ey Əbu əl-Qasim." deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: "Bunu istəyirdim. İslamı qəbul edin canınızı qurtarın." Onlar: "Artıq istədiyini çatdlırmısan Ey Əbu əl-Qasim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: "Bunu istəyirdim" deyə üçüncü dəfədə dedi sonra isə belə buyurdu: "Bilinki həqiqətən yer üzü Allaha və Elçisinə məxsusdur. Mən sizi bu yerdən sürgün etmək istəyirəm. Sizlərdən kimsə malının qarşılığında bir şey taparsa onu həmən satsın. Əks halda isə bilin ki, yer üzü Allaha və Elçisinə məxsusdur." (Müslim / 1765).

## Otuz doqquzuncu fəsil: Yahudi və xiristiyanları Ərəbistan yarmadasından çıxarılması.

45-Ömər ibn əl-Xattab (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Yahudi və xiristiyanları Ərəbistan yarmadasından mütləq çıxaracağam. Orada yalnız müsəlman olan kimsələri saxlayacağam." ( Müslim 1767).

## Qırxıncı fəsil: Əhdini pozan və hərb edənin hökmü haqda.

46-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Saad Xəndəq günü yaralandı. Onu Qureyşdən olan əl-Ariqa qəbiləsindən bir kişi yaraladı. Onu qolundakı şah damarından yaraladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu ziyarət etmək yaxın olsun deyə onun üçün məsciddə bir çadır qurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xəndəkdən qayıtdıqdan sonra silahını yerə qoydu və yuyundu. Cəbrail (Ona Allahın salamı olsun) onun yanına gəldi. O başından tozu təmizləyirdi. O Ondan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sən silahı qoymusan? Allaha and olsun ki biz qoymamışıq. Onların yanına çıx! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Hara" deyə soruşduqda O Bəni Qureyzəyə işarə etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlarla vuruşdu. Onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hökmünə ram oldular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara hökm kəsməyi Saadə həvalə etdi. Saad belə buyurdu: "Mən belə hök edirəm: "Onlardan döyüşə yararlı olanlar öldürülsün! Uşaq və qadınlar əsir alınsın və malları bölünsün!"

Hişam belə demişdir: "Atam mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini xəbər verdi: "Sən onlara Allahın hökmü ilə hökm kəsdin." Başqa bir rəvayətdə isə belədir: "Allahın hökmü ilə hökm kəsdin." Başqasında isə belə deyilir: "Artıq Hökümdarın (Mülk sahibinin) hökmü ilə hökm kəsdin." (Müslim / 1768).

# Hicrət və döyüşlər kitabı.

## Birinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hicrəti və möcüzələri haqda.

1- Əbu İshaq belə rəvayət edir: Bəra ibn Əzibinin (Allah onların hər ikisindən razı olsun) belə dediyini eşitdim: "Əbu Bəkr əs-Siddiq atam evində ikən yanına gəldi və ondan yəhər aldı." Sonra Əzibə belə buyurdu: "Oğlunu mənimlə göndər! Onu məmim üçün mənzilimə kimi daşısın." Atam mənə: "Onu daşı" deyə buyurdu. Mən onu götürdüm. Atam onunla (malın) pulunu almaq üçün bayıra çıxdı. Atam ona belə buyurdu: "Ey Əbu Bəkr mənə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə gecə getdiyinizdə necə oldu?" O belə buyurdu: "Bəli biz bütün gecəni getdik hətta günorta oldu və yol açıldı. (işıqlandı, hamı üçün görünən oldu). Yanımızdan bir kimsə keçdiyində, bizim üçün bir üzün kölcəsi olan bir daş gördük. Günəş hələ onun üzərinə gəlməmişdi. Biz onun yanında endik. Mən daşın yanına gələrək əlim ilə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kölcəsində yatması üçün yer düzəltdim. Sonra onun üzərinə kürk sərdim. Sonra isə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Yat Ey Allahın Elçisi! Mən isə sənin üçün ətrafa göz gəzdirərəm!" deyə buyurdum. Mən ətrafa göz gəzdirmək üçün çıxdım. Birdən qoyunları ilə daşın yanına bizim kimi kölcədə dincəlmək istəyən bir çobanla qarşılaşdım. Ondan: "Ey qul (oğlan) sən kiminsən? Deyə soruşdum? O: "Mədinə əhlindən bir kişinin." Deyə cavab verdi. Mən ondan: "Sənin qoyunlarında süd var?" Deyə soruşdum. O: "Bəli" deyə cavab verdikdə, Mən: "Mənim üçün sağarsan?" deyə soruşdum. O: "Bəli" deyib bir qoyun tutdu. Mən ona: "Qoyunun məmələrini tükdən, tozdan, pislikdən təmizlə." deyə ona buyurdum. (İshaq belə demişdir: "Bəranın əlini o biri əlinə vuraraq (sanki) tozu təmizlədiyini gördüm") sonra belə buyurdu: "O mənim üçün əlindəki içinə süd sağılmış bir qabdan taxtadan olan bir qədəhə süd sağdı. Mən ona: "Yanımda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) su süzdüyüm və ondan içdiyi və dəstəmaz aldığı bir qab var." Deyə buyurdum. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim. Onu yuxusundan oyatmaq istəmədim və O oyanana kimi durub gözlədim. Südün aşağı hissəsi soyusun deyə üzərinə su süzdüm və: "Ey Allahın Elçisi bu süddən iç" deyə buyurdum. Onu içdi və məndə razı oldum." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Yola çıxmayaqmı? Mən: "Bəli! Çıxaq." Deyə cavab verdim. Biz günəş zeniti keçdikdən sonra yola qoyulduq. Suraqa ibn Məlik arxamızca gəlirdi. Biz bərk bir (quru, möhkəm) torpaqda ikən mən Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Çatdıq Ey Allahın Elçisi!" deyə buyurdum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Qəm etmə Allah bizimlədir!" deyə buyurdu və dua etdi." Onun (Suraqanın) atı qarnına kimi bu bərk torpağa batdı. Suraqa belə buyurdu: "Bilirəm ki, mənim əleyhimə dua etmisiniz! Mənim üçün Allaha dua edin! Məndə sizi axtaranları (bu yoldan) (sizin izinizdən rədd edim) azdırım." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı

olsun) Allaha dua etdi və xilas oldu. sonra qayıtdı və yolda önünə çıxan hər bir kəsə: "Mən bu tərəfdən sizin üçün (Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu yolda olmadığına) əmin oldum (kifayətəm). Qarşılaşdığı hər bir kəsi bu yoldan azdırdı. O bizə vəfalı oldu." (Müslim /2009).

## İkinci fəsil: Bədr döyüşü haqda.

2- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Sufyanın gəlişi xəbərini bildikdə müşavirə etdi. Birinici Əbu Bəkr danışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan üz çevirdi. Sonra Ömər danışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondanda üz çevirdi. Sonra Saad ibn Ubada qalxaraq belə buyurdu: "Ey Allahın Elçisi, bizi qəsd edirsən? Nəfsim əlində olana and olsun ki, bizə onu (dəvələrmizi) dənizin dibinə salmağı əmr etsən salarıq. Bizə onu (dəvələrmizi, atlarmızı) Birk əl-Ğimad adlanan yerə sürməmizi istəsəydin edərdik." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xalqı dəvət etdi. Onlar yola çıxdılar Bədrə endilər. Onların yanına Qureyşin su daşıyanları (su işinə baxanları) gəldi. Yanlarında Bəni əl-Həccac qəbiləsinə məxsus bir qara kölələridə vardı. Onları tutdular. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabı onlardan Əbu Sufyan və yoldaşları haqda soruşurdular. O belə deyirdi: "Mənim Əbu Sufyan haqda bir xəbərim yoxdur. Lakin bu Əbu Cəhl, Utbə, Şeybə və Umey ibn Xaləf" deyirdi. Belə dedikdə onu döyürdülər. O da: "Bəli mən sizə xəbər verəcəyəm." deyirdi. Onu tərk edib Əbu Sufyan haqda soruşduqlarında O belə deyirdi: "Mənim Əbu Sufyan haqda bir xəbərim yoxdur. Lakin bu Əbu Cəhl, Utbə, Şeybə və Umey ibn Xaləf insanlar içində..." Deyirdi. Bunu dedikdə onu yenə döyürdülər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılırdı. Bunu gördükdə çevrildi və belə buyurdu: "Nəfsim əlində olana and olsun ki, O sizə doğru söylədiyi vaxt onu döyürsünüz. Yalan söylədiyi vaxt isə onu buraxırsınız." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bura filan kəsin yıxılacağı (düşəcəyi, məğlub olacağı) yerdir” deyir və əlini ora, bura qoyurdu. Onlardan (müşriklərdən) heç biri Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlini qoyduğu yerdən bu tərəfə geçmədi." (Müslim /1779).

3- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Buseysəni Əbu Sufyanın karvanı nə etdiyini görmək üçün cəsus olaraq göndərdi. O qayıtdığında, evdə mən və Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başqa kimsə yox idi. (Ravi qadınlardan kiminsə istisna edib etmədiyini "bilmirəm" demişdir.) Ona xəbədəri danışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bayıra çıxaraq danışdı və belə buyurdu: "Bizim bir istəyimiz var! Hər kimin miniyi hazırdırsa bizimlə gəlsin!” Mədinənin yuxarı məhəllələrində kişilər onlarla miniklərinə minmək üçün izin istəyirdilər." O: "Xeyr! Yalnız miniyi hazır olan kimsələr." Deyə buyururdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabı ilə gedərək Bədrə müşriklərdən tez çatdılar. Müşriklər gəldiklərində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizlərdən biriniz mən başda (öndə) olamadan nə badə bir şeyə (görə) irəli atılsın." Müşriklər yaxınlaşdıqlarında Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Qalxın, genişliyi yer və göy qədər olan Cənnətə doğru!" Umey ibn əl-Hammam əl-Ənsari (Allah ondan razı olsun) belə soruşdu: "Ey Allahın Elçisi, genişliyi yer və göy qədər olan Cənnətə?" Peyğəmbər (ona,

ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli" deyə cavab verdikdə. O belə buyurdu: "Hələ! Hələ!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Səni Hələ! Hələ! Deməyə sövq edən nədir?" deyə ondan soruşdu. O belə cavab verdi: "Xeyr. Ey Allahın Elçisi, Allaha and olsun ki, mən bunu yalnız onu əhlindən olmağı arzuladığım üçün dedim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Sən onun əhlindənsən" deyə buyurdu. Sonra o torbasından bir neçə xurma çıxartdı və onlardan yeməyə başladı. Sonra O: "Əgər mən bu xurmaları yeyincəyə qədər gözləsəm bu həyat uzun olar." Dedi və xurmaları yerə ataraq ölüncəyə qədər vuruşdu." (Müslim / 1901).

## Üçüncü fəsil: Mələklərdən kömək imdad etmək, əsirləri fəda etmək və qənimətin halal olması haqda.

4- İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: "Ömər ibn əl-Xattab (Allah ondan razı olsun) mənə belə danışdı: "Bədr günü Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müşriklərə baxdı. Onlar min, əshabı isə üç yüz on doqquz nəfər idilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qibləyə çevrilərək əllərini göyə qaldırdı və Rəbbinə: "Allahım mənə vəd etdiyini yerinə yetir! Allahım mənə vəd etdiyini mənə ver! Allahım əgər sən İslam əhli olan bu camaatı həlak etsən yer üzündə sənə ibadət edən olmaz!" deyə nida etdi. O qibləyə üz tutmuş əllərini yuxarı qaldırmış halda o qədər yalvardı nida etdi ki, ridası çiyinlərindən düşdü. Əbu Bəkr gələrək onun ridasını qaldırıb çiyinlərinin üzərinə qoydu. Sonra onun arxasından ona sarılaraq: "Ey Allahın Elçisi Rəbbinə dua etməyin kifayətdi. Şübhəsiz O sənə vəd etdiyini yerinə yetirəcəkdir." deyə buyurdu. Və Allah Təala bu ayəni nazil etdi: "O zaman siz (dua edərək) Rəbbinizdən kömək diləyirdiniz. (Allah) "Mən sizin imdadınıza bir-birinin ardınca gələn min mələklə çataram!" – deyə duanızı qəbul etmişdi." Və Allah Təala onun imdadına mələklərlə çatdı."

Əbu Zumeyl belə rəvayət edir: "İbn Abbas (Allah ondan razı olsun) mənə belə danışdı: "Müsəlman bir kişi önündə olan müşrik bir kişinin ardınca qaçarkən üzərində qamçı zərbəsi eşitdi. Atın üzərindəki suvarı: "Haydı irəli Heyzum" deyə səsələnirdi. Önündəki müşriki kürəyi üctə yerə sərildiyini gördü. Ona baxdığında, onun burnunun əzilmiş, üzünün isə sanki qamçı zərbəsi ilə yarılmış olduğunu gördü. Bütün bunlar yam yaşıl olmuşdu. Ənsardan olan kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Doğru söylədin. Bu üçüncü səmadan gələn imdaddır. O gün yetmiş nəfər öldürdülər və yetmiş nəfər isə əsir aldılar. (Əbu Zumeyl belə rəvayət edir: "İbn Abbas belə demişdir): "Əsir aldıqlarında Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Bəkr və Ömərə belə buyurdu: "Bu əsirlər haqda fikriniz nədir?" Əbu Bəkr belə buyurdu: "Onlar əmi uşaqları və qohumlardır. Mən bunlardan fidyə almağı və biz bununla kafirlərə qarşı qüvvətlənərik deyə düşünürəm. Ümid edirəm ki, bəlkə Allah Təala onları İslama hidayət edər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sən nə fikirdəsən ey İbn əl-Xattab?" deyə Ömərdən soruşdu? Ömər: "Mən belə dedim: "Allaha and olsun ki, Xeyr Ey Allahın Elçisi. Mən Əbu Bəkrin gördyü rəyi görmürəm. Mən bizə izn versən onların boyunlarını vursaq deyə düşünürəm. Aqilə qarşı Əliyə izn ver ki, onun boynunu vursun. Mənədə yaxınlarımdan olan filan kişiyə qarşı izn ver ki, onun boynunu vurum. Çünki bunlar kafirlərin imamları və şərəfli saydıqlarıdır. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Bəkrin rəyini seçdi və mənim dediyimə baxmadı." Deyə

buyurdu. Sabahsı gün gəldiyimdə Əbu Bəkr və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) otumuşdular və iksidə ağlayırdılar. Mən: "Ey Allahın Elçisi sən və yoldaşın nə üçün ağladığınızı mənədə xəbər verin. Əgər sizin ağlamanızda ağlamalı bir şey tapsam məndə ağlayacağam. Əgər ağlamalı bir şey tapmasam onda məndə özümü ağlayar kimi göstərərəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən sənin yoldaşının mənə fidyə almaq haqda dediyi rəyə görə ağlayıram." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yaxın bir ağaca işarə edərək: "Mənə onların əzabı bu ağacdanda yaxın ərz olundu." Deyə buyurdu və Allah Təala bu ayəni: "Heç bir peyğəmbərə yer üzündə (küfrün kökünü kəsmək üçün bacardığı qədər çox kafir) öldürməyənə qədər əsirləri özünə mal etmək (onları öldürməyib fidyə müqabilində azad etmək) yaraşmaz." Və bu ayəyə kimi: "Əldə etdiyiniz qənimətləri halal və təmiz olaraq (halallıq və nuşcanlıqla) yeyin." nazil etdi. Və Allah Təala qəniməti halal etdi." (Müslim / 1763).

## Dördüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bədrdə öldürülənlərlə, öldüklərindən sonra danışması haqda."

5- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bədrdə ölənləri üç gün tərk etdi sonra yanlarına gələrək onları çağırdı və belə buyurdu: "Ey Əbu Cəhl! Ey Umeyyə ibn Xələf! Ey Utba ibn Rabia! Ey Şeyba ibn Rabia! Məgər siz Rəbbinizin sizə vəd etdiyini haqq olaraq tapmadınızmı? Mən artıq Rəbbimin mənə vəd etdiyini haqq olaraq tapdım." Ömər (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu sözünü eşitdikdə belə buyurdu: "Ey Allahın Elçisi, onlar necə eşidib və cavab verirlər ki, atrıq ölmüşlər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Nəfsim əlində olana and olsun ki, mənim dediklərimi siz onlardan yaxşı eşitmirsiniz. (onlar sizdən pis eşitmir.) lakin onlar cavab verməyə qadir deyillər." Sonra onları sürüyərək Bədir çuxurlarına atdılar." (Müslim /2874).

## Beşinci fəsil: Uhud döyüşü.

6- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uhud günü Ənsardan yeddi və qureyişdən iki kişi arasında tək qaldı. Müşriklər onu sarınca belə buyurdu: "Bunları bizdən uzaqlaşdırana Cənnət vardır." Və ya: "O Cənnətdə mənimlə olacaqdır." Ənsarlardan bir kişi qabağa çıxaraq ölənə kimi vuruşdu. Sonra müşriklər yenidən onun ətrafını sarıdı və O belə buyurdu: "Bunları bizdən uzaqlaşdırana Cənnət vardır." Və ya: "O Cənnətdə mənimlə olacaqdır." Ənsarlardan bir kişi qabağa çıxaraq ölənə kimi vuruşdu. Bu hal yeddi nəfər öldörülənə kimi davam etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanındakı iki sahibinə (qureyşliyə) belə buyurdu: "Yoldaşlarımıza insaf etmədik." (Müslim / 1789).

## Altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uhud döyüşü günü yaralanması.

7- Əbu Həzim belə rəvayət edir: "O Sahl ibn Saaddan Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uhud günü yaralanması haqda soruşulduğunu eşitmişdir. O belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) üzü yaralanmış, yan dişi sındırılmış və başındakı dəbilqə parçalanmışdı. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızı Fatimə (Allah ondan razı olsun) onun üzündən qanı silir Əli ibn Əbu Talib (Allah ondan razı olsun) qalxanla onun üzərinə su tökürdü. Fatimə suyun qanı yalnız artırdığını gördükdə, həsirdən bir parça götürüb yandırdı və külə döndərdi sonra onu yaranın üzərinə basdı və qan dayandı." (Müslim /1790).

8- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yan dişi sındırıldı və başından yaralandı. Ondan qan axmağa başladı. O isə belə deyirdi: "Onları Allaha çağıran Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yaralayan, dişini sındıran bir qövm necə nicat tapar." Və Allah Təala bu ayəni nazil etdi: "Bu işdə sənə dəxli olan bir şey yoxdur." (Müslim /1791).

## Yeddinci fəsil: Cəbrail və Mikailin Uhud günü Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) naminə vuruşması.

9- Saad ibn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: "Uhud günü Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sağında və solunda ağ paltarda iki kişi gördüm. Onları nə bundan əvvəl nə də sonra görmüşəm." Bu sözü ilə Cəbrail və Mikaili qəsd edirdi. Başqa rəvayətdə isə belə deyilir: "Onun naminə şiddətlə vuruşurdular." (Müslim / 2306).

## Səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) öldürdüyü kimsəyə Allahın qəzəbi şiddətli oldu.

10-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu edənə Allahın qəzəbi şiddətləndi (artdı)" O bu vaxt onun yan dişinə işarə edirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həmçinin belə buyurdu: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) öldürdüyü kimsəyə Allahın qəzəbi şiddətli oldu." (Müslim / 1793).

## Doqquzuncu fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qövmü tərəfindən gördüyü əziyyət haqda.

11-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "O Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Allahın Elçisi sənə Uhud günündəndə daha şiddətli bir gün başına gəlibmi?" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "Sənin qövmündən nələr başıma gəldi nələr. Onlardan ən şiddətli gördüyüm əziyyət əl-Aqabə günüdür. Özümü İbn Əbd Yəlil ibn Əbd Kuləlyə ərz etmişdim. O mənim istədiyimə cavab vermədi. Mən kədərli üzlə gözüm gördüyü yerə çıxıb getdim. Və yalnız Qarnu əs-Saləbə adlanan yerdə özümə gəldim. Başımı qaldırdığımda bir buludun məni kölgələndirdiyini gördüm. Baxdığımda Cəbraili onun üzərində gördüm. Məni çağırıb: "Allah Təala qövmünün sənə dediklərini və sənə cavab vermədiklərini (qəbul etmədiklərini) eşitdi. O sənə ona onlara etmək istədiyini əmr etmən üçün dağların mələkini göndərmişdir." Deyə buyurdu. Dağların mələyi onu çağırdı və ona salam verdi. Sonra isə belə buyurdu: "Ey Muhamməd Allah Təala qövmünün sənə dediyini eşitdi və mən dağların mələyiyəm. Sənin Rəbbin məni

sənə mənə onlara etmək istədiyini əmr etmən üçün göndərmişdir. Əgər istəyirsənsə bu əl-Axşabeyni (iki dağı) onların üzərinə bağlayım?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Yox! Allahdan diləyirəm ki, onların belindən yalnız Allaha ibadət edib ona heç bir şeyi şərik qoşmayan kimsələr çıxarsın." (Müslim/1795).

12- Cundub ibn Sufyan (Allah ondan razı olsun) belə rəvayət edir: "Döyüşlərin birində Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) barmağı qanadı və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sən yalnız bir qanayan bir barmaqdan başqa bir şey deyilsən. yalnız başına gələn Allah yolunda gəlmişdir." (Müslim/1796).

13- İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəfə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Evin (Kəbənin) yanında namaz qılarkən Əbu Cəhl və əshabı orada oturmuşdular. Dünən bir dişi dəvə kəsilmişdi. Əbu Cəhl belə dedi: "Sizdən kim gedib bəni filanın dəvəsinin selikli qişasını (içərisində bala olan sarğı, bətnini, içalat) gətirib o səcdə etdikdə onun çiyinlərinə qoyar? Qövmün ən bədbəxt biri irəli atılaraq onu götürdü və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səcdə etdikdə onu onun çiyinlərinin arasına qoydu. Onlar gülməyə başladılar və bir birinin üzərinə yastlanmağa başladırar. Mən dayanıb baxırdım. Əgər bacarsa idim onu onun belindən götürərdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səcdədə başını qaldırmırdı. Nəhayət bir insan gedib Fatiməyə (Allah ondan razı olsun) xəbər verdi. O balaca bir qız idi. Gələrək onu onun üzərindən atdı sonra çevrilərək onları söyməyə başladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirdikdən sonra səsini qaldıraraq onların əleyhinə dua etməyə başladı. Dua etdikdə onu üç kərə təkrarlardı. İstədikdə onu üç kərə istəyərdi. Sonra belə buyurdu: "Allahım Qureyşi sənə həvalə etdim!” Üç kərə təkrarladı. Onlar onun səsini eşitdikdə gülməkləri itdi. Onun duasından qorxdular. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım Əbu Cəhli ibn Hişamı, Utba ibn Rabianı, Şeybə ibn Rabianı, Valid ibn Uqbanı, Umey ibn Xəlafi, Uqba ibn Muayti (və yeddinicinin adını dedi yalnız unutdum) sənə həvalə etdim." Muhamməmədi haqla göndərənə and olsun ki, onun adını çəkdiklərini Bədr günü öldürülərək yerə sərilmiş gördüm. Sonra sürülərək Bədr çuxurlarına atıldılar." Əbu İshaq belə demişdir: "Valid ibn Uqba bu hədisdə xatadır." (Müslim / 1794). Düzgün olanı Valid ibn Utbadır.

## Onuncu fəsil: Peyğəmbərlərin qövümlərindən gördükləri əziyyətə səbr etmələri haqda.

14- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən san ki, halədə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) O qövmü onu vurmuş bir Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) haqda danışarkən baxıram. O üzündən qanı silir belə deyirdi: "Rəbbim qövmümü bağışla həqiqətən onlar bilmirlər." (Müslim/1792).

## On birinci fəsil: Əbu Cəhlin öldürülməsi.

15- Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim bizim üçün Əbu Cəhlin nə etdiyinə baxar.?" İbn Məsud gedərək onu Afranın oğullarının onu vurduqdan sonra yerə sərildiyini gördü. Onun saqqalından yapışaraq belə dedi: "Sən Əbu Cəhlsənmi?” O: “Öldürdüyünüz bir adamın üzərindəmi?” Yaxud: "Onu qövmü oldürdü?" cavab verdi (yəni sizin məni öldürməniz eyb edilməz).

Əbu Micləz belə demişdir: "Əbu Cəhl belə dedi: "Kaş ki, məni əkinçi yox başqası öldürərdi." (Müslim / 1800).

## On birinci fəsil: Kəab ibn əl-Əşrafın öldürülməsi.

16- Cabir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kəab ibn əl-Əşrafi kim öldürər. O artıq Allah və Elçisinə əziyyət etmişdir." Muhamməd ibn Məsləmə Ondan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi mənim öldürməymi istərmisən?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli." deyə cavab verdikdə, O belə dedi: "Mənə icazə ver deyim" O: "De!" deyə cavab verdi. O onun (Kəab ibn Əşrafın) yanına gəldi və aralarında (Onun və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)) olanı xatırlatdı. Sonra belə dedi: "Bu kişi (yəni Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)) Sədəqə istəyirdi. Və bizi çətinə saldı." Kəab ibn Əşraf bunu eşitdikdə belə dedi: "Allaha and olsun ki, bundan dahada çox sıxılacaqsınız." Sonra Muhamməd belə dedi: "Biz indi ona tabe olmuşuq və onu tərk edib sonunun hara olacağına baxmağı xoşlamırıq." Muhamməd ondan bir az borc verməsini istədi. O: "Mənə zamin olaraq nə verirsən." dedi. Muhamməd: "Nə istəyirsən?" deyə soruşdu. O: "Qadınlarınızı zamin qoyun!" dedi. Muhamməd: "Sən ərəblərin ən gözəlisən sənin yanında qadını zamin qoymaq olar?" dedi. O: "Uşaqlarınızı zamin qoyun?" dedi. Muhamməd: "Birimizin oğlunu söyərlər. Lakin sənə yaraqlarımızı yəni silahımızı zamin qoya bilərik." Dedi. O: "Bəli" deyə cavab verdi." Ona gecə Həris, Əbu Abəs ibn Cubeyr və Abbad ibn Bişrlə gələcəyini vəd verdi. Gecə gəlib onu çağırdıq. O onların yanına çıxdı. (Sufyan: "Amrdan başqası dedi ki: "Arvadı ona: "Mən bir səs eşidirəm san ki, qan səsidir." Dedi. O belə buyurdu: "Bu Muhamməd ibn Məsləmə və süd qardaşı Nailədir. Mərd kişi gecə öldürülməyə çağırılsa belə cavab verər." Muhamməd belə dedi: "Mən əlimi onun başına uzadacağam. Onun başını əlimə keçirsəm tutun onu." O endi. Endiyində qılıncına qurşanmışdı. Onlar biz səndən ətir iyi hiss edirik." Dedilər. O: "Bəli! Filankəs mənim nigahım altındadır. Bu Ərəb qadınlarının ətirlərindəndir." Deyə cavab verdi. O ondan: "Mənə bundan qoxlamağa izn verərsən?" deyə soruşdu? O: "Bəli! Qoxla!" O da tutaraq qoxladı. Sonra ona: "Mənə yenidən qayıdıb qoxlamağa izn verərsən? deyə soruşdu və onun başını əlinə keçirdi. Sonra: "Tutun." dedi və onu həmən öldürdülər." (Müslim /1801).

## On üçüncü fəsil: Riqa döyüşü.

17- Əbu Musə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə döyüşə çıxmışdıq. Biz altı nəfər idik. Aramızda bir dəvə var idi. Bizim ayağlarımız deşildi. Mənim ayaqlarım deşildi və dırnaqlarım düşdü. Biz ayaqlarımza əski bürümüşdük. Ayaqlarımıza əski sarıdığımız üçün bu döyüş Zatu Riqa adlandı. Əbu Burda belə demişdir: "Əbu Musa bu hədisi danışdı. Sonra isə bunu bəyənmədi. Sanki o hər hansısa bir əməlinin ifşa olmasını istəmirdi." Başqa bir rəvayətdə isə belə deyilir: "...Allah onun mükafatını verər." (Müslim / 1816).

## On dördüncü fəsil: Əhzab (Xəndək) döyüşü haqda.

18- İbrahim ət-Teymi atasından (Allah ondan razı olsun) belə rəvayət edir: "Hüzeyfənin yanında idik. Bir kişi belə dedi: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın

salavatı və salamı olsun) (zamanına) yetişsəydim onunla bərabər vuruşaraq özümü göstərərdim." Hüzeyfə ona belə buyurdu: "Bunu sən edəcəkdin? And olsun ki, mən özümü Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə əl-Əhzab gecəsi gördüm. Bizi soyuq və şiddətli bir külək yaxalamışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Qövmün (düşmənlərin) xəbərini mənə gətirən bir kişi yoxdumu ki, Allah Təala onu Qiyamət günü mənimlə bərabər həşr etsin?" Biz sakit durduq. Bizdən heç kəs səslənmədi. Sonra yenidən belə buyurdu: "Qövmün (düşmənlərin) xəbərini mənə gətirən bir kişi yoxdumu ki, Allah Təala onu Qiyamət günü mənimlə bərabər həşr etsin?" Biz sakit durduq. Bizdən heç kəs səslənmədi. Sonra mənə: "Ey Hüzeyfə dur get qövmün xəbərini bizə gətir!" deyə buyurdu. Çarəm yox idi. Adımla mənim durmamı tələb etmişdi. Mənə: "Dur get qövmün xəbərini bizə gətir! Lakin onları üzərimizə yönəltmə!" Onun yanından çıxdıqda, sanki (istidən) hamamda yürüyüdüm. Nəhayət onların yanına çatdığımda Əbu Sufyan kürəyini ocağda isidirdi. Mən yaya bir ox qoyub ona atmaq istəyirdim ki Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Lakin onları üzərimizə yönəltmə!" dediyini xatırladım. Mən qayıtdığımda da sanki hamamda yürüyürdüm. Onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına çatdığımda xəbəri ona söylədim. Sözü bitirdiyim vaxt soyuqdan üşüdüm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərinə bürüdüyü içərsində namaz qıldığı əbanın artıq qalan yerini mənim üzərimə örtdü." Mən səhər oyanana kimi yatdım. Səhər oyandığımda mənə: "Qalx ey yatağan!" deyə buyurdu." (Müslim / 1788).

19-əl-Bəra (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Əhzab günü bizimlə birlikdə torpaq daşıyırdı. Torpaq onun ağ qarnını örtmüşdü. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdurdu: "Vallahi Sən olmasaydın biz nə hidayətə gələr, nə zəkat verər, nədə namaz qılardıq. Bizim üzərimizə sükünət endir, çünki onlar üzərimzə gəlmişlər." Bəzən isə belə deyər və səsini yüksəldərdi: "Bu adamlar üzərimizə gəldilər. Onlar fitnə istədikdə biz bu işə qarışırıq." (Müslim/803).

20-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əshabı Xəndək günü belə deyirdilər: "Biz  Muhamməda sağ qaldıqca əbədiyyən İslam dininə beyət etdik." Həmməd şəkk edərək: "və ya belə deyirdilər: "Sağ qaldıqca əbədiyyən cihada beyət edirik." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım axirət xeyrindən başqa xeyr yoxdur. Ənsar və Muhacirləri bağışla." (Müslim / 1805).

## On beşinci fəsil: Bəni Qureyzənin xəbəri haqda.

21-Abdullah ibn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: "əl-Əhzab döyüşündən qayıtdıqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə buyurdu: "Sizdən heç kim Zöhr namazını Bəni Qureyzəyə çatmamış qılmasın! İnsanlardan bəzilər namazın vaxtının çıxmasından qorxaraq onu Bəni Qureyzəyə çatmamış qıldı. Bəziləri isə, xeyr vaxt çıxsada biz onu yalnız Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə əmr etdiyi yerdə qılacayıq." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  bu iki qism insanlardan heç kəsi azarlamadı." (Müslim /1770).

## On altıncı fəsil: Zu- Qarad döyüşü.

22-İyas ibn Sələmə belə rəvayət edir: "Atam mənə belə danışdı: "Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hüdeybiyyə adlanan yerə gəldik. Yüz on dörd nəfər idik. Quyunun başında əlli qoyun var idi ki, quyu onlara su çatdırmırdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) quyunun kənarına oturdu və dua etdi, yada ki onun içinə tüpürdü. Quyu daşdı və biz ondan içdik və heyvanları suladıq. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağacın altında beyət etməyə çağırdı. Ona insanlardan əvvəl mən beyət etdim. Sonra bir-bir hər kəs beyət etdi. Nəhayət insanların yarsına gəlincə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Sələmə beyət etmirsənmi?!" deyə buyurdu. Mən: "Ey Allahın Elçisi, sənə ən birinci mən beyət etdim." Deyə söylədikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Yenədə" deyə buyurdu və mənim silahsız olduğumu gördükdə mənə Cəhfə və ya Dərqa (dəridən yapılmış qalxan) verdi. Sonra: "Beyət et" dedi. İnsanların sonuncusuna çatdıqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Ey Sələmə beyət etmirsənmi?!" deyə buyurdu. Mən: "Ey Allahın Elçisi mən sənə insanların ən əvvəlində və ortasında beyət etdim." Deyə söylədikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Yenədə" deyə buyurdu və mən üçüncü kəs beyət etdim. Sonra məndən: "Ey Sələmə sənə verdiyim dəri qalxan hanı?" Mən: "Ey Allahın Elçisi, mən əmim Amirlə qarşılaşdığımda onu silahsız gördüm və qalxanı ona verdim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülümsədi və belə buyurdu: "Sən bundan əvvəlki adamın dediyi kimi dedin: "Allahım mənə elə bir dost nəsib et ki O mənə nəfsimdən daha istəkli olasun." Sonra müşriklər bizimlə sülh müqabiləsi üçün məktublaşdı. Hətta biz bir-birimizə girdik və sülh bağladıq. Mən Talha ibn Übeydullaha tabe idim. Onun atına su verir tozunu çırpır, Ona (Talhaya) xidmət edir yeməyindən yeyirdim. Mən əhlimi və malımı Allah və Elçisinə görə tərk edərək hicrət etmişdim. Məkkə əhli ilə biz sülh bağladıqdan sonra biz bir birimizə qarışdıq. Mən ağacın yanına gələrək tikanlarını süpürərək təmizlədim və kökünə söykəndim. Məkkə əhlindən dörd müşrik yanıma gəldi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) haqda nə gəldi danışmağa başladılar. Onlara hirsləndim və başqa ağacın altına getdim. Onlar silahlarını asaraq uzandılar. Onlar bu halda ikən vadinin aşağasından bir kişi belə qışqırdı: "Gəlin ey Muhacirlər İbn Zuneym öldürüldü." Mən qılıncıma qurşanıb bu dörd nəfərin üzərinə onlar yuxuda ikən hücüm etdim. Onların silahlarını götürüb əlimdə bir dəstə etdim. Sonra onlara belə dedim: "Muhammədin üzünü şərəfləndirənə and olsun ki, sizdən kim başını qaldırarsa üzərində iki gözü olan üzvünü (başını) kəsəcəyəm. Sonra onları sürərək Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim. Əmim Amir Abəlatdan olan Mikraz adlanan bir kişini müşriklərdən olan yetmiş kişinin içində zirehli bir at üzərində dartaraq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara baxaraq belə buyurdu: "Buraxın onları bu (pis əməl) onlar üçün birinci və axırıncı dəfə olsun." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların hamsını əf etdi və Allah Təala bu ayəni nazil etdi: "Sizi onlara qalib etdikdən sonra Məkkə vadisində onların əlini sizdən, sizin də əlinizi onlardan çəkən Odur. Allah sizin nə etdiklərinizi görəndir!" Sonra Mədinəyə qayıtmaq üçün yola çıxdıq. Yolda bir yerdə dayandıq. Bizimlə müşrik olan Bəni Lihan qəbiləsinin arasında bir dağ vardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu gecə bu dağa dırmanan kəs üçün bağışlanma dilədi. Sanki O Peyğəmbərlə (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrinin keşikçisi olacaqdı. O gecə mən bu dağa iki və ya üç kərə çıxdım. Sonra Mədinəyə gəldik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yük dəvələrini Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xidmətçisi olan Rabah ilə göndərdi. Məndə onunla bərabər Talhanın atının üzərində çıxdım. Talhanın atını dəvələrlə birlikdə su içmək üçün gətirib aparırdım. Sabahladıqda Əbd ər-Rahman əl-Fəzərənin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bütün dəvələrini yığıb apardığını və çobanları öldürdyünü gördüm. Rabahaya: "Ey Rabah bu atı götür Talha ibn Ubeydullaha çatdır və Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verki, müşriklər onun sürüsünə basqın ediblər." Deyə buyurdum. Sonra isə bir təpənin üzərinə çıxdım və Mədinəyə tərəf üz tutaraq üç kərə: "Ey sabahım" deyə səsləndim. Sonra onların ardınca çıxaraq onlara ox atmağa başladım. Həmdə belə şer deyirdim: "Mən əl-Əkvanın oğluyam! Bu gün alçaqların ölüm günüdür." Onlardan birinə çataraq arxasınca ox atdım. Ox onun çiyninə batdı. Mən: "Al sənə! Mən əl-Əkvanın oğluyam! Bu gün alçaqların ölüm günüdür." Dedim. Allaha and olsun ki, mən onlara ox atmaqda davam edir onların atlarını vurub öldürürdüm. Üzərimə bir atlı dönüb gəldikdə isə bir ağacın kökünə sığınaraq ox atır və heyvanını vururdum. Dağ daraldıqda onlar dar bir (dərəyə) yerə daxil oldular. Mən dağın hündür bir yerinə qalxaraq onların başına daş atmağa başladım. Mən bu halda davam etdim. Nəhayət Allahın yaratmış olduğu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) elə bir dəvəsi olmadı ki, onu arxama keçirməyim. Onlardan heç kəsi mənimlə heyvanlar arasında bıraxmadım. Sonra onların ardınca düşərək ox atmağa davam etdim. Onlar qaçarkən yüngülləşmək üçün otuzdan artıq zireh və nizə atıb getdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və əshabı bilsinlər deyə onların atdıqları şeylərin üzərinə daşdan işarələr qoyurdum. Nəhayət gəlib bir dağ yoluna çatdılar. Bu vaxt Finakəs ibn Fəzəri gəldi və onlar oturub səhər yeməyi yeməyə başladılar. Mən kiçik bir dağın təpəsində oturdum. Fəzəri onlara belə dedi: "Bu gördüklərim nədir belə? Onlar: "Bu adamla bəlaya düşmüşük. Allaha and olsun ki, ala-qaranlıqdan bizdən heç ayrılmır. Bizi ox atəşinə tutub və əlimizdə olan hər bir şeyi alıb. Fəzəri onlara belə dedi: "Sizdən dörd nəfər onun yanına getsin." Onlardan dörd nəfər dağa çıxmağa başladı. Onlar mənimlə danışa biləcək bir məsafəyə çatdıqda, mən onlara: "Siz məni tanıyırsınız?" deyə soruşdum. Onlar: "Xeyr! Sən kimsən?" deyə cavab verdikdə, Mən belə dedim: "Mən Sələmə ibn əl-Əkvayam!" Muhəmmədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzünü mübarək edən Allaha and olsun ki, sizlərdən kimi tutmaq (öldürmək) istəsəm buna nail olaram. Lakin sizlərdən kimsə məni tutmaq istəsə buna nail ola bilməz." Onlardan biri belə dedi: "Məndə elə bunu zənn edirəm." Onlar qayıtdılar. Mən isə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) suvariləri köməyə gəlməyincə yerimdən tərpənmədim. Suvarilər ağacların arasında görünməyə başladılar. Suvarilərin önündə əl-Əxram əl-Əsədi, arxasınca Əbu Qatədə əl-Ənsari, onunda arxasında, Miqdad ibn əl-Əsvad əl-Kindi (Allah onlardan razı olsun) vardı. Mən (onlar yaxınlaşdıqda) əl-Əxramın atının yüyənindən tutdum. Bu an müşriklər qaçmağa başladılar. Mən ona belə dedim: "Ey Əxram onlardan özünü qoru. Mən istəmirəm ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və əshabələri gəlincəyə kimi onlar səni öldürsünlər." O belə buyurdu: "Ey Sələmə əgər Allaha və axirət gününə, Cənnətinn və Cəhənnəmin haqq olduğuna iman edirsənsə, mənə Onun yolunda şəhid olmağa mane olma!" mən onu sərbəst buraxdım. O Əbd ər-Rahmanla tək-bətək qarşılaşdı. O Əbd ər-Rahmanın atını vurub öldürdü. Əbd ər-Rahmanda onu nizə ilə vurub öldürdü və onun atının üzərinə atılaraq qaçdı. Peyğəmbərin (ona,

ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) suvarisi ona çataraq Əbu Qatədə onu nizə ilə vurub öldürdü. Muhamədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzünü mübarək edənə and olsun ki, onlarına ardınca qaçır onları təqib edirdim. Nəhayət arxamda nə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) suvarilərindən nə də onların tozlarından bir şey görünmədi. Nəhayət günəş batmaqdan əvvəl müşriklər zu–Qarad adlanan vadiyə susamış halda endilər. Onlar baxdıqlarında mənim onların arxalarınca gəldiyimi gördülər. Bir qurtum su içmədən oranı tərk etdilər. Qaçaraq təpənin üzərinə çıxmağa başladılar. Məndə onların ardınca qaçaraq onlardan birinə yaxınlaşdım və ox atdım. Ox müşrikin çiyin nahiyyəsinə batdı. Mən: "Al səni! Mən əl-Əkvanın oğluyam! Bu gün alçaqların ölüm günüdür." Dedim. O müşrik: "Anası onu itirsin sən ala-qaranlıqda oxuyan əl-Əkvasan!" dedi. Mən: "Bəli! Ey nəfsimin düşməni mən ala-qaranlıqda sizi izləyən əl-Əkvayam!” Deyə cavab verdim. onlar dağın təpəsində iki at tərk edərək getdilər. Məndə o iki atı sürüb Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim. Yolda məni Amir (Allah ondan razı olsun) bir əlində bir az süd, o biri əlində isə su olan bir tuluqla qarşıladı. Mən dəstəmaz aldım və süddən içib sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim. O müşriklərin tərk etdikləri suyun yanında dayanmışdı. Müşriklərdən aldığım dəvələri, zirehləri və nizələri götürmüşdü. Bilal dəvələrdən birini kəsib ciyərindən və hürgücündən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün qızardırdı. Mən belə dedim: "Ey Allahın Elçisi, mənə izn ver əshabından yüz nəfər seçib onların ardınca gedim və öldürmədiyim heç bir xəbərçi qalmasın." Bu sözlərə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) güldü və gündüzün parlaqlığında yan dişləri göründü. Sonra belə buyurdu: "Əgər sənə izn versəm bu işi edəcəksənmi?" Mən: "Səni hörmətli edənə and olsun ki, bəli!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hal hazırda onlar Qatafan ərazisində ziyafətə qonaqdırlar!" Qatafandan bir kişi gələrək belə dedi: "Filan kəs onlar üçün bir dəvə kəsdi. Onlar dəvənin dərisini soyarkən bir toz (qopduğunu) gördülər. Oradakılar: "Sizi qovanlar gəldilər" dedilər və həmən çıxıb qaçdılar. Səhər açıldığında Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu gün suvarilərimizin ən xeyirlisi Əbu Qatədə piyadalarımızın ən xeyirlisi isə Sələmədir." sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə qənimətdən suvari hissəsindən bir və piyada hissəsindəndə bir pay ayıraraq iki hissə pay verdi." Sonra Mədinəyə qayıdarkən məni əl-Adba adlı dəvəsinin tərkinə aldı." Biz bu şəkildə yolda ikən Ənsarlardan biri: "Mədinəyə kimi qaçaraq yarışmaq istəyən varmı?” deyə bir neçə dəfə təkrarladı. Bu sözləri eşitikdə belə dedim: "Məgər sən ali cənab, şərəfli insanlara hörmət etmirsən?" O belə cavab verdi: "Xeyr! Mən yalnız Allahın Elçisinə hörmət edirəm." Mən: "Ey Allahın Elçisi, atam anam sənə fəda olsun izn ver kişi ilə yarışım." Dedim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "İstəyirsənsə yarış" deyə buyurdu. Mən ona: "Sən qaç deyə buyurdum və ayağlarımı qaçış üçün büküb onun ardınca sıçrayaraq qaçmağa başladım. Ona qarşı nəfəsimi almaq üçün bir və ya iki yerdə dayandım. Sonra yenə onun ardınca surətlə qaçmağa başladım. Sonra ona qarşı nəfəsimi almaq üçün bir və ya iki yerdə dayandım. Sonra başımı qaldıraraq surətlə onun ardınca qaçmağa başladım. Sonra gəlib ona çatdıqda çiyninə vuraraq: "Vallahi mən səni ötdüm!” dedim. O: "Məndə belə hesab edirəm!" dedi. Nəhayət mən onu Mədinəyə kimi keçdim. Sələmə belə buyurdu: "Allaha and olsun ki, üç gecə qaldıqdan sonra Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybər istiqamətinə yola çıxdıq. Əmim Amir camaat üçün belə şer oxuyurdu:

"Allaha and olsun ki Allah istəməsəydi hidayət olmazdıq biz,
Nə sədəqə verərdik nədə namaz qılardıq biz,
Olmasaydı lütfün sənin keçinə bilməzdik biz,
Qədəmlərimiz düşmənlə sabit qarşılaşaq biz,
Sakinlik nazil et bizə,
Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Bu kimdir?" deyə soruşdu? O: "Mən Amirəm" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dua etdi: "Rəbbin səni bağışlasın." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kimin üçün xüsusən dua edirdisə o adam mütləq şəhid olurdu. Dəvəsinin üzərində oturmuş Ömər ibn əl-Xattab belə dedi: "Ey Allahın Elçisi, Qoy o hələ bizi şerləri ilə feyziad etsin!" Xeybərə çatdıqda, düşmənlərin başçısı Mərhab qılıncını oynadaraq irəli çıxdı və belə dedi:
"Artıq Xeybər tanıdı bildiki Mərhabam mən,
Müharibə başlayıb döyüş başlayarkən,
Mahir sılah ustası təcrübəliyəm mən.
Əmim Amir onunla vuruşmaq üçün onə çıxdı və belə dedi:
"Artıq Xeybər tanıdı bildi ki Amirəm mən.
Mahir silah ustası çevik qəhramanam mən.

Tək bətək döyüş başladı və hər biri bir birinə qarşılıqlı qılınc zərbələri endirdi. Mərhabın qılıncı əmimin qalxanına dəydi. Əmim onu alt nahiyədən vurmaq istədikdə qılınc onun özünə qayıdaraq damarını kəsdi. Onun ölümüdə bu yaradan oldu. Sələmə belə buyurmuşdur: "Mən çıxdıqda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən bir neçəsinin: "Amirin əməli batil oldu O özünü öldürdü" dediyini eşitdim və ağlaya ağlaya Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib belə dedim: "Ey Allahın Elçisi, Amirin əməli batil olub? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bunu kim deyir" deyə soruşdu? Mən: "Səhabələrindən bəziləri?" deyə cavab verdim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bunu deyənlər yalan deyirlər! Əksinə o ikiqat savab qazanmışdır." Sonra məni Əlini (Allah ondan razı olsun) arxasınca göndərdi. O göz ağrısından əziyyət çəkirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu bayrağı elə bir kəsə verəcəyəm ki, O Allah və Elçisini sevir, Allah və Elçisidə onu sevir!" deyə buyurdu. Mən Əlinin (Allah ondan razı olsun) yanına gəldim gözlərindən əziyyət çəkdiyi üçün onun əlindən tutaraq onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun gözlərinə tüfürərək dua etdi və gözləri sağaldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bayrağı ona verdi. Mərhab irəli çıxdı və belə dedi:
"Artıq Xeybər tanıdı bildiki Mərhabam mən,
Müharibə başlayıb döyüş başlayarkən,
Mahir sılah ustası təcrübəliyəm mən."
Əli (Allah ondan razı olsun) belə buyurdu:
"Anamımın heydər (Aslan) adlandırdığı mənəm,
Meşələr aslanı tək görkəmliyəm,
Düşmənləri pərən-pərən edib tez öldürərəm.
Məhrabın başından qılınc ilə vuraraq öldürdü. Sonra Xeybər onun əli ilə fəth edildi." (Müslim1807).

## On yeddinci fəsil: Hüdeybiyyə sülhü və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qureyşlə sülh bağlaması haqda.

23-əl-Bəra ibn Azib (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Evin yanında (yəni Kəbəy girmək) qadağan olunduqda Məkkə əhli onunla: "Oraya daxil olduqda orada üç gün qalmaq, oraya girdiklərində yalnız qılınc qını yəni qılnc və qını olmaqla, Oranın əhlindən onunla heç kəsin çıxmamağı və onunla olan (müsəlmanlarda) orada qalmaq istəyən kəsə qadağan olmamağ şərti ilə Sülh imzalamağı qərar aldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əliyə (Allah ondan razı olsun) belə buyurdu: "Bizim aramızda olan şərtləri yaz! Rəhimli və Mərhəmətli olan Allahın adıyla. Bu Muhamməd Allahın Elçisi.." Müşriklər belə dedilər: "Biz sənin peyğəmbər olduğunu bilsəydik səni qəbul edərdik lakin sən belə yaz: "Muhamməd ibn Abdullah." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əliyə o bunu silməsini əmr etdikdə, Əli (Allah ondan razı olsun) belə buyurdu: "Allaha and olsun ki, onu pozmayacağam!" deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Mənə onu yerini göstər!" deyə buyurdu. O ona yerini göstərdi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu pozdu və yerinə İbn Abdullah yazdı." Orada üç gün qaldı. Üçüçncü gün olduqda Əliyə (Allah ondan razı olsun) belə dedilər: "Bu gün yoldaşının şərtinin son günüdür ona buyur çıxsın! O bunu Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli" deyə buyurdu və çıxdı." (Müslim /1783).

24-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Hüdeybiyyədən dönüşdə Bu ayə: "Həqiqətən, Biz sənə açıq-aşkar bir zəfər bəxş etdik! Allah sənin əvvəlki və sonrakı günahlarını bağışlayacaq." Alahın buyurduğu bu ayəyə kimi: "Allah sənə yenilməz qələbə verəcəkdir." nazil olduqda artıq Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qurbanlarını Hüdüeybiyyədə kəsmişdi və onlar (Səhabələr) qəm-qüssə içində idilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu gün mənə elə bir ayə nazil olmuşdur ki, o mənə dünyada nə varsa onların hamsından daha sevimlidir." (Müslim/1786)."

## On Səkkizinci fəsil: Xeybər döyüşü.

25-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Xeybərə doğru çıxdıq. Allah Təala onu bizim üçün fəth etdi. Biz Qızıl və Gümüş qənimət əldə etmədik, əldə etdiyimiz sadəcə əşya, yemək və paltar idi. Sonra vadiyə tərəf getdik Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında Cüzam qəbiləsindən olan Bəni Dubeybli Rifa ib Zeyd adlana bir kişinin hədiyyə etdiyi köləsi var idi. Vadiyə endiyimiz zaman Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) köləsi miniyi rahatlamağ istədikdə ona bir ox sancıldı və ölümüdə bundan oldu. Səhabələr Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi onun Şəhidliyi mübarək olsun." dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Muhammədin nəfsi əlində olana and olsun ki, xeyr onun Xeybər günü qənimət bölünmədən götürdüyü bu balaca kisəcik onun üçün atəş oldu. İnsanlar çaşqınlığa düşdülər. Bir kişi əlində bir və ya iki qaytan gəldi və: "Ey Allahın Elçisi bunu xeybər günü ələ keçirmişəm." dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Atəşdən bir qaytan və ya atəşdən iki qaytan." deyə buyurdu." (Müslim/115)

## On doqquzuncu fəsil: Fəhtdən sonra Mühacirlərin Ənsarların onlara verdikləri hədiyyələri (müvəqqəti istifadə üçün verilmiş ağac və meyvələrin) qaytarması haqda.

26-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Mühacirlər Məkkədən gəldiklərinində əllərində heç bir şey yox idi. Ənsarlar isə torpaq və əkin sahibləri idilər. Ənsarlar onlara hər ilə bəhrələrinin yarısını verəçəklərinə və onların iş və yaşamlarını öz üzərilərinə alacaqlarına dair and verdilər. Ənəs ibn Məlikin anası vardı ona Ummu Suleym deyirdilər. O Ənəsin anadan qardaşı olan Abdullah ibn Əbu Talhanında anası idi. Ənəsin anası Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona məxsus olan bir xurmalıq vermişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu xurmalığı köləlikdən azad etdiyi Ummu Əymənə vermişdi. O Usamə ibn Zeyd anası idi." İbn Şihab belə demişdir: "Ənəc ibn Məlik (Allah ondan razı olsun) mənə belə xəbər verdi: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybər Əhli ilə döyüşü bitirdikdən sonra Mədinəyə qayıtdı və Mühacirlər Ənsarların onlara meyvələrindən müvəqqəti istifadə üçün verdiklərini qaytardılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) anama xurmalığını qaytardı. Ummu Əymənə isə onun əvəzinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) öz baxçasını verdi." İbN Şihab belə demişdir: "Usamə ibn Zeydin anası Ummu Əymən Abdullah ibn Əbd əl-Muttalibin hizmətçisi idi. O həbəşlərdən idi. Əminə Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dünyaya gətirdiyində atası öldükdən sonra Ummu Əymən ona böyüyənədək dayəlik etmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) böyüdükdə onu azad etmiş və Zeyd ibn əl-Hərisə onunla evlənmişdi. Ummu Əymən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfatından beş ay sonra vəfat etmişdir." (Müslim / 1771).

## İyirminci fəsil: Məkkənin fəthi və Onun güclə döyüşərək girməsi və onlara mərhəməti haqda.

27-Abdullah ibn Rabəh Əbu Hüreyrənin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: "Ramazan ayında Müaviyyənin yanına bir dəstə nümayəndələr gəldi. Biz bir birimiz üçün yemək bişirirdik. Əbu Hüreyrə (Allah ondan razı olsun) bizi ən çox mənzilinə dəvət edənlərdən idi. Mən: "Yemək bişitdirimdə onları evimə çağırmı?” Dedim və yemək hazırlamalarını əmr etdim. Sonra axşama yaxın Əbu Hüreyrə (Allah ondan razı olsun) ilə qarşılaşdığımda ona belə dedim: "Bu gecə yemək dəvəti məndədir." O belə buyurdu: "Sən məni qabaqladınmı?" Mən: "Bəli" deyə cavab verdim və onları dəvət etdim. Əbu Hüreyrə (Allah ondan razı olsun): "Ey Ənsar toplusu sizə sizin hədislərinizdən bir hədis haqda xəbər verimmi?" deyə buyurdu və sonra Məkkənin fəthini xatırlayaraq belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gələrək Məkkəyə çatdı və Zubeyri bir cinaha Xalidi isə başqa bir cinaha göndərdi.Əbu Ubeydəni isə zirehləri olmayanların üzərinə təyin etdi. Onlar vadinin ortasını tutdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kicik bir dəstə ilə qaldı. Baxdığında məni gördü və belə buyurdu: "Əbu Hüreyrə!" Mən: "Eşidirəm itaətindəyəm Ey Allahın Elçisi." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mənim yanıma yalnız Ənsarlar gəlsin!" Şeybandan başqaları isə belə əlavə etdi: "Mənə ənsarları çağır!" Onlar onun ətrafına sarıldılar. Qureyş özləri üçün müxtəlif qəbilələrdən səfeh və onlara tabe olanları yığdılar və "bunları qabağa verərik" dedilər. əgər əllərinə bir şey keçərsə onlarla bərabər olarıq. Yox əgər məğlub olsalar onlara istədiklərini verərik." Peyğəmbər (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun): "Qureyşin özləri üçün müxtəlif qəbilələrdən seçdiyi səfeh və onlara tabe olanlarına baxın?" Deyə buyurdu və iki əlini bir birinin üzərinə qoydu. Sonra isə belə buyurdu: "Mənə Safaya çatanda mənimlə qarşılaşın!" Biz yola çıxdıq. Bizdən kim kimisə öldürmək istədikdə öldürürdü. Onlardan heç kim bizə bir şey deyə bilmirdi. Əbu Sufyan gələrək belə dedi: "Ey Allahın Elçisi Qureyş camaatı tükəndi. Bu gündən sonra Qureyş yoxdur." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Əbu Sufyanın evinə girən əmindir." Ənsarlar bir birlərinə belə dedilər: "Bu kişiyə (Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)) kəndi və qəbiləsi üçün şəfəqət gəldi." Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurdu: "Vəhy nazil oldu. vəhy gəldiyi zaman bizdən gizli qalmazdı. Vəhy gəldiyində bitənə kimi bizdən heç kimsə gözünün ucuyla olsa belə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tərəf baxmazdı. Vəhy bitdikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Ənsar toplusu!" Onlar: "Eşidirik itaətindəyik Ey Allahın Elçisi" deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Siz bu kişiyə (Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)) kəndi və qəbiləsi üçün şəfəqət gəldi." Dediniz." Onlar: "Belə bir şey olmuşdur." Deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Xeyr haqq budur ki, mən Allahın qulu və Elçisiyəm. Allaha və sizə hicrət etdim. Yaşam yaşamınız. Olümüm olümünüzdür." Onlar onun yanına gələrək ağlamağa başladılar və belə dedilər: "Allah and olsun ki, bizi bunu yalnız Allah və Rəsuluna qıymadığımız üçün söylədik." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən Allah və Elçisi sizi təsdiqləyir və sizi üzürlü sayır." İnsanlar Əbu Sufyanın evinə doluşmağa başladılar. Və insanlar qapılarını bağladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldi və nəhayət qara daşa yaxınlaşaraq ona əl sürtdü. Sonra evi (Kəbəni) tavaf etdi. Bütün yanına gəldikdə, onun gözlərinə batırmağa başladı. O belə deyirdi: "De: Haqq (islam) gəldi, batil (şirk və küfr) yox oldu." tavafını bitirdikdən sonra isə Safaya gəldi ora qalxaraq evə baxdı və əllərini qaldıraraq Allah istədiyi qədər Allaha həmd və dua etdi." (Müslim 1780).

### İyirmi birinci fəsil: Kəbənin ətrafından bütlərin çıxarılması.

28- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkəyə daxil oldu. Kəbənin ətrafında üçyüz altımış büt var idi. O əlindəki ağacla onlara batırır və belə buyurdu: "De: Haqq (islam) gəldi, batil (şirk və küfr) yox oldu. Çünki batil (öz-özlüyündə) yoxluğa (heçliyə) məhkumdur!" "Haqq (islam) gəldi, batil (şirk və küfr) nə yoxdan var edər, nədə yox olanı qaytarar." İbn Əbu Ömər: "Fəth günü." Deyə əlavə etmişdir." (Müslim / 1781).

### İyirmi ikinci fəsil: Fəthdən sonra heç bir qureyşli bağlanıb həbs (əziyyət) edilərək öldürülməyəcəkdir.

29- Abdullah ibn Mutii atasından (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkənin fəthi günü belə dediyini eşitdim: "Bu gündən sonra qiyamətə kimi heç bir qureyşli bağlanıb həbs (əziyyət) edilərək öldürülməyəcəkdir." (Müslim /1782).

### İyirmi üçüncü fəsil: Fətdən sonra İslam, Cihad və Xeyir üzərinə beyət edilməsi haqda.

30-Mucaşi ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Fəthdən sonra qardaşım Əbu Məbədi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim və: "Ey Allahın Elçisi onu hicrətə beyət etdir." Deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hicrət artıq onun əhli üçün keçib getmişdir." Mən: "Onda nəyə beyət etdirilir?" deyə soruşduqda, O belə buyurdu: "İslam, Cihad və Xeyir üzərinə." Əbu Osman ən-Nəhdi belə demişdir: "Mən Əbu Məbədlə qarşılaşdıqda ona Mucəşinin dediyini xəbər verdim. O: "O düz demişdir." Deyə buyurdu." (Müslim / 1863).

## İyirmi dördüncü fəsil: Fəthdən sonra Hicrət yoxdur yalnız Cihad və Niyət vardır.

31-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir:Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hicrət haqda soruşuldu? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Fəthdən sonra Hicrət yoxdur yalnız Cihad və Niyət vardır. Sizə (döyüşə) çıxmaq əmr olunduqda çıxın!" (Müslim / 1863).

## İyirmi beşinci fəsil: Hicrət etmək çətin gələnə xeyirli bir əməl etməsinin əmr olunması haqda.

32-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir çöl ərəbi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hicrət haqda soruşdu?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Vay sənin halınına Hicrət çətin bir işdir. Sənin dəvələrin varmı?" O: "Bəli" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onun sədəqəsini (zəkatını) verirsənmi?” Deyə soruşdu. O: "Bəli." Deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sən kəndlərin arxasında əməl et! Şübhəsiz ki, Allah sənin əməlindən heç bir şey əskildməz." (Müslim / 1865).

## İyirmi altıncı fəsil: Hicrətdən sonra çöldə yaşamağa çıxmasına izn verilən kəs haqda.

33-Sələmə ibn əl-Əkva (Allah ondan razı olsun) belə rəvayət edir: "O Həccac ibn Yusifin yanına daxil olduqda O ona belə dedi: "Ey İbn əl-Əkva boynun (hicrətdən) geri döndü? Bədəviləşdin (çöl ərəbi oldun)?” O belə cavab verdi: "Xeyr! Lakin Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə çöldə yaşamama izn verdi." (Müslim / 1862).

## İyirmi yeddinci fəsil: Hüneyn döyüşü haqda.

34-Kəsir ibn Abbas ibn Əbd əl-Muttalib belə rəvayət edir: "Abbas (Allah ondan razı olsun) belə buyurmuşdur: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə hüneyn döyüşündə iştirak etdim. Mən və Əbu Sufyan ibn əl-Həris ibn Əbd əl-Muttalib Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə idik və heç ondan ayrılmadıq. O ağ qatırının üzərində idi. Bunu ona  Farva ibn Nufəsə əl-Cuzami hədiyyə etmişdi. Müsəlmanlar kafirlərlə üz üzə gəldikdə müsəlmanlar çevrilib qaçdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qatırını kafirlər istiqamətində sürməyə başladı. Abbas belə buyurmuşdur: "Mən, Peyğəmbər (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) sürətlə getməsin deyə qatırının buxovundan yapışmışdım. Əbu Sufyan isə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzəngisindən yapışmışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Ey Abbas əshabı Səmurayı (Səmura ağacı altında beyət edənləri) çağır!" deyə buyurdu. Abbas səsi qüvvətli bir adam idi. Abbas belə demişdir: "Məndə Uca Səslə: "Ey Əshabı Samura" deyə çağırdım. Allaha and olsun ki səsimi eşitdikləri zaman dönüşləri inəklərin balalarına doğru dönüşü kimi idi. Onlar: "Səni eşidirik itaətindəyik! Səni eşidirik itaətindəyik!" deyə deyə kafirlərlə vuruşdular. Ənsarları çağırarkən isə: "Ey Ənsarlar toplusu! Ey Ənsarlar toplusu!deyirdilər. Sonra bu çağrı: "Bəni əl-Həris əl-Xəzrəc" deyə qısaldıldı və Ey Bəni əl-Həris əl-Xəzrəc! Ey Bəni əl-Həris əl-Xəzrəc! Deyə çağrıldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qatırının üzərinidə yuxarıya doğru uzanmış bir vəziyətdə onların döyüşünə baxdı və belə buyurdu: "Bu təndirin qızdığı zamandır." Sonra O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xırda daşlar götürərək kafillərin üzərinə atdı və: "Muhammədin Rəbbinə and olsun ki, məğlubiyyətə uğradılar." Dedi. Mən döyüşə baxmaq üçün getdiyimdə hərb onun dediyi kimi olduğunu gördüm. Allaha and olsun ki, O onlara yalnız xırda daş atmışdı. Mən (bu andan) onların zəiflədiyini və işlərinin gerilədiyini gördüm."

35- Əbu İshaq belə rəvayət edir: "Bir kişi əl-Bəranın (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Əbu Amara siz Hüneyn günü (döyüşdən) dönüb qaçdınızmı?" O belə buyurdu: "Allahın Peyğəmbərinə şəhadət edirəm ki, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qaçmadı. Lakin bu varki tələsik, zirehsiz insanlar havazinin bu gəbiləsinə getdilər. Onlar isə atıcı (ox atan) bir qövmdür. Onları ox yağışına tutdular. Sanki bu oxlar çəritkə sürüsü kimi idi. Onların sıraları dağıldı. Düşmənlər Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tərəfə yönəldi. Əbu Sufyan (Allah ondan razı olsun) onun qatırını çəkərək sürürdü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yerə endi dua etdi və kömək dilədi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deyirdi: "Peyğəmbərəm mən yalan yox, Mən Əbd əl-Muttalibin oğluyam. Allahım yardımını bizə nazil et!" əl-Bəra (Allah ondan razı olsun) belə demişdir: "Hər qızışdıqda onu qoruyurduq bizim ən cəsurmuz Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında idi." (Müslim / 1776).

36- Sələmə ibn əl-Əkva (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Huneyn döyüşünə çıxmışdıq. Düşmənlə qarşılaşdıqda irəllədim və bir dağ yoluna çıxdım. Birdən döşməndən bir adam qabağıma çıxdı. Mən ona tərəf ox atdım və O gözümdən itdi. Nə etdiyini anlamadım. Baxdığımda onların başqa bir dağ yolundan Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və səhabələri ilə qarşıladıqlarını gördüm. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri qaçmışdı. Mən məğlub olunmuş bir hakda qayıtdım. Üzəlimdə iki libasım var idi. Birinə sarınmış digərinə isə bürünmüşdüm. Birdən izarım açıldı və mən əhər ikisini toplayıb məğlub olunmuş halda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ağ xallı bir qatırın üzərində idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Əl-Əkvanın oğlu bir qoru görmüşdür!" deyə buyurdu. Düşmənlər Onun ətrafını sarıdıqda qatırdan endi və bir ovuc götürərək onlara tərəf çevrildi. Onu onların üzərinə atdı və: "Üzlər qaralsın." Deyə buyurdu. Onlardan olan Allahın xəlq etdiyi elə insan olmadı ki, gözlərinə atdığı bu torpaqla dolmasın."

Onlar çevrilib qaçdılar. Allah Təala onları məğlub etdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qənimətləri müsəlmanlar arsında bölüşdürdü." (Müslim 1777).

### İyirmi səkkizinci fəsil: Taif döyüşü.

37- Abdullah ibn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Taif əhlini mühaşirəyə aldı. Lakin onlardan bir şey əldə etmədi. Əshabına: "Biz qayıdırıq inşa Allah." Deyə buyurdu. Əshabı: "Fəth etmədən dönürük?" deyə soruşduqda. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sabah döyüşə hazır olun." Sabahsı gün döyüşə getdilıər lakin yaralandılar." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: "Biz sabah dönürük inşa Allah." Deyə buyurdu. Bu onlrın xoşuna gəldikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) güldü." (Müslim / 1778).

### İyirmi doqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşlərinin sayı haqda.

38- Əbu İshaq belə rəvayət edir: Abdullah ibn Yezid insanlara yağış dua etdirmək üçün cıxmışdı. O iki rükət namaz qıldı sonra dua etdi. Sonra mən o gün Zeyd ibn Arqamla qarşılaşdım. (mənimlə onun arasında bir kişidən başqa heç kəs yox idi. Və ya: "mənimlə onun arasınba heç bir kəs yox idi.). Ondan Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) neçə döyüş etmişdir?" Deyə soruşdum? O: "On doqquz döyüş." Deyə cavab verdi. Mən: "Sən onunla neçə döyüşdə iştirak etdin?" deyə soruşdum? O: "On yeddi döyüş." Deyə acavb verdi. Mən: "Onun ən birinci döyüşü hansıdır deyə soruşdum? O: "Zətu əl-Useyr və ya Uşeyr." dedi (Müslim/1254).

39- Bureydə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) on doqquz döyüş etdi bunların səkkizində vuruşdu." (Müslim/1814).

## Əmirlik kitabı.

### Birinci fəsil: Xəlifələr qureyşdəndir.

1- Abdullah ibn Ömər (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İnsanlardan iki kişi qaldığı müddətcə bu iş Qureyşdə davam edəcəkdir." (Müslim /1820).

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İnsanlar bu işdə Qureyşə tabedirlər. Müsəlmanları müsəlmanlarına. Kafirləri isə kafirlərinə." (Müslim / 1918).

3- Amir ibn Sad ibn Əbu Vaqqas belə rəvayət edir: "Qulum Nəfi ilə Cabir ibn Samuraya Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyini yazması üçün məktub göndərdim. O mənə belə yazdı: "Mən Cümə günü əl-Əsləminin daşqalaq olunduğu bir gecədə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Bu din Qiyamət qopuncaya kimi və ya sizin üzərinizdə hamsı Qureyşdən olmaqla on iki

xəlifə durana kimi durmaqda davam edəcəkdir.” Həmçinin Onun belə dediyini eşitdim: "Müsəlmanlardan bir dəstə Kisranın ağ evini və ya Kisra ailəsinin ağ evini fəth edəcəklər.” Həmçinin belə dediyini eşitdim: "Şüphəsiz ki, Qiyamət öncəsi yalançılar çıxacaqdır onlardan qorunun!” Həmçin belə dediyini eşitdim: "Allah Təala sizdən kiməsə bir xeyir verərsə O öz nəfsindən və Ailəsindən başlasın.” Həmçinin belə deiyini eşitdim: "Hovuzun başına ilk çatacaq olan mənəm." (Müslim / 1822).

## İkinci fəsil: Xəlifə təyin etmək və etməmək haqda.

4- İBn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Hafsanın (Allah ondan razı olsun) yanına daxil oldum. O (Allah ondan razı olsun) mənə belə buyurdu: "Atanın özüdən sonra xəlifə təyin etməyəcəyini bilirsənmi? Mən: "O bunu etməyəcək." deyə cavab verdim. O: "Mütləq edəcək." deyə buyurduqda, mən onunla bu xüsusda danışmağa and içdim və susdum. Nəhayət sabah getdiyimdə onunla danışmadım. Sanki mən sağ əlimdə dağ daşıyırdım. Nəhayət qayıdıb onun yanına daxil oldum. O məndən insanların halını soruşdu. Mən ona xəbər verdim sonra isə belə dedim: "Mən insanların bir söz dediyini eşitmişəm və onu sənə deməyə and içmişəm. Onlar sənin Xəlifə təyin etməyəcəyini iddia edirlər. Həqiqətən əgər sən bir dəvə və ya qoyun çobanın olsa sonra sürünü tərk edib sənin yanına gələrsə ona heyvanları itirdiyini deyərdin. İnsanları idarəlik isə dahada çətindi." O mənim sözüm ona müvafiq gəldi və bir müddət başını aşağı saldı. Sonra başını mənə tərəf qaldıraraq belə buyurdu: "Mən xəlifə təyin etməsəm belə Allah Təala dinini qoruyacaqdır. Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəlifə təyin etməmişdir. Mən xəlifə təyin etmiş olsam Əbu Bəkir də xəlifə təyin etmişdi." İbn Ömər demişdir: "Allaha and olsun ki, O Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və Əbu Bəkiri xatırladığında anladım ki, O Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç kimə dəyişməyəcəkdir və xəlifə təyin etməyəcəkdir." (Müslim / 1823).

## Üçüncü fəsil: Birinci xəlifə və onun ardıcılları olan xəlifələrə edilən beyətə vəfalı olmağa əmr haqda.

5- Əbu Həzim belə rəvayət edir: "Əbu Hüreyrənin (Allah ondan razı olsun) yanında beş il qaldım.Onun Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə rəvayət etdiyini eşitdim: "Bəni İsraili peyğəmbərlər idarə edirdi. Bir peyğəmbər həlak olduğunda yerinə başqa bir peyğəmbər keçirdi. Şübhəsiz ki, məndən sonra peyğəmbər yoxdur. Lakin xəlifələr gələcəkdir və bu xəlifələr həm də çox olacaqdır." Onlar: "Bizə nə əmr edirsən?" deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Birinci xəlifə və onun ardıcılları olan xəlifələrə edilən beyətə vəfalı olun. Onların haqlarını verin. Həqiqətən Allah Təala onları rəiyyətlərindən dolayı sorğu sual edəcəkdir." (Müslim/1842).

6- Əbd ər-Rahman ibn Əbd Rəbb əl-Kəbə belə rəvayət edir: "Məscidə daxil olduğumda Abdullah ibn Amr ibn əl-Assı (Allah ondan razı olsun) Kəbənin kölgəsində oturduğunu gördüm. İnsanlar onun ətrafına toplaşmışdı. Onların yanına gələrək ona yaxın əyləşdim. O belə buyurdu: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bircə səfərdə idik. Bir yerdə dayandıq. Bizlərdən bəzisi çadırını düzəldir, bəziləri ox atmaqla yarışır, bəzilərimiz isə otlaqda kı, heyvanına göz qoyurdu. Birdən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) carçısı: "Namaza toplanın" deyə

səsləndi. Biz Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ətrafında toplandıq. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən məndən əvvəl elə bir Peyğəmbər olmayıb ki (onlar üçün) bildiyi hər bir xeyirli ümmətinə göstərmək və bildiyi hər bir şərdən onları çəkindirmək boynuna düşməsin. Sizin bu ümmətinizin rifahı (salamatlığı) əvvəlində verilmişdir. Sonuna isə bəla və sizin üçün qeyri adi olan bir şeylər baş verəcəkdir. Bir fitnə gələcəkdir ki, bəzisi bəzisini xəfifləndirəcəkdir (yəni əvvəlki fitnə bunun yanında asan görünəcəkdir.). Elə bir fitnə gələcəkdir ki, mömin: "Bu mənim həlakımdır." Deyəcək. Sonra aşılacaq. Sonra elə bir fitnə gələcək ki, mömin: "Budur, budur." Deyəcək. Sizlərdən kim Cəhənnəmdən uzaqlaşıb Cənnətə daxil olmasını istəyirsə əcəlini Allaha və axirət gününə iman etmiş bir halda qarşılasın. İnsanlarla özünə qarşı dilədiyi rəftarla davransın. Və hər kim bir imama beyət edər ona əlini onun əlinin üzərinə qoyar və qəlbinin səmərəsini ona verərsə ona əlindən gəldiyi qədər itaət etsin. Başqa birisi gələrək onunla çəkişərsə gələnin boynunu vurun." Mən ona yaxınlaşaraq ondan belə soruşdum: "Səni Allaha and verirəm sən bunları Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitmisən?" O əli ilə qulaqlarına və qəlbinə işarə edərək belə buyurdu: "Bunu qulaqlarım eşidib və qəlbim ram etdi." Mən ona: "Sənin əmin oğlu Müaviyyə bizə mallarımızı aramızda batilcəsinə yeməyi və nəfslərmizi öldürməyi əmr edir. Allah Təala isə belə buyurur: "Ey iman gətirənlər! Qarşılıqlı razılıqla edilən alış-veriş müstəsna olmaqla, bir-birinizin mallarını haqsız bəhanələrlə (haqsız yerə) yeməyin və özünüzü öldürməyin! Həqiqətən, Allah sizə qarşı mərhəmətlidir!" O bir müddət sakit qaldı sonra isə belə buyurdu: "Ona Allahın itaəti xüsusunda itaət et, Allah Təalaya asi olan şeylərdə isə asi ol!" (Müslim / 1844).

## Dördüncü fəsil: İki xəlifəyə beyət olunarsa.

7- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İki xəlifəyə beyət olunarsa, onlardan axırıncı olanı öldürün." (Müslim / 1853).

## Beşinci fəsil: Hamınız çobansınız (başçısınız) və hamınız sürüsünə (rəiyyətinə) görə məsuliyyət daşıyırsınız.

8- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hamınız çobansınız (başçısınız) və hamınız sürünüzdən (rəiyyətindən) məsuliyyət daşıyırsınız. İnsanların üzərində olan əmir çobandır (başçıdır) və O rəiyyətinə görə məsuliyyət daşıyır. Kişi ailəsi üzərində çobandır (başçıdır) və O onlara görə məsuliyyət daşıyır. Qadın kişisinin evində uşaqların üzərində çobandır (başçıdır) və O onlara görə məsuliyyət daşıyır. Qul ağasının malı üzərində cobandır (başçıdır) və O onlara görə məsuliyyət daşıyır. Diqqət edin haminiz çobansınız (başçısınız) və hamınız sürünüzdən (rəiyyətindən) məsuliyyət daşıyırsınız." (Müslim / 1829).

## Altıncı fəsil: Əmirlik tələb etmənin və ona həris olmağın bəyənilməməsi.

9- Əbd ər-Rahman ibn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Ey Əbd ər-Rahman əmirlik istəmə! Əgər onu istəyərək əldə edərsənsə onunla baş başa tərk olunarsan. Yox onu istəmədən əldə edərsənsə onun uğruna sənə yardım olunar." (Müslim /1823).

10-Əbu Zər (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ey Əbu Zər Mən səni zəif görürəm və sənə nəfsim üçün istədiyimi istəyirəm. İki nəfərin üzərinıə əmir seçilmə və yetimin malına vəli olma." (Müslim/1826).

11-Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Ey Allahın Elçisi məni vali edərsən? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çiynimə əli ilə vuraraq belə buyurdu: "Ey Əbu Zər Sən zəifsən. Bu isə əmanətdi. Bu Qiyamət günü xəsarət və peşmançılıqdır. Yalnız onu haqqı ilə əldə edən və bu xüsüsda üzərinə düşəni yerinə yetirən istisna olmaqla." (Müslim/1825).

## Yeddinci fəsil: Biz işimizə istəyəni (məmur) təyin etmirik.

12-Əbu Burda belə rəvayət edir: "Əbu Musa belə demişdir: "Mən yanımda əl-Əşarilərdən biri sağımda biridə solumda olmaqla iki kişi ilə birgə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdim.onların ikisidə ondan iş (məmurluq) istədilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu vaxt misvakla dişlərini təmizləyirdi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Nə deyirsən Ey Əbu Musa. Və ya Ey Abdullah ibn Qeys?" Mən belə cavab verdim: "Səni haqla göndərənə and olsun ki, mənə onlar qəlblərində olanı mənə söyləmədilər. Mən onların iş istəməsini heç düşünmədimdə. Sanki mən halədə onun dodağının altında misvakın yüksəldiyini halədə görürəm. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Biz işimizə istəyəni (məmur) təyin etmirik (və ya etməyəçəyik). Ey Əbu Musa. Və ya Ey Abdullah ibn Qeys sən get!" deyə buyurdu və onu Yəmənə göndərdi."sonra onun ardından Muaz ibn Cəbəli göndərdi. O onun yanına çatdıqda ona: "Düş (en)!" deyə buyurdu və onu üçün döşək qoydu. Muaz onun yanında bağlı bir adam gördü və: "Bu nədir?" deyə soruşdu. O belə cavab verdi: "Bu yahudi idi. Sonra İslamı qəbul etdi. Sonra yenidən pislik dininə geri döndü. Muaz: "Mən bu öldürülməyincə oturmaram! Allah və Elçisinin hökmü budur." Deyə buyurdu. Əbu Musa: "Otur! Bəli Muaz: "Mən bu öldürülməyincə oturmaram! Allah və Elçisinin hökmü budur." Deyə üç kərə təlrar etdi və O əmr etdi və onu öldürdülər. Sonra onlar oturub gecə namazını xatırladılar. Onlardan biri (Muaz) belə buyurdu: "Mən həm yatır həm də namaza dururam. Yatdığımda da, namaza durduğumda da umduğumu umuram." (Müslim/1823).

## Səkkizinci fəsil: İmam (rəhbər) Allahdan qorxmağı əmr edər və adil olarsa ona əcr vardır.

13-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İmam qalxandır. Onu arxasında vuruşulur. Onunla qorunulur. O Allahdan qorxmağı əmr edər və adil olarsa ona əcr vardır. Bundan başqasını əmr edərsə ondan gələn əleyhinə olar." (Müslim /1841).\

## Doqquzuncu fəsil: Bir şeyə Vali təyin olunduqda (onda) adillik edən kəs haqda.

14-Abdullah ibn Ömər (Allah onların hər ikisndən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Adil olanlar Allahın yanında nurdan olan minbərlərdə olacaqlar. Onlar ər-Rəhmanın sağında olacaqlar. Onu hər iki əli sağdır. O kəslər ki, hökümlərində, ailələrində və vali olduqları şeydə adildirlər." (Müslim/1827).

## Onuncu fəsil: Bir şeyə Vali təyin olunduqda çətinlik edən və mülayim rəftar edən kəs haqda.

15-Əbd-Rahman ibn Şumasə belə rəvayət edir: "Aişənin yanına gələrək nəsə bir şey haqda soruşdum? O məndən: "Sən kimlərdənsən?" deyə soruşdu. Mən: "Mən Misir əhlindən bir kişiyəm." deyə cavab verdim. O belə soruşdu: "Sizinki sizin bu döyüşünüzdə sizinnlə müamələsi necədir." Mən belə cavab verdim: "Biz ondan bir pislik görməmişik. Əgər bizdən bir kişinin dəvəsi ölsə, ona dəvə verir. Qulu ölsə ona qul verir. Kimsə nəfəqəyə (yemək, mal,) möhtac olarsa ona nəfəqə verir." Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Bax onun qaradaşım Muhaməd ibn Əbu Bəkrə etdiyi məni sənə Bu evimdə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyimi xəbər verməkdən qadağan etməz. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım bir kimsə ümmətimnin bir işində bir vəzifə alar və onlar üçün çətinləşdirərsə, sən də onun üçün çətinləşdir! Və kimsə ümmətimnin bir işində bir vəzifə alar və onlarla xoş müamələ edərsə, səndə onunla xoş müamələ et!" (Müslim/1828).

## On birinci fəsil: Din Nəsihətdir.

16-Təmim əd-Dəri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Din nəsihətdir." Biz: "Kimin üçün" deyə soruşduqda, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah üçün. Kitabı üçün. Peyğəmbəri üçün. Müsəlmanlara və onların imamına." (Müslim /55).

17-Cəbir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılmağa, zəkat verməyə və hər bir müsəlmana nəsihət etməyə beyət etdim." (Müslim / 1256).

## On ikinci fəsil: Rəiyyətini aldadan (xəyanət edən) və onlara nəsihət etməyən haqda.

18-əl-Həsən belə rəvayət edir: "Ubeydullah ibn Ziyad, Makil ibn Yasar əl-Muzənini ölüm ayağında ikən ziyarət etdiyində, Maqil belə buyurdu: "Mən sənə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyim bir hədisi danışacağam. Əgər mən yaşayacağımı bilsəydim sənə bu hədisi danışmazdım. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Elə bir bəndə yoxdur ki, Allah Təala onu bir sürüyə (rəiyyət üzərinə) çoban (başçı) etməsin və O ölərkən bu sürünü aldadaraq (xəyanət edərək) öldürdükdə ona Cənnəti haram etməsin." (Müslim / 1829, 142).

19-əl-Həsən belə rəvayət edir: "Aiz ibn Amr (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən idi. O Ubeydullah ibn Ziyadın yanına daxil olduqda, ona belə buyurdu: "Ey oğulcuğum Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitmişəm: "Ən şərli çobanlar insafsız (qəddar) dəvə baxıcılarıdır. Diqqət et! Onlardan olma!" Ubeydullah ona: "Otur! Sən Muhammədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrinin kəpəyindənsən." O ona belə dedi: "Məgər onların kəpəyi var, Kəpək ançaq onlardan sonra və başqalrında olur." (Müslim / 1830).

## On üçüncü fəsil: Əmirlərin xəyanəti və bu işin ağır bir günah olması haqda.

20-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) aramızda ayağa qalxaraq xəyanəti xatirlatdı və onu ağır bir günah olmasını bildirdi sonra isə belə buyurdu: "Diqqət edin! Nə badə sizlərdən kimsə qiyamət günü boynunda böyürtüsü olan bir dəvə ilə gələrək: "Ey Allahın Elçisi məni xilas et!" Desin və məndə ona: "Mən sənin üçün heç bir şeyə malik deyiləm artıq sənə bəyan etmişəm (çatdırmışam)." deyərək cavab verim. Diqqət edin! Nə badə sizlərdən kimsə qiyamət günü boynunda kişnəyişi olan bir at ilə gələrək: "Ey Allahın Elçisi məni xilas et! Desin və məndə ona: "Mən sənin üçün heç bir şeyə malik deyiləm artıq sənə bəyan etmişəm (çatdırmışam)." deyərək cavab verim. Diqqət edin! Nə badə sizlərdən kimsə qiyamət günü boynunda mələyişi olan bir qoyun ilə gələrək: "Ey Allahın Elçisi məni xilas et!" Desin və məndə ona: "Mən sənin üçün heç bir şeyə malik deyiləm artıq sənə bəyan etmişəm (çatdırmışam)." deyərək cavab verim. Diqqət edin! Nə badə sizlərdən kimsə qiyamət günü boynunda çığırtısı olan bir nəfs (kəs) ilə gələrək: "Ey Allahın Elçisi məni xilas et!" Desin və məndə ona: "Mən sənin üçün heç bir şeyə malik deyiləm artıq sənə bəyan etmişəm (çatdırmışam)." deyərək cavab verim. Diqqət edin! Nə badə sizlərdən kimsə qiyamət günü boynunda dalğalan libaslar olduğu halda gələrək: "Ey Allahın Elçisi məni xilas et!" Desin və məndə ona: "Mən sənin üçün heç bir şeyə malik deyiləm artıq sənə bəyan etmişəm (çatdırmışam)." deyərək cavab verim. Diqqət edin! Nə badə sizlərdən kimsə qiyamət günü boynunda qızıl, gümüş olan bir halda gələrək: "Ey Allahın Elçisi məni xilas et!" Desin və məndə ona: "Mən sənin üçün heç bir şeyə malik deyiləm artıq sənə bəyan etmişəm (çatdırmışam)." deyərək cavab verim." (Müslim / 1831).

### On dördüncü fəsil: Əmirlərin gizlətdiyi xəyanətdir.

21-Adiy ibn Umeyrə əl-Kindi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Sizlərdən hər hansınızı məmur olaraq təyin etdikdə bir iynə və daha artığını gizlədərsə bu xəyanət olar və qiyamət günü (gizlətdiyini) gətirər. Ənsarlardan olan qara bir kişinin durub onun yanına yaxınlaşdı. Sanki hələdə ona baxan kimiyəm. belə buyurdu: "Ey Allahın Elçisi məni təyin etdiyin bu işi məndən geri al." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Sənə nə olub?" deyə soruşduqda, O belə cavab verdi: "Sənin belə və belə dediyini eşitdim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən indidə deyirəm sizlərdən hər hansınızı bir işə məmur təyin etdikdə azını da, çoxunu da gətirsin. Ondan ona nə verilsə götürsün nə qadağan olunsa əlini çəksin." (Müslim / 1833).

### On beşinci fəsil: Əmirlərə (məmurlara) hədiyyə verilməsi haqda.

22- Əbu Humeyd əs-Saidi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Əsəd qəbiləsindən olan və İbn əl-Lutbiyyə adlı bir kişini bəni Suleymin sədəqələrini (zəkatını) yığmağa məmur təyin etdi. O gəldiyində belə dedi: "Bu sizin malınız, bu isə (Mənə) hədiyyədir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Əgər düzgün danışırsansa, onda atanın və ananın evində otursaydın sənə hədiyyə gətirərdilər?!" Sonra bizə xütbə verərək Allaha həmd səna etdi və belə buyurdu: "Və sonra mən sizlərdən bir kişini Allahın mənim idarəmə verdiyi bir işə məmur təyin etdikdə O gəlib "Bu sizin malınızdır.

Bu isə hədiyədir mənə hədiyyə edilib” deyir. Əgər düzgün danışırsansa onda atanın və ananın evində otursaydın sənə hədiyyə gətirərdilər?! Allaha and olsun ki, sizdən kimsə onun haqqı olmayan bir şeyi götürərsə qiyamət günü Allah Təala ilə onu (boynunda) daşıdığı bir halda qarşılar." Sizlərdən biriniz boynunda böyürtüsü olan bir dəvə, və ya böyürən bir inək, və ya mələyən bir qoyun olan halda Allah Təala ilə qarşılaşdıqda mən bunu mütləq biləcəyəm." Sonra O əllərini yuxarı qaldırdı. Hətta qoltuğlarının bəyazlığı göründü. Belə deyirdi: "Allahım çatdırdımmı? Gözüm gördü və qulağım eşitdi." (Müslim / 1832).

## On altıncı fəsil: Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağacın altında (döyüşdən) qaçmamağa beyət haqda.

23-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Biz Hüdeybiyyə günü min dörd yüz nəfər idik. Biz ona beyət edtik. Ömər (Allah ondan razı olsun) ağac altında onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlindən tutmuşdu. Bu Səmura ağacı idi. Biz ona döyüşdən qaçmamağa beyət etdik. Ona ölümə beyət etmədik."

24-Səlim ibn Əbu əl-Cəəd belə rəvayət edir: "Cabir ibn Abdullahdan ağac altında beyət edənlər haqda soruşdum. O belə buyurdu: "Biz yüz min kişi olasaydıq bizə yetərdi. Biz min beş yüz kişi idik." (Müslim / 1856).

25-Abdullah ibn Əbu Əvfa belə demişdir: "Ağac altında beyən edənlər min üç yüz nəfər idi. Əsləm qəbiləsi mühacirlərin səkkizdə biri idi." (Müslim / 1857).

## On yeddinci fəsil: Ölümə beyət etmək haqda.

26-Yezid ibn Ubeyd belə rəvayət edir: “Sələməyə belə söylədim: "Siz Hüdeybiyyə günü Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəyə beyət etdiniz? O: "Olümə." deyə cavab verdi." (Müslim / 1860).

## On səkkizinci fəsil: Baçardıqça eşidib itaət etməyə beyət haqda.

27-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Biz Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşidib itatət etməyə beyət edirdik və O bizə: "Bacardığınız şeylərdə" deyə buyururdu." (Müslim / 1867).

## On doqquzuncu fəsil: Eşidib itaət etməyə beyət etmək yalnız açıq aydın küfrü görmək istisna olmaqla.

28-Cunədə ibn Əbu Umeyyə belə rəvayət edir: "Ubadə ibn Samiti xəstə ikən yanına daxil olduq. Ona belə dedik: "Allah səni salamat etsin, bizə Allah onunla fayda verəcək Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyin bir hədis danış!" O belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizi çağırdı və biz ona beyət etdik. Bizdən aldığı sözlər arasında: "Ona (rifahımız) yaxşı (sevinc) və (kədərli) pis anımızda, çətin və rahatlığımızda, bizə (dünya işlərində) çətinləşdirildikdə eşidib itaət etməyə və əmirlik xüsusunda onun (əmirliyinə) əhlinə (əmirə) qarşı çıxmamağa beyət etdik. Ancaq Allah yanında sizin hüccətiniz olaraq, açıq aydın küfrü görmədikcə" (Müslim /709).

## İyirminci fəsil: Hicrət etmiş mömin qadınları beyət zamanı imtahan etmək haqda.

29-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Mömin qadınlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına hicrət etdikdə Allah Təalanın bu kəlmələri ilə imtahan olunurdular: "Ya Peyğəmbər! Mömin qadınlar Allaha heç bir şərik qoşmayacaqları, oğurluq və zina etməyəcəkləri, övladlarını öldürməyəcəkləri, özgə kişilərdən olan uşaqlarını yalandan ərlərinə isnad etməyəcəkləri və heç bir yaxşı işdə sənin əleyhinə çıxmayacaqları barədə sənə beyət etmək üçün yanına gəldikləri zaman onların beyətini qəbul et və Allahdan onların bağışlanmasını dilə. Həqiqətən, Allah bağışlayandır, Rəhm edəndir!" Kim bunları iqrar edərdisə O imtahanı iqrar etmiş olardı. Onlar bu sözləri iqrar etdikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyururdu: "Gedin sizin beyətinizi qəbul etdim. Allaha and olsun ki, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əli heç bir qadının əlinə toxunmamışdır. O onlardan beyəti sözlə qəbul etmişdir." Aişə (Allah ondan razı olsun) belə demişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlardan Allah Təalanın əmr etdiyindən başqa bir şey almamışdır və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əli heç bir qadının əlinə heç bir zaman toxunmamışdır. Onlardan beyəti sözlə: "Gedin sizin beyətnizi qəbul etdim." Deyərək qəbul edərdi." (Müslim /1866).

## İyirmi birinci fəsil: İmama (Rəhbərə) itaət.

30-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim mənə itaət edərsə artıq Allaha itaət etmiş olar. Və hər kim mənə asi olarsa artıq Allaha asi olmuş olar. Kim mənim əmirimə itaət edərsə artıq mənə itaət etmiş olar. Və hər kim mənim əmirimə asi olarsa artıq Allaha asi olmuş olar." (Müslim / 1835).

## İyirmi ikinci fəsil: Allahın kitabına əməl edənə eşidib itaət etmək haqda.

31-Yəhya ibn Husayn nənəsi Ummu əl-Husayndən belə rəvayət edir: "Onun belə dediyini eşitdim: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Vida həccində həcc etdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir çox söz söylədi sonra isə belə buyurdu: "Sizin üzərinizə sizi Allahın kitabı ilə idarə edən qolları və ayaqları kəsilmiş -zənnimcə- qara bir kölə təyin olunsa belə, onu eşidib itaət edin." (Müslim/1838).

## İyirmi üçüncü fəsil: Allaha asi olan şeylərdə itaət yoxdur. İtaət yalnız yaxşı işlərdədir.

32-Əli (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir ordu göndərərək onların üzərinə əmir təyin etdi. O od qalayaraq onlara: "Girin ona!" deyə əmr etdi. Bir dəstə insan girmək istədi. Başqa bir dəstə isə: "Biz ondan qaçmışıq." Dedilər və bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oda girmək istəyənlərə belə buyurdu: "Əgər girsəydiniz qiyamətə kimi onun içində olardınız." O birilərinə isə yaxşı söz söylədi. Sonra isə belə buyurdu: "Allaha asi olan şeylərdə itaət yoxdur. İtaət yalnız yaxşı işlərdədir." (Müslim /1840)

## İyirmi dördüncü fəsil: Günah etmək əmr olunarsa eşidib itaət edilməz.

33- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Müsəlman kişiyə sevdiyi və sevmədiyi xüsusda eşidib itaət etmək vacibdir. Yalnız günah etmək əmri istisnadır. Əgər günah etməsi əmr olunarsa eşidib itaət edilməz." (Müslim / 1839).

## İyirmi beşinci fəsil: Haqqları verməsələr belə əmirlərə itaət etmək.

34- Vail əl-Hadrami belə rəvayət etdir: "Sələmə ibn Yezid əl-Cufi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşdu: "Ey Allahın Elçisi bizim üzərimizə haqqlarını istəyən və bizim haqqlarımızı verməyən əmirlər təyin olunsa nə etməmizi deyirsən?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan üz çevirdi. Sonra O yenidən soruşdu? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə ondan üz çevirdi. Sonra o ikinci və ya üçüncü kəs yenidən soruşduqda əl-Əşəs ibn Qeys onu çəkərək o belə dedi: "Eşidin və itaət edin. Şübhəsiz onlara yükləndikləri və sizədə yükləndiyiniz vardır." Başqa bir rəvayətdə isə belə deyilir: "Əşəs ibn Qeys onu çəkdi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Eşidin və itaət edin. Şübhəsiz onlara yükləndikləri və sizədə yükləndiyiniz vardır." (Müslim /1846).

## İyirmi altıncı fəsil: Əmirlərin ən xeyirli və ən şərli olanı haqda.

35- Ovf ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizin ən xeyirli əmirləriniz bir-birinizi sevdiyiniz və bir-biriniz üçün dua etdiklərinizdir. Və sizin ən şərli əmirləriniz bir-birinizə nifrət etdikləriniz və bir-birinizi lənət etdiklərinizdir." Ondan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allaın Elçisi onlara qarşı qılıncla mücadələ edəkmi?” Deyə soruşulduqda belə buyurdu: "Aranızda namaz qıldıqca xeyr! Əgər əmirinizdə bəyənmədiyiniz bir şeyi görsəniz onu əməlinə nifrət edin və əlinizi ona itaətdən çəkməyiniz." (Müslim / 1855).

## İyirmi yeddinci fəsil: Əmirlərə inkar etmək və onlar namaz qıldıqca onlara qarşı vuruşmağı tərk etmək.

36- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Ummu Sələmə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Üzərinizə bir dəstə əmirlər təyin olunacaqdır ki, siz bilib etiraz (bəzi əmələrini yaxşı, bəzisini isə pis sayacaqsınız) edəcəksiniz. Kim ikrah etsə (bəyənməsə) bəraət qazanar və kim inkar etsə qurtular. Lakin razı olub tabe olarsa!" Səhabələr: "Ey Allahın Elçisi onlarla vuruşaqmı?” deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Namaz qıldıqca xeyr!" (Yəni qəlbi ilə ikrah edər və qəlbi ilə inkar edərsə).

## İyirmi səkkizinci fəsil: Çətinləşdirildikdə səbr etməyə əmr olunması haqda.

37- Useyd ibn Xudeyr (Allah ondan razı olsun) belə rəvayət edir: "Ənsarlardan bir kişi Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təkliyə

çəkilərək ona belə dedi: "Ey Allahın Elçisi filankəsi işlətdiyin kimi mənidə məmur işinə al." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Siz məndən sonra çətinliklərə dükar olacaqsınız. Mənimlə Hovuzun yanında qarşılaşana qədər səbr edin." (Müslim / 1845).

## İyirmi oqquzuncu fəsil: Fitnə zamanı camaatda olmağın əmr olunması haqda.

38-Hüzeyfə ibn əl-Yəmən (Allah ondan razı olsun) belə rəvayət edir: "İnsanlar Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xeyir haqda soruşardılar. Mən isə ondan ona düşməkdən qorxduğum üçün şər haqda soruşardım. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Ey Allahın Elçisi biz cahilliyə və şər bir qurluşda idik. Allah Təala bizə bu xeyri gətirdi. Bu xeyirdən sonra şər olacaqmı. O: "Bəli" deyə cavab verdikdə, mən: "Bu şərdən sonra xeyir olacaqmı?" deyə soruşdum. O: "Bəli lakin onda qarışıqlıq olacaq." Ondan: “Onun qarışığlığı nədir?" deyə soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mənim sünnətimdən baş bir sünnəti, yolumdan başqa bir yolu tutan bir qövm olacaq. Onların bəzilərini tanıyıb bəzilərini isə inkar (bəzi əmələrini yaxşı, bəzisini isə pis sayacaqsınız) edəcəksiniz." Mən: "Bu xeyirdən sonra şər olacaqmı?" deyə soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəli! Cəhənnəmin qapılarında duran dəvətçilər olacaqdır. Kim onların isdədikləri şeyə cavab versə onu oraya salacaqlar." Mən ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi onları bizə vəsf et!" deyə söylədim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəli onlar bizim cinsimizdən olan, bizim dilimizlə danışan bir qövmdür." Mən: "Ey Allahın Elçisi bu mənim başıma gələrsə mənə nə etməmi buyurursan?” deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Müsləlmanların camaatı və imamından ayrı düşmə, onlarla ol!” Mən: "Onların İmamı və camatı olmasa necə?” Deyə soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu firqələrin hamsından üzaqlaş! Və ölüm sənə sən bir ağacın kötüyünü dişləmiş halda ikən yetişsə belə, o halda ol." (Müslim /1847).

## Otuzuncu fəsil: İtaətdən çıxan və camaatı parçalayan haqda.

39-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “İtaətdən çıxan və camaatı parçalayaraq ölərsə cahiliyyə ölüsü kimi ölər. Və hər kim kor-korana qaldırılmış bir bayraq altında döyüşərsə, qövümçülüyyə görə qəzəblənərsə və ya qövmçülüyə çağırarsa və ya qövümçülüyə yardım edərək öldürülərsə cahiliyyə ölüsü kimidir. Ümmətimə qarşı çıxan və yaxşısını pisini vuran, mömınindən çəkinməyən, əhd sahibinin əhdini yerinə yetirməyən məndən deyil və məndə ondan deyiləm." (Müslim /1848).

40-Nafi belə rəvayət edir: "Yezid ibn Müaviyyənin zamanında Abdullah ibn Ömər əl-Hadda hadisəsi olub keçmiş bir vaxtda Abdullah ibn Mutinin yanına gəldi. O (Abdullah ibn Mutini) belə dedi: "Əbu Əbd ər-Rahman üçün döşək qoyun!” O belə buyurdu: "Mən sənin yanına oturmaq üçün gəlməmişəm. gəlmişəm ki, Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyim hədisi sənə danışam. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitmişəm: "Hər kim əlini itaətdən çəkərsə (itaətdən çıxarsa) Qiyamət günü Allah Təala ilə qarşılaşdıqda onun heç bir

hüccəti olmaz. Və hər kim öldüyü zaman boynunda beyət olmazsa onun ölüsü cahiliyyə ölüsü kimidir." (Müslim /1851).

### Otuz birinci fəsil: Ümmət bir ikən onu parçalayan haqda.

41-Arfacə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Şübhəsiz ki, bir cür şeylər olacaqdır. Və hər kim ümmət bir ikən onu parçalamaq istərsə kim olursa olsun qılıncla onun (boynunu) vurun." (Müslim /1852).

### Otuz ikinci fəsil: Üzərimizə silah çəkən bizdən deyildir.

42-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Üzərimizə silah çəkən bizdən deyildir. Və bizi aldadan bizdən deyildir." (Müslim /101).

### Otuz üçüncü fəsil: Allahın ipidən yapışmaq və parçalnmanı tərk etməyin əmri haqda.

43-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təala sizin üçün üç seyə razı olur və üç şeyi bəyənməz. Ona ibadət etmənizə və Ona heç bir şeyi şərik qoşmamağınız, Hamılıqla Allahın ipindən tutunmanıza razı olur və qila və qal (dedi-qodu), çox sual verməyinizi və malı tələf etməyinizi bəyənməz." (Müslim /1715).

### Otuz dördüncü fəsil: Yenilik və bidət olan şeylərin rəddi.

44-Saad İbn İbrahim belə rəvayət edir: Qasim İbn Muhamməddən üç məskəni olan və hər birinin üçdə birini vəsiyət edən kişi haqda soruşdum?" Belə buyurdu: "Bunlar hamsı bir məskəndə cəm olunur.” Sonra isə belə buyurdu: "Aişə (Allah ondan razı olsun) mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu xəbər verdi: "Hər kim bizim dinimizdə olmayan bir əməl edərsə o rədd olunur." (Müslim / 1718).

### Otuz beşinci fəsil: Yaxşılığı əmr edib özü əməl etməyən haqda.

45-Usama İbn Zeyddən (Allah ondan razı olsun) belə rəvayət edilir: "Ona: "Sən Osmanın yanına daxil olub danışa bilərsənmi?” Deyildiyində, O belə buyurdu: "Siz zənn edirsiniz ki, mən onun yalnız sizə eşitdirərək danışmalıyam. Allaha and olsun ki, mən onunla aramızda (danışdığımızı) açmadan (yaymadan, ifşa etmədən) danışmışam. Və bunu ilk açanın mən olmasını istəməzdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini: "Qiyamət günü bir kişi gətirilərək cəhənnəmə atılacaq. Qarnındakı bağırsaqları çölə töküləcək. onları eşşəyin dəyirman daşını fırlatdığı kimi sürüyəcəkdir. Cəhənnəm əhli onun başına toplanaraq: "Ey filankəs məgər sən bizə yaxşı işləri əmr edib pis işlərdən çəkindirmirdin?” Deyə soruşacaqlar. O belə cavab verəcək: "Bəli Sizə yaxşı işləri əmr edir özüm isə əməl etmirdim. Pis işlərdən çəkindirir özüm isə əməl edirdim." Eşitdikdən sonra üzərimdə əmir olan kimsəyi o insanların ən xeyirlisidir demərəm." (Müslim / 2989).

# Əti yeyilən heyvanların ovlanması və kəsilməsi haqda.

## Birinci fəsil: Oxla heyvan ovlamaq və oxu atarkən "Bismilləh" demək.

1- Adiy ibn Hatim (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "İtini göndərdiyin zaman Allahın adını zikr et (çək). Əgər o sənin üçün nəsə tutarsa və sən onun tutduğuna sağ ikən yetişsən onu kəs! Yox əgər ona çatdıqda artıq ölmüş olsa və əgər it ondan yeməyibsə onu ye! Əgər o ölü olsa və sən itinin yanında başqa it görsən yemə! Çünki sən onu hansının öldürdüyünü bilmirsən. Oxunu atdıqda Allahın adını zikr et (çək). Əgər sən ovunu bir gün tapmasan sonra tapdığında onun üzərində yalnız oxunun izini görsən istərsənsə ye! Əgər onu suda boğulmuş halda tapsan yemə!" (Müslim /1929).

## İkinci fəsil: Oxla və təlim edilmiş və edilməmiş itlə ov etmək haqda.

2- Əbu Səələbə əl-Xuşanı (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedim: "Ey Allahın Elçisi biz kitab əhlindən olan bir qövmün torpaqlarında yaşayırıq. Onların qablarında yemək yeyəkmi? Bu torpaqlar ov üçündür. Mən ox və təlim edilmiş və ya edilməmiş itimlə ov edirəm. Bizə bunların hansının halal olduğu haqda xəbər ver!" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sənin kitab əhi olan bir qövmün torpağında olduğunu dediyinə cavab budur ki, onların qablarından başqasını tapsanız, onların qablarında yeməyin. Yox əgər tapmasanız onu yuyun sonra onda yeyin! Amma sənin ov torparlarında olduğunu dediyin sualına cavab budur ki, oxunla vurduğuna Allahın adını zikr et sonra ye! Təlim keçmiş itinin tutduğunun üzərinə Allahın adını zikr et sonra ye. Təlim keçməmiş itinin tutduğunu isə, sağ ikən yetişsən onu kəs sonra ye!" (Müslim / 1930).

## Üçüncü fəsil: əl-Miradla (ucunda dəmir ağır əsa, ucunda dəmirolmayada bilər) ov etmək və iti göndərdikdə Allahın adını zikr etmək.

3- Adiy ibn Hatim (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Miradla ov haqda soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "İti tərəfi ilə dəysə ye! Küt (arxa) tərəfi ilə dəysə və öldürsə onu yemə! Çünki o əzilərək ölmüşdür." Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) itlə ov haqda soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "İtini göndərdikdə Allahın adını zikr etsən ye! Əgər itin ondan yesə onda yemə! Çünki o şikarı öz nəfsi üçün tutmuşdur." Mən: "Əgər itimin yanında başqa bir it görsəm və hansının tutduğunu bilməsəm necə?" deyə soruşdum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onda yemə! Çünki sən öz itini göndərdikdə Allahın adını zikr etmisən başqasına yox." (Müslim/1929)

## Dördüncü fəsil: Ov zamanı şikar itirilər və sonra tapılarsa.

4- Əbu Səələbə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ovunu üç gün sonra tapan haqda belə buyurdu: "O iylənməyibsə ye!" (Müslim/1931).

## Beşinci fəsil: Ov və  çoban iti saxlamağın mübah olması haqda.

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ov və çoban iti müstəsna olmaqla hər kim it saxlarsa hər gününü əcrindən iki Qirat əskilər." (Müslim /1574).

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Ov, çoban və əkin iti müstəsna olmaqla hər kim it saxlarsa hər gününü əcrindən iki Qirat əskilər." əz-Zuhri belə demişdir: "İbn Ömərə Əbu Hüreyrənin bu dedikləri zikr edildikdə belə buyurdu: "Allah Təala Əbu Hüreyrəyə rəhm etsin o əkin sahibi idi." (Müslim / 1575).

## Altıncı fəsil: İtlərin öldürülməsi haqda.

7- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə itləri öldürməyi əmr etdi. Hətta çöldən bir qadın iti ilə gəlsəydi biz iti öldürərdik. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə onları öldürməyi qadağan etdi və belə buyurdu: "Xalis qara iki nöqtəli olanı öldürün! Çünki o şeytandır." (Müslim / 1572).

## Yeddinci fəsil: Sapanla daş atmağın qadağan olması.

8- Səid ibn Cubeyr belə rəvayət edir: "Abdullah ibn Muğaffəlin qohumlarından biri sapanla daş atdı. Ona bunu qadağan edərək belə buyurdu: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): sapanla daş atmağı qadağan edərək belə buyurdu: "Onunla ov ovlanmır və düşmənidə dağıdmır. Yalnız diş sındırıb göz çıxarır." O yenidən bu əmələ qaydıtdıqda  Abdullah ona belə dedi: "Mən sənə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu qadağan etdi deyirəm sənsə yenə sapanla daş atırsan. Sənlə bir daha danışmayacağam." (Müslim / 1954).

## Səkkizinci fəsil: Heyvanı həbs edərək (hədəf edərək) ov etməyin qadağan olması.

9- Hişam ibn Zeyd ibn Ənəs ibn Məlik belə rəvayət edir: "Babam Ənəs ibn Məlik (Allah ondan razı olsun) ilə birgə əl-Həkəm ibn Əyyubun evinə daxil oldum. Birdən bir dəstə insan toyuğu bağlayaraq onu (hədəf edərək. daş və ya ox) atırdılar. Ənəs belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heyvanı həbs edərək əzabla öldürülməsini qadağan etdi." (Müslim/1956).

10- Səid ibn Cubeyr belə rəvayət edir: "İbn Ömər Qureyşdən olan iki cavanın yanından keçdiyində, onlar bir quşu hədəf edərək ona ox atırdılar. Hər dəyməyən oxa görə quşun sahibinə nəsə verirdilər. İbn Öməri gördüklərində dağıldılar. İbn Ömər belə buyurdu: "Bunu kim edib? Bunu edənə Allah lənət etsin. Həqiqətən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içərisində ruh olan bir şeyi hədəf üçün istifadə edəni lənətləmişdir." (Müslim/1958).

## Doqquzuncu fəsil: Kəsməyi gözəl bir şəkildə etmək və bıçağı itiləmək haqda.

11-Şəddad ibn Ovs (Allah ondan razı olsun) belə rəvayət edir: "İki şey var ki, onları Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əzbərlədim: "Çübhəsiz ki Allah hər bir şeydə yaxşılığı fərz etmişdir. Elə isə oldürdüyünüz zaman gözəl bir şəkildə öldürün! Kəsdiyiniz zaman gözəl bir şəkildə kəsin! Sizlərdən biriniz (kəsdiyi ) bıçağını itiləsin və kəsdiyi heyvanını rahat etsin." (Müslim \ 1955).

### Onuncu fəsil: Qan axıdan alətlə kəsmək və diş dırnaq kəsməyin qadağan olması haqda.

12-Rafi ibn Xədic (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Ey Allahın Elçisi biz sabah düşmənlə qarşılaşırıq və bizimlə bıçaq yoxdur." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buuyrdu: "Tezləşdir (kəsməyi), və ya qanı axıdan bir şeylə öldür. Üzərinə Allahın adını zikr et və ye. (yırtıcı) Diş və dırnaq müstəsnadır. Sənə anladım. Amma diş sümükdür. Dırnaqa gəlincə isə o həbəşilərin bıçağıdır." Biz dəvə və qoyun sürüsü ələ keçirdik. Bir dəvə sürüdən ayrılıb qaçmağa başladı. Bir kişi ox ataraq onu vurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu dəvələrinin vəhşi heyvan kimi bir qaçışı vardır. Bunlardan hansısa sizə qalib gəlsə (qaçsa) onunla belə edin!" (Müslim/1968).

## Qurbanlar kitabı

### Birinci fəsil: Zil Hiccə ayının əvvəl on günü  daxil olarsa və sizlərdən kimsə qurban kəsmək istərsə (on gün) saçından və dırnağından bir şey almasın.

1- Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Kimim kəsəcək bir heyvanı varsa və Zil Hiccə ayının hilalı yeniləndiyi vaxtdan qurbanını kəsincəyə qədər saçından və dırnağından bir şey almasın." (Müslim/1977).

### İkinci fəsil: Qurbanın kəsildiyi vaxt.

2- Cundub ibn Sufyan (Allah ondan razı olsun) belə rəvayət edir: "Qurbanlıqda Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə idim. Namazı qılıb salam vermişdi ki, namazı bitirməmiş kəsilmiş qurban ətlərini gördü və belə buyurdu: "Hər kim namazını qılmadan və ya biz qılmadan qurbanını kəsmişsə onun əvəzinə başqasını  kəssin! Və hər kim kəsməyibsə Allahın adıyla kəssin."

### Üçüncü fəsil: Kim namazdan öncə qurbanını kəsərsə (qurbanlıq) sayılmaz.

3- əl-Bara ibn Azib (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Bu gün bizim ilk öncə edəcəyimiz iş namaz qılmaqdır. Sonra qayıdaraq qurban kəsəcəyik. Kim belə  edərsə sünnətə müvafiq olmuşdur. Hər kim (namazdan qabaq) kəsmişsə bu ailəsi üçün kəsdiyi ət sayılır və qurbanlığdan onun heç bir payı yoxdur." Əbu Burda ibn Neyyar (Allah ondan razı olsun) artıq kəsmişdi belə dedi: "Məndə bir yaşlı heyvandan daha xeyirli bir oğlaq var." Peyğəmbər (ona, ailəsinə

və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onu kəs yalnız səndən sonra bu heç kəs üçün caiz deyildir." (Müslim/1961).

Dördüncü fəsil: Hansı yaşda olan heyvanın qurban kəsilməsinin caiz olması haqda.

4- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir yaşlı heyvandan başqasını kəsməyin! Yalnız gücünüz yetməsə qoyundan bir quzu kəsin!" (Müslim /1963).

Beşinci fəsil: Oğlaq (quzu) qurban etmək.

5- Uqba ibn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qurbanları aramızda böldü. Mənə oğlaq düşdü. Mən: "Ey Allahın Elçisi mənə oğlaq düşdü?" Deyə soruşduqda: "Onu qurban kəs!" deyə buyurdu." (Müslim /1965).

Altıncı fəsil: İki ağ buynuzlu qoç qurban etmək, əl ilə Allahın adını zıikr və təkbir (Allahu Əkbər) edərək kəsmənin müstəhəb olması haqda.

6- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki ağ buynuzlu qoç qurban etdi. Onları əlləri ilə kəsdiyini gördüm. Və ayağını onun hər birinin boynunun üzərinə qoyduğunu gördüm. Allahın adını zikr etdi və təkbir gətirdi." (Müslim/1966).

Yeddinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qurbanı özü, ailəsi və ümməti adından kəsməsi haqda.

7- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qara yerə ayağını basan, qara yerdə yatan və qaraya baxan bir buynuzlu qoç gətirilməsini əmr etdi. Onu qurban etməsi üçün gətirdilər. Belə buyurdu: "Ey Aişə bıçağı gətir!" Sonra isə belə dedi: "Onu daşla itilə!" Məndə onun dediyini etdim. Sonra onu götürdü və qoyunu tutub yerə sərdi. Sonra isə onu kəsdi və belə buyurdu: "Allahın adıyla (Bismilləh). Allahım Muhamməddən, Muhammədin ailəsindən və Muhammədin ümməti adından qəbul et!" sonra onu qurban etdi." (Müslim / 1967).

Səkkizinci fəsil: Qurbanlıq ətinin üç gündən artıq yeməyin qadağan olması haqda.

8- İbn Əzharın azad etdiyi mövlası Əbu Ubeyd belə rəvayət edir: "Ömər ibn Xattabla bayramı birgə keçirdim. Sonra Əli ibn Əbu Taliblə bayram namazını birgə qıldım. Namazı bizə Xütbədən qabaq qıldırdı. Sonra insanlara xütbə verərək belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sizə qurban ətlərini üç gündən artıq qalarsa yeməyinizi qadağan etdi. Ona görə yeməyin!" (Müslim /1969).

Doqquzuncu fəsil: Qurbanlığ ətinin üç gündən artıq yeməyin, saxlamağın, azuqə etməyin və sədəqənin izinli olması haqda.

9- Abdullah ibn Əbu Bəkr, Abdullah ibn Vaqiddən belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qurban ətlərini üç

gündən artıq yeməyi qadağan etdi." Abdullah ibn Əbu Bəkr belə demişdir: "Bunu Amrayə söylədiyimdə belə buyurdu: "Düz demişdir.Aişənin (Allah ondan razı olsun) belə dediyini eşitmişəm: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında çöl ərəblərindən ev sahibləri olanlar Qurbanlıq günündə yavaş yavaş yürüyüb gəldilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "(Qurban ətini) üç gün saxlayın (yeyin) nə qalsa qalanını sədəqə verin. Bundan sonra ki, ildə insanlar belə dedilər: "Ey Allahın Elçisi insanlar su tuluqlarını qurbanlardan düzəldirlər və onların yağını əridirlər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O nə üçün?" deyə soruşduqda, onlar belə dedilər: "Sən bizə qurban ətini üç gündən artıq yeməyi qadağan etmişsən." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən bunu sizə yavaş yavaş yürüyüb gedən zəif bəndələrdən dolayı qadağan etmişdim. Ondan yeyin, saxlayın və sədəqə verin." (Müslim / 1971).

### Onuncu fəsil: əl-Fara (ərəblərin ilk doğulmuş balanı kəsmələridir) və əl-Atira (ərəblərin Rəcəb ayında kəsdikləridir).

10- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "nə əl-Fara nədə əl-Atira yoxdur." İbn Rafi başqa bir rəvayətində belə əlavə etmişdir: "əl-Fara ərəblərdə ilk doğmuş baladır və o balanı kəsərdilər." (Müslim /1976).

### On birinci fəsil: Allahdan qeyrisinə qurban kəsən haqda.

11- Əbu Tufeyl ibn Vail belə rəvayət edir: "Əli ibn Əbu Talibin (Allah ondan razı olsun) yanında idim. Bir kişi onun yanına gələrək belə soruşdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənə nə sir vermişdir?" O qəzəblənərək belə buyurdu: "O mənə insanlardan gizlətdiyi heç bir şeyi sir olaraq vermədi. Yalnız mənə dörd şey söylədi. Kişi: "Ey möminlərin əmiri onlar nədir?" deyə soruşduqda, O belə buyurdu: "Allah Təala valideyni lənət edənə lənət etmişdir. Allah Təala ondan qeyrisinə qurban kəsənə lənət etmişdir. Allah Təala bidətçiyə (yenilik gətirənə) sığınacaq verənə lənət etmişdir. Allah Təala yer üzünün əlamətlərini dəyişdirənə lənət etmişdir." (Müslim / 1978).

# İçkilər kitabı

### Birinci fəsil: Arağın (Spirtli içkidir, şərab) haram olması.

1- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər bir sərxoş edən araqdır (spirtli içkidir, şərabdir) və hər bir araq haramdır."

2- Əli ibn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: "Bədr günü qənimətdən payıma yaşlı bir dəvə düşmüşdü. Peyğəmbərdə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə o gün xumus (beşdə birdən) bir yaşlı dəvə vermişdi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızı Fatimeylə evlənmək istədikdə Qeynuqa qəbiləsindən olan zərgər bir kişi ilə mənimlə İzxır (Ətirli ot) yığmağa getməsinə vədləşdim. Onu zərgərlərə satıb toy ziyafətim üçün sərf edəcəkdim. Mən dəvələrim üçün çuval, yəhər, ip toplayarkən dəvələrin ənsarlardan olan bir kişinin evinin yanında yerə

çökmüşdülər. Toplaya bildiyimi cəm etdikdən sonra qayıtdım. Dəvələrimin hörcükləri kəsilmiş, böyürlədi yırtılaraq ciyərlərindən bir şey qopardılmışdı. Bu mənzərəni gördükdə gözlərimə hakim ola bilmədim və: "Bunu kim etdi?" deyə soruşdum. Onlar belə savab verdilər: "Bunu Həmzə ibn Əbd əl-Muttalib etdi. O bu evdədiir. Ənsarlardan olan içki içənlərin arasındadır.” Ona və yoldaşlarına bir cariyə mahnı oxudu və mahnı əsnasında: "Ey Həmzə bu yaşlı kök dəvələrə diqqət et!” dedi və Həmzə qalxaraq qılıncı ilə dəvələrin hörcükləri kəsdi, böyürlərini yırtdı və ciyərlərindən bir şey qopartdı.  Əli (Allah ondan razı olsun) belə buyurdu: "Dərhal gedib Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına daxil oldum. Yanında Zeyd ibn Hərisə var idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzümdən başıma nəsə gəldiyini anladı və: "Sənə nə olub?" deyə soruşdu? Mən: "Ey Allahın Elçisi bu günki kimi heç görməmişdim. Həmzə mənim dəvələrimə təcavüz edərək hörcükləri kəsib və böyürlərini yırtıb. Budur indi o içki içənlərlə birgə bir evdədir. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ridasını istədi. Geyindi və gəzərək getdi. Mən və Zeyd ibn Hərisə onun ardınca getdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həmzə olan qapının yanına gələrək içəri girmək üçün izn istədi. Ona izn verdilər. Onlar içiki içənlər idilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həmzəni etdiyi şeyə görə danlamağa başladı. Həmzə gözləri qızarmış halda Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) baxdı. Sonra nəzərini onun dizlərinə zillədi. Sonra baxışlarını qaldırdı. Sonra nəzərini onun göbəyinə zillədi. Sonra baxışlarını qaldırdı və onun üzünə baxdı. Sonra belə dedi: "Siz mənim atamın kölələrindən başqa bir şey deyilsiniz?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun sərxoş olduğunu anladı və döndü dal-dalı gedərək bayıra çıxdı. Bizdə onunla birgə çıxdıq." (Müslim / 1979).

## İkinci fəsil: Hər bir sərxoş edən haramdır.

3- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Ceyşəndən (Ceyşən yəməndə yer adıdır) gələrək Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların torpaqlarında qarğıdalıdan düzəldilmiş əl-Mizr adlanan və onların içdikləri içki haqda soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O sərxoş edirmi?” Deyə ondan soruşdu. O: "Bəli" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hər bir sərxoş edən haramdır. Allah Təala sərxoş edən içki içən Tinatə əl-Xabəl içirəcəyini özünə əhd etmişdir." Onlar: "Ey Allahın Elçisi Tinatə əl-Xabəl nədir?" deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O Cəhənnəm əhlinin təridir." Və ya: "Onların şirələrindəndir." (Müslim / 2002).

## Üçüncü fəsil:  Hər hansı bir içki sərxoş edirsə, o haramdır.

4- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bal şərbətinin hökmünü soruşdular? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hər hansı bir içki sərxoş edirsə, o haramdır." (Müslim /2001).

### Dördüncü fəsil: Dünyada araq içənin axirətdə ondan içməyəcəyi və yalnız tövbə edənlərin istisna olması haqda.

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər kim dünyada araq içərsə Axirətdə ondan içməyəcəkdir. Yalnız tövbə edənlər müstəsnadır." (Müslim /2003) .

### Beşinci fəsil: Xurma və üzümdən çəkilən araq (işki) haqda.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Araq bu iki ağac: Xurma və Üzüm ağaclarındandır." (Müslim / 1985).

### Altıncı fəsil: Quru və kal xurmadan çəkilən araq.

7- Ənəs İbn Malik (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən Ənsarlardan olan bir camaatın içində Əbu Talha, Əbu Ducənə və Muaz ibn Cəbələ (Allah onlardan razı olsun) içki süzürdüm." Yanımıza bir nəfər daxil oldu və belə dedi: "Təzə xəbər var. arağın haram olması nazil oldu." O gün biz onu boşaltdıq. Bu quru xurma və kal xurmanın qatışığı idi. Qatədə belə demişdir: "Ənəs ibn Məlik belə buyurdu: "Artıq araq haram olmuşdur. Ümümiyyətlə o gün onların araqları hamısı quru və kal xurma qatışığından idi." (Müslim /1980).

### Yeddinci fəsil: Araq beş şeydən çəkilir.

8- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Ömər (Allah ondan razı olsun) bizə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərinin üzərində xütbə verdi. Allaha həmd və səna etdikdən sonra belə buyurdu: "Və sonra Araqın haramlığı nazil olduğunda, o beş şeydən çəklirdi: buğda, arpa, quru xurma, kişmiş və baldan. Ağlı aparan hər bir şey araqdır. Ey insanlar üç şey vardır ki, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlar haqda bizə bir bilgi verməsini dilədim: "Baba, Kələlə (Atası və övladı olmayan şəxs), və Riba (sələm) fəsilərindən bir fəsil haqda." (Müslim / 3032).

### Səkkizinci fəsil: Kişmiş və quru xurmanın birgə qıcqırdılaraq şirə çəkilməsinin qadağan olması.

9- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kişmiş və quru xurmanın birgə qıcqırdılaraq şirə çəkilməsini və yaş xurma ilə kal xurmanın birgə qıcqırdılaraq şirə çəkilməsini qadağan etdi." (Müslim /1986).

10- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən hər kim qıcqırdılmış şirə içmək istərsə, onu tək başına (qarışdırmadan) kişmiş olaraq və ya quru xurma və ya kal xurma olaraq içsin." (Müslim / 1987).

### Doqquzuncu fəsil: Dubbə (quru balqabağdan olan qab) və müzəffət (qırla sıvanmış qab) qabda qıcqırdılaraq şirə çəkilməsinin qadağan olması.

11-Zazən (Allah ondan razı olsun) belə rəvayət edir: "İbn Ömərə (Allah onların hər ikisindən razı olsun) belə dedim: "Mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənin dilində içkilərdən hansını qadağan etdiyini danış. Sonra isə onu mənə mənim dilimdə açıqla. Çünki sizin bizim dilimizdən başqa diliniz vardır." O belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həntəm: o yaşıl saxsı qabdır, dubbə: o quru balqabağdan olan qabdır, müzəffət: o qırla sıvanmış qabdır və nəqiri: o qabığı soyulan və içi ovularaq çıxarılan xurma ağacının kötüyündən olan qabdır (bu qablarada nəsə qıcqırdaraq şirə çəkməyi) qadağan etdi. Və (su) tuluqlarda qıcqırdaraq şirə çəkməyi əmr etdi." (1997).

## Onuncu fəsil: Daşdan olan qədəhdə qıcqırdaraq şirə çəkməyin mübah olması.

12-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün tuluqda qıcqırdaraq şirə çəkərdilər. Tuluq tapmadıqa isə daşdan olan qədəhdə qıcqırdaraq şirə çəkdilər." Mən eşitdiyim halda camaatda bəziləri Əbu Zubeyrə: "Daşdanmı?" deyə soruşduqda, O: "Bəli daşdan." Deyə cavab verdi." (Müslim /1999).

## On birinci fəsil: Qabların hamisinda qıcqırdaraq şirə çəkməyə izn verilməsi və sərxoş edən hər bir şeyi içməyin qadağan olması haqda.

13-Bureydə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mən sizə qablarda (qıcqırdaraq şirə çəkməyi) qadağan etmişdim. Şübhəsiz ki qablar heç bir şeyi haram və ya halal etmir. Və hər bir  sərxoş edən (şey) haramdır."

## On ikinci fəsil: Müzəffətdən (O qirla sıvanmış qab) başqa qalan küplərdə izn verilməsi.

14-Abdullah İbn Ömər  (Allah onların hər ikisndən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qablarda qıcqırdaraq şirə çəkməyi qadağan etdikdə, Onlar: "İnsanlardan çoxu (qab) tapmır." dedilər və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara Müzəffətdən (O qırla sıvanmış qab) başqa qalan küplərdə izn verdi." (Müslim / 2000).

## On üçüncü fəsil:  Qıcqırdma müddəti haqda.

15-İbn Abbas  (Allah onların hər ikisndən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün gecənin əvvəlində nəbiz (xurmanı qıcqırdaraq ondan içmək üçün şirə cəkmək) düzəldilirdi. Ondan o gecənin səhəri, gecəsi, o biri günün səhəri, gecəsi və ondan sorakı günün səhəri əsr namazına kimi içərdi. Əgər ondan bir şey qalsaydı onu xidmətçiyə içirir və ya tökməsini əmr edərdi." (Müslim / 2004).

16-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Biz Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün bir tuluqda nəbiz düzəldərdik. Tuluğun yuxarısı bağlanardı. Aşağı hissəsində isə deşik vardı.  Biz sabah nəbiz düzəldər, O onu axşam içər. Axşam nəbiz düzəldər, O onu səhər içərdi." (Müslim / 2005).

## On dördüncü fəsil: Arağı sirkəyə çevirmək.

17-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arağı sirkəyə çevrimək haqda soruşdular? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Xeyr!" deyə cavab verdi." (Müslim /1983).

## On beşinci fəsil: Araqla müalicə etmək.

18-Vail əl-Xadrami belə rəvayət edir: "Tariq İbn Suveyd əl-Cufi (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) araq haqda soruşdu? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona qadağan etdi və ya onu düzəltməyi bəyənmədi. O: "Mən onu müalicə üçün düzəldirəm." dedikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O dərman deyildir. Lakin O xəstəlikdir. (Dərddir)" (Müslim /1984).

## On altıncı fəsil: Qabların ağzını örtmək.

19-Əbu Humeyd əs-Saidi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Nəqidər (yer adı) ağzı bağlı olmayan bir qədəhdə süd gətirdim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Heç olmasa onun ağzına bir çubuqda olsa qoyub bağlasaydın." Əbu Humeyd belə demişdir: "Bizə qabların ağzını yalnız gecələr bağlamaq əmr olunmuşdur. Və həmçinin bizə qapıları yalnız gecələr bağlamaq əmr olunmuşdur." (Müslim / 2010).

## On yeddinci fəsil: Qabların ağzını örtün və tuluqların ağzını bağlayın.

20-Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Gecə qaranlıq düşdüyü vaxt və ya gecələdiyiniz vaxt uşaqlarınıza (bayıra çıxmağı) qadağan edin və tutub saxlayın! Çünki Şeytanlar bu vaxtda dolaşırlar. Gecədən bir qismi getdikdə onları buraxın. Qapıları bağlayıb üzərinə Allahın adını zikr edin! Çünki Şeytan bağlı qapını açmaz. Tuluqlarınızın ağzını bağlayıb üzərinə Allahın adını zikr edin! Qablarınızın üzərini nə isə bir şey olsa belə qoyub Allahın adını zikr edərək örtün! Və çıraqlarınızı söndürün!" (Müslim / 2012).

21-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Qabları örtün, tuluqları bağlayın! Həqiqətən ildə bir gün var ki, O gün vəba xəstəliyi gəzər. Və elə ağzı örtülməmiş qab və ya ağzı bağlanmamış tuluq yoxdurki onun içinə ondan nəsə nazil olmasın." Başqa bir rəvayətdə isə belə deyilir: "əl-Leys (yəni İbn Saad) belə demişdir: "Bizdə əcəmilər bundan Kanun ayında (Dekabır) qorxardılr." (Müslim /2014).

## On səkkizinci fəsil: İçkilər: Bal, qıcqırdılmış xurma şirəsi, süd və su haqda.

22-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün bu qədəhimdən bu içkilərin hamsından süzmüşəm: Bal, qıcqırdılmış xurma şirəsi, su və süd." (Müslim /2008).

23-əl-Bara (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkədən Mədinəyə doğru çıxdıqda Suraqa ibn Məlik ibn Cuuşum onun ardınca düşdü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun əleyhinə dua etdi və atın ayaqları yerə batdı. Suaraqa ona: "Allaha mənim üçün dua et sənə zərərim toxunmaz!" dedi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün dua etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) susadı. Abu Bəkr (Allah ondan razı olsun) belə buyurdu: "Bir qoyun otaran çobanın yanından keçdikdə bir qədəh götürdüm. Onda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün bir az süd sağdım və ona gətirdim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan içdi və mən razı qaldım." (Müslim / 2009).

24-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) meraca qaldırıldığı bir gecədə İyla adlanan yerdə birində araq, digərində süd olan iki qab gətirildi. O onlara baxdı və südü seçdi. Cəbrail (Ona Allahın salamı olsun) belə buyurdu: "Səni fitrətə hidayət edənə həmd olsun. Əgər arağı götürsəydyin ümmətinin azdırmış olardın." (Müslim / 168-2009-dan sonra).

## On doqquzuncu fəsil: Qədəhdə içmək.

25-Səhl ibn Saad (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ərəblərdən olan bir qadını xatırlatdılar. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Useydi onun dalınca göndərilməsini əmr etdi. O göndərildi. Qadın Bəni Səadanın qalasında qonaq olaraq gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çıxaraq onun yanına gəldi. İçəri daxil olduqda qadın boynunu bükərək oturmuşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onunla danışdıqda, qadın ona: "Səndən Allaha sığınıram." dedi. Və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Mən səni özümdən sığındırdım" Ona: "Bunu kim olduğunu bilirsənmi?" dediklərində, Qadın: "Xeyr!" deyə cavab verdi. Onlar Bu Peyğəmbərdir (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və O səni istəməyə gəlmişdir." Qadın belə demişdir: "Mən bu işə yaramadım." Səhl belə buyurmuşdur: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o gün gələrək əshabı ilə Bəni Səadanın damının altında oturdu. Sonra Səhlə: "Bizə su süz!" deyə buyurdu. Mən onlar üçün bu qədəhi çıxararaq su süzdüm." Əbu Həzim belə demişdir: "Səhl bizim üçün bu qədəhi çıxartdı və biz ondan içdik. Sonra onu Ömər ibn Əbd əl-Əziz hədiyə olaraq istədi. Və onu ona hədiyə etdi." (Müslim / 2007).

## İyirminci fəsil: Tuluqları başı aşağı çevirərək ondan içmək haqda.

26-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tuluqları çevirərək (tuluğun) ağzından içməyi qadağan etdi." Başqa bir rəvayətdə isə belə deyilir: "Yəni - tuluqları başı aşaqı çevirərək ondan içmək." (Müslim /2023).

## İyirmi birinci fəsil: Qızıl və gümüş qablarda içməyin qadağan olması.

27-Abdullah İbn Ukeym belə rəvayət edir: "Hüzeyfə ilə birgə əl-Mədəin adlanan yerdə idik. Hüzeyfə su istədi. Dihqan gümüşdən olan bir qabda ona içəcək gətirdikdə onu

ona atdı və belə buyurdu: "Mən sizə bildirirəm ki, mən ona mənə bu qabda su verməməsini əmr etmişdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Qızıl və gümüş qablarda içməyin! İpək və əd-Dibac (ipək növü) geyməyin! Həqiqətən bu onlar üçün dünyada sizin üçün isə axirətdə Qiyamət günündədir." (Müslim /2067).

28-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Gümüş və qızıl qablarda içən ancaq və ancaq qarnına Cəhənnəmin odunu şırıldadır." Başqa bir rəvayətdə isə belə deyilir: "Gümüş və qizil qablarda yeyən və ya içən...." (Müslıim /2065).

## İyirmi ikinci fəsil: Su içərkən sağ tərəfdə olandan başlamaq.

29-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evimizə gəldi. Bir müddət sonra içəcək istədi. Biz onun üçün bir qoyunu sağıdıq. Sonra mənim bu quyumdan südə su qatdım və onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ötürdüm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan içdi. Onun solunda Əbu Bəkr, önündə Ömər, sağında isə bir bədəvi ərəb vardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içib qurtardıqda Ömər ona Əbu Bəkri göstərərək: “Ey Allahın Elçisi bu Əbu Bəkrdir." Dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə Əbu Bəkr və Ömərə deyil südü bədəvi ərəbə verdi və belə buyurdu: "Sağdakılar, sağdakılar, sağdakılar." Ənəs (Allah ondan razı olsun) belə demişdir: "Bu Sünnətdir, bu sünnətdir, bu sünnətdir." (Müslim /2029).

## İyirmi üçüncü fəsil: Kiçikdən qocalara verməyə izn istəmək haqda.

30-Səhl ibn Saadəs-Saidi (Allah onların hər ikisndən razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir qabda (su) içki gətirildi. O ondan içdi. Sağında biz oğlan, solunda isə yaşlı kişilər var idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oğlandan: "Mənə bunu onlara verməmə icazə verərsən?" Oğlan belə cavab verdi: "Xeyr! Allaha and olsun ki, səndən gələn payımı heç kəsə keçmərəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu sakitcə onun əlinə qoydu." (Müslim / 2930).

## İyirmi dördüncü fəsil: Qaba üfürməyin qadağan olması.

31-Əbu Qatədə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qaba üfürməyi qadağan etdi." (Müslim / 267-2027- dən sonra).

## İyirmi beşinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) su içərkən nəfəs alardı.

32-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) su içərkən üç kərə nəfəs alardı və belə buyurardı: "Bu daha susuzulğü aparan, daha sağlam və daha iştahlıdır." Ənəs belə buyurdu: “Məndə su içərkən üç kərə nəfəs alaram” (Müslim /2028).

İyirmi altıncı fəsil: Ayaq üstə içmənin qadağan olması.

33- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən heç biriniz suyu ayaq üstə içməsin. Kim  unudarsa onda qussun." (Müslim /  2026).

İyirmi yeddinci fəsil: Zəm-zəmin ayaq üstə içməyə izn verilməsi haqda.

34- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün Zəm-zəm süzdüm onu ayaq üstə içdi. Evin (Kəbənin) yanında ikən su istədi." (Müslim / 2027).

# Yeməklər Kitabi

Birinci fəsil: Yeməyə başlamazdan öncə Allahın adını zikr etmək.

1- Hüzeyfə (Allah ondan razı olsun) belə rəvayət edir: "biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə yemək yedikdə o yeməyə başlanmamış əl vurmamış əllərimizi yeməyə üzadmazdıq. Bir gün yenə onunla birgə yeməkdə idik. Balaca bir qız sanki onu qovurlar kimi bir halda gələrək əlini yeməyə uzatdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun əlini tutdu. Sonra bir bədəvi ərəb sanki onu qovurlar kimi bir halda gələrək əlini yeməyə uzatdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onunda əlini tutdu və belə buyurdu: "Şübhəsiz üzərinə Allahın adı zikr olunmayan yeməyi Şeytan (özünə) halal edər. O bu qızı yeməyi özünə halal etsin deyə gətirdi və mən onun əlini tutdum. Sonra isə bu bədəvi ərəbi yeməyi özünə halal etsin deyə gətirdi və mən onunda əlini tutdum. Nəfsim əlində olana and olsun ki, Onun (şeytanın) əli bu qızın əli ilə birgə əlimdədir." başqa bir rəvayətdə isə belə deyilir: "Sonra Allahın adını zikr etdi və yedi." (Müslim/2017).

2- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deyərkən eşitdiyini rəvayət edir: "Kişi evinə girərkən, Allahın adının evə girdiyində və yemək yeyəndə zikr etdikdə, şeytan belə deyər: "Sizin üçün nə yatacaq yer var nədə axşam yeməyi." Yox əgər kişi evinə girdiyində Allahın adını zikr etməzsə, şeytan belə deyər: "Siz yatacaq yer tapdınız." Yemək yeyərkəndə Allahın adını zikr etməzsə, belə deyər: "Siz yatacaq yer və axşam yeməyi tapdınız." (Müslim / 2018).

İkinci fəsil: Sağ əllə yemək.

3- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz yemək yeyərkən sağ əllə yesin  və içərkən sağ əllə içsin. Həqiqətən Şeytan sol əllə yeyib sol əllə içər." (Müslim/2020).

4- İyas İbn Sələmə İbn əl-Akva (Allah onların hər ikisindən razı olsun) atasının ona belə danışdığını rəvayət edir: "Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında sol əllə yedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Sağla ye!" deyə buyurdu. Kişi: "Bacarmıram." Deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Heç bacarmayasanda." Buna onu ancaq

təkəbbürlüyü vadar etdi. Və O əlini bir daha ağzına apara bilmədi." (Müslim / 2021).

### Üçüncü fəsil: Qabağında (olan yerdən) olanı yemək.

5- Ömər ibn Sələmə (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evində idim. Əlim (beş nəfərlik olan bir) qabın ətrafında dolanırdı. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey oğlan Allahın adını zikr et! Sağ əlinlə ye! Və öz qabağından ye!" (Müslim/2022).

### Dördüncü fəsil: Üç barmaqla yemək.

6- Kaəb İbn Malik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üç barmaqla yeyər və əlini silməzdən öncə yalayardı." (Müslim / 2032).

### Beşinci fəsil: Yemək yedikdən sonra əli yalamaq və ya yalatmaq.

7- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən biriniz yemək yeyərsə əlini yalamamış və ya yalatmamış silməsin." (Müslim /2031).

### Altıncı fəsil: Barmaqları və qabı yalamaq.

8- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) barmaqları və qabı yalamağı əmr etdi və belə buyurdu: "Siz bərəkətin onun harasında olduğunu bilmirsiniz." (Müslim /2033).

### Yeddinci fəsil: Loxma düşərsə onu silmək və yemək.

9- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Həqiqətən Şeytan ona aid olan hər bir işdə sizin yanınızda olur. Hətta yemək yeyərkəndə gəlir. Sizlərdən kiminsə əlindən loxması düşərsə onun üzərində olanı təmizləsin və yesin! Onu şeytan üçün qoymasın! Yeməyi bitirdikdə barmaqlarını yalasın. Çünki o bərəkətin yeməyin harasında olduğunu bilmir." (Müslim/2033).

### Səkkizinci fəsil: Yemək və içməkdən sonra həmd etmək.

10-Ənəs ibn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz Allah Təala yemək yedikdən sonra ona həmd edən və ya su içdikdən sonra ona həmd edən bəndədən razı olar." (Müslim /2734).

### Doqquzuncu fəsil: Yemək və içmək nemətinə görə sorğu-sual olunacağı haqda.

11-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün və ya bir gecə evindən

çıxdı. Birdən Əbu Bəkr və Ömərində çıxdığını gördü. Onlardan: "Sizi bu saatda evinizdən çıxardan nədir?" deyə soruşdu. Onlar: "Aclıq Ey Allahın Elçisi." Deyə cavab verdilər. O belə buyurdu: "Nəfsim əlində olana and olsun ki, məni də evimdən sizi çıxardan şey çıxartmışdır. Durun gedək!" onlar qalxaraq onunla birgə Ənsarlardan olan bir kişinin evinə getdilər. Kişi evində deyildi. Qadın onları gördükdə: "Xoş gəlmisiniz buyurun." dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Filankəs haradadır?" deyə soruşdu. Qadın: "Bizim üçün şirin su gətirməyə getdi." Deyə cavab verdi. Bu vaxt Ənsardan olan kişi gəlib çıxdı. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və yanındakı iki səhabəsinə baxaraq belə buyurdu: "Allaha həmd olsun bu gün məndən qonaqları daha şərəfli olan heç kəs yoxdur. Sonra gedərək onlar üçün bir xurma salxımı gətirdi. İçində kal, quru tam yetişmiş (yaş) xurma var idi. Onlara "Bunu yeyin." dedi. Sonra bıçaqı götürdü. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "diqqət et südlük qoyuna dəymə!" deyə buyurdu. Onlar üçün qoyun kəsdi və onlar qoyundan və xurma salxımından yedilər və içdilər. Yeyib içib doyduqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Bəkr və Ömərə (Allah onların hər ikisindən razı olsun) belə buyurdu: "Nəfsim əlində olana and olsun ki, Qiyamət günü bu nemətlər haqda sorğu-sual olunacaqsınız. Aclıq sizi evinizdən çıxardı sonra isə bu nemətlər sizə nəsib oldu." (Müslim 2038).

### Onuncu fəsil: Qonşunun yemək dəvətinə cavab vermək.

12-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qonşusu fars bir kişi idi. Və yaxşı şorba bişirirdi. Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün bişirərək onu yeməyə dəvət etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Aişəni göstərərək: "Bunu da?" deyə soruşdu? Kişi: "Xeyr." Deyə cavab verdikdə, Peyğəmbərdə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Xeyr" deyə cavab verdi. O qayıdaraq onu yenə dəvət etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bunu da?" deyə soruşdu? Kişi: "Xeyr." Deyə cavab verdikdə, Peyğəmbərdə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Xeyr" deyə cavab verdi. O üçüncü dəfə qayıdaraq onu yenə dəvət etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bunu da?" deyə soruşdu? Kişi: "Bəli." Deyə cavab verdikdə, onlar qalaxaraq bir-birinin ardınca onun mənzilinə çatana kimi getdilər." (Müslim /2037).

### On birinci fəsil: yeməyən çağrılan və onunla birgə gələn haqda.

13-Əbu Məsud əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "Ənsarlardan bir kişi var idi. Adı Əbu Şueyb idi. Onun qəssab bir köləsi var idi. Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gördükdə üzündən ac olduğunu anladı və köləsinə: "Vay olsun sənə bizim üçün beş nəfərlik yemək hazırla çünki mən Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) beş nəfərin beşincisi olaraq dəvət etmək istəyirəm." O hazırladı. Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək onu beş nəfərin beşincisi olaraq dəvət etdi. Onların ardınca bir kişi gəlirdi. Qapıya çatdıqlarında Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Bu bizin ardımzca gəlib, istərsən ona izn verərsən, istəsən də qayıdar." O: "İzn verirəm, Ey Allahın Elçisi." Deyə cavab verdi." (Müslim/ 2036).

## On ikinci fəsil: Qonağı (özləri ehtiyac içində olsalar belə, özündən) üstün tutmaq.

14-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir çöl ərəbi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək: "Mən möhtacam." Dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlarından birinin evinə adam göndərdi və O (Allah ondan razı olsun): "Səni haqqla göndərənə and olsun ki, evimdə sudan başqa bir şey yoxdur." Deyə buyurdu. Sonra başqa bir qadının yanına adam göndərdi. O da birinci kimi buyurdu. Nəhayət bütün qadınları eyni ilə: "Xeyr səni haqqla göndərənə and olsun ki, evimdə sudan başqa bir şey yoxdur." Deyə cavab verdiklərində, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bu kişini bu gecə kim qonaq edəsək? Allah ona rəhm etsin!" deyə buyurdu. Ənsarlardan bir kişi qalxaraq: "Mən Ey Allahın Elçisi." Deyə cavab verdi və onu götürüb evinə apardı. Ailəsinə: "Səndə (yeyəcək) nəsə varmı?" deyə soruşdu. Qadın: "Xeyr! yalnız uşaqların yeməyi var." Deyə cavab verdikdə, O: "Sən onların başını bir şeyə qat, qonaq daxil olduqda isə çırağı söndür və sanki biz də yeyirik kimi davran! O yeməyə əyildikdə sən qalx çırağı söndür!" Onlar oturdular və qonaq yedi. Səhər açıldıqda o, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Bu axşam ikinizin qonaq üçün etdiyinizə Allah Təala təəccübləndi. (xoşuna gəldi)." (Müslim / 2054).

## On üçüncü fəsil:  İki nəfərin yeməyi üç nəfərə kifayət edər.

15-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İki nəfərin yeməyi üç nəfərə, üç nəfərin yeməyi isə dörd nəfərə kifayət edər." (Müslim / 2058).

16-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Bir nəfərin yeməyi iki nəfərə, iki nəfərin yeməyi dörd nəfərə, dörd nəfərin yeməyi isə səkkiz nəfərə kifayət edər." (Müslim / 2059).

## On dördüncü fəsil: Mömin bir bağırsaq (qarın) içinə, kafir isə yeddi bağırsaq (qarın) içinə yeyir.

17-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mömin bir bağırsaq (qarın) içinə, kafir isə yeddi bağırsaq (qarın) içinə yeyir." (Müslim /2061).

18-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir kafir kişi qonaq gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün bir qoyundan süd sağılmasını buyurdu. Kişi bu qabı içərək boşaltdı. Sonra başqa bir qab gətirildi onu da içdi. Nəhayət yeddi qoyundan süd içdi. Sonra səhər açıldıqda müsəlman oldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün bir qoyundan süd sağılmasını buyurdu. Kişi südü içdi. Sonra ona başqa bir qab gətirildikdə onu içib tamamlaya bilmədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mömin bir bağırsaq (qarın) içinə, kafir isə yeddi bağırsaq (qarın) içinə içir." (Müslim / 2063).

## On beşinci fəsil: Qabaq (balqabaq, kudu, boranı) yemək haqda.

19-Ənəs in Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qonaq çağırdı. Mən də onunla getdim. O içərisində qabaq olan bir şorba gətirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu qabaqdan yeməyə başladı. Xoşuna gəlmişdi. Mən bunu gördükdə qabaqı yeməyib ona verməyə başladım." Ənəs belə buyurmuşdur: "Bundan sonra qabaq mənim xoşuma gəlməyə başladı." (Müslim / 2041).

## On altıncı fəsil: Sirkə nə gözəl ədviyyatdır.

20-Talha ibn Nafi belə rəvayət edir: "Cabir ibn Abdullahın belə dediyini eşitmişdim: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün əlimdən tutaraq evinə apardı. Onun üçün çörəkdən bir neçə parça çıxarıldı. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) : "Ədviyyat yoxdurmu?" deyə soruşdu. Ona: "Xeyr yalnız bir az sirkə var." Deyə cavab verildikdə, belə buyurdu: "Sirkə nə gözəl ədviyyatdır." Cabir belə demişdir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu eşitdiyim vaxtdan sirkəni sevməkdə davam etdim" Talha belə demişdir: "Cabirdən bunu eşitdiyim vaxtdan sirkəni sevməkdə davam etdim." (Müslim / 2052).

## On yeddinci fəsil: Xurma yemək və tumunu iki barmağın arasında çıxarıb atmaq.

21-Abdullah ibn Busr (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) atama qonaq oldu. Onun qabağına yemək və xurma halvası qoyduq. Ondan yedi. Sonra onun üçün quru xurma gətirildi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yeyir və tumlarını iki barmağı, şəhadət və orta barmağı arasında çıxararaq atırdı." Şöbə belə dedmişdir: "Bu mənim zənnimcədir. İnşə Allah ki tumu iki barmaqla çıxarıb atmaq hədisdəndir." Sonra onun üçün içəcək bir şey gətirildi və ondan içdi. Sonra onu sağında olana verdi." Atam heyvanın yüyənindən tutaraq: "Bizim üçün dua et!" deyə söylədi və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım! Onlara verdiyin ruzunu bərəkətli et! Onları bağışla! Onlara rəhm et!" (Müslim /2042).

## On səkkizinci fəsil: Çöməlmiş halda oturaraq xurma yemək.

22- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xurma gətirildi. O çöməlmiş halda oturaraq onu bölür və tələsik şəkildə ondan yeyirdi." Başqa bir rəvayətdə isə belə deyilir: "Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çöməlmiş halda oturaraq xurma yediyini gördüm." (Müslim / 2044).

## On doqquzuncu fəsil: Evində xurma olmayanın (ev əhli) ailəsi acdır.

23-Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ey Aişə (Allah ondan razı olsun) evində xurma olmayanın (ev əhli) ailəsi acdır, Ey Aişə (Allah ondan razı olsun) evində xurma olmayanın (ev əhli) ailəsi acdır, və ya ac olar." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu iki və ya üç kərə təkrar etdi." (Müslim / 2046).

## İyirminci fəsil: İki xurmanı birdən (bir loxma şəklində) yeməyin qadağan olması.

24-Cəbələ in Suheym belə rəvayət edir: "İbn Zubeyr (Allah ondan razı olsun) bizə xurma yedirirdi. O günlərdə insanlar qıtlığa dükar olmuşdu. Biz ondan yeyirdik. Biz yemək yeyərkən İbn Ömər yanımızdan keçir və belə buyururdu: "İki xurmanı cəm edərək yeməyin! Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki xurmanı birdən (bir loxma şəklində) yeməyi qadağan etmişdir. Yalnız kişi qardaşına izn verməsi müstəsna olmaqla." Şöbə belə demişdir: "Mən bu izni kəsməsini yalnız İbn Ömərin sözü olduğunu hesab edirəm." (Müslim/2045).

## İyirmi birinci fəsil: Xiyarla yaş xurma yemək.

25-Abdullah ibn Cəfər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xiyarla yaş xurma yediyini gördüm." (Müslim/2043).

## İyirmi ikinci fəsil: Qara əl-Kəbas (əl-Ərak ağacının yetişmiş meyvəsi) haqda.

26-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Mərri əz-Zahran adlanan yerdə idik. Əl-Kəbas yığırdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə: "Qara olanını yığın." Deyə buyurdu. Biz: "Ey Allahın Elçisi sanki sən qoyun otarmısan?" Deyə soruşduqda, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəli. Məgər Elə bir peyğəmbər varmı ki, o qoyun otarmasın?" və ya buna oxşar bir söz." (Müslim / 2050).

## İyirmi üçüncü fəsil: Dovşan yemək.

27-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Mərri əz-Zahran adlana yerdə bir dovşanı hürkütdük və səhabələr onun ardınca qaçdılar və yoruldular. Mən onun ardınca qaçdım və nəhayət onu tutdum. Onu Əbu Talhanın yanına gətirdim. O onu kəsdi və buduyla iki baldırını Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) göndərdi və mən onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gətirdikdə onu qəbul etdi." (Müslim /1953).

## İyirmi dördüncü fəsil: əd-Dab (varan) yemək.

28-Abdullah ibn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: "(Allahın qılıncı adlandırılan) Xalid İbn Valid (Allah ondan razı olsun) ona belə xəbər vermişdir: "O Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi olan və onun və Abbasın xalası olan Meymunənin yanına daxil oldular. Onun yanında qızardılmış: əd-Dab (varan) vardı. Onu onun üçün bacısı Həfidə bintu əl-Həris Nəcddən (yer adı) gətirmişdi. O əd-Dabı Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qabağına qoydu. Onun önünə çox az olardı ki, yemək qoyularkən onun haqda danışılar və adı çəkilərdi. Orada olan qadınlardan biri: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun önünə qoyduğunuz haqda xəbər verin!" deyə buyurdu. Biz: "Bu

əd-Dabdır Ey Allahın Elçisi." Deyə söylədikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlinini çəkdi. Xalid İbn Valid ona: "əd-Dab haramdırmı Ey Allahın Elçisi?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Xeyr! Lakin bu mənim qövmümün yaşadığı yerdə olmur. Buna görədə ondan diksindim." Xalid belə buyurmuşdur: "Onu qabağıma çəkərək yedim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə baxırdı və mənə bunu qadağan etmədi." (Müslim / 1946).

29- Əbu Səid (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir bədəvi çöl ərəbi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Mən əd-Dablar olan bir alçaq yerdə yaşayıram. Ailəmin əksər yeməyi də budur." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona heç bir şey cavab vermədi. Biz ona yenidən müraciət etməsini söylədik və kişi yenə ondan soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üç kərə ona cavab vermədi. Sonra isə onu üçüncüdə çağıraraq belə buyurdu: "Ey bədəvi çöl ərəbi Allah Təala Bəni İsrail övladlarına qəzəblənmiş və onlara lənət edərək onları yer üzündə gəzən heyvanlara çevirmişdir. Bilmirəm bəlkə buda onlardandır. Mən onu yemirəm və onu qadağanda etmirəm." (Müslim /1951).

## İyirmi beşinci fəsil: Çəyirtkə yemək.

30- Abdullah İbn Əbu Əvfa (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə yeddi döyüşdə iştirak etdim. Biz çəyitkə yeyirdik." (Müslim /1952).

## İyirmi altıncı fəsil: Dəniz heyvanlarını və dənizdən qırağa (sahilə) atılan heyvanları yemək haqda.

31- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizim üzərimizə Əbu Ubeydə əmir qoyaraq göndərdi. Qureyşin bir karvanı ilə qarşılaşmalı idik. Yanımızda bir qab quru xurma götürmüşdük. Bizim üçün başqa bir şey tapmamışdı. Əbu Ubeydə bizə (hərəyə) bir xurma verirdi." Mən ondan: "Siz onunla nə edirdiniz?” Deyə soruşdum? O belə buyurdu: "Biz onun uşaq sovurduğu kimi sovururduq. Sonra isə onun üzərindən su içir və bu bizə bir gün gecəyə kimi kifayət edirdi. Sonra əsalarımıza Sələm ağacının yarpağını sıxır və onun üzərinə su alaraq yeyirdik. Biz dənizin sahilinə tərəf getdikdə, bizə yüksək qum təpəsi kimi bir şey göründü. Ona yaxınlaşdıqda onun əl-Ənbər (Balina) adlanan heyvan olduğunu gördük. Əbu Ubeydə: "Bu meyitdir." Deyə buyurdu. Sonra isə: "Xeyr! Biz Allahın Elçisinin elçiləriyik, Allah yolunda çıxmışıq və ehtiyac içindəsiniz yeyin!" deyə buyurdu. Biz onun yanında bir ay qaldıq. Biz üç yüz nəfər idik, kökəlmişdik. Mən bizim onun gözünün içindən çömçələrlə yağ çıxardığımızı görmüşdüm. Ondan öküz qədər və ya öküz boyda parçalar qoparırdıq. Əbu Ubeydə bizdən on üç kişini götürərək onun gözünün içinə oturtdu. Sonra onun qabırqasından birini dik qoyaraq bizim ən hündür dəvələrimizdən birini yəhərlədi və dəvə onun altından keçdi. Biz onun ətidən qovuraraq azüqə olaraq yanımızda götürdük. Mədinəyə gəldikdə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldik və ona bu haqda xəbər verdik. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu Allahın sizin üçün çıxardığı ruzidir. Yanınızda onun ətindən bizi yedirəcək bir şey varmı?" Biz onun ətindən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün

göndərdik və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan yedi." (Müslim /1935).

## İyirmi yeddinci fəsil: At əti yemək haqda.

32- Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybər günü ev eşşəyinin ətini yeməyi qadağan etdi və at əti yeməyə izn verdi." (Müslim / 1941).

33- Əsma (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında bir atı kəsib yedik." (Müslim /1942).

## İyirmi səkkizinci fəsil: Ev eşşəyinin ətini yeməyin qadağan olması.

34- Əbu Səələbə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ev eşşəyinin ətini yeməyi qadağan etdi." (Müslim/1936).

35- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybəri fəth etdikdə kənddən çıxan eşşəkləri ələ keçirdik və ondan bişirdik. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) carçılarından biri: "Bilin və agah olun ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu qadağan edir. Çünki bu pislik və şeytan əməlidir." Deyə səsləndi. Qazanlar içində olanlarla birlikdə cevrildi (dağıdıldı, boşaldıldı). Qazan və içindəkilər hələdə qaynayırdı." (Müslim/1942).

## İyirmi doqquzuncu fəsil: Yırtıçı (köpək) dişi olan hər bir yırtıcı heyvanı yeməyin qadağan olması.

36- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Yırtıçı (köpək) dişi olan hər bir yırtıcı heyvanı yemək haramdır." (Müslim / 1933).

## Otuzuncu fəsil: Caynağı olan hər bir quşu yeməyin qadağan olması.

37- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yırtıçı (köpək) dişi olan hər bir yırtıcı heyvanı və caynağı olan hər bir quşu yeməyi qadağan etdi." (Müslim / 1934).

## Otuz birinci fəsil: Sarımsaq yeməyin bəyənilməməsi.

38- Əbu Eyyub (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun evində qonaq olaraq endi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) aşağı Əbu Eyyub isə üst qatda qalırdı. Gecə Əbu Eyyub diqqət edərək belə buyurdu: "Biz Peyğəmbərin (Ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərində gəzirik? Sonra kənarda bir yerə çəkilərək gecələdilər. Sonra O Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu söylədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun):

"Alt qat daha rahatdır." Deyə buyurduqda, O: "Sən altında olan tavanın, üzərinə mən çıxmaram." Deyə buyurdu. Beləcə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üst, Əbu Eyyub isə alt qata keçdi. O Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün yemək hazırlayırdı. Yemək ona qaytarıldığı vaxt O onun barmaqlarının yerini soruşar və onun barmaqlarının yerini izləyərdi. Bir dəfə Onun üçün içində sarımsaq olan bir yemək hazırladı. Yemək ona qaytarıldıqda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) barmaq yerlərini soruşdu. Ona: "O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yemədi." Deyildikdə, qorxudan təəcübləndi, yuxarı qalxaraq: "Bu haramdır?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Xeyr! Lakin mən onu xoşlamıram." Deyə buyurdu. O: "Elə isə Sənin bəyənmədiyini və ya xoşlamadığını məndə xoşlanmıram." Deyə buyurdu." Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu vaxtlarda vəhy gəlirdi." (Müslim /2053).

### Otuz ikinci fəsil: Yeməyi pisləməmək.

39- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Heç zaman Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir yeməyi pislədiyini görmədim. İştahası çəksəydi yeyərdi, iştahası çəkməsəydi sakit durardı." (Müslim / 2064).

## Libas və zinət kitabı.

### Birinci fəsil: İpəyi bu dünyada yalnız axirətdə ondan heç bir payı olmayan geyir. Və ondan və qiymətindən faydalanmağın mübah olması.

1- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Ömər (Allah ondan razı olsun) Utarid ət-Təmimini bazarda Sirra (ipək və qızıl qarışıqlı) adlı əbanı (satış üçün) sərdiyini gördü. Utarid ət-Təmimi padşahlar məst edərək onlardan bəxşiş alan bir kişi idi. Ömər (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə söylədi: "Ey Allahın Elçisi mən Utaridi bazarda Sirra (ipək və qızıl qarışıqlı) adlı əbanı (satış üçün) sərdiyini gördüm. Onu alıb ərəb qəbilələrinin nümayəndələri gəldiyində geyinsəydin yaxşı olardı. Və ya onun belə dediyini zənn edirəm: "Cümə günü geyinsəydin." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "İpəyi bu dünyada yalnız axirətdə ondan heç bir payı olmayan geyir." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sirra (ipək və qızıl qarışıqlı) adlı əba gətirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan bir pay Ömərə, bir pay Usamə ibn Zeydə və bİr payda Əli ibn Əbu Talibə göndərək: "Bunları qadınların arasında baş örtüyü etmələri üçün bölün!" deyə ona buyurdu. Ömər (Allah ondan razı olsun) ona göndərilən payı əlində tutaraq gəldi və: "Ey Allahın Elçisi bunu mənə göndərmisən. Dünən isə Utaridin əbasına dediyini dedin. Bu necə olur?" deyə ondan soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə cavab verdi: "Mən onu sənə geyinmən üçün göndərmədim. Göndərdim ki ondan mənfəətlənəsən." Usamə ibn Zeyd (Allah ondan razı olsun) isə onu geyinərək gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona elə baxdı ki, O bundan Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun bu felini inkar

etdiyini anladı və belə dedi: "Ey Allahın Elçisi mənə nə üçün belə baxırsan onu mənə sən göndərmisən." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən onu sənə sən onu geyinəsən deyə göndərməmişəm. Onu sənə qadınların arasında baş örtüyü etsinlər deyə bölmən üçün göndərmişəm." (Müslim / 2068).

### İkinci fəsil: İpəyi bu dünyada geyinən axirətdə onu geyinməz.

2- Xalifə ibn Kaab Əbu Zibyan (Allah ondan razı olsun) belə rəvayət edir: "Abdullah İbn əz-Zubeyrin xutbədə belə dediyini eşitdim: "Diqqət edin! Qadınlarınıza ipək geyindirməyin! Çünki mən Ömər İbn əl-Xattabın belə dediyini eşitmişəm: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "İpək geyinməyin! Çünki onu bu dünyada geyinən axirətdə geyinməz." (Müslim / 2069).

### Üçüncü fəsil: Allahdan qorxan kəslərə ipək kaftan, don; (uzunətəkli qədim kəndli paltarı) geyinmək yaraşmaz.

3- Uqba ibn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ipək kaftan, don; (uzunətəkli qədim kəndli paltarı) hədiyyə edildi. Onu geyinərək namaz qıldı. Sonra namazı bitirdikdə onu bəyənməmiş kimi tez şiddətlə çıxartdı və belə buyurdu: "Allahdan qorxan kəslərə bu yaraşmaz." (Müslim / 2075).

### Dördüncü fəsil: İki barmaq miqdarında müstəsna olmaqla ipək geyməyin qadağan olması.

4- Əbu Osman belə rəvayət edir: "Biz  Azərbaycanda ikən Ömər (Allah ondan razı olsun) bizə belə yazdı: "Ey Utba ibn Farqad bu (mal) nə sənin, nə atanın, nə də ananın alın tərindən deyildi. Elə isə mənzilində nə ilə doyursansa müsəlmanlarında mənzillərində ondan doyur! Öz rifahına yaşamaqdan, müşriklərin geyimindən və ipək geyməkdən uzaq ol! Çünki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə ipək geyməyi qadağan etmişdir və belə buyurmuşdur: "Yalnız bu miqdar müstəsnadır." Deyərək iki barmağını orta və işarə barbağını bir-birinə sıxaraq bizim üçün qaldırdı." Zuheyr belə demişdir: "Asim belə buyurmuşdur: "Bu Allahın kitabında belədir." Və Zuheyrdə iki barbağını qaldırdı." (Müslim/2069).

5- Suveyd ibn Ğafla belə rəvayət edir: "Ömər İbn əl-Xattab əl-Cabiyye adlanan yerdə xütbə verdi və belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ipək geyməyi qadağan etdi. Yalnız iki və ya üç və ya dörd barmaq miqdarında müstəsna olmaqla." (Müslim /2069).

### Beşinci fəsil:  Dibəcdən (ipək növü) olan  kaftanın, donun (uzunətəkli qədim kəndli paltarı) qadağan olması.

6- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün ona hədiyyə olunmuş dibəcdən (ipək növü) olan kaftan geyindi. Sonra tələsik onu çıxararaq onu Ömər ibn əl-Xattaba göndərdi." Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi onu necə də tələsik çıxartın." Deyə söylədilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Cəbrail mənə onu qadağan etdi!" deyə buyurdu. Ömər (Allah ondan

razı olsun) ağlaya-ağlaya onun yanına gəldi və belə buyurdu: " Ey Allahın Elçisi bəyənmədiyin bir işi mənə verdin. Mənim halım nə olacaq?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən onu sənə geyinmən üçün vermədim. Verdim ki, onu satasan." Və o onu Min dirhəmə satdı." (Müslim / 2070).

## Altıncı fəsil: Xəstəlik səbəbi ilə ipək paltar geyməyə izn haqda.

7- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbd ər-Rahman ibn Ovfa və Zubeyr ibn əl-Əvvama onlarda olan qaşınma və ya ağrı səbəbindən səfərdə ipək geyməyə izn verdi." Başqa bir rəvayətdə isə belə deyilir: "Onlar Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bitdən şikayət etdilər." (Müslim /2076).

## Yeddinci fəsil: Paltara dibəcdən olan (ipək) parçayla yamaq vurmağa izn verilməsi haqda.

8- Əsma bintu Əbu Bəkrin mövlası olan Abdullah - bu Abdullah Ətanın oğlunun dayısı idi - belə rəvayət edir: "Əsma məni Abdullah ibn Ömərin (Allah onların hər ikisindən razı olsun) yanına göndərdi və belə deməyi buyurdu: "Mənə belə xəbər çatıb ki sən üç şeyi: ipəkdən və ya yundan olan qırmızıya boyanmış balınc və Rəcəb ayının tam oruc tutmağı haram edirsən. Abdullah mənə belə cavab verdi: "Amma Rəcəb ayı haqda xatırlatdığına gəlincə isə daim (bütün ili) oruc tutana nə deyirsən?! Paltarda olan nişanələrə gəlincə isə mən Ömər ibn əl-Xattabın (Allah ondan razı olsun) belə dediyini eşitmişəm: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "İpəyi yalnız (axirətdə) ondan bir payı olmayan kəs geyinər." Və məndə nişanələrin ondan bir şey olacağından qorxdum. Amma qırmızıya boyanmış balınca gəlincə isə bu Abdullahın qırmızıya boyanmış balıncıdır (yəni ipək deyil).” Mən Əsmanın yanına qayıdaraq ona bunu xəbər verdim. Əsma: "Bu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) cübbəsidir." deyə buyurdu və mənə qalın Kisraniyyə Cübbəsi çıxartdı. Onun dibəcdən yamaqları var idi. Yanlarıda dibac ilə kəsilmiş şəkildə idi. Bu Cübbə vəfatına qədər Aişənin yanında idi. O vəfat etdikdə mən onu götürdüm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu geyinərdi. Biz isə onu yuyur və onunla xəstələr şəfa tələb edirlər." (Müslim /2069).

## Səkkizinci fəsil: İpək paltarı qadınlar arasında baş örtüyü etmələri üçün bölmək.

9- Əli İbn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: "Ukeydar Dumə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ipək paltar hədiyyə etdi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu Əliyə (Allah ondan razı olsun) verdi və belə buyurdu: "Onu Fatimələr arasında baş örtüyü etmələri üçün böl!" (Müslim / 2071).

## Doqquzuncu fəsil: əl-Qissiy (Misir və Şamdan gətirilən naxışlı paltar) və sarıya boyanmış paltar geyməyin və qızıl üzük taxmağın qadağan olması.

10-Əli İbn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Qissiy (Misir və

Şamdan gətirilən naxışlı paltar) və sarıya boyanmış paltar geyməyi, qızıl üzük taxmaqı və rükuda Quran oxumağı qadağan etdi." (Müslim /2078).

11- Abdullah İbn Amr ibn əl-Ass (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim üzərimdə sarıya boyanmış iki paltar gördü və mənə belə buyurdu: "Bu kafirlərin paltarlarındandır onu geyinmə!" mən ondan: "Onu yuyummu? Deyə soruşduqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Xeyr! Yandır!" deyə cavab verdi." (Müslim / 2077).

### Onuncu fəsil: Zəfəran sürtməyin qadağan olması haqda.

12- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kişilərə zəfəran sürtməyi qadağan etdi." (Müslim /2101).

### On birinci fəsil: Saçı boyamaq və ağarmış saçı (boyamaqla) dəyişmək haqda.

13- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Məkkənin fəthi günü Əbu Quhafəni gətirdiklərində saqqalı və saşı əs-Sağamə çiçəyi kimi ağarmışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: "Bunu bir şeylə (rəngini) dəyişin və qaradan (rəngdən) çəkinin!" (Müslim /2102).

### On ikinci fəsil: (Saçı və ya saqqalı) boyamaqla yahudi və nəsranilərə müxalif olmaq.

14- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən yahudi və nəsranilər boyamırlar, onlara müxalif olun!" (Müslim / 2103).

### On üçüncü fəsil: əl-Həbira (əlvan rəngli yəmən paltarı) geymək haqda.

15- Qatədə belə rəvayət edir: "Ənəs ibn Malikə (Allah ondan razı olsun) belə dedik: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hansı paltar daha sevimli və ya daha xoş idi?" O belə buyurdu: "əl-Həbira (əlvan rəngli yəmən paltarı)!" (Müslim /2079).

### On dördüncü fəsil: əl-Mirt əl- Murahhal (yun və ya kətandan olan çizgili örtü, paltar.) geyinmək.

16- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir sabah Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əynində qara yundan olan əl-Mirt əl- Murahhal (yun və ya kətandan olan çizgili örtü, paltar.) paltarda bayıra çıxdı." (Müslim / 2081).

### On beşinci fəsil: Qalın izar (bədənin alt hisəsni örtmək üçün paltar) və əl-Müləbbəd (yamağlı paltar) geymək haqda.

17- Əbu Burda belə rəvayət edir: "Aişənin (Allah ondan razı olsun) yanına daxil oldum. Bizə yəməndə toxunan qalın izar və əl-Müləbbəd (yamağlı paltar) adlanan paltar çıxartdı. O (Allah ondan razı olsun) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə

Allahın salavatı və salamı olsun) vəfata etdikdə bu paltarda olduğuna and içdi." (Müslim /2080).

## On altıncı fəsil: Döşək üzü (örtük) haqda.

18-Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: "Evləndiyimdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən: "Döşək üzü (örtük) götürdünmü?" Mən ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizdə örtü haradandır?" deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəri bax bu olacaqdır!" deyə buyurdu. Cabir belə buyurmuşdur: "Zövcəmdə bir örtü var idi. Mən ona: "Bunu məndən uzaq et!" dedim, O isə: "Artıq Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bu olacaqdır." deyə buyurmuşdur." (Müslim /2083).

## On yeddinci fəsil: Ehtiyac olduğu qədər Döşək (yataq əşyası) götürmək.

19-Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Kişi üçün döşək, qadın üçün döşək. Üçüncüsü qonaq üçün, dördüncüsü isə Şeytan üçündür." (Müslim /2084).

## On səkkizinci fəsil: İçərisi lif olan dəri döşək.

20-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərində yatdığı döşək dəridən idi və içi liflə dolu idi." (Müslim /2082).

## On doqquzuncu fəsil: Paltarı bədənə sıx bürümək və bir paltara bürünmüş halda ayaqları dik qoyaraq oturmaq.

21-Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kişiyə sol əllə yeməyi və ya bir ayaqqabıda gəzməyi, paltarı bədənə sıx bürüməyi və övrət yeri açıq qalaraq bir paltara bürünmüş halda ayaqları dik qoyaraq oturmağı qadağan etdi." (Müslim/2099).

## İyirminci fəsil: Söykənərək oturmağın və bir ayağı o biriniun üzərinə qoymağın qadağan olması haqda.

22-Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizlərdən biriniz: "Söykənərək oturub sonra isə bir ayağını o birinin üzərinə qoymasın!" (Müslim/2099).

## İyirmi birinci fəsil: Söykənərək oturmağın və bir ayağı o biriniun üzərinə qoymağın mübah olması haqda.

23-Abbad ibn Təmim əmisindən (Allah ondan razı olsun) belə rəvayət edir: "O Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)

məsciddə söykənərək bir ayağını o birinin üzərinə qoyduğunu görmüşdür." (Müslim /2100).

## İyirmi ikinci fəsil: İzarı (paltarı) baldırların yarısına kimi qaldırmaq.

24-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanından keçirdim və izarım topuğumdan aşağı idi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Ey Abdullah izarını qaldır! Mən qaldırdım. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bir azda artır!" deyə buyurdu. Mən artırdım və buna sonda davamlı olaraq ona (izara) fikir verirdim. Qövmdən bəzi kəslər ondan: "Haraya qədər?" deyə soruşdular? O: "Baldırların yarısına qədər." Deyə cavab verdi." (Müslim /2086).

## İyirmi üçüncü fəsil: Allah Təala izarını təkəbürlüklə uzadan kəsə baxmaz.

25-Muhamməd ibn Ziyad belə rəvayət edir: "Əbu Hüreyrədən (Allah ondan razı olsun) eşitdim: "İzarını sürükləyən bir adam gördüm və ayağı ilə yerə vurmağa başladı. O Bəhreynin əmiri idi. Belə deyirdi Əmir gəldi. Əmir gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah Təala izarını təkəbürlüklə uzadan kəsə baxmaz." (Müslim / 2087).

## İyirmi dördüncü fəsil: Üç sinif insan vardır ki Allah Təala onlarla danışmaz və onlara baxmaz.

26-Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: "Üç sinif insan vardır ki Qiyamət günü Allah Təala onlarla danışmaz, onlara baxmaz və onları təzkiyə (zamin durmaq, tövsiyyə etmək) etməz. Onlar üçün ağrı verici əzab vardır." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu üç kərə oxudu. Əbu Zər belə buyurdu: "Adları batsın! Umduqlarına çatmasınlar! Ey Allahın Elçisi onlar kimlərdir?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "İzarını topuqdan aşağı uzadan, mənnan (minnət edən, verdiyini başına çırpan) və ticarət malını yalandan and içməklə satan kəsdir." (Müslim / 106).

## İyirmi beşinci fəsil: Paltarını təkəbürlüklə uzadan haqda.

27-Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Paltarını təkəbbürlüklə uzadan kəsə Qiyamət günü Allah Təala baxmaz." (Müslim / 2085).

## İyirmi altıncı fəsil: Nəfsini bəyənmiş (özündən xoşlanmış) riyakarlıqla gedən bir kişi birdən (yerə) batması haqda.

28- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir kişi çiyinlərinə tökülən saçlarını və əbasını bəyənmiş (xoşlanmış) yolla gedərkən birdən torpaga batmış və o Qiyamətə kimi hərəkət edərək torpağa batmaqda davam edəcək." (Müslim / 2088).

## İyirmi yeddinci fəsil: İçərisində it və ya şəkil olan evə mələklər daxil olmaz.

29-Meymunə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir səhər sakit fikirli (üzülmüş) halda oyandı. Meymuna Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi bu gündən bəri sənin halını bəyənmədim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən Cəbrail bu gecə mənimlə görüşəcəyinə vəd vermişdi. Lakin görüşmədi. Allaha and olsun ki, mənə verdiyi vədə heç xilaf olmamışdı." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o gün bu halında oldu. Sonra yadına bizim çadırın altındakı it balası düşdü və onun çıxarılmasını əmr etdi və çıxarıldı. Sonra əlində su götürərək onun yerinə çilədi. Gecələdikə isə Cəbrail (Ona Allahın salamı olsun) onunla qarşılaşdı və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Dünən mənimlə qarşılaşacağına söz vermişdin." O: "Bəli! Lakin biz it və şəkil olan evə girmərik." Deyə cavab verdi. Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o gündən itlərin öldürülməsini əmr etdi. Hətta kiçik həyət itinin öldürülməsinə əmr edər, böyük həyət itinə isə toxunmazdı." (Müslim / 2105).

30-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Mələklər içində heykəllər və şəkillər olan evə girməzlər." (Müslim /2112).

## İyirmi səkkizinci fəsil: Mələklər içində şəkil olan evə girməzlər yalnız paltarda olan nişanələr müstəsna.

31-Busr İbn Saad Zeyd İbn Xaliddən O da Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabəsi Əbu Talhadan(Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buurmuşdur: "Həqiqətən mələklər içərisində şəkil olan evə girməzlər." Busr belə byurmuşdur: "Sonra Zeyd xəstələndi və biz onu ziyarətə getdikdə qapsında asılan örtünün üzərində şəkil vardı. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Meymunənin böyütdüyü Ubeydullah əl-Xovləniyə belə dedim: "Məgər Zeyd bundan əvvəl bizə şəkil haqda xəbər verməmişdi." Ubeydullah ona: "Sən onun bunu deyərkən: "Yalnız paltardakı nişanələr müstəsna," deməsini eşitmədinmi?" deyə cavab verdi.

## İyirmi doqquzuncu fəsil: Üzərində surət şəkli olan örtünün bəyənilməməsi və onu parçlayaraq döşək düzəltmək haqda.

32-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün yanıma daxil oldu: "Mən rəfimi (yerdə olan balaca otağı, zirzəmi və ya anbar). Üzərində səkillər olan  yun bir örtü ilə örtmüşdüm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu gördükdə parçaladı və üzünün rəngi dəyişdi. Sonra isə belə buyurdu: "Ey Aişə Qiyamət günü Allah qatında ən şiddətli əzaba düçar olanlar Allahın yaratdıqlarına bənzədənlərdir.” Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Onu kəsərək ondan bir və ya iki yastıq düzəltdik." (Müslim / 2107).

33-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərdən qayıtdı. Mən qapıya saçaqlı bir pərdə asmışdım. Onun üzərində qanadlı bir at səkilləri vardı. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə onu çıxarmamı əmr eti və mən onu çıxartdım." (Müslim / 2107).

## Otuzuncu fəsil: Üzərində şəkillər olan yastıq və ondan mütəkkə düzəltmək.

34-Aişə (Allah ondan razı olsun) belə rəvayət olunur: "O üzərində səkillər olan bir döşək aldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu gördükdə qapıda duararaq evə daxil olmadı. O onun üzündən onu bəyənmədiyini anladı. Və ya onun üzündən onu bəyənmədiyi anlaşıldı. Aişə belə soruşdu: "Ey Allahın Elçisi Allah və Elçisinə tövbə edim? Nə günah etmişəm?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bu yastıq nədir?" deyə soruşdu? O: "Onu üzərində oturasan, başının altına yastıq edəsən deyə almışam," deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən bu şəkillərin sahiblərinə əzab verilir. Onlara : "Yaratdıqlarınızı dirildin!"deyilir. Sonra isə belə buyurdu: "İçərisində şəkil olan evə mələklər daxil olmaz." Başqa rəvayətdə isə belə deyilir: "Mən onu gütürərək ondan mütəkkə düzəltdim və O evdə ona dirsəklənərdi." (Müslim / 2107).

## Otuz birinci fəsil: Şəkil çəkənlərin Qiyamət günü əzaba düçar olmaları.

35-Səid ibn Əbu əl-Həsən belə rəvayət edir: "Bir kişi İbn Abbasın (Allah onlardan razı olsun) yanına gələrək belə dedi: "Mən bu şəkilləri çəkən bir rəssamam. Mənə bu haqda fitva ver!"  O ona: "Mənə yaxınlaş!" deyə buyurdu. Kişi ona yaxınlaşdı. Sonra o yenə: "Mənə yaxınlaş!" deyə buyurdu. Kişi ona o qədər yaxılaşdı ki, o əlini onun başına qoydu və belə buyurdu: "Səni Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyimlə xəbərdar edirəm Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Hər bir rəssam oddadır. Ona çəkdiyi hər bir şəkilə görə bir nəfs veriləcəkdir və ona Cəhənəmdə əzab verəcəkdir." sonra İbn Abbas ona belə buyurdu: "Əgər mütləq etməli olsan onda ağac və cansız şeylər çək (düzəlt)!"

## Otuz ikinci fəsil: Rəssamlara qarşı şiddətli olmaq.

36-Əbu Zura belə rəvayət edir: "Mən Əbu Hüreyrə ilə Marvanın yanına daxil oldum. O orada şəkillər gördü və belə buyurdu: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Allah Təala belə buyurmuşdu: "Mənim yaratdığım kimi yaratmaq istəyəndən zalım kim ola bilər?! Elə isə qoy onlar bir zərrə və ya bir dən və ya bir arpa dənəsi yaratsınlar."

## Otuz üçüncü fəsil: Qızıl üzük taxmanın, gümüş qabda içmənin, ipək və dibac geymənin qadağan olması.

37-Bara ibn Əl-Azib (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə yeddi şeyi əmr edib, yeddi şeydən  çəkindirdi. Bizə: "Xəstəni ziyarət etməyi, cənazəni müşayət etməyi, asqıran kəsə dua etməyi, anda və  ya and içənə bəraət qazandırmağı, məzluma kömək etməyi, dəvət edənin dəvətini qəbul etməyi və salamı yaymağı əmr etdi. Bizə üzükləri və ya qızıl üzük taxmağı, gümüş qabda içməyi, əl-Məyasiri (Əcəmilərin ipəkdən düzəltdikləri yastıq), əl-Qissiyi (Misir və Şamdan gətirilən naxışlı paltar), ipək geyməyi, qalın ipək və Dibəc geyməyi qadağan etdi." (Müslim / 2066).

## Otuz dördüncü fəsil: Qızıl üzüyü atmaq haqda.

38-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir kişinin əlində qızıldan bir üzük gördü və onu çıxardaraq atdı. Sonra isə belə buyurdu: "Sizlərdən biriniz atəşdən bir köz alıb onu əlində tutur." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) getdikdən sonra kişiyə: "Üzüyünü götür onunla faydalan." deyə söylədilər. Kişi belə buyurdu: "Xeyr! Allaha and olsun ki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu atdıqdan sonra mən onu götürmərəm." (Müslim / 2090).

39-Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızıldan bir üzük düzəltdirdi. Onu geyindikdə qaşını əlinin içi tərəfinə qoyardı. İnsanlarda onu etdiyi kimi düzəltdilər. Sonra o minbərə oturdu. Üzüyü çıxararaq belə buyurdu: "Mən bu üzüyü taxardım və qaşını əlimin içi tərəfinə qoyardım." Onu atdı və sonra belə buyurdu: "Allaha and olsun ki, onu bir daha taxmaram." İnsanlarda üzüklərini atdılar." (Müslim / 2091).

## Otuz beşinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gümüşdən üzük taxması, qaşıda Muhamməd Allahın Elçisidir yazılması və ondan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sonra xəlifələrində onu taxmağı haqda.

40-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gümüşdən üzük götürdü. O əlində idi. Sonra Əbu Bəkrin (Allah ondan razı olsun) əlində, sonra Ömərin (Allah ondan razı olsun) əlində, sonra isə Osmanın (Allah ondan razı olsun) əində idi. Nəhayət O Əris quyusunda düşdü. Onun qaşında: "Muhamməd Allahın Elçisidir" yazılmışdı." (Müslim / 2091).

41-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gümüşdən üzük götürdü və onun qaşına: "Muhamməd Allahın Elçisidir." yazdırdı. Sonra insanlara belə buyurdu: "Mən gümüşdən üzük götürmüşəm və qaşına: "Muhamməd Allahın Elçisidir." yazdırmışam. Heç kəs mənim üzüyümün qaşı kimi düzəltdirməsin." (Müslim/2092).

42-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Kisra, Qeysərə və ən-Nəcaşiyə məktub yazmaq istədi. Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların yalnız möhürlü məktubu qəbul etdiklərini söylədilər. Və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gümüşdən bir üzük götürdü və onun qaşına: "Muhamməd Allahın Elçisidir." yazdırdı." (Müslim / 2092).

## Otuz altıncı fəsil: Qaşı Həbəş muncuğu olan gümüş üzük və üzüyü sağ ələ geyinmək haqda.

43-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sağ əlinə qaşı Həbəş muncuğundan olan gümüş üzük saldı və qaşını əlinin içi tərəfinə qoydu." (Müslim/2094).

## Otuz yeddinci fəsil: Üzüyü sol əlin çeçələ barbağına taxmaq.

44-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzüyü bu barmağında idi." Deyərək sol əlinin çeçələ barbağına işarə etdi." (Müslim / 2095).

### Otuz səkkizinci fəsil: Üzüyü orta və ondan sonra gələnə taxmağın qadağan olması haqda.

45-Əli İbn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə üzüyü bu və bu barmağıma taxmağı qadağan etdi." dedi və orta və ondan sonrakı barmağını göstərdi." (Müslim /2095).

### Otuz doqquzuncu fəsil: Sandal (ayaqqabı) geymək və Sandal (ayaqqabı) geyməyi çoxaltmaq haqda.

46-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşlərin birində belə dediyini eşitdim: "Sandal geyməyi çoxaldın! Həqiqətən kişi sandal geydi müddətdə minikdə olduğu kimidir." Müslim /2096).

### Qırxıncı fəsil: Ayaqqabı geyərkən sağdan çıxararkən isə soldan başlamaq.

47-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz ayaqqabı geyinərkən sağdan. Ayaqqabını çıxararkən isə soldan başlasın. Onların ikisinidə geysin və ya ikisinidə çıxartsın." (Müslim /2097).

### Qırx birinci fəsil: Bir tay ayaqabıda gəzməyin qadağan olması.

181b-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz bir tay ayaqqabıda gəzməsin! Onların ikisinidə geysin və ya ikisinidə çıxartsın." (Müslim/2097).

### Qırx ikinci fəsil: Qazəa (saçın bir qisminin qırxıb bir qismini tərk etmək.) etmənin qadağan olması haqda.

48-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qazəa etməyi qadağan etdi. Ravi belə demişdir: "Mən Nəfidən: "Qaza nədir?" deyə soruşdum. O belə buyurdu: "Uşağın saçının bir qisminin qırxıb bir qismini isə tərk etmək." (Müslim / 2122).

### Qırx üçüncü fəsil: Qadının saçına nəsə (parik və ya saç) əlavə etməsinin (əkməsinin, yapışdırmasının) qadağan olması.

49-Əsma bintu Əbu Bəkr (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Bir qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi təzə gəlin olacaq bir qızım var. O qızılça xəstəliyinə tutulub və saçının bir qismi tökülüb. Onun başına saç əlavə edimmi?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah Təala saç əlavə edəni və etdirəni lənətləmişdir." (Müslim/2122).

Qırx dördüncü fəsil: Qadının başına nəyi isə əlavə etməsindən çəkindirmək.

50-Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Qadının başına nəyi isə əlavə etməsindən çəkindirdi." (Müslim / 2126).

51-Humeyd ibn Əbd ər-Rahman ibn Ovf Müaviyyə ibn Əbu Sufyanın (Allah ondan razı olsun) Həcc ilində minbərdə ikən mühafizəçinin əlindən bir saç topası alaraq belə dediyini eşitdiyini rəvayət edir: "Ey Mədinə əhli alimləriniz haradadır? Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu cür şeylərdən qadağan etdiyini eşitmişəm. Belə buyuraradı: "Bəni İsrail yalnız qadınları bu cür şeylər götürdüklərindən dolayı həlak oldular." (Müslim /2127).

Qırx beşinci fəsil: Döymə döyənlərin və dişləri aralaynların lənətlənməsi.

52-Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə buyurmuşdur: "Allah Təala döymə döyəni və döydürəni, qaş alanı və aldıranı, gözəllik üçün Allahın yaratdığını dəyişərək dişlərini aralayanı lənətləmişdir." Bu xəbər Bəni Əsəd qəbiləsindən olan Ummu Yaqub adlanan bir qadına çatdı. O quran oxuyan bir qadın idi. O (qadın) onun (İbn Məsudun) yanına gələrək belə dedi: "Bu nədir mənə sənin döymə döyəni və döydürəni, qaş alanı və aldıranı, gözəllik üçün Allahın yaratdığını dəyişərək dişlərini aralayanı lənətlədiyinin xəbəri çatmışdır?!" Abdullah belə buyurdu: "Nə üçün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) lənətlədiyini lənətləməli deyiləm ki?! Həm bu Allahın Kitabında belədir." Qadın ona belə dedi: "Mən bu Mushafın (Quranın) bu iki cildi (üzü) arasında olanı oxumuşam lakin buna rast gəlməmişəm." Abdullah ona belə buyurdu: "Əgər sən onu oxusaydın ona rast gələrdin. Allah Təala buyurur: "Peyğəmbər sizə nə verirsə, onu götürün; nəyi qadağan edirsə, ondan əl çəkin." Qadın belə dedi: "Mən sənin dediyin bu şeyləri indi sənin qadının üzərində görürəm." O ona: “Get bax!” deyə buyurdu. Qadın Abdullanın qadının yanına daxil oldu və heç bir şey görmədi. Onun ynına qayıdaraq: "Bir şey görmədim." dedi. Abdullah belə buyurdu: "Əgər dediyin kimi olsa idi biz onunla bir yerdə olmazdıq." (Müslim / 2125).

Qırx altıncı fəsil: Özünü ona verilməyən bir şeyə doymuş göstərən haqda.

53-Əsma (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi mənim bir komam var. Ərimin mənə vermədiyi malından mən özümü ona doymuş kimi göstərməmdə mənə bir gühah varmı?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Özünü ona verilməyən bir şeyə doymuş göstərən iki yalançı libas geymiş kimidir." (Müslim /2129).

Qırx yeddinci fəsil: Geyinmiş çılpaq qadınlar haqda.

54-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Cəhənnəm əhlindən iki sinif insan varkı onları görmürəm: "Əllərində inək quyruqlarına oxşar qamçılar olan bir qövm. Onlar onunla insanları vururlar. Və geyinmiş çılpaq, əyilərək təkəbbürlü yeriyən, başları uzun boğaz dəvələrin hörgücü kimi əyilmiş qadınlar. Onlar cənnətə daxil olamaz və onun iyini duymazlar. Hal bu ki, iyi bu və bu qədər məsafədən gəlir." (Müslim / 2128).

## Qırx səkkizinci fəsil: Heyvanların boynundan nəzər dəyməsin deyə asılan boynbağı, əski və sair şeyləri qırmaq haqda.

55-Əbu Buşeyr əl-Ənsari (Allah ondan razı olsun) belə rəvayət edir: "O səfərlərin birində Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (Abdullah ibn Əbu Bəkr belə demişdir: "Zənn edirəm ki o belə dedi") insanlar gecələdikləri yerlərində ikən bir elçisini göndərərək ona belə buyurdu: "Hər hansı bir dəvənin boynunda əski boyunbağı və ya boyun bağı varsa qırılsın." Məlik belə demişdir: "Mən bunu (bu iplərin) nəzərə qarşı olduğunu düşünürəm." (Müslim / 2115).

## Qırx doqquzuncu fəsil: Zınqırov və Mıələklərin yanlarında it və zınqırov olan yolçulara (səfərdə olana) yoldaşlıq etmədikləri haqda.

56-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mələklər yanlarında it və zınqırov olan yolçulara (səfərdə olanda) yoldaşlıq etməzlər." (Müslim /2113).

57-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Zınqırov Şeytanın tütəyidir." (Müslim / 2114).

58-Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzə vurmağı və üzə damğa vurmağı qadağan etdi." (Müslim / 2116).

59-Ummu Sələmənin mövlası olan Nəim Əbu Abdullah İbn Abbasın (Allah onların hər ikisindən razı olsun) belə dediyini eşitmişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzünə damğa vurulmuş bir eşşək gördü bunu inkar edərək belə buyurdu: "Allaha and olsun ki, bunu yalnız üzünün dibindən bir yerə damğa vurardım. Sonra öz eşşəyinin gətirilməsini əmr etdi və onun iki oturacağından damğaladı. İlk kəs oturacaqdan damğalayan o oldu." (Müslim/2118).

## Əllinci fəsil: Qoyunların qulaqlarını damğalamaq.

60- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qoyunların tövləsində ikən yanına daxil olduq. O onlara (zənnimcə: qulaqlarına) damğa vururdu." (Müslim / 219).

## Əlli birinci fəsil: Kürəyə damğa vurmaq haqda.

61-Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Ummu Suleym doğduğunda, mənə belə buyurdu: "Ey Ənəs bu uşağa bax sabah Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına onu təhnik (Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xurmanı öz ağzından çıxararaq uşağın ağzına qoyması) edənə kimi ona bir şey olmasın." Mən sabah onun yanına getdim. O həyətdə idi əynində covniyyə qəbiləsinə məxsus bir xələt vardı. O Məkkənin fəthində ona gətirilən heyvanların kürəyinə damğa vururdu." (Müslim /219).

# Ədəb kitabı

Birinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Adımla adlandırın lakin kunyəmlə (kunyə yəni atanı böyük övladın adıyla çağırmaq məsələn: əbu Muhamməd) kunyələməyin.

1- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Bir kişi Bəqi qəbiristanlığında başqa bir kişini: "Ey Əbu əl-Qasim" deyə çağırdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona tərəf çevrildi. Kişi ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , mən səni qəsd etmədim. Mən filankəsi çağırdım." Deyə söylədikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Adımla adlandırın lakin kunyəmlə kunyələməyin!" (Müslim / 2131).

İkinci fəsil: Muhammədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) adını (uşağa) qoymaq haqda.

2- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Bizdən bir kişinin oğlu oldu və adını Muhamməd qoydu. Onun qövmü ona: "Biz sənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) adını qoymağa izn verməzik." Dedilər. O oğlunu çiyninə alaraq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldikdə belə buyurdu: "Ey Allahın Elçisi , mənim oğlum olub və adını Muhamməd qoymuşam. Qövmüm isə mənə: ""Biz sənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) adını qoymağa izn verməzik." Deyirlər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Adımla adlandırın lakin kunyəmlə kunyələməyin! mən yalnız Qasiməm və sizin aranızda bölüşdürənəm." (Müslim / 2133).

Üçüncü fəsil: Allaha ən sevimli olan adlar Abdullah və Əbd ər-Rahmandır.

3- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Allaha ən sevimli olan adlar Abdullah və Əbd ər-Rahmandır." (Müslim /2132).

Dördüngü fəsil: Yeni doğulmuş uşağa Əbd ər-Rahman adı vermək.

4- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ bizdən bir kişinin oğlu oldu və adını Qasim qoydu. Biz ona: " Biz sənə Əbu əl-Qasim deməyəcək və sənə gözünü açmağa imkan verməzik." Dedik. O Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Oğlunun adını Əbd ər-Rahman qoy!" (Müslim / 2133).

Beşinci fəsil: Yeni doğulmuş uşağa Abdullah adı vermək, sığallamaq və onun üçün dua etmək.

5- Urva İbn əz-Zubeyr və Fatimə bintu əl-Munzir İbn əz-Zubeyr belə rəvayət etmişlər: "Əsma bintu Əbu Bəkr (Allah ondan razı olsun) Abdullah İbn Zubeyrə hamilə ola-

ola hicrət etdiyində çıxaraq Qubaya (yer adı) gəldi və Qubada Abdullanı dünyaya gətirdi. Doğduqdan sonra onu təhnik (Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xurmanı öz ağzından çıxararaq uşağın ağzına qoyması) etmək üçün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan uşağı alaraq qucağına qoydu. Sonra xurma istədi." Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Biz bir müddət onu tapana kimi axtardıq və nəhayət tapdıq. O onu ağzında çeynədi sonra onu uşağın ağzına qoydu. Uşağan mədəsinə ən birinci düşən şey Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağız suyu oldu. Sonra Əsma belə demişdir: " Sonra O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu sığalladı, onun üçün dua etdi və adını Abdullah qoydu." Sonra o yeddi və ya səkkiz yaşında ikən Zubeyrin əmri ilə gələrk Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) beyət etmək istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun ona tərəf gəldiyini gördükdə gülümsədi. Sonra o beyət etdi." (Müslim / 2146).

6- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Əbu Talhanın oğlu xəstə idi. Əbu Talha bir gen (səfərə) getdiyində oğlu vəfat etdi. O qayıtdıqda: "Uşaq nə etdi?" deyə zövcəsindən xəbər aldı. Ummu Süleym ona: "Əvvəlkindən daha sakitdir." Deyə buyurdu və onun qabağına şam yeməyini qoydu. O şam yeməyini yedikdən sonra qadınla yaxınlıq etdi. Qurtardıqdan sonra qadın: "Uşağı dəfn edin" deyə buyurdu. Səhər açıldıqda isə Əbu Talha Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu gecə yaxınlıq etmisinizmi?" O: "Bəli!" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Allahım , onlara bərəkət ver!" deyə buyurdu. Mən bir oğlan uşağı doğdum. Əbu Talha mənə onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına aparmasını buyurdu. Onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətrdi. Onula birgə bir neçə quru xurma göndərdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu götürdü və: "Onunla bərabər bir şey varmı?" deyə soruşdu. Onlar: "Bəli quru xurma" deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu ağzında çeynədi və sonra çıxararaq uşağın ağzına qoydu. Onu təhnik etdi və adını Abdullah qoydu." (Müslim/2144).

## Altıncı fəsil: Peyğəmbərlərin və Saleh insanların adıyla adlandırmaq.

7- əl-Muğira İbn Şöbə (Allah ondan razı olsun) belə rəvayət edir: "Nəcrana gəldiyimdə məndən belə soruşdular: " Siz: "Ey Harunun qızı." deyə oxuyursunuz. Halbuki , Musa İsadan bu və bu qədər öncədir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldikdə ondan bu haqda soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Onlar (uşaqlarına) ondan əvvəlki peyğəmbərlərin və salehlərin adlarını qoyurdular." (Müslim / 2135).

## Yeddinci fəsil: Yeni doğulmuş uşağa İbrahim adı vermək haqda.

8- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: "Mənim oğlum oldu. Onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim. Adını İbrahim qoydu və onu təhnik etdi." (Müslim / 2145).

## Səkkizinci fəsil: Yeni doğulmuş uşağa əl-Munzir adı vermək haqda.

9- Səhl İbn Saad: belə rəvayət edir: əl-Munzir İbn Useyd (Allah ondan razı olsun) doğulduqda onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıan gətirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu baldırının üzərinə qoydu. Əbu Useyd də yanında oturmuşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) önündə nə ilsə məşğul oldu. Əbu Useydə oğlunu götürməyi əmr etdi və uşağı Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) baldırının üzərindən götürərək geri qaytardılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) özünə gəldikdə: "Uşaq haradadır?" deyə soruşdu. Əbu Useyd: "Onu geri qaytardıq , ey Allahın Elçisi." deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onun adı nədir?" deyə soruşdu. O: "Filankəs , ey Allahın Elçisi." deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Xeyr! Lakin onun adı əl-Munzirdir!"deyə buyurdu və o gün adını əl-Munzir qoydu." (Müslim / 2149).

## Doqquzuncu fəsil: Adı ondan daha gözəl olanına dəyişmək.

10-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Ömərin (Allah ondan razı olsun) bir qızına asiyə (asi olan) deyirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu Cəmilə (gözəl) adlandırdı." (Müslim / 2139).

## Onuncu fəsil: Barra adını Cuveyriyyəyə çevirmək.

11-İbn Abbas İbn (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Cuveyriyyənin adı Barra idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu dəyişərək Cuveyriyyə qoydu. O: "Bərranın yanından çıxdı" deyilməsindən xoşlanmazdı." (Müslim / 2140).

## On birinci fəsil: Barra adını Zeynəbə çevirmək.

12-Muhamməd ibn Amr İbn Ata belə rəvayət edir: "qızımın adını Barra qoymuşdum. Mənə Zeynəb bintu Əbu Sələmə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu adı qoymağı qadağan etdiyini söylədi. Mən də Barra adlandırılmışdım . Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Təzkiyə (zamin durmaq, tövsiyyə etmək) etməyiniz. Allah Təalə sizin hansızın yaxşılıq əhlindən olduğunuzu daha yaxşı biləndir." Ondan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onu nə adlandıraq?" deyə soruşuldu və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onu Zeynəb adlandırın!" deyə buyurdu."

## On ikinci fəsil: Üzümün Kərm (kərəmli) adlandırılması.

13-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Sizlərdən heç kimsə üzümə Kərm deməsin. Kərm yalnız müsəlman bir kişidir." (Müslim \ 2247).

14- Vail ibn Hucr (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Kərm deməyin. lakin Üzüm və əl-Həblə (yəni üzüm) deyin!" (Müslim / 2248).

## On üçüncü fəsil: Əflah, Rəbah, Yasar və Nafi adlandırmağın qadağan olması.

15- Samura İbn Cundub (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə kölələrimizə bu dörd ismi verməyi qadağan etdi: " Əflah, Rəbah, Yasar və Nafi." (Müslim / 2136).

16- Samura İbn Cundub (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allaha ən sevimli olan dörd kəlimə vardır: "Sübhənallah, Əlhəmdulillah, və Lə ilahə İllallah və Allahu Əkbər. Hansı biri ilə başlaman sənə biz zərər etməz. Kölələrinizi Yasar, Rəbah, Nəcih və Əflah adı ilə adlandırmayın! Çünki sən: "O hardadı? "deyərsən və o orada olmaz və onlar: "Xeyr" deyə cavab verərlər. " ravi belə demişdir: "Bunlar dörddür. Bunların üzərinə əlavə etməyin." (Müslim / 2137).

## On dördüncü fəsil: Buna izn verilməsi haqda.

17- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Yalə, Barakə, Əflah, Yasar, Nafi və buna oxşar adları qadağan etmək istədi. Sonra onun bu haqda susduğunu gördüm. Heç bir şey demədi.  Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdi və bunu qadağan etmədi.  Sonra Ömər bunu qadağan etmək istədi, lakin tərk etdi." (Müslim / 2138).

## On beşinci fəsil: Qul, kəniz Mövla, seyuid  (ağa) adlandırmaq haqda.

18- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən heç biriniz: "Rəbin üçün süz! Rəbbini yedizdir! Rabbinə işıq gətir!" Deməsin! Sizlərdən heç biriniz: "Rəbbim, seyyidim (ağam), Mövlam" deməsin! Sizlərdən heç biriniz: "Qulum, kənizim" deməsin! Lakin: "mənim Fətəm (oğlan xidmətçim), mənim Fətəyəm (qız xidmətçim) ğulamım (oğlan xidmətçim) desin!" (Müslim /2249).

## On altıncı fəsil: Kiçik uşağaı kunyalamaq haqda.

19- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanların ən əxlaqlısı idi. Mənim bir qardaşım vardı , adı Əbu Umeyr idi. (ravi belə demişdir: "zənnimcə O belə dedi") o süddən ayrılmışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldiyində onu görərdisə , belə deyərdi: "Ey Əbu Umeyr , Nuğeyr (kiçik quş) nə etdi?" Ravi belə  demişdir: "O (Umeyr) onunla (Quşla) oynayrdı." (Müslim / 2150).

## On yeddinci fəsil: Bir kişinin başqa bir kişiyə: "Ey oğulcuğum." Deməsi.

20- əl-Muğira İbn Şöbə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəccal haqda məndən çox heç kəs soruşmamışdır. Mənə belə buyurdu: "Ey oğlcuğum , bundan ötrü niyə özünü çox yorursan? O sənə bir zərər yetirəcək deyildir." Mən ona: "onun

haqda: "Onunla birgə axan çaylar, çörək dağları olacağını söyləyirlər." Dedim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buurdu: "O Allah bundan daha yüngüldür." (Müslim / 2152).

## On səkkizinci fəsil: Allah qatında ən pis ism Məliklərin –Məliki (Şahən-Şah) adlanandır.

21-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah qatında ən pis ism Şahən-şah adlanandır." Başqa rəvayətdə isə belə deyilir: "Allahdan başqa Məlik (Şah) yoxdur." Sufyan İbn Üyeynə belə demişdir: "Şahən-Şah da onun kimidir." Əhməd İbn əl-Hənbəl belə demişdir: "Əbu Amrdan: "Ən pis" haqda soruşdum? O: "yəni ən alçaq deməkdir." Dedi." (Müslim / 2143).

## On doqquzuncu fəsil: Müsəlmanın müsəlman üzərindəki haqqı beşdir.

22-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Müsəlmanın müsəlman qardaşına qarşı beş şey vacibdir: "Salamı yaymaq, asqırana dua etmək, dəvəti qəbul etmək,xəstəni ziyarət etmək və cənazənin ardınca getmək."

23-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Müsəlmanın müsəlman üzərindəki haqqı altıdır. Ondan: "Ey Allahın Elçisi onlar hansılardır?" deyə soruşulduqda, belə buyurdu: "Onunla qarşılaşdıqda salam ver, dəvət etdiyində qəbul et, səndən nəsihət dilədikdə ona nəsihət et, asqırdıqda , Allaha həmd edərsə , onun üçün dua et, xəstələndikdə onu ziyarət et və vəfat etdikdə cənazəsinin ardınca get!" (Müslim / 2162).

## İyirminci fəsil: Yollarda oturmağın qadağan olması və yolun haqqının verilməsi haqda.

24-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Diqqət edin , yollarda oturmaqdan çəkinin!" Onlar belə dedilər: "Ey Allahın Elçisi , bizim oturmaqdan başqa çarəmiz yoxdur , orada söhbət edirik." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "əgər oturmaqdan başqa işiniz yoxdursa , onda yolun haqqını verin!" Onlar: "onun haqqı nədir? " deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " gözü çəkmək, əziyət verməmək, salamı qaytarmaq, yaxşılığı əmr edib pis şeylərdən çəkindirmək." (Müslim / 2161).

## İyirmi birinci fəsil: Minikdə olanın piyadaya, azın isə çoxa salam verməsi.

25-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Minikdə olan piyadaya, piyada gedən oturana , az olanlar isə çox olana salam versin!"

## İyirmi ikinci fəsil: İzn istəmək və salam vermk haqda.

26-Əbu Burda Əbu Musə əl-Əşaridən (Allah ondan razı olsun) belə rəvayət edir: "Əbu Musə Ömər əl-Xattabın (Allah onlardan razı olsun) yanına gələrək: "Əs-Salamu aleykum , bu , Abdullah ibn Qeysdir." Deyərək izn istədi. Ona izn verilmədi. O yenidən Əs-Salamu aleykum , bu ,Əbu Musadır. Əs-Salamu aleykum bu əl-

Əşaridir." Deyərək izn istədi. Sonra çıxıb getdi." Ömər belə dedi: " Onu mənim yanıma qaytarın! Onu mənim yanıma qaytarın!" O gəldiyində Ömər ona: "Ey Əbu Musa , nə üçün qayıtdın? Biz məşğul idik. O belə buyurdu: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "İzn almaq üç kərədi. Əgər sənə izn verilsə , daxil ol! Əks halda qayıt." Ömər ona belə buyurdu: "Bu dediyinə dəlil gətirəcəksən , yoxsa sənə belə və belə edəcəyəm." Əbu Musa getdi. Ömər (Allah ondan razı olsun) belə buyurdu: "Əgər dəlil taparsa , axşam minbərin yanında görərsən. Dəlil tapmasa isə , görməzsən." Axşam gəldiklərində onu minbərin yanında gördülər. O ona: "Ey Əbu Musa nə deyirsən? Deyəsən artıq tapmısan?" deyə soruşdu. O: "Bəli, Ubeyy İbn Kaab" deyə cavab verdikdə, O: "Adildir." Dedi. Sonra isə belə dedi:" Ey Əbu Tufeyl , bu nə deyir?" O belə cavab verdi: " Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm , ey İbn əl-Xattab! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrinə əzab verən olma." O belə buyurdu: "Sübhənallah , mən sadəcə bir şey eşitdim və onu əsaslandırmaq istədim." (Müslim /2145).

### İyirmi üçüncü fəsil: Örtünü qaldırmağın izn olması.

27-İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Sənin mənim yanıma girmə iznin örtünün qaldırılmasıdır. Və mən sənə qadağan edənə kimi mənim fısıltımı eşidə bilərsən." (Müslim /2169).

### İyirmi dördüncü fəsil: İzn istəyərkən "Mənəm" demənin bəyənilməməsi haqda.

28-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına girməyə izn istədim. Məndən: "bu kimdir?" deyə soruşdu? Mən: "Mənəm" Deyə cavab verdikdə, sanki O onu bəyənməmiş kimi: "Mənəm! Mənəm!" deyə-deyə söyləndi." (Müslim / 2155).

### İyirmi beşinci fəsil: İzn isətəyərkən içəri baxmağın qadağan olması.

29-Səhl ibn Saad əs-Saidi (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qapsındakı dəlikdən içəri baxdı. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlində başını qaşıdığı bir dəmir parçası var idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu gördükdə belə buyurdu: "Əgər məni güddüyünü bilsəydim , bunu sənin gözünə soxardım." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "İzn istəmək gözə görə icad edilmişdir." (Müslim / 2156).

### İyirmi altıncı fəsil: Kim bir kəsin evinə izn olmadan baxarsa , onun gözünü çıxarın!

30-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Əgər bir kəs sənin evinə izn olmadan baxarsa və sən daş ataraq onun gözünü çıxarsan , sənə bir günah olmaz." (Müslim /2158).

### İyirmi yeddinci fəsil: Göz anidən şeyə sataşarsa onu çəkmək haqda.

31- Cərir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) anıdən görmək haqda soruşdum və O mənə gözümü çəkməmi əmr etdi." (Müslim /2159).

### İyirmi səkkizinci fəsil: Bir məclisə gələn və salam verərək oturan haqda.

32- Əbu Vail əl-Leysi (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəfə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İnsanlarla birgə məsciddə oturmuş ikən üç kişi göründü. Onlardan ikisi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tərəf üz tutdular. Biri isə getdi. Onlar gəlib Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yannında dayandılar. Onlardan biri məclisdə boş yer gördü və geçib oturdu. O biri isə onların arxasında oturdu. Üçüncü isə çevrilib getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) boşaldıqdan sonra belə buyurdu: "Sizə üç nəfər haqda xəbər verimmi? Onlardan biri Allaha sığındı , Allah da onu sığındırdı. O biri isə utandı və Allah da ondan utandı. Sonuncusu isə üz çevirdi Allah da ondan üz çevirdi." (Müslim / 2176).

### İyirmi doqquzuncu fəsil: Kişini oturduğu yerdən qaldırıb başqasını oturtmağın qadağan olması.

33- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "bir kişi başqa bir kişini oturduğu yerdən qaldırıb , sonra onun yerində oturmasın. Lakin aralanın , genişlənin." Başqa bir rəvayətdə isə belə deyilir: "Mən Cümə günü? "deyə soruşdum" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Cümə və qeyri günlər." Deyə cavab verdi." İbn Ömər (Allah onların hər ikisindən razı olsun) üçün kimsə qaıxardısa , o, o yerə oturmazdı." (Müslim / 2177).

### Otuzuncu fəsil: Oturduğu yeridən qalxan , sonra ora qayıdan kəsin o yerə daha haqlı olması.

34- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Sizlərdən biriniz (yerindən) qalxarsa..(Əbu Ovananın) rəvayətində isə belə deyilir: "Oturduğu yeridən qalxan sonra ora qayıdan kəs o yerə daha haqlıdır." (Müslim / 2179).

### Otuz birinci fəsil: Üç nəfər bir yerdə ikən , üçüncü kəsin izn olmadan iki nəfərin gizli danışmasının qadağan olması haqda.

35- Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " Üçünüz bir yerdə ikən , üçüncü kəsin izn olmandan iki nəfər insanlara qarışıncaya qədər gizli danışmasın! Çünki bu , onu incidər." (Müslim / 2184).

### Otuz ikinci fəsil: Uşaqlara salam vermək haqda.

36- Seyyar belə rəvayət edir: "Mən Səbit əl-Bunani ilə gedirdim: "Uşaqların yanından keçdikdə onlara salam verdi. Sonra Səbit Ənəslə getdiyində uşaqların yanından keçdikdə onlara salam verdiyini söylədi. Və Ənəsin ona Peyğəmbər (ona, ailəsinə

və səhabələrinə Allahın salavatı və salamı olsun) gedərkən uşaqların yanından keçdikdə onlara salam verdiyini danışdı." (Müslim / 2168).

## Otuz üçüncü fəsil: Yəhudi və Nəsranilərə salamı ilk siz verməyin!

37-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Yəhudi və Nəsranılərə salamı ilk siz verməyin! onlardan kiminləsə yolda qarşılaşdığınızda onları yolun dar hissəsinə sıxışdırın!" (Müslim /2167).

## Otuz dördüncü fəsil: Əhli Kitabın salamını qaytarmaq.

38- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Yəhudilərdən bir neçə insan Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) salam verərək , Ey Əbu əl Qasim , Əssəmu əleykum (yəni sizə ölüm olsun) dedi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlar: "Va aleykum (sizə də) deyə cavab verdi." Aişə qəzəbləndi və belə buyurdu: " məgər onların dediklərini eşitmirsən?! O: "Bəli eşitdim və cavab verdim." deyə buyurdu. Sonra isə belə buyurdu: "Onların əleyhinə bizim duamız qəbul edilir, onların bizim əleyhimizə olan duası qəbul olmur." (Müslim /2170).

## Otuz beşinci fəsil: Hicabın vacibliyini birdirən ayə nazil olduqdan sonra qadınların (tək) çıxmasının qadağan olması.

39-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınları ayaq yoluna getmək istədiklərində gecə əl-Mənas adlanan geniş bir yerə çıxardılar. Ömər İbn əl-Xattab (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) daim: "Qadınlarına hicab geyindir." Deyərdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə etmirdi. Gecələrin birində Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Sovda bintu Zamaə çıxdı. Hüdürboy bir qadın idi. Ömər hicab ayaəsinin nazil olması hərisi olduğundan: "Səni tanıdım , ey Sovda." Deyə onu çağırdı. " Aişə (Allah ondan razı olsun) belə demişdir: "Və Allah Təala hicab ayəsini nazil etdi." (Müslim / 2170).

## Otuz altıncı fəsil: Qadınlara ehtiyaclarından dolayı (tək) çıxmağa izn verilməsi.

40-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Sovda (Allah ondan razı olsun) bizə hicab vacib qılınandan sonra çıxdı. O cisimli bir qadın idi. Qadınları cisimdə keçirdi. Onu görən tanımaya bilməzdi. Ömər İbn əl-Xattab onu gördü və: "Ey Sovda! Allaha and olsun ki , gizlənə bilmirsən. Necə çıxdığına fikir ver!" O üzülərək geri qayıtdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evimdə idi. O şam yeməyi yeyirdi və əlində bir sümük vardı. O içəri daixil olaraq belə buurdu:" Ey Allahın Elçisi , mən çıxmışdım və Ömər mənə belə və belə dedi." Aişə belə buyurdu: " Ona vəhy naiz oldu. O özünə gəldiyində sümük hələ də əlində idi , onu buraxmamışdı. Belə buyurdu: "Sizə ehtiyacınıza görə çıxmağa izn verildi." (Müslim /2170).

## Otuz yeddinci fəsil: Miniyin tərkinə məhrəm plan qadını almaq haqda.

41-Əsma bintu əbu Bəkr (Allah ondan razı olsun) belə rəvayət edir: " əz-Zbeyr mənimlə evləndi. Onun bir atından başqa nə torpağı, nə malı, nə qulu, nə də bir şeyi vardı. Mən onun atını otarır, ehtiyacını ödəyir, onu sürür, onun su dəvəsi üçün töxum əzir, otaraır, su verir, vedrəsini təmir edir və xəmir yoğururdum. Yaxşı çörək bişirə bilmədiyim üçün Ənsarlardan olan qonşu qadınlar mənim üçün bişirirdilər. Onlar sadiq (düzgün) qadınlar idi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zübeyr üçün ayırdığı tprpaqdan başımın üstündə toxum daşıyırdım. Bu tpopaq üçdə iki fərsax (ölçü vahidi) uzunluqda idi. Bir gün toxum başımın üzərində olduğu halda gəldiyimdə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qarşılaşdım. Yanında Əshabından bir neçə insan vardı. Məni çağırdı, sonra dəvəsinin tərkinə almaq üçün dəvəsinə: "İx! İx!" dedi. Mən utandım və sənin qısqanclığını bilirdim." Zbeyr ona belə buyurdu: "Allah ahd olsun ki sənin başında toxum daşıman onun tərkinə minməkdəm daha şiddətlidir." Sonra Əbu Bəkr mənə bir xidmətçi göndərdi və o məni at baxıcılığından qurtardı. Sanki məni azad etdi." (Müslim / 2182).

## Otuz səkkizinci fəsil: Yanında qadınınla bir kişinin yanından geçdikdə: "Bu filankəsdir." demək.

42-Safiyyə bintu Huyeyə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məsciddə etikafda idi. Gecə onu ziyarət etməyə gəldim. Onunla söhbət etdim sonra getmək üçün qalxdığımda, o da məni ötürmək üçün qalxdı. Onun qaldığı yer Usamə İbn Zeydin (Allah ondan razı olsun) evində idi. Yanımızdan Ənsarlardan olan iki kişi keçdi. Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gördükdə tələsik getməyə başladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: " Yavaş olun! Bu , Safiyyə bintu Huyeyədir." Onlar: "Sübhənallah , Ey Allahın Elçisi " dedikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu:" Həqiqətən , şeytan adəm övladının damarlarında qan kimi gəzir. Mən onun sizin qəlbinizə şər salmasından qorxdum." Və ya (qəlbinizə Bir şey salmasından." Dedi." (Müslim / 2175).

## Otuz doqquzuncu fəsil: Kişiyə məhrəmi olmayan qadının yanında gecələməsinin qadağan olması.

43-Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Bilin və agah olun! Nə badə bir kişi dul bir qadının yanında gecələməsin! Yalnız nigahlısı və ya məhrəmi müstəsnadır." (Müslim / 2171).

44-Uqba İbn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə demişdir: "Qadınların yanına girməkdən çəkinin!" Ənsarlardan bir kişi ondan: "Ey Allahın Elçisi , qayına nə buyurursan?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Qayın ölümdür." əl-Leys İbn saad belə demişdir: "Qayın ərin qardaşı və ya ərin qohumlarından buna oxşar kəslərdir." Dayı oğlu kimi." (Müslim / 2172).

## Qırxıncı fəsil: Əri evdə olmayan qadının yanına girməyin qadağan olması.

45- Abdullah ibn Amr İbn əl-Ass (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “bəni Həşimdən olan bir neçə nəfər Əsma bintu Umeyyisin yanına daxil oldu.

O o günlərdə Əbu Bəkirn nigahı altında idi. Əbu Bəkr içəri daxil olduğunda onları gördü və bu , onun xoşuna gəlmədi. Gəlib bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdi və: "xeyirdən başqa bir şey görmədim."deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Şübhəsiz ki Allah Əsmanı bundan qorumuşdu. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərə qalxdı və belə buyurdu: "Bu gündən sonra heç kimsə yanında bir və ya iki kişi olmadan əri evdə olmayan qadının yanına daxil olmasın!" (Müslim / 2173).

### Qırx birinci fəsil: Qadın təbiətli kişilərin qadınların yanına girməsindən çəkindirmək.

46- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrinin yanına qadin təbiətli kişi girərdi. Onlar onu ehtiyac sahibi olmyanlardan sayardılar. Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içəri girdikdə , o bəzi qadınlarının yanında idi. O bir qadını vəsf edirdi və belə deyirdi: "Gəldiyi zaman dörd gəlir, getdiyində isə səkkiz gedirdi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Diqqət edin! Mən bunun burda nə olduğunu bildiyini görüürəm. Bir daha yanınıza girməsin!" Aişə (Allah ondan razı olsun) belə buyurdu: "və ona girməyi qadağan etdilər." (Müslim / 2181).

## Qırx ikinci fəsil: Yatmazdan əvvəl odu söndürmək.

1 - Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: " Mədinədə bir ailənin evi gecə yandı. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların halı haqda danışıldıqda, belə buyurdu: "Həqiqətən , bu od sizin düşməninizdir. Gecə yatdığınızda onu söndürün!" (Müslim / 2016).

## Ruqyə ( əli xəstə olan yerə uzərinə qoyaraq , şəfa olsun deyə , quran oxumaq) kitabı.

### Birinci fəsil: Cəbrailin (Ona Allahın salamı olsun) Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ruqyə etməsi.

1- Peyğəmbərin(Ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəstələndikdə onu Cəbrail ruqyə edir və belə deyirdi: "Səni sağaldan, hər xəstəlikdən sənə şəfa verən həsəd aparanın həsədinin şərrindən və hər bir şər nəzərdən səni qoruyan Allahın adıyla." (Müslim / 2185).

2- Əbd əl-Əziz İbn Suheyb, Əbu Nadradan, o da Əbu Səiddən (Allah ondan razı olsun) belə rəvayət edir: "Cabrail Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Muhəmməd , xəstələnmisən?" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli" deyə cavab verdikdə, Cəbrail belə dedi: "Allahın adıyla səni sənə əziyyət

verən hər bir nəfsin şərrindən, nəzərindən və həsədindən ruqya edirəm. Allah sənə şəfa verər. Allahın adıyla sənə ruqyə edirəm." (Müslim / 2186).

## İkinci fəsil: Sehr haqda və yəhudilərin Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sehr etmələri.

3- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Bəni Zureyq qəbiləsindən bir yəhudi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sehr etdi. Onun adı Ləbid ibn əl-Əsam idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etmədiyi bir şeyi sanki etmiş kimi xəyal olurdu. Bir gün və ya bir gecə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dua etdi , sonra yenə dua etdi , sonra yenə dua etdi , sonra belə buyurdu: " Ey Aişə , (Allah ondan razı olsun) Allahdan soruşduğum şey haqda onun mənə verdiyi fitvanı anladınmı? İki kişi gəldi və biri baş digəri isə ayaq tərəfimdə oturdu. Baş tərəfimdə olan ayaq tərəfimdə olana və ya ayaq tərəfimdə olan baş tərəfimdə olana belə dedi: "Kişinin ağrıları nədir? " O: "Sehr olunub" deyə cavab verdi. O biri: "Kim onu sehr edib?" deyə soruşdu. O: "Ləbid İbn Əsam" deyə cavab verdi. O biri: "Nə ilə?" deyə soruşdu. O: "Daraq və daraqdakı saçı erkək xurma tumurcuğunun içnə qoyaraq" deyə cavab verdi. O biri: "O haradadır?" deyə soruşdu. O: "Zi Ərvan quyusunda." deyə cavab verdi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabından bir neçə nəfərlə ora gəldi və belə buyurdu: "Ey Aişə , sanki quyunun suyu xınaya boyanmış, xurmaları isə şeytanın başı kimi idi." Mən: "Ey Allahın Elçisi onu yandıraqmı?" deyə soruşdum . O belə buyurdu: "Xeyr! Mənə Allah Təala artıq şəfa verib. Yalnız , insanlara pisliyi toxunar deyə , qorxuram. Mən əmr verərək onu basdırtdım." (Müslim / 2189).

## Üçüncü fəsil: Xəstənin üzərinə Muəvvizatı (əl-Fələq və ən-Nas surələri) surələrini oxumaq və üfürmək.

4- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ailəsindən kim isə xəstəlndikdə onun üzərinə üfürərək müəvvizatı oxuyardı. O vəfat etdiyi xəstəliyə düşdükdə mən onun üzərinə üfüləyir və onun üz əli ilə sürtürdüm. Çünki onun əli mənim əlimdən daha bərəkətli idi." (Müslim / 2192).

## Dördüncü fəsil: Allahın adıyla və Allaha sığınaraq ruqya etmək.

5- Osman İbn Əbu əl-Ass Əssaqfi (Allah ondan razı olsun) belə rəvayət edir: " O İslamı qəbul etdiyindən bəri bədənində olan ağrılardan Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şikayət etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: " Əlini bədənində ağrı hiss etdiyin yerə qoy! Sonra üç kərə Bismilləh (Allahın adıyla) de! Sonra isə yeddi kərə Əuzu billəhi və Qudratihi min şərri mə əcidu və uhəzir. (hiss etdiyim və şəkindiyim ağrıların şərrindən Allah sığınıram.)" Müslim / 2202).

## Beşinci fəsil: Namazda Vəsvəsə verən şeytanın şərrindən Allaha sığınmaq.

6- Əbu əl-Əla belə rəvayət edir: "Osman İbn Əbu əl-Ass Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi , şeytan mənimlə namazım arasına giridi və qiraətimdə çaşqınlıq yaratdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)

belə buyurdu: "Bu Şeytana , Xinzəb deyilir. Onu hiss etdiyində , ondan Allaha sığın və sol tərəfinə üç kərə tüpür." Mən onun dediyi kimi etdim və Allah Təala məndən onu apardı. (Müslim / 2203).

## Altıncı fəsil: Əqrəb sancdıqda Quranın anası adlanan əl-Fatihə surəsi ilə ryqyə etmək.

7- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən bir neçə insan səfərə çıxmışdı. Onalar ərəblərin olan ərazilərin birindən keçdikdə, onları qonaq kimi qəbul etmələrini istədilər. Onlar onları qonaq qəbul etmədilər. Sonra onlardan: " Qəbilənin başçısını əqrəb sançmışdır. İçinizdə ruqya edən varmı? " deyə soruşdular." Onlardan bir kişi: "Bəli var!" deyə cavab verdi. Onun yanına gələrək əl-Fahihə surəsini oxudu. Və kişi sağaldı. Ona bir sürü qoyun verdikdə o onu qəbul etmək istəmədi və: "Bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verməmiş götürmərəm." dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdi və belə buyurdu: "Ey Allahın Elçisi , mən yalnız əl-Fahihə surəsini oxumuşam." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülümsədi və belə buyurdu: "Onun ruqya olduğunu haradan bilidin? Sonra isə belə buyurdu: "onlardan onu qəbul et və mənə də özünüzlə birgə pay ayırın!" (Müslim / 2201).

## Yeddinci fəsil: Hər bir zəhərli olan heyvanın sançmasından ruqya etmək.

8- əl-Əsvad belə rəvayət edir: "Aişədən (Allah ondan razı olsun)ruqya haqda soruşdum?" Belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarlardan olan bri ailəyə Hər bir zəhrli olan heyvanın sançmasından ruqya etməyə izn verdi." (Müslim / 5741).

## Səkkizinci fəsil: Sıraca xəstəliyindən ruqya etmək.

9- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) göz dəyməsindən, zəhərli heyvanın sancmasından və sıraca xəstəliyindən ruqya etməyə izn verdi."

## Doqquzuncu fəsil: Əqrəb sancmasından ruqya etmək.

10-Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ruqya etməyi qadağan etdi. Amr İbn Həzm Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə buyurdular: "Bizm bir ruqyamız vardı. Əgrəb sancdıqda onu oxuyardıq. Sən isə onu qadağan etmisən." Sonra onlar onu ona göstərdilər və o belə buyurdu: "Bunda bir şey görmürəm. Sizlərdən hər kim qardaşına fayda verə bilirsə , versin!" (Müslim / 2199).

11-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına bir kişi gələrək belə buyurdu: "Ey Allahın Elçisi , dünən gecə məni sancan əqrəbdən nələr çəkdiyimi bir bilsən." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Dünən axşamladıqda belə desəydin: "Əuzu bi kəlimtilləhi min şərri mə xaləq." (Xəlq etdiklərinin şərrindən Allahın kəlimələrinə sığınıram) sənə bir zərər toxunmazdı." (Müslim / 2709).

Onuncu fəsil: Nəzər haqqdır. Sizdən qüsl tələb olunarsa yuyunun!

12-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Nəzər haqqdır. Qədəri qabaqlayan bır şey olsa idi , bu , nəzər olardı. Sizdən qüsl tələb olunarsa yuyunun!" (Müslim / 2188).

On birinci fəsil: Nəzərdən ruqya olunmaq haqda.

13-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə nəzrədən ruqya etməyimi əmr etdi." (Müslim / 2195).

14-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həzmin ailəsinə ilan sancmasından ruqya etməyə izn verdi. O Əsma bintu Umeyyisə belə buyurdu: " Mən nə olub qardaşım övladlarının cisimlərini zəif görürəm. Onların nəyə isə ehtiyacları var?" Əsma(Allah ondan razı olsun) belə cavab verdi: " Xeyr! Lakin onlara tez nəzər dəyir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Onlara ruqya et!" deyə buyurdu. Mən bunu ona ərz etsəm də O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sən ruqya et!" deyə buyurdu." (Müslim / 2198).

On ikinci fəsil: Nəzərdən ruqya etmək.

15-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi olan Ummu Sələmə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi olan Ummu Sələmənin (Allah ondan razı olsun) evində olan bir cariyənin üzündə sarılıq gördü və belə buyurdu: "Buna nəzər dəymişdir. Onu ruqya edin!" (yəni üzündə sarılıq vardı.) (Müslim / 2197).

On üçüncü fəsil: Yerin torpağı ilə ruqya etmək haqda.

16-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir insan Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir şeydən, yaradan və ya yaralandıqda şikayət etdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) barmağı ilə belə edərdi: "Sufyan işarə barmağını yerə qoydu sonra qaldıraraq belə buyurdu: "Allahın adı ilə, yerimizin torpağı ilə, bəzimizin tüpürcəyi ilə , xəstəmiz bununla , Rəbbimizin izni ilə sağalsın!" İbn Əbu Şeybə belə buyurmuşdur: "Xəstəmiz sağalsın!" Zuheyr isə belə buyurmuşdur: "Xəstəmiz bununla!" (Müslim /2194).

17-Xovlə bintu Həkim əs-Suləmi  (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Kim bir yerə endikdən sonra: "Əuzu bi kəlimtilləhi min şərri mə xaləq." (Xəlq etdiklərinin şərrindən Allahın kəlimələrinə sığınıram) o yerdən gedənə kimi ona bir zərər toxunmaz." (Müslim / 2708).

On dördüncü fəsil: Kişinin ailəsi xəstələndikdə onları ruqya etməsi haqda.

18- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ bizdən kimsə xəstələndikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sağ əli ilə onu məsh (sığallar) edər sonra isə belə deyərdi: "Ey insanların Rəbbi , rahatsızlığı apar! Şəfa ver şəfa verən sənsən! Sənin Şəfandan başaqa şəfa yoxdur. Xəstəlik qalmayan bir şəfa ver!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəstələndikdə onun əlindən tutdum və ona bizə etdiyi kimi etmək istədim. O əlini əlimdən çəkərək belə buyurdu: "Allahım , məni bağışla! Məni "Rafiq əl-Əla" ilə bəabər et!" Mən bir ona baxım dedim və artıq onun dünyasını dəyişdiyini gördüm. (Müslim /2191).

19- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu ruqya ilə ruqya edərdi: " Ey insanların Rəbbi , rahatsızlığı apar! Şəfa sənin əlindədir! Səndən başaqa onu aparan yoxdur." (Müslim /2191).

### On beşinci fəsil: İçərsində şirk olmayan şeylərlə ruqya etməkdə bir günah yoxdur.

20- Ovf ibn Malik əl-Əşcai (Allah ondan razı olsun) belə rəvayət edir: " Biz cahiliyyə zamanında ruqya edərdik. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Buna necə baxırsan?" deyə soruşduq? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə burdu: "mənə ruqyalarınızı ərz edin! İçərsində şirk olmayan şeylərlə ruqya etməkdə bir günah yoxdur." (Müslim /2200).

## Xəstəlik və Tibb kitabı

### Birinci fəsil: Möminin başına gələn xəstəlik və ağrılar.

1- Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına daxil oldum. O ağır xəstə idi. Əlimlə ona tounaraq belə dedim: "Ey Allahı Elçisi , sən şiddətli bir qızdıma və iztirab içindəsən!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "Bəli , mən sizdən iki kişinin qızdırma və iztirab keçirdiyi kimi iztirab keçirirəm." Mən Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Buna görə sənə iki savab olmalıdır." Dedim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli!" deyə cavab verdi, sonra isə belə buyurdu: "Xəstəlik və ya başqa bir şeydən dolayı əziyyətə düçar olan elə bir müsəlman yoxdur ki, Allah Təala onunla onun günahlarını ağac yarpaqlarını tökdüü kimi tökməsin." (Müslim / 2571).

### İkinci fəsil: Xəstəni ziyarət etməyin fəziləti.

2- Sovban (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur:" Həqiqətən , müsəlman olan kimsə , müsəlman qardaşının ziyarətində olduğu müddətdə , geri dönənə kimi Cənnət xurmalıqındadır." (Müslim / 2568).

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Allah Təala Qiyamət günü belə buyuracaqdır: "Ey Adəm övladı , xəstələndim ziyarətimə gəlmədin! O belə deyəcəkdir: "Ey Rəbbim , səni necə ziyarət edim ? Sən aləmlərin Rəbbisən!" Allah Təala belə buyuracaq: "Məgər filan bəndəmin xəstə olduğunu bilmirdin ?

Onu ziyarət etmədin! Məgər sən onu ziyarət etdiyində məni onun yanında tapacağını bilmirdin? Ey Adəm övladı , səndən yemək istədim , məni doyurmadın!" O belə deyəcəkdir: "Ey Rəbbim , səni necə doyura biərdim ? Sən aləmlərin Rəbbisən! Allah Təala belə buyuracaq: "Məgər filan bəndəmin səndən onu doyurmanı istədiyini bilmirdin? Onu doyurmadın! Məgər sən onu doyurduqda bunu mənim dərgahımda tapacağını bilmirdin? Ey Adəm övladı , səndən su istədim mənə su vemədin! Allah Təala belə buyuracaq: "Məgər filan bəndəmin səndən su istədiyini bilmirdin? Ona su vermədin! Əgər sən ona su versəydin , bunu mənim dərgahımda tapardın!" (Müslim /2569).

## Üçüncü fəsil: Nəfsim xəbisləşdi demə!

4- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Sizlərdən biriniz nəfsim xəbisləşdi deməsin! Lakin nəfsim pisləşdi (ağırlaşdı) desin! "(Müslim / 2250).

## Dördüncü fəsil: Hər bir xəstəliyin bir dərmanı var.

5- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " Hər bir xəstəliyin bir dərmanı var. Əgər dərman xəstəliyə toxunarsa , Allahın izni ilə şəfa tapar." (Müslim /2204).

## Beşinci fəsil: Qızdırma Cəhhənəmin kükrəməsindəndir , onu su ilə sərinləşdirin!

6- Əsma (Allah ondan razı olsun) belə rəvayət edir: " Onun yanına qızdırmalı bir qadın gətirildiyində, o su istəyər və onu qadının sinəsinə tökərək belə deyərdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " Onu su ilə sərinləşdirin! Həqiqətən , o Cəhhənəmin kükrəməsindəndir." (Müslim /2211).

## Altıncı fəsil: Qızdırma günahları aparır.

7- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ummu Saibin və ya Ummu əl-Museyyibin yanina daxil oldu və belə buyurdu: " Sənə nə oldu , Ey Ummu Saib və ya Ummu əl-Museyyib , titrəyirsən?" O: "Qızıdırma, Allah xeyr verməsin!" deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Qızdırmanı söymə! O , Adəm övladının günüahlarını , körük dəmirin pisliyini apardığı kimi , aparır." (Müslim / 2575).

## Yeddinci fəsil: Epilepsiya (özündən getmə xəstəliyinin bir növü) və onun savabı haqda.

8- Ata İbn Əbu Rabah belə rəvayət edir: " Abdullah ibn Abbas (Allah ondan razı olsun) mənə belə dedi: " Sənə cənnət əhlindən olan bir qadını göstərimmi?" Mən: "Bəli!" deyə cavab verdikdə, o belə buyurdu: "Bu qara qadın Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: " Mən epilepsiya (özündəngetmə xəstəliyinin bir növü) oluram və (paltarım) açılıram. Allaha mənim üçün dua et!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "İstərsənsə , səbr et və sənin

üçün cənnət vardır. İstərsənsə də , Allah sənə şəfa versin deyə , dua edərəm." Qadın: "Səbr edərəm!" deyə cavab verdi sonra isə belə dedi: "Mən açılıram , Allaha dua et ki açılmayım!" və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün dua etdi." (Müslim / 2576).

## Səkkizinci fəsil: Sıyıq xəstənin qəlbini rahat edər.

9- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi olan Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " onun ailəsindən kim isə öldükdə , qadınlar yığışardılar. Sonra dağılaraq gedər və yalnız yaxınlar, ailə üzvləri qaldıqda bir saxsı qabda sıyıq bişirilməsini əmr edər və bişirilərdi. Sonra Sərid adlanan duru yemək bişirərək sıyığı onu üzərinə tökərdilər. Sonra onlara belə deyərdi: "Ondan yeyin! Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sıyıq xəstənin qəlbini rahat edər. Onun bəzi kədərini aparar " dediyin eşitmişəm." (Müslim /2216).

## Doqquzuncu fəsil: Bal şərbəti ilə müalicə etmək.

10-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: " Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: " qardaşım qarın ağrısına düşüb." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "ona bal içirt!" deyə buyurdu. O ona içirtdi , sonra onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək: "Mən ona içirtdim , yalnız bu , onun qarın ağrısını daha da artırdı." deyə söylədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona üç kərə "ona bal içirt!" deyə buyurdu. Kişi dördüncü kərə gəldiyində , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona:"ona bal içirt!" deyə buyurduqda, kişi: " Mən ona içirtdim , yalnız bu onun qarın ağrısını daha da artırdı." deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah Təalə doğru, qardaşının qarnı isə yalan dedi." Sonra kişi ona içirtdi və o sağaldı." (Müslim / 2217).

## Onuncu fəsil: Qara çörək otu (zirə) ilə müalicə etmək.

11-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " zirə toxumunda ölümdən başqa hər bir xəstəliyə şəfa vardır. Zirə yəni (qara çörək otu). (Müslim / 2215).

## On birinci fəsil: Hər kim səhər Əcva adlanan xurma yeyərsə , ona nə sehr nə də zəhət toxunmaz.

12-Səid ibn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: " Hər kim səhər Əcva adlanan yeddi xurma yeyərsə , ona həmən günü nə sehr nə də zəhət toxunmaz." (Müslim / 155- 2047 –dən sonra).

13-Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "əl-Əliyə (yer adı) Əcvasında (xurma növü) şəfa vardır.o səhərin ilk çağının padzəhəridir." (Müslim /20480.

## On ikinci fəsil: Göbələk nemətdəndir və suyu göz üçün şəfadır.

14- Səid İbn Zeyd (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Göbələk Allah Təalanın Musaya nazil etdiyi nemətdəndir və suyu göz üçün şəfadır." (Müslim / 2049).

On üçüncü fəsil: Hindi udu ilə müalicə. O əl-Kistdir (şabalıd ağacı).

15- Ubeydullah İbn Abdullah İbn utba İbn Məsud belə rəavyət edir: "Ummu Qeys Bintu Mihsan (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) beət edən birinci mühacir qadınlardan idi. O Bəni Əsəd İbn Xuzeymə qəbiləsindən olan Ukaşə İbn Mihsanın bacısı idi. O mənə hələ yemək yeyə biləcək həddə çatmayan bir oğlu ilə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dediyini rəvayət etmişdir: "oğlanın boğazındakı yaranı barmağı ilə sıxmışdı. (Yunus belə demişdir: "sıxmışdı yəni basmışdı. O onun boğazında yara olmasından qorxmuşdu." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Siz uşaqlarınızı nə üçün bu cür müalicə edirsiniz? Bunu Hind udu (çubuq) (yəni: " əl-Kist (şabalıd ağacı)." ilə müalicə edin. Həqiqətən , onda yeddi şəfa vardır. Ondan biri Zət əl-Cənb adlana xəstəlikdir." Ubeydullah belə demişdir: "Qadın mənə oğlunun Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qucağına bövl etdiyini söyləmiş və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) su istəyərək onu qucağına səpmiş və yumamışdır." (Müslim /287- 2214 sonra).

On dördüncü fəsil: Lədud (xəstanın ağzının bir tərəfindən axıdılan və ya barmaqla sü-rtülüb ovuşturulan dərman) ilə müalicə.

16- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəstləndikdə , onu Lədud ilə müalicə etdik. O , (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona Lədud sürtməyək deyə ,bizə işarə etdi." Biz xəstəninləduddan xoşlanmadığı üçün belə etdiyini söylədik." O ayıldıqda belə buyurdu: "Sizlərdən lədud sürülməmiş bir kimsə qalmasın! Yalnız Abbas müstəsnadır. Çünki o sizi görməmişdir!" (Müslim /2213).

On beşinci fəsil: Hicamə (qan almaq) etmək və burunna dərman damcılatmaq.

17- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hicamə (qan almaq) etdirdi, hicamə edənin pulunu verdi və burnuna dərman damcılatdı." (Müslim / 1202- 2208 dən sonra).

On altıncı fəsil: " Hicamə və dağ vurmaqla müalicə.

18- Asim ibn Ömər İbn Qatədə belə rəvayət edir: "Biz ailəmizlə ikən yanımıza Cabir ibn Abdullah (Allah onların hər ikisindən razı olsun) gəldi. Bir kişi əlindəki çiban və yaxud yaradan şikayət edirdi. Cabir ona: "Nədən şikayət edirsən?" deyə soruşdu. Kişi: "Əlimdəki çiban mənə çox əziyyət verir." deyə cavab verdikdə, O belə buyurdu: "Ey oğlan , mənə bir hicamə edən çağır." Kişi ona: "Ey Abdullah , hicamə edəni nə edəcəksən?" deyə söylədikdə, O: "Oraya bir hicamə süşəsi qoyacağam." deyə cavb verdi. Kişi belə dedi: "Allaha and olsun ki , mənim üzərimə

milçəklər qonur və ya paltarıma ilişərək mənə əziyyət edir. Bu mənə ağır gəlir." Cabir kişinin bundan diksindiyini gördükdə , belə buyurdu: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Əgər sizin dərmanlarınızın hansındasa bir xeyir varsa , bu neştər (cərrah bıçağının) vuruşunda (hicaməsində) və ya bal şərbətində və ya odla dağlamadadır." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən dağ çəkməyi sevmirəm." Sonra bir hicamə edən gətirərək onu neştərlə kəsdi və ondan çəkdiyi ağrılar itdi." (Müslim 2205).

19- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: " Ummu Sələmə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hicamə etmək üçün izn istəi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Taybəyə onu hicamə etməsini əmr etdi." mən onun belə dediyini hesab edirəm: "o onun süd qardaşı və ya həddi buluğa çatmamış uşaq idi." (Müslim /2206).

On yeddinci fəsil: Damar kəsərək və dağ vuraraq müalicə etmək.

20- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ubey İbn Kaabın yanına bir həkim göndərdi və o ondan bir damar kəsdi , sonra ora dağ çəkdi." (Müslim / 2207).

On səkkizinci fəsil: Yaranı dağ çəkməklə müalicə etmək.

21- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: " Saad İbn Muaz venasından yaralandı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu əlindəki uzun dəmirlə dağladı. Sonra o yer şişdikdə , ikinci kərə də dağladı." (Müslim / 2208).

On doqquzuncu fəsil: Araqla (spirtli içki) müalicə.

22- Vail əl-Xadrami belə rəvayət edir: "Tariq İbn Suveyd əl-Cufi (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) araq haqda soruşdu? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona qadağan etdi və ya onu düzəltməyi bəyənmədi. O: "Mən onu müalicə üçün düzəldirəm." dedikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " O dərman deyildir. Lakin o xəstəlikdir. (Dərddir)" (Müslim /1984).

# Taun kitabı

Birinci fəsil: Taun haqda. Onun pislik olması. O olan yerə girməyi və ondan qaçmaq üçün oradan çıxmayın!

1- Usəmə İbn Zeyd (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Bu xəstəlik və ya ağrı pislikdir. Onunla sizdən öncəki bəzi ümmətlərə əzab verilmişdir. Sonra ondan nə isə yer üzündə qalmışdır. Bəzən gedər , bəzən isə gələr. Sizlərdən kimsə onun bir torpaqda olduğunu eşidərsə , ora girməsin! (getməsin), və hər kim o olan bir torpaqdadırsa , ondan qaçmaq üçün oradan çıxmasın!" (Müslim /2228).\

2- Abdullah İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Ömər İbn əl-Xattab (Allah ondan razı olsun) Şama doğru yola çıxdı. Sarağ adlana yerə çatdıqda əl-Əcnad əhli yəni Əbu Ubeydə və əshabı (Allah onlardan razı olsun) onunla qarşılaşdı və ona Şamda vəba olduğunu xəbər verdilər. Ömər (Allah ondan razı olsun) belə buyurdu: "Mənə ilk mühacirləri çağırın!" Onları çağıraraq onlarla müşavirə etdi və Şamda vəba olduğunu onlara xəbər verdi. Onlar öz aralarında ixtilaf etdilər: onlardan bəziləri: "Sən bu iş üçün çıxmısan , ondan geri qayıtmanı məsləhət görmürük." dedilər. Başqaları isə belə dedilər: "Səninə başqa insanlar və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri var , onları vəbanın üzərinə aparmağını məsləhət görmürük." O onlara: "Yanımdan qalxın!" deyə buyurdu, sonra: "Mənə ənsarları çağırın deyə buyurdu. Onları çağıraraq onlarla müşavirə etdi. Onlar da mühacirlərini tütduğu mövqedə oldular və onlar kimi ixtilaf etdilər. O onlara: "Yanımdan qalxın!" deyə buyurdu. Sonra: "Mənə Qureyşin yaşlılarını və Məkkə fəthində hicrət edənləri çağırın!" deyə əmr etdi."Onları çağırdı və onlardan iki kişi olsun belə ixtilaf etmədi. Onlar belə dedilər: "Biz sənin insanlarla qayıtmanı məsləhət görürük. Onları bu vəbaya tərəf aparma!" Ömər insanlara səslənərək belə buyurdu: "mən səhəri minik üzərində açacağam. Siz də minin! Əbu Ubeydə İbn əl-Carrah ona: "Allahın qədərindən qaçırsan?" deyə söylədikdə, O belə buyurdu:" kaş ki ,bunu səndən başqası desəydi , Ey Əbu Ubeydə. Ömər onun müxalif olmasından xoşlanmırdı və belə buyurdu: " Bəli , Allahın qədərindən qədərinə qaçırıq. Məgər sənin dəvələrin olsa və onlar iki tərəfli , biri quraq , digəri verimli (yaşıllıq) bir vadıyə ensə , sən onları verimli yerdə otlatsan , Allahın qədəriylə otlatmış və quraq yerdə otlatsan Allahın qədəriylə otlatmış olmazsan? Bu vaxt Əbd ər-Rahman İbn Ovf gəldi. O ehtiyacından dolayı yox idi. O belə buyurdu: "Məndə bu haqda elm var: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: " Onun bir torpaqda olduğunu eşidərsinizsə , ora girməyin! (getməyin), o bir torpaqda olarsa və siz orada olarsınızsa , ondan qaçmaq üçün oradan çıxmayın!" Ömər (Allah ondan razı olsun) Allaha həmd edərək çevrilib getdi." (Müslim / 2219).

# Uğursuzluq (bəd əlamətlər, nişanələr) və yoluxucu xəstəliklər kitabı.

### Birinci fəsil: Yoluxucu xəstəliklər yoxdur, uğursuzluq (bəd əlamətlər,nişanələr) yoxdur, qarın qurdu yoxdur, bayquş yoxdur.

1- Əbu Sələmə İbn Əbd ər-Rahman Əbu Hüreyrənin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): " Yoluxucu xəstəliklər yoxdur, qarın qurdu yoxdur, bayquş yoxdur." dedikdə, bir bədəvi çöl ərəbi belə dedi: "Ey Allahın Elçisi , elə isə necə olur ki , dəvələr qumluqda ikən maral kimi olur , sonra aralarına qotur bir dəvə girdikdə, hamsı qotura yoluxur?" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Yaxşı , elə isə birincini kim yoluxdurdu?" başqa rəvayətdə isə belə dedyilir: " Yoluxucu xəstəliklər yoxdur, uğursuzluq (bəd əlamətlər,nişanələr) yoxdur, qarın qurdu yoxdur, bayquş yoxdur." (Müslim /222).

### İkinci fəsil: Xəstələnən heyvan sahibi sağlam heyvan saibinin yanıana heyvanını gətirməz.

2- İbn Şihab belə rəvayət edir: " Əbu Sələmə İbn Əbd ər-Rahman ibn Ovf (Allah ondan razı olsun) belə buyurur: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: " Yoluxucu xəstəliklər yoxdur." Həmçinin Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu söyləyir: " Xəstənən heyvan sahibi sağlam heyvan saibinin yanıana heyvanını gətirməz." Əbu Sələmə belə demişdir: "Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu iki hədisi danışırdı. Sonra isə O: " Yoluxucu xəstəliklər yoxdur." Hədisni danışmadı və : " Xəstənən heyvan sahibi sağlam heyvan saibinin yanıana heyvanını gətirməz." Hədisini rəvayət etməkdə davam etdi. Əbu Hüreyrənin (Allah ondan razı olsun) əmisi oğlu olan əl-Haris İbn əbu Zubəb ona belə buyurdu: "mən sənin bu hədislə yanaşı başa hədis danışdığını eşitmişəm indi isə onun haqda susursan?! Sən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu: " Yoluxucu xəstəliklər yoxdur." danışırdın. Əbu Hüreyrə (Allah ondan razı olsun) bu hədisi tanımaqdan imtina etdi və: " Xəstənə heyvan sahibi sağlam heyvan saibinin yanıana heyvanını gətirməz." Hədisini danışdı. əl-Haris bu xüsusdakı görüşünü qəbul etmədi və və nəhayət qəzəblənərək Həbəşicə nəsə söylədi. Sonra əl-Harisə: "Nə dediyimi anladınmı?" deyə soruşdu. O: "Xeyr!" deyə cavab verdikdə, Əbu Hüreyrə (Allah ondan razı olsun): "Mən imtina etdim!" dedim" Əbu Sələmə belə buyurmuşdur: " And olsun ki , Əbu Hüreyrə (Allah ondan razı olsun) bizəPeyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): " Yoluxucu xəstəliklər yoxdur." dediyini danışırdı. Bilmirəm Əbu Hüreyrə (Allah ondan razı olsun) unundub və ya iki sözündən bir nəsx olunub." (Müslim /2221).

## Üçüncü fəsil: Ulduz batması yoxdur.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Yoluxucu xəstəliklər yoxdur, bayquş yoxdur, ulduz batması yoxdur, qarın qurdu yoxdur."

## Dördüncü fəsil: Ğul (Qəzəbli, pis ruhlar, əcinələr) yoxdur.

4- Cabir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Yoluxucu xəstəliklər yoxdur, uğursuzluq (bəd əlamətlər,nişanələr) yoxdur, ğul (Qəzəbli, pis ruhlar, əcinələr) yoxdur." (Müslim / 2222).

## Beşinci fəsil: Yoluxmuş insandan uzaq durmaq.

5- əş-Şərid (Allah ondan razı olsun) belə rəvayət edir: " Bəni Səqif qəbiləsinin nümayəndələrinin içində cüzamlı bir kişi vardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanına adam göndərədk ona: "Biz səndən beyətini qəbul etdik qayıt!" buyurdu." (Müslim /2231).

## Altıncı fəsil: Gözəl fal haqda.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “uğursuzluq (bəd əlamətlər,nişanələr) yoxdur, onun ən xeyirlisi faldır." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizdən birinizin eşitdiyi gözəl sözdür." (Müslim / 2223).

### Yeddinci fəsil: Uğursuzluq ev, qadın və atdadır.

7- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Əgər uğursuzluq naminə haqq bir şey varsa bu at, qadın və evdədir."

8- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Əgər bir şeydə (uğursuzluq) varsa o ev, xidmətçi və atdadır."

# Kahinlik kitabı

### Birinci fəsil: Kahinlərin yanına getməyin və xətt haqda.

1- Muaviyə ibn Əl- Həkəm (Allah ondan razı olsun) belə rəvayət edir: " Bir dəfə mən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılarkən camatdan bir kişi asqırdı. Mən Ona: " Yarhəmuk Allah (Allah sənə rəhm etsin)." Dedim. Cammat gözlərini mənə zillədi. Mən:"Vay olsun mənə, sizə nə olub ki , mənə belə baxırsınız? " dedikdə, onlar əllərini budlarına vurdular. Mən onların məni susdurmaq istəmələrinə qəzəbləndim , lakin susdum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) , atam anam ona fəda olsun , ondan yaxşı öyrədən bir müəllim görmədim, məni nə azarladı, nə döydü, nə də söydü. Namazı bitirdikdən sonra belə buyurdu: "Bu namazdır, onun içində insan danışan sözlərdən heç nə caiz deyildir. Onda yalnız Təsbih (sübhənallah), Təkbir (Allahu Əkbər) və Quran oxumaq caizdir. Və ya Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurduğu kimi." Mən: "Ey Allahın elşisi , mən cahillikdən təzə çıxmışam və Allah təala bizə bu İslam dinini bəxş edib. Bizdən bəzi kişilər kahinlərin yanına gedirlər" dedikdə, O belə buyurdu: "onların yanına getmə" sonra belə dedim: " Bizdən bəzi kişilər işin nəhs gətirməsinə inanırlar." O belə buyurdu: "Bu onların içindən gələn bir şeydir , nə badə bu onları ( İbn Sabbah demişdir: "Sizi") düz yoldan azdırmasın." Mən: "Bizdən bəzi kişilər xətt çəkirlər" deyə buyurduqda, O belə dedi: "Peyğəmbərlərdən bəziləri də xətt çəkirdilər. Hər kim onların xəttinə müafiq düşünərsə düzgün etmiş olar." Sonra isə (Muaviyə ibn Əl- Həkəm) belə dedi: " Mənim bir kənizim vardı. Uhud dağı və Cəvvaniyyə deyilən yerdə mənim qoyunlarımı otarırdı. Bir gün baxdım ki, qoyunlarımdan birini canavar aparıb. Mən də adəm ovladıyam , hamının heyfsləndiyi kimi heyfslənirəm. Lakim mən ona bir sillə vurdum. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim. Bu mənə çox ağır gəlmişdı. Bu üzdən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , onu azad edim?" deyə soruşduqda, "Onu bura gətir" deyə buyurdu. Onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim. Ondan belə soruşdu: "Allah haradadır?". O: "Səmada" deyə cavab verdikdə, O , yenə sourşdu: "Mən kiməm?" O: "Sən -Allahın Elçisi" deyə cavab verdikdə, Mənə: "Onu azad et , o , mömindir" deyə buyurdu." (Müslim / 537).

### İkinci fəsil: Cinlərin nəyi hifz etdiklər haqda.

2- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Bir neçə insan Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kahinlər barəsində soruşdu.Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)

onlara belə buyurdu:" Onlar heç bir şeydirlər." Onlar belə dedilər: "Ey Allahın Elçisi , bəzən onların danışdıqları haqq olur." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu haqq kəlimə cinlərdəndir. Onlar bunu oğurlayaraq vəlisinin qulağına toyuğun qaqqıldadığı kimi qaqqıldayarlar və onunla yanaşı yüzdən çox yalan söyləyərlər." (Müslim /2228).

Üçüncü fəsil: Şeytanların (mələklərin söhbətinə) xəlvəti qulaq asdıqda (oğurladıqda) ulduzla vurulması.

3- Abdullah İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarlardan olan səhabələrindən bir kişi, başqa bir rəvayətdə isə kişillər belə xəbər verdi: "Onlar bir gecə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə oturduqlarında bir ulduz düşərək aydınlandı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: "Siz cahilliyə dövründə bunun kimi ulduz düşdükdə nə deyirdiniz?" Onlar belə dedilər: "Allah və Elçisi bilən yaxşıdı. Biz bu gecə bir əzəmətli insan anadan olub və ya ölüb." deyərdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O , kiminsə ölümü və ya həyatına görə düşmür. Allah Təalə bir işi əmr etdikdə Ərşi daşıyan mələklər təsbih edər, sonra onlardan sonra gələn səma əhli təsbih edər və nəhayət bu təsbih dünyanın səmasının əhlininə gəlib çatar. Sonra Ərşi daşıyan mələklərdən sonra gələn səma əhli Ərşi daşıyan mələklərə: "Rəbbiniz nə dedi?" deyə söyləyərlər. Onlar da xəbər verər. Beləcə səma əhli bir- birinə xəbər verə-verə nəhayət , xəbər gəlib dünya səmasının əhlinə çatar. Cinlər bu söhbəti oğurlayaraq öz vəlilərinə çatdırarlar və onlar bununla (ulduzla) vurularlar. Onu necə var elə çatdırsalar , bu haqq olar. Lakin onlar onu qarışdırır və artırırlar." (Müslim / 2229).

Dördüncü fəsil: Kahinin (bilicinin, baxicinin) yanına gedənin namazı qəbul olunmaz.

4- Sfiyyə bintu Əbu Ubeyd Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bəzi zövcələrindən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu rəvayət edir: "Hər kim bir kahinin (bilicinin, baxıcının) yanına gedər və ondan bir şey soruşarsa , onun qırx gün namazı qəbul olunmaz." (Müslim / 2230).

# İlanlar və başqa bu kimi canlılar kitabı.

Birinci fəsil: Evdə olan ilanların öldürülməsinin qadağan olması.

1- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) itləri öldürməyi əmr etdiyini eşitdim belə buyururdu: "İlanlarla itləri öldürün! İki çizgili ilanı və qısa quyruqlu ilanı öldürün! Çünki onlar gözü çıxarır və hamilə qadının uşağını salarlar." Zuhri belə demişdir: "Biz bunu , Allah bilir , bu iki ilnaın zəhərindən zənn edirdik. " Səlim belə demişdir: "Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Artıq mən gördüyüm hər bir ilanı öldürməmiş buraxmırdım. Bir gün mən evdə olan ilanlardan birini qovarkən Zeyd İbn əl-Xattab və ya Əbu Lubəbə yanımdan geçdi. Mən onu qovalayırdım. O mənə belə buyurdu:" Yavaş ol , Ey Abdullah!" Mən ona Peyğəmbərin (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) onları öldürməsini əmr etdiyi şöylədim." O mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evdə olan ilanların öldürülməsini qadağan etdiyini dedi."

## İkinci fəsil: Cinə (damdabaca, evdə olan ilan) üç gün xəbərdarlıq etmək.

2- Hişam İb Zuheyrin (Allah ondan razı olsun) mövlası olan Əbu əs-Səib belə rəvayət edir: "O Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) evində ikən yanına daxil oldu. Onun namaz qıldığını gördüm və oturub onun namazını bitirməsini gözlədim. Birdən evin bir küncündə ağaç çırpısı arasında bir hərəkət eşitdim. Baxdığımda onun ilan olduğunu gördüm. Onu öldürmək üçün sıçradığımda o mənə: "Otur!" deyə işarə etdi və mən oturdum. Namazı biridikdən sonra oradakı bir evə işarə edərək belə buyurdu: " Bu evi görürsənmi?" Mən: "Bəli." deyə cavaab verdikdə, belə buyurdu: "Bu evdə bizdən olan təzə evlənmiş bir cavan vardı. Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə xəndək döyüşünə çıxdıq. Bu cavan günün yarsında Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) izn alaraq ailəsinin yanına qayıdardı. Bir gün yeə izn istədikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Silahını da özün ilə götür! Mən Qureyzə qəbiləsinin sənə bir şey etməsindən qorxuram." deyə buyurdu. Kişi silahını aldı və getdi. Qadının qapının arxasında dayandığını gördü. O bunu qeyrətinə sığışdırmadı və nizəsinə qurşanaraq qadına batırmaq üçün onun üzərinə getdi. Qadın ona: "Süngünü çək , və evə daxil ol və məni nəyin çıxardığını bir gör!" deyə buyurdu. O içəri daxil olduğunda yekə bir ilanın döşəyin üzərində yatdığını gördü. Ona hücum edərək onu nizə ilə vurdu və işini bitirdi. Sonra çıxaraq nizəsini həyətə batırdıqda ilan onun üzərinə atıldı. Onlardan kimin ilanın və ya onun ilk öldüyü bilinmədi. Biz Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdik və belə dedik: "Allaha dua et onu bizim üçün diriltsin!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu:" Allahdan yoldaşınız üçün bağışlanma diləyin!" sonra isə belə byuyrdu:" Həqqiqətən Mədinədə İslamı qəbul etmiş cinlər vardır. Onlardan birini gördükdə , ona üç gün xəbərdarlıq edin. Sonra yenə görünsə onu öldürün!" (Müslim / 2236).

## Üçüncü fəsil: İlanları öldürmək.

3- Abdullah İbn məsud (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə bir mağarada idik. Ona "əl-Mursəlat" surəsi nazil olmuşdu. Biz onu hələ yaş-yaş onun ağzından götürürdük. Birdən yanımıza bir ilan çıxdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onu öldürün!" deyə buyurdu. Biz onu öldürmək üçün cəld davrandıq. Lakin ilan bizdən tez qaçdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah Təala sizi onun şərrindən qoruduğu kimi, onu da sizin şərrinizdən qorudu." (Müslim \ 2234).

## Dördüncü fəsil: Kərtənkələ öldürmək haqda.

4- Saad İbn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kərtənkələni öldürməyi əmr etdi və onu fasiqlik adlandırmışdır." (Müslim / 2238).

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Kim kərtənkələni birinci zərbə ilə öldürərsə , ona bu və bu savab vardır. Və kim onu ikinci zərbə ilə öldürərsə , ona bu və bu savab vardır. Birincidən az. Əgər onu üçüncü zərbədə öldürərəsə , ona bu və bu savab vardır. İkincidən az." Başqa rəvayətdə isə belə deyilir: "Kim kərtənkələni birinci zərbə ilə öldürərsə ona yüz savab vardır. İkinci zərbə birincidən az. Üçüncü zərbədə ondan az." (Müslim 2240).

## Beşinci fəsil: Qarışqanı öldürmək haqda.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Peyğəmbərlərdən biri bir ağac altına endi və onu bir qarışqa sancdı. Əşyalarını əmr etdi və altından çıxarıldı. Sonra onu (qarışqa yüvasının) yandırılmasını əmr etdi və yandırıldı. Allah Təala ona: "Bir qarışqa yandırsaydın." Deyə vəhy etdi." (Müslim /2241).

## Altındcı fəsil: Pişik öldürmək haqda.

7- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bir qadına pişiyə görə əzəzb verildi. Onu ölənə kimi həbs etdi və ona görə Cəhənnəmə daxil oldu. Onu həbs etdiyində nə özü yedizdirib içizdirmədi, nə də ki ,yer üzünün həşaratlarından yesin deyə ,onu buraxmadı." (Müslim / 2242).

## Yeddinci fəsil: Siçan və onun Məsx (çevrilmiş (döndərilmiş)) olması haqda.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Bəni İrasildən olan bir ümmət itdi. Onun nə etdiyi bilinmədi. Mən onun ancaq siçan olduğunu düşünürəm. Məgər siz onun qabağına dəvə südü qoyulduqda içmədiyini, qoyun südü qoyulduqda içdiyini görmürsünüz ?" Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurdu: "Mən bu hədisi Kaaba danışdım." O mənə: "Sən bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitmisən?!" Mən: "Bəli!" deyə cavab verdim. O bunu dəfələrcə təkrar etdi. Mən ona: "Tövratı oxuyum dedim." Başqa rəvayətdə isə belə dedyilir: "Məgər mənə Tövrat nazil olub?" (Müslim / 2997).

## Səkkizinci fəsil: Heyvanlara su vermək.

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " bir kişi yol ilə gedərkən susuzluğu artdı. Bir quyu tapdı. Ora düşərək su içdi və sonra çıxdı. Birdən bir itin susuzluqdan ləhləyərək torpağı yediyini gördü. Kişi belə dedi: "Bu it susuzluqdan mənim çatdığım bir həddə çatıb. Quyuya düşərək xoffunu (dəri corab) su ilə doldurdu. Sonra onu ağzında tutaraq  yuxarı qalxdı və itə su verdi. Allah Təala ona Təşəküür olaraq onu bağışaldı. Onlar Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , bizə heyvanlarımıza görə əcr var?" deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hər bir yaş qaraciyərə görə əcr vardır." (Müslim / 2244).

# Şer və digərləri kitabı.

## Birinci fəsil: Şer və şer oxumaq haqda.

1- əş-Şərid (Allah ondan razı olsun) belə rəvayət edir: " Bir gün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) miniyinin tərkinə minmişdim. Mənə belə buyurdu: "Səndə Umeyyə İbn Əbu əs-Saltın şerindən bir şey varmı?" Mən: "Bəli." Deyə cavab verdim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Hih!" deyə buyurdu və mən ondan bir beyt oxudum. Sonra yenə O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Hih!" deyə buyurdu və mən yenə bir beyt oxudum. Sonra O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Hih!" deyə buyurdu və mən yüz beyt oxudum." (Müslim / 2225).

## İkinci fəsil: Şairin dediyi ən doğru söz haqda.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şairin dediyi ən doğru söz: "Ləbidin (şair) dediyi: "Agah ol Allahdan başqa hər bir şey batildir." Sözdür." (Müslim / 2256).

## Üçüncü fəsil: Çox şer deməmyin bəyənilməməsi.

3- Saad İbn Əbu Vaqqas (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizlərdən birinizin qarnını içib xarab edəcək irinlə doldurması onun üçün onu şerlə doldurmasından daha xeyirlidir." (Müslim /2258).

## Dördüncü fəsil: Məddahların üzünə torpaq səpmək.

4- Həmmam İbn əl-Haris belə rəvayət edir: "Bir kişi Osmanı tərifləməyə başladı. Miqdad qalxaraq iki dizinin üzərinə oturduş İri bir kişi idi. O xırda daşları kişinin üzünə səpməyə başladı. Osman (Allah ondan razı olsun): "Sənə nə olub? " deyə ondan soruşdu? O belə cavab verdi: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Məddahları gördüyünüzdə onların üzünə torpaq səpin!" (Müslim / 3002).

## Beşinci fəsil: Mədh və təzkiyə (zamin durmağın, tövsiyyə) etməyin bəyənilməməsi.

5- Əbu Bəkra (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında bir kişini xatırlatdılar. Bir kişi belə dedi: "Ey Allahın Elçisi , Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sonra bu və bu şeydə ondan əfzəl bir kişi yoxdur." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Vay olsun sənə , yoldaşının boğazını kəsdin!" Bunu davamlı olaraq deyirdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "əgər sizlərdən biriniz qardaşını mədh eləmək məcburiyyətində qalarsa onda belə dedsin: "Filankəsi belə hesab edirəm- o belə görünsədə - Alah qarşısında heç kəsi təzkiyə etmirəm." (Müslim / 2999).

## Altıncı fəsil: Nərd oynamaq haqda.

6- Bureydə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bülə buyurdu: "Nərd oynayan sanki əlini donuzun ətinə və qanına bulamışdır." (Müslim / 2260).

# Yuxu kitabı

Birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yüxüsu.

1- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bir gecə yatan kimsənin gördüyü kimi yuxumda sanki bizim Uqba İBn Rafinin evidə olduğumuzu gördüm. Bizə İbn Tabanin yaş xurmalarından bir xurma gətirdilər. Mən bunu bizim üçün dünyada yüksəlmək axirətdə isə , axirətdə aqibətin bizim olacağına və dinimizin artıq tamamlandığına yozdum." (Müslim / 2270).

2- Əbu Musa əl-Əşari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ yuxda mən Məkkədən Xurmalıqlar olan bir torpağa hicrət etdiyimi gördüm. Zənnimdə bu yerin əl-Yəmamə və ya Həcər olduğunu düşündüm. Bir də baxdım ki bu yer Yəsrib (əl-Mədinə) şəhəridir. Həmçinin yuxumda qılıncı yellətdiyimi gördüm onun başı sındı. Bir də baxdım ki , bu , Uhud günü möminlərin başına gələn müsübətdir. Sonra onu yenə yellətdiyimdə ən gözəl şəklinə qayıtdı. Birdə baxdım ki , bu , Allah Təalanın gətirdiyi fəth və möminlərin bir yerə cəm olmasıdır. Bu yuxuda inəklərlə Allahın etdiyinin daha xeyrli olduğunu gördüm. Birdə baxdım ki, bu , Uhud günündə mömilərdən olan bir camaatdır. Xeyir isə Allah Təalann sonradan gətirdiyi xeyir və Bədr günündən sonra gətirdiyi sidqin savabıdır."

### İkinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yuxuda Müseyləmə əl-Kəzzəbi və həmçinin əl-Ansi (yalançı peyğəmbərlər) görməsi.

3- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Müseyləmə əl-Kəzzəb Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında Mədinəyə gəldi və belə deməyə başladı. Əgər Muhəmməd özündən sonra bu işi mənə həvalə etsə , ona tabe olacağam. Mədinəyə öz qövmündən olan bir çox adamın arasında gəlmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona tərəf gəldi. Yanında Səbit İbn Qeys əş-Şəməs vardı. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlində xurma budağı vardı. Gəlib yoldaşlarının içində olan Müseyləmənin qarşısında durdu və belə dedi: "Əgər sən məndən bu budağı istəsəydin belə onu sənə verməzdim. Allahın sənin haqda əmrinidə aşa bilmərəm. Mənə itaətdən boyun qaçırsan , Allah təala məhv edəcəkdir. Elə zənn edirəm ki , sən mənə haqqında nə göstərildi isə , göstərilən kəssən! Bu Səbitddir o sənə mənim əvəzimə cavab verər!" sonra ondan çevrilib getdi. İbn Abbas belə demişdir: " Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): " Elə zənn edirəm ki ,sən mənə haqqında nə göstərildi isə göstərilən kəssən!" dediyi bu söz haqda soruşdum. Və Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini mənə xəbər verdi: "mən yatmış ikən yuxuda əlimdə iki qızıl bilərzik gördüm. Bunların halı

məni məşğul etmişdi ki, mənə yuxuda onlara üfləməm vəhy olundu. Və mən üfürdükdə onlar yox oldu. Bunu özümdən sonra çıxacaq iki yalançı peyğəmbər olduğuna yozdum Onlardan biri Sananın ağası əl-Ansi, o biri isə əl-Yəmamənin ağası Müseyləmədir." (Müslim / 2273-2274).

## Üçüncü fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Məni yuxuda görən görmüşdür."

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “Məni yuxuda görən ayıq vaxtda görəcəkdir. Və ya sanki ayıq vaxtı görmüş kimidir. Seytan mənim timsalma girə bilmir." Əbu Sələmə belə rəvayət edir: "Əbu Qatədə (Allah ondan razı olsun) belə demişdir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyudu: "Məni görən həqqətən haqqı görmüşdür." (Müslim / 2266-2267).

## Dördüncü fəsil: Yuxu Allahdan, qarışıq yuxu isə Şeytandandır.

5- Əbu Sələmə belə rəvayət edir: "Əbu Qatədə (Allah ondan razı olsun) belə demişdir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: " Yuxu Allahdan, qarışıq yuxu isə şeytandandır. Əgər sizdən biriniz xoşlamadığı bir şey görərsə onda sol tərəfinə üç kərə tüfürsün , sonra isə onun şərrindən Allaha sığınsın! Daha ona bir zərər toxundurmaz." Ravi belə buyurdu: "mən yuxu gördükdə mənə bu bir dağdan da ağır gələrdi. Bu hədisi eşitdikdən sonra isə heç fikir vermirəm." (Müslim \ 2266).

## Beşinci fəsil: Yuxu Allahdan, əgər sizdən biriniz xoşlamadığı bir şey görərsə , onu danışmasın.

6- Əbu Sələmə belə rəvayət edir: "Mən yuxu gördükdə , o məni xəstə edərdi. Sonra əbu Qatədə (Allah ondan razı olsun) ilə qarşılaşdım O mənə belə dedi: "Mən də yuxu gördükdə , o məni xəstə edirdi. Nəhayət , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: " Yuxu Allahdan , əgər sizdən biriniz xoşlamadığı bir şey görərsə , onu sevdiyi kəsdən başqa heç kimə danışmasın! Əgər sizlərdən biriniz xoşlamadığı bir şey görərsə , onda sol tərəfinə üç kərə tüfürsün , sonra isə şeytanın və onun şərrindən Allaha sığınsın! Onu heç kimə danışmasın! Daha ona bir zərər toxundurmaz." (Müslim / 2266).

## Altıncı fəsil: Xoşlamadığı bir şey görərsə Allaha sığınsın və olduğu yandan (tərəfdən) digərinə çevrilsin.

7- Cabir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Əgər sizlərdən biriniz xoşlamadığı bir şey görərsə , onda sol tərəfinə üç kərə tüfürsün sonra isə şeytanın şərrindən Allaha sığınsın və olduğu yandan (tərəfdən) digərinə çevrilsin."

## Yeddinci fəsil: Mömінin yuxusu peyğəmbərliyin qırx altı cüzündən bir cüzdür.

8- 1519m - Ubada İbn əs-Samit (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə

buurmuşdur: " Möminin yuxusu peyğəmbərliyin qırx altı cüzündən bir cüzdür." (Müslim /2264).

### Səkkizinci fəsil: Saleh yuxu peyğəmbərliyin qırx yetmiş cüzündən bir cüzdür.

9- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Saleh yuxu peyğəmbərliyin yetmiş cüzündən bir cüzdür." (Müslim /2265).

### Doqquzuncu fəsil: Zaman yaxınlaşdıqca , müsəlmanın yuxusu az olsun ki yalan çıxsın.

10- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Zaman yaxınlaşdıqca , müsəlmanın yuxusu az olsun ki yalan çıxsın. Sizin sadiq yuxusu olan , sadiq danışanınızdır. Möminin yuxusu peyğəmbərliyin qırx beş cüzündən bir cüzdür. Yuxu üç cürdür: " biri Saleh yuxu Allahdan müjdədir, digəri şeytandan olan kədərli yuxu, üçüncüsü isə insanaın nəfsinə danışdığı şeylərdir." Əgər sizlərdən biriniz xoşlamadığı bir şey görərsə qalxıb namaz qılsın! Onu insanlara danışmasın!" Ravi belə demişdir: "Yuxuda zənciri sevir, qanadlalı isə xoşlamıram. Zəncir dində sabitlikdir." Bilmirəm bu hədisdəndir və ya İbn Sirinin sözləridir."

### Onuncu fəsil: Yuxu yozmaq haqda varid olan.

11- Ubeydullah İbn Abdullah İbn Utba belə rəvayət edir: " İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə danışardı: " Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey Allahın Elçisi , mən bu gecə yuxumda yağ və bal yağdıran bir bulud gördüm. İnsanların da bundan əlləri ilə ovuc-ovuc yığdıqlarını gördüm. Onlaradan bzəisi çox bəzisi isə az yığmışdı. Sonra səmadan yerə uzanan bir ip gördüm. Və səni ondan tutaraq yüksəldiyini gördüm. Sonra onu səndən sonra bir kişi götürdü və yüksəldi. Sonra onu başqa bir kişi götürdü və yüksəldi. Sonra onu başqa bir kişi götürdü və ip qopdu. Və onun üçün ipə başqa bir ip qoşularaq uzadıldı və o yüksəldi." Əbu Bəkr (Allah ondan razı olsun) belə dedi: "Ey Alahın Elçisi , atam anam sənə fəda olsun! Mənə izin versən , onu çox yaxşı yozaram." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Yoz!" Əbu Bəkr belə buyurdu: "Buluda gəlincə o İslamdır. Göydən yağan yağ və bal isə Quran və onun ləzzəti və yumuşaqlığıdır. İnsanların əlləri ilə yığdıqlarına gəlincə isə bu insanlardan Quranı az və çox oxuyanlardır. Səmadan enən ip isə haqqdır , sən ondan tutursan və Allah təala səni onunla yüksəldir. Sonra onu səndən sonra bir kişi götür və yüksəlir. Sonra başqa kişi götür və yüksəlir. Sonra başqa kişi götür və ip qopur. Və onun üçün ipə başqa bir ip qoşularaq uzadılır və o yüksəlir. İndi Ey Alahın Elçisi , atam anam sənə fəda olsun! Mənə düz və ya səhv dediyimi söylə! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "bəzisini düz , bəzisini isə səhv dedin!" O (Allah ondan razı olsun) belə dedi: "Allaha and olsun , Ey Allahın Elçisi , mənə nəyi səhv dediyimi danışacaqsan. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "And içmə!" deyə buyurdu." (Müslim /2269).

### On birinci fəsil: Yuxuda Şeytanın onunla oynadığını xəbər verməmək.

12- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Bir Bədəvi ərəb Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı

olsun) yanına gələrək belə buyurdu: "Ey Allahın Elçisi mən yuxuda gördüm ki başım vurulub və yerdə diyirlənir. Mən isə onun ardınca qaçıram. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Yuxuda şeytanın səninlə oynamağını  insanlara danışma." Cabir belə demişdir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xütbə deyərkən belə dediyini eşitdim: "Ey insanlar , sizlərdən briniz yuxuda şeytanın onunla oynadığını danışmasın." (Müslim / 2268).

# Fəzilətlər kitabı.

## *Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) fəzilətləri.*

### Birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) seçilməsi.

1- Vasilə ibn əl- Əsqa  (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Allah Təala Kinənə qəbiləsini İsmailin (ona Allahın salamı olsun) övladlarının içərisindən seçdi. Qureyş qəbiləsini isə Kinənə qəbiləsindən seçdi. Qureyşdən isə Bəni Həşim sülaləsini seçdi. Bəni Həşimdən isə məni seçdi."

### İkinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Mən Adəm övladlarının ağasıyam.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Mən Qiyamət günü Adəm övladlarının ağasıyam. Qəbri ilk açılan mənəm və mən ilk şəfaət diləyən və ilk şəfaət haqqı verilənəm."

### Üçüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hidayət və elmlə göndərildiyinin misalının bəyanı.

3- Əbu Musa əl-Əşari (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Allah Təalanın məni hidayət və elmlə göndərməsinin misalı bir yerə yağan yağışın misalı kimidir. Bu yerin bir qismi gözəldir. Suyu qəbul etdi və çəmən və çox sayda ot bitirdi. Bu yerin bəzi qismi isə şorandır. Suyu saxladı və Allah Təala onunla insanlara fayda verdi. Onlar bunu içdilər, heyvanlarını suladılar və otardılar. Yerin başqa bir qisminə də yağış düşdü. Lakin bu yer düz müstəvi bir yer idi. Suyu saxlamadı, cəmən və ot da bitirmədi. Bu misallar: "Allahın dinini dərk edənin və Allah Təala ona mənimlə göndərdiyindən fayda verdiyi, onu öyrənib, öyrədənin misalı ilə, təkəbbürlükdən buna başını qaldırmayanın və Allahın məni mənimlə göndərdiyi hidayəti qəbul etməyənin misalıdır."

4- Əbu Musa (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Allah Təalanın məni və mənimlə göndərdiyinin misalı bir qömvə gələn bir kişinin misalı kimidir. O onlara belə buyurdu: "Ey qövm, mən bu iki gözümlə bir qoşun gördüm və mən soyunmuş xəbərdar edənəm, xilas olun!" qövmündən bir tayfa ona itaət edti və

birinci gecədən yola çıxaraq yavaş-yavaş getdilər. Digər tayfa isə onu yalançı saydı və yerlərində sabahladılar. Sabah açıldıqda, qoşun onlara hücum etdi və həlak edərək köklərini kəsdi. Bu mənə itaət edən və məinm gətirdiyimin ardınca gedənin və mənə asi olub, mənim gətirdiyim haqqı yalançı sayanın misalıdır."

## Dördüncü fəsil: Peyğəmbərlərin Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tamamlanması və möhürlənməsi haqda.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mənimlə məndən öncə olan peyğəmbərlərin misalı bir ev tikən kişinin misalına bənzəyir. O, evi gözəl, yaxşı bir şəkildə tikdi. Lakin künclərdən birində bir kərpic qaldı. İnsanlar onun ətrafında dövrə vuraraq ona baxır və xoşlanır və belə deyirdilər: "Kaş ki, bu kərpic də qoyulardı." Bu kərpic mənəm və mən peyğəmbərlərin möhürüyəm."

## Beşinci fəsil: Daşın Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) salam verməsi.

6- Cabir İbn Samura (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mən Məkkədə mənə peyğəmbərlik verilməmişdən öncə mənə salam verən bir daş tanıyıram. Mən onu indi də tanıyıram."

## Altıncı fəsil: Suyun Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) barmaqlarının arasından çıxaraq axması.

7- Ənəs ibn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabı ilə əz-Zəvrada (əz-Zəvra Mədinədə bazar və məscidin yaxınlıqda bir yerdir) ikən içində su olan bir qədəh istədi, əlini onun içinə saldı. Su onun barmaqlarının arasından çıxmağa başladı. Onun bütün əshabı ondan dəstəmaz aldı. Mən: "Ey Əbu Həmzə , onlar neçə nəfər idilər?" deyə soruşdum. O: "Üç yüz kişiyə yaxın." deyə cavab verdi."

## Yeddinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) su haqda olan möcüzələri.

8- Muaz İbn Cəbəl (Allah ondan razı olsun) belə rəvayət edir: "Tabuk döyüşü ilində Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə çıxmışdıq. O namazı cəm edərək qılırdı. əz-Zöhr ilə əl-Əsr namzını, əl-Məğrib ilə əl-İşa namazını cəm edərək qıldı. Bir gün namazı gecikdirdi. Sonra çıxaraq əz-Zöhr ilə əl-Əsr namazını cəm edərək qıldı və içəri daxil oldu. Daha sonra çıxaraq əl-Məğrib ilə əl-İşa namazını cəm edərək qıldı. Sonra belə buyurdu: "Sabah siz Allahın izni ilə Tabuk bulağına çatacaqsınız. Siz ora yalnız günortaya yaxın bir vaxtda çatacaqsınız. Kim ora çatarsa, mən gəlməyincə onun suyundan bir şey içməsin." Biz ora gəldik. Bizi iki kişi qabaqlamışdı. Bulağın gözündən ayaqqabı qaytanı kimi bir su axırdı (yəni suyu az idi). Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlardan: "Onun suyundan içdinizmi?" deyə soruşdu. Onlar: "Bəli!" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onları danladı və Allahın istədiyi qədər söz söylədi. Sonra onlar əlləri ilə bulaqdan az-az su götürdülər və nəsə az bir şey yığıldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əllərini və üzünü bu suda yudu. Sonra suyu yerinə tökdü və o elə

şırıltı ilə və ya bol suyla axdı ki, insanlar hamısı ondan içdi. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Muaz , əgər sənin ömrün üzün olarsa buranın baxça-bağla dolu olacağını görəcəksən."

## Səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yeməyi bərəkətli etməsi haqda.

9- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək yemək istədi. Ona yarım vasaq (çəki vahidi) qab arpa verdi. Kişi, zövcəsi və qonağı bu qabdan ta onun zövcəsi arpanı çəkənə qədər yedilər. Sonra o Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldikdə, ona belə buyurdu: "Əgər onu çəkməsəydiniz, ondan hədələ də yeyərdiniz və qalardı da."

10- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Xəndək qazıldıqda mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) halından ac olduğunu gördüm. Zövcəmin yanına dönərək ondan: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) halından çox ac olduğunu gördüm, səndə (yeməyə) bir şey varmı?" deyə soruşdum. O mənə icində bir Saa miqdarında arpa olan saxsı bir qab çıxartdı. Bizim bir quzumuz vardı, onu kəsdim. Zövcəm arpanı üyütdü. Mənimdə işimi bitirdim. Quzunu doğrayıb qazanın içinə atdım. Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdim. Zövcəm mənə: "Məni Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və onunla olanların yanında utandırma!" deyə buyurdu. Gizlicə onun yanına gəldim və belə dedim: "Ey Allahın Elçisi, mən bizim olan bir quzu kəsmişəm və evimizdə olan bir Saa miqdarında arpa üyütmüşəm. Sən və bir neçə nəfərlə gəl!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səsini yüksəldərək belə buyurdu: "Ey, Xəndək əhli, Cabir sizin üçün ziyafət hazırlayıb, haydı gəlin!" sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən gəlməyincə, qazanı odun üzərindən düşürməyin və xəmiri bişirməyin!" mən gəldim, Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlarla birgə gəldilər. Zövcəmin yanına gəldikdə o mənə: "Ax Sənə! Ax Sənə!" deyərək məni danladı. Mən Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Mən sənin dediyin kimi etdim." deyə söylədim və xəmiri onun üçün çıxartdım. O xəmirə tüpürərək bərəkət dilədi. Sonra qazana yaxınlaşaqraq ona tüpürdü və bərəkət dilədi. Sonra belə buyurdu: "Bir çörək bişirən çağır, səninlə çörək bişirsin! Qazanı odun üzərindən götürmə, yeməyi çömçə ilə götür." Onlar min kişi idilər. Allaha and içirəm ki, onlar onu tərk edənə kimi yedilər. Getdiklərində qazan hələdə olduğu kimi qaynayırdı. Xəmirimizdən hələ də (və ya Dahhakın dediyi kimi) çörək bişirilirdi, o olduğu kimi qalırdı."

11- Əbd ər-Rahman ibn Əbu Bəkr (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə idik, sayımız yüz otuz idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizlərdən kiminsə yeməyi varmı?" bir kişinin bir Saa və ya ona yaxın miqdarda buğdası vardı. ondan xəmir yoğruldu. Sonra saçı dağınıq, hündür boylu müşrik bir kişi gəldi. Qoyun otarırdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Satlıq yoxsa hədiyyə? Və ya: "pay?" deyə soruşdu. Kişi: "Xeyr , satlıq!" deyə cavab verdi. Ondan bir qoyun aldı və onu hazırladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun ciyərinin qızardılmasını əmr etdi. Allaha and olsun ki, yüz otuz nəfərdən elə insan olmadı ki, Peyğəmbər (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) ona bu ciyərdən pay ayırmasın. Orada olana verdi. Olmayan üçün isə pay ayırıb saxladı. İki qab doldurdu və biz hamımız ondan yedik doyduq. Qabda artıq qalanı isə dəvəsinin üzərinə yüklədi."

12-Əbd ər-Rahman ibn Əbu Bəkr (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: Suffə əhli (islamı qəbul edən və heç bir şeyi olmayan Mədinəyə hicrət edərək məsciddə qalan və yun paltar geyinən müsəlmanlar) kasıb insanlar idi. Bir dəfə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Kimin iki kişilik yeməyi varsa üç, kimi dörd kişilik yeməyi varsa beş, altı nəfər aparsın." Və ya Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dediyi kimi. Əbu Bəkr üç nəfərlə gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) on, Əbu Bəkr isə üç nəfərlə getdi." Ravi belə demişdir: "Bu mən, atam və anam idi." Bilmirəm o belə dedi ya yox: "Zövcəm və xidmətçim evimizlə Əbu Bəkrin evinin arasında idi." Əbu Bəkr Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) axşam yeməyini yedi, sonra əl-İşa namazı qılınana kimi gözlədi. Sonra qayıdaraq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yüxusu gələnə kimi oturdu. Gecədən Allahın istədiyi qədər keçdikdən sonra gəlib çıxdı. Zövcəsi ona: "Sənə qonaqlarının və ya qonağının yanın gəlməyə nə mane oldu?" deyə soruşdu. O: "Məgər sən onlara axşam yeməyini verməmisən?" deyə soruşdu. Qadın: "Onlar sən gələnə kimi yemək istəmədilər." deyə cavab verdi. Onlara (evdəkilərə) yemək ərz olundu, lakin onlar qalib gəldi. Əbd ər-Rahman belə buyurdu: "Mən qaçıb gizləndim." Əbu Bəkr: " Ey Cahil, Ey burnu kəsilmiş" deyə söydü. Sonra belə dedi: "Yeyin! Xoş olmasın! Allaha and olsun ki, mən ondan heç vaxt yemərəm." Allaha and olsun ki, biz ondan bir loxma aldıqda o altdan əvvəlkindəndə çox artırdı. Biz doyduq. O isə əvvəlkindəndə daha çox oldu. Əbu Bəkr ona baxdığında onun necə var və ya daha çox olduğunu gördü. Zövcəsinə: "Ey Firasın bacısı, bu nədir?" deyə söylədi. Qadn belə cavab verdi: "İki gozüm bəbəyi üçün (dediyimdən başqa bir şey deyil)! Bu əvvəlkindən üç qat daha çoxdur." Əbu Bəkr ondan yedi və andını xatırladaraq: "Bu ancaq şeytandandır" dedi. Sonra ondan bir loxma yedi və yeməyi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına apardı. Və yemək səhərə qədər Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında qaldı. Bizimlə bir qövm arasında əhd vardı. Müddət bitdi və biz on iki dəstəyə ayrıldıq. Hər bir ilə bir neçə insan vardı. Allah bilir hər bir kişi ilə neçə nəfər vardı. O onlara bu yeməkdən göndərdi və onlar hamısı ondan yedi." Və ya onun dediyi kimi."

## Doqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) südü bərəktli etməsi.

13-əl-Miqdad (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən və iki yoldaşım yoldan (səfərdən) gəldik, aclıqdan gözlərimiz və qulaqlarımız getmişdi. Biz özümüzü Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrinə ərz edirdik. Heç kim bizi qəbul etmirdi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldik. Bizi ailəsinin yanına apardı. Baxdığımızda üç keçi gördük. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu südü aramızda paylamaq şərti ilə sağın! Biz sağır və hər birimiz öz payını içir və Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun payını verirdik. O, gecə gəldiyində yatanı oyatmayan, lakin oyaq olan kəsin eşidəcəyi tərzdə salam verərdi. Sonra məscidə gələrək namaz qılardı. Sonra isə gələrək südü içərdi. Bir gecə yanıma şeytan gəldi. Mən südümü tam içmişdim. Mənə belə (yəni Şeytan) dedi:

"Muhəmməd Ənsarların yanına gedir, onlar ona həddiyə verir, onlardan pay alır. Onun bu südə ehtiyacı yoxdur." Mən gəlib bu südü içdim. Qarnıma yerləşdiyi və onu çıxarmağın mümkün olmayacağını anladım və şeytan mənə peşmanlıq gətirdi və belə dedi: "Vay olsun sənə nə etdin! Sən Muhamməddin südünü içdin! O gəldiyində onu tapmasa, sənin lehinə dua edəcək və sən həlak olacaqsan. Dünyan da axirətin də gedəcək." Mənim üzərimdə bir örtü (önlük) vardı onunla ayaqlarımı örtsəm, başım açıqda qalırdı. Başımı örsəm, ayaqlarım açılırdı. Yuxum gəlmirdi. İki yoldaşım isə yatdılar. Onlar mənim etdiyimi etmədilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldi və həmişəki kimi salam verdi. Sonra məscidə gələrək namaz qıldı. Sonra südünü içmək istədikdə onun içində bir şey tapmadı. Başını səmaya doğru qaldırdı." Mən: "O indi mənim əleyhimə dua edəcək və mən həlak olacağam" dedim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım, məni yedizdirəni yedizdir! Məni içirəni içir!" mən örtü götürərək bədənimə sarıdım və bıçağı götürərək keçilərin yanına getdim. Hansı daha kök olarsa, onu Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün kəsəcəkdim. Bir də baxdım ki, onun südü gəlib. Onların hamsının südü gəlmişdi. Muhamməddin ailəsinin bir qabını götürdüm. Onun içinə süd sağmamı istəməzdilər. Onun içini südün köpüyü görünənə kimi doldurdum. Sonra onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gətiridm. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Siz gecə südünüzü içdinizmi?" deyə soruşdu Mən: "Ey Allahın Elçisi, iç!" deyə söylədim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içdi , sonra onu mənə verdi. Mən: "Ey Allahın Elçisi, iç!" deyə söylədim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içdi sonra onu mənə verdi. Mən onun doyduğunu və duasına nail olduğumu bildikdən sonra gülməyə başladım və yerə yıxıldım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Bu sənin yaramazlığından biri olacaq , Ey Miqdad " deyə buyurdu. Mən ona: "Ey Allahın Elçisi, bu və bu işim olub və belə və belə etmişəm." deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu ancaq Allah Təaladan bir rəhmətdir. Mənə bunu söyləsəydin, iki yoldaşını da oyadardıq onlara da pay düşərdi." Mən belə dedim: "Səni Haqqla göndərənə and olsun ki, ondan sənə və səninlə mənə pay olduqdan sonra insanlardan kimə ondan pay düçəcəyi heç vecimə də deyil."

## Onuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yağı bərəkətli etməsi.

14- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: "Ummu Malik Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun olan bir tuluqda yağ hədiyyə edərdi. Sonra onun övladları gəlib ondan ədviyyat (qatıq) istəyərdilər. Halbuki evlərində heç bir şey yox idi. O Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün göndərdiyi tuluğuna baxdıqda onun içində yağ tapır. Bu ona uzun müddət ədviyyatı əvəz edir. Nəhayərt, bir gün onu sıxır sonra isə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlir. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Tuluğu sıxdınmı?" deyə ondan soruşdu. O: "Bəli!" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Əgər onu tərk etsəydin, hələ də qalmışdı."

## On birinci fəsil: Ağacın Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tabe olması. (onu örtməsi.)

15- Ubədə İbn əl-Valid İbn Ubadə İbn əs-Samit (Allah ondan razı olsun) belə rəvayət edir: " Mən və atam çıxaraq Ənsarların bu qəsəbəsində onlar vəfat etmədən öncə elm tələb edirdik.İlk öncə qarşılaşdığımız Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabəsi olan Əbu əl-Yasar oldu. Yanında bir xidmətiçisi də var idi. Onun əlində vərqlərdən olan bağlama vardı. Əbu Yusrun əynində Maəfiri adlanan paltar və çizgili əba vardı. Xidməçisinin əynində də Maəfiri adlanan paltar və çizgili əba vardı. Atam ona belə dedi: "Ey dayı , mən sənin üzündə qəzəb əlaməti görürəm. O belə buyurdu: "Bəli! Mənim Haram qəbiləsindən filan oğlu filandan alacağım vardı. Ailəsinin yanına gedib salam verdim və "o burdamı ?" deyə soruşdum. Onlar: "Xeyr!" dedilər. Yanıma həddi buluğa çatmağa az qalan bir oğlu çıxdı. Ondan: "Atan haradadır?" deyə soruşdum. O: "Sənin səsini eşitdikdə anamın yatağına girdi." Deyə cavab verdi. Mən ona: "Yanıma çıx! Harada olduğunu bilirəm!" deyə səsləndiim. O yanıma çıxdı. Mən ondan: "Səni gizlənməyə vadar edən nədir?" deyə soruşdum. O belə cavab verdi: "Allaha and olsun ki , sənə danışacağam və sənə yalan söyləməyəcəyəm. Allaha adn olsun  ki , səninlə danışıb sənə yalan söyləməkdən və sənə vəd verib vədimə xilaf çıxmağımdan qorxdum. Sən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabəsi idin və mən yoxsul idim." Mən: "Allah xatirinəmi?" deyə soruşdum. O: "Allah xatirinə." Deyə cavab verdi. Mən yenə : "Allah xatirinəmi?" deyə soruşdum. O yenə: "Allah xatirinə." deyə cavab verdi. Mən yenidən : "Allah xatirinəmi?" deyə soruşdum. O da: "Allah xatirinə." Deyə cavab verdi və sənədini gətirdi. Atam onu əli ilə sildi və belə söylədi. Ödəyəcək bir şey tapa bilirsənsə , ödə. Yox , tapa bilmirsənsə , sənə halal olsun! O (iki barmağnı iki gözünün üzərinə qoyaraq) belə buyurdu:" bu iki gözüm gördü, iki qulağım eşitdi və (əli ilə qəlbini işarə edərək) qəlbimin hifz etməsi ilə: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğuna: "Hər kim bir yoxsula möhlət verərsə , və ya onu bağışlarsa ,  Allah Təala onu öz kölgəsində kölgələndirəcəkdir." Şahid oldum. Mən ona belə dedim: "Ey dayı , xidmətçinin çizgili əbasını alsan və ona öz Məafiri adlanan paltarını versən, sən də onun Məafiri adlanan paltarını götürsən, və çizgili əbanı ona versən , sənin də, onun da əynində dəst paltar olar." O mənim başımı sığalladı və belə buyurdu: "Allahım , ona bərəkət ver. Ey qardaş oğlu , bu iki gözüm gördü, iki qulağım eşitdi və (əli ilə qəlbini işarə edərək) qəlbimin hifz etməsi ilə: "Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şahid oldu. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyururdu: "Onlara özünüz yediklərinizdən yedirin və geyindiklərinizdən geyindirin." Dünya malından ona verməyim Qiyamət günü onun mənim savablarımdan götürməyindən mənim üçün daha yaxşıdır. Sonra yürüyərək nəhayət Cabir ibn Abdullahın məscidində ikən yanına gəldik. O bir paltara bürünmüş halda namaz qılırdı. Mən Camaatın arasından adımmlayaraq onunla qiblə arasında oturdum və ona belə dedim: "Allah sənə rəhm etsin Ridan (bədənin üst hisssinə geyilən paltar) yanında ola – ola tək bir paltarda namaz qılırsan? O əli ilə sinəmə qoyaraq barmaqlarını araladı və belə buyurdu: " diləyirəm ki , yanıma sənin kimi bir axmaq girsin və mənim nə etdiyimi görsün ki, o da elə etsin.  Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlində bir İbn  Tab xurmasının budağı olduğu halda məscidimizə gəldi və məscidin qibləsində tüpürcək gördü. Onu budaqla sildi sonra bizə dönərək belə buyurdu: "Allahın ondan üz çevirməsini hansınız istəyirsiniz?"  Biz qorxduq. Sonra o yenə: "Allahın ondan üz çevirməsini hansınız istəyirsiniz?" deyə buyurdu. Biz yenə qorxduq. Sonra o yenə: "Allahın ondan üz çevirməsini hansınız istəyirsiniz?" deyə buyurduqda, belə dedik: "Xeyr! Heç birimiz , Ey Allahın Elçisi." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu:

"Şübhəsiz ki , sizlərdən biriniz namaza durduqda Allah Təala onun üzünü çevirdiyi tərəfdədir. Buna görədə sizlərdən biriniz üzünü tutduğu (baxdığı) tərəfə və sağına tüpürməsin! Sol tərəfinə sol ayağının altına tüpürsün! Yox əgər tüpürcək onu tələsdirsə , onda paltaına belə etsin." Sonra paltarını bir birinin üzərinə qatladı və belə buyurdu: "Mənə bir zəfəran göstərin!" Məhəllədən bir gənc qalxaraq ailəsinin yanına getdi və ovcunda zəfaranlı bir ətir gətirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu alaraq budağın arxasına sürtdü və onunla tüpürcəyin izini sildi." Cabir (Allah ondan razı olsun) belə demişdir: "Sizin məscidlərinizə zəfəran sürtməniz bundan qalmışdır. Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Batn Bavatın döyüşünə yola çıxdıq. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mecdi İbn Amr əl-Cuhanini axtarırdı. Bu su dəvəsinə bizdən beş, altı və yeddi kişi növbə ilə minirdi. Birdən Ənsarlardan bir kişinin öz su dəvəsinə növbəsi gəldi. Onu çökdürərək tərkinə mindi. Sonra onu sürdü. Lakin dəvə onu bir az dayandırdı. (ləngitdi.) kişi ona: "Deh! (yəni get!) Allah sənə lənət etsin!" dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Kimdir dəvəsinə lənət edən?" deyə soruşdu. Kişi: "Mən , Ey Allahın Elçisi" deyə cavab verdikdə, belə buyurdu: "En onun üzərindən , lənətlənmiş heyvanla bizə yoldaşlıq etmə! Özünüzə bəd dua etməyin! Uşaqlarınıza bəd dua etməyin! Mallarınıza bəd dua etməyin! Allahdan sizin üçün bir şey istənilən və sizə verilən bir vaxta müvafiq olmayın!" Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə çıxdıq. Nəhayət axşam vaxtı ikən biz Ərəb sularından bir suya yaxınlaşdıqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Kim bizdən öncə gedərək hovuzu doldurar, ondan su içib və bizə də içirər?" deyə soruşdu. Cabir belə buyurdu: "Mən qalxaraq belə dedim: "Bu kişi , Ey Allahın Elçisi!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Hansı kişi Cabirlə birgə gedər?" deyə soruşduqda, Cabbar ibn Saxr qalxdı və biz quyunun yanına getdik , hovuzun dibindən bir iki qab su çəkdik. Sonra onu daşlarla örtdük. Sonra onu dolduruncaya qədər su çəkdik. Yanımıza ilk gələn Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oldu. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Mənə icazə versiniz?" deyə soruşdu. Biz: "Bəli , Ey Allahın Elçisi!" deyə cavab verdik. Dəvəsini oraya saldı və o da su içdi. Onun yüyənini çəkdi və heyvan ayaqlarını araladı və bevl etdi. Sonara onu qırağa çəkərək çökdürüdü. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gələrək hovuzdan dəstəmaz aldı. Mən qalxaraq onun dəstəmaz aldığı yerdən dəstəmaz aldım. Cabbar İbn Saxr ehtiyacını ödəməyə getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə namaz qılmaq üçün qalxdı. Mənim üzərimdə çizgili bir əba vardı. onun iki tərəfi ilə sarımaq istədim. Lakin mənə çatmadı. Paltarın saçaqları vardı. Onları tərs çevirdim və sonra onun iki tərəfini də sarıdım və onu boğazımın altında (düşməsin deyə) tutdum. Sonra gəlib Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sol tərəfində durdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlimdən tutaraq məni arxasından çevirərək sağ tərəfinə çevirdi. Sonra Cabbar ibn Saxr gəldi və dəstəmaz aldı. Və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) solunda durdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ikimizin əlindən tutaraq bizi itələyərək arxa tərəfə qoydu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə hiss etdirmədən nəzarət etməyə başladı. Sonra mən onun məqsədini anldım. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əli ilə mənə: "Yəni izarını bərkit!" deyə belə işarə etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirdikdən sonra

belə buyurdu:"  Ey Cabir!" Mən: "Eşidirəm əmrindəyəm , Ey Allahın Elçisi!" deyə cavab verdim.  O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Əgər paltarın geniş olsa , onda onun iki tərəfi ilə sarın, yox əgər dardırsa , onu göbəyinin ətrafına sarı." Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə yola çıxdıq. Bizdən olan bir kişinin yeməyi gündəlik bir xurma idi. Onu sorar sonra isə paltarının içinə qoyardı. Sonra oxlarımızla yarpaq sirkələr və onu yeyərdik. Hətta dodaqlarımız yara olmuşdu.  Allaha and olsun , bir gün bizədən birinə səhvən xurma verilmədi. Biz taqətsizlikdən onu aldırmaya  və ona xurma verilmədiyinə şahidlik etməyə getdik. O qalxdı və onu aldı." Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə yürüyürdük. Nəhayət , geniş bir vadiyə çatdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ehtiyacını ödəmək üçün getdi,  Mən  də bir su qabı ilə onun ardınca getdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) örtünəcək bir şey üçün baxdı lakin bir şey görmədi.  Birdən vadinin kənarında iki ağac gördü. Onlardan birinin yanına gedərək budaqlardan birini tutdu və: "Allahın izni ilə mənə ram ol deyə buyurdu. Ağac ona sahibinə itaət etmədiyi üçün itaət etsin deyə burnuna ağac salınmış dəvə kimi ram oldu. Sonra o biri ağcın yanına getdi və onun da budaqlarından birini tutaraq: "Allahın izni ilə mənə ram ol!" dedi. O onunla  getdi nəhayət onların ortasında ikən  onları yaxınlaşdırdı və (cəm edərək): "Allahın izni ilə yapışın!" deyı buurdu və onlar dərhal birləşdilər. Cabir belə demişdir: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim yaxında olduğumu hiss edərək uzaqlaşmasından qorxaraq oradan qaçdım. Oturub nəfsimdə danışmağa başladım. Təsadüfən başımı yuxarı qaldırdığımda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldiyini gördüm. O iki ağacda bir – birindən aralanaraq hər biri öz gövdəsi üzərində durmuşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir an duraraq başı ilə ( Əbu İsmail: "sağa və sola işarə etdi) işarət ediyini gördüm. Sonra yenə gəlməyə davam etdi. Yanıma gəldikdə: "Ey Cabir! Mənim durduğum yeri gördünmü?" deyə soruşdu Mən: "Bəli!" deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Elə isə bu iki ağacın yanına get və hər birindən  bir budaq qır və gətir. Mənim durduğum bu yerə çatdıqda bir budağı sağ , digərini isə sol tərəfinə batır." Cabir belə dedi:" Mən qalxaraq bir daş götürüdm və onu sındıraraq iti etdim və mənim üçün iti oldu. Sonra iki ağacın yanına gedərək hər birindən bir budaq kəsdim. Onları sürüyyərək Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) duran yerə gətirdim və birini soluma, digərini isə sağıma sancdım. Sonra ona çataraq: "Ey Allahın Elçisi , dediyini etdim. Bu nə üçün idi? "deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən əzab verilən iki qəbrin yanından keçdim və bu budaqlar yaş olduğu müddətdə onların əzəblarının yüngülləşməyi üçün şəfaət etmək istədim." Sonra biz ordunun yanına getdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Cabir dəstamz almaq üçün su istə!" Mən: "Diqqət dəstəmaz üçün su varmı!  Dəstəmaz üçün su varmı! Dəstəmaz üçün su varmı!" deyə səsləndim." Mən: "Ey Allahın Elçisi , karvanda bir damla su yoxdur" deyə söylədim. Ənsarlardan bir kişi Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün xurma budağından olan bir asılqan üzərində olan köhnə bir tuluqda su sərinlədirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Filan kəs oğlu filanın yanına get və tuluğunda bir şey varmı deyə bax!" Mən onun yanına gedərək tuluğun içinə baxdım. Lakin içində tuluğun ağzında qalan bir damladan başqa bir şey tapmadım. Əgər onu boşaltsaydım quru olan tərəfi onu içəcəkdi. Peyğəmbərin (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona: " Ey Allahın Elçisi , tuluğun içində ağzında qalan bir damladan başqa bir şey tapmadım. Əgər onu boşaltsaydım quru olan tərəfi onu içəcəkdi." deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Get onu gətir!" deyə buyurdu. Mən onu gətirdim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu əlinə aldı və mənim başa düşmədiyim bir şeylər danışmağa başladı. Həmçinin iki əli ilə onu sıxırdı, sonra onu mənə verərək: "Ey Cabir böyük bir çən?" deyə səslən! Mən: "Karvanın çən sahibi" deyə səsləndim. Onu yükləyib mənə gətirdilər. Çəni onun hüzuruna qoydum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əli ilə çənin içərisinə belə etdi. əlini açaraq barmaqlarını araladı. Sonra isə əlini çənin dibinə qoydu və: "Ey Cabir onu al üzərinmə tök və Allahın adıyla de!" mən həmən suyu onun (əlinin) üzərinə tökdüm və Allahın adıyla dedim! Bunun ardından suyun onun barmaqlarının arasından qaynadığını gördüm. Conra cən qaynadı və döndü nəhayət doldu. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Ey Cabir , suya ehtiyacı olanlara səslən!" deyə buyurdu. İnsanlar gələrək doyana kimi su içdilər. Mən: "Ehtiyacı olan kimsə qaldımı?" deyə soruşdum. Artıq çən dolduqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlini onun üzərindən  çəkdi. İnsanlar Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) aclıqdan şikayət etdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara: "Allahın sizi doyuracağını diləyirəm!" dedi. Biz gəlib dəniz sahilinə çatdıq. Birdən dəniz dalğalanaraq sahilə bir heyvan atdı. Bu heyvanın yarısını bişirmək üçün od yandırdıq, onu  qızardaraq bişirdik və doyuncaya qədər yedik.  Cabir belə demişdir: "Mən və filan və filan kişi olmaqla beş nəfər onun göz sümüyünü içinə girdik. Bizi kimsə görmürdü. Nəhayət çıxaraq onun qabırğalarından birini götürərək əydik. Sonra karvandakı ən böyük adamı, ən böyük dəvəni və ən böyük örtünü gətirdik. O heç başını əymədən onun altına girdi." (Müslim 3006-3014).

## On ikinci fəsil: Ayın bölünməsi.

16- Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: " Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Minada ikən birdən ay iki hissəyə bölündü. Bir hissəsi dağın dalında digəri isə  onun önündə idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə: "Şahid olun!" deyə buyurdu." (Müslim / 2800).

17- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Məkkə əhli Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara möcüzə göstərməsini istədilər və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara iki dəfə ayın bölünməsini göstərdi."

## On üçüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona əziyyəyt etmək istəyənlərə mane olması.(imkan verməməsi.)

18- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Əbu Cəhl belə dedi: "Muhamməd sizin yanınızda üzünü torpağa qoyurmu?" Ona: "Bəli!" deyə cavab verildikdə belə dedi: "əl-Lat və əl-Uzzaya and olsun ki onun bunu etdiyini görsəm , boynunun üzərindən basaram. Və ya mütləq üzünü torpağa basdıraram." Və o Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaz qılarkən yanına gəldi. Boynuna basmaq niyətində idi , lakin birdən- birə geri döndüyünü və əli ilə qorunduğunu gördülər. Ona: "Sənə nə oldu?" deyə söylədilər. O belə dedi: "Həqiqətən ,onunla mənim aramda atəşdən bir xəndək vardı. Qorxulu

bir şey və bir neçə qanad vardı." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu:" Əgər mənə yaxınlaşsaydı mələklər onun bir-bir bədən üzvlərini qoparardılar." Ravi belə demişdir: "Allah Təala –bilmirəm Əbu Hüreyrənin (Allah ondan razı olsun) hədisindədir və ya ona çatan bir xəbərdə belədir- bu ayələri nazil etdi: " Xeyr, insan azğınlıq edər. Özünün dövlətli olduğunu gördüyü üçün! Axı sənin axır dönüşün Rəbbinədir! Gördünmü o kimsəni ki, mane olur. Bir bəndəyə (sənə) namaz qıldığı vaxt? Bir de görək, əgər o doğru yoldadırsa, yaxud (xalqa Allahdan) qorxmağı əmr edirsə. Bir de görək, yalan sayır - (Əbu Cəhli) və üz döndərirsə. Məgər bilmir ki, Allah görür?! Yox, yox! Əgər son qoymasa, and olsun ki, Biz onu kəkilindən yapışıb sürükləyəcəyik! Özü də yalançı, günahkar kəkilindən! Qoy o özünün bütün tərəfdarlarını çağırsın! Biz də zəbaniləri (Cəhənnəmdəki əzab mələklərini) çağıracağıq! Yox, yox! Sən ona uyma! Başqa rəvayətdə isə belə deyilir: " ona nə əmr etdisə etdi." Başqa rəvayətdə isə belə deyilir: "(Məclisini) yəni qövmünü çağırsın!"

## On dördüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu öldürmək istəyənlərə mane olması.(imkan verməmısi.)

19-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Nəcd istiqamətində döyüşlərinin birində idik. Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tikanlı ağacı çox olan bir vadiyə endik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir ağacın altına enərək qılıncını onun budaqlarından birindən asdı. İnsanlar isə vadiyə səpələnərək kölgələnirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Bir kişi mən yuxuda ikən yanıma gəldi və qılıncı götürdü. Oyandığımda onu başımın üstündə durduğunu gördüm. Mən his etmədən o qılıncı sıyırmış olaraq əlində tutmuşdu. Mənə belə dedi: "Səni öldürməyə mənə kim mane olar? Mən: "Allah" deyə cavab verdim. O ikinci kərə: " Səni öldürməyə mənə kim mane olar?" dedi. Mən yenə: "Allah" deyə cavab verdim. O qılıncı qınına salladı və həmən yerə oturdu. Bundan sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona bir şey söyləmədi." (Müslim /2281).

## On beşinci fəsil: Zəhər və zəhərli qoyun yemək haqda.

20-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Yahudi bir qadın Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zəhərli qoyun gətirdi və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan yedi. Sonra o qadını Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirərək bu haqda ondan soruşdular. O: "Səni öldürmək istədim!" deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah Təal sənin məni öldürməyinə imkan verməz." Və ya: "Mənim üzərimə" Onlar: "onu öldürəkmi?" deyə soruşduqda, belə buyurdu: "Xeyr!" Ənəs belə demişdir: "Mən bu əlaməti Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) damağında görürdüm." (Müslim / 2190).

## On altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (gözə yarı ) təxmin edərkən dediyinin düz çıxması haqda.

21-Əbu Humeyd (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə tabuk döyüşünə çıxdıq. Biz əl-Qura vadisində bir qadının bağına gəldik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Təxmin edin!" Bizdə onu təxmin etdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə onu on vasaq (bəhrə) təxmin etdi. Sonra isə belə buyurdu: "Allahın izni ilə qayıdana kimi onu say!." Biz getdik və gəlib Tabuka çatdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu axşam üzərinizdən şiddətli bir külək əsəcəkdir. Bu küləkdə sizdən heç kim ayağa durmasın! Və hər kimin dəvəsi varsa ipini möhkəm bağlasın. Şiddətli bir külək əsməyə başladı. Bir kişi ayağa qalxı və külək onu götürərək Tayy dağına atdı. Eylə hökmüdarı İbn əl-Almənın Elçisi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir məktub gətirdi. Ona bir ağ qatır da hədiyyə etdi. Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona məktub yazaraq bir əba hədiyyə etdi. Sonra biz çevrilib getdik və gəlib əl-Qura vadisinə çatdıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadından bağının bəhrəsinin nə qədər olduğunu soruşdu. Qadın: "On vasaq" deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən tələsik gedirəm. Sizlərdən kim istəyirsə , mənimlə birgə tələssin! Qalmaq istəyən qalsın! Biz yola çıxdıq və gəlib Mədinəyə yaxınlaşdıqda , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Budur Taba. Bu da Uhuddur. O bizi sevən, biz də onun sevən dağdır." Sonra isə belə buyurdu: "Ənsarların ən xeyirli məskəni Bəni Nəccarın məskənidir. Sonra Bəni Əbd əl-Əşhəlin, sonra Bəni Əbd əl-Həris İbn əl-Xəzrəcin, sonra Bəni Saədənin. Ənsarların hər birinin məskəni xeyirlidir." Biz Saad ibn Ubada ilə qarşlıaşdıqda Əbu Useyd belə dedi: " Məgər Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarların məskənlərini xeyirli etdiyini və bizi ən sonuncu saydığını görmürsən?" Sad Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çataraq belə dedi:" Ey Allahın Elşisi , ənsarların məskənlərini xeyirli etdin və bizi ən sonuncu saydın." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə cavab verdi: "Məgər xeyirlilərdən olmanız sizə kifayət deyil?!" (Müslim / 1392).

## On yeddinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Mən sizi oddan qorumaq üçün ətəyinizdən tuturam."

22-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Mənim misalım od qalamış bir kişinin misalıdır. Atəş ətrafı işıqlandırdıqda pərvanələr və bu oddakı heyvanlar ora düşməyə başlayırlar. Kişi onlara mane olsa da onlar ona üstün gələrək ora düşürlər. Bu da mənim və sizin misalınızdır ki , mən sizi oddan qorumaq üçün ətəyinizdən tuturam və atəşdən bəri gəlin! Atəşdən bəri gəlin! Deyirəm. Siz isə mənə üstün gəlib və ora daxil olursunuz." (Müslim / 2284).

## On səkkizinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların Allahı daha yaxşı tanıyanı və ondan daha çox qorxanı idi.

23-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir işə rüsxət verdi və insanlar isə bundan çəkindilər. Bu xəbər Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çatdıqda qəzəbləndi. Hətta bu qəzəb onun üzündən aydın oldu. Sonra isə belə buyurdu: "Bir qurup insanlara nə olub ki mənim verdiyim

rüsxətdən imtina edirlər?! Allah and olsun ki mən onların Allahı daha yaxşı tanıyanı və ondan daha çox qorxanıyam. " (Müslim /2356).

## On doqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) günahlardan üzaq olması və Allahın haram qıldığı şeylərə nəzarət etməsi.

24- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki iş arasında seçim etdikdə , bu iş günah olmadıqca ən asanını seçərdi.Əgər onda günah vardısa , ondan insanların ən uzaq olanı idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç zaman öz nəfsinə görə intiqam almadı. Yalnız Allahın haram qıldığı şeylər çeynənilərsə , bu , müstəsna idi." (Müslim / 2327).

## İyirminci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaqları şişənə qədər namaz qılması və: "Məgər şükr edən bəndələrdən olmayımmı?" deməsi haqda.

25-əl- Muğira İbn Şöbə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaqları şişənə qədər namaz qıldı. Ona: "Allah təal sənin keçmiş və gələcək günahlarını bağışladığı halda bu qədər nəfsini yorursan?" deyildi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "Məgər şükr edən bəndələrədn olmayımmı?" (Müslim / 2819).

## İyirmi birinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Mən hovuzun başına sizdən öncə çatacağam."

26-Cundub (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: " Mən hovuzun başına sizdən öncə çatacağam." (Müslim / 2289).

## İyirmi ikinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hovuzu, onun böyüklüyü və ümmətinin ora gəlməsi haqda.

27-Abdullah İbn Amr İbn əl-Ass (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Hovuzum bir aylıq məsafə qədərdir. Və onun küncləri bərabərdir suyu gümüşdən bəyazdır. Ətri miskdən daha gözəldir. Badələri göydəki ulduzların sayı qədərdir. Kim onun suyundan içərsə , heç bir zaman susamaz." Əsma bintu Əbu Bəkr (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizlərdən kiminsə gəldiyini görənə kimi mən hovuzun başında oalcağam. Yanıma gələn bir qurup insanlar tutulacaqlar. Mən: "Ey Rəbbim , məndəndirlər, ümmətimdəndirlər" deyəcəm. Mənə belə deyiləcək: "Sən onların səndən sonra nə etdiklərini bilimədin" Allaha and olsun ki , onlar səndən sonra geriyə dönməkdə (dinlərinə qayıtmaq) davam etdilər." İbn Əbu Muleykə belə deyərdi: "Allahım! Biz geriyə dönməkdən və ya dinimizlə imtahana çəkilməkdən sənə sığınırıq."

28- Həris İbn Vahb (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişdir: "Hovuzum Sanə və Mədinə arasındakı məsafə boydadır." Mustavrid ona belə

dedi:" Onun: "Qablar." Dediyini eşitmədinmi?" O: "Xeyr!" deyə cavab verdikdə, Mustavrid belə buyurdu: "Qablar orada ulduzlar kimi görünəcəkdir."

29-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən sizin önünüzdə Carbə və Uzruh (yer adları) arasında olan məsafə boyda hovuz olacaqdır." Başqa rəvayədə isə belədir: "Hovuzum." Başqa bir rəvayəatdə isə belə deyilir: " Ubeydullah belə demişdir: "Ondan –yəni Nəfidən- onun haqda soruşdum. Belə buyurdu: "Bu Şamda iki kənddir onlar arasındakı məsəafə üç gecəlik yoldur." Başqa rəvayət isə belədir: "Üç günlük." (Müslim / 2299).

30-Cabir İbn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " Mən hovuzun başına sizdən öncə çtacağam. Onun tərəfləri arasındaki uzunluq Sanə və Əylə arasındakı məsafə qədərdir. Oradakı badələr sanki ulduzlar qədərdir." (Müslim /2305).

31-Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Ey Allahın Elçisi , hovuzun badələri nədir?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Muhammədin nəfsi əlində olana and olsun ki , onun badələrinin sayı səmadakı ulduz və bürclər qədərdir. Həmdə açıq qaranlıq bir gecədə. Hər kim ondan içərsə heç zaman susamaz. Hovuza cənnətdən iki novundan sırıltı ilə su axar. Ondan içən heç zaman susamaz. Eni uzunu kimidir. O Ammandan Eyləyə kimi olan məsafə boydadır. Suyu süddən daha da bəyazdır və baldan daha şirindir." (Müslim / 2305).

32-Savban (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " Mən hovuzumun kənarında Yəmən əhli gəlsin deyə insanları qovacağam. Əlimdəki sobayla onları vurduqda üzərlərinə su sıçrayacaqdır." Ondan onun eni haqda soruşuldu O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Durduğum bu yerdən Ammana kimi." Onun suyu haqda soruşulduqda isə belə buyurdu: " O süddən daha bəyaz, baldan dah şirindir. Onun içinə şırıltı ilə iki novdan su axır. O Cənnətdən uzanan bir novdur. Onun biri qızıldan digəri siə gümüşdəndir." (Müslim / 2301).

33-Uqba İbn Amir (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün çıxaraq Uhud əhi üçün cənazə namazlı qıldı. Sonra minbərə qalxaraq belə buyurdu: "Mən sizdən öncə çatanam və sizin üçün şahidlik edənəm Allaha and olsun ki , mən indi də hovuzuma baxıram .Mənə yer üzünün xəzinələrinin açarları verilmişdir. Və ya yer üzünün açaraları. Allah and olsun ki , mən sizin üçün məndən sonra şirk edəcəyinizdən qorxmuram. Mən sizin üçün dünyaya görə yarışacağınızdan qorxuram." (Müslim \ 2296).

## İyirmi üçüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəsfi, elçi olaraq göndərilməsi və yaşı haqda.

34-Ənəs İbn Məlk (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nə çox uzun , nə də alçaq boylu idi. Nə çox bəyaz , nə də çox qara deyildi. Saçı nə çox qıvrım , nə də çox düz deyildi. Allah Təala onu qırx ilin başında elçi olarq göndərmişdi. Məkkədə on il , Mədinədə də on il qaldı. Allah Taəla onun altımış ilin başında ruhunu aldıqda başında və saqqalında iyirmi ədəd belə ağ tük yox idi." (Müslim / 2347).

35-əl-Bara (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) orta boylu , enli kürək, uzun saçları qulaqlarının mərcəkinə kimi idi. əynində qırmızı əba vardı. Onadan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gözəl bir şey görməmişdim."

36-Əbu ət-Tufeyl (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gördüm. Yer üzündə məndən başqa onu görən yoxdur." Mən ona belə dedm:" Onu necə gördün?" O belə buyurdu: "O ağ, sevmli , orta boylu biri idi." Müslim belə demişdir:" Əbu Tufeyl yüzüncü ildə vəfat etmişdir. O Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən ölən ən sonuncu səhabədir. " (Müslim / 2340).

## İyirmi dördüncü fəsil: Peyğəmbərlik möhürü.

37-Cabir İbn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saqqalı ilə başının ön tərəfi ağarmağa başlamışdı. Saçına yağ sürtdüyündə (bəyazlıq) bilinməzdi. Saçı dağınıq olanda bilinərdi. Saqqalının tükü çox olan biri idi." Bir kişi: "Üzü qılınc kimi idi" deyə söylədikdə, o belə buyurdu: "Xeyr! Əksinə , günəş kimi yümru sifət biri idi. Çiynindəki möhürünü də gördüm. Köyərçin yumurtası kimi id. Bədəninə bənzəyirdi." (Müslim / 2343).

38-əs-Səib İbn Yezid (Allah ondan razı olsun) belə rəvayət edir: "Xalam məni Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına apardı və belə dedi: "Ey Allahın Elçisi , bacım oğlu xəstədir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başımı sığalladı , sonra bərəkət dilədi. Sonra isə dəstəmaz aldı və mən onun dəstəmaz aldığı sudan içdim. Sonra onun arxasında durdum və onun iki çiyni arasında çadır düyməsi kimi möhürü gördüm." (Müslim / 2345).

39-Abdullah İbn Sarcas (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gördüm və onunla çörək və ət yedim. (və ya Sərid adlı yemək dedi.) Mən ondan: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənin üçün bağışlanma dilədimi?" deyə soruşdum. O belə cavab verdi: "Bəli! Sənin üçün də dilədi." Sonra bu ayəni oxudu: "Həm öz günahlarının, həm də mömin kişilərin və qadınların bağışlanmasını dilə." Sonra mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)) arxasına keçdim və iki kürəyinin arasında olan peyğəmbərlik möhrünə baxdım. Sol kürəyinin başında barmaqları bükülmüş bir əl kimi möhür vardı. Üzərində ziyilə oxşar xalllar vardı." (Müslim / 2346).

## İyirmi beşinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ağzı, gözü və dabanın vəsfi.

40-Cabir İbn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) geniş ağızlı, gözünün ağında azca qırmızılıq olan və ətsiz dabanlı bir insan idi." Mən Siməkdən: "geniş ağızlı nə deməkdir? " deyə soruşdum . O: "Yəni böyük ağızlı." Deyə cavab verdi. Mən: " gözünün ağında azca qırmızılıq nə deməkdir?" deyə yenə soruşdum. O: "yəni göz qapağının uzun olması." Deyə cavab verdi. Sonra mən: "Ətsiz daban nə neməkdir?" deyə soruşdum. O: "Dabanında az ət olan." Deyə cavab verdi."

## İyirmi altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saqqalının vəsfi.

41-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " o bir kimsənin saçından və saqqalından bəyaz tük qoparmasını bəyənməzdi. Belə deyərdi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) boyamamışdır. Bəyazlıq onun alt dodağında, saqqalında və başının tükündə bir neçə dənə idi."

## İyirmi ueddinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qocalması.

42-Əbu Cuheyfə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bəyaz gördüm , qocalmışdı. əl-Həsən İbn Əli (Allah ondan razı olsun) ona çox oxşayırıdı."

## İyirmi səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saçının vəsfi.

43-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saçı çiyinlərinə dəyirdi."

44-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saçı qulağının yarısına çatırdı."

## İyirmi doqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saçını açması (tökməsi, uzatması) və ayırması.

45-İbn Abbas Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Kitab əhli saçlarını açardılar. Müşriklər isə saçlarını ayırardılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona əmr gəlməyən şeylərdə əhli Kitabın etdiyini etməyi xoşlayırdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saçını alnına tökdü və bir müddət sonra isə ayırdı." (Müslim / 2336).

## Otuzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təbəssümü haqda.

46-Simək ibn Harb belə rəvayət edir: "Cabir ibn Samuraya (Allah ondan razı olsun) belə dedim: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç oturmusan?" O belə cavab verdi: " Bəli , çox oturmuşam. Sabah -və ya günorta- namazını qıldıqdan sonra namz qıldığı yerdə gün doğana kimi oturardı. Gun doğduqdan sonra durardı. Onlar söhbət edər, cahiliyyə dövründən danışır söhbət edir və gülürdülər. O isə təbəssüm edirdi." (Müslim / 2332).

## Otuz birinci fəsil: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hələ bakirə olan bir qızdan daha utancaq idi."

47-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hələ bakirə olan bir qızdan daha utancaq idi. O bir şeyi bəyənmədikdə biz bunu onun üzündən anlardıq." (Müslim 2320).

## Otuz ikinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gözəl ətirli olması və əlinin yumuşaqlığı haqda.

48-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) parlaq bəyaz rəngli idi. Onun təri inci kimi idi. Yeridiyində sağa və sola meyl edərdi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlindən yumuşaq nə bir ipəyə , nə də bir dibəcə əlimi sürtməmişəm. Heç bir Ənbər (ətir növü) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iyindən gözəl deyildi." (Müslim /2330).

49-Cabir İbn Samura (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə ilk namzı qıldım. Sonra o çıxaraq ailəsinin yanına getdi. Mən də onunla bərabər çıxıdm. Bir neçə oğlan uşağı ilə qarşılaşdı. Onların hər birinin yanağını bir-bir sığalladı. Mənə gəlincə isə mənim də yanağıma toxundu. Onun əlini elə sərin və ətirli hiss etdim ki, sanki onu ətirçinin səbətindən çıxarmışdı." (Müslim / 2329).

## Otuz üçüncü fəsil: Vəhy nazil olduqda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) soyuq havada tərləməsi.

50-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Soyuq bir səhər vaxtı Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəhy nazil oldu. Sonra üzündən tər axmağa başladı." (Mülsim /2333).

51-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “əl-Həris ibn Hişam Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sənə necə vəhy nazil olur?" deyə soruşdu. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəzən zınqırov səsi kimi gəlir. Bu mənim üçün ən şiddətli olanıdır. Sonra açılar (gedir) və mən onu anlamış oluram. Bəzən isə insan cildində bir mələk gəlir və mən onun dediyini anlayıram." (Müslim / 2333).

## Otuz dördüncü fəsil: Peyğəmbərin (a, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tərinin gözəl olması.

52-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanımıza daxil odu. Bizdə biraz yatdı və tərlədi. Anam bir şüşüə qab gətirərək təri onun içinə yığdıqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oyandı və belə dedi: "Ey Ummu Suleym , bu nədir belə edirsən? " O belə cavab verdi: "Bu sənin tərindir. Onu ətirlərimizə qatacağam. O , ətirlərin ən gözəlidir." (Müslim / 6281).

## Otuz beşinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təri ilə təbbatuk (bərəkət diləmək) etmək.

53-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ummu Süleym evində olmadıqda onun evinə daxil olaraq onun döşəyində yatardı. Bir gün gəlib yenə onun döşəyində yatdı. Həmən Ummu Süleymin yanına gedərək: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənin evindədir və sənin döşəyində yatıb " dedilər. Ummu Süleym gəldiyində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tərləmişid və təri bir parça dərinin

üzərində toplaşmışdı. O dərhal sandığını açaraq  bu təri silib onu şüşə bir qabın içinə sıxmağa başladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) diksindi və oyandı. Ondan: "Ey Ummu Süleym , nə edirsən? " deyə soruşdu. O belə cavb verdi: "Ey Allahın Elçisi , ondan uşaqlarımız üçün bərəkət umuruq." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Düz edirsən!" deyə cavab verdi." (Müslim / 2331).

## Otuz altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlara yaxıın olması və insanların onunla təbərruk etmələri haqda.

54-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saban namazını qıldıqdan sonra Mədinə əhlinin xidmətçiləri içərisində su olan qablarla gəlirdilər. Ona gətirilən elə qab olmurdu ki onun içinə əlini salmasın. Bəzən onu soyuq bir səhər vaxtı gətirirdilər və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlinin onun içinə salırdı." (Müslim / 2324).

55-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Bərbərin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) saçını qırxdığını görmüşəm. Əshabələri ətrafını sarımışdı. Bir tükün  bir kişinin əlindən başqa bir yerə düşməsini istəmirdilər." (Müslim / 2325).

56-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Ağlında bir şey olan bir qadın Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Ey Allahın Elçisi , mənim sənə (danışacaq) bir ehtiyacım var." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)ona belə buyurdu: "Ey Ummu filan , bax yollardan hansında istərsən sənin ehtiyacını dinləyərəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onunla yolların birinə çəkilərək onun ehtiyacını dinlərdi." (Müslim / 2326).

## Otuz yeddinci fəsil: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) uşaq və ailəsinə insanların ən rəhimli olanı idi.

57-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "İnsanların içində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kimi ailəsinə qarşı rəhimli olanı görmədim. İbrahim Mədinə yaylağında süd anasına verilmişdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizimlə gedər və evə daxil olardı. Süd verən arvadın əri dəmirçi idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İbrahimi götürərək öpər , sonra isə qayıdardı." Amr (Allah ondan razı olsun) belə demişdir: "İbrahim vəfat etdikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Həqiqətən İbrahim mənim oğlumdur və döşdən ayrılmadan ölmüşdür. Cənnətdə onun iki süd anası vardır və onu əmizdirməyi tamalayırlar.."

58-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ əl-Əqra İbn əl-Habis Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Həsəni öpdüyünü gördü və belə dedi: "mənim on övladım var onlardan birini də öpməmişəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "həqiqətən rəhm etməyənlərə rəhm olunmaz."

## Otuz səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlara rəhm etməsi və karvan sürənlərə onlara qarşı yumuşaq davrammalarını əmr etməsi.

59-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərlərinin birində idi. Əncəşə adlı qara kölə oxuyaraq dəvələri sürətləndirirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Ey Əncəşə şüşələrə (qadınlara) görə dəvələri yavaş sür!" (Müslim / 2323).

## Otuz doqquzuncu fəsil: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şücaəti və hərbdə öndə olması.

60-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İnsanların ən yaxşısı, ən səxavətlisi və ən şücaətlisi idi. Bir gecə Mədinə əhli həqiqətən , bir səsdən qorxdular. İnsanlar səs olan tərəfə getdikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların qarşısına çıxdı. O səs gələn tərəfdən qayıdırdı və onları qabaqlamışdı. O Əbu Talhanın çılpaq bir atına minmişdi. Qılıncı boynuda belə deyirdi: "Qorxmayın! Qorxmayın!" Ənəs belə demişdir: "Biz onun dərya kimi olduğunu gördük. Və ya o dərya idi. (yəni at sürətli idi) halbu ki , biz bu atı asta və aciz bilirdik." (Müslim / 2307).

## Qırxıncı fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanların ən əxlaqlısı idi.

61-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İnsanların ən əxlaqlılarından id. Bir gün məni bir iş dalınca göndərdi. Mən isə: "Allaha and olsun ki getməyəcəyəm." Dedim. Nəfsimdə isə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə əmr etdiyi işə getmək idi. Çıxdığımda uşaqların yanından geçirdim , onlar bazarda oynayırdılar. Birdən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başımın arxasından tutdu. Ona baxdığımda gülürdü. Belə buyurdu: "Ey Uneys! Sənə əmr etdiyim yerə get! " Mən: "Bəli! Gedirəm , Ey Allahın Elçisi" dedim." Ənəs (Allah ondan razı olsun) belə demişdir: "Allah and olsun ki , ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) doqquz il xidmət etdim. Etdiyim bir şeyə görə mən: "Niyə belə və belə etdin!" və ya tərk etdiyim bir şeyə görə: "Kaş ki , belə və belə etsəydin!" dediyini bilmirəm." (Müslim / 2309).

## Qırx birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) danışığı haqda.

62-Urva ibn əz-zUbeyr belə rəvayət edir: "Əbu Hüreyrə (Allah ondan razı olsun) hədis danışar və belə deyərdi: "Ey otaq sahibi eşit!" "Ey otaq sahibi eşit!"Aişə (Allah ondan razı olsun) isə namaz qılırdı. Namzı bitirdikdən sonra urvaya belə buyurdu: "Bunun bayaq dediyi sözü eşidirsənmi?! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədis danışarkən onu danışığını saymaq istəyən olsaydı sayardı." (Müslim / 2493).

## Qırx ikinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizdən moizə üçün (müəyyən günləri təyin edərdi) əhd alardı.

63-Şaqiq İbn Əbu Vail belə rəvayət edir: Abdullah hər cümə axşamı bizimlə müzakirə edir bizə xatırladırdı. Bir kişi ona belə dedi: "Ey Əbu Əbd ər-Rahman , biz sənin söhbətlərini sevirik və istəyirik. İstərdik ki , sən bizimlə hər gün danışasan!" O belə

cavab verdi: "Mənə sizinlə danışmağa mane olan bir şey yoxdur. Yalnız mən sizi bezdirməkdən çəkinirəm. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizi bezdirməkdən qorxduğu üçün bizdən moizə üçün (müəyyən günləri təyin edərdi) əhd alardı." (Müslim /2821).

## Qırx üçüncü fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xeyir işlərdə insanların ən comərd olanı idi.

64-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xeyir işlərdə insanların ən comərd olanı idi. Ramazan ayında isə daha da comərd olardı. Cərail (ona Allahın salamı olsun) Onunla (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hər il Ramazan ayında qarşılaşardı. Bu , Ramazan ayı bitənə kimi davam edərdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona quranı ərz edərdi (təkrarlardı). Cəbrail Onunla (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qarşılaşıdqda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xeyir işlərdə ən sürətli küləkdən də comərd olardı." (Müslim / 2308).

## Qırx dördüncü fəsil: Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir şey istədikdə, əsla "yox" deməzdi.

65-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir şey istədikdə, əsla "yox" deməzdi" (Müslim / 2311).

66-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki dağın arasını dolduracaq sayda qoyun istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona istədiyini verdi. Kişi qövmünün yanına qayıtdıqda onlara: "Ey Qövm , İslamı qəbul edin! Allaha and olsun ki , Muhamməd elə bir əta edir ki , kasıbçılıqdan qorxmur." Ənəs belə buyurmuşdur: " Bir insan dünya üçün islama girər, lakin islama girdikdən sonra İslam onun üçün dünya və onda olandan daha sevimli olurdu." (Müslim /2312).

## Qırx beşinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) böyük və çox əta etməsi haqda.

67- İbn Şihab (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Fəth döyüşünə çıxdı və Məkkənin fəth etdi. Sonra isə yanında oaln müsəlmanlarla çıxaraq Hünüeyndə döyüşdü. Və Allah Təala onun və müsəlmanların dininə kömək oldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Safvan İbn Umeyyəyə yüz dəvə verdi. Sonra yenə yüz dəvə verdi. Sonra yenə də yüz dəvə verdi." İbn Şihab belə demişdir: "Səid ibn Museyyib Saffanın belə dediyini rəvyət etmişdir: " Allaha and olsun ki , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə verdiyini verdi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim üçün insanlardan ən nifrət ertdiyim biri idi. Mənə o qədər (pay) verdi ki, artıq mənüm üçün o (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlardan ən sevimli biri oldu." (Müslim \2313).

## Qırx altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vədi haqda.

68-Cabir İbn Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: " Əgər əl-Bəhreyndəm mal gəlsəydi ,sənə bu və bu və bu qədər verərdim" deyərək əli ilə bütün mala işarə etdi." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əl-Bəhreyndəm mal gəlmədən öncə vəfat etdi. Bu mal əbu Bəkrin (Allah ondan razı olsun) xilafətində gəldi və carçıya belə çağırmasını əmr etdi: "Hər kimə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəd vermişdirsə və ya ona borcu varsa , gəlsin!" mən qalxaraq ona: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Əgər əl-Bəhreyndəm mal gəlsəydi sənə bu və bu və bu qədər verərdim" dediyini söylədim. Əbu Bəkr (Allah ondan razı olsun) bir ovuç aldı və sonra mənə: "Say!" deyə buyurdu. Mən onu syydım. O , beş yüz idi. Sonra o mənə: "Onun iki mislini də al!" deyə buyurdu." (Müslim / 2314).

## Qırx yeddinici fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) adlarının sayı haqda.

69-Cubeyr İbn Mutim (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Mənim adlarım var. Mən: "Muhamməddəm!" Mən: "Əhmədəm!" Mən: "əl-Məhiyəm (silən) Allah Təala mənimlə küfrü sillir." Mən: "əl-Həşirəm (həşr edən) İnsanlar mənim qədəmlərimə həşr olunacaqlar." Mən: "əl-Aqibəm" (sonuncu Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)" ki, ondan sonra heç kim yoxdur.) Allah Təala onu Rauf və Rəhim (şəfqətli, mərhəmətli) adlandırmışdır." (Müslim /2355).

70-Əbu Musa əl-Əşari (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə öz adlarını deyərdi. Belə buyurdu: "Mən: "Muhamməddəm, Əhmədəm, əl-Muqaffiyəm, əl-Həşirəm, Tövbə və Rəhmət peyğəmbəriyəm." (Müslim /2355).

## Qırx səkkizinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkə və Mədinədə qaldığı müddət haqda.

71-İbn Anbbas (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkədə on üç il qadı və ona vəhy nazil olurudu. Mədinədə isə on il qaldı. Vəfat etdiyində isə altımış üç yaşı vardı." (Müslim / 2351).

72-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkədə on beş il qadı. Yeddi il səs eşidir , işıq görürdü. İşıqdan başqa bir şey görmürdü. Səkkiz il isə ona vəhy olundu. Mədinədə isə on il qaldı." (Müslim / 2353).

## Qırx doqquzuncu fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdiyində neə yaşında idi.

73-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), Əbu Bəkr və Ömər vəfat etdiklərində altımış üç yaşları vardı." (Müslim / 2348).

74-Bəni Həşimin mövlası olan Ammar belə rəvayət edir: "İbn Abbasdan belə soruşdum: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdikdə neçə yaşında idi?" O belə buyurdu: " Qövmündən sənin kimi bir adama bunun gizli qaldığını bilməzdim." Mən belə dedim: "Mən insanlardan bu haqda soruşdum. Lakin onlar müxtəlif rəydədirlər. Və sənin bu haqda sözünü bilmək istədim. O mənə : "Sən hesab bilirsənmi?" deyə soruşdu. Mən: "Bəli!" deyə cavab verdikdə, belə buyurdu: " qırxı tut. Bu yaşda ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) peyğəmbərlik verilmişdir. On beşil məkkədə əminamanlıq və qorxu içində qalmışdır. On il də Mədindədə hicrətdən sonra yaşadı." (Ənəsin hədisində keçdiyi kimi) (Müslim /2353).

## Əllinci fəsil: Allah Təala bir ümmətə rəhm etmək istədikdə, onun peyğəmbərinin ruhunu onlardan öncə alar.

75-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Allah Təala bəndələrindən bir ümmətə rəhm etmək istədikdə , onların peyğəmbərlərinin ruhunu onlardan öncə alar. Onu onlar üçün öndər və qabaqçıl edər. Əgər onları həlak etmək istərsə , Peyğəmbəri sağ ikən onlara əzab verər. Onlar həlak olduqda o baxar. Onu yalan saydıqları və asi olduqlar üçün onların həlakı ilə onu məmnun edər." (Müslim /2288 )

## Əlli birinci fəsil: Allah Təala buyurur: "Amma, xeyr! Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə... iman gətirmiş olmazlar.

76-Abdullah İbn Zubeyr (Allah ondan razı olsun) belə rəvayət edir: " Ənsarlardan bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanaında çöldə xurmalıqları suladıqları su arxı barasində Zübeyrdən şikayətçi oldu. O ona: "Suyu arxa burax getsin!" Zubeyr onlara etiraz etdikdə , Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şikayət etdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zubeyrə belə buyurdu: " Ey Zubeyr , xurmalığı sula , sonra isə suyu qonşun üçün burax!" Ənsardan olan kişi qəzəbləndi və belə dedi: "Ey Allahın Elçisi , sənin əmin oğlu olduğu üçün belə edirsən!" Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzünün rəngi dəyişdi sonra isə belə buyurdu: " Ey Zubeyr , xurmalığı sula , sonra suyu divara qayıdana kimi bağla." Zubeyr belə demişdir: "Allah and olsun ki , mən bu ayənin: "Amma, xeyr! Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən ixtilaflarda səni hakim təyin etməyincə....... iman gətirmiş olmazlar." Bu haqda nazil olduğunu hesab edirəm." (Müslim /2357).

## Əlli ikinci fəsil: Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tabe olmaq. Allah Təala buyurur: "Ey iman gətirənlər! Sizə bəlli olunca , qanınızı qaraldacaq şeylər barəsində soruşmayın."

77-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri haqda bir xəbər çatdı. Xütbə verərək belə buyurdu: "Cənnət və Cəhənnəm mənə göstərildi. Bu günkü gündəki kimi xeyr və şər olduğunu görmədim. Mənim bildiyimi bilsəniz

, az gülüb çox ağlardınız." Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri üçün o gündən ağır bir gün gəlmədi. Başlarını örtmüşdülər və onların iniltiləri eşidilirdi. Ömər (Allah ondan razı olsun) qalxaraq belə dedi: " Allahdan Rəbb, İslamdan din, Muhəmmədən Peyğəmbər kimi razıyıq. Bir kişi qalxaraq atam kim idi?" deyə soruşdu Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Atan filankəsdir" deyə cavab verdi və bu ayə nazil oldu: "Ey iman gətirənlər! Sizə bəlli olunca qanınızı qaraldacaq şeylər barəsində soruşmayın." (Müslim / 2358).

78- Saad İbn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Şübhəsiz ki, müslumanların müsəlmanlar haqqında ən böyük günahkarı o, müsəlmanlara haram qılınmayan bir şeyi soruşan kəsdir. Sorduğu üçün bu şey onlara haram qılınar". (Müslim /2358).

79- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi belə dedi: " Ey Allahın Elçisi atam haradadır? " O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Cəhənnəmdə!" Kişi çevrilib getdiyiyində, onu çağıraraq belə buyur: "Mənimdə , sənində atan cəhənnəmdədir." ( Müslim / 203).

## Əlli üçüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadağan etdiyi şeylərdən, çox sual verməkdən və ona müxalif olmaqdan çəkinmək.

80- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişdir: "Sizə nəyi qadağan etdimsə , ondan çəkinin! Və sizə nəyi əmr etdimsə ondan bacardığınıza əməl edin! Həqiqətən , sizdən öncəki ümmətləri çox sual vermələri və Peyğəmbərlərinə müxalif olmaları həlak etdi." (Müslim / 1337).

## Əlli dördüncü fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) din (şəriət ) barəsində xəbər verməsi və onunla dünyavi məsələlərdə rəy verməyin fərqi haqda.

81- Talha (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə xurma ağaclarının başından olan bir dəstə adamın yanından keçdik. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onlar nə edirlər?" deyə soruşdu. Ona: "Tozlandırırlar. Erkək xurmanının çiçəyini dişinin çiçəyinə qoyurlar" deyə cavab verdiklərində belə buyurdu: "Bunun kifayət edəcəyini zənn etmirəm." Onlara bu xəbər çatdırıldıqda belə etməyi tərk etdilər. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların belə etdikləri xəbər verildi və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "əgər bu onlara fayda verirdisə , qoy etsinlər , mən yalnız belə zənn etdim. Zənnimdən dolayı mənə məzəmmət etməsinlər. Lakin mən sizə Allahdan bir şey danışsam onu götürün. Həqiqətən , mən Allahın adından yalan danışan deyiləm!" (Müslim / 2351).

## Əlli beşinci fəsil: Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) görməyi arzulamaq və ona həris olmaq.

82- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Muhammədin nəfsi əlində olana and olsun ki elə gün gələcək ki , sizlərdən biriniz məni görməyəcəkdir. Sonra məni yanında görmək onun üçün ailəsi və malından daha sevimli olacaqdır." Əbu İshaq ( yəni İbrahim İbn Sufyan) belə demişdir: "Məncə bu hədisdəki məna

budur: " Məni yanlarında görmək onlar üçün ailəsi və mallarından daha sevimlidir. Sonra məni görməyəcəklər." Cümlədə təxir və təqdim vardır." (Müslim / 2364).

### Əlli altıncı fəsil: Ailəsi və malı bahasına Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) görmək istəyən haqda.

83-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ümmətimdən məni ən çox sevən məndən sonra gələcək bir qurup insanlardır. Onlardan biri məni ailəsi və malı bahasına görmək istəcəkdir." (Müslim /2832).

## *Peyğəmbərlər və onların fəzilətləri kitabı.*

### Birinci fəsil: Adəmin (Ona Allahın salamı olsun) yaradılışının başlanğıcı.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əlimdən tutaraq belə buyurdu: "Allah Təala altıncı gün torpağı yaratdı. Brinci Bazar günü (hicri təqvimi ilə birinci gün) onun üzərində dağları yaratdı. Birinci cün (hicri təqvimi ilə ikinci gün) ağacları yaratdı. İkinci gün (hicri təqvimi ilə üçüncü gün) yaşam üçün önəmli olan şeyləri yaratdı. Üçüncü gün (hicri təqvimi ilə dördüncü gün) nuru yaratdı. Dördüncü gün (hicri təqvimi ilə beşinci gün) ora heyvanları səpələdi. Beşinci gün (hicri təqvimi ilə Cümə günü) əsr vaxtınından sonra, məxluqatın ən sonunda , cümə saatlarının sonunda, gecə ilə əsr vaxtı arasında Adəmi xəlq etdi." (Müslim / 2789).

### İkinci fəsil: Xəlil İbrahimin (Ona Allahın salamı olsun) fəziləti haqda.

2- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedi: "Ey bəşəriyyətin ən xeyirlisi!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "O , İbrahimdir (Ona Allahın salamı olsun)." (Müslim /2369).

### Üçüncü fəsil: İbrahimin (Ona Allahın salamı olsun) sünnət olunması haqda.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " İbarahim (Ona Allahın salamı olsun) səksən yaşında ikən balta ilə özünü sünnət etdi." (Müslim / 2370).

### Dördüncü fəsil: İbrahimin (Ona Allahın salamı olsun): "Ey Rəbbim, ölüləri nə cür diriltdiyini mənə göstər!" deməsi və Lut və Yusif (onlara Allahın salamı olsun) peyğəmbər haqda.

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Biz şəkk etməyə İbrahimdən daha haqlıyıq. O: "Ey Rəbbim, ölüləri nə cür diriltdiyini mənə göstər!" -dedikdə (Allah) : "Məgər (ölüləri diriltməyimə) inanmırsan?" –buyurmuşdu. (İbrahim: ) "Bəli, inanıram, lakin ürəyim sakit (xatircəm) olmaq üçün (soruşdum)", - deyə cavab vermişdi." Allah Təala Luta rəhm etsin , o möhkəm bir dayağa

sığınmışıdır. Əgər həbsdə Yusif kimi uzun bir müddət qalsaydım , çağırana mütləq cavab verərdim." (Müslim /2370).

## Beşincii fəsil: İbrahimin (Ona Allahın salamı olsun): "Mən xəstəyəm!", "Bəlkə, onların bu böyüyü bunu etmişdir." Və Sara haqda: "Bu bacımdır." deməsi.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " İbrahim (Ona Allahın salamı olsun) üç dəfədən başaqa yalan danışmamışdır. İkisi Allah xatirinə olmaqla , biri :"Mən xəstəyəm!", ikincisi"Bəlkə, onların bu böyüyü bunu etmişdir" deməsidir. Digərini isə Saraya görə etmişdir. O qəddar bir hökmüdarın torpağına gəldikdə, Sara da onunla idi. O insanların ən gözəllərindən idi. O ona belə dedi: "Əgər bu qəddar sənin mənim arvadım olduğunu bilsə , səni almaq üçün məmə üstün gələr. Səndən soruşduqda bacım olduğunu söylə. Çünki sən mənim İslamda (müsəlman) bacımsan. Mən yer üzündə səndən və məndən başqa müsəlman tanımıram. O onun torpağına daxil olduqda qəddar hökmüdarın adamlarından bir dəstə onu gördü. Hökmüdarın yanına gələrək ona: "Sənin torpağına elə bir qadın daxil olub ki, ona səndən başqa kimsə sahib olmağa layiq deyil!" O onun ardınca adam göndərdi və onu gətirdilər. İbrahim (Ona Allahın salamı olsun) namaza durdu. O onun (hökmüdarın) yanına daxil olduqda o nəfsini saxlamayıb əlini ona tərəf uzatmaq istədi. Lakin əli şiddətli bir şəkildə tutuldu. O ona: Allah dua et əlim buraxılsın! Sənə bir zəzər verməərəm." deyə söylədi və o onun deiyini etdi. Lakin o yenidən əməlinə qayıtdı və əli əvəlkindən də şidətli bir şəkildə tutuldu. O ona əvəlki kimi söylədi və o onun deiyini etdi. Lakin o yenidən əməlinə qayıtdı və əli əvəlki iki dəfədən də şidətli bir şəkildə tutuldu. O ona: Səni and verirəm Allah dua et əlim buraxılsın! Sənə bir zəzər verməərəm." deyə söylədi və o onun deiyini etdi. Sonra o onu gətirəni yanına çağıraraq belə dedi: "Sən mənə insan yox , bir şeytan gətirmisən. Onu mənim torpağımdan çıxar və Həcəri ona ver!" O çevrilib getməyə başladı. İbrahim (Ona Allahın salamı olsun) onu gördükdə çevrilərək ondan belə soruşdu: "Nə xəbər?" O belə cavab verdi: "Xeyrdir! Allah təala facirin əlini bizdən uzaq etdi və mənə bir xadim əta etdi." Əbu Hürüeyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Ey səma suyunun oğulları , bu , sizin ananızdır." (Müslim / 2371).

## Altıncı fəsil: Musa (Ona Allahın salamı olsun) haqda. Allah Təala buyurur: " Allah onların dediklərindən təmizə çıxartdı. O, Allah yanında çox hörmətli idi."

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: " Musa (Ona Allahın salamı olsun) həyalı bir kişi idi. Çılpaq görünməzdi. Bəni İsrail (onun barəsində) belə dedi: "Onun xayaları böyükdür." O (Musa) kiçik bir su arxının yanında yuyundu. Paltarını bir daşın üzərinə qoydu və daş onun paltarını alaraq yuvarlanaraq qaçdı. O onun ardınca qaşaraq ağacla onu vurur daş paltarım! Daş paltarım! Deyə qışqırırdı. Nəhayət daş gəlib Bəni İsraildən olan bir dəstə insanın önündə durdu. Və bu ayə nazil oldu: "Ey iman gətirənlər! Musaya əziyyət verən kəslər kimi olmayın. Allah onların dediklərindən (böhtanlarından) təmizə çıxartdı. O, Allah yanında çox hörmətli idi."

## Yeddinci fəsil: Musanın Xıdırla (ona Allahın salmı olsun) hekayəsi.

7- Said ibn Cubeyr belə rəvayət edir: "İbn Abbasa (Allah ondan razı olsun) belə dedim: " Nofə əl-Bikəli Bəni İsrailin peyğəmbəri Musanın (ona Allahın salamı olsun) Xıdırın yoldaşı olan Musa olmadığını iddia edir." O belə buyurdu: "Allahın düşməni yalan deyir.Mən Ubey İbn Kabbin belə dediyini eştdim: "Peyğəmbərin

(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitdim: "Musa Bəni İsrailin arasına xütbə vermək üçün ayağa qalxdı. Ondan: "İnsanlardan ən elimli olan kimdir?" deyə soruşulduqda, O: "Mən ən elimliyəm!" deyə cavab verdi. O , elmi Allaha istinad etmədiyi üçün Allah Təala onu məzəmmət etdi və belə buyurdu: "Məcmə əl-Bəhreyn adlanan yerdə (iki dənizin qovuşduğu yer) bəndələrimdən biri səndən də elimlidir!" Musa belə dedi: "Ey Rabbim , mən onu necə tapa bilərəm?" ona belə deyildi: "Zənbilində bir balıq götür onu harada itirsən , o , orada olar." Beləcə o getdi. Onunla birgə xidmətçisi də getdi. O Yuşa ibn Nun idi. Musa (Ona Allahın salamı olsun) zənbildə özü ilə bir balıq da götürdü. O xidmətçisi ilə birgə gəzərək gəlib bir daşın yanına çatdılar. Musa və xidmətçisi yatdıqda balığ zənbildə hərəkətə gəldi və zənbildən çıxaraq dənizə düşdü. Allah Taəla onun üçün suyun axıntısını durdurdu və su çuxur kimi oldu. Balıq üçün bir kanal meydana gəldi. Musa (Ona Allahın salamı olsun) və xidmətçisi üçün qeyri adi bir şey olmuşdu. Günün qalan qismini və gecəni bu kanalla yürüdülər. Musanın (Ona Allahın salamı olsun) yol yoldaşı ona bunu xəbər verməyi unutmuşdu. Səhər açıldıqda Musa (Ona Allahın salamı olsun) xidəmətçisinə belə buyurdu: "“Nahar yeməyimizi gətir. Bu səfərimiz bizi lap əldən saldı!” Əmr olunduğu yeri keçənə qədər yorulmadı. Xidmətçi ona belə dedi: "Görürsənmi, biz qayanın yanında gizləndiyimiz zaman mən balığı unutdum. Doğrusu, onu xatırlamağı mənə yalnız Şeytan unutdurdu əcaib bir şəkildə dənizə yollanmışdır." Musa belə cavab verdi: "Elə istədiyimiz də budur!” – dedi və onlar öz ləpirlərinin izinə düşüb gəldikləri yolla geri qayıtdılar." "öz ləpirlərinin izinə düşümüdülər. Onlar gəlib daşın yanına çatdıqda orada bir kişinin yatdığını gördülər. Üzərində bir libas var idi. Musa (Ona Allahın salamı olsun) ona salam verdi. Xıdır ona: " Sənin bu torpağında salam nə gəzir?" deyə söylədi. O: "Mən Musayam!" deyə cavab verdi. O: "Bəni İsrailin Musasımı?" deyə ondan soruşdu. O : "Bəli!" deyə cavab verdikdə, ona belə dedi: "Sən Allahımn elmindən bir elm bilirsən ki, Allah onu sənə öyrətmişdir. Onu mən bilmirəm. Məndə Allahın elmindən elə bir elm bilirıəm ki, Allah onu mənə öyrətmişdir. Sən onu bilmirsən." Musa ona: "Öyrədildiyin doğru yolu göstərən elmdən mənə öyrətmək şərtilə sənə tabe olummu?” (Xıdır) belə cavab verdi: "Sən mənimlə bir yerdə olsan , əsla dözə bilməzsən. Axı sən bilmədiyin bir şeyə necə dözə bilərsən? (Musa) dedi: "İnşallah, səbirli olduğumu görəcəksən. Sənin heç bir əmrindən çıxmayacağam!" Xıdır belə buyurdu: "Əgər mənə tabe olacaqsansa, səbəbini sənə izah etməyincə , məndən heç bir şey haqqında soruşma!" Musa (Ona Allahın salamı olsun)" Bəli" deyə cavab verdi və Xıdır ilə Musa (Onlara Allahın salamı olsun) Sahilin kənarı ilə getməyə başladılar. Yanlarından bir gəmi keçdi və onlar onları da götürmələri üçün gəmidəkilərlə danışdılar. Onlar Xıdırı tanıdılar və hər ikisini də pulsuz gəmiyə aldılar. Xıdır gəminin taxtalarından birini tutaraq çıxartdı. Musa (Ona Allahın salamı olsun) ona belə buyurdu: "Bu qövm bizi pulsuz gəmilərinə aldlar və sənsə gəmidə olanları suya qərq etmək üçünmü gəmini deşdin? Doğrusu, (günahı) böyük bir şey etdin (olduqca çirkin bir iş gördün)." Xıdır belə cavab verdi: "Sənə demədimmi ki, mənimlə bir yerdə olanda əsla dözə bilməzsən?" (Musa) dedi: “Unutduğum bir şeyə görə məni danlama və məni öz işimdə çətinliyə salma!" Sonra onlar gəmidən çıxdılar. Onlar sahildə gedərkən uşaqlarla oynayan bir oğlan gördülər. Xıdır əli ilə onun başını tutaraq qopardı və öldürdü. Musa belə dedi: Pak (məsum) bir canamı qıydın? Doğrudan da, çox pis bir şey etdin". Xıdır yenə belə cavab verdi: “Sənə demədimmi ki, mənimlə birlikdə olanda əsla dözə bilməzsən?" Lakin bu birincidən də daha da şiddətli idi. Sora isə belə dedi: "Əgər bundan sonra səndən bir şey barəsində xəbər alsam, bir daha mənimlə yoldaşlıq etmə. Sən artıq mənim tərəfimdən üzrlüsən." Sonra yenə yola düzəlib getdilər. Axırda bir məmləkət əhlinə yetişib onlardan yeməyə bir şey istədilər. Əhali onları qonaq

etmək istəmədi. Onlar orada yıxılmaq üzrə olan bir divar gördülər. (Xıdır) onu düzəltdi." Əyilmiş dururdu. Xıdır əlini belə edərək onu düzəltdi. Musa ona belə dedi: "Yanlarına gəldikdə bizi qonaq kimi qəbul etmədilər bizə yemək vermədilər. "Əgər istəsəydin, sözsüz ki, bunun müqabilində bir müzd (çörək pulu) alardın. . " (Xıdır) dedi: "Bu artıq mənimlə sənin aranda ayrılıq vaxtıdır. Dözə bilmədiyin şeylərin yozumunu sənə xəbər verəcəyəm!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah Təal Musaya (Ona Allahın salamı olsun) rəhm etsin , istərdim ki, o səbr edərdi və biz onların xəbərlərindən bir az da agah olardıq. Ravi belə dedyir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Birincisi Musa (Ona Allahın salamı olsun) unutduğu üçün oldu. " Bir sərçə gələrək gəminin kənarınaqondu , sonra dənizə bir dimdik vurdu. Xıdır Musaya (Ona Allahın salamı olsun) belə dedi: "Mənim və sənin elmin Allahın elmindən bu sərçənin dənizdən aldığı su qədər azaldar. Səid İbn Cubeyr belə demişdir: "İbn Abbas (Allah ondan razı olsun) belə oxuyardı: "Onların önündə işə yararlı gəmilərəi qəsb edərək alan bir hökmüdar vardı." Həmçinin belə oxuyardı: "Amma oğlana gəlincə , o kafir idi."

## Səkkizinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Peyğəmbərlər arasında ayrı seçkilik etməyin!"

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir dəfə malını satışa çıxaran, bir şey verildikdə xoşlanmayan və ya razı qalmayan (Əbd əl-Əzizi burada şəkk etmişdir) bir yəhudi belə dedi: "Xeyr! Musanı insanların üzərinə seçən Allaha and olsun!" Ənsarlardan bir kişi bunu eşitdikdə , onun üzünə sillə vurdu və belə dedi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) aramızda ola-ola sən "Musanı insanların üzərinə seçən Allaha and olsun." deyirüsən?! Yəhudi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gedərək belə dedi: "Ey Əbu əl-Qasim , mənim əhdim və zimmətim vardır , bu filankəs isə üzümə sillə vurdu." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Onun üzünə nə üçün vurdun?" deyə soruşdu O belə cavab verdi: "Ey Allahın Elçisi ,o belə dedi:"Musanı insanların üzərinə seçən Allaha and olsun." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qəzəbləndi. Hətta üzündən qəzəbləndiyi bəlli oldu. Sonra belə buyurdu: "Allahın peyğəmbərləri arasında ayrı seçklik etməyin. Sur (birinci dəfə) çalınacaq, Allahın göylərdə və yerdə olan istədiyi kimsələrdən başqa, dərhal hamı yıxılıb öləcək. Sonra bir daha çalınacaq və ilk öncə mən qalxacağam və ya mən ilk qalxanların içində olacağam. Bir də baxdığımda Musanı ərşdən tutduğunu görəcəyəm. Bilmirəm tur günüdəki huşunu itirməsi iləmi hesaba çəkildi ,yoxsa ki , məndən qabaq qalxdı. Və mən Yunus ibn Mattadan kiminsə daha əfzəl olduğunu da söyləmirəm." (Müslim / 2373).

## Doqquzuncu fəsil: Musanın (Ona Allahın salamı olsun) vəfatı haqda.

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Ölüm mələyi Musanın (Ona Allahın salamı olsun) yanına gəldi və ona: "Rəbbinə cavab ver!" deyə buyurdu. Musa (Ona Allahın salamı olsun) əli ilə ona sillə vuraraq onun gözünü çıxartdı. Allah Təal onun gözünü yerinə qaytardı. Və ona: "Bəndəmin yanına get! Və onadan" yaşamq istəyirsənmi? " deyə soruş! Əgər yaşamaq istəyirsə , əlini öküzün belinə qoy və əlinə nə qədər tük yapışarsa, o qədər il yaşayacaqsan!" Musa (Ona Allahın salamı olsun) ondan: "Sonra nə olcaq?" deyə soruşdu? O: "Sonra öləcəksən!" deyə cavab verdikdə, belə dedi:" Elə isə yaxın vaxta öldür.

Rəbbim , məni Müqəddəs torpaqdan daş atılacaq bir məsafədə öldür!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Əgər onun yanında olsaydım ,onun yolun kənarındakı qırmızı qum təpəciyinin yanına olan qəbrini sizə göstərərdim." (Müslim /2372).

## Onuncu fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Musanın (Ona Allahın salamı olsun) yanından keçdikdə qəbrində namaz qılırdı.

10-Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İsra gecəsi qırmızı qum təpəciyinin yanında olan Musanın (Ona Allahın salamı olsun) yanaı gəldim (Həddabın rəvayətində isə: "keçdim"). O , qəbrində dayanıb namaz qılırdı."(Müslim / 2375).

## On birinci fəsil: Yusif (Ona Allahın salamı olsun) haqda.

11-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi insanların ən kəramətlisi kimdir? " deyə soruşuldu. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "ən təqvalı olanı" deyə cavab verdi. Onlar: "biz səndən bunu soruşmuruq." Dedikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahın Xəlilinin oqlu olan ,Allahın peyğəmbərinin oglu olan , Allahın Peyğəmbərinin oğlu olan Allahın peyğəmbəri Yusif. " Onlar yenə: "biz səndən bunu soruşmuruq."Dedikdə, belə buyurdu:" məndən ərəblərin mədənlərinimi soruşursunuz? Onların cahilliyyə dövründə ən xeyirliləri , fəqih olarlar (başa düşərlərsə) İslamda da ən xeyirliləridirlər."

## On ikinci fəsil: Zəkəriyyə (Ona Allahın salamı olsun) haqda.

12-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Zəkəriyyə dülgər idi."

## On üçüncü fəsil: Yunus (Ona Allahın salamı olsun) haqda.

13-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Allah Təala belə buyurmuşdur: "Mənim bəndəmə (İbn Musənnə belə demişdir: "bəndəmə") "Mən Yunus ibn Mattadan xeyirliyəm" deməsi yaraşmaz." (Müslim / 2375).

## On dördüncü fəsil: İsa (Ona Allahın salamı olsun) haqda.

14-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Məryəm oğlu İsaya bu dünyada da, axirətdə də insanların ən yaxını mənəm." Ondan: "Necə , Ey Allahın Elçisi?" deyə soruşulduqda belə buyurdu: "Peyğəmbərlər bir atanın oğullarıdır. Anaları ayrıdır. Dinləri biridir. Bizim aramızda heç kim yoxdur." (Müslim / 2365).

## On beşinci fəsil: Şeytan Məryəm oğlu İsadan başqa bütün yeni doğulmuş körpələrə toxunmuşdur.

15-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Elə bir yeni doğulmuş körpə yoxdur ki , şeytan ona toxunmasın. Körpə şeytanın toxunmasından fəryad edərək ağlar. Yalnız Məryəm oğlu İsa müstəsnadır." Sonra Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: " İstərisinizsə , bu ayəni oxuyun: "onu və onun nəslini məlun şeytandan sənə tapşırıram." (Müslim /2366).

On altıncı fəsil: İsa (Ona Allahın salamı olsun) belə buyurmuşdur: "Allaha iman etdim və gözümü yalan saydım. "

16-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Məryəm oğlu İsa (Ona Allahın salamı olsun) bir kişini oğurluq edərkən görür və ona: "Oğurluq etdin?" deyir. Kişi belə cavab verir: " Ondan başqa ilah olmayana and olsun ki , xeyr!" İsa (Ona Allahın salamı olsun) belə buyurur: ""Allaha iman etdim və gözümü yalan saydım." (Müslim / 2368).

## *Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrinin fəziləti kitabı.*

Birinci fəsil: Əbu Bəkrin fəziləti haqda. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə byurur: "Üçüncüsü Allah olan iki kişini sən nə zənn edirsən."

1- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz mağarada ikən başımızın üzərində duran müşriklərin ayaqlarına baxdım və belə dedim: "Ey Allahın Elçisi , əgər onlardan biri ayaqlarının altına baxsa , bizim ayaqlarının yanında olduğumuzu görəcək." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Ey Əbu Bəkr , üçüncüsü Allah olan iki kişini sən nə zənn edirsən." (Müslim / 2381).

İkinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) byurur: "Həqəqətən malı və yoldaşlığı xüsusunda mənə ən comərd olan Əbu Bəkrdir (Allah ondan razı olsun).

2- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərin üzərinə oturdu və belə buyurdu: " Allah Təala bir bəndənyə dünya naz nemətləri ilə onun dərgahında olan şeylər arasında seçim verdi və o Allah dərgahında olanı seçdi." Əbu Bəkir (Allah ondan razı olsun) ağladı, ağladı sonra isə belə buyurdu: "Ata analarımızı sənə fəda edək." Seçim qarşısında qalan Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) idi və bizdən bunu ən yaxşı bilən Əbu Bəkr (Allah ondan razı olsun) idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqəqətən malı və yoldaşlığı xüsusunda mənə ən comərd olan Əbu Bəkrdir (Allah ondan razı olsun). Əgər mən xəlil götürsəydim Əbu Bəkri (Allah ondan razı olsun) xəlil götürərdim. Lakin din qardaşlığı (əfzəldir.) Məsciddə Əbu Bəkrin (Allah ondan razı olsun) qapısından başqa bir açıq qapı qalmasın!" (Müslim / 2382).

Üçüncü fəsil: Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanlardan ən istəkli olan Əbu Bəkrdir (Allah ondan razı olsun).

3- Əbu Osman belə rəvayət edir: "Mənə Amr İbn əl-Ass belə xəbər vermişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu zət əs-Sələsil döyüşünə çıxan ordunun başında göndərdi. Mən Ondan(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "İnsanlardan sənə ən sevimli olan kimdir?" deyə soruşdum. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Aişə." Mən: "Kişilərdən kim?" deyə yenə soruşdum O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Atası." Deyə cavb verdi. Mən yenə: "Sonra kim?" deyə soruşduqda, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ömər." deyə buyurdu və bir neçə kişinin adını çəkdi." (Müslim / 2383).

Dördüncü fəsil: Sədəqə ilə xeyir olan əməlləri bir araya cəm etmək.

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Kim Allah yolunda iki zövcəsinə malından sərf edərsə , Cənnətdə: "Ey Allahın bəndəsi bu xeyirdir" deyə çağrılacaq. Və hər kim Namaz əhlindəndirsə , o Namaz qapsından çağrılacaq . Və kim Cihad əhlindəndirsə , o Cihad qapsından çağırılacaq. Və kim Sədəqə əhlindəndirsə , Sədəqə qapsından çağırılacaq. Və kim Oruc əhlindəndirsə, o Rayyan adlanan qapıdan çağırılacaq." Əbu Bəkir əs_Siddiq (Allah ondan razı olsun) Ondan: " Bir kimsənin bu qapların hamısından çağrılmasında bir zərər yoxdursa , bu qapların hamsından çağırılacaq?" deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəli! Və diləyirəm ki, (arzulayıram) sən onlardan olasan" (Müslim / 1027).

Beşinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurur: "Buna mən iman edirəm və mənimlə birlikdə Əbu Bəkr və Ömər də (Allah onlardan razı olsun) iman edirlər.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Bir dəfə bir kişi inəyini yükləyərək yolla sürürdü. İnək ona tərəf çevrilib: "Mən bunun üçün xəlq olunmamışam! Mən yalnız əkin üçün xəlq olunmuşam!" dedi. İnsanlar buna təəccüb edərək belə dedilər: "Sübhən Allah İnək də danışarmı?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Buna mən iman edirəm və mənimlə birlikdə Əbu Bəkr və Ömər də (Allah onlardan razı olsun) iman edirlər." Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bir gün bir çoban qoyun otararkən bir canavar gələrək sürüdən bir qoyunu aprdı. Çoban onu təqib edərək qoyunu ondan aldı. Canavar ona tərəf çevrilərək belə buyurdu: " Yırtıcı günü baxarıq. O gün bu sürüyə məndən başqa çoban olmaycaqdır." İnsanlar: "Sübhən Allah!" dedikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Buna mən iman edirəm və mənimlə birlikdə Əbu Bəkr və Ömər də (Allah onlardan razı olsun) iman edirlər." (Müslim /2388).

Altıncı fəsil: Siidiq və Faruqun Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə yoldaşlığı.

6- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Ömər (Allah ondan razı olsun) yatağının üzərinə qoyuldu. O qaldırılmamışdam öncə insanlar onun başına toplanaraq onun üçün dua edir və ona təriflər deyib (cənazə) namazını

qılrdılar. Mən də onların arasında idim. Arxadan çiynimdən tutan bir kişi məni diksindirdi. Ona tərəf çevrildiyimdə , onun Əli İbn Əbu Talib (Allah ondan razı olsun) olduğunu gördüm. Ömərə rəhmət dilədi və belə dedi: "Özündən sonra mənə Allahla qarşıladığımda sənin əməlin kimi sevimli olan bir əməl edən kimsə qoymadın! Allaha and olsun ki , mən zənn edirəm ki, Allah səni ikili dostuna qovuşduracaqdır. Çünki mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çox vaxt belə dediyini eşidərdim: "Mən, Əbu Bəkr və Ömər gəldik. Mən, Əbu Bəkr və Ömər daxil olduq. Mən, Əbu Bəkr və Ömər çıxdıq." Mən diləyirəm və ya zənn edirəm ki , Allah Təala səni onlarla birgə (Bir yerdə) edəcəkdir." ( Müslim 2389).

## Yeddinci fəsil: Siddiqin (Allah ondan razı olsun) xəlifə təyin olunması.

7- İbn Muleykə belə rəvayət edir: "Aişənin (Allah ondan razı olsun) belə dediyini eşitdim: "Ondan: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) özündən sora xəlifə təyin etsəydi , kimi təyin edərdi?" deyə soruşuldu.O (Allah ondan razı olsun) belə dedi: "Əbu Bəkri (Allah ondan razı olsun)." Ondan (Allah ondan razı olsun): "Əbu Bəkrdən (Allah ondan razı olsun) sonra kimi? Deyə souşuldu. O (Allah ondan razı olsun) belə buyurdu: "Öməri (Allah ondan razı olsun)." Ondan: "Ömərdən (Allah ondan razı olsun) sonra kimi? Deyə soruşulduqda O (Allah ondan razı olsun) belə buyurdu: "Əbu Ubeydə İbn əl-Carrahlı (Allah ondan razı olsun)." Və bunda dayandı." (Müslim / 2385).

8- Muhamməd İbn Cubeyr İbn Mutim atasından (Allah ondan razı olsun) belə rəvayət edir: " Bir qadın Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir şey istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona sonra gəlməsini söylədikdə, qadın: "səni tapmasam necə?" deyə soruşdu. Atam belə dedi: "Sanki o ölümü nəzərdə tuturdu." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Məni tapmasan , Əbu Bəkrin (Allah ondan razı olsun) yanına get!" (Müslim /2386).

9- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəstələndiyi ərəfədə mənə belə buyurdu: "Əbu Bəkri (Allah ondan razı olsun) atanı, qardaşını bir namə yazmam üçün yanıma çağır. Mən arzu edənin təmənna edərək "mən daha layiqəm " deməsindən qorxuram. Halbu ki , Allah və möminlər Əbu Bəkrdən (Allah ondan razı olsun) başqasını qəbul etməz." (Müslim / 2387).

## Səkkizinci fəsil: Ömər İbn əl-Xattabın (Allah ondan razı olsun) fəziləti haqda.

10-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir dəfə mən yatarkən mənə insanlar ərz olundu. Əyinlərində köynəklər var idi. Onlardan bəzilərinin köynəyi sinəsinə, bəzilərinin ki isə ondan bir az aşağıya çatırdı. Ömər İbn əl-Xattab (Allah ondan razı olsun) yanımdan keçdi. əynidə ətəyini yerlə sürüdüyü bir köynək vardı." Onlar: "Ey Allahın Elçisi , onu nəyə yozdun?" deyə soruşduqda belə cavab verdi: "Dinə." (müslim \ 2390).

11-Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Mən yatdığımda mənə içərisində süd olan bir qədəh gətirildiyini gördüm. Sonra mən ondan içdim və onun dırnaqlarıma kimi axdığını gördüm. Sonra artıq qalanını Ömər İbn əl-Xattaba (Allah ondan razı olsun) verdim." Ondan: "Ey Allahın Elçisi bunu nəyə yozdun?" deyə sotuşulduqda belə buyurdu: "Elmə!" (Müslim / 2391).

12-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: “Bir dəfə mən yatdığımda özmü üzərində qab olan bir quyunun yanında gördüm. Ondan Allhın istədiyi qədər su çəkdim. Sonra Onu İbn Əbu Quhafə (Allah ondan razı olsun) ötürdüm və ondan bir yaxud iki qab su çəkdi. Onun çəkməyində zəiflik vardı. Allah ona rəhm etsin. Sonra qab dah böyük bir qaba çevrildi və onu İbn əl-Xattab (Allah ondan razı olsun) aldı. Mən insanların içində Ömər İbn əl-Xattab (Allah ondan razı olsun) kimi su çəkən bir igid görmədim. Və nəhayət , insanlar heyvanlarını axurlarına saldılar." (Müslim /2392).

13-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Bir dəfə mən yatarkən özümü cənnətdə gördüm. Bir qadın bir qəsrin yanında dəstəmaz aldı. Mən: "Bu kimindir?" deyə soruşdum. Mənə: "Bu Ömər ibn əl-Xattabındır (Allah ondan razı olsun)." deyə cavab verdiklərində, onun qısqanclığını xatırladım və çevrilib getdim." Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurmuşdur: "Ömər (Allah ondan razı olsun) ağladı və biz də o məclisdə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə ağladıq. Sonra Ömər belə buyurdu: "Atam anam sənə fəda olsun , ey Allahın Elçisi , səndən qısqancam?!" (Müslim / 2395).

14-Saad İbn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: " Ömər (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içəri daxil olmaq üçün izn istədi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında qureyşdən olan qadınlar vardı. Onlar səslərini yüksəldərək onunla (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) danışır , ondan onlara çox əta etmələrini istəyirdilər. Ömər (Allah ondan razı olsun) izn istədikdə , onlar qalxaraq tez hicabla örtündülər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona izn verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülürdü. Ömər (Allah ondan razı olsun) ona belə dedi: " Ey Allahın Elçisi , Allah ömrünü güldürsün." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Yanımda olan bu qadınlara təəccübləndim. Səsini eşitdiklərində tez örtündülər." Ömər (Allah ondan razı olsun) belə buyurdu: "Ey Allahın Elçisi , onların çəkinməsinə sən daha layiqsən." Sonra isə Ömər (Allah ondan razı olsun) belə dedi: "Ey Nəfslərinin düşmənləri , Allahın Elçisindən çəkinməyib məndən çəkinirsiniz?! Onlar: "Bəli sən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) daha sərt və şiddətlisən." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Nəfsim əlində olana and olsun ki , şeytan səninlə bir küçədə rastlaşarsa, sənin getdiyin küçdən başqa küçəyə keçər." (Müslim /2396).

15-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurardı: "Sizdən əvvəlki ümmətlərdə danışılanlar olardı. Əgər bu Ümmətdə onlardan kimsə olarsa, Ömər İbn əl-Xattab onlardan olar." İbn Vahab: "danışılanların" təfsirində belə demişdir: "Danışılanlar yəni onlara ilham (vəhy) olunanlar." (Müslim / 2398).

16-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Ömər (Allah ondan razı olsun) belə buyurmuşdur: " Rəbbimə üç şeydə müvafiq oldum: "İbrahim məqamı, hicab və Bədrdəki əsirlər barəsində." (Müslim /2399).

17-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Abdullah İbn Ubeyy İbn Səlul vəfat etdikdə oğlu Abdullah İbn Abdullah Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ondan atasını kəfləmək üçün onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və

salamı olsun) köynəyini istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona istədiyini verdi. Sonra O onun üçün cənazə namazını qılmasını istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namaza qalxdıqda , Ömər (Allah ondan razı olsun) qalxaraq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) köynəyindən tutdu və belə dedi: "Ey Allahın Elçisi , Allah sənə ona namaz qılmağı qadağan etdiyi halda ona namaz qılırsan?! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah Təala mənə seçim verdi və belə buyurdu: "Onlar üçün istər bağışlanma dilə, istər diləmə; onlar üçün yetmiş dəfə bağışlanma diləsən də, yenə Allah onları bağışlamayacaq." Və Mən yetmişədn çox diləyəcəyəm. Ömər (Allah ondan razı olsun): "O münafiqdir!" deyə buyurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun cənazə namazını qıldı və Allah təla bu ayəni nazil etdi: "Onlardan ölən heç bir kəsə , heç vaxt namaz qılma, qəbrinin başında durma" (Müslim / 2400).

## Doqquzuncu fəsil: Osman İbn Affanın (Allah ondan razı olsun) fəziləti haqda.

18- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evimdə budlarını və ya baldırlarını açmış halda söykənmişdi. Əbu Bəkr (Allah ondan razı olsun) içəri daxil olmaq üçün izn istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona izn verdi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əvvəlki vəziyətində idi. Onunla söhbət etməyə başladı. Sonra Ömər (Allah ondan razı olsun) içəri daxil olmaq üçün izn istədi. Ona izn verdi və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əvvəlki vəziyətində idi. Onlar söhbət etməyə başladılar. Sonra Osman (Allah ondan razı olsun) içəri daxil olmaq üçün izn istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxaraq oturdu və paltarını düzəltdi. (Muhamməd ibn Əbu Harmalə belə demişdir: "Onun bir gündə olduğunu demirəm.") O daxil oldu və onlar söhbət etdilər. Çıxdığında Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Əbu Bəkr (Allah ondan razı olsun) daxil oldu, ona gülərüzlük göstəmədin və onu diqqətə almadın. Sonra Ömər (Allah ondan razı olsun) daxil oldu , onagülər üzlük göstəmədin və onu diqqətə almadın. Sonra Osman (Allah ondan razı olsun) daxil oldu , ona görə qalxıb oturdun və paltarını düzəltdin." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mələklər utanan bir kişidən mən utanmayımmı?" (Müslim / 2401).

19- Səid İbn əl-Museeyib belə rəvayət edir: "Əbu Musə əl-Əşəri (Allah ondan razı olsun) mənə belə xəvər verdi: "O evində dəstəmaz alaraq çıxdı və belə burdu: "Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mülazim olaraq bu gün onunla bərabər olacağam." Məscidə gəldi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) haqda soruşdu. Ona: "Onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu istiqamətdə çıxdığını xəbər verdilər." Mən harda olduğunu soruşa-soruşa onun ardınca getdim. Nəhayət gəlib Əris quyusuna daxil oldu.Mən qapının yanında oturdum. Qapı xurma budağından idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ehtiyacnı gördükdən sonra dəstəmaz aldı və mən onun yanna gəldim. O Əris quyusunun yanında orta hissəsində oturmuş və baldırlarını açaraq ayaqlarını quyuya salmışdı. Ona salam verdikdən sonra çevrilib qapının yanında oturdum və: "Bu gün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qapıçısı olacağam." Dedim. Bu vaxt Əbu Bəkr (Allah ondan razı olsun) gəldi və qapını itələdi. Mən: "Kimdir?" deyə soruşdum. O: "Əbu Bəkr," deyə cavab verdikdə, Mən: "Gözlə!" deyə söylədim. O: "Bəli!" dedi və

mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdim. Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , bu , Əbu Bəkrdir (Allah ondan razı olsun) daxil olmaq üçün izn istəyi." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ona izn ver və onu Cənnətlə müjdələ." Mən qayıtdım və Əbu Bəkrə: "Daxil ol! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səni Cənnətlə müjdələyir." Dedim. Əbu Bkr daxil oldu və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sağında onunla birgə quyunun ortasında oturdu və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kimi baldırlarını açaraq ayaqlarını quyuya saldı. Mən qayıdaraq oturdum. Qardaşımı isə dəstəmaz alaraq mənə çatması üçün arxada qoymuşdum. Mən: "Allah əgər filankəsə (qardaşını qəsd edərək) xeyr istəyərsə , onu bura gətirər" demişdim ki , birdən qapını bir insan tərpətdi. Mən: "Kimdir?" deyə soruşdum. O: "Ömər İbn əl-Xattab," deyə cavab verdikdə, Mən: "Gözlə!" deyə söylədim. Və mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdim. Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) salam verdikdən sonra belə dedim: "Ey Allahın Elçisi , bu , Ömərdir (Allah ondan razı olsun) daxil olmaq üçün izn istəyi." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ona izn ver və onu Cənnətlə müjdələ." Mən Ömərin yanına qayıtdım və belə dedim: "Daxil ol! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) izn verdi və səni Cənnətlə müjdələdi." O daxil oldu və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) solunda onunla birgə quyunun ortasında oturdu və ayaqlarını quyuya saldı. Mən qayıdaraq oturdum. Mən: "Allah əgər filankəsə (qardaşını qəsd edərək) xeyr istəyərsə , onu bura gətirər " demişdim ki , birdən qapını bir insan tərpətdi. Mən: "Kimdir?" deyə soruşdum. O: Osman İbn Affan," deyə cavab verdikdə, Mən: "Gözlə!" deyə söylədim. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdim və Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ona izn ver və onu Cənnətlə və başına gələn müsibətlə müjdələ." Mən qayıtdım və ona belə dedim: "Daxil ol! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) izn verdi və səni Cənnət və başına gələcək müsibətlə müjdələdi." O daxil oldu və quyunun orta tərəfinin dolu olduğunu gördkdə quyunun digər tərəfində oturdu. Şureyk belə buyurdu: "Səid İbn Museyyib: "mən bunu onların qəbirlərinin olduğuna yozdum." (Müslim / 2403).

## Onuncu fəsil: Əli İbn Əbu Talibin (Allah ondan razı olsun) fəziləti haqda.

20- Saad İbn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əli İbn Talibi tabuk döyüşünüə gedərkən öz əvəzinə (Mədinəyə əmir) qoydu. O (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , məni qadın və uşaqların üzərinə təyin edirsən?" deyə söylədikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Məgər sən məndən Musaya nisbətdə Harunun yerində olmağa razı deyilsənmi? Yalnız , məndən sonra peyğəmbər yoxdur."

21- Səhl İbn Saad (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xeybər günü belə buyurdu: "Bu bayrağı Allah və Elçisinin sevdiyi və O da Allahı və elçisini sevən bir kişiyə verəcəyəm və Allah Təala onun əliylə fəhthi müyəssər

edəcəkdir. İnsanlar geçələdiklərində gecəni onu kimə verəcəyi haqda müzakirədə keçirdilər. Sabah açıldıqda onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdilər. Hər biri bayrağın ona verilməsini arzulayırdı. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Əli haradadır deyə soruşdu?" Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , o (Allah ondan razı olsun) gözlərindən şikayələnir." Deyə cavab verdilər." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Onun ardınca göndərin!" deyə buyurdu. Onu gətirdilər və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun gözlərinə tüpürdü və onun üçün dua etdi!" O sağaldı. Sanki gözlərində heç xəstəlik olmamışdı. Və ona bayrağı verdi. Əli (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Ey Allahın Elçisi , onlarla bizim kimi olan qədər vuruşum?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Yavaşca onların sahələrinə enənə kimi get! Sonra onları islama dəvət et və İslamda onların üzəriə vacib olan Allahın haqlarını xəbər ver. Allaha and olsun ki , Allahın sənin əlinlə bir insana hidayət verməsi sənin üçün qırmızı dəvələrdən daha xeyirlidir."

22- Səhl İbn Saad (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Mədinəyə Maran ailəsi bir kişi təyin edildi. O Səhl İbn Saadı çağıraraq ona Əlini söyməyi əmr etdi. Səhl imtina etdikdə, O ona belə dedi: "Əgər onu söyməkdən imtina edirsənsə , onda Əbu Turaba (yəni torpağın atası deməkdir.) lənət de!" Səhl ona belə cavab verdi: "Əliyə Əbu Turab adından daha sevimli bir ad yox idi. O onu belə çağırdıqda sevinərdi." O ona: "Bizə onun hekayəsini danış! Nə üçün onu Əbu Turab deyirdilər?" deyə buyurdu. O belə dedi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Fatimənin (Allah ondan razı olsun) evinə gəldi və Əlini evdə tapmadı. Ondan (Allah ondan razı olsun): "Əmin oğlu haradadır?" deyə soruşdu? O (Allah ondan razı olsun) belə cavab verdi: "Mənimlə onun arsında olan şeydən mənə qəzəblədi və yanımda yatmayıb çıxıb getdi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir adama: "Bax gör o (Allah ondan razı olsun) hardadır!" deyə buyurdu. O gələrək: "Ey Allahın Elçisi , o (Allah ondan razı olsun) məsciddə uzanıb" deyə xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanına gəldikdə o (Allah ondan razı olsun) uzanmışdı. Ridası çiyninin bir təfindən düşmüş və o (Allah ondan razı olsun) torpağa bulaşmışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üstünü təmizləyib: "Ey Əbu Turab , qalx! Ey Əbu Turab , qalx!" deyə buyurdu." (Müslim / 2409).

23- Əbu Osman belə rəvayət edir: " Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə o günlərdə etdiyi hərblərin bəzisində Talha və Saaddan başqa kimsə qalmamışdı." (Bu söz onların hədislərindən götürülmüşdür). (Müslim /2414).

## Dördüncü fəsil: Zubeyr İbn Avvamın (Allah ondan razı olsun) fəziləti haqda.

24- Muhammad İbn Munkadir belə rəvayət edir: " Cabir İbn Abdullahın (Allah ondan razı olsun) belə deiyini eşitdim: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xəndək günü insanları döyüşə səslədi. Zubeyr onun çağırışına cavab verdi. Sonra O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə çağırdı. Yenə Zubeyr cavab verdi. Sonra O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə də çağırdı. Və yenə də Zubeyr cavab verdi. Hər bir Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həvarisi (səhabəsi, köməkçisi) var. Mənim həvarim Zubeyrdir."

25-Abdullah İbn əz-Zubeyr (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən və Ömər İbn Sələmə Xəndək döyüşü günü qadınlarla birgə Həssən qalasında idik. Bəzən o əyilir mən baxırdım, bəzən isə mən əyilir o baxırdı. Atam silahı ilə atının üzərində Bəni Qureyzəyə getdiyində onu görürdüm." Ravi belə demişdir: "Abdullah İbn Urva mənə Abdullah İbn əz-Zubeyrdən belə xəbər verdi: "Mən bunu atama xatırlatdıımda, mənə belə dedi: "Ey oğlum , məni gördünmü?" Mən: "Bəli!" deyə cavab verdikdə, belə buyurdu: "Allah And olsun ki Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o gün iki valideynini mənim üçün cəm edərək: "Atam , anam sənə fəda olsun!" dedi." (Müslim / 2416).

26-Urva İbn əz-Zubeyr belə buyurdu: " Aişə (Allah ondan razı olsun) mənə belə buyurdu: "Allaha and olsun ki , sənin iki atan yaralandıqdan sonra Allahın və onun Elçisinin çağrışına cavab verdilər." Başqa bir rəvayədə isə belə deyilir: "Yəni – Əbu Bəkr və əz-Zubeyr)." (Müslim / 24180.

## On ikinci fəsil: Talah və əz-Zubeyrin (Allah onlardan razı olsun) fəziləti haqda.

27-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hira dağının üzərində idi və birdən dağ titrədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Sakit ol Hira sənin üzərindəki yalnız ya peyğəmbər və ya Siddiq və ya Şəhiddir." Onun üzərində Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), Əbu Bəkr, Ömər, Osman, Əli, Talaha, Zubeyr və Saad İbn Əbu Vaqqas (Allah ondan razı olsun) var idi." (Müslim / 2417).

## On üçüncü fəsil: Saad İbn Əbu Vaqqasın (Allah ondan razı olsun) fəziləti haqda.

28-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə gəldiyi ilk günlərin birndə gecə yata bilmədi və: "Kaş ki , əshabımdan bir saleh kişi bu gecə mənim keşiyimdə durardı. Biz bu halda ikən bir silah xışıltısı eşitdik. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Kimdir?" deyə soruşdu. O: "Saad İbn Əbu Vaqqasam " deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Səni bura gətirən nədir!" deyə ondan soruşdu. O belə cavab verdi: "Nəfsimdə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) görə qorxu hiss etdim və onun keşiyini çəkmək üçün gəldim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün dua etdi və yatdı." (Müslim / 2410).

29-Amir İbn Saad atasından (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün Uhud günü iki valideyinini cəm etdi. O gün müşriklərdən bir kişi müsəlmanlara od (mənəvi) qoymuşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ona: "Atam , anam sənə fəda olsun , at!" deyə buyurdu. Mən ona ucsuz bir ox atdım və ox onun yan tərəfinə batdı. O yıxıldı və övrəti açıldı və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülümsədi. Hətta dişləri göründü." (Müslim / 3725).

30-Musab İbn Saad atasından (Allah ondan razı olsun) belə rəvayət edir: " Onun haqda Quranda ayələr nazil olmuşdur. Saadın anası dinindn dönməyincəyə kimi onunla danışmamağa, yeməyib içməməyə and içdi. Sonara ona belə dedi: "Sən Allahın anan və atanı sənə vəsiyyət ediyini iddia edirsən. Sənin anan mənəm və sənə bunu mən əmr edirəm." O üç gün belə oturdu , sonra isə halsızlıqdan huşunu itirdi. Onun Umara adlı oğlu ona su verdi. Və o (qadın) Saadın əleyhinə dua etməyə başladı. Və

Allah Təala bu ayəni nazil etdi: "Biz insana ata-anasına (yaxşılıq etməyi, valideyninə yaxşı baxmağı, onlarla gözəl davranmağı) tövsiyə etdik.", "Əgər (ata-anan) bilmədiyin bir şeyi Mənə şərik qoşmağına cəhd göstərsələr, (bu işdə) onlara itaət etmə. (Qalan) dünya işlərində onlarla gözəl keçin." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) böyük bir qənimət ələ keçiridi. Onun içində bir qılınc vardı. Mən onu götürərək Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim və belə dedim: "Sən mənim halımı bilənlərdənsən , bu qılınclı məni ver!" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "Onu götürdüyün yerə qaytar!" deyə buyurdu. Mən onu qənimət toplanan yerə gətirdikdə, nəfsim məni danladı və mən onun yanına qayldaraq: "Onu mənə ver!" deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səsini yüksəldərək mənə "Onu götürdüyün yerə qaytar!" deyə buyurdu. Və Allah Təal bu ayəni nazil etdi: "Səndən (müharibədə əldə edilmiş) qənimətlər (onların kimə çatması) haqqında soruşarlar. De: “Qənimətlər Allahın və Peyğəmbərinindir (onun bölünməsi Allaha və Peyğəmbərinə aiddir)." Sonra mən xəstələndikdə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dalınca adam göndərdim. O gəldiyində ona belə dedim: "Mənə izn ver , malımı istədiyim yerə bölüm." O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) razı olmadıqda, Mən: "Yarısını?" deyə söylədim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə razı olmadı. Mən: "Üçdə birini." Dedikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) susdu və bundan sonra üçdə biri (vəsiyyət etmək) caiz oldu." Sonra mən Ənsar və Mühacirlərdən olan bir neçə kişinin yanına gəldim. Onlar mənə : "Səni yedizdirib, şərab (spirtli içki) içirək " deyə buyurdular. Bu hələ şərab (spirtli içki) haram olmamışdan əvvəl idi. Onlar bir bostanda ikən mən onların yanına gəldim. Yanlarında qızardılmış bir dəvə başının və bir qab şərab olduğunu gördüm. Mən onlarla bərabər yeyib içdim. Sonra Ənsar və Mühacirləri onların yanında xatırlayaraq: "Mühacirlər Ənsarlardan daha xeyirlidir." demişdim ki , bir kişi başımın iki çənəsindən birini tutaraq mənə kəllə vurdu və burnumu yaraladı. Mən gəlib bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xəbər verdim və Allah Təala məmim barəmdə bu ayəni nazil etdi: " Şərab da (içki də), qumar da, bütlər də, fal oxları da Şeytan əməlindən olan murdar bir şeydir. Bunlardan çəkinin." (Müslim / 1748- 2412 dən sonra).

31- Saad (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz altı kişi Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə idik. Müşriklər Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bunları qov! Bizə qarşı çürət etməsinlər. Bu altı kişi mən, İbn Məsud, Huzeyl qəbiləsindən bir kişi, Bilaal və adlarını çəkmədiyin iki kişi idi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qəlbinə Allahın istədiyi bir şeylər gəldi. Sonra nəfsində düşündü və Allah Təala bu Ayəni nazil etdi: "Rəbbinin camalını (rizasını) diləyərək səhər-axşam Ona dua edənləri yanından qovma." (Müslim / 2413).

## On dördüncü fəsil: Əbu Ubeydə İbn əl-Carrahın (Allah ondan razı olsun) fəziləti.

32- Huzeyfə (Allah ondan razı olsun) belə rəvayət edir: "Nəcran Əhli Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dedilər: "Ey Allahın Elçisi , bizə əmin bir kişi göndər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara belə buyurdu: "Mən sizə həqqətən , əmin olan bir kişini göndərəcəyəm. İnsanlar bu şərəfli iş üçün irəli

atıldılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Ubeydə əl – Carrahı (Allah ondan razı olsun) göndərdi." (Müslim / 2420).

## On beşinci fəsil: Həsən və Hüseynin (Allah onların hər ikisindən razı olsun) fəziləti.

33- Sələmə İbn əl-əkva (Allah ondan razı olsun) belə rəvayət edir: " Mən Həsən və Hüseyni Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) alaça qatırının üzərində sürərək Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hücrəsinə (evinə) gətirdim. Biri Onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) önündə, digəri isə arxasında idi." (Müslim /2428).

34- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Günorta vaxtı Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və onunla olan birgə çıxdım. Nə o məni nə də mən onu danışdırırdım. Nəhayət gəlib Bəni Qeynuqa qəbiləsinin bazarına çatdıq. Sonra ayrılaraq Fatimənin (Allah ondan razı olsun) getdi və: Həsəni qəsd "Kiçik buradadır? Kiçik buradadır?" deyə soruşdu. Biz anasının onu tərtəmiz yuyub geydirmək və boyuna gözəl qoxulu boyunbağı taxmaq üçün saxladığını zənn etdik. Çox keçmədi ki , o qaçaraq gəldi. Onlar bir birini qucaqladılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım! Mən onu sevirəm! Onu sən də sev! Onu sevəni də sev!" (Müslim / 2421).

## On altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızı Fatimənin (Allah ondan razı olsun) fəziləti haqda.

35- əl-Misvar İbn Məxrəmə (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Əli İbn Əbu Talib (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızı Fatıməyə evli ikən, Əbu Cəhlin qızına nikahlanmaq istədi. Fatimə (Allah ondan razı olsun) bunu eşitdikdə, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə buyurdu: " Qövmün sənin qızlarına görə qəzəblənmədiyini söyləyirlər. Budur Əli (Allah ondan razı olsun) Əbu Cəhlin qızına nigahlanır." əl-Misvar bel demişdir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxdı. Onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şəhadət etdiyini eşitdim. Sonra isə belə buyurdu: "Və sonra:" Məlum olsun ki , mən Əbu əl-As İbnü Rəbiyə nikahladım. Mənimlə danışdı və doğru söylədi. Şübhəsiz ki, Fatımə bintu Muhamməd də məndən bir parçadır. Mən ancaq və ancaq onu bəlaya salmaqlarından çəkinirəm. Məsələ budur ki : Allaha and olsun ki , Allahın Elçisinin qızı ilə Allahın düşmənin qızı, bir adamın yanında heç zaman bir yerə gələ bilməzlər." əl-Misvar bel demişdir: "Bunun üzərinə Əli (Allah ondan razı olsun) onu istəməkdən imtina etdi." (Müslim / 2449).

36- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arvadları onun yanında idilər. Onlardan heç birini tərk etməmişdi. Bu vaxt Fatimə (Allah ondan razı olsun) gəzərək gəldi. Gəzişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəzişindən heç seçilmirdi. Onu görüncə: "Xoş gəlmisən , qızım!" deyə salamladı . Sonra onu sağına , yaxud soluna oturtdu. Sonra ona bir şeylər pıçıldadı. Bunun üzərinə Fatimə şiddətlə ağladı.Onun fəryadını görüncə, ikinci dəfə ona bir şeylər pıçıldadı. (Bu səfər) Fatimə güldü. Mən ona: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qadınlarının arasından sirr söyləmək üçün səni seçdi. sən isə ağlayırsan? " deyə söylədim. Peyğəmbər (ona,

ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qalxdığı vaxt mən Fatiməyə " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənə nə söylədi? " deyə soruşdum. O: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sirrini ifşa edə bilmərəm! " dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfat etdikdən sonra mən Fatıməyə: "Səni üzərində olan haqqıma and verirəm , mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənə nə dediyini söylə!" dedim. Fatimə belə buyurdu: "İndi (olar.) bəli! Birinci dəfə mənə pıçıldadığında Cəbrayılın hər il Quranı ona bir və ya iki dəfə ərz etdiyini və bu səfər isə iki dəfə ərz etdiyini xəbər verdi. Sonra isə belə buyurdu: "Mən əcəlimin yaxınlaşdığını görürəm. Allahdan qorx! Səbr et! Çünki mən sənin üçün nə yaxşı sələfəm." Mən də gördüyün şəkildə ağladım. Mənim fəryadımı görüncə mənə təkrar pıçıldayaraq: "Ey Fatimə! Möminlərin qadınlarının xanım-əfəndisi olmaq istəmirsənmi? Yaxud bu ümmətin qadınlarının xanım-əfəndisi olmaq istəmirsənmi? " deyə buyurdu. Mən də gördüyün şəkildə güldüm." (Müslim / 2450).

## On yeddinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əhli beytinin (ailəsinin) fəziləti haqda.

37- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir sabah Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərində qara yundan toxunmuş naxışlı bir örtü olduğu halda (evdən) çıxdı. Bu vaxt Həsən İbn Əli gəldi. Onu örtünün içinə aldı, sonra Hüseyn gəldi, onu da örtünün içinə aldı. Sonra Fatimə gəldi onu da örtünün içinə aldı. Sonra Əli gəldi onu da örtünün içinə aldı və belə buyurdu: " Ey əhli-beyt! Allah sizdən çirkinliyi (günahı) yox etmək və sizi tərtəmiz (pak) etmək istər!" (Müslim / 2424).

38- Yezid İbn Heyyan (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən, Huseyn İbn Səbra və Ömər İbn Müslim ilə birgə Zeyd İbn Arqamın yanına getdik. Onun yanına oturduğumuzda Huseyn ona: "Həqiqətən, ey Zeyd, sən çox xeyrlə qarşılaşdın. Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gördün, hədisini dinlədin; onunla birlikdə müharibə etdin və arxasında namaz qıldın. Həqiqətən, ey Zeyd , sən çox xeyrlə qarşılaşdın. Ey Zeyd! Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiklərini bizə danış! O belə buyurdu: " Ey qardaşım oğulu! Allaha and olsun ki, yaşım keçib və əhdim yaxınlaşıb. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiklərəmin bəzisini unutmuşam. Sizə nə rəvayət etmişsəm onu qəbul edin, nəyi rəvayət etməmişsəm məni ona mükəlləf etməyin! Sonra isə belə buyurdu: ": Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkə ilə Mədinə arasında Hum deyilən bir suyun başında bizə xütbə oxumaq üçün ayağa qalxdı və Allaha həmdi-səna etdi. Moizə etdi və xatırlatdı. Sonra belə buyurdu : "Və sonra! Ey camaat! Mən ancaq bir bəşərəm. Rəbbimin Elçisinin gəlişi və ona cavab verməyim çox yaxındır. Mən sizə iki ağır yük qoyuram. Bunların birincisi içində doğru yol və nur olan Allahın Kitabıdır. Allahın Kitabından tutunuun və ona sarılın! Allahın Kitabına tövsiyyə və rəğbətləndirdikdən sonra belə buyurdu: "Bir də əhli beytimi... Əhli beytim haqqında sizə Allahı xatırladaram!.. Əhli beytim haqqında sizə Allahı xatırladaram!.. Əhli beytim haqqında sizə Allahı xatırladaram!" . Huseyn ondan: "Onun əhli beyti kimlərdir Ey Zeyd? Qadınları Əhli beyti deyilmi?" deyə soruşdu. O ona: "Qadınları əhli beytindəndir. Lakin Onun əhli beyti ondan sonra onlara sədəqə yemək haram olanlardır." Deyə cavab verdi." O: "Onlar kimlərdir?" deyə yenə soruşdu. O belə buyurdu: "Əlinin ailəsi, Aqilin ailəsi, Cəfərin ailəsi və

Abbasın ailəsi." deyə cavab verdikdə, O: "Onların hamısına sədəqə haramdır?" deyə soruşdu. O: "Bəli!" deyə cavab verdi." (Müslim / 2408).

## On səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi və möminlərin anası Aişənin (Allah ondan razı olsun) fəziləti.

39-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Sən mənə üç gecə yuxumda göstərildin. Səni mənə mələk ağ bir parça ipək içində gətirdi və: "Bu zövcəndir!" dedi. Mən yüzünü açdım və sənin olduğunu gördüyümdə: "Əgər bü Allahdandırsa, onu həyata keçirəcəkdir." dedim. (Müslim /2438).

40-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Mən sənin nə zaman məndən razı olduğunu və mənə nə zaman qəzəbləndiyini bilə bilirəm." Mən ondan: "Bunu hardan bilirsən? " deyə soruşduqda, belə buyurdu: "Məndən razı olduqda sən: "Xeyr! Muhammədin rəbbinə and olsun ki" deyirsən. Mənə qəzəbləndikdə isə: "Xeyr! İbrahimin Rəbbinə and olsun ki deyirsən." Mən belə cavab verdim: "Bəli! Ey Allahın Elçisi ,Allaha and olsun ki , mən yalnız sənin ismini tərk edirəm." (Müslim / 2439).

41-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "O Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında qızlarla oynayarmış. Yoldaşlarım mənim yanıma gələr, lakin Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) utanaraq gizlənərdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onları mənə göndərərdi." (Müslim /2440).

42-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " İnsanlar hədiyələrini vermək üçün Aişənin (Allah ondan razı olsun) gününü araşdırıb seçərdilər. Bununla Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) razılığına nail olmaq istəyirdilər." (Müslim / 2441).

43-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələri Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qızı Fatiməni Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına göndərdilər. O da yanma girmək üçün icazə istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənimlə birlikdə örtünün altında uzanmışdı. Ona icazə verdi, Fatimə: "Ey Allahın Elçisi , zövcələrin məni sənin yanına göndərdilər. Səndən Əbu Kuhafenin qızı haqqında adil olmanı istəyirlər " deyə söylədi. Mən susurdum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Ey qızcığazım! Sən mənim sevdiyimi sevməzsənmi?" deyə soruşdu. Fatimə: "Sevərəm." deyə cavab verdikdə O: "O halda bunu sev!" deyə buyurdu." Fatimə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu eşidincə , qalxdı və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələrinin yanına dönərək , onlara öz söylədiklərini və ona Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) söylədiyini xəbər verdi. Onlar da ona belə dedilər: "Bizim üçün bir şey etdiyini görmürük. Dərhal Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına dön və ona: "Həqiqətən , zövcələrin Əbu Kuhafenin qızı haqqında səndən adillik istəyirlər , de!" Fatimə belə buyurdu: " Allaha and olsun ki , onun haqqında mən onunla (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç vaxt danışmaram." Aişə (Allah ondan razı olsun) belə buyurmuşdur: " buna görə də Peyğəmbərin (ona,

ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arvadları onun yanına Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arvadı Zəynəb binti Cəhşı göndərdilər. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında onlardan mənə rəqib olanı da o idi. Din barəsində Zəynəbdən daha xeyirli heç bir qadın görmədim. Allahdan onun qədər qorxan, onun qədər doğru söyləyən, onun qədər qohumluq əlaqələrini saxlayan, ondan çox sədəqə verən, verdiyi sədəqədə nefsini onun qədər xor görüb, o əməllə Allah Təalaya yaxınlıq göstərən yox idi. Ancaq xasiyyətindəki hiddətindən tez qəzəblənməsi vardır ki, ondan da tez dönərdi. Zeynəb Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanma girmək üçün icazə istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə Fatimənin yanlarına girdiyi zamandakı kimi Aişə ilə birgə onun örtüsünün altında uzanmışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona da icazə verdi. Zəynəb: "Ey Allahın Elçisi , zövcələrin məni sənin yanıana göndərdilər və Əbu Kuhafenin qızı haqqında səndən adil olmanı istəyirlər" deyə buyurdu. Sonra məndən danışdı və haqqımda sözü uzatdı. Mən Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) güdür və mənə onun haqqında danışmağa icazə verəcəkmi deyə , gözünə baxırdım. Zəynəb davam etdi. Nəhayət anladım ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim özümü müdafiə etməyimə etiraz etməyəcək. Zəynəb haqda danışmağa başlayınca, ona etdiyim hücumda ona aman vermədim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gülümsəyərək: "Bu, Əbu Bəkrin qızıdır!" deyə buyurdu." (Müslim / 2442).

44- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bu gün mən haradayam? Sabah mən harada olacağam?" deyərək axtarır, Aişənin günü gecikdi sanırdı." Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Mənim günümün növbəsi gəlincə Allah onun ruhunu mənim ciyərimlə boğazım arasında aldı." (Müslim / 2443).

45- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ölməmişdən əvvəl onun sinəsinə çöykənmiş halda ikən ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qulaq asmış və onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişdir: "Allahım məni bağışla! Mənə rəhm et! Məni: "Rafiq əl-Əla"-ya qovuşdur. "

46- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sağlam ikən belə deyirdi: "Elə bir Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yoxdur ki , ona ruhu alınmadan öncə cənnətdəki yeri göstəilib sonra seçim verilməsin." Aişə (Allah ondan razı olsun) belə buyurmuşdur: “ Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfatı yaxınlaşdıqda , başı mənim dizimin üzərində olduğu halda bir müddət huşunu itirdi. Sonra ayildı. Və gözünü tavana tikdi. Sonra : "Allahım! "Rafiq əl-Əla" deyə buyurdu." Aişə (Allah ondan razı olsun) belə buyurmuşdur: " Mən: "Elə isə bizi seçmir." dedim."sonra Aişə (Allah ondan razı olsun) belə buyurdu: " Onun sağlam ikən bizə danışdığı: ""Elə bir Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yoxdur ki , ona ruhu alınmadan öncə cənnətdəki yeri göstəilib sonra seçim verilməsin." Hədisi ilə nə demək istədiyini anladım." Aişə (Allah ondan razı olsun) belə buyurmuşdur: "Bu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) söylədiği son söz oldu: "Allahım! "Rafiq əl-Əla" (Müslim / 2444).

47- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (səfərə) çıxdıqda qadınları arasında Qura (püşk) çəkərdi. Bir dəfa Qura Aişə ilə Hafsaya düşdü və ikisi də birden onunla

bərabər çıxdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə olduqda Aişə (Allah ondan razı olsun) ilə birlikdə yürüyür, onunla söhbət edirdi. Hafsa Aişəyə belə dedi: "Bu gecə mənim dəvəmə minərsən? Mən də sənin dəvənə minərəm. Sən də gör, mən də görüm." Beləcə Aişə Hafsanın, Hafsa da Aişənin dəvəsinə mindi. Az sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Aişənin dəvəsinin yanına gəldi. Onun üzərində Hafsa var idi. Salam verdikdən sonra onunla irəlləməyə başladı. Aişə Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) axtardı və qısqandı. Bir yerə endiklərində Aişə (Allah ondan razı olsun) ayaqlarını İzxır otlarının arasına salaraq belə buyurdu: "Ey Rəbbim , üzərimə bir əqrəb və ya bir ilan sal ki , məni sancsın! Peyğəmbərinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir şey deyə bilmirəm." (Müslim / 2445).

48- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " Kişlərdən kamillıyə çoxları çatmışdır. Qadınlardan isə kamilliyə yalnız İmranın qızı Məryəm və Firovnun arvadı Asya çatmışdır. Aişənin başqa qadınlara nisbətdə fəziləti Sərid (yemək növü) yeməyinin başqa yeməklər üzərində olan fəziləti kimidir."

49- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Ey Aişə , bu Cəbraildir. O sənə salam deyir." Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Ona da Allahın salamı və rəhməti olsun!" Aişə (Allah ondan razı olsun) belə buyurmuşdu O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim görmədiyimi görürdü." (Müslim / 2447).

50- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “On bir qadın otuaraq ərlərinin xəbərlərindən heç bir şeyi gizlətməməyə əhd peyman etdilər..Birincisi: Mənim ərim sarp (sıldırım) dag başında arıq dəvə ətidir. (Dağ) Düz deyil ki , çıxa biləsən! (Dəvə) kök deyil ki , sürülsün! İkincisi belə dedi: Ərimin xəbərini ifşa edə bilmərəm, çünki qorxuram. Onu ( xəbəri bitirmədən) buraxa bilmərəm. Onu xatırlasam böyük və kiçiyini söyləyərəm. Üçüncüsü belə dedi: "Ərim uzun boyludur. Danışsam boşanaram, susarsam asılı buraxılaram. Dördüncüsü belə dedi: "Ərim Tihame gecəsi kimidir. Nə istidir, nə soyuq. Ondan nə qorxular, nə bezilər. Beşincisi belə buyurdu: "Ərim (İçəri) girsə bəbir, (çölə) çıxarsa aslan kəsilər. əhd etdiyi şeyi soruşmaz. Altıncısı belə buyurdu: " Ərim yesə bükər (çox yeyər), içərsə sourar. Yatarsa sarınar. Kədəri anlamaq üçün əlini soxmaz! Yeddincisi belə dedi: "Ərim toxumsuzdur. Yaxud qaranlıqdır. (Axmaqlığından) İşləri üzərinə yığılıb qalıb. Hər dərd onu tapar. Baş yarığını və ya qol sınığını istəsən, yaxud ikisini də sənin üçün bir araya cəm edər." Səkkizincisi belə dedi: "Ərimin qoxusu Zərnəb (ətirli ağac, zəfəran) qoxusudur, bədəni də dovşandır (yəni yumuşaqdır)." Doqquzuncusu belə dedi: "Ərim dirəyi yüksək, qını uzun, külü çox (yəni kaslbları çox yedizdirən), evi məclisə yaxın bir adamdır." Onuncusu : Ərim Malikdir (Şah, sahibkar). Amma nə Malik! Malik bundan çox daha xeyirlidir. Onun çox çökən, az gəzən dəvələri vardır. Ud səsini eşitdikdə həlak olduqlarını anlarlar." On birincisi belə dedi: "Ərim Əbu Zərdir (əkinçidir). Amma nə Əbu Zər (əkinçi)! Zinətinin hərəkəti qulaqlarımı şıqqılldatdı. Əsasılarımı yağla doldurdu. Məni sevindirdi. Mənim də könülüm fərəhləndi. Məni dağ başında bir qoyun sürücük sahibinin yanında tapdı və at kişnəməsinə və dəvə səsinə sahib xarman döyən, saman ( quru ot) sovuran bir ailəyə qatdı. Onun yanında danışır, və eyb olunmuram, yatır sabahlayıram, içir və doyuram. Əbu Zerin (əkinçinin) anası! nə dir Əhu Zerin anası?! Anbarları böyük, evi genişdir. Əbu Zerin oğlu! Nədir Əbu Zer oğulu?! Yatağı soyulmuş xurma lifi kimidir. Onu bir quzunun budu doyurar. Əbu Zerin qızı! Nədir Əbu Zərin qızı?! Anasına, atasına xoşbəxtlikdir. Döşəkağı dolusu ortağını çartladan ləvazimat dəsti var. Əbu Zerin nökəri! Nədir Əbu Zer nökəri?! Bizim sözlərimizi

(ortalıqda) yaymaz. Azüqiəmizi töküb, dağıtmaz, evimizi də quş yuvasına çevirməz. Nehrələrimizdə süd çalxalanarkən Əbu Zer çıxdı (getdi). Və bir qadına rast gəldi. Yanında bəbir kimi iki uşağı vardı. Böyrünün altındakı iki nar dənəsiylə (yəni nar dənəsinə oxşar döşüylə) oynayırlar. Dərhal məni boşayıb ona nikahladı. Mən də ondan sonra şərəfli bir adama ərə getdim. Sürətli bir ata minər. Əlinə Xatt (yer adı) nizəsi götürər. Evimə bir çox dəvələr gətirər. Mənə hər heyvandan bir cüt verdi və: "Ey Ummu Zər ye və qohumuna da ver! dedi. Amma onun mənə verdiyi hər şeyi yığsam Əbu Zerin qablarının ən kiçiyini doldurmaz." Aişə belə buyurmuçdur: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)mənə belə buyurdu: "Mən sənin üçün Ümmu Zərə nisbətdə Əbu Zər kimiyəm." (Müslim / 2448).

## On doqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi və möminlərin anası Xədicənin (Allah ondan razı olsun) fəziləti.

51- Abdullah İbn  Cəfər (Allah ondan razı olsun) belə rəvayət edir: " Əlini Küfədə belə deyərkən eşitdim: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Bunların ən xeyili qadınını İmranın qızı Məryəmdir. Bunların ən xeyirli qadını isə Xuveylidin qızı Xədicədir." Əbu Kureyb belə demişdir: "O yerə və göyə işarə etdi." (Müslim / 2430).

52- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Cəbrail Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi və belə buyurdu: "Bu , Xədicədir. O sənin yanına içərisində yemək, içki və ədəvat olan bir qabla gəlmişdir. O yanna gəldikdə ona Rəbbindən və məndən salam olduğunu söylə və onu Cənnətdə incidən olan qamışdan bir evlə müjdələ. O evdə nə gurultu nə də bir çətinlik olacaqdır." (Müslim /2432).

53- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arvadlarından Xədicədən başqa heç kimə qarsqanclıq etmədim. Mən onu görməmişdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qoyun kəsidyində: "Bunu Xədicənin rəfiqələrinə göndər! " deyə buyurardı. Bir gün onu qəzəbləndirdim və: "Xədicə?" deyə söylədiyimdə, belə buyurdu: "Mən artıq onun sevgisi ilə ruzilənmişəm."

54- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xədicə vəfat edənə kimi onun üzərinə heç kəslə evlənməmişdir." (Müslim / 2436).

55- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Xədicənin bacısı Halə bintu Xuveylid Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına girmək üçün izn istədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Xədicənin izn istəməsini xatırladı və bundan xoşlanaraq: "Allahım , Xuveylidin qızı Halə." Dedi. Mən qısqanaraq belə dedim: " Allah sənə yerinə daha xeyirlisini vermişkən, uzun zaman əvvəl ölmüş Qüreyşin qoca arvadlarından çənələrinin içi qırmızı bir qoca arvadın nəyini xatırlayırsan?" (Müslim / 2337).

## İyirminci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi və möminlərin anası Zeynəbin (Allah ondan razı olsun) fəziləti.

Möminlərin anası Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizlərdən mənə ən tez qovuşan , əli uzun olandır." Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Onlar hansının əlinin daha uzun olduğu bilmək üçün əllərini uzatdılar. Zeynəbin əli daha uzun idi. Çünki o əli ilə iş görərər və sədəqə verərdi." (Müslim / 2452).

## İyirmi birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi və möminlərin anası Ummu Sələmənin (Allah ondan razı olsun) fəziləti.

56-Əbu Osman Salmandan (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: "Əgər bacarırsınızsa , bazara ilk girən və ən sonuncu çıxan olmayınız! Çünki bu , Şeytanın savaş yeridir. Onunla bayrağını sancar. Mənə Ummu Sələmə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında ikən yanlarına Cəbrailin gəldiyi xəbəri çatmışdır. O (Cəbrail) danışmağa başladı sonra isə qalxdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ummu Sələmənin yanına qalxdıqda "Bu kimidr? (və ya onun dediuyi kimi) " deyə soruşdu . O (Allah ondan razı olsun): "Dihyə əl-Kəlbi!" deyə cavab verdi. Ummu Sələmə (Allah ondan razı olsun) belə buyurmuşdur: "Allaha and olsun ki, mən yalnız onun olduğunu hesab etdim. Nəhayət , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xütbəsində bizə onun xəbərini söylədi." (və ya onun dediuyi kimi). Mən Əbu Osmana belə dedim: "bunu kimdən eşitmisən?" O: "Usamə İbn Zeyddən " deyə cavab verdi: "(Müslim / 2451).

## İyirmi ikinci fəsil: Ənəs İbn Məlikin (Allah ondan razı olsun) anası Ummu Süleymin fəziləti.

57-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arvadlarından başqa qadınlardan yalınız Ummu Süleymin yanına daxil olardı. Ona bu deyildildikdə, belə buyurdu: "Mən ona rəhm edirəm , qardaşı məmimlə birgə ikən öldürüldü.".

58-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Cənnətə daxil oldum və ayaq səsləri eşitdim: "Bu kimdir? " deyə soruşdum. Mənə: "Ənəs İbn Məlikin anası , bu əl-Ğamaysa bintu Milhandır." (Müslim /)

## İyirmi üçüncü fəsil: Usamə İbn Zeydin anası Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mövlası olan Ummu Eymənin fəziləti.

59-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəfatından sonara Əbu Bəkr (Allah ondan razı olsun) Ömərə (Allah ondan razı olsun) belə buyurdu: "Bizi Ummu Eymənin yanına apar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu ziyarət etdiyi kimi ziyarət edək." Biz onun yanına çatdıqda ağladı. Onlar ona: "Səni ağladan nədir? Allah qatında nə xeyirli şey varsa , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçündür." deyə soruşdular. O: "Mən Allah qatında nə xeyirli şey varsa , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üçün olduğunu bilmədiyimə görə ağlamıram. Lakin mən Səmadan vəhyin kəsilməsinə görədir " deyərək onların hər ikisini ağlamağa həyacanlandırdı və onlar da onunla ağladı." (Müslim / 2454).

## İyirmi dördüncü fəsil: Zeyd İbn Harisə (Allah ondan razı olsun).

60- İbn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Zeyd İbn Hərisəni yalnız Zeyd ibn Muhamməd çağırırdıq . Hətta bu haqda Quran nazil oldu: "Onları (əsil-nəsəbləri bilinsin deyə) öz atalarının adları ilə çağırın." (Müslim / ).

## İyirmi beşinci fəsil: Zeyd İbn əl-Harisə və Usamə ibn Zeydin (Allah onların hər ikisindən razı olsun) fəziləti.

61-İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərdə ikən belə buyurdu: "Əgər siz (Usəmə İbn Zeyd) onun əmirliyinə (Rəhbərliyinə) tənə edirsinizsə , onda ondan öncə olan atsının əmirliyinə tənə edirsiniz. Allaha and olsun ki , O , ona layiqdir! Allah and olsun ki , o mənə ən sevimli insandır! Allaha and olsun ki , bu (Usəmə İbn Zeyd) ona layiqdir. Allaha and olsun ki , o sonrada onların mənə ən sevimlisidir. Sizə onu tövsiyyə edirəm. O sizin salehlərinizdəndir."

## İyirmi birinci fəsil: Əbu Bəkrin (Allah ondan razı olsun) mövlası Bilal İbn Rabəhin (Allah ondan razı olsun) fəziləti.

62-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sabah namzında Bilala belə buyurdu: "Ey Bilal! Mənə İslamda sən tərəfindən ən çox mənfəəti ümid edilən bir əməlini söylə. Çünki mən bu gecə cənnətdə önümdə sənin ayaqqabılarının tıqqıltısını eşitdim." Bilal: "Mən İslamda gecənin və ya gündüzün bir saatında tərtəmiz paklanaraq, o təmizliklə Allahın mənə təqdir etdiyi qədər namaz qılmamdan başqa, daha mənfəəti ümid edilən bir əməl işlədiyimi sanmıram."

## İyirmi yeddinci fəsil: Salman, Suheyb və Bilalın (Allah onlardan razı olsun) fəziləti haqda.

63-Aiz İbn Amr  (Allah ondan razı olsun) belə rəvayət edir: "Əbu Sufyan Salman, Suheyb və Bilal bir neçə nəfərin  içində ikən onların yanına gəldi. Onlar belə dedilər: "Allah and olsun ki , Allahın qılıncları Allah düşməninin  boyundakı yerini almamışdır. Əbu Bəkr: " Siz Qüreyşin şeyxi və rəisi üçün bunumu söyləyirsiniz?" deyə buyurdu və dərhal Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) " Ey Əbu Bəkr! Ola bilsin ki, sən onları qəzəbləndirmişdin?! Əgər onları qəzəbləndirmisənsə, şübhəsiz Rəbbini qəzəbləndirmisən!" deyə buyurdu. Əbu Bəkr onların yanına çataraq: "Ey qardaşlarım, sizi qəzəbləndirdimmi? " deyə onlardan soruşdu. Onlar: "Xeyr! Allah səni bağışlasın qardaşım!" deyə cavb verdilər." (Müslim /2504).

## İyirmi səkkizinci fəsil: "  Ənəs İbn Məlikin (Allah ondan razı olsun) fəziləti haqda.

64-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Anam Ummu Ənəs məni Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına apardı. O , baş örtüyünün yarısını mənim üçün izar, digər yarısını isə rida etmişdi. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə söylədi: "Ey Allahın Elçisi , bu oğlum Uneysi (kiçildilmiş şəkildə) sənə xidmət etmək üçün yanına gətirmişəm. Allaha onun üçün dua et!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım , onun malını və övladlarını artır!" Ənəs belə buyurmuşdur: "Allaha and olsun ki , malım xeyli çoxdur. Uşaqlarım və uşaqlarımın uşaqlarının sayı isə bu gün yüzə çatır." (Müslim / 2481).

65-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) keçdiyində, Anam Ummu

Suleym onun səsini eşitidi və: "Atam anam sənə fəada olsun , Ey Allahın Elçisi , Ənəsciyim." Deyə söylədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim üçün üç şeyi dua etdi. Onlardan ikisini bu dünyada görmüşəm üçüncüsünü isə axirətdə görməyi arzulayıram." (Müslim / 2481).

66-Səbit Ənəsdən (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən oğlanlarla oynayarkən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma gəldi. Bizə salam verdi və məni bir iş dalınca buyurdu. Mən anamım yanına gecikdim. Onun (Allah ondan razı olsun) yanına gəldiyimdə, məndən: "Səni nə gecikdirdi?" deyə soruşdu. Mən: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni bir iş üçün göndərmişdi " deyə söylədikdə, O (Allah ondan razı olsun): "Nə iş?" deyə soruşdu. Mən: "Bu sirdir!" deyə söylədim. O (Allah ondan razı olsun) belə buurdu: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sirrini heç bir kəsə danışma!" Ənəs belə buyurdu: "Ey Səbit , əgər mən bu sirri kimə isə danışmış olsaydım , sənə danışardım." (Müslim / 2482).

## İyirmi doqquzuncu fəsil: Cəfər İbn Əbu Talib və Əsma bintu Umeyyisin (Allah onlardan razı olsun) fəziləti.

67-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Yəməndə ikən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zühur xəbəri bizə çatdı. İki qardaşım, biri Əbu Burda, digəri Əbu Ruhm və ən kiçikləri olan mən onun (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanma getmək üzrə mühacir olaraq yola çıxdıq." O "Ya üç doqquz arası, yaxud da qövmümdən əlli üç və ya əlli iki adam." Deyərək sözünə belə davam etdi: " Bir gəmiyə mindik. Gəmimiz bizi Həbəşistandakı Necaşinin yanma buraxdı. Onun yanında Cəfər İbn Əbu Talib və yoldaşlarına rast gəldik. Cəfər belə buyurdu:" Bizi bura Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) göndərdi. Və burada qalmağımızı əmr etdi. Siz də bizmlə birlikdə qalın! "Biz də hamımız gələnə qədər onunla birlikdə qaldıq. Xeybəri fəth etdiyi gün Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) rastlaşdıq. Bizə (qənimətdən) pay verdi. Yaxud bizə ondan əta etdi. Xeybərin fəthində olmayan heç bir kimsəyə qənimətdən hissə ayırmadı. Yalnız özüylə birlikdə olanlara hissə verdi. Lakin Cəfər və yoldaşları ilə birlikdə bizim gəmimizdə olanlar müstəsna olaraq , döyüşənlərlə bərabər onlara da hissə ayırdı. Bunun üzərinə bəzi insanlar bizə,yəni gəmidə olanlara: "Biz hicrətdə sizi keçdik."deyirdilər. Əbu Musa belə demişdir: "Deyərkən Əsma bintu Umeyyis bizimlə birlikdə gələnlərdən biri idi. Ziyarət üçün Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arvadı Hafsanın yanna girdi. Əsma Necaşinin yanına hicrət edənlər arasında hicrət etmişdi. Az sonra Ömər, Hafsanın yanına girdi. Əsma də Hafsanın yanında idi. Ömər, Əsmanı görüncə: "Bu kim? " deyə soruşdu. O da: "Əsma bintu Umeyyis! " dedi. Ömər :- Bu Həbəşistanlıdırmı? Bu dənizlidirmi? -deyə soruşdu. Əsma: "Bəli!" deyə cavabını verdi. Bunun üzərinə Ömər: Hicrətdə biz sizi keçdik. Buna görə də Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) biz sizdən daha haqlıyıq." dedi. Əsma qəzəbləndi və bu sözləri söylədi : Yalan (düz demirsən) deyirsən , Ey Ömər! Xeyr! Allaha and olsun ki , siz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə idiniz. Aç olanınızı doyurar, cahilinizə moizə edərdi. Biz isə uzaqlarda, düşmənlərin diyarında , yaxud torpağında , Həbəşistanda idik. Bu da Allah və Elçisi uğrundaydı. Allaha and olsun ki , sənin söylədiyini Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xatırlatmadıqca nə yemək yeyəcək, nə də su içəcəyəm! Bizə əziyyət olunur və qorxudulurduq. Bunu Peyğəmbərə (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) söyləyəcəyəcək və ondan soruşacağam. Allaha and olsun ki , nə yalan danışacaq, nə də (yolumu) azacağam. Bundan əlavə (artıq) bir şey də söyləməyəcəyəm."Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)yanıan gəldiyində Əsma : "Ey Allahın Elçisi , Ömər: "belə və belə" söylədi." dedi. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O mənə sizdən çox haqq sahibi deyil. Onun və yoldaşlarının bir, sizinsə ,Ey gəmi yolçuları , iki hicrətiniz vardır!" deyə buyurdular. Əsma belə demişdir: "Mən Əbu Musa ilə gəmi yolçularının axın-axın yanıma gəldiklərini gördüm. Məndən bu hədisi soruşurdular." Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlar üçün söylədiklərindən ürəklərində daha böyük, daha sevindirici dünyada heç bir şey yox idi." Əbu Burdə belə demişdir: "Əsma belə demişdi: Həqiqətən Əbu Musanı görmüşdüm. O bu hədisi məndən təkrar-təkrar dinləmək istəyirdi." (Müslim / 2502-2503).

## Otuzuncu fəsil: Abdullah İbn Cəfər İbn Əbu Talibin (Allah ondan razı olsun) fəziləti.

68- Abdullah İbn Cəfər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərdən qayıtdıqda , o biz tərəfdən qarşılanardı. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mən və Həsən və ya Hüseyn (Allah onladan razı olsun) tərəfindən qarşılandı. Mədinəyə daxil olana qədər birimizi önündə, digərini arxasında tərkinə mindirdi." (Müslim / 2428).

69- Abdullah İbn Cəfər (Allah ondan razı olsun) belə rəvayət edir: " O gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni tərkinə aldı və insanlardan heç bir kəsə danışmayacağım bir sirri danışdı." (Müslim /2429).

## Otuz birinci fəsil: Abdullah İbn Abbasın (Allah onların hər ikisindən razı olsun) fəziləti.

70- İbn Abbas (Allah onların hər ikisindən razı olsun)belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayaq yoluna çıxdı. Mən onun üçün dəstəmaz suyu qoyudum. Çıxdığında: "Bunu kim qoydu?" deyə soruşdu." Zuheyrin rəvayətində isə belə deyilir: "Onlar," Əbu Bəkrin rəvayətində isə belə deyilir: "Mən: "İbn Abbas!" deyə cavab verdikdə, belə buyurdu: "Allahım ! Onu dində fəqih et!" (Müslim / 2477).

## Otuz ikinci fəsil: Abdullah İbn Ömərin (Allah onların hər ikisindən razı olsun) fəziləti.

71- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında bir kişi yuxu görsəydi , onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) danışardı. Mən bir yuxu görüb onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) danışmağı arzu edirdim. Mən cavan , subay bir oğlan idim. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında məsciddə yatırdım. Yuxumda iki mələyin məni götürüb Cəhənnəmə apardığını gördüm. Bir də baxdığımda, cəhənnəmin quyu ətrafı kimi çevrilmiş və quyu dirəyi kimi iki dirəyi olduğunu gördüm. İçində də bir sıra insanlar vardı. Onları tanıdım. Dərhal: "Cəhənnəmdən Allaha sığınıram, Cəhənnəmdən Allaha sığınıram, Cəhənnəmdən Allaha sığınıram." deməyə başladım. O iki mələyi (başqa) bir mələk qarşıladı. Və mənə: "Qorxma!" dedi. Mən bu yuxunu Hafsaya danışdım. Hafsa da onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)

danışdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Gecə namaz qılsa , Abdullah nə yaxşı kişidir!" Səlim belə buyurmuşdur: "Bundan sonra Abdullah gecə çox az yatardı." (Müslim / 2479).

## Otuz üçüncü fəsil: Abdullah İbn Zubeyrin (Allah onların hər ikisindən razı olsun) fəziləti.

72-Abdullah İbn Əbu Muleyka belə rəvayət edir: "Abdullah İbn Cəfər Abdullah İbn Zubeyrə belə buyurdu: "Xatırlayırsansa , mən, sən və İbn Abbas Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qarşıladıq?" O belə cavab verdi: "Bəli , bizi götürdü , səni isə yox." (Müslim / 2427).

## Otuz dördüncü fəsil: Abdullah ibn Məsud (Allah ondan razı olsun) fəziləti.

73-Abdulah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Bu ayə: " İman gətirib yaxşı işlər görənlərə pis əməllərdən çəkinib iman gətirdikləri, saleh əməllər etdikləri, sonra pis əməllərdən çəkinib iman gətirdikləri, sonra yenə də pis əməllərdən çəkinib yaxşı işlər gördükləri təqdirdə, (haram edilməmişdən əvvəl) daddıqları (yeyib içdikləri) şeylərdən ötrü günah tutulmaz." nazil olduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Sən olardansan!" (Müslim /2459).

74-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən və qardaşım Yəməndən qayıtdıq. Xeyli zaman yanına çox girib, ona davam etdikləri üçün biz İbni Məsud ilə anasını ancaq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əhl-i beytindən sanırdıq." (Müslim \ 2460).

75-Əbu əl-Əhvas (Allah ondan razı olsun) belə rəvayət edir: " Abdullahın yoldaşlarından bir neçə nəfərlə Əbu Musanın evində idik. Onlar Qurana baxırdılar. Bu vaxt Abdullah ayağa qalxdı. Bunun üzərinə Əbu Məsud belə buyurdu: " Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allahın endirdiklərini özündən sonra bu qalxan şəxsdən daha yaxşı bilən birini buraxdığını bilmirəm." Əbu Musa ona belə dedi: "Bəri bax! Sən belə deyirsənsə , həqiqətən , biz olmadığımız vaxt o olar. Bizə pərdə bağlandığı vaxt ona icazə verilərdi." (Müslim 2461).

76-Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə buyurdu: " Əmanətə xəyanət edən şəxs, qiyamət günü xəyanət etdiyi şeylə (boynuna yüklənmiş halda) gələr." Sonra isə belə dedi: " Mənə kimin qiraəti üzrə oxumamı əmr edirsiniz?! Həqiqətən mən Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yetmiş və bir neçə dəfə surə oxumuşam. Və həqiqətən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabı bilir ki , mən Allahın kitabını onların ən yaxşı biləniyəm. Özümdən daha yaxşı bilən birini bilsəm , mütləq onun yanına gedərdim. Şəqiq belə demişdir: "Mən Məhəmmədin Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabının halqalarında (yığıncaqlı) oturdum. Amma bunu ona rədd edən və bunu ona eyb edən birini eşitdim." (Müslim / 2462).

77-Məsruq belə rəvayət edir: "Abdullah İbn Ömərin (Allah onların hər ikisindən razı olsun) yanında idim və İbn Məsuddan (Allah ondan razı olsun) bir hədisi xatırlatdıq. O (Allah ondan razı olsun) belə buyurdu: "Bu kişini Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyim bir şeydən sonra onu hələ də sevirəm. Onu belə buyururkən eşitdim: "Quranı dörd adamdan oxuyun (öyrənin): İbn Ummu Abddan -ondan başladı- Ubeyy İbn Kabbdən, Əbu Huzeyfenin mövlası Sələmdən və Muaz İbn Cebeldən." (Müslim / 2464).

## Otuzbeşinci fəsil: Abdullah İbn  Amr İbn Haramın (Allah ondan razı olsun) fəziləti.

78- Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: " Uhud günü atam vuruldu. Mən onun üzündən paltarı açmağa və ağlamağa başladım. Camaat da mənə bunu qadağan etməyə başladılar. Amma Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə bunu qadağan etmirdi. Fatimə bintu Amr da ağlamağa başladı. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ona: "Ağlayırsanmı? " Və ya: "Ağlama! Siz onu qaldırıncaya qədər mələklər qanadlarıyla onu kölgələndirib dayanacaqlar " deyə buyurdu." (Müslim / 2471).

## Otuz altıncı fəsil: Abdullah İbn Salamın (Allah ondan razı olsun) fəziləti.

79- Amir İbn Saad belə rəvayət edir: "Atamı (Allah ondan razı olsun) belə deyərkən eşitdim: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Abdullah İbn Salamdan başqa qəzən bir canlı üçün: "Bu Cənnətdədir" dediyini eşitmədim." (Müslim / 2483).

80- Xaraşə İbn əl-Hurrbelə rəvayət edir: "Mədinənin məscidində bir halqada oturURDUM. Halqada gözəl paltarlı bir qoca vardı. Bu şəxs Abdullah İbn Salam idi. Oradakılara gözəl bir hədis danışmağa başladı. O qalxdığı vaxt camaat: "Kim Cənnət əhlindən olan şəxs görmək istəyirsə , buna baxsın! " dedilər. Mən (öz özümə): "Allaha and olsun ki, bunun arxasınca gedəcəyəm və mütləq evinin yerini öyrənəcəyəm." dedim. Və arxasına düşdüm.  O yola qoyuldu, nəhayət az qala Mədinədən çıxırdı ki, çatdı. Sonra evinə girdi. Mən də yanına girmək üçün icazə istədim. Mənə icazə verdi. Və: "Ehtiyacın nədir , ey qardaşım oğulu?" deyə soruşdu . Mən belə cavab verdim: "Camaatı dinlədim. Sən qalxdığın vaxt sənin üçün "Kim Cənnət əhlindən olan bir şəxs görmək istəyirsə , buna baxsın " dedilər. Mənim də səninlə birlikdə olmaq xoşuma gəldi." O (Allah ondan razı olsun) belə söylədi: "Cənnət əhli kimdir , onu Allah bilər. Mən sənə bunu nə üçün söylədiklərini danışım. Bir dəfə mən yatarkən birdən bir adam gələrək mənə: "Qalx!" dedi və əlimdən tutdu. Onunla birlikdə getdim. Birdən baxdığımda sol tərəfimdə olan küçələri gördüm.O küçəni tutmağa cəhd etdim. Mənə: "Onu tutma! Çünki o solçuların (sol əhlinin) yollarıdır." dedi. Baxdım ki, sağ tərəfimdə bir sıra yollar (küçələr) var. Mənə : Bu yolu tut!" dedi. Məni bir dağa gətirərək (buna): "Çıx!" dedi. Mən çıxmaq istədiyimdə arxam üzərinə düşməyə başladım və bunu dəfələrlə etdim. Sonra məni apardı. Nəhayət mənimlə bir dirəyin yanına çatdı. Dirəyin başı göydə, alt qisimi yerdə idi. Təpəsində bir halqa vardı. Mənə: "Bunun üzərinə çıx!" dedi. Mən: "buna necə çıxa bilərəm? Onun başı göydədir." dedim. Bunun üzeərinə əlimdən tutaraq məni atdı. Bir də baxdım ki, halqadan asılmışam. Sonra dirəyə vurdu və dirək yıxıldı. Mən səhərə qədər halqadan asılı qaldım." Mən gəlib bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) izah etdim və O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Solunda gördüyün yollar solçuların (Sol tərəf əhlinin, yəni Kitabı sol əlinə verilənlərin, Cəhənnəm əhlinin) yollarıdır. Sağında gördüyün yollar isə sağçıların (sağ tərəf əhlinindir, Kitabı sağ əlinə verilənlərin, Cənnət əhlinin) yoludur. Dağ, şəhidiərin yeridir. Sən ona əsla çıxamayacaqsan. Dirək isə, İslamın direyidir. Qulpa gəlincə, o İslamın qulpudur. Sən ölənə qədər ona yapışmış qalacaqsan." (Müslim / 2484).

## Otuz yeddinci fəsil: "Saad İbn Muazın (Allah ondan razı olsun) fəziləti.

81-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Sadd ibn Muazın cənazəsi önümüzdə ikən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "onun üçün ər-Rəhmanın ərşi titrədi." (Müslim / 2466).

82-əl-Bara (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ipək bir əba hədiyyə olundu. Səhabələri ona əllərini sürtərək onun incəliyinə heyran olurdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bunun incəliyinə heyran olursunuz? Saad İbn Muazın Cənnətdəki dəsmalı bundan daha xeyirli və daha incədir (yumuşaqdır)." (Müslim /2467).

## Otuz səkkizinci fəsil: Əbu Talha əl-Ənsarinin və zövcəsi Ummu Suleymin (Allah onlardan razı olsun) fəziləti.

83-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: Əbu Talhanın Ümmü Süleymdən olan bir oğulu vəfat etdi və Ümmü Süleym ailəsinə: "Əbu Talhaya mən söyləmədikcə , oğulundan bəhs etməyin!" dedi. Sonra Əbu Talha gəldi, O ona axşam yeməyi gətirdi və Əbu Talha yedi içdi. Sonra Ümmü Süleym ona bundan əvvəl etdiydən də ən gözəl şəkildə zinətləndi və O onunla yaxınlıq etdi. Ümmü Süleym onun yaxınlıq edib doyduğunu görüncə belə söylədi: "Ey Əbu Talha! Necə bilirsən? Bir qövm, bir ailəyə əmanət versələr, sonra əmanətlərini istəsələr, əmanəti onlara verməyə bilərlərmi?" Əbu Talha: "Xeyr!" deyə cavab verdikdə, belə buyurdu: "Elə isə oğulunu hesaba qat (səbr et!)! dedi. Bunun üzərinə Əbu Talha qəzəbləndi və: "Məni bulaşana qədər buraxdın, sonra yeganə oğulumu xəbər verdin!" dedi. Dərhal qalxıb Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdi və ona bunu xəbər verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Keçən gecəniz üçün Allah sizə bərəkət lütf etsin!" deyə buyurdu. Ümmü Süleym hamilə qaldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərlərinin birində idi. Ümmü Süleym də onlarla birgə idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir səfərdən Mədinəyə qayıtdığı vaxt oraya gecə girməzdi. Onlar Mədinəyə yaxınlaşdılar. Ümmü Süleymin doğum sancısı tutdu. Bu səbəblə Əbu Talha onun yanında qaldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) getdi. Əbu Talha belə deyirdi: "Ey Rəbbim! Sən çox yaxşı bilirsən ki Elçin çıxdığı zaman onunla birlikdə çıxmaq, girdiyi zaman da onunla birlikdə girmək mənim xoşuma gəlir. Lakin bu gördüyün şeylə bağlandım qaldım. Ümmü Süleym belə buyurdu: ":Ey Əbu Talha, duyduğum sancını duymaz oldum. Get!" Biz də getdik. Gəldikləri zaman Ümmü Süleymi (yenə) doğum sancısı tutdu və bir oğlan doğurdu. Anam mənə: "Ey Ənəs! Bu uşağı sabah səhər sən Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) aparmadıqca , kimsə əmizdirməsin! dedi. Səhər açıldıqda mən uşağı alaraq onu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim. Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)əlində bir dağlama aləti olduğu halda rast gəldim. Məni görüncə: "Yəqin Ummu Süleym doğdu!» deyə buyurdu. Məm: "Bəli!" deyə cavab verdikdə, dağlama alətini buraxdı. Mən də uşağı gətirərək onun qucağına qoydum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinə Acvasıhdan (xurma növü) bir xurma istədi və onu əriyənə qədər ağızında əzdi. Sonra uşağın ağızına qoydu. Uşaq onu yalamağa başladı. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ənsarın xurmanı sevmələrinə baxın!" deyə buyurdu. Uşağın üzünü sildi və ona Abdullah adını verdi." (Müslim / 2144).

## Otuz doqquzuncu fəsil:Ubeyy İbn Kaabın (Allah ondan razı olsun) fəziləti.

84-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zamanında Quranı dörd nəfər cəm etdi. Hamısı Ənsarlardan idi. Muaz İbn Cəbəl, Ubeyy İbn Kaab, Zeyd İbn Səbit və Əbu Zeyd." Qatədə belə demişdir: "Ənəsə (Allah ondan razı olsun) belə dedim: "Əbu Zeyd kimdir?" O: "Əmilərimdən biri " deyə cavab verdi." (Müslim / 2465).

## Qırxıncı fəsil: Əbu Zər əl-Ğifərinin (Allah ondan razı olsun) fəziləti.

85-Abdullah ibn Samit belə rəvayət edir: "Əbu Zər (Allah ondan razı olsun) belə buyurmuşdur: " Qövmümüz Ğıfarin arasından çıxdıq. Onlar haram ayı halal edərdilər. Mən, qardaşım Üneys və anamız (birlikdə) çıxdıq. Və bir dayımıza qonaq olduq. Dayımız bizə ikram və lütfkarlıq etdi. Onun qövmü bizə həsəd edərək ona: "Sən ailənin yanından çıxdığın vaxt Üneys onlara müxalif çıxdı (yəni arxandan onların yanına girdi)." dedilər. Sonra dayımız gəldi və ona deyiləni bizə söylədi. Mən də ona: "Bizə etdiyin yaxşılığı şübhəsiz ki bərbad etdin. Bundan sonra sənə yaxınlaşmayacağıq." dedim. Dərhal dəvələrimi yaxınlaşdıraraq üzərlərinə mindik. Dayımız paltarına sarınaraq ağlamağa başladı. Biz yolumuza davam etdik. Nəhayət Məkkə kənarına endik. Üneys bizim dəvələrimizlə onların misli dəvələr adına şeir yarışına girdi. Və hər iki tərəf kahinin yanıan getdilər. O Üneysi daha xeyirli saydı. Bunun üzerinə Üneys yanımıza dəvələrimiz və onunla bir misli də bərabərləri olduğu halda gəldi." Əbu Zər: "Ey qardaşım oğulu! Mən Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) görüşməmişdən üç il əvvəl namaz qıldım" deyə buyurdu. Mən: "Kimin üçün?" deyə soruşdum. O: "Allah üçün!" deyə cavab verdi.  Mən ona: "Hara doğru dönürsən?" deyə soruşdum. O: "Rəbbim məni hara çevirsə , oraya doğru!" deyə cavab verdi. Sonra belə dedi: "İşa namazını gecənin sonu olana və günəş üzərimə düşənə kimi qılıram sonra bir örtü kimi sərilirəm." Üneys mənə belə buyurdu: "Mənim Məkkədə bir işim var. Mənim əvəzimə burada baş göz ol!" Ardından Üneys yola düşdü və nəhayət Məkkəyə çatdı. Yanıma dönməkdə bir az gecikdi. Sonra gəldi. Mən ondan: "Nə etdin?" deyə soruşdum . O belə buyurdu: "Məkkədə sənin dinində bir adama rast gəldim. Onu Allah Təala gönderdiyini iddia edir. Mən: "İnsanlar nə deyir?" deyə ondan soruşdum. O: "Şair, kahin, sehirbaz." deyirlər. Üneys də şairlərdən biriydi. Üneys belə buyurdu: "Mən , həqiqətən , kahinlərin sözünü dinləmişəm amma onunki kahinlərin sözü deyil. Onun sözünü şair növlərinə tətbiq etdim, lakin məndən sonra ona şair deməyə kimsənin dili çatmaz. Allah and olsun ki , o , həqiqətən , doğru, kahinlər də ,həqiqətən , yalançıdırlar." Mən ona: "O halda mənim əvəzimə burda baş göz ol ki , gedib görüm." dedim və Məkkəyə gəldim. Məkkəlilərdən zəif bir adam tapdım və ondan: "Ona pozğun dediyiniz şəxs haradadır? " deyə soruşdum . O mənə işarə edərək: "Budur pozğun!" dedi. Az sonra vadinin sakinləri bütün gil və sümükləri ilə üzərimə hücum etdilər. Hətta huşumu itirərək düşdüm. Qalxdığım vaxt dim dik qoyulmuş daşlar kimi qıpqırmızı idim. Dərhal zəmzəm quyusuna gedərək üzərimdən qanı yudum və suyundan içdim. Ey qardaşım oğlu , Allaha and olsun ki , otuz gün və gecə arası orada qaldım. Zəmzəm sunundan başqa yeməyim yox idi.  Mən kökəldim , hətta ,qarınımın büküntüləri qıvrıldı. Qarınımda aclıq, zəiflik hiss etmədim. Məkkəlilər ay işıqlığı bir gecədə qəflətən yatdılar. Kəbəni kimsə təvaf etmirdi. Onlardan iki qadın İsaf və Nailəyə dua edirdilər. Təvafları əsnasında yanıma gəldilər. Mən : Bunların birini digərinə nigahlayın." dedim. Lakin onlar sözlərindən əl çəkmədilər və yanıma gəldilər. Mən olara: "(söyüş qəsd edərək) Odun kimi şeydir. Lakin mən kinayə söyləmirəm." dedim. Bunun üzərinə

qadınlar vəlvələ qopardılar və "Bizimkilərdən bir nəfər burada olsaydı." deyərək getdilər. Az sonra qarşılarına Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ilə Əbu Bəkr çıxdı. Yuxarıdan enirdilər. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlardan: "Sizə nə oldu?» deyə soruşdu. Onlar: " Dinsiz Kəbə İlə örtülərinin arasındadır." dedilər. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sizə nə söylədi?" deyə onlardan soruşdu. Onlar: "Bizə ağızı dolduran sözlər söylədi " dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gələrək Qara daşı öpdü və yoldaşı ilə birlikdə Kəbəni təvaf etdi. Sonra namaz qıldı. Namazını bitirincə (Əbu Zər belə buyurdu): "Onu İslamın salamı ilə ilk salamlayan mən oldum. Və: "əs-Salamu aleykə , ey Allahın Elçisi." Dedim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənə də Salam və Allahın rəhməti olsun " deyə buyurdu. Sonra: "Sən kimsən?" deyə soruşdu. Mən: "Ğifar qəiləsindənəm." dedim. Bunun üzərinə əlini uzadaraq barmaqlarını alınına qoydu. Mən öz özümə: "Mənim Ğıfara mənsub olmamdan xoşlanmadı." dedim və əlini tutmağa cəhd etdim. Yoldaşı dərhal mənə mane oldu. Onu məndən yaxşı tanıyırdı. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başını qaldırdı və:"Nə zamandan bəri buradasan?» deyə soruşdu. Mən: "Gecəsi gündüzü otuz gündən bəri buradayam." dedim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "O halda səni kim doyururdu? " deyə soruşdu. Mən: " Zəmzəm suyundan başqa yeməyim yox idi , amma kökəldim, hətta qarınımın bükümləri qırıldı. Qarınımda bir aclıq , zəiflik də görmürəm " deyə cavab verdim . O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Həqiqətən , o , mübarəkdir. O , həqiqətən , doyurucu yeməkdir." Deyə buyurdu. Əbu Bəkr belə buyurdu: "Ey Allın Elçisi , bu gecə onu doyurmaq üçün mənə icazə ver!" dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ilə Əbu Bəkr getdilər və mən də onlarla birlikdə getdim. Əbu Bəkr bir qapı açdı və bizə Taifin quru üzümündən ovuçlamağa başladı. Bu Məkkədə yediyim ilk yemək oldu. Sonra qaldığım qədər qaldım. Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim və belə buyurdu: "Mənə həqiqətən xurmalıq bir yerin səmti göstərildi. Onun Mədinədən başqa bir yer olacağını sanmıram. Sən qövmünə məndən (bir şeylər) təbliğ edərsənmi? Ola bilsin ki, Allah sənin vasitənlə onları faydalandırar. Və onlara görə sənə əcr verər." Sonra mən Uneysin yanına gəldim. O məndən: "Nə etdin? "deyə soruşdu. Mən belə cavab verdim: " Bunu etdim ki, mən , həqiqətən , müsəlman oldum və təsdiq etdim." O belə buyurdu: "Mən sənin dininə qarşı deyiləm, çünki mən da müsəlman oldum və təsdiq edim. Sonra anamızın yanına gəldik və o da: "Mən sizin dininizə qarşı deyiləm, çünki mən də müsəlman oldum və təsdiq etdim." dedi. Bunun üzərinə heyvanlarımıza mindik və qövmümüz Ğıfara gəldik. Onların da yarısı müsəlman oldu. Onlara Əyma ibn Rahadat əl-Ğıfari əmirlik edirdi. O onların rəisləri idi. Yarısı da: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə gəldiyi vaxt müsəlman olarıq:" dedilər. Az sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinəyə gəldi və onların qalan yarısı da müsəlman oldular. Əsləm qəbiləsi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək: "Ey Allahın Elçisi , bunlar bizim qardaşlarımızdır. Onlar nə üzərinə müsəlman oldularsa, biz də müsəlman olarıq " dedilər və müsəlmançılığı qəbul etdilər." Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ğıfar! Allah ona bağışlasın! Əsləm! Allah ona da salamatlıq versin! " deyirdilər." (Müslim / 2473).

86-İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: Məkkədə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zühur xəbəri Əbu Zərrin qulağına çatınca qardaşına: "Heyvanına min bu vadiyə get və

özünə səmadan xəbər gəldiyini söyləyən bu adam haqqında mənə məlumat topla. Danışdığını dinlə, sonra da mənə xəbər gətir! " deyə buyurdu. Qardaşı yola qoyularaq Məkkəyə gəldi və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) söylədiklərini dinlədi, sonra Əbu Zərin yanına dönərək belə dedi: "Onu, yaxşı əxlaqı əmr edərkən və elə bir söz söyləyərkən gördüm. Bu söz şeir deyil." Əbu Zer ona belə buyurdu: "İstədiyim haqda mənə bir şey əldə etmədin!" Sonra azuqəsini yığdı və içində su olan bir tuluğunu götürərək Məkkəyə gəldi. Məscidə çatdıqda Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) axtardı, lakin onu tanımırdı və soruşmaqdan da çəkindi. Nəhayət , axşam oldu və yatdı. Əli onu gördü və onun qərib olduğunu başa düşdü. Onu gördükdə arxasınca düşdü lakin bir-birlərindən heç bir şey soruşmadılar. Nəhayət , səhər olduqda (Əbu Zerr) tuluğu və azüqəsini alaraq məscidə çəkildi. O gün belə davam etdi. Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) görə bilmirdi. Nəhayət , axşam oldu. O yenə yatdığı yerə döndü. Əli yenə onun yanına baş çəkdi və: "Bu adama evinin yolunu bilmək zamanı gəlmədimi? " deyərək onu qaldırdı və özü ilə apardı. Bir-birlərinə heç bir şey soruşmadılar. Üçüncü gün gəlincə eyni şəkildə etdi. Əli yenə onu qaldıraraq apardı. Sonra ondan "Mənə səni bu diyara gətirən nədir? " deyə soruşdu. Əbu Zer ona: "Məni irşad edəcəyinə əhdi peyman versən , (dediyini) edərəm " deyə buyurdu: " O da onun dediyi kimi etdi. Bunun üzərinə Əbu Zərr ona (nə üçün gəldiyini) xəbər verdi. Əli belə buyurdu: "Həqiqətən , o haqqdır. Allahın Elçisidir (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sabahladığında məni təqib et! Mən sənin üçün qorxulacaq bir şey görsəm su tökərmişəm kimi edəcəyəm, keçib getdikdə arxamca gəl və menim girdiyim yerə gir!" Əbu Zerr onun dedyini etdi. Əlini təqib edərək yola düşdü. Nəhayət Əli Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına girdi. Əbu Zər də onunla birlikdə girid. Onun söylədiyini dinlədi və orada müsəlman oldu. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Qövmünə dön də , əmrim sənə gəlincə onlara xəbər ver " deyə buyurdu. Əbu Zər belə buyurdu: "Nəfsim əlində olan Allaha and içərəm ki, onların arasında bunu qışqıracağam. O çıxaraq məscidə gəldi və var səsiylə: "Şahidlik edərəm ki, Allahdan başqa ilah yoxdur. Və Məhəmməd Allahın Elçisidir." deyə qışqırmış. Müşriklər ayağlandılar və onu yerə sərənə kimi döydülər. Abbas gələrək onun üzərinə yıxıldı və: "Təəssüflər olsun sizə! Bunun Ğıfar qəbiləsindən olduğunu və tacirlərinizin Şama gedən yolu bunlardan keçdiyini bilmirsiniz?" deyərək onu onların əlindən qurtardı. O sabahsı gün yenə bunun kimi etdi. Onlar yenə ayaqlandılar və onu döydülər. Yenə Abbas onu qurtardı." (Müslim / 2473).

## Qırx brinci fəsil: Əbu Musa əl-Əşarinin (Allah ondan razı olsun) fəziləti haqda.

87-Əbu Musa əl-Əşari (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkə və Mədinənin arasında əl-Cirana yerə endiyi zaman yanında idim. Bilal da onunla bərabər idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına Bedəvi bir adam gələrək: " Ey Muhəmməd , mənə vəd etdiyinini yerinə yetirməyəcəksənmi?" deyə soruşdu . Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Müjdələn!" deyə cavab verdikdə, Bədəvi: "Mənə bu müjdə sözünü çox söylədin!" deyə söylədi. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qəzəbli halda Əbu Musa ilə Bilala dönərək: "Bu , müjdəmi rədd etdi. Siz qəbul edin!" buyurdu. Onlar: "Qəbul etdik , ey Allahın Elşisi" deyə cavab verdilər. Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içində su olan bir tas

istədi və əlləriylə üzünü onun içində yudu,sonra içinə tüpürdü. Sonra: "Bundan için və üzlərinizə, sinələrinizə sürtün! Sizə müjdələr olsun!" deyə buyurdu. Onlar tası alaraq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əmr etdiyini etdilər. Ummu Səlmə pərdənin arxasından belə buyurdu: "Qabınızdakından ananız üçün də saxlayın! " deyə səsləndi. Onlar da onun üçün bir miqdar (su) saxladılar." (Müslim / 2497).

## Qırx ikinci fəsil: Əbu Musa və Əbu  Amir əl-Əşarinin (Allah ondan razı olsun) fəziləti.

88-Əbu Burda  atasından (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hünüy döyüşünü bitirdikdən sonra Əbu Amiri  qoşunun üzərində əmir  olaraq Avtas adlanan yerə göndərdi.  O (Allah ondan razı olsun) Durəyd İbn əs-Sammət ilə qarşılaşdı və onu öldürdü. Allah Təaala onun əshabını məğlubiyyətə uğratdı." Əbu Musa (Allah ondan razı olsun) belə demişdir: "Məni də Əbu Amir ilə birgə göndərmişdi. Əbu Amir dizindən vuruldu. Onu Bəni Cuşm qəbiləsindən bir kişi oxla vurdu. Dizinə dəyərəydi. Mən onun yanına yetişib: "Əmi , səni kim vurdu? "deyə soruşdum . Əbu Amir Əbu Musa üçün işarə edənək: "Mənim qatilim budur görürsən? Məni o vurdu." deyə buyurdu. Mən onu qəsd edərək bilərəkdən onun üzərinə yürüdüm və ona çatdım. Məni gördükdə çevrilib getməyə başladı. Arxasınca düşərək ona: "Utanmırsanmı? Ərəb deyilsənmi? Dayanmayacaqsanmı?" deyə söylədim. O dayandı. Mən və o qarşılaşdıq və iki qılınc zərbəsiylə bir birimizə girdik. Onu qılıncla vürdum və öldürdüm. Sonra Əbu Amirin yanına qayıtdım və ona: "Allah təala: "Sənin qatilini öldürmüşdür" dedim. O mənə: "Elə isə bu oxu çıxar!" deyə buyurdu.  Mən çıxartdım , yerindən su axdı. Mənə belə dedi: "Ey qardaşım oğlu , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına get və məndən ona salam söylə. De ki ,mənim üçün  bağışlanma diləsin!" Əbu Əmir məni insanların üzərinə əmir təin etdi , sonra bir müddət yaşadı və öldü. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına qayıtdıqda , yanına daxil oldum. O evində xurma  budağından toxunmuş bir yatağın üzərində idi.  Yatağın üzərində döşək vardı. Döşəyin hörgüləri onun belində və yan tərəflərində iz qoymuşdu. Mən ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizim və Əbu Amirin xəbərini çatdırdım və belə dedim: " O: "ona mənim üçün bağışlanma diləməsini söylə!" deyə buyurdu." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir su istədi və ondan dəstəmaz aldı. Sonra əllərini qaldıraraq: "Allahım !Ubeyd Əbu Amiri bağışla!" Hətta mən onun qoltuqlarının ağlığını görürdüm. Sonra belə buyurdu: "Allahım ! Onu Qiyamət günü xəlq etdiklərinin çoxusundan və ya insanlardan üstün et!" Mən ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , mənim üçün də bağışlanma dilə" deyə söylədim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım! Abdullah İbn Qeysin günahlarını bağışla .Onu Qiyamət günü Kərim (məqbul) bir yerə daxil et!" Əbu Burda belə demişdir: "Biri Əbu Amir , digəri siə Əbu Musa üçündür." (Müslim / 2498).

## Qırx üçüncü fəsil: Əbu Hüreyrə əd-Dəvsinin (Allah ondan razı olsun) fəziləti.

89-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Anamı islama dəvət edirdim. O müşrik idi. Bir gün onu yenə dəvət etdiyimdə mənə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) haqda bəyənmədiyim bir söz eşitdirdi. Ağlayaraq Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldim və ona belə dedim: "Ey Allahın Elçisi , mən anamı

islama dəvət edirdim. O məni rədd edirdi. Bu gün yenə dəvət etdim və mənə sənin haqda bəyənmədiyim bir söz söylədi. Allaha Əbu Hüreyrənin anasına hidayət verməsi üçün dua et!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım! Əbu Hüreyrənin anasına hidayət ver!" mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) duasının müjdəsi ilə çıxdım. Qayıtdıqda qapının önündə dayandım. O bağlı idi. Anam ayaq səslərimi eşitdi və belə buyurdu: "Ey Əbu yerində qal!" mən su şırıltıdı eşitdim. O yuyundu və köynəyini geyindi və tələsik baş örtüyünü sarıdı. Sonra qapını açdı və: "Ey Əbu Hüreyrə Allahdan başqa İlah olmadığına və Muhammədin onun qulu və Elçisi olduğuna şəhadət edirəm." Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına qayıtdım. Sevindiyimdən ağlayırdım. Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , müjdə , Allah sənin duanı qəbul etdi və anama hidayət verdi" dedim. O Allaha həmd sənalər etdi və xeyir söylədi. Sonra belə dedim: " Ey Allahın Elçisi , məni və anamı Mömin bəndələr sevsin və bizə də onları sevdirsin , deyə Allaha dua et!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım! Bu bəndəciyini (Əbu Hüreyrəni) və anasını mömin bənədlərinə sevdir və onları da onlar üçün sevimli et!" Elə bir mömin xəlq olmamışdı ki , mənim haqda eşitdikdə məni sevməsin!"

90-Urva Aişədən (Allah ondan razı olsun) belə rəvayət edir: Əbu Hüreyrəyə təəccüblənməzsənmi? Evimin yanında oturub-oturub Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədis rəvayət edir, bunu mənə eşitdirirdi. Mən nafilə namaz qılırdım. Namazımı bitirmədən qalxdı getdi. Ona yetişsəydim , rədd cavabı verəcəkdim. Şübhəsiz ki , Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədisi sizin ərz etdiyiniz kim danışmazdı." İbn Şihab belə dmişdir: "İbn əl-Müseyyeb belə söylədi. Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurdu: " Əbu Hüreyrə çox hədis rəvayət etdi " deyirlər. Çatılacaq yer Allahın hüzurudur. Bir də: "Nə üçün Mühacirlərlə Ənsar onun hədisləri kimi (çox) hədis rəvayət etmirlər?" deyirlər. Bunun səbəbini sizə xəbər verim: "Ənsardan olan qardaşlarımı torpaqlarında işdə çalışmaq məşğul edirdi. Mühacirlərdən olan qardaşlarımı da bazar yerlərindəki ticarət işi məşğul edirdi. Mən də boğaz toxluğuna Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mülazim olurdum. (ximətimə davam edirdim.) Onlar olmadığı vaxt mən var, onlar unutduğu vaxt bədən əzbərləyirdim. Həqiqətən , bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Hansınız paltarını açar , mənim bu hədisimdən (bir şeylər) alar , sonra onu sinəsinə yığacaq, şübhəsiz o, məndən eşitdiyi bir şeyi unutmayacaq!" deyə buyurdu. Dərhal üzərimdə olan bir əbanı sərdim. Və sözünü bitirənə qədər! (gözlədim). Sonra onu sinəmə yığdım. O gündən sonra mənə söylədiyi bir şeyi bir daha unutmadım. Əgər Allahın kitabında endirdiyi iki ayət: "Kitabda insanlara aşkar etdiyimiz dəlillərdən sonra göndərdiyimiz nişanələri və doğru yol göstərən ayələrimizi gizlədən kimsələr Allahın lənətinə düçar olar və bütün lənət edə bilənlər də onlara lənət oxuyar. Mən ancaq tövbə edənləri, yaxşı işlər görənləri və bəlli edənləri əfv edərəm. Mən tövbələri qəbul edənəm, mərhəmətliyəm." olmasaydı əbədi olaraq bir şey rəvayət etməzdim." (Müslim 2493).

## Qırx dördüncü fəsil: Əbu Ducənə Simək İbn Xuraşənin (Allah ondan razı olsun) fəziləti.

91-Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uhud günü qılıncı götürərək belə buyurdu: " Bunu mənədn kim götürər?" Əllələrini uzadaraq hər bir insan: "Mən! Mən!" deyirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı

olsun): "Onu haqqı ilə kim götürər?" deyə sotruşduqda, insanlar imtina etdilər. Simək İbn Xuraşə Əbu Ducənə: "mən haqqıyla götürərəm!" dedi. O onu haqqıyla aldı və müşriklərin başını yardı." (Müslim 2470).

## Qırx beşinci fəsil: Əbu Sufyan Saxr İbn Harb (Allah ondan razı olsun) fəziləti.

92-Əbu Zumeyl belə rəvayət edir: "İbn Abbas (Allah onların hər ikisindən razı olsun) mənə belə danışdı: "Müsəlmanlar Əbu Sufyana baxmır , onunla oturmurdular. O Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə söylədi: "Ey Allahın Elçisi , üç şeyi mənə ver!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli!" deyə cavab verdi. O (Allah ondan razı olsun) belə buyurdu: "Məndə ərəblərin ən yaxşı və ən gözəl qadını Ummu Həbibə bintu Əbu Sufyan var , onu səninlə evləndirim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli!" deyə buyurdu. O (Allah ondan razı olsun)sonra belə buyurdu: "Müaviyəni hüzurunda katib (yazar) et!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli!" deyə buyurdu. O (Allah ondan razı olsun) yenə buyurdu: "Məni də əmir et ki , müsəlmanlarla vuruşduğum kimi kafirlərlə də vuruşum." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli!" deyə cavab verdi." Əbu Zumeyl belə demişdir: "Əgər bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) istəməsədi , bunu ona verməzdi. Çünki ondan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nə istədikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli!" deyirdi. (Müslim / 2501).

## Qırx altıncı fəsil: Culeybibin (Allah ondan razı olsun) fəziləti.

93-Əbu Bərza (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşlərinin birində idi. Allah Təala ona bir qənimət vermişdi. O Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabına belə buyurdu: "kimisə itirmisiniz: "Bir itkiniz varmı?" Səhabələr: "Bəli filan kəs, filankəs və filankəs! (axtarılmaqdadır) deyə cavab verdilər. Sonra (yenə): "Bir itkiniz varmı?" deyə soruşdu? Səhabələr: "Bəli! Filakəs, filankəs və filankəs! (axtarılmaqdadır) deyə cavab verdilər. Sonra O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) təkrarən: "Bir itkiniz varmı?" deyə soruşdu. (Bu səfər) Onlar: "Xeyr!" deyə cavab verdikdə, O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Lakin mən Cüleybibi itkin görürəm, onu dərhal axtarın!" Onu Ölənlərin içində axtardılar və onun öldürdüyü yeddi adamın yanında tapdılar. Sonra (düşmənlər) onu da öldürmüşdülər. Peyğəmbər (Sallallahu Əleyhiyə Səlləm) gələrək onun baş ucunda dayandı və belə buyurdu: "Yeddi adam öldürdü. Sonra onu öldürdülər. Bu məndəndir. Mən də ondanam! Bu məndəndir, mən də ondanam". Sonara onu iki qolunun üzərinə qoydu. Onun Peyğəmbərin (Sallallahu Əleyhi və Səlləm) qollarından başqa qolu yox idi. Onun üçün bir qəbir qazdılar və qəbrə qoydular. Yuyulmağından bəhs edilməmişdir." (Müslim / 2472).

## Qırx yeddinci: Həssən ibn Sabitin (Allah ondan razı olsun) fəziləti.

94-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Ömər İbn əl-Xattab (Allah ondan razı olsun) Həssənin (Allah ondan razı olsun) yanından keçdikdə o məsciddə şer oxuyurdu. Onu gözünün ucuyla süzdü. Həssən belə buyurdu: "Mən bu məsciddə səndən də daha xeyirlisi var ikən şer oxuyurdum." Sonra Əbu Hüreyrəyə

tərəf çevrilərək belə buyurdu: "səni Allaha and veririəm , Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Əvəzimə cavab ver! Allahım! Ona Müqəddəs ruhla yardım et!" dediyini eşitmisənmi?" O: "Bəli!" deyə cavab verdi." (Müslim / 2485).

95- əl-Bara İbn Azib (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hassan İbn Sabitə belə dediyini eşitdim: "Onları dağıt. Və ya onları dağıt , Cəbrail səninlədi."

96- Masruq (Allah ondan razı olsun) belə rəvayət edir: " Aişənin (Allah ondan razı olsun) yanına daxil oldum, yanında Həssan İbn Sabit vardı. Ona şeir oxuyur, öz beytlərindən gəzəller söyləyirdi. (Belə dedi): "İffətlidir, ağıllıdır; heç bir şübhə İlə ittiham oluna bilməz.", "Qafil qadınların ətlərini yemədən aç səhərlər." Bunun üzerine Aişə ona: "Lakin sən belə deyilsən!" deyə buyurdu. Masruq belə demişdir: "Mən Aişəyə (Allah ondan razı olsun): Yanna girmək üçün ona nə üçün icazə verirsən? Halbuki Allah belə buyurmuşdur: " Onlardan günahın böyüyünü öz üstünə götürəni çox böyük bir əzab gözləyir! " Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Korluqdan daha şiddətli əzab nə ola bilər? O Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müdafiə edər, yaxud qoruyardı."

97- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə byurmuşdur: " Qureyşi (şözlə, hüccətlə) dağıdın, çünki bu onlara ox atmaqdan daha ağır gəlir." Sonra İbn Ravahaya xəbər göndərərək: "Onları (şözlə, hüccətlə) dağıt!" deyə buyurdu. O da Qüreyşi (şözlə, hüccətlə) dağıtdı. Lakin Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) razı qalmadı. Bunun Üzərinə Kab İbn Malin, daha sonra isə Hssən İbn Səbbitin dalınca xəbər göndərdi. Həssən onun yanına girincə belə buyurdu: "Sizin üçün quyruğu ilə çarpan bu aslana (xəbər) göndərmənizin zamanı gəlmişdir." Sonra dilini çıxararaq onu oynatmağa başlamış və: "Səni Haqq (din) ilə göndərən Allaha and içərəm ki, onları dilimlə dəri parçalar kimi parçalayacağam! " dedi. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Tələsmə! Çünki Əbu Bəkr Qüreyşin nəsəblərini ən yaxşı bilən kimsədir. Mənim də onlar arasında nəsəbim var. Sənin üçün mənim nəsəbimi xülasə etsin." buyurdu. Həssən dərhal onun yanına getdi. Sonra dönərək: "Ey Allahın Elçisi , mənə sənin nəsəbini xülasə etdi. Səni haqq (din) ilə göndərən Allaha and içərəm ki, səni onlardan xəmirdən ət çəkər kimi çəkib çıxaracağam. "deyə söylədi. Aişə (Allah ondan razı olsun) belə buyurmuşdur: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Həssənə: "Sən Allah və Elçisi adına müdafiədə olduqca , şübhəsiz ,müqəddəs ruh sənə kömək etmədə davam edəcək!" deyə buyurduğunu eşitdim." Həmçinin Aişə belə buyurmuşdur: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Həssən onları sözlə dağıtdı və həm şəfa verdi, həm şəfa tapdı." Həssən belə dedi: "Sən Məhəmmədə (sölə) hücum etdin. Mən də onun adına cavab verirəm. Bunda Allah qatında mükafat vardır. Sən Məhəmmədi sadə, müttəqi, Allahın Elçisi, əxlaqı vəfalılıq olduğu halda sözlə dağıtdın. Heç şübhəsiz ki, atam onun atası və mənim ismətim, Məhəmmədin ismətini sizdən qorumaq üçün gözətçidir. Əgər atlar, mızi Keda yolunun iki tərəfindən toz qaldırarkən görməsəniz qızcığazımı itirim. O atlar üzərinizə gəlirkən gəmilərini çəkərlər. Kürəklərində incə mızraqlar vardır. Atlarımız çox sürətli qaçarlar. Qadınlar yaylıqlarıyla onların tozlarını götürərlər. Əgər bizdən üz çevirsəniz ,ümrə edərik. Fəth müyəssər olar, pərdə də qalxar. Əks halda , elə bir günün vuruşması üçün səbr edin ki, o gündə Allah dilədiyini əziz edər. Allah: "Mən haqqı söyləyən, bunda heç bir gizlilik olmayan bir qul göndərdim. " demişdir. Allah: "Mən bir ordu hazırladım ki, onlar məqsədləri düşmənlə qarşılaşmaq olan ənsardır. " buyurmuşdur. Bizlər üçün qayıdış yeri (yəni Qüreyşdən) hər gün ya

söymək, ya hərb, yaxud sözlə dağıtmaqdır. Amma Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sizdən qoruyan, tərifləyib köməyində olan bərabərdir. Allahın Elçisi Cəbrayıl aramızdadır. Müqədəs ruhun heç bir tayı yoxdur." (Müslim / 2490).

## Qırx səkkizinci fəsil: Cərir İbn Abdullah əl-Bəcəlinin (Allah ondan razı olsun) fəziləti.

98-Cərir (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İslama girdiyimdən mənə yanına girməyimi qadağan etməmişdi. Məni hər gördüyündə üzümə güləridi."

99-Cərir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə belə buyurdu: "Ey Cərir , məni Zül Xalasadan qurtarmazsanmı?" (Yəni) Xasamın evində olan ,ona Yəmənin Kəbəsi deyiləndən." Dərhal yüz əili altı ilə getdim. At üstündə dayana bilmirdim. Bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xatırlatdığımda, əliylə sinəmə toxundu və: "Allahım! Bunu sabit et! Bunu hiadyət olunmuş və hiayət edən et! " deyə dua etdi. Cərər getdi və o evi odla yandırdı. Sonra Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müjdələmək üçün bir adam göndərdi. Bu adam Əbu Ərtat adlanırdı. Bizdən idi. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək: "Onu qətranlı dəvə kimi buraxmadıqca , sənə gəlmədim." dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əhməsin (Cəririn qəbiləsinin adı) atlarına və kişilərinə beş dəfə bərəkət dilədi." (Müslim / 2476).

## Qırx doqquzuncu fəsil: Ağac altında beyət edənlərin (Allah onlardan razı olsun) fəziləti.

100-Ummu Mubəşşir (Allah ondan razı olsun) belə rəvayət edir: " O Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Hafasanın yanında ikən belə dediyini eşitdi: "Allahın izni ilə Cəhənnəmə ağac altında beyət edən ağac əshabından kimsə girməyəcəkdir. O: "Bəli , Ey Allahın Elçisi?!" deyə cavab verdikdə, ona qadağan etdi. Hafsa belə buyurdu: "Sizdən elə bir kəs olmaz ki, oraya varid olmasın. " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: " Allah təala artıq belə demişdir: "Sonra Biz Allahdan qorxub pis əməllərdən çəkinənlərə nicat verəcək, zalımları isə orada diz üstə çökmüş halda saxlayacağıq!" (Müslim / 2496).

## Əllinci fəsil: Bədirdə iştirak edənlərin fəziləti haqda.

101- Əli İbn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni, Zuveyri və Miqdadı göndərərək belə buyurdu: "Xax baxçasına get! Orada bir nökər qadın var, onda bir məktub var. O məktubu ondan alın!" Dərhal atlarımızı çaparaq yola qoyulduq. Birdən qadın qarşımıza çıxdı. Biz ona: "Məktubu çıxar!" dedik. O: "Məndə məktub yoxdur!" dedi. Biz ona: "Ya bu məktubu çıxararsan , yaxud paltarları çıxaracaqsan! dedik. Bunun üzərinə hörülmüş saçlarının arasından məktubu çıxardı. Biz də onu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gətirdik. Məktubda belə yazılmışdı: "Hatib İbn Baltədən Məkkəli müşriklərdən bəzi kəslərə. Onlara Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bəzi işlərini xəbər verirdi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Ey Hatib! Bu nədir?" deyə soruşdu? Hatib belə dedi: "Üzərimə düşməkdə tələsik etmə , Ey Allahın Elçisi! Mən Qüreyşə bitişik bir kimsə idim. (Süfyan belə

demişdir: "Onların müttəfiqi idi , amma onlardan deyildi.) Səninlə birlikdə olan mühacirlərdən onlara qohum olanlar vardı. Bu qohumluq səbəbiylə ailələrini himayə edirdilər. Mənim nesəbim cəhətindən onların arasında yaxınım olmağın tərəfindən, onlardan dost əldə edib onunla qohumlarımı himayə etmələrini arzu etdim. Bunu küfr etmək və ya dinimdən dönmək üçün etmədim. Müsəlman olduqdan sonra küfrə razı olduğum üçün də etmədim. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Doğru söylədi!" deyə buyurdu. Ömər isə belə buyudu: "Mənə icazə ver , Ey Allahın Elçisi , bu münafiqin boyunu vurum." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Şübhəsiz , o , Bədrdə olmuşdur. Nə bilirsən, ola bilsin ki, Allah Bədr əhlinə baxmış və: "Dilədiyinizi edin! Sizi bağışladım" buyurmuşdur." Və Allah Təala bu ayəni nazil etdi: "Ey iman gətirənlər! Nə mənim düşmənimi, nə də özünüzün düşmənini dost (vəli) tutmayın!" bu ayəni İshaq Suyanın tilavəti rəvayətində gətirdi." (Müslim /2494).

## Əlli birinci fəsil: Qureyşin, Ənsarların və başqalarının fəziləti haqda.

102- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Qureyş, Ənsarlar, Muzeynə, Cuheynə, Əsləm, Ğifar və Əşca mənim Mövlalarımdır. Onların Allah və Elçisindən başqa mövlası yoxdur." (Müslim / 2520).

## Əlli ikinci fəsil: Qureyşin qadınları haqda.

103- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Qüreyş qadınları dəvəyə minən qadınların ən xeyirlisi, uşağa qarşı ən şəfqətlisi, ərinə əlindəki iş barəsində ən riayətkar olanıdır." Əbu Hüreyrə (Allah ondan razı olsun) belə buyurdu: "Məryəm bintu İmran heç dəvəyə minməmişdir."

## Əlli üçüncü fəsil: Ənsarların (Allah ondan razı olsun) fəziləti haqda.

104- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Bu ayə bizəim haqda nazil olmuşdur: " Sizin içərinizdən iki dəstə məğlubiyyətdən (uğursuzluqdan) qorxaraq geri çəkilmək fikrinə düşmüşdü." Bənu Sələmə və Bənu Hərisə. Aıllah Təalanın: " Halbuki, Allah onların yardımçısı idi " kəlamına görə onun enməməsini diləmirik." (Müslim / 2505).

105- Zeyd İbn Arqam (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Allahım ! Ənsarları, Ənsarlarlın övladlarını və Ənsarların övladlarının övladlarını bağışla!" (Müslim \ 2506).

106- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) toydan qayıdan bir dəstə uşaq və qadınları gördü və ayağa qalxaraq belə buyurdu: "Allahım! Siz mənə insanların ən sevimlisisiniz Allahım! Siz mənə insanların ən sevimlisisiniz." Ənsarı nəzərdə tuturdu." (Müslim / 2508).

107- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Ənsarlardan olan bir qadın, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldi və Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onunla xəlvətə çəkilərək üç dəfə: "Nəfsim əlində olan Allaha and olsun ki , siz mənə insanların ən sevimlisisiniz." Deyə buyurdu." (Müslim / 2509).

108- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarlar üçün bağışlanma dilədi. Belə dedyini hesab edirəm: "Onların zürriyti və azad etdikləri mövlaları üçn də dilədi. Buna şəkk etmirəm." (Müslim / 2507).

109- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Şübhəsiz ki, Ənsar mənim mədəm və camaatımdır. Həqiqətən , insanlar çoxalıb azalacaqlar. Buna görə də siz onların yaxşılıq edənlərindən qəbul edin! Pislik edənləri bağışlayın!" (Müslim / 2510).

## Əlli dördüncü fəsil: Ənsarların evlərinin ən xeyirlisi haqda.

110- Əbu Useyd əl-Ənsari Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyinə şahidlik edir: " Ənsarların evlərinin ən xeyirlisi Bəni Nəccar, sonra Bəni Əbd əl-Əşhəl, sonra Bəni əl-Həris İbn əl-Xəzrəc, sonra Bəni Səidədir. Ənsarların hər evində xeyir vardır." Əbu Sələmə belə buyurmuşdur: "Əbu Useyd belə dedi: " Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) adından yalan danışmaqla ittiham olunarammı?! Yalançı olsam , öz qövmüm Bəni Səidədən başlardım." Bu söz Sad İbn Ubadenin qulağına çatdıqda xətrinə dəydi və: "Biz arxada qoyulduq? Dördün ən sonuncusu olduq? Mənə eşşəyimi yəhərləyin! Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gedəcəyəm," dedi. Qardaşı oğlu Sehl isə onunla danışaraq: Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) rədd cavabı verməyəmi gedəcəksən? Halbuki o (bu işi) ən yaxşı biləndir. Sənə dördüncüsü olmağın kifayət deyilmi?" dedi. Sad döndü və: "Allah və Elçisi ən yaxşı bilər" Dedi. Sonra eşşəyinin yəhərinin açılmasını əmr etdi və açıldı." (Müslim / 2511).

## Əlli beşinci fəsil: Ənsrlarla gözəl davranmaq haqda.

111- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Cərir İbn Abdullah əl-Bəcəli ilə səfərə çıxdım. Mənə xidmət edirdi. Mən ona: "belə etmə!" deyə buyurduqda belə dedi: "Mən ənsarların Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir şey etdiklərini görmüşəm. Onlardan biriylə yoldaşlıq etsəm , mütləq ona xidmət edəcəyəmə and verdim." Başqa rəvayətdə isə belə deyilir: "Cərir Ənəsdən daha böyük idi" (Müslim / 2513).

## Əlli altıncı fəsil: əl-Əşarilərin (Qəbilə adı) (Allah ondan razı olsun) fəziləti haqda.

112- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " Mən gecə evlərinə girərkən Əşari səfər yolçularının Quran səslərini çox əla bilirəm. Hər nə qədər gündüzləri evlərinə endikləri vaxt evlərini görməmiş olsam da, gecə Quran oxuyan səslərindən onların evlərini də bilərəm. Onlardan biri də Hakimdir. Süvarilərə yaxud düşmənə rast gəldiyi zaman onlara: " Yoldaşlarım sizə onları gözləmənizi əmr edirlər" deyər." (Müslim / 2813).

113- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Əşarilər döyüşdə yeməkləri bitdikdə və ya Mədinədəki ailələrinin yeməkləri azaldıqda əllərindəki yeməyi bir paltarın içinə toplar, sonra onu aralarında bir qabın içində bərabərcəsinə bölərdilər. Onlar məndəndir, mən də onlardanam." (Müslim /2500).

## Əlli yeddinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ğifar və Əsləm qəbilələri üçün dua etməsi.

114- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Əsləm Allah onu salamat etsin! Ğifar Allah onu bağışlasın! Bunu mən demirəm. Lakin bnuu Allah Təala söylədi." (Müslim / 2516).

115- Xufaf İbn Əymə əl-Ğifari (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazda belə dedi: "Allahım Bəni Lihyənə, Riləyə, Zəkvan və Useyyəyə lənət et! Onlar Allah və Elçisinə asi oldular.Ğifarı Allah bağışlasın! Əsləmi Allah Təala salamt etsin!" (Müslim / 2817).

## Əlli səkizinci fəsil: Muzeynə, Cuheynə və Ğifarın fəziləti.

116- Əbu Bəkra (Allah ondan razı olsun) belə rəvayət edir: "əl-Əqra İbn Həbis (Allah ondan razı olsun) Peyğəmbərin(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə buyurdu: "Sənə ancaq Gıfar və Müzeynedən hacılardan oğurluq edənlər beyət etdi. Onun: "Cüheyneni" də söylədiyini zənn edərəm. (Şekkeden ravi Muham-məddir.) Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Əgər Ğıfar və Müzeyne -zənn edərəm Cüheyne də dedi- Bəni Temim ilə Bəni Amirdən, Əsəd və Ğaiafandan daha xeyirli isələr, bunlar xəsarətə uğramışdırlarmı? Aqra: "Bəli!" deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O halda nəfsim əlində olan Allaha and içərəm ki, onlar bunlardan daha xeyirlidir." (Müslim / 2522).

## Əlli doqquzuncu fəsil: Tey qəbiləsi haqda.

117- Adiy İbn Hatim (Allah ondan razı olsun) belə rəvayət edir: " Ömər İbn əl-Xattabın (Allah ondan razı olsun) yanına gəldim və O mənə belə buyurdu:" Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və əshabının üzünü ağardan ilk sədəqə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gətirdiyim tey qəbiləsinin sədəqəsidi."

## Altımışıncı fəsil: Dovs qəbiləsi haqda.

118- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "ət-Tufeyl və əshabı gələrək: "Ey Allahın elcisi , Dovs qəbiləsi kafir oldu və imtina etdi Allaha onların əleyhinə dua et!" dedilər. İnsanlar da: "Dovs həlak oldu." dedilər. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buuyurdu: "Allahım , Dovsa hidayət ver və gətir." (Müslim / 2524).

## Altımış birinci fəsl: Bəni Təmimin fəziləti.

119- Əbu Zura belə rəvayət edir: "Əbu Hüreyrə (Allah ondan razı olsun) buyurmuşdur: "Üç xüsusiyyət var ki, mən bunları Bəni Temim haqqında Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdikdən sonra onları sevməkdə devam edirəm. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Onlar

Deccala qarşı insanların ən şiddətli vuruşanlarıdır" demiş; xatırlamamışdır. Onların sədəqələri (zəkatı) gəldikdə, belə buyurdu: "Bunlar bizim qövmümüzün sədəqələridir." Aişənin əlində onlardan bir əsir vardı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Onu azad et ! O İsmayıl övladlarındandır." (Müslim \ 2525).

## Altımış ikinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrinin bir birlərını qardaş edilməsi haqda.

120- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Ubeydə əl-Carrahla Əbu Talhanı bir birərinə qardaş etdi." (Müslim /2528).

121- Asım İbn əl-Əhval belə rəvayət edir: "Ənəs İbn Məlikə belə dedyildi: "sənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "İslamda əhdləşmə yoxdur " deməsi xəbəri çatıbmı?" O belə bnbuyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evində Qureş və Əlsarlar arasında əhdləşmə etdi." (Müslim / 2529).

122- Cabir İbn Mutim (Allah ondan razı olsun) belə rəvayət edir: "İslamda əhdləşmə yoxdur. Cahiliyyət dövründə olan hər hansı bir əhdləşməyi islam ancaq şiddət artırmışdır." (Müslim 2530).

## Altımış üçüncü fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: "Mən əshabım üçün bir əminəm (təhlükəsizliyəm)! " Əshabım isə ümmətim üçüm bir əmindirlər.

123- Əbu Bürdə atasından (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ilə birgə Məğrib namazını qıldıq. Sonra "otursaq da onunla birlikdə İşa namazını da gılsaq!" dedik və oturduq. O yanımıza çıxdı və:"Siz hələ buradasınız?" deyə birzdən soruşdu . Biz: "Ey Allahın Elçisi , səninlə birlikdə Məğrib nazını qıldıq, sonra: "Oturaq səninlə birlikdə İşa namazını da qılaq " dedik. O: "Yaxşı etdiniz!" Yaxud "Düz etdiniz!" deyə buyurdu. Sonra başını səmaya qaldırdı. Çox dəfələr başını səmaya qaldırardı və: "Ulduzlar səmanın təhlükəsizliyidir. Ulduzlar getdikdə səmaya vəd olunan gəlir. Mən səhabələrim üçün bir əminəm. Mən getdimi, səhabələrimə vad olunanlar gəlir. Səhabələrim də ümmətim üçün bir əmindir. Səhabələrim getdimi ümmətimə vad olunan şeylər gəlir." (Müslim / 2531).

## Altımış dördüncü fəsil: Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), və ya əshabını, və ya Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əshabının əshabını görən haqda.

124- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " İnsanların üzərinə elə bir zaman gələcək ki, özlərindən bir ordu göndəriləcək və: "Baxın aranızda Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən bir kimsə tapa biləcəksinizmi? " deyiləcək. Belə bir şəxs tapılacaq və onlara onun səbəbiylə fəth müyəssər olacaq. Sonra ikinci bir ordu göndəriləcək yenə: "Görəsən bunların arasında Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrini görən varmı?" deyəcəklər və onun səbəbiylə onlara fəth müyəssər olacaq. Sonra üçüncü ordu göndəriləcək və : "Baxın aralarında Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə

Allahın salavatı və salamı olsun) əshabını görənləri görən tapa biləcəksənmi? " deyiləcək. Sonra dördüncü ordu göndəriləcək və yenə: "Baxın içlərində Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrini görən, birini görən, birini görən, biri varmı? " deyiləcək. Belə bir şəxs də tapılacaq və onlara onun sayəsində fəth müyəssər olacaq." (Müslim / 2532).

## Altımış beşinci fəsil: Ən xeyirli əsr Səhabələrin əsridir. Daha sonra onların arxasından gələnlərindir. Daha sonra onların arxasından gələnlərindir.

125- İmran İbn Husey (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Sizin ən xeyirliləriniz mənim əsrimdə olanlardır. Sonra onların arxasından gələnlər. Daha sonra onların arxasından gələnlər. Daha sonra onların arxasından gələnlərdir. "İmran (Allah ondan razı olsun) belə demişdir: " Bilmirəm Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) öz əsrindən sonra iki dəfə və ya üç dəfə dedi." Sonra onlardan sonra bir qövm gələcək ki, şahid çağrılmadıqları halda şahidlik edəcəklər. Xəyanət edəcəklər və əmin olmayacaqlar. Nəzir edəcəklər və yerinə yetirməyəcəklər. Aralarında köklük zühur edəcək." (Müslim / 2535).

## Altımış altıncı fəsil: İnsanları əsl olaraq taparsınız.

126- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İnsanları əsl olaraq taparsınız. Onların cahiliyyet dövründə xeyirli olanları anlayış göstərmək şərti ilə İslamda da xeyirlilərdir. Bu işdə insanların ən xeyirlilərindən bəzilərini içinə girməzdən əvvəl, ondan ən çox xoşlanmayanlar olduğunu taparsınız. İnsanların ən pislərindən bəzılərini bir üzlə onlara, bir üzlə də bunlara gələn iki üzlünü taparsınız.". (Müslim /2526).

## Altımış yeddinci fəsil: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurmuşdur: " Heç şübhə yoxdur ki, bundan etibarən yüz ilin başında yer üzündə olanlardan heç bir kimsə qalmayacaq."

127- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) həyatının sonunda bir gecə İşa namazını qıldırdı. Salam verincə ayağa qalxaraq: "Bu gecənizə nə deyirsiniz? Heç şübhə yoxdur ki, bundan etibarən yüz ilin başında yer üzündə olanlardan heç bir kimsə qalmayacaq." İbn Ömər belə buyurmuşdur: "İnsanların danışdıqları sözlər arasında Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu yüz il haqqındakı sözü barəsində xəta etdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ancaq: "Bu gün yer üzünde olanlardan kimsə qalmayacaq." dedi. Bununla o (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əsr insanlarının keçib gedəcəyini nəzərdə tutdu." (Müslim / 2537).

## Altımış səkkizinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrini söyməyin qadağan olması və onların başqaları üzərindəki fəziləti.

128- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Səhabələrimi söyməyin! Səhabələrimi söyməyin! Nəfsim əlində olana and olsun ki

, əgər sizlərdən biri Uhud dağı boyda qızıl (sədəqə) sərf etsə , onlaraın bir mudd (bir ovuc) və ya onun yarısı miqdarı verdiyinə çatmaz." (Müslim / 2540).

## Altımış doqquzuncu fəzil: "Uveys əl-Qarninin (Allah ondan razı olsun) təbinlərədən olması və fəziləti haqda.

129- Ömər İbn əl-Xattab (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Təbiinlərin ən xeyirlisi Uveys adlan kəsdir. Onun bir anası vardır. Onun özündə bir bəyazlıq vardır. Ona sizin üçün bağışlanma diləməsini əmr et!"

130- Useyr İbn Cabir belə rəvayət edir:" Ömər İbn əl-Xattab Yəmənlilərin köməkçi qoşunlarlı gəldiyi vaxt onlara: Üveys İbn Amir aranızdamı?" deyə soruşardı. Nəhayət , Uveysə rast gəldi. Və ona: "Sən Üveys İbn Amirsən?" deyə soruşdu. O da: "Bəli!" deyə cavab verdi. O ondan: "Murad qəbiləsindən sonra Qran qəbiləsindənsən?" deyə soruşdu. Üveys: "Bəli!" cavabını verdi. O ondan: "Səndə baras xəstəliyi vardı?" deyə yenə soruşdu. " Ondan sağaldın və tək bir dirhəm yeri boyda yer qaldı eləmi? " deyə soruşdu. Üveys: "Bəli!" cavabını verdi. " Anan varmı? " deyə soruşdu. Üveys: "Bəli! cavabını verdi. Ömər (Allah ondan razı olsun) ona: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitmişəm: "Sizə Uveys İbn Amir Yəmən əhlinin kömək dəstəsi ilə gələcək. O Murad ,sonra isə Qarn qəbiləsindəndir. Onda baras xəstəliyi vardı. Ondan sağaldı və tək bir dirhəm yeri boyda yer qaldı. Bir anası vardır. Ona çox yaxşı davranır. Allaha and içsə, onu mütləq andında sadiq çıxarar. Sənin üçü bağışlanma diləməsinə imkan tapsan , bunu et!" sonra Ömər (Allah ondan razı olsun) ona: "Mənim üçün istiğfar et! dedi. O da Ömər üçün bağışlanma dilədi. Ömər ondan: "Hara getmək istəyirsən? " deyə soruşdu. Üveys: "Kufəyə!" deyə cavab verdikdə, O: "Sənin üçün oranın əmirinə məktub yazımmı?" deyə soruşdu. Üveys belə cavab verdi: "İnsanların dəstəsinin arasında olmağım mənim üçün daha sevimlidir. Gələn il gəlincə Kufənin şərəflisindən bir adam həccə getdi və Ömərlə qarşılaşdı. Ömər (Allah ondan razı olsun) ondan Üveysi soruşdu. O şəxs: "Mən onu evi pərişan, əşyası az bir halda buraxdım." deyə cavab verdi. Ömər ona belə buyurdu: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitmişəm: "Sizə Uveys İbn Amir Yəmən əhlinin kömək dəstəsi ilə gələcək. O Murad sonra isə Qarn qəbiləsindəndir. Onda baras xəstəliyi vardı. Ondan sağaldı və tək bir dirhəm yeri boyda yer qaldı. Bir anası vardır. Ona çox yaxşı davranır. Allaha and içsə, onu mütləq andında sadiq çıxarar. Sənin üçü bağışlanma diləməsinə imkan tapsan, bunu et!" O şəxs Üveysin yanına gələrək: "Mənim üçün bağışlanma dilə" deyə buurdu. Üveys ona: "Sən xeyirli bir səfərdən yeni gəlirsən , mənim üçün sən bağışlanma dilə!" dedi. O şəxs yenə: "Mənim üçün bağışlanma dilə" dedi. Üveys (təkrarən) ona: "Sən xeyirli bir səfərdən yeni gəlirsən. Mənim üçün sən bağışlanma dilə! " O ondan: "Ömərə rast gəldinmi? " deyə soruşdu. O şəxs: "Bəli" deyə cavab verdi. Bunun Üzərinə onun üçün bağışlanma dilədi. İnsanlar da onun kim olduğunu anladı. O da çevrilib getdi." Üseyr belə demişdir: "Paltarı xəttli bir parça idi. (ona xətli bir parçadan əba geyinduirdim) İnsanlar onu gördükcə: "Görəsən Üveys bu əbanı haradan tapdı?" deyirdi." ("Müslim / 2542).

## Yetmişinci fəsil: Misir və əhli haqda.

131- Əbu Zər (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən , siz Misiri fəth edəcəksiniz. Oraya Qirat deyilər. O yerin əhalisi haqqında bir-birinizə xeyir

tövsiyyə edin! Çünki onların bir zimmet və qohumluq (hörmet) haqqı vardır. Bir kərpiç yeri haqqında döyüşən iki adam gördünüzmü dərhal oradan çıx!" Ravi belə demişdir: "Əbd ər-Rahman Şurahbil İbn Həsəni qardaşı Rəbiyə ilə bir kərpic yeri haqqında döyüşərkən gördüm və dərhal oradan çıxdım." (Müslim / 2543).

## Yetmiş brinci fəsil: Oman haqda.

132- Əbu Burza (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ərəb qəbilələrindən birinə bir adam göndərdi. Onlar bu şəxsə söydulər  və döydülər. O Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona bunu xəbər verdi. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sən Oman əhlinin yanına getsəydin , səni söyməz və döyməzdilər." (Müslim / 2554).

## Yetmiş ikinci fəsil: Farslar haqda.

133- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında oturmuşduq. Birdən ona Cümə surəsi nazil oldu: "Ərəblərdən savayı hələ onlara qoşulmamış başqalarına da O, yenilməz qüvvət sahibi, hikmət sahibidir!" Kişi:  "Ey Allahın Elçisi, onlar kimlərdir?" deyə soruşdu. Lakin Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona heç bir şey söyləmədi. Hətta adam ondan bir, iki və ya üç dəfə soruşdu. Salman əl-Farisi də aramızda idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əlini Salmanın üzərinə qoydu. Sonra belə buyurdu: "İman əs-Səriyyə ulduzunda olsa, bunlardan bəzi kəslər onu əldə edəcəkdir." (Müslim / 2546).

## Yetmiş üçüncü fəsil: İnsanları yüz dəvə kimi tapacaqsınız, içində işə yarayan bir dəvə tapılmayacaq.

134- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "İnsanları yüz dəvə kimi tapacaqsınız, içində işə yarayan bir dəvə tapılmayacaq."

## Yetmiş dördüncü fəsil: Bəni Səqif qəbiləsindən olan yalançı və zalım haqqında söylələnlər.

135- Əbu Nofəl belə rəvayət edir: "Abdullah İbn Zübeyri (Allah ondan razı olsun) Mədinənin dağ yolunda (carmıxa çəkilmiş) gördüm. Qureyş və insanlar yanından geçməyə başladılar. Nəhayət , Abdullah İbn Ömer da onun yanına uğradı. Başında qaldıraraq: "Salam olsun sənə , Ey Əbu Xubeyb .Salam  olsun sənə, Ey Əbu Xubeyb . Salam olsun sənə , Ey Əbu Xubeyb. Allaha and olsun ki , mən sənə bu işi qadağan edirdim!  Allaha and olsun ki , mən senə bu işi qadağan edirdim!  Allaha and olsun ki , mən senə bu işi qadağan edirdim! Allaha and olsun ki , mənim bildiyimə göre sen , həqiqətən , çox oruç tutan, çox namaz qılan, qohumlara çox yardım edən bir adamdın. Allaha ən pisi sən olan bir ümmet ən xeyirli bir ümmetdir. "  Sonra Abdullah İbn Ömer oradan ayrıldı. Abdullahınn durması ve danışması Həccacın qulağına çatdı. Dərhal İbn Zubeyrin  yanına adam göndərərək onu çarmıxından yerə endirdi və yahudilərin qəbiristanlığında basdırdı. Sonra anası Əsma binti Əbu  Bəkrə xəbər göndərdi. Lakin o gəlməkdən imtina etti. Həccac yenə bir nəfəri onun ardınca göndərdi və Ona: "Ya gələcəksən, ya da saçlarından sürükləyərək gətirmən üçün mütləq birini  göndərəcəyəm" dedi Əsma yenə imtina etdi və belə buyurdu: "Allaha and olsun ki , mənə saçlarımdan sürükləyəcək birini

göndərmədikcə mən sənin yanına gəlməyəcəyəm."  Həccac: "Mənə ayaqqabılarımı göstərin! " dedi. Ve ayaqqabılarını götürərək getdi. Nəhayət gəlib Əsmanın yanına daxil oldu və belə dedi: "Allahın  düşməninə nə etdiyimi gördünmü? "Əsma belə buyurdu:" Gördüm ki, ona dünyasını bərbad etdin. Ama o sənin axirətini bərbad etdi. Qulağıma çatıb ki , sən ona: "Ey iki qurşaqlının oğlu." demisən. Allah and olsun ki , o iki qurşaqlı mənəm. Qurşağın biri ilə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və Əbu Bəkrə heyvanların üzərindən yemək qaldırırdım.Digəri isə hər bir qadına lazım olan qurşaqdır. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə buyurmuşdu: "Saqaf qəbiləsində bir yalancı və bir can alan (zalım) vardır." Yalancını gördük. Can alana (zalıma) gəlincə isə, bunun ancaq sən olacağını zən edirəm. Bunun üzərinə Həccac onun yanından qalxdı və bir daha da ona müraciət etmədi." (Müslim / 2545).

# Yaxşılıq etmək və qohumluq əlaqələri kitabı

## Birinci fəsil: validеyinlərlə yaxşı davranmaq və hansının yaxşı mühasibətə daha haqqı olduğu haqda.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)  yanına gələrək belə soruşdu: "İnsanlrdan mənə onunla yaxşı davranmama daha haqqı olan kimdir?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Anan!" deyə cavab verdi. Kişi: "Sonra kim?" deyə soruşdu. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə: " Anan!" deyə cavab verdi. Kişi yenidən: "Sonra kim?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə: "Anan!" deyə cavab verdi. Sonra kişi yenə: "Sonra kim?" deyə soruşduqda, o (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Atan!" deyə buyurdu." (Müslim / 2548).

## İkinci fəsil: Validеyinlərlə yaxşı davranmağın ibadətdən  qabaq olması haqda.

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Beşikdə yalnız üç adam danışmışdır: "Biri Məryəmin oğulu İsa, digəri Cüreycin yoldaşı. Cüreyc abid bir adam idi. Bir kilsə düzətdirdi. Onun içində yaşayırdı. O namaz qılarkən anası gəldi  və: "Ey Cüreyc! " dedi. Cüreyc:"Ey Rəbbim! Anam və namazım! " dedi və namazına yönəldi. Anası getdi. Sabahsı gün olunca , təkrar onun yanına gəldi. Cüreyc namaz qılırdı. Anası ona: " Ey Cüreyc! " dedi. Cüreyc:"Ey Rəbbim! Anam və namazım! " dedi və namazına yönəldi. Anası getdi. Sabahısı gün olunca təkrar onun yanına gəldi. Cüreyc namaz qılırdı. Anası ona: " Ey Cüreyc! " dedi. Cüreyc:"Ey Rəbbim! Anam və namazım! " dedi və namazına yönəldi.  Anası belə dua etdi: "Allahım! Pozğunların üzünü görmədikcə, bunun canını alma!" Bəni israil Cüreyci və ibadətini müzakirə etdilər. Pozğun bir qadın vardı. Gözəlliyi dillərə dastan olmuşdu. (Bu qadın): "İstəsəniz sizin üçün onu fitnəyə salaram." deyə söylədi və ona sataşdı. Lakin Cüreyc ona fikir vermədi. Sonra  qadın Cüreycin kilsəsində məskunlaşan bir çobanın yanına gəldi. Və ona özüylə zina etməsinə imkan verdi. O da onunla zina etdi. Qadın hamilə qaldı. Doğduğu vaxt: "Bu uşaq Cüreycdəndir!" dedi. (Kəndlilər) Cüreycə gələrək onu aşağı endirdilər. Və kilәsni yıxdılar. Onuda  də döyməyə başladılar. Bunun üzərinə Cüreyc: "Sizə nə olur?" dedi. Onlar: "Bu pozğun ilə zina etdin və səndən uşaq doğdu." dedilər. Cüreyc:

"Uşaq haradadır?" deyə onlardan soruşdu. Dərhal onu gətirdilər. Cüreyc onlara: "Məni buraxın , namaz qılım!" dedi və namaz qıldı. Namazı bitirdikdən sonra uşağın yanına gələrək onun qarnına toxundu və: "Ey uşaq! Sənin atan kimdir?" deyə ondan soruşdu. Uşaq: "Filan çobandır" deyə cavabını verdi. Bunun üzərinə kəndlilər Cüreycə yönəldilər və onu öpüb sığallayırdılar. Sənin üçün kilsəni qızıl və gümüşdən tikərik." dedilər. O onlara: "Xeyr! Onu köhnəsi kimi palçıqdan tikin!"deyə buyudu. Onun dediyi kimi etdilər. Bir dəfə uşaq anasını əmirdi. (Oradan) Şahlanlıq bir ata minmiş, paltarı gözəl bir adam keçdi. Uşağın anası: "Allahım! Oğulumu bunun kimi et! " deyə dua etdi. Uşaq dərhal döşü buraxıb adama doğru döndü və ona baxdı. Sonra: " Allahım! Məni bunun kimi etmə!" dedi. Sonra döşə dönərək əmməyə başladı." Əbu Hüreyrə belə demişdir: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şəhadət barmağını ağızına salaraq onu əmməyə başladığını və uşağın necə əmdiyini anlatmasını sanki hələ də görürəm." (Sonra) Oradan bir kəniz keçdi. Sahibləri onu döyür və: " Sən zina etdin! oğurladın! " deyirdilər. Nökər isə : "Mənə Allah yetər! O nə gözəl vəkildir." deyirdi. Uşağın anası: "Allahım! Oğulumu bu kəniz kimi etmə!" deyə dua etdi. Uşaq dərhal əmməyi buraxdı və kənizə baxaraq: "Allahım! Məni bu kəniz kimi et! " dedi. " Burada danışmağa başladılar. Ana dedi ki : "Boğazı tutuldu! Gözəl paltarlı bir adam keçdi. Mən: Allahım! Oğulumu bunun kimi et!" dedim. Sən: "Allahım! Məni bunun kimi etmə!" dedin. Bu kənizi döyərək və: "Sən zina etdin! Oğurladın! deyərək yanımızdan keçirdilər. Mən: "Allahın! Oğulumu bunun kimi etmə!" deyə dua etdim. Sən: "Allahım! Məni bunun kimi et!" dedin. Uşaq belə cavab verdi: "O adam bir zalım idi. Bundan ötəri: "Allahım! Məni onun kimi etmə!" dedim. Bu kənizə isə: "Sən zina etdin!" deyirdilər. Halbuki zina etməmişdir. "Oğurladın! " deyirdilər. Halbuki oğurlamamışdı. Bu səbəblə də: "Allahım! Məni bunun kimi et!" dedim." (Müslim / 2550).

## Üçüncü fəsil: Valideyinlərlə qalaraq onlarla yaxşı davranmaq üçün Cihadı tərk etmək!

3- Abdullah ibn Amr İbn əl-Ass (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Bir kişi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) tərəf gəldi və belə buyurdu: "Mən sənə Hicrət və Cihada beyət edir və əcrinini Allahdan umuram." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "sənin valideyinlərindən kim isə sağdırmı?" O: "Bəli! Hər ikisi!" deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Sən Allahdan əcrini umursan?" Kişi: "Bəli!" deyə cavb verdikdə, belə buyurdu: "Valideyinlərinin yanına dön və onlarla yaxşı davran!" (Müslim / 2549).

## Dördüncü fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buurmuşdur: "Allah Təala valideyinlərin üzünə ağ olmağı qadağan etmişdir."

4- Muğirə ibn əş-Şöbə (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " Allah Təala valideyinlərin üzünə ağ olmağı, qızları diri diri başdırmağı və (ərə zorla) verib, istəməyi sizə haram etmişdir. Sizin üçün üç şeyi: "dedi qodunu, çox sual verməyi və malı tələf etməyi bəyənmir." (Müslim / 593).

## Beşinci fəsil: Ata anası və ya onlardan biri onun yanında qocalan və onu cənnətə salmayan kəs burnu üstündə sürünsün!

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Burunu üstündə sürünsün! Burunu üstündə sürünsün! Burunu üstündə sürünsün!" ondan "Kim , ey Allahın Elçisi?" deyə soruşulduqda belə buyurdu: "Ata anası və ya onlardan biri onun yanında qocalan və onu cənnətə salmayan kəs!" (Müslim / 2551).

## Altıncı fəsil: Atanın dostunun ailəsi ilə yaxşı davranmağım yaxşılığın ən yaxşısı olması haqda.

6- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Onun bir eşşəyi vardı. Məkkəyə çıxdığında dəvəyə minməkdən bezdiyi zaman onun üzərində rahatlanardı. Bir də başına bağladığı bir sarığısı vardı. Bir gün bu eşşəyin üzərində ikən birdən yanından bir bədəvi ərəb keçdi. Abdullah (ona): "Sən filankəs oğulu filanın oğulu deyilsən?" deyə soruşdu .Bədəvi: "Bəli! Cavab verdikdə, Abdullah dərhal eşşəyi ona verdi və: "Buna min!" dedi. Sarığını da verərək: "Bunu basına sarı!" dedi. Bunun üzərinə yoldaşlarından biri Abdullaha: "Allah sənə bağışlasın! Bu bədəviyə üzərində rahatlanıldığın bir eşşəyi və bir də başına bağladığın sarığını verdin?! "Abdullah belə buyurdu: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "İnsanın atası öldükdən sonra atanın dostunun ailəsi ilə yaxşı davranmaq yaxşılığın ən yaxşısıdır." Bunun atası da Ömərin dostu idi." (Müslim / 2552).

## Yeddinci fəsil: Qızlara yaxşı münasibət bəsləmək.

7- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Bir qadın yanında iki qızı ilə yanıma gəldi və məndən bir şeylər istədi. Lakin mənim yanımda bir dənə xurmadan başqa ona verəcək bir şey tapmadım. Mən xurmanı ona verdim. O onu götürərək qızları arasında böldü. Özü isə ondan yemədi. Sonra qızları ilə birgə çıxdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanıma daixl olduqda ona onun haqda danışdım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Hər kim qızlarına görə bir şeylə imtahana çəkilərsə və onlara yaxşı münasibət bəsləyərsə, onlar onun üçün Cəhənnəmdən sipər (örtü ) olarlar." (Müslim /2629).

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): “Bir kimsə iki qiza həddi buluğa çatana qədər baxarsa, qiyamət günündə mənimlə birlikdə (belə) gələr." Deyə buyurdu və barmaqlarını bir birinə sıxdı." (Müslim / 2631).

## Səkkizinci fəsil: Qohumluq əlaqələrini saxlamaq ömürü atırır.

9- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Hər kim ruzisinin artırılmasını , yaxud əcəlinin gecikdirilməsini arzu etsə , qohumluq əlaqələri saxlasın!" (Müslim / 2557).

## Doqquzuncu fəsil: qohumlar səninlə əlaqəni kəssələr belə onlarla əsaqəni kəsməmək (qurmaq).

10-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bir kişi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , mən

qohumlarımla əlaqə saxladığım halda onlar mənimimlə əlaqəni kəsirlər. Onlara yaxşılıq edirəm, onlarsa mənə pislik edirlər. Onlara qarşı yumuşaq davranır, onlarsa mənə qarşı cahillik edirlər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Əgər dediyin kimisənsə, sanki onlara isti kül yedirir kimisən! Sən bu minval üzrə davam eitikçə Allah tərəfindən onlara qarşı səninlə daim bir köməkçi olacaqdır." (Müslim / 2558).

## Onuncu fəsil: Qohumluq əlaqəsi saxlamaq və kəsmək haqda.

11-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz Allah məxluqatı yaratmışdır. Onları xəlq etdikdən sonra rəhm (Qohumluq əlaqəsi) ayağa qalxdı: "Bu qohumluq əlaqələrinin kəsilməsindən (Allaha) sığınamağın məqamıdır." Allah Təal belə nuyurdu: "Bəli! Səni saxlayanı mən saxlayacaq, səndən əlaqəni kəsəndən, mən də əlaqəni kəsəcəyəm , razı deyilsənmi? Rəhm: "Bəli ! Razıyam! " dedi. Allah Təala belə buyurdu: "Bu sənə verilmişdir." Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "İstəyirsiniz bu ayəni oxuyun: "Əgər üz döndərsəniz, sizdən yer üzündə fitnə-fəsad törətmək və qohumluq tellərini qırmaq gözlənilməzmi?! Onlar Allahın lənət etdiyi kar və gözlərini kor etdiyi kimsələrdir! Onlar Quran barəsində düşünməzlərmi? Yoxsa ürəklərinə kilid vurulmuşdur?" (Müslim / 2554).

12-Cubeyr İbn Mutim (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Əlaqələri kəsən Cənnətə girməz!" İbn Əbu Ömər belə demişdir: "Sufyan belə buyurdu: "Yəni qohumluq əlaqələrini kəsən!" (Müslim / 2556).

## On birinci fəsil: Yetimi himayə edən haqda.

13-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Özünün və ya başqasının olsun , yetimə baxan kimsə ilə mən, cənnətdə bunlar kimiyik." Malik şəhadət və orta barmağa işarə etdi." (Müslim / 2953).

## On ikinci fəsil: Dul və yoxsul üçün çalışan (işləyən) haqda.

14-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dul və yoxsul üçün çalışan kimsə, Allah yolunda cihad edən kimidir." Belə buyurduğunu hesab edirəm: " Yorulmadan namaz qılan, İftar etmədən oruc tutan kimidir." (Müslim / 2982).

## On üçüncü fəsil: Allah üçün bir birini sevən haqda.

15-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah təala qiyamət günü belə deyəcəkdir: "Cəlalıma görə bir birlərini sevənlər haradadı? Onları mənim kölgəmdən başqa bir kölgə olmayan bu gündə kölgələndirəcəyəm."

16-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Bir kişi başqa bir kənddə olan qardaşını ziyarət etdi Bunun üzərinə Allah onun üçün yoluna nəzarət edən bir mələk qoydu. Adam mələyin yanına gəlincə (ona): "Hara getmək istəyirsən? " deyə soruşdu. Adam: "Bu kənddəki qardaşımın yanına getmək

istəyirəm!" deyə cavab verdikdə, Mələk ondan: "Sənin onun üzərində islahına çalışdığın bir nemətin varmı? " deyə soruşdu. Adam: "Xeyr! Lakin mən onu Allah Təalə üçün sevdim " cavabını verdi. Mələk: "O halda mən sənin o qardaşını Allah üçün sevdiyin kimi, Allah da səni sevdiyini bildirmək üzrə Allahın sənə göndərdiyi elçiyəm." (Müslim / 2567).

## On dördüncü fəsil: Kişi sevdiyi kimsə ilədir.

17-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Bir adam Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək: "Ey Allahın elçi , qiyamət nə vaxt qopacaq?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Sən qiyamət üçün nə hazırladın? " deyə soruşu . O: "Allah ilə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sevgisini!" deyə cavab verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "O halda sən sevdiklərinlə bərabərsən!" deyə buyurdu." Ənəs belə demişdir: "İslamdan sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O halda sən sevdiklərinlə bərabərsən» sözündən daha çox heç bir şeyə sevinmədik." Ənes belə demişdir: "Mən də Allah ilə Elçisini və Əbu Bəkirlə, Öməri sevirəm! Onların etdiyi əməli etməsəm də, onlarla bərabər olmağı arzulayıram."

## On beşinci fəsil: Allah Təala bir qulunu sevərsə, başqa bəndələrinə də sevdirər.

18-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Allah təala bir bəndəsini sevərsə, Cəbraili (Ona allahın salmı olsun.) çağırar və ona: "Mən filankəsi sevirəm , səndə onu sev!" deyər. Və Cəbrail onu sevər. Sonra səmada çağıraraq belə byurar: "Allah Təala filankəsi sevir , siz də onu sevin!" Və səma əhli onu sevər. Sonra yer üzündə onunu üçün qəbul buyurular. Yox əgər Allah təala bir bəndəsinə nifrət edərsə, Cəbraili (Ona allahın salmı olsun.) çağırar və ona: "Mən filankəsə nifrət edirəm , sən də ona nifrət et!" deyər. Və Cəbrail ona nifrət edər. Sonra səmada çağıraraq belə byurar: "Allah Təala filankəsə nifrət edir, siz də ona nifrət edin!" Və Səma əhli ona nifrət edər. Sonra yer üzündə onun üçün nifrət buyurular." (Müslim /2637).

## On altıncı fəsil: Ruhlar də toplu ordudur.

19-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəql edərək belə rəvayət edir: “İnsanlar gümüş və qızıl mədənləri kimi mədənlərdir. Cahiliyyə dövründə xeyirli olanları dində fəqih (dərk etmək) olmaq şərti ilə İslamda da xeyirlilərdir. Ruhlar də toplu ordudur. Onlardan bir-birləriylə tanış olanlar qaynaşar , tanışmayanlar ayrılarlar." (Müslim / 2638).

## On yeddinci fəsil: Mömin mömin üçün bir-birinə parçim olan bir bina kimidir.

20-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmişdur: " Mömin mömin üçün bir-birinə parçim olan bir bina kimidir." (Müslim /2585).

## On səkkizinci fəsil: Möminlər (biribirinə qarşı) mərhəmətdə, (şəfqətli) davranışda bir cəsəd kimidir.

21-Ən-Noman İbn Bişr (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşsur: "Möminlər biribirinə qarşı səxvətdə, mərhəmətdə, və (şəfqətli) davranışda bir cəsəd kimidir. Bədənin bir üzvü ağradıqda, cəsədin sair yerləri qızdırma və yuxusuzluqla ona.cavab verərər." (Müslim / 2586).

## Ondoqquzuncu fəsil: Müsəlman müsəlmanın qardaşıdır ona zülm etməz, onu alçaltmaz (köməksiz qoymaz).

22-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir-birinizə həsəd etməyin! Müştəri (qiyməti qaldırmaq üçün) qızışdırmayın! Bir-birinizə nifrət etməyin! Bir-birinizə arxa çevirməyin! Biriniz digərinin bazarlığı üzərinə satmasın! Ey Allahın qulları , qardaş olun! Müsəlman müslümamn qardqşıdır. Ona zülm etməz; onu köməksiz qoymaz, onu tahqir etməz. Uc dəfə ürəyinə işarə ederek: "Taqva buradadır. Kişiyə şərdən payı olması üçün müsəlman qardaşını tahqir etməsi kifayətdir. Müslümamn qanı, malı və namusu başqa müsəlmana haramdır."

23-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Allah Taəala sizin surətinizə və malınıza baxmaz. Lakin sizin qəlbləriniz və əmələrinizə baxar."

## İyirminci fəsil: Bəndənin eybini örtmək.

24-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Allah Təala bu dünyada bir qulunun günahını örtərsə, Qiyamət günüdə də onun eybini örtər."

25-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Bir bəndə başqa bir bəndəni eybini bu dünyada örtərsə, qiyamət günü Allah təala onun da eybini örtər."

## İyirmi birinci fəsil: Oturduğun insaların (yoldaşlarının) şəfaəti.

26-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına ehtiyaçı olan biri gəldiyi zaman, yanında oturanlara çevrilərək: "Şəfaət edin! Əcr qazanın! Allah Təala da Peyğəmbərinin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dili ilə sevdiyini hökm etsin! "(Müslim / 2678).

## İyirmi ikinci fəsil: Salaeh yoldaşın misalı haqda.

27-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Saleh yoldaşla pis yoldaşın misalı misk (ətir) daşiyanla, körük üfürənin misalı kimidir. Misk (ətir) daşıyan ya sənə (ondan) verər , yaxud ondan satın alarsan , yaxud da o miskindən gözəl bir qoxu duyarsan. Körük üfürən isə, ya sənin paltarını yandırar, yaxud ondan pis bir qoxu duyarsan." (Müslim / 2628).

## İyirmi üçüncü fəsil: Qonşu ilə yaxşı münasibətdə olmağa tövsiyyə.

28-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: " Cəbrail mənə qonşum haqda o qədər tövsiyyə etdi ki, mən onun ona mirasdan pay verəcəyini zənn etdim!" (Müslim / 2624).

## İyirmi dördüncü fəsil: Qonşularla yaxşı davranmaq haqda.

29-Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: "Mənim xəlilim mənə belə vəsiyyət etmişdir: "Yemək bişirdiyində suyunu çox et, sonra qonşunun ailəsi üçün bax və onlara bişirdiyindən yaxşılıqla ver.! " (Müslim / 2625).

30-Əbu Zər (Allah ondan razı olsun) belə rəvayət edir: "Yaxşı işlərdən heç bir şeyi az hesab etmə! Hətta qardaşının üzünə təbəssüm etmək olsa belə." (Müslim / 2626).

## İyirmi beşinci fəsil: Yumuşaq davranmaq haqda.

31-Cərir (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: " Yumuşaq davranmaqdan məhrum olan , xeyirdən məhrumdur." (Müslim /2592).

32-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Şübhəsiz ki, yumşaq davranmaq bir şeydə olarsa, onu bəzədər, bir şeydən də alınarsa, onu ləkələr."

## İyirmi altıncı fəsil: Allah Təala rifqi (yumuşaqlığı) sevir.

33-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Ey Aişə , Allah təala Rafiqdir və rifqi (yumuşaqlıq) sevər. Yumuşaqlığa (qarşılıq olaraq) şiddət və başqasına vermədiyini verərər." (Müslim / 2593).

## İyirmi yeddinci fəsil: təkkəbürlük edənin əzabı haqda.

34-Əbu Səid əl-Xudri (Allah ondan razı olsun)və Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ İzzət onun izarı, təkkəbbürlük isə onun ridasıdır. Bunda mənimələ mübahisəyə çıxmaq istəyənə əzab verərəm." (Müslim 2620).

35-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Üç sinif insan vardır ki, Qiyamət günündə Allah onlarla danışmaz. Onları təzkiyə də etməz. (Əbu Müaviyyə belə demişdir: "və onlara baxmaz.") onlar üçün ağrıdıcı bir əzab vardır." Bunlar: "Zina edən qoca, yalançı hökmüdar və təkəbbürlük edən kasıbdır."

## İyirmi səkkizinci fəsil: Allahın adından danışan haqda.

36-Cundub (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " Bir kişi belə dedi: "Allaha and olsun ki , Allah Təala filankəsi bağışlamayacaq." Allah Taəla isə belə buyurdu: "Filankəsi bağışlamayacağam deyə Mənim adımdan danışan kimdir?! Mən artıq filankəsi bağışladım və sənin əməlini puç etdim." Və ya onun dediyi kimi." (Müslim / 2621).

## İyirmi doqquzuncu fəsil: Yumşaq Davranmaq və fahişliyindən qorxulan kimsə haqda.

37- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: “ Bir kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına girmək üçün izn istədi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ona icazə verin" deyə Tayfanın oğulu nə pisdir. Yaxud bu tayfanın adamı nə pisdir!" buyurdu. Kişi onun yanına girincə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onunla yumşaq danışdı." Aişə belə demişdir: " Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Ey Allahın Elçisi , onun haqqında söylədiyini söylədin. Sonra onunla yumşaq danışdın?! " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Aişə! Şübhəsiz ki, qiyamət günündə Allah nəznində insanların ən pis dərəcəli olanı insanların (onun) fahişliyindən qorxaraq onu itirdiyi , yaxud tərk etdiyi kimsədir." (Müslim / 2591).

## Otuzuncu fəsil: Əff etmək haqda.

38-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sədəqə maldan heç bir şey əksiltməz. Əhv səbəbiylə Allah bir qulun ancaq şərəfini artırar. Və bir kimsə Allah üçün təvazökarlıq göstərərsə , Allah onu ancaq yüksəldər." (Müslim /2588).

## Otuz birinci fəsil: " Qəzəblənərkən nəfsinə hakim olan kəs haqda.

39-Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Aranızda ər-Raqub kimə deyərsiniz?" deyə soruşdu. Biz: "Uşağı doğulmayana!" deyə cavabını verdik. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "ər-Raqub bu deyil. Lakin ər-Raqub uşaqlarından heç birini (özündən əvvəl axirətə) gondermeyendir." Sonra O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Aranızda pəhləvan kimə deyərsiniz?" deyə soruşdu. Biz: "Onu kişilərin məğlub edə bilmədiyi kimsəyə!" deyə cabab verdik. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: " O deyil. Lakin pəhləvan qəzəb anında özünə hakim olan kimsədir." (Müslim / 2608).

## Otuz ikinci fəsil: Qəzəb anında Allah sığınmaq.

40-Süleyman İbn Surad (Allah ondan razı olsun) belə rəvayət edir: "İki kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) huzurunda söyüşdülər. Biri qəzəbləndi və üzü qızarmağa başladı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona baxaraq: "Mən bir söz bilirəm ki, onu söyləmiş olsa , bu hal ondan gedər. (Bu söz): "Qovulmuş şeytandan Allaha sığınaram. (sözüdür)" deyə buyurdu. Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dinləyənlərdən biri qalxaraq o adamın yanna getdi və ona: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) az öncə nə dediyini bilirsənmi? Mən bir söz bilirəm ki, onu söyləmiş olsa , bu hal ondan gedər. (Bu söz): "Qovulmuş şeytandan Allaha sığınaram. (sözüdür)." deyə söylədikdə, kişi ona belə dedi: "məni dəli görürsən?"

## Otuz dördüncü fəsil: İnsan malik ola bilməyəcək bir şekilde yaradılmışdır.

41-Ənəs ibn Malik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Allah cənnətdə Adəmə surət verdiyi vaxt, onu dilədiyi qədər tərk etdi. Bunun üzərinə İblis onun nə olduğunu görmək üçün ətrafında gəzməyə başladı. Onu içi boş görüncə bildi ki, o malik ola bilməyəcək bir şekilde yaradılmışdır."

Otuz dördüncü fəsil: Yaxşılıq və günah haqda.

42-ən-Navvas İbn Saman (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Mədinədə bir il qaldım. Hicrət etməyimə yalnız  sual soruşmağım mane olurdu. Bizlərən kim isə hicrət etdikdə, Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç nə souşmazdı. Mən ondan yaxşılıq və günah haqda soruşdum. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Yaxşılıq gözəl əxlaq, günah isə nəfsini qıcıqlandıran və insanların bilməsini bəyənmədiyin şeydir." (Müslim / 2553).

Otuz beşinci fəsil:  Yoldan əziyyət verən şeyi qaldıran haqda.

43-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Bir kişi yolda olan bir ağac budağının yanından keçdikdə, belə dedi: "Allaha and olsun ki, mən müsəlmanlara əziyyət verməməsi üçün onu yoldan yox edəcəyəm!" Bu səbəblə də cənnətə daxil edildi." (Müslim / 1914).

44-Əbu Burza (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Ey Allahın Elçisi , mənə faydalanacağım bir şey öyrət! "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Müsəlmanların yolarının üzərindən əziyyət edən şeyləri götür!" (Müslim / 2618).

Otuz altıncı fəsil: Müsəlmanın (ayağına ) batan tikan və başına gələn bəlalar haqda.

45-əl-Əsvad (Allah ondan razı olsun) belə rəvayət edir: " Qureyşin cavanlarından bir dəstə Aişə (Allah ondan razı olsun) Minada ikən gülə -gülə yanına daxil oldular." Onlardan: "sizi güldürən nədir?" deyə soruşdu. Onlar: "Filankəs çadır ipinin üzərinə yıxıldı. Az qaldı boynu və yaxud gözü getsin" deyə cavab verdilər. Aişə (Allah ondan razı olsun) belə buyurdu: "Gülməyin , mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Elə bir müsəlman yoxdur ki , ona bir tikan və ya daha böyük bir şey (üz verdikdə) batdıqda, onunla ona yüksək dərəcə yazılıb, onun günahları silinməsin!"

Otuz yeddinci fəsil: Möminin başına gələn hüzn və xəstəliklər haqda.

46-Əbu Səid əl Xudri və Əbu Hüreyrə (Allah onlardan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişlər: "Möminin başına bir məşəqqət, bir xəstəlik, bir hüzn, hətta onu üzən bir kədər gəlirsə, onunla günahlarından bəzisi silinər." (Müslim / 2573).

47-Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: “Bu ayə nazil olduqda: "Pislik edən şəxs, onun cəzasını görəcək." Müsəlmanlara çox şiddətli təsir etmişdi. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Orta yolu tutun və doğrunu axtarın! Müsləmanın başına

gələn hər müsibətdə bir kəffarə vardır. Hətta bədənindən sıyrılan hər sıyrıqda və ya batan hər tikanda belə!"

Otuz səkkizinci fəsil: Həsəd aparmağın, nifrət etməyin və arxa çevirməyin qadağan olması haqda.

48-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Həsəd aparmayın, nifrət etməyin və arxa çevirməyin! Ey Alaahın bəndələri, qardaş olun! Müsəlman olan kəsə qardaşı ilə üç gündən artıq küsülü qalmaq haramdır."

Otuz doqquzuncu fəsil: Onların ən xeyirlisi salama birinci başlayandır.

49-Əbu Eyyub əl-Ənsari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Müsəlman olan kəsə qardaşı ilə üç gecədən artıq küsülü qalmaq haramdır. Qarşılaşdıqa bu üz çevirdikdə digəri də üz çevirər. Onların ən xeyirlisi salama birinci başlayandır." (Müslim / 2560).

Qırxıncı fəsil: Düşmənçiliyin və bir-birini (danışdırmağı) tərk etməyin qadağan olması.

50-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Həftənin ikinci (miladi ilə birinci) və beşinci (miladi ilə cümə axşamı) günü cənnətin qapıları açılır və Allaha şərik qoşmayan hər bir bəndə bağışlanır. Bundan yalnız aralarında düşmənçilik olan iki kişi müstəsna olunur. Və: "Bunları barışana kimi gözlədin!", "Bunları barışana kimi gözlədin!", "Bunları barışana kimi gözlədin!" deyə buyurular." (müslim 2563).

Qırx birinci fəsil: Cəsusluq, münafəsə (bir şeyin yalnız onun olmasını istəmək) və zənn etməyin qadağan olması.

51-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Zənndən çəkinin! Çünki zənn sözün ən yalanıdır. Başqalarının danışığını dinləməyin! Cəssuluq və münəfəsə etməyin! Həsəd aparmayın! Nifrət etməyin! arxa çevirməyin! Allahın bəndələri , qardaş olun!" (Müslim / 2563).

Qırx ikinci fəsil: Şeyrtanın namaz qılanların arasında aldatma xüsusunda səyy göstərməsi.

52-Cəbir (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Şeytan Ərəb yarımadasında namaz qılanların ona ibadət etməsinden ümidini kəsmişdir. Lakin aralarında aldatma barəsində səyy göstəməkdədir." (Müslim / 2812).

Qirx üçüncü fəsil: Hər bir insanla şeytan vardır.

53-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gecə onun yanından çıxdı.

Mən (Aişə) onu qısqandım. Gəldiyində nə etdiyimi gördü və: "Ey Aişə, (Allah ondan razı olsun)  sənə nə olub? Qısqandın?" deyə soruşdu. Mən: "Niyə də olmasın, mənim kimisi sənin kimi bir şəxsi qısqanmasın" dedim. Bunun üzərinə Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun). «Sənə şeytanınmı gəldi?» dedi. Mən:- "Ey Allahın Elçisi! Mənimlə birlikdə şeytanım var?" deyə soruşdum. O: «Bəli!» dedi. Mən "Və hər insanla birlikdə?" dedim. «Bəli!» cavabını verdi. Mən: "Səninlə dəmi , Ey Allahın Elçisi?" dedim. O: «Bəli! Lakin Rəbbim onun haqqında mənə kömək etdi, ta ki müsluman oldu.» dedi.

## Qırx dördüncü fəsil: Qeybət etməyin qadağan olması.

54- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Qeybətin nə olduğunu bilirsinizmi?" Onlar: "Allah və Elçisi bilər " deyə cavab verdikdə, belə buyurdu: " Qardaşını xoşlanmadığı bir şeylə zikr etməndir." Onlar: "Əgər qardaşımda dediyim şeylər varsa necə?" deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə  buyurdu: " Əgər dediyin onda varsa , artıq qeybət etdin. Yox əgər yoxdursa , onda ona böhtan atdın!"

## Qırx beşinci fəsil: Soz gəzdirənlik haqda.

55- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: " Muhamməd (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə demişdir: "Diqqət edin, sizə əl-Ədhin (yalançı) nə olduğunu söyləyimmi?  O insanlar arasında söz gəzdirəndir." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Şübhəsiz ki, kişi doğru söyləməkdə davam edərək nəhayət doğruçu yazılar. Və yalan danışmaqda davam edərək nəhayət yalançı yazılar." (Müslim / 2606).

## Qırx altıncı fəsil:  Yalançı (böhtançı, şərçi) Cənnətə girməz.

56- Həmmam ibn əl-Həris belə rəvayət edir: "Hüzeyfə (Allah ondan razı olsun) ilə birgə məsciddə idik. Bir kişi gəldi və yanımıza oyurdu. Hüzeyfəyə: "Bu , Sultana bəzi şeyləri çatdırır " deyildikdə, Hüzeyfə (Allah ondan razı olsun) ona eşitdirməyi qəsd edərək belə buyurdu: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deyərkən eşitdim: " Yalançı (böhtançı, şərçi) Cənnətə girməz." (Müslim / 105).

## Qırx yeddinci fəsil: İkiüzlülük haqda.

57- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İnsanları əsl olaraq taparsınız. Onların cahiliyyət dövründə xeyirli olanları , anlayış göstərmək şərti ilə İslamda da xeyirlilərdir. Bu işdə insanların ən xeyirlilərindən bəzilərini içinə girməzdən əvvəl, ondan ən çox xoşlanmayanlar olduğunu taparsınız. İnsanların ən pislərindən bəzılərini bir üzlə onlara, bir üzlə də bunlara gələn ikiüzlünü taparsınız." (Müslim / 2526).

## Qırx doqquzuncu fəsil: Sidq və yalan haqda.

58- Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Düzgünlüyə

iltizam edin! Çünki düzgünlük xeyirə aparar. Xeyir isə cənnətə aparar. Kişi doğru söyləyib, doğruluğu axtararsa , nəhayət , Allah qatında doğruçu (sadiq) yazılar. Yalandan çəkinin! Çünki yalan pozğunluğa aparar. Şübhəsiz pozğunluq da cəhənnəmə aparar. Adam yalan danışıb, yalanı axtararsa , nəhayət , Allah yanında yalançı yazılar." (Müslim / 2607).

## Əllinci fəsil: Hansı hallrda yalanın caiz olması.

59-Uqba İbn Əbu Mueytin qızı Ummu Külsümdən (Allah ondan razı olsun) belə rəvayət olunur: "-Bu qadın Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) beyət edən ilk mühacirlərdəndir.- O (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişdir: "İnsanların arasını düzəldən və xeyir söyləyib , xeyir təbliğ edən kimsə  yalançı deyil." İbni Şihab belə demişdir: "́Üç şey müstəsna olmaqla insanların söylədiklərindən heç bir şeydə yalana izn verildiyini eşitmədim. Hərbdə, insanların arası düzəltmək, ərin arvadına və arvadının ərinə söylədiklərində." Başqqa bir rəvayətdə isə belə deyilir: "Ummu Külsüm belə buyurmuşdur: " Təkcə üç şey müstəsna olmaq şərti ilə insanların danışıqları şeylərdə yanana izn verildiyini eşitmədim." (Müslim / 2605).

## Əlli birinci fəsil:  Cahilliyə dövrünün (adətlərinə) işlərinə dəvət etməyin (çağırmağın) qadağan olması.

60-Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: " döyüşlərin birində  Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə idik. Mühacirlərdən bir adam Ənsardan birinin araxsına (əli və ya ox ilə) vurdu. Ənsarlardan olan kişi: "Yetişin , ey ənsarlar!" deyə, Mühacir kişi isə: "Yetişin , ey mühacirlər!" deyə çağırmağa başladı. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bu cahiliyyet iddiası nədir?" deyə soruşdu. Səhabələr: " Mühacirlərdən bir adam Ənsardan birinin araxsına (əli və ya ox ilə) vurdu " deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu iddianı buraxın! Çünki o iylənmiş bir şeydir." Abdullah İbn Übey bu dəvəti eşitdi və belə dedi: "Allah and olsun ki , onlar bunu eşitdilər.Əgər Mədinəyə qayıtsaq, ən güclülər (ən şərəflilər – münafiqlər) ən zəifləri (ən fəqirləri )  əlbəttə, oradan çıxardacağıq!" Ömər: "Mənə icazə ver də , bu münafiqin boynunu vurum!" dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: "Burax onu! İnsanlar: "Məhəmməd səhabələrini öldürür." deyə danışmasınlar." (Müslim / 2584).

## Əlli ikinci fəsil: Söyüş söyməyin qadağan olması.

61-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Söyüşən iki adamın söylədiklərinin günahı, məzlum olan təcavüz etmədikcə başlayana aiddir"

## Əlli üçüncü fəsil: Zəmanəni söyməyin qadağan olması.

62-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Allah Taəla belə buyurdu: "Adəm oğlu mənə əziyyət edir: "Vay zəmanənin musibətinə!" deyir. Sizdən biriniz əsla: "Vay zəmanənin müsibətinə!" deməsin. Çünkü zəmanə mənəm, gecəsini gündüzünü çevirərəm, dilədiyim zaman ikisini də tutaram!"

63-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Zəmanəni söyməyin! çünki zəmanə ancaq Allahdır." (Müslim / 2246).

## Əlli dördüncü fəsil: Kişinin qardaşına (tərəf) silah ilə işarə etməsinin qadağan olması haqda.

64-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Sizlərdən biriniz qardaşına silah ilə işarə etməsin! Çünkü o bilmədən Şeytan əlindən çıxarar və bu səbəblə atəşdən bir çuxura düşər." (Müslim / 2617).

## Əlli beşinci fəsil: Məsciddə ikən oxların (nizənin) ucun tutmaq.

65-Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Məsciddə ox sədəqə edən bir adama onları uclarından tutmadan məscidə soxmamasını əmr etdi." (Müslim/2614).

66-Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Biriniz əlində ox olduğu halda bir məclisdən və ya bazar yerindən keçərsə, onların uclarından tutsun! Sonra onların uclarından tutsun! Sonra onların uclarından tutsun! " Ravi belə demişdir: "Əbu Musa belə buyurmuşdur: Allaha and olsun ki, biz onları bir-birimizin üzünə doğrultmadan ölmədik." (Müslim / 2615).

## Əli altıncı fəsil: Üzə vurmağın qadağan olması.

67-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz qardaşı ilə dalaşarsa üzündən vurmasın!" (Müslim / 2612).

68-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Sizlərdən biriniz qardaşı ilə dalaşarsa , üzündən vurmaqdan çəkinsin. Çünki Allah təala Adəmi öz surətində yaratmışdır." (Müslim / 2612).

## Əlli yeddinci fəsil: Heyvanlara lənət etmək və bunun (aqibətinin) şiddətli olması haqda.

69-İmran İbn Huseyn (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərlərinin birində ikən Ənsar qadınlardan biri dişi bir dəvəsinin üzərində gedirdi. Bezdiyində dəvəyə lənət etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu eşitdikdə belə buyurdu: "Onun üzərində olanı götürün və onu buraxın! Çünkü o lənətlənmişdir." Mən sanki hələdə onun insanlar arasında dolaşdığını görür kimiyəm, heç kim ona (dəvəyə) yaxınlaşmırdı."

## Əlli səkkizinci fəsil: Kişinin Lənətçi olamsının bəyənilməməsi.

70-Əbu Dərda (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Lənətçilər qityamət günü nə şahid, nə də səfaətçilərdən olmayacaqlar." (Müslim / 2598).

71-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deyildiyini rəvayət edir: “Ey Allahın Elçisi,

müşriklərin əleyhinə dua et!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən lənətçi olaraq göndərilmədim. Mən rəhmət olaraq göndərildim." (Müslim / 2599).

### Əlli doqquzuncu fəsil: "İnsanlar həlak oldu." deyən haqda.

72-Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Əgər bəndə: "İnsanlar həlak oldu "deyərsə, o , onların ən həlak olanıdır. " Əbu İshaq (O Muhamd İbn Sufyanın oğludur) belə demişdir: "Birmirəm "Əhləkəhum" (yəni: "hələak etdi") yaxud: "Əhləkuhum! (yəni: "Hələk olanı") dedi." (Müslim / 2623).

### Altımışncı fəsil: İfrata varanlar həlak oldu.

73-Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " İfrata varanlar həlak oldu." (Müslim / 2670).

### Altımış birinci fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) möminlərin əleyhinə olan duasının onlar üçün rəhmət və zəkat olması haqda.

74-Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına iki kişi daxil oldu. Onunla bilmirəm nəsə bir şey haqda danışdılar və onu qəzəbləndirdilər. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara lənət edərək onları söydü. Çıxdıqlarında mən Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ey Allahın Elçisi , bu iki adamın qazandığı xeyirdən kim bir şey qazana bilir?" deyə söylədim. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Nə üçün (deyirsən)?" deyə soruşduqda, mən: "Sən onlara lənət etdin , söydün!" deyə cavab verdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buurdu: "Sən mənim Rəbbimə dediyim şərti bilmirsənmi? Belə dedim: "Allahım! Mən ancaq bir bəndəyəm, müsəlmanlardan hansına lənət etsəm və ya söysəm , bunu onun üçün bir zəkat və əcr et!"

75-Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Ümmü Süleymin yanında yetim bir qız vardı. Ümmü Süleym Ənəsin anasıdır. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu yetim qızı görərək: "Bu sənsənmi? Həqiqətən böyümüsən! Yaşın böyüməsin!" dedi. Bunun üzərinə yetim qız ağlayaraq Ümmü Süleymin yanına döndü. Ümmü Süleym: " Ey qızcığazım , sənə nə oldu? " deyə ondan soruşdu. Kəniz: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: "yaşın böyüməsin!" deyə əleyhimə dua etdi. İndi arttıq mənim yaşım əbədi olaraq böyüməyəcək. Yaxud ömrüm uzanmayacaq!" deyə cavab verdi. Ummu Süleym tələsik baş örtüsünü sarıyaraq dərhal çıxdı. Nəhayət , Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qarşılaşdı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Nə var , ey Ummu Süleym?" deyə soruşdu. O: "Ey Allahın Elçisi , sən mənim yetim qzımın əleyhinə dua etdin?" deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Nəyə görə belə deyirsən?" deyə soruşdu. Ummu Süleym belə cavab verdi: "O iddia edir ki , sən ona: "Yaşın böyüməsin!" Yaxud: "Ömrün uzanmasın!" deyə dua etmitsən. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) güldü. Sonra isə belə buyurdu: "Ey Ummu Süleym! Bilmirsənmi ki, mənim Rəbbimə dediyim şərtim vardır. Mən Rəbbimə şərt qoyaraq

belə dedim: "Mən ancaq bir bəşərəm. Bəşərin razı olduğu kimi razı olur, bəşərin qəzəbləndiyi kimi qəzəblənirəm.Ümmətimdən hər hansı birinin əleyhinə o onun əhlindən olmadığı halda dua etsəm, bunu onun üçün bir təmizlik suyu, bir zəkat və qıyamət günündə onu sənə yaxınlaşdıracaq bir əməl qıl!" Əbu Main belə demişdir: "Hədisin üç yerində də: "yetimcik" sözü kiçilmə formasında gəlmişdir."

76- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Oğlan uşaqları ilə oynayırdım. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldi və mən qapının arxasında gizləndim. O əlinin içi ilə çiyinləriimin arasına yavaşca vurdu və: "Get mənim üçün Müaviyyəni çağır!" dedi. Mən gəlib ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O yemək yeyir " dedim. Sonra o (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə: " Get mənim üçün Müaviyyəni çağır!" deyə buyurdu. Mən yenə gəlib ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O yemək yeyir" deyə cavab verdikdə, belə buyurdu: "Allah onun qarnını doyurmasın!" İbn əl Musənnə belə demişdir: "Umeyyədən "Hattani" nə deməkdir?" deyə soruşdum. O belə dedi: "Əlinin içi ilə məni vurdu " deməkdir."

# Zülm kitabı

### Birinci fəsil: Zülmün haram olması və tövbə və bağışlanma diləmənin əmri haqda.

1- Əbu Zər (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Rəbbindən rəvayət etdiyi hədisi belə rəvayət edir: "O (Allah Təal) buyurur: "Mən zülmü özümə haram etmişəm. Onu sizin aranızda da haram etdim. Buna görə də bir-birinizə zülm etməyin! Ey bəndələrim! Hamınız zəlalətdəsiniz, yalnız mənim hidayətə çatdırdığım müstəsna! Məndən hidayət diləyin ki, sizi hidayətə çatdırım. Ey bəndələrim! Hamınız açsınız! Yalnız mənim doyurduqlarım müstəsna. Məndən yemək istəyin ki, sizi doyurum. Ey bəndələrim! Hamınız çılpaqsınız, yalnız mənim geydirdiklərim müstəsna! Bu halda məndən geyəcək istəyin ki, sizi geyindirim. Ey bəndələrim! Siz gecə-gündüz günah işləyirsiniz. Bütün günahları bağışlayan da mənəm. Bu halda məndən bağışlanama istəyin ki, sizi bağışlayım! Ey qullarım! Sizin mənə zərər verməyə , əlbəttə , gücünüz çatmaz ki, zərər verəsiniz. Mənə fayda verməyə də gücünüz çatmaz ki, fayda verəsiniz. Ey bəndələrim! Sizin əvvəliniz , axırınız, insanınız , cininiz , sizdən ən təqva sahibi bir adamın ürəyi kimi olsalar, bu mənim mülkümə bir şey artırmaz. Ey bəndələrim! Sizin əvvəliniz ,axırınız və insanınız , cininiz ən pozğun bir adamın ürəyi kimi olsalar, bu mənim mülkümdən bir şey əksiltməz. Ey bəndələrim! Sizin əvvəliniz , axırınız və insanınız , cininiz bir torpağın üzərində ayağa qalxaraq məndən istəsələr, mən də hər insana dilədiyini versəm, bu məndə olandan ancaq iynənin dənizə batırıldığı vaxt (onun suyundan) azaltdığı qədər azaldar. Ey bəndələrim! Bunlar ancaq sizin əməllərinizdir. Onları sizin üçün sayıram. Sonra onların qarşılığını sizə tam verəcəyəm. Hər kim xeyir tapsa , Allaha həmd etsin! Xeyirdən başqa bir şey tapan yalnız özünü tənbeh etsin!" Səid belə demişdir: " Əbu İdris əl-Xovləni bu hədisi rəvayət etdiyi vaxt dizlərinin üzərinə çökərdi." (Müslim / 2578).

2- Cabir İbn Abdullah (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “ Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Zülmdən çəkinin! Çünki zülm qiyamət günündə qaranlıqlar olacaqdır. Xəsislikdən çəkinin! Çünki xəsislik sizdən əvvəlkiləri həlak etmiş, onları bir-birlərinin qanlarını tökməyə, haramlarını halal saymağa vadar etmişdir."

3- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: “Müsəlman müsəlmanın qardaşıdır. Ona zülm etməz, onu təhlükəyə atmaz. Bir kimsə din qardaşının ehtiyacını ödərsə, Allah da onun ehtiyacını ödər. Hər kim bir müsəlmanın bir çətinliyini aradan qaldırarsa, onun səbəiylə Allah Təala qiyamət günü onun sıxıntılarından birini aradan qaldırar. Və hər kim bir müsəlmanın (eybini) örtətsə qiyamət günündə də Allah onu (eybini) örtər." (Müslim / 2580).

## İkinci fəsil: Zalıma möhlət haqda.

4- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "Şübhəsiz ki, Allah Təala zalıma möhlət vermişdir. Lakin onu tutarsa , bir də buraxmaz. Sonra isə bu ayəni oxudu: "Rəbbin zülmkar məmləkətləri əzabla yaxalayanda belə yaxalayar. Onun cəzası, doğrudan da, ağrılı-acılıdır, şıddətlidir." (Müslim / 2583).

## Üçüncü fəsil: Qardaşın zalım olsa da, məzlum olsa da, kömək et!

5- Cabir ibn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Biri mühacirlərdən, digəri ənsardan iki uşaq döyüşdülər. Bunun üzərinə mühacir yaxud mühacirlərdən bir: "Yetişin , ey mühacirlər!" , Ənsari də: "yetişin , ey ənsarlar!" deyə səsləndilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çıxaraq: "Bu cahiliyyət əhlinin iddiası nədir belə?" deyə soruşdu. Səhabələr: "bir şey yoxdur ,ey Allahın Elçisi , sadəcə iki uşaq döyüşdülər və biri digərinin arxasına (əli və ya oxla) vurdu " deyə cavab verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O halda zərəri yoxdur Qardaşın zalım olsa da, məzlum olsa da , kömək et! Zalımsa ona mane olsun. Çünki bu onun üçün bir yardımdır. Məzluma isə kömək et!" (Müslim / 2584).

## Dördüncü fəsil: İnsanlara əzab verənlər haqda.

6- Urva ibn Zubeyr Hişam İbn Həkim ibn Hizamdan belə rəvayət edir: " Şamda bir sıra insanların yanından keçdi. Onları günəşin altında saxlamış , başlarının üzərinə də zeytun yağı tökmüşdülər. O: "Bu nədir?" deyə soruşdu. Ona: "Vergi üçün əzab olunurlar!" deyildikə, belə buyurdu: "Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişəm: "Şübhəsiz ki, Allah dünyada insanlara əzab edənlərə əzab verəcək." (Müslim / 2613).

## Beşinci fəsil: Ağlayara daxil olmaq müstəsna olmaqla nəfslərininə zülm etmişlərin məskənlərinə daxil olmayın!

7- İbn Şihab Səmud qövmünün məskənlərini xatırlayaq belə rəvayət edir: "Səlim İbn Abdullah belə demişdir: "Abdullah İbn Ömər (Allah onların hər ikisndən razı olsun) belə buyurmuşdur: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə Hıcr əshabının məskənin yanından keçdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə: "Ağlayara daxil olmaq müstəsna olmaqla. Onların başlarına gələn sizin başınıza gəlməsin deyə , nəfslərininə zülm etmişlərin məskənlərinə daxil olmayın! " Sonra heyvanını sürdü və sürətlə gedərək o yeri arxasında buraxdı." (Müslim / 2980).

## Altıncı fəsil: əzab verimişlərin quyularından su çəkmək gaqda.

8- Abdullah İbn Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: " İnsanlar Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Səmud qövmünün məskənlərindəki yerə gəldilrər və onların quyularından su götürdülər. Sonra ondan xəmir yoğurdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara götürdükləri suyu tökməyi, xəmiri heyvanlara yem etməyi və dişi dəvələrin içdiyi yerdən su götürmələrini əmr etdi." (Müslim / 2981).

Yeddinci fəsil: Qisas və Qiyamət günü haqların ödənilməsi haqda.

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “ Müflisin kim olduğunu bilirsinizmi?" Onlar: "Bizdə müflis dinarı və əşyası olmayan kimsədir " dedilər. Bunun üzərinə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən , mənim ümmətimdən müflis, qiyamət günündə namaz, oruc və zəkatla gələcək olan kimsədir. Lakin bunu söymüş, bunu zinada ittihan etmiş, bunun malını yemiş, bunun qanını tökmüş, digərini də döymüş olaraq gələcək. Və onun savabından buna veriləcək. Sonra onun savabından buna veriləcək. Əğər hesabı bitmədən (görülmədən) savabı bitərsə, onların günahlarından alınaraq bunun üzərinə yüklənəcək, sonra cəhənnəmə atılacaq."

10- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: “Qiyamət günündə haqqları mütləq sahiblərinə verəcəksiniz. Hətta buynuzsuz qoyun üçün buynuzlu qoyundan qisas alınacaq." (Müslim / 2582).

# Qədər kitabı.

Birinci fəsil:Uca Allahın "Şübhəsiz ki, Biz hər şeyi müəyyən ölçüdə də (lazım olduğu qədər) yaratdıq" ayəsi haqqında.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) rəvayət edir ki, Qüreyşın müşrikləri Rəsulullahın (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib onunla qədər haqqında mübahisə edirdılər. Bu zaman bu ayələr nazil oldu. "O gün onlar üzüstə Cəhənnəmə sürüklənəcək (və onlara): "Duyun Cəhənnəmin (aləmini) təmasını!" (deyiləcəkdir). " Şübhəsiz ki, Biz hər şeyi müəyyən ölçüdə (lazım olduğu qədər) yaratdıq."

İkinci fəsil: Hər bir şey qədərlədir. Hətta acizlik və gözüaçıq olmaq da.

2- Tavus belə rəvayət edir: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)"Hər şey bir qədərə görədir" deyən səhabələrini gördüm və Abdullah ibn Ömərin (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə rəvayət etdiyini eşitdim: "Hər bir şey qədərlədir. Hətta acizlik və gözüaçıqlıq" ya da "gözüaçıq və acizlik.".

Üçüncü fəsil:qüvətli olmaq və acizliyi tərk etməyin əmr olunması haqda.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Allah üçün güclü mömin zəif mömindən daha yaxşı və daha sevimlidir. Onların hər birinin öz xeyri var. Sənə fayda verən şeylərə həris ol, Allahdan kömək dilə və aciz olma. Başına bir iş gəlsə , demə ki, əgər belə-belə etsəydim....(belə olardı). De ki: "Qadərullahi va mə şəə fəalə" Bu, Allahın qədəridir, O nəyi istədi onu da etdi. "Əgər" sözü şeytan əməli üçün yol açır".

Dördüncü fəsil: Yaratmamışdan əvvəl qədərləri yazdı.

4- Abdullah ibn Amr ibn əl-Ass (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Allah məxluqatın (qəza və qədərini) göyləri və yeri yaratmamışdan əlli min il əvvəl yazmışdır və onun ərşi suyun üzərindədir".

Beşinci Fəsil: Qədərin isbatı və Adəmlə Musanın mübahisəsi.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Adəm ilə Musa Allahın yanında mübahisə etdilər. Adəm Musaya qələbə çaldı. Musa dedi: "Sən o Adəmsən ki, Allah səni öz əli ilə yaratdı. Sənə öz ruhundan üfürdü. Mələkləri sənə səcdə etdirdi. Və səni öz cənnətində sakin etdi. Sonra etdiyin günahın səbəbi ilə insanları yer üzərinə endirdin." Adəm isə ona: " Sən, Allahın Öz risaləsi və kəlamı ilə ixtiyar etdiyi Musasan və sənə işində hər şeyin bəyanı olan lövhələri verdi və səni sirdaş olaraq özünə yaxınlaşdırdı. Tövratı Allahın məni yaratamazdan neçə il əvvəl yazdığına rast gəldınmi? " deyə söylədikdə, Musa belə buyurdu: "Qırx il (əvvəl)." Adəm ondan: "Onda: "Adəm Rəbbinə asi oldu və yoldan çıxdı" (ayəsinə) rast gəldinmi? " deyə söylədi. Musa: "Bəli!" cavabını verdi. Adəm belə buyurdu: "İndi də məni yaratmazdan qırx il əvvəl qədərimə yazılmış işi etdiyimə görə qınayırsan?!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Adəm Musaya qalib gəldi." deyə buyurdu."

Altıncı Fəsil: Qədərlərin keçməsi və Allah Təalanın bu ayəsi haqqında "And olsun nəfsə və onu yaradıb biçim verənə! Ona günahlarını və təqvasını təlqin edənə!

6- Əbu əl-Əsvəd əd-Diəliyy, İmran ibn Hüseynın (Allah onların hər ikisindən razı olsun) ona belə dediyini rəvayət edir. "İnsanların bu gün işləyib özlərini yorduqları şeyin nə olduğunu bilirsənmi?! Onların taleləri, barələrində verilmiş olan qərardan, yoxsa gələcəkdə onları gözləyən və öz təsdiqini tapmış Peyğəmbərlərinin (Ona Allahın salavatı və salamı olsun!) xəbərlərindən ibarətdir?" Mən belə cavab verdim: "Əksinə! Onlar barəsində bir qərar verilmişdir". O dedi: "Bu, zülm ola bilərmi?" Onun bu sözlərindən mən bərk diksindim və ona dedim: "Yaradılanların hamısını Allah yaratmışdır və hər şey onun ixtiyarındadır. O, etdiyinə görə sorğu-suala çəkilməz. Ancaq insanlar əməllərinə görə sorğu-suala çəkilərlər". İmran ibn Huseyn dedi: "Allah sənə rəhm etsin! Mən bunları səndən sadəcə ağlını yoxlamaq üçün soruşdum. Belə ki, Muzeynə qəbiləsindən iki nəfər gəlib Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə soruşmuşdu: "Ey Allahın Elçisi, insanların nə uğrunda işləyib özlərini yorduqlarını görürsünüzmü? Bu, barələrində artıq qərar verilmiş olan, yoxsa peyğəmbərlərinin (Ona Allahın salavatı və salamı olsun!) onlara xəbər verdiyi və öz təsdiqini tapmış olan şeylərdir?" Peyğəmbər (Ona Allahın salavatı və salamı olsun!) buyurdu: "Xeyr! Onlar barəsində artıq qərar verilib!" Allah təalanın kitabında bunu təsdiq edən ayə

var: "And olsun nəfsə və onu yaradana (ona biçim verənə) Sonra da ona günahlarını və pis əməllərdən çəkinməsini (xeyir və şəri) öyrədənə ki".

## Yeddinci fəsil: Qədər, Xöşbəxtlik və bədbəxtlik.

7- Əli (Allah ondan razı olsun) belə rəvayət edir: "Bəqi əl-Ğərqəddə bir cənazədə idik.Allahın Elçisi bizim yanımıza gəlidi və oturdu.Biz də onun ətrafında oturduq. Onun əlində bir ağac parçası vardı. Başını əyib onunla yeri cızmağa başladı.Sonra isə dedi: "Sizdən hər bir kəsin və yaradılmışlardan hər bir nəfsın şübhəsiz ki, Cənnətdəki və Cəhənnəmdəki yerini Allah yazmış (təqdir və təyin) etmişdir. Hər kəsin xoşbəxt və ya bədbəxt olduğu şübhəsiz ki, yazılmışdır". Səhabələrdən biri: "Ya Allahın Elçisi! "Bizə yazılan üzrə dayanaraq əməli buraxmayaqmı?" deyə soruşdiqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Xoşbəxt olanlardan olan kimsə, xoşbəxt kimsələrin əməli ilə əməl edəcəkdir. Bədbəxt olanlar da, bədbəxt olan kimsələrin əməli ilə əməl ediləcəkdir. Əməl edin !Hər kəs nə üçün yaradılıbsa , o da onun üçün asanlaşdırılacaqdır. Xoşbəxt olan kimsələrə, xoşbəxt olan kimsələrin əməlini etmək asanlaşdırılacaqdır. Bədbəxt olan kimsələrə də, bədbəxt olan kimsələrin əməlini etmək asanlaşdırılacaqdır". Sonra bu ayəni oxudu: "Kim (malını Allah yolunda) versə, (Allahdan) qorxsa və ən gözəl sözü təsdiq etsə , biz ona Cənnəti müyəssər edəcəyik. Amma kim (malını Allah yolunda xərcləməyə) xəsislik etsə, (mal-dövlətinə güvənib Allaha) möhtac olmadığını sansa və ən gözəl sözü yalan saysa biz ona ən çətin olanı (Cəhənnəmi) müyəssər edəcəyik (onu Cəhənnəm üçün hazırlayacağıq!)"

## Səkkizinci fəsil: Əməllərin sonu haqqında.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən elə bir kimsə vardır ki, uzun zaman Cənnət əhlinin əməlini edər. Lakin sonra onun bu əməli Cəhənnəm əhlinin əməli ilə son olub möhürlənər. Kimisi də uzun zaman Cəhənnəm əhlinin əməlini edər. Lakin sonra onun bu əməli Cənnət əhlinin əməli ilə son olub möhürlənər".

## Doqquzuncu fəsil: Ruzilərin bölünməsi və əcəllərin müəyyən edilməsi.

9- Abdullah ibn Məsud (Allah ondan razı osu) Ummu Həbibənin belə dediyini rəvayət edir. Allahım! Mənə zövcəm Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun), atam Əbu Süfyan və qardaşım Müaviyə ilə fayda ver! Bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə buyurdu: Sən Allahdan dəqiqləşmiş əcəllərə, sayılmış günlərə və bölünmüş ruzilər haqqında bəzi tələblər etdin ki, Allah onlardan heç birini nə vaxtından əvvələ alar, nə də sonraya buraxar! Əgər, Allahdan səni Cəhənnəmdəki əzabdan və qəbirdəki əzabdan qurtarmasını istəsəydin , sənin üçün daha xeyrli olardı." Bu zaman bir adam: "Ey Allahın Elçisi, bu meymunlar və donuzlar, şəkli dəyişdirilmiş insanlardandırmı?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə cavab verdi: "Həqiqətən, Allah Təala bir qövmü həlak etdisə, yaxud bir qövmə əzab verdisə, onlar üçün nəsil yaratmamışdır. Meymunlar və donuzlar bundan əvvəl də vardı".

## Onuncu fəsil: Məxluqatın yaradılışı və bədbəxt və xöşbəxt olması haqda.

10- Abdullah ibn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Doğru sözlü və doğruluğu təsdiq olunan Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə belə buyurdu: "Sizdən hər birinizin yaradılışı anasının bətnində qırx gündə toplanır. Sonra o qədər müddətdə (ikinci qırx gündə) aləqa (laxtalanmış qan) olur. Sonra o qədər müddətdə (üçüncü qırx gündə) müdğa (çeynənilmiş ət parçası kimi) olur. Sonra Allah bir mələk göndərir. Və (mələk ) ona ruh üfürdükdən sonra dörd şeyi: "Ruzisini, əcəlini, əməlini, bədbəxt və ya xöşbəxt olacağını" yazmaq əmr olunur. Ondan başqa heç bir haqq ilah olmayan Allaha and olsun ki, sizlərdən biri Cənnət əhlinin əməli ilə əməl edər və onunla Cənnət arasında bir arşınlıq məsafə qalarkən, kitab (oradakı qədər) onun əlehinə irəli keçər , o da cəhənnəm əhlinin əməli ilə əməl edib Cəhənnəmə düşər. Həmçinin sizdən biri Cəhənnəm əhlinin əməli ilə əməl edər və onunla Cəhənnəm arasında bir arşınlıq məsafə qalarkən kitab (oradakı qədər) onun lehinə irəli keçər , o da Cənnət əhlinin əməli ilə əməl edib Cənnətə düşər".

11- Hüzeyfə ibn Əsid Peyğəmbərdən nəql etdiyi hədisi belə rəvayət edir: "Nütfə (məni, sperma) rəhmdə (ana bətni) qırx yaxud qırx beş gecə qərar tutduqdan sonra mələk daxil olaraq: "Ey Rəbb (bu) bədbəxt yoxsa xöşbəxt olacaq? " deyə soruşar. Bunlar yazılar. Və o deyər : "Ey Rəbbim! Oğlan yoxsa qız olacaq? " Bunlar da yazılar. Və onun əməli, əsəri (izi) əcəli və ruzisi yazılar. Sonra səhifələr bükülər. Ora heç nə artırılmaz və heç nə də azaldılmaz".

12- Amir ibn Vasilə Abdullah ibn Məsuddan (Allah ondan razı olsun) belə eşitdiyini rəvayət edir: "Bədbəxt , anasının bətnində bədbəxt olandır. Xöşbəxt isə başqasından ibrət götürəndir. O, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən Hüzeyfə (Allah ondan razı olsun) adlı bir səhabənin yanına gəldi və bunu İbni Məsudun sözü olaraq ona danışdı. Hüzeyfə (Allah ondan razı olsun) belə buyurdu: "Necə ola bilər ki , adam, heç bir iş işləmədən (hələ anasının qarnında) bədbəxt ola bilər? " Bu şəxs ona: "Buna niyə təəccüblənirsən? Həqiqətən mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim. Nütfənin (ana rəhminə girdiyi andan) qırx iki gecə keçəndə, Allah nütfəyə bir mələk göndərir. Mələk ona şəkil verir, göz qulaq verir, dərisini, ətini və sümüklərini meydana gətirir. Sonra: "Ya Rəbb oğlan, yoxsa qız olsun?" soruşur. Rəbbin də istədiyini hökm edir, mələk də yazır. Sonra: "Ya Rəbb, ömrü nə qədər olsun?" deyə soruşur. Rəbbin istədiyini hökm edir, mələk yazır. Sonra:Ya Rəbb, ruzisi?" deyir. Rəbbin istədiyini hökm edir, mələk yazır. Sonra əlindəki səhifə ilə, əmr olunduğuna bir şey əlavə etmədən və bir şey əksiltmədən çıxır." Başqa bir rəvayətdə isə belə deyilir: " Tam (sağlam) ya yarımçıq (şikəst) olacaq? Və Allah təala onu ya Tam (sağlam) ya da yarımçıq (şikəst) edəcəkdir."

### On birinci fəsil:Adəm övladına zinadan olan nəsibini yazdı.

13- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Adəm oğlunun zinadan bir nəsibi vardır. Heç şübhəsiz ki, o buna mütləq düşəcəkdir. Gözlərin zinası baxmaqdır. Qulaqların zinası dinləməkdir. Dilin zinası danışmaqdır. Əlin zinası tutmaqdır. Ayağın zinası addımlamaqdır. Qəlb isə arzu və təmənna edir. Övrət yeri ya bunu təsdiq ya da inkar edəcəkdir".

### On ikinci fəsil: Allah Təalanın qəlbləri istədiyi kimi çevirməsi.

14- Abdullah ibn Amr ibn əl-As (Allah onların hər ikisindən razı olsun) Allahın Elçisindən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Həqiqətən, Adəm övladının hamısının qəlbi tək bir qəlb

kimi Ər-Rəhmanın barmaqlarının ikisi arasındadır. Onu necə istəyər, elə də çevirər" . Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahım, sən qəlbləri çevirənsən! Bizim qəlblərimizi sənə itaət etməyə yönəlt".

On üçüncü fəsil: Hər kəs fitrət üzərində doğulur.

15- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər kəs fitrət üzərində doğulur. Valideyinləri isə onu ya yəhudi, ya nəsrani (xristian) ya da məcusi (atəşpərəst) edər. Necə ki,bir heyvanın, sağlam doğurması kimi. Siz heç belə doğan bir heyvanda kəsik orqan görə bilirsiniz?".Sonra Əbu Hüreyrə belə buyurdu: "İstəsəyirsinizsə (bu ayəni) ouyun: "Üzünü Allahın fitri olaraq insanlara verdiyi dinə (islama) tərəf tut. Allahın dinini heç vəchlə dəyişdirmək olmaz."

On dördüncü fəsil: Müşriklərin uşaqları haqda.

16- İbni Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Allahın Elçisindən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müşriklərin uşaqları haqqında soruşuldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allah onları yaratdığı vaxt onların nə edəcəklərini biləndir."

On beşindsi fəsil: Xıdırın öldürdüyü uşaq haqqında.

17- Ubeyy ibn Kəab (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Xıdırın öldürdüyü uşaq, kafir olaraq təbiətləndirilmişdi. Yaşasaydı, anasına və atasına azğınlıq və küfrlə zülm edəcəkdi."

On altıncı fəsil: Uşaq ikən ölən kəslər və atalarının belində ikən Cənnət və Cəhənnəm əhlinin xəlq olunması haqda.

18- Möminlərin anası Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarlardan balaca bir uşağın cənazəsinə çağrıldı. Mən: "Ey Allahın Elçisi! O nə xoşbəxdir! O, Cənnət sərçələrindən bir sərçədir. Pislik etmədi və pislik etmək yaşına da çatmadı" dedim. Peyğəmbər: "Sən bilmirsən ki, Allah Cənnət üçün bir əhali yaratmışdır. Onlar atalarının bellərində ikən Allah onları Cənnət üçün yaratmışdır. Allah Cəhənnəm üçün də elə bir əhali yaratmışdır. Onlar da atalarının bellərində ikən Allah onları Cəhənnəm üçün yaratmışdır."

# Elm kitabı

Birinci fəsil: Elmin qaldırılması və cahilliyin zühur etməsi.

1- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Mən sizə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyim hədisi danışımmı? Məndən sonra onu sizə heç kim ondan eşidib danışmayacaq! Buyurmuşdur: "Elmin qaldırılması,cahilliyin zühur etməsi, zinanın

artması, içkinin içilməsi,kişlərin gedib, qadınların qalması, hətta əlli qadının bir ağası (başçısı) olması qiyamətin əlamətlərindəndir"

### İkinci fəsil: Elmin alınması (qaldırılması götürülməsi).

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Zaman yaxınlaşacaq, elm alınacaq(qaldırılacaq), fitnələr zühur edəcək, xəsislik (qəlblərdə) yerləşəcək və əl-Hərc çoxalacaq". Səhabələr : "əl-Hərc nədir? deyə soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Qətldir" deyə cavab verdi.

### Üçüncü fəsil: Alimləri götürməklə elmin qaldırılması.

3- Abdullah İbn Amr İbn əl-As (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Həqiqətən Allah elmi insanlardan çəkib götürməz. Lakin elmi, alimləri götürməklə (öldürməklə) qaldırar. Alimsiz qalan insanlar isə özlərinə biliksiz başçılar seçərlər. Onlardan soruşarlar, onlar isə elmsiz fitva verərlər. Nəticədə özlərini də, başqalarını da düz yoldan azdırarlar."

### Dördüncü fəsil: Kim islamda yaxşı və ya pis yol açarsa (qoyarsa).

4- Cərir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Bədəvilərdən bəzi insanlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldilər. Onların üzərlərində yun paltarlar var idi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların hallarının pis olduğunu, ehtiyac içində qaldıqlarını gördükdə insanları onlara sədəqə verməyə təşviq etdi. Lakin insanlar gecikdilər. Bu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzündə hiss olundu Sonra Ənsardan biri bir kisə gümüş gətirdi. Sonra bir başqası gəldi. Sonra səhabələr bir-birinin arxasından gəldilər. Nəhayət Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzündən onun sevindiyi hiss olundu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bir kəs İslamda gözəl bir yol açsa, (qoysa) özündən sonra onunla əməl edilsə, o kəsə bu yolla əməl edənlərin əcri qədər savab yazılar. Əməl edənlərin əcrlərindən də bir şey əksilməz. Və hər kim islamda pis bir yol açsa özündən sonra onunla əməl olunsa, o kimsənin əleyhinə bu yolla əməl edənlərin günahı qədər günah yazılar. Əməl edənlərin günahlarından da bir şey əksilməz".

### Beşinci fəsil: Kim doğru yola və ya zəlalətə çağırarsa.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir kimsə doğru bir yola dəvət etsə, ona tabe olanların əcrləri qədər əcr olar. Bu, tabe olanların əcrindən bir şey əksiltməz. Və hər kim bir zəlalətə dəvət etsə ona tabe olanların günahları qədər günahı olar. Bu, tabe olanların günahlarından heç bir şey əksiltməz."

### Altıncı fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) adından yalan danışmaqdan çəkinmək və Quranı yazanlar haqda.

6- -Əbu Səid əl-Xudri Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Məndən bir şey yazmayın! Hər kim Qurandan başqa məndən bir şey yazarsa, onu dərhal silsin. Məndən hədis rəvayət edin, zərəri yoxdur! Lakin kim mənim adımdan (Həmmam belə demişdir: "Zənn edirəm ki: "qəsdən" dedi.) yalan danışarsa, cəhənnəmdəki yerinə hazır olsun!"
7- Əl- Muğirə İbn Şöbə (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Mənim adımdan yalan danışmaq başqa birinin adından yalan danışmaq kimi deyil. Kim mənim adımdan qəsdən yalan danışarsa cəhənnəmdəki yerinə hazır olsun!"
8- Səmuratə İbn Cundub və əl- Muğirə İbn Şöbə (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edirlər: "Mənim adımdan yalan olduğunu bilə-bilə bir hədis danışan yalançılardan biridir."

# Dua kitabı.

Birinci fəsil: Allah Təalanın adları və onları sayan haqda.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təalənin doxsan doqquz adı vardır. Kim onları sayarsa cənnətə daxil olar. O təkdir və (işlərin) təki(ni) sevir"

Birinci fəsil: Peyğəmbərin(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)duası.

2- Fərvatə İbn Novfəl əl-Əşcai belə rəvayət edir: "Aişədən (Allah ondan razı osun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Rəbbinə necə dua etdiyi haqqında soruşdum" Aişə (Allah ondan razı osun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini söylədi: "Allahummə inni əuzu bikə min şərri mə amiltu va min şərri mə ləm əməl" (Allahım! Etdiyim və etmədiyim əməllərin şərindən Sənə sığınıram)."
3- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allahummə ləkə əsləmtu va bikə əməntu va əleykə təvəkkəltu va ileykə ənəbtu va bikə xasamtu. Allahummə inni əuzu bi izzətikə lə iləhə illə əntə ən tudilləni əntəl heyyulləzi lə yəmutu val cinnu val insu yəmutun" (Allahım! Sənə təslim oldum, Sənə iman gətirdim, Sənə təvəkkül etdim, Sənə qayıtdım, insanlarla Sənin adını tutub mübahisə edirəm. Allahım! Zəlalətə düşməkdən sənin izzətinə sığınıram. Səndən başqa (İbadətə layiq olan) məbud yoxdur .Sən ölməyən, Əbədisən. Cinlər və insanlar isə öləndir)."
4- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərdə olduğu zaman səhərə yaxın belə dua edərdi: "Səmmə'a (səmmi'a) samiun bihəmdilləhi, və husni bəlaihi aleynə. Rabbənə sahİbnə və afdıl aleynə aizən billəhi minən nər .(Üzərimizə olan gözəl sınağından dolayı Allaha etdiyimiz həmdi eşidən eşitdi (və ya eşitdirdi). Oddan Allaha sığınaraq (deyirəm:) Ey Rəbbimiz! Bizə yoldaş ol (qoru) və bizə mərhəmət et!")."
5- Əbu Musa əl-Əşari (Allah ondan razı olsun) "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu dua ilə dua etdiyini rəvayət edir:

"Allahummə-ğfirli xatiəti va cəhli va israfi fi əmri va mə əntə ələmu bi minni. Allahummə - ğfirli həzli va cəddi va xatai va amdi va kullu zəlikə indi.Allahummə-ğfir liy mə qaddəmtu, və mə əxxartu, və mə əsrartu, və mə ə'ləntu, və mə əntə ə'ləmu bihi minniy. Əntəl-muqaddimu, və əntəl-muəxxiru, və əntə alə kulli şeyin qadir".(Allahım! Günahımı, cahilliyimi, etdiyim israfı və bilməyib etdiklərimi - yalnız Sən hər şeyi bilənsən-bağışla. Allahım, zarafatla, ciddi, bilməyərək və bilərəkdən etdiyim səhflərə görə məni bağışla! Bunların hamısının məndə olması mümkündür! Allahım! Əvvəl etdiyim və sonra edəcəyim, gizlin saxladığım və üzə çıxardığım, və məndən daha yaxşı bildiyin (pis) əməllərimi bağışla! Əvvələ çəkən də Sənsən, təxirə salan da Sənsən. Və sən hər şeyə qadirsən)."

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allahummə əslih li diniyəlləzi huva ismətu əmri va əslih li dunyəyəlləti fiyhə məaşi va əslih li axirətil ləti fiyhə məadi vacəlil həyatə ziyədətən li fi kulli xeyr vacəlil məvtə rahətən li min kulli şərr" (Allahım! Xoşbəxtliyimin zəmanəti olan dinimi təkmilləşdir, yaşayışımın əsası olan dünyamı sahmana sal, qayıdış yerim olan axirətimi yaxşılaşdır. Həyatı mənim üçün hər bir xeyir işdə artım və ölümü mənim üçün hər bir şər işdən qurtuluş et!)."

7- Abdullah İbn Məsud Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə dediyini rəvayət edir: "Allahummə inni əsələkəl-hudə vat-tuqa val-afəfə val-ğinə"(Allahım! Səndən hidayət, Allah qorxusu, iffətli və zəngin olmağı diləyirəm)."

8- Ziyad İbn Ərqam belə rəvayət edir: "Mən sizə yalnız Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dediyi kimi deyirəm. O belə buyurardı: "Allahummə inni əuzu bikə minəl-aczi val-kəsəli val-cubni val-buxli val-hərami va azəbil-qabri. Allahummə əti nəfsi təqvəhə va zəkkihə əntə xayru mən zəkkəhə əntə vəliyyuhə va məvləhə. Allahummə inni əuzu bikə min ilmin lə yənfə‘ va min qalbin lə yəxşə‘ va min nəfsin lə təşbə‘ va min dəavətin lə yustəcəbu ləhə" (Allahım! Acizlikdən, tənbəllikdən, qorxaqlıqdan, paxıllıqdan, qocalıq dərdindən və qəbr əzabından Sənə sığınıram. Allahım! Nəfsimi təqvalı et və onu təmizə çıxar! Sən onu təmizə çıxaranların ən xeyirlisisən. Sən nəfsimin qəyyumu və hamisisən! Allahım! Faydasız elmdən, təslim olmayan qəlbdən, doymaz nəfsdən və eşidilməyən duadan Sənə sığınıram)."

## İkinci fəsil:Allahım! Məni bağışla, mənə rəhm et, mənə salamatlıq ver, mənə ruzi yetir duası.

9- Əbu Məlik əl-Əşcai belə rəvayət edir: "Atası Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dinləyərkən bir adam gələrək: Ya Peyğəmbər! Rəbbimdən bir şey istəyəcəyim zaman necə dua edim? deyə soruşdu. Peyğəmbər(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deməyini buyurdu: " Allahumməğfir liy, vərhəmniy, və afiniy, vərzuqniy" (Allahım! Məni bağışla, mənə rəhm et, mənə salamatlıq ver, mənə ruzi yetir). Və baş barmağından başqa qalan barmaqlarını yığdı və: "Bu sözlər sənin həm dünya, həm də axirət üçün istəməyin lazım olan şeyləri toplayar" deyə buyurdu."

## Üçüncü fəsil: Ey Rəbbimiz, bizə dünyada da, axirətdə də gözəl nemətlər ver, bizi cəhənnəm əzabından qoru!" duası.

10- Əbd əl-Əziz (O İbn Suheybdir) belə rəvayət edir: "Qətədə Ənəsdən: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hansı dua ilə daha çox dua edərdi?" deyə soruşdu. O, belə cavab verdi: "Ən çox bu şəkildə dua edərdi.

"Rəbbənə ətinə fid dunyə həsənətən va fil əxirəti həsənətən va qinə azəbən nər". (Ey Rəbbimiz, bizə dünyada da, axirətdə də gözəl nemətlər ver, bizi cəhənnəm əzabından qoru!). Qətədə belə demişdir: "Ənəs, qısa dua etmək istədiyi zaman bu sözlərlə dua edərdi. Daha uzun dua etmək istədiyi zaman isə (digər duaların) içərisində bu duanı da oxuyardı"

## Dördüncü fəsil: Hidayət və müvəffəq olunmaq (diləmək) üçün dua etmək.

11- Əli (Allah ondan razı olsun) rəvayət edir ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə deməyini buyurdu: "Allahummə ihdini va səddidni (Allahım! Mənə hidayət ver! Məni doğruya müvəffəq et ! Və (duanda) hidayət (dedikdə): "düz yola hidayət olunmağını, müvvəffəq (dedikdə): "oxun (nişangaha) müvəffəq olmağını" zikr et!"

## Beşinci fəsil: Etdiyi yaxşı əməllərlə dua etmək.

12- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Üç adam yolla gedərkən onları yağış tutdu və dağda bir mağaraya sığındılar. Bu zaman dağdan bir qaya parçası qopdu və mağaranın ağzını örtdü. Onlar bir-birinə belə dedilər: "Allah üçün etdiyiniz yaxşı əməli düşünün. onunla Allaha dua edin, ola bilsin ki, Allah sizi xilas etdi. Onlardan biri belə dedi: "Allahım! Mənim yaşlı qoca ana-atamla, bir xanımım və bir də kiçik uşağım vardı. Onlara yaxşı baxardım. Heyvanlarımı onların yanlarına gətirdiyim zaman süd sağıb, uşaqlarımdan əvvəl anamla atamdan başlayaraq onlara süd içirərdim. Bir gün odun yığmaq məni uzaqlara apardı. Axşama kimi ailəmin yanına gələ bilmədim. Gəldiyimdə anamla atamı yatmış halda gördüm. Hər gün sağdığım kimi südü sağıb içərisində süd olan qabı gətirdim və onları yuxudan oyandırmaq istəməyərək onların başlarının yanında durdum. Onlardan əvvəl uşaqlara süd içirməyi istəmirdim. Halbuki uşaqlar ayaqlarımın yanında aclıqdan qışqırırdılar. Mənim və uşaqların halı, şəfəq doğulana qədər belə davam etdi. Əgər bunu sənin (razılığın) üçün etdiyimi bilirsənsə, bu qayadan bizim üçün bir az aç ki, oradan səmanı görək" Bu zama Allah Təala, qayanı bir az araladı və oradan göy üzünü gördülər. O biri isə belə dedi: "Allahım! Mənim bir əmim qızı vardı. Mən onu kişilərin qadınları sevdikləri sevginin ən son dərəcəsiylə sevmişdim. Ondan nəfsini (mənə tabe etməsini) tələb etdim. Amma o, ona yüz dinar gətirmədikcə bunu qəbul etmədi. Mən bu pulu toplamaq üçün yoruldum. Nəhayət yüz dinarla onun yanına gəldim. Ayaqlarının arasına oturduğum zaman belə dedi: "Ey Allahın qulu! Allahdan qorx! Bu subaylıq möhrünü, haqqı ilə (yalnız ev lənməklə) aç" Bu zaman onun üzərindən qalxdım. Əgər bunu sənin (razılığın) üçün etdiyimi bilirsənsə, bu qayadan bizim üçün bir az aç! Və onlar üçün qaya bir miqdarınıda açıldı. Digəri isə belə dedi: "Allahım! Mən bir Faraq (üç Saa miqdarında olan qab) düyü qarşılığında bir işçi tutmuşdum. İşini bitirdiyi zaman: "Mənə haqqımı ver!" dedi. Mən də ona haqqı olan Faraqı verdim. O da bunu qəbul etmədi. Mən o işçiyə vermək istədiyim düyüsünü əkməyə davam etdim. Nəhayət o düyünün gəliri ilə bir çox inək və çoban əldə etdim. Bu zaman o işçi yanıma gəldi və Mənə: "Allahdan qorx! Mənim bu haqqıma zülm etmə!" dedi. Mən də: "O inəklərin və çobanların yanına get və onları götür!" dedikdə, O mənə belə dedi: "Allahdan qorx! Məni ələ salma!" Mən ona: "Səni ələ salmıram. Bu inəkləri və çobanları götür!" dedim. Bu vaxtı o işçi onları götürüb apardı. Əgər bunu sənin (razılığın) üçün etdiyimi bilirsənsə, bu qayadan bizim üçün bir az aç! Bu zaman Allah, qayanın qalan hissəsini də araladı."

## Altıncı fəsil: Sıxıntı anında oxunan dua

13- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Sıxıntı anında belə dediyini rəvayət edir: "Lə ilahə illəllahul-aziymul-həliym lə ilahə illəllahu Rabbul-arşil-aziym, lə ilahə illəllahu Rabbus-səməvati bə Rabbul-ardı və Rabbul-arşil-kəriym) "Əzəmətli, Həlim olan Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur! Ərşin Əzəmətli Rəbbi olan Allahdan başqa (İbadətə layiq olan) məbud yoxdur! Göylərin, yerin və Ərşin Səxavətli Rəbbi olan Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur!"

## Yeddinci fəsil: Qul tələsmədikcə duası qəbul olmaqda davam edər.

14- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qul tələsmədən, günah və qohumluq əlaqələrinin kəsilməsi üçün dua etdikcə diləyi qəbul olmaqda davam edər." Ondan: "Ey Allahın Elçisi, tələsmək nədir?deyə soruşuldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "(Qul) Deyər: Çoxlu dua etdim lakin qəbulunu görmədim. O zaman bezər və duanı tərk edər".

## Səkkizinci fəsil: Duada qətiyyətlik və "istəsən" deməməsi

15- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizdən biriniz heç vaxt : "Allahım, istəsən məni bağışla! Allahım, istəsən mənə rəhmət et!" deməsin. Duada qətiyyətlik göstərsin. Çünki Allah istədiyini edəndir. Onu məcbur edəcək yoxdur"

## Doqquzuncu fəsil: Gecədə bir saat vardır ki,o vaxtda dua qəbul olunur.

16- Cabir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən gecədə elə bir saat vardır ki, müsəlman bir kəs, dünya və axirət işləri barəsində Allahdan bir xeyir istəyərkən duası o vaxta müvəffəq olarasa, Allah o kəsə istədiyini verər. Bu, hər gecə belədir."

## Onuncu fəsil: Gecənin son anında zikr və dua etməyə rəğbətləndirmək və O anda duanın qəbul olunması haqda.

17- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Rəbbimiz hər gecə dünya səmasına enər və gecənin axırıncı üçdə biri olduğu vaxda belə buyurar: " Mənə dua edən bir kimsə varmı onun duasını qəbul edim?! Məndən istəyən bir kimsə varmı onun dilədiyini verim?! Məndən bağışlanma diləyən bir kimsə varmı onu bağışlayım?!"

## On birinci fəsil: Xoruz banlayarkən edilən dua.

18- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Xoruzun banlamasını eşitsəniz, Allahdan Onun lütfünü diləyin. Çünki o (xoruz), mələk görmüşdür. Uzunqulağın anqırtısını eşitsəniz, şeytandan Allaha sığının. Çünki o (uzunqulaq), şeytan görmüşdür."

### On ikinci fəsil: Müsəlmana onun xəbəri olmadan gizlicə dua etmək.

19- Safvan (bu şəxs İbn Abdullah İbn Safvandır. Dərdənin anası onun nikahlısı idi) belə rəvayət edir: "Şama gəldim. Və Əbu Dərdənın evinə getdim. Onu evdə tapa bilmədim lakin Ummu Dərdəni tapdım.O məndən: "Bu il həcc etmək istəyirsən?" deyə soruşdu? Mən: "Bəli!" deyə cavab verdikdə, O belə buyurdu: "Allaha bizim üçün xeyir dilə! Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: " "Müsəlman bir kişinin öz (müsəlman) qardaşı üçün onun xəbəri olmadan gizlicə etdiyi duası qəbuldur. Onun (dua edənin) başı üzərində vəkil olunmuş bir mələk vardır ki, hər dəfə qardaşı üçün xeyir dua etdiyi zaman ona vəkil olunmuş mələk belə deyər: "Amin və sənə də onun mislində." Safvan belə demişdir: "Bazara çıxdım və bu zaman Əbu Dərdəyə rast gəldim. O da mənə onun dediyi kimi söylədi." Onu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) rəvayət edirdi."

### On üçüncü fəsil: Cəzanın bu dünyada verilməsini tələsdirmək üçün dua etməyin bəyənilməməsi.

20- Ənəs (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müsəlmanlardan zəifləmiş, cücə kimi olmuş bir adamı ziyarət etdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ondan: "Sən Allaha hər hansı bir şeylə dua edirdin və yaxud ondan bir şey istəyirdin?" deyə soruşdu? O adam belə dedi: "Bəli, mən, "Allahım! Mənə axirətdə bir cəza verəcəksənsə o cəzanı mənə dünyada ver" deyə dua edirdim". Bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Subhanallah! Sənin ona gücün çatmaz! Kaş ki Sən: "Allahummə ətinə fid-dunya həsənətən və fil-axirəti həsənətən və qinə əzaban-nar" (Allahım! bizə dünyada da, axirətdə də gözəl nemətlər ver, bizi cəhənnəm əzabından qoru!" deyə dua etsəydin!". Daha sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun üçün Allaha dua etdi və ona şəfa verildi."

### On dördüncü fəsil: Başına gələn müsibətə görə ölüm arzulamağın bəyənilməməsi və xeyirli olanı diləmək haqda.

21- Ənəs (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizdən heç bir kəs başına gələn müsibətə görə ölüm arzulamasın. Əgər ölümü mütləq arzulamaq istəyərsə, belə desin: "Allahım, əgər yaşamaq mənim üçün daha xeyirlidirsə, məni yaşat! Əgər ölüm mənim üçün daha xeyirlidirsə, məni öldür!"

22- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizdən heç biriniz ölümü arzulamasın, ölüm gəlmədən də gəlməsi üçün dua etməsin. Həqiqətən, sizdən biriniz öldüyü vaxt əməli kəsilər. Mömininin ömrü ona xeyirdən başqa bir şeyi artırmaz."

## Zikr kitabı.

### Birinci fəsil: Allahı zikr etməyə, ona yaxınlaşmağa və davamiyyətli zikrinə rəğbətləndirmək.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Uca Allah belə buyurur: "Mən qulumun barəmdəki zənni yanındayam. Məni yad etdikcə onunlayam. O Məni öz-özlüyündə yad etsə, Mən də onu Öz-Özlüyümdə yad edərəm. O Məni camaatın yanında yad etsə, Mən onu onlardan daha xeyirli camaatın (mələklərin) yanında yad edərəm. O Mənə bir qarış yaxınlaşsa, Mən ona bir dirsək yaxınlaşaram. O Mənə bir dirsək yaxınlaşsa, Mən ona bir qulac yaxınlaşaram. O Mənə doğru yeriyərək gəlsə, Mən ona doğru yüyürərək gələrəm".

İkinci fəsil: Zikirdə davamiyyətli olmaq və tərk etmək haqda.

2- Əbu Osman ən-Nəhdi, Hənzala əl-Useydiyyidən belə rəvayət edir. ( O, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) katiblərindən idi): "Mən Əbu Bəkrlə (Allah ondan razı olsun) rastlaşdım. O: "Ey Hənzələ, necəsən? Deyə soruşduqda, belə cavab verdim: "Hənzələ münafıqlik edir!". O: "Sübhanallah! Sən nə deyirsən?" deyə buyurdu. Mən belə dedim: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında oluruq. Bizə cənnəti, cəhənnəmi o qədər xatırladır ki, sanki onu gözlərimizlə görürük. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanından çıxdıqdan sonra isə xanımlarımızla, uşaqlarımızla, dolanışığımızla bağlı problemlərlə məşğul oluruq. Hər şeyi unuduruq". Əbu Bəkr : "Vallahi, biz də belə şeylərlə qarşılaşırıq" deyə buyurdu. Əbu Bəkrlə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdik. Mən: "Hənzələ münafiq oldu, Ey Allahın elçisi!" dedim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Nə oldu?" deyə soruşdu. Mən: "Ey Allahın elçisi! Sənin yanında oluruq. Bizə cənnəti və cəhənnəmi xatırladırsan. Sanki onu gözlərimizlə görmüş kimi oluruq. Sənin yanından çıxdığımız zaman isə xanımlarımızla, uşaqlarımızla və dolanışıq problemləriylə məşğul oluruq. Çox şeyi unuduruq" . Bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Nəfsim əlində olan Allaha and içirəm ki, siz mənim yanımda olduğunuzdakı halı yaşamağa və məni zikr etməyə davam etsəniz, mələklər sizinlə musafaha edərlər(əl verib görüşərlər). Lakin ey Hənzələ! Bəzən belə, bəzən də elə" buyurdu və bunu üç dəfə təkrarladı.

Üşüncü fəsil: Allahın kitabını oxumaq üçün toplanmaq.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyi rəvayət edir: " Kim bir müsəlmanın dünya kədərlərindən bir kədərini aradan qaldırarsa Allah onun axirət günü kədərlərindən bir kədərini aradan qaldıracaqdır. Və kim bir kasıb borcluya asanlıq göstərərsə, Allah ona dünyada və axirətdə asanlıq göstərəcəkdir. Kim bir müsəlmanı örtərsə Allah onu dünya və axirətdə örtəcəkdir. Qul, (din) qardaşının köməyində olduğu müddətdə Allah da onun köməkçisidir. Kim bir yola gedərək orada elm axtararsa, bu səbəblə Allah ona Cənnətə bir yolu asanlaşdıracaqdır. Allahın evlərindən birinə toplanıb Quran oxuyaraq onu bir-birlərinə öyrədən hər camaatın üzərinə iç sakitliyi və rahatlığı enər, ilahi rəhmət onları bürüyər, mələklər onların əhatə edərlər.Allah onları öz yanında olanlara zikr edər. Bir kimsəni əməli yavaşladarsa nəsəbi onu sürətləndirməz."

Dördüncü fəsil:Kim Allaha zikr və ona həmd etmək üçün otursa Allah mələklərə onlarla fəxr edər.

4- Əbu Səid əl-Xudri belə rəvayət edir: Müaviyə halqa şəklində oturan səhabələrin yanına gəldi və belə dedi: "Sizi (bura) oturdan nədir?" Onlar dedilər: "Allahı zikr etmək üçün oturduq." Müaviyə belə dedi: "Allah xatirinə sizi ancaq bumu oturtdu?" Onlar belə dedilər: "Vallah bizi ancaq bu oturtdu" . Müaviyə buyurdu: "Mən sizi ittiham etdiyim üçün and içdirmədim. Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədis rəvayət etməkdə məndən aşağı mərtəbədə olan yoxdur. Həqiqətən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dairə şəklində oturan səhabələrin yanına gəldi və belə buyurdu: " Sizi (bura) oturdan nədir?" Səhabələr dedilər: "Bizə İslamı qismət edərək böyük bir lütf bağışladığına görə, Allahı zikr etmək və Ona həmd etmək üçün oturmuşuq".Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: " Allah xatirinə doğru söyləyin. Həqiqətən, siz burada ancaq Allahı zikr etmək üçün oturmusunuz?" Onlar: "Bəli, vallahi, ancaq bu məqsədlə oturmuşuq." Deyə cavab verdikdə, Allahın elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən sizi ittiham etdiyim üçün and içdirmədim. Cəbrayıl yanıma gələrək uca Allahın mələklərə sizinlə fəxr etdiyini xəbər verdi".

## Beşinci fəsil: Dua, istiğfar və Allahı zikr məclislərinin fəziləti haqda

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Uca Allahın yer üzündə səyahət edən çox mələkləri vardır. Bunlar, elm məclislərini axtararlar, zikr olan bir məclis tapdıqlarında onlarla birlikdə oturarlar və qanadlarıyla bir-birlərini dinləməyə təşviq edərlər. Hətta özləri ilə dünya səmasının arasını doldurarlar. Camaat dağıldıqda yüksələrlər və səmaya çıxarlar. Uca Allah onların nə etdiklərini çox yaxşı bildiyi halda onlara: "Haradan gəldiniz?" deyə soruşar. Onlar da: "Sənin yer üzündəki bəzi qullarının yanından gəldik. Onlar Sənə təsbeh edirlər, təkbir gətirirlər, təhlil ( La ilahə illəllah) deyirlər, Sənə həmd edirlər və Səndən istəyirlər" deyə cavab verərlər. Uca Allah: "Məndən nə istəyirlər?" deyə soruşur. Onlar: "Səndən cənnətini istəyirlər" deyərlər. Uca Allah: "Onlar, mənim cənnətimi görüblərmi?" deyər. Onlar: "Xeyr, ya Rəbb " deyə cavab verərlər. Uca Allah: "Görəsən cənnətimi görsələr, nə edərlər?" deyər. Mələklər: "Onlar Səndən aman diləyərlər" . Uca Allah: "Məndən, nədən aman diləyərlər?" deyər. Mələklər: "Sənin cəhənnəmindən, ya Rəbb " deyə cavab verərlər. Allah: "Onlar mənim cəhənnəmimi görüblərmi?" deyər. Mələklər: "Xeyr!" deyə cavab verərlər. Uca Allah: "Görəsən cəhənnəmimi görsələr, nə edərlər?" deyər. Mələklər: "Səndən bağışlama diləyərlər" deyərlər. Uca Allah: "Mən onları bağışladım, onlara bütün istədiklərini verdim, aman dilədikəri şeydən də onlara sığınacaq verdim" buyurar. Bu zaman mələklər: "Ya Rəbbi! Onların içində filankəs var, günahı çox olan quldur. O, ancaq oradan keçərkən onlarla birlikdə oturdu" deyər. Uca Allah: "Onu da bağışladım. Onlar, elə camaatdır ki, onlarla birlikdə oturan kimsə pis olmaz" buyurar."

## Altıncı fəsil: Allahı zikr edən kişi və qadınlar.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir : Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkə yolunda gedirdi. Cümdan deyilən dağın yanından keçdikeə belə buyurdu: "Gedin! Bu Cümdandır. Mufərridlər (başqalarını) keçmişdir" . Səhabələr dedilər: "Mufərridlər nədir Ey Allahın elçisi?". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Allahı çox zikr edən kişi və qadınlardır."

## Yeddinci fəsil: Təhlil (lə iləhə illallah) haqda.

7- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Allahadan başqa (ibadətə layiq olan) məbud yoxdur.O təkdir. Qoşununu izətləndirdi, quluna kömək etdi və (düşmənlərdən olan) dəstələrə tək özü qələbə çaldı. Ondan sonra heç bir şey yoxdur."

## Səkkizinci fəsil: Zikr edərkən səsi yüksəltmək haqda.

8- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə bir səfərdə idik. İnsanlar səslərini qaldıraraq təkbir etməyə başladılar. Bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey insanlar! Canınıza yazığınız gəlsin, (səsinizi yüksəltməyin). Şübhəsiz siz nə bir karı , nə də olmayan bir adamı çağırırsınız. Dua etdiyiniz Allah, şübhəsiz sizinlə bərabərdir. O sizə çox yaxındır, və sizi çox yaxşı eşidir". Əbu Musa belə buyurmuşdur: "Mən onun arxasındaydım və güc qüvvət ancaq Allaha məxsusdur." deyirdim. Bu zaman O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Ey Abdullah İbn Qeys! Sənə cənnət xəzinələrindən bir xəzinə göstərimmi?" deyə buyurdu. Mən: "Bəli Ey Allahın Elçisi!" dedim. O: "Güc və qüvvət ancaq Allaha məxsusdur, de!" deyə buyurdu.

## Doqquzuncu fəsil:Axşam düşdükdə deyilən (zikr) haqda.

9- Abdullah İbn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) axşam olduqda belə dediyini rəvayət edir: "Əmseynə və əmsəl mulku lilləh,val həmdu lilləh ,lə iləhə illəllahu vəhdəhu lə şərikə ləhu .Allahumə inni əsələkə min xeyri həzihil leyləh və xeyri mə fihə.Və əuzu bikə min şərrihə və şərri mə fihə.Allahumə inni əuzu bikə minəl kəsəl,vəl hərami, və suil kibəri və fitnətid dunyə və azəbil qabri". ( Axşamladıq , hökm də Allahın olaraq axşamladı. Allaha həmd olsun! Allahdan başqa (ibadətə layiq olan] məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Ey Rəbbim! Səndən bu gecənin xeyrini və onda olan hər şeyin xeyrini diləyirəm. Bu gecənin şərindən və onda olan hər şeyin şərindən.Sənə sığınıram. Ey Rəbbim! Tənbəllikdən, ölümdən, və pis qocalıqda, dünyanın fitnəsindən və qəbr əzabından Sənə sığınıram). (Əl-Həsən İbn Ubeydullah belə demişdir: "Zubeyd mənə əlavə olaraq İbrahim İbn Suveyddən o da Abdurrahmən İbn Yəziddən o da Abdullahdan Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nəqlən belə rəvayət etmişdir: " Allahdan başqa (İbadətə layiq olan) məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Mülk Onundur və həmd Onadır! O hər şeyə Qadirdir! Və başqa rəvayətdə belə deyilir: Sabahladıqda bunu həmçinin dedi: Sabahladıq, hökm də Allahın olaraq sabahladı."

## Onuncu fəsil: Yatmaq istədikdə və yatağa girərkən deyilən (Zikr) haqda.

10- Əli İbn Əbu Talib (Allah ondan razı olsun) belə rəvayət edir: "Fatimə(Allah ondan razı olsun) dəyirman daşı çevirməkdən əlində narahatlıq meydana gəlmişdi. O ərəfədə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əsir gətirilmişdi. Fatimə, xidmətçi istəmək üçün atasının yanına getdi. Lakin atasını tapa bilmədi. Aişə ilə rastlaşdı. Ona gəlişinin səbəbini xəbər verdi. Peyğəmbər (ona,

ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evə gəldikdə Aişə Fatımənin gəldiyini xəbər verdi. Əli (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə gəldi. Biz artıq yatağımıza girmişdik. Dərhal qalxmağa başladıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Yerlərinizdə qalın!" deyə buyurdu və aramızda oturdu. Hətta sinəmin üzərində ayağının soyuqluğunu hiss etdim. Sonra belə buyurdu: "Sizə İstədiyinizdən daha xeyirlisini öyrədimmi? Yatağınıza girdiyiniz zaman Allaha otuz dörd dəfə Təkbir, otuz üç dəfə Təsbeh, otuz üç dəfə də Təhmid edin. Bu sizin üçün xidmətçidən daha xeyirlidir"başqa rəvayətdə belə əlavə olunur: "Əli (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdikdən bəri onu tərk etmədim. Ondan "Hətta Saffeyn gecəsi də (tərk etmədinmi deyə ) soruşuldu. O belə buyurdu "Hətta Saffeyn gecəsi də (onu tərk etmədim)."

11- Əl- Bəra İbn Azib (Allah onların hər iksindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə dediyini rəvayət edir: "Yatağa uzandıqda namaz üçün dəstəmaz aldığın kimi dəstəmaz al, sonra sağ tərəfin üstə uzanıb de: "Allahummə inni əsləmtu vachi ileykə.Və fəvvadtu əmri ileykə.Və əl´cətu zahri ileykə. Rəğbətən və rəhbətən ileykə.Lə məlcə´ə valə məncə minkə illə ileyk.Əməntu bi kitabikəl ləzi ənzəltə və bi nəbiyyikəl ləzi ərsəltə. (Allahım! Sənə ümid edərək və Səndən qorxaraq mən üzümü sənə təslim etdim, işimi Sənə həvalə etdim, kürəyimi Sənə etibar etdim. Sığınacaq və Səndən (əzabından) xilas olmaq üçün nicat yeri yalnız Sənə yönəlməkdir. Sənin nazil etdiyin Kitaba və göndərdiyin Peyğəmbərə iman gətirdim!) Bunlar son sözün olsun. Əgər bunu deyib o gecə ölsən, fitrət üzərində (heç bir günahı olmadan, anadan doğulmuş uşaq kimi) ölmüş olarsan". Bəra deyir ki, mən bunları xatırlamaq üçün təkrarladım : "Göndərdiyin Rəsuluna iman etdim" dedim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Göndərdiyin Peyğəmbərinə iman etdim de!" buyurdu.

12- Əl- Bəra İbn Azib (Allah onların hər iksindən razı olsun) rəvayət edir ki,Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yatağa uzandıqda belə deyərdi: "Allahummə bi ismikə əhya və bi ismikə əmutu".(Allahım! Sənin adınla ölür və dirilirəm!) Oyandıqda isə belə deyərdi: "Əlhəmdulilləəhil-ləzi əhyəənə bə'də mə əməətənə və ileyhin-nuşuur". (Bizi öldürdükdən sonra dirildən Allaha həmd olsun və (Ölüb dirildikdən sonra isə) qayıdış Onadır)."

13- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) bir kişiyə yatağa uzandıqda belə deməyi əmr etdi. "Allahummə, innəkə xaləqtə nəfsiy, və əntə təvaffahə, ləkə məmatuhə və məhyahə, in əhyəytəhə fəhfəzhə, və in əməttəhə fəğfir ləhə. Allahummə, inniy əs'əlukəl-afiyətə" (Allahım! Canımı Sən yaratdın, Sən də onu alacaqsan. Onu öldürmək də, diriltmək də Sənə məxsusdur. Onu diriltsən, qoru, öldürsən, bağışla! Allahım! Səndən salamatlıq diləyirəm!) Kişi ona dedi: "Bunu Ömərdən eşitdin?" O dedi: " Ömərdən xeyirlisi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdim".

14- Suheyl deyir ki,Əbu Salih bizdən birimiz yatağına girdikdə sağ tərəfi üstə uzanıb belə deməyini əmr edirdi. "Allahummə, rabbəs-səmavatis-səb'i və rabbəl-arşil-azim. Rabbənə və rabbə kulli şeyin, faliqal-həbbi vən-nəva, munzilət-təvrati vəl-inciyli vəl-furqan. Əuzu bikə min şərri kulli şeyin əntə axizun binasiyətihi. Allahummə, əntəl-əvvəlu fəleysə qabləkə şeyun, və əntəl-axiru fəleysə bə'dəkə şeyun, və əntəz-zahiru fəleysə fəuqakə şeyun, və əntəl-batinu fəleysə dunəkə şeyun, iqdi annəd-deynə və əğninə minəl-fəqri". (Allahım! Səmaların Rəbbi, yerin Rəbbi, böyük Ərşin Rəbbi, bizim Rəbbimiz və hər bir şeyin Rəbbi! Toxumu və çəyirdəyi cücərdib çatladan, Tövratı, İncili və Furqanı nazil edən! Kəkilindən tutduğun (idarə etdiyin) hər bir şeyin şərindən Sənə sığınıram. Allahım! Sən Əvvəlsən, Səndən əvvəl heç nə

yoxdur. Sən Axırsan, Səndən sonra heç nə yoxdur. Sən Zahirsən, Səndən üstə heç nə yoxdur. Sən Batinsən, Səndən iç üzdə heç nə yoxdur! Borcumuzu ödə, bizi yoxsulluqdan qurtar!) O bunu Əbu Hüreyrədən o da Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) rəvayət edirdi.

15- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Sizlərdən biriniz yatağına girdiyi zaman paltarının iç ətəyi ilə yatağını çırpıb təmizləsin. Çünki o, özündən sonra yatağa nəyin girdiyini bilmir. Uzanmaq istədikdə isə sağ tərəfi üstə uzanıb desin: "Subhanəkə Allahummə rabbi bikə vəda'tu cənbiy və bikə ərfəuhu. İn əmsəktə nəfsiy fəğfir ləhə və in ərsəltəhə fəhfəzhə bimə təhfəzu bihi ibadəkəs-salihin" (Ey Allahım! Sən pak və müqəddəssən! Rəbbim! Sənin sayəndə böyrümü yerə qoydum, Sənin sayəndə də qaldıraram. Ruhumu tutub saxlasan, onu bağışla! Onu buraxsan, əməlisaleh qullarını qoruduğun kimi onu da qoru!)."

16- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yatağına girəndə belə deyərdi: "Əlhəmdulilləhil-ləzi ət'amənə və səqanə və kəfanə və əvanə, fəkəm min-mən lə kafiyə ləhu və lə mu'viyə".( Bizi yedirdən, içirdən, qoruyan və bizə sığınacaq verən Allaha həmd olsun! Neçə-neçə şəxslər vardır ki, onların nə bir qoruyanı, nə də bir sığınacaq verəni var!)."

## On birinci fəsil:Sübh namazından sonrakı təsbeh haqqında.

17- Cuveyriyyə (Allah ondan razı olsun) belə rəvayət edir Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun yanından o məsciddə ikən sübh namazını qıldıqdan sonra çıxdı. Duha vaxtı olduqdan sonra isə qayıtdı. Cuveyriyyə. halədə oturmuşdu. Ondan: "Mən sənin yanından ayrılıb getdiyim haldasan?" deyə soruşdu. Cüveyriyə: "Bəli! deyə cavab verdi." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Həqiqətən səndən ayrıldıqdan sonra üç dəfə dörd kəlmə söylədim. Əgər həmin kəlmələrlə, sənin gün boyu söylədiklərin (tərəzinin gözünə qoyulsavə ) çəksilsə, şübhəsiz ki, həmin kəlimələr onlardan ağır gələrdi. Həmin kəlmələr bunlardır: " Subhanəllahi və bihəmdihi, adədə xalqihi, və rıda nəfsihi, və zinətə arşihi, və midadə kəlimətihi" (Məxluqatının sayı və Özünün razı qalacağı qədər, Ərşinin ağırlığı və kəlmələrinin çoxluğu qədər Allaha həmd edir və Onu bütün nöqsanlardan tənzih edirəm)." Başqa bir rəvayətdə isə belədir: " Subhanəllahi, adədə xalqihi, Subhanəllahi rıda nəfsihi, Subhanəllahi zinətə arşihi, Subhanəllahi midadə kəlimətihi" (Məxluqatının sayı qədər Allahı bütün nöqsanlardan tənzih edirəm Özünün razı qalacağı qədər Allahı bütün nöqsanlardan tənzih edirəm, Ərşinin ağırlığı qədər Allahı bütün nöqsanlardan tənzih edirəm, kəlmələrinin çoxluğu qədər Allahı bütün nöqsanlardan tənzih edirəm.)"

18- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim səhər və axşam yüz dəfə (Subhanəllahi və bihəmdihi) "Allah pak və müqəddəsdir,və Ona həmd olsun!" deyərsə Qiyamət günü heç kəs onun gətirdiyindən əfzəl heç bir şey gətirə bilməz Yalnız o şəxsdən başqa ki, o bunu onun kimi və ya ondan çox demiş olsun!"

## On ikinci fəsil: Təsbih etməyin fəzilətləri haqqında.

19- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dilə yüngül, çəkidə ağır gələn və ər-Rəhmana sevimli olan kəlmə bunlardır: "Subhanə-llahi va

bihəmdihi, subhanəllahil azım" (Allah pak və müqəddəsdir və həmd Ona məxsusdur, Əzəmətli Allah pak və nöqsansızdır)."

20- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mənim üçün "Subhanəllah, vəl həmdu lilləh, va lə iləhə illəllah, vallahu əkbər"(Allah pak və nöqsansızdır, həmd Allaha məxsusdur, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, Allah hər şeydən üstündür, böyükdür – demək, Günəşin üzərinə işıq saçdığı şeydən əzizdir).

## On üçüncü fəsil: Təhlil (Lə iləhə illəllah),Təhmid (əlhəmdulilləh) və Təkbir (Allahu əkbər) haqqında.

21- Musa əl- Cuhəniy o da Musab İbn Səaddan o da atasından (Allah onlardan razı olsun) belə rəvayət edir: "Bir bədəvi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib: "Mənə bir yaxşı söz öyrət" dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə deməsini buyurdu: "Lə iləhə illəllah vahdəhu lə şərikə ləhu, Allahu əkbər kəbiran, val həmdu lilləhi kəsiran, subhanəllahi rabbil aləmin, lə havlə va lə quvvatə illə billəhil azizil hakim" (Allahdan başqa ibadətə və itaətə layiq haqq məbud yoxdur, O təkdir, şəriki yoxdur, Allah hər şeydən üstündür və böyükdür, Allahın həmdi hədsizdir, çoxdur, aləmlərin Rəbbi pak və nöqsansızdır, qüvvət ancaq Uca, Qüdrətli və Müdrik olan Allaha məxsusdur). Bədəvi ona belə dedi: "Bu sözlər Rəbbim üçündür, bəs mənim özüm üçün? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə deməsini buyurdu: "Allahummə - ğfirli varhəmni vahdini varzuqni" (Allahım, məni bağışla və mənə rəhm et, məni doğru yola yönəlt, mənə ruzi ver)."

## On dördüncü fəsil: (Subhanəllahi və bihəmdihi) Allah pak və müqəddəsdir,və Ona həmd olsun! Allaha ən sevimli olan kəlamdır.

22- Əbu Zərr (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizə Allaha olan ən sevimli kəlamı xəbər verimmi?".Mən dedim: "Ey Allahın elçisi!Bizə Allaha olan ən sevimli kəlamı xəbər ver!". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: " Subhanəllahi və bihəmdihi" (Allah pak və müqəddəsdir,və Ona həmd olsun!) Allaha ən sevimli olan kəlamdır."

## On beşinci fəsil:Gün ərzində " Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur." deyən (kimsə haqqında)

23- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim (Lə ilahə illəllah vəhdahu lə şərikə ləhu, ləhul-mulku və ləhul-həmdu və huvə alə kulli şeyin qadir) (Allahdan başqa (ibadətə layiq olan) məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur. Mülk Onundur və həmd Onadır! O hər şeyə Qadirdir!) bunları bir gündə yüz dəfə desə, bu onun üçün on qulu azad etməyə bərabər olar, ona yüz savab yazılar, onun yüz günahı silinər, axşamadək də şeytandan qorunmuş olar və (Qiyamət günü) heç kəs onun gətirdiyindən əfzəl heç bir şey gətirə bilməz. Yalnız o şəxsdən başqa ki, o bunu ondan çox etmişdir.Və kim " Subhanəllahi və bihəmdihi" (Allah pak və müqəddəsdir,və Ona həmd olsun!) gün ərzində yüz dəfə desə,onun günahları dənizin köpükləri qədər də olsa belə silinər."

### On altinci fəsil: Yüz dəfə təsbih edən haqda.

24- Saad İbn Əbi Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında idik.Bu zaman O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Aranızda hər gün min savab qazanmaqda aciz olan kimsə varmı?" Onun yanında oturanlardan biri soruşdu : "Bir adam necə min savab qazana bilər? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: "Yüz dəfə təsbih edir, ona min savab yazılır, yaxud min günahı silinir."

## Allaha sığınma kitabı.

### Birinci fəsil: Fitnələrin şərrindən Allaha sığınma

1- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu dualarla dua edərdi: " Allahummə inni əuzu bikə min fitnətin nər və azəbin nər və fitnətil qəbri və əzabil qabri və min şərri fitnətil ğinə və min şərri fitnətil faqri və əuzu bikə min şərri fitnətil məsihid dəccəl.Allahumməğsil xətayaya bi məissəlci vəl bəradi.Və nəqqi qəlbi minəl xətaya kəmə nəqqəytəs səvbəl əbyədi minəd dənəsi.Və bəid beyni və beynə xətayəyi kəmə bəadtə beynəl məşriqi vəl məğrib.Allahummə inni əuzu bikə minəl kəsəli vəl hərami vəl mə`səmi vəl məğrəmi". (Allahım! Mən cəhənnəmin fitnəsindən və cəhənnəmin əzabından, qəbrin fitnəsindən və qəbirin əzabından, zənginlik fitnəsinin şərindən və fəqirlik fitnəsinin şərindən sənə sığınıram. Məsih Dəccal fitnəsinin şərindən də sənə sığınıram. Allahım! Mənim günahlarımı qar və dolu suyu ilə yu! Ürəyimi ağ paltarı çirkdən təmizlədiyin kimi günahlardan təmizlə! Mənimlə günahlarımın arasını məğrib və məşriq arasnı uzaqlaşdırdığın kimi uzaqlaşdır. Allahım! Mən tənbəllikdən, qocalıqdan, günah və borcdan da sənə sığınıram)."

### İkinci fəsil: Acizlik və tənbllikdən Allaha sığınma

2- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allahummə inni əuzu bikə minəl aczi vəl kəsəli vəl cubni vəl hərami vəl buxli .Və əuzu bikə min azəbil qəbri və min fitnətil məhya və məməti".(Allahım! Acizlik, tənbəllik, qorxaqlıq, qocalıq və paxıllıqdan sənə sığınıram. Həmçinin qəbr əzabından, ölümün və həyatın fitnəsindən Sənə sığınıram!).

### Üçüncü fəsil: Pis taledən və bədbəxtçilikdən Allaha sığınmaq

3- Əbu Hüreyrə ((Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) pis taledən,bədbəxtçilikdən,düşmənlərin bədxahlığından və bəla məşəqqətindən Allaha sığınırdı. Amr hədisində Sufyanın belə dediyini rəvayət etdi: "Şəkk edirəm ki, birini mən artırdım."

### Dördüncü fəsil: Nemətinin tükənməsindən Allaha sığınmaq.

4- Abdullah İbn Amr (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Allahummə inni əuzu bikə min zəvali nimətik.Və təhəvvul afiyətik.Və fucəəti

niqmətik.Və cəmii səxatik".(Allahım, nemətinin tükənməsindən, verdiyin uğurun dəyişməsindən, qəfil qisasından və cəmi qəzəbindən Sənə sığınıram!)"

Beşinci fəsil: Asqıran Allaha həmd edərsə ona yərhəmukəllah deмək.

5- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında iki kişi asqırdı.Onlardan birisinə Yərhəmukəllah dedi. Digərinə isə Yərhəmukəllah demədi. Yərhəmukəllah demədiyi şəxs (Peyğəmbərə) belə dedi: "Filankəs asqırdı yərhəmukəllah dedin, mən asqıranda isə yərhəmukəllah demədin. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu Allaha həmd etdi, sən isə Allaha həmd etmədin."

6- İyəs İbn Sələməhin atası ona Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Bir kişi onun yanında asqırdı. Ona yərhəmukəllah (Allah sənə mərhəmət etsin ) dedi.Sonra bir daha asqırdı. Bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu adam soyuqlamışdır (zökəm xəstəliyinə tutulmuşdur.)."

# Tövbə, onun qəbulu, Allahın rəhmətinin genişliyi və sair kitabı.

Birinci fəsil: Tövbə etməyin əmr olunması.

1- Əbu Bərdətə belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən olan əl-Əğər İbn Ömərə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət etdi: "Ey insanlar, Allaha tövbə edin və Ondan bağışlanma diləyin! Mən gün ərzində yüz dəfə tövbə edirəm".

İkinci fəsil: Tövbə etməyə rəğbətləndirmək.

2- Əl-Haris İbn Suveyd belə rəvayət edir: "Mən, Abdullah xəstə olduğu vaxt onu ziyarət etmək üçün yanına girdim. O bizə, biri özündən digəri isə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) olan iki hədis rəvayət edib dedi ki: "Mən, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurarkən eşitdim: "Allah, mömin qulunun tövbə etməsinə; quraq, təhlükə qorxusu olan bir yerdə, onunla dəvəsi olan, yeməyi və içkisi dəvəsinin üzərində olduğu halda yatan, oyandığında dəvəni getmiş görən və onu axtaran , nəhayət özünə susuzluq çatan, sonra öz-özünə: "Olduğum yerə geri qayıdım və ölənə qədər orada yatım." Deyən və ölmək üçün başını dirsəyinin üzərinə qoyan sonra oyanarkən dəvəsini üzərindəki azuqəsi yeməyi və içməyi ilə yanında görən bir adamdan ,Allah o mömin qulunun tövbəsinə bu adamın dəvəsi və azuqəsinə sevinməsindən daha çox sevinər."

Üçüncü fəsil: Tövbədə sadiq olmaq Allah Təala buyurur: "Həmçinin (Təbuk döyüşündən) geri qalmış üç nəfərin də (tövbələrini qəbul etdi)".

3- İbn Şihab belə rəvayət edir: "Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Təbuk döyüşünə getdi. Halbuki özü Romalılarla Şamdakı xristian Ərəblərinin üzərinə getmək istəyirdi. İbn Şihab deyir ki; Mənə

Əbdurrəhman İbn Abdullah İbn Kəab İbn Malik xəbər verdi ki, Kəabin gözləri tutulduqdan sonra onu gəzdirən oğlu Abdullah bin Kəab belə deyir ki, o Kəab bin Malikin Təbuk döyüşündə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iştirak etməyib, arxada qalmasından danışdığını eşidib. Kəab belə rəvayət edir: "Təbuk döyüşündən başqa, Allahın Elçisinin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşlərinin heç birində arxada qalmadım. Bir də arxada qalanların məzəmmət olunmadığı Bədr savaşında olmadım. Beləki, Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və müsəlmanlar Qureyşin dəvələri üçün çıxmışdılar, Allah da onları vədələşmədikləri bir yerdə düşmənləri ilə üz-üzə gətirdi.Mən həmçinin İslama sadiq qalacağımıza əhd etdiyimiz Əqəbə (Məkkə yaxınlığında Peyğəmbərin Mədinədən olan tərəfdarları (ənsarlar) ilə gizli görüşdükləri yerin adı) gecəsi Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə idim. İnsanlar arasında Bədr döyüşünün Əqəbə beyətindən daha üstün sayılmasına baxmayaraq mənim üçün Əqəbə beyəti daha sevimli idi. O ki, qaldı Təbuk döyüşündə iştirak etməyib Allah Elçisindən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arxada qalmağıma, həqiqətən o döyüşə getmədiyim vaxtdakı kimi heç bir zaman güclü və varlı olmamışam. Allaha and olsun ki, o vaxta qədər heç iki minik heyvanım da yox idi, amma o döyüş zamanı bunlar mənim varım idi. Allah Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Təbuk döyüşünə şiddətli bir isti zamanı yola düşdü. Bu səfər çox uzun və təhlükəli, qarşılaşacaqları düşmənin isə sayı çox olduğundan o, müsəlmanlar bunları nəzərə alıb hazırlıq gör-sünlər deyə, məqsədini açıqlayıb, gedəcəyi istiqaməti onlara xəbər verdi. Allah Elçisi ilə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o qədər müsəlman var idi ki, sayı hafiz bir kəsin kitabina yerləşməzdi. Kəab dedi: Uca Allahdan vəhy gəlməmiş heç kəsin bilməyəcəyini zənn edərək gizlənənlər çox az idilər. Allah Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu döyüşə meyvələrin yetişdiyi, kölgələrin xoş olduğu, mənim də vurğunu olduğum bir zamanda çıxmışdı.Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və onunla birgə müsəlmanlar hazırlaşırdılar. Mən də onlarla hazırlaşmaq üçün səhərlər çıxırdım, amma heçnə etməyib qayıdırdım və öz-özümə deyirdim ki, istədiyim hər bir zaman bunu edə bilərəm. Başqaları səylə hazırlaşdıqları halda mən belə etməkdə davam etdim. Nəhayət bir sabah Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) digər müsəlmanlarla birgə yola çıxdı, mən isə hələ də hazırlıqdan heç bir şey etməmişdim. Yenə evdən çıxıb, heç bir şey etməyib qayıtdım. Mən belə vəziyyətdə olduğum halda (onlar) sürətlə aralanaraq uzaqlaşdılar. Mən yola çıxıb onlara çatmaq qərarına gəldim. Kaş ki, bunu edərdim! Amma bu mənə nəsib olmadı. Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinədən çıxıb döyüşə getdikdən sonra insanlar arasına çıxdıqda məni ən çox kədərləndirən o idi ki, burada yalnız münafiqlikdə ittiham olunanlar və Allahın döyüşə getməməyə rüsxət verdiyi zəiflər qalmışdı. Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Təbuka çatana qədər mənim haqqımda heçnə danışmadı, Artıq orada Təbuk əhalisinin arsında oturduqda belə soruşdu: "Kə'b bin Malik nə edir?" Bəni Səlimə tayfasından biri dedi: "Ey Allahın Elçisi, onu bahalı paltarı və təkəbbürlüyü gecikdirdi". Muaz İbn Cəbəl (Allah ondan razı olsun) ona dedi: "Nə pis dedin! Ey Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) , Allaha and olsun ki, biz onun haqqında xeyirdən (yaxşılıqdan) başqa heçnə bilmirik". Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) susdu və bu zaman ağ paltarlı bir adamı ilğım (xəyal) kimi görərək dedi: "Gərək ki, bu Əbu Xeysəm olsun". O həqiqətən bir saa ( 2,5 -3 kilo arası) xurmanı sədəqə etdiyi üçün münafiqlərin rişxənd etdikləri Əbu Xeysəm əl-Ənsari idi. Kə'b

dedi: "Bilǝndǝ ki, artıq Allahın Elçisi (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) Tǝbukdan qayıdır, mǝni dǝrin hüzn bürüdü vǝ öz-özümǝ: "Onun qǝzǝbindǝn necǝ qaçım"- deyǝ (yalandan) bǝhanǝlǝr uydurmağa (fikirlǝşmǝyǝ) başladım, bunda kömǝk üçün ailǝ üzvlǝrimdǝn müdrik hǝr birinǝ müraciǝt etdim. (Adamlar) danışanda ki, artıq Allahın Elçisi (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) lap yaxındadır, bütün yalanlar getdi vǝ mǝn başa düşdüm ki, heç bir yalan mǝni onun qǝzǝbindǝn qurtarmaz, odur ki, düzünü demǝk qǝrarına gǝldim. Sǝhǝr Allahın Elçisi (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) qayıtdı. O hǝr hansı bir sǝfǝrdǝn qayıdanda, hǝr şeydǝn ǝvvǝl mǝscidǝ gǝlǝr, iki rükǝt namaz qılar, sonra oradakı adamlarla oturardı. Bunları etdikdǝn sonra Tǝbuk döyüşündǝn yayınan sǝksǝndǝn artıq kişi gǝlib Peyğǝmbǝrǝ (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) müxtǝlif bǝhanǝlǝr gǝtirmǝklǝ vǝ and içmǝklǝ üzrxahlıq etmǝyǝ başladılar. Allahın elçisi onların camaat arasında dediklǝrini qǝbul etdi, onlardan bir daha vǝd aldı, onlar üçün bağışlanma dilǝdi, qǝlblǝrindǝ gizlǝtdiklǝrini isǝ Allaha hǝvalǝ etdi. Sonra ona mǝn yaxınlaşdım, onu salamladıqda qǝzǝbini gizlǝdǝn adamın tǝbǝssümü kimi bir tǝbǝssümlǝ: "Gǝl" dedi. Mǝn yaxınlaşdım vǝ qarşısında oturdum, Peyğǝmbǝr (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) bel' buyurdu: "Bu döyüşdǝn yayınmağının sǝbǝbi nǝ idi? Mǝgǝr sǝn minik satın almamışdın? (Kǝab) dedi: "Mǝn dedim: "Ey Allahın Elçisi! Allaha and olsun ki, ǝgǝr sǝndǝn başqa istǝnilǝn birinin qarşısında otursaydım, bir bǝhanǝ ilǝ onun qǝzǝbindǝn qurtarardım, çünki mǝn fǝsahǝtlǝ danışmağı bacaranam. Lakin - and olsun Allaha - mǝn başa düşdüm ki, ǝgǝr mǝn bu gün yalan danışmaqla sǝni razı salsam, sonra Allah elǝ edǝcǝk ki, sǝn tezliklǝ mǝnǝ qǝzǝblǝnǝcǝksǝn. Ancaq sǝnǝ hǝqiqǝti söylǝsǝm, sǝnin mǝnǝ qǝzǝbin tutsa da Allahın mǝni bağışlayacağına ümid edǝcǝm. Allaha and olsun ki, heç bir üzürüm yoxdur. Allaha and olsun ki, arxada qaldığım zaman heç bir vaxt olmadığım kimi güclü vǝ varlı olmamışam! Peyğǝmbǝr (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) dedi: "O ki, qaldı buna, o doğru danışdı. Nǝ qǝdǝr ki, Allah sǝnin haqqında hökm vermǝyib, dur ayağa". Bundan sonra bǝni Sǝlimǝnin adamları üstümǝ yeriyǝrǝk mǝnǝ dedilǝr: "Allaha and olsun ki, sǝnin heç bir günahının olmadığını bilirdik. Sǝn döyüşdǝn geri qalan digǝrlǝrinin etdiklǝri kimi Allahın Elçisinin (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) qarşısında bǝraǝt qazanmaq da aciz oldun. Halbuki Allahın Elçisinin (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) sǝndǝn ötrü bağışlanma dilǝmǝsi kifayǝt edǝrdi". (Kǝab) dedi: "Onlar o qǝdǝr mǝni qınadılar ki, Allaha and olsun ki Allahın Elçisinin (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) yanına qayıdıb yalan dediyimi demǝk istǝyirdim. Sonra onlardan soruşdum: Mǝnim başıma gǝlǝn başqasının da başına gǝlibmi (yǝni, atdığı addıma bǝraǝtin olmadığını vicdanla boynuna alan tapıldımı?) Onlar dedilǝr: "Bǝli, daha iki nǝfǝr oldu ki, sǝnin dediklǝrini dedilǝr vǝ sǝnǝ deyilǝn dǝ onlara deyildi".(Kǝab) dedi: "Mǝn kimdir bu iki nǝfǝr? Deyǝ soruşdum? Onlar belǝ dedilǝr: "Murara İbn Rabiǝtǝ ǝl-Amriyy vǝ Hilal İbn Umeyyǝ ǝl-Vaqifiyy".(Kǝab) dedi: "Mǝnǝ nümunǝ ola bilǝcǝk iki nǝfǝr Bǝdr döyüşünün iştirakçısı olan ǝmǝli salehlǝrin adlarını çǝkdilǝr".(Kǝab) dedi: "Onlar o iki nǝfǝrin (adını) çǝkǝndǝn sonra (heç nǝyi dǝyişmǝmǝk) qǝrarına (yǝni, sözündǝn imtina etmǝmǝk qǝrarına) gǝldim. Vǝ, Allahın Elçisi (ona, ailǝsinǝ vǝ sǝhabǝlǝrinǝ Allahın salavatı vǝ salamı olsun) digǝr adamlara arxada qalan biz üç nǝfǝrlǝ danışmağı qadağan etdi". (Kǝab) dedi: "Adamlar da bizdǝn çǝkindilǝr (vǝ ya (Kǝab) dedi: "bizǝ qarşı dǝyişdilǝr") vǝ hǝtta (yaşadığım) yer mǝnim üçün tanınmaz oldu, çünki o mǝnim (öncǝdǝn) bildiyim torpaq deyildi. Ǝlli gecǝni bu cür keçirtdik. Mǝnǝ vǝ o iki yoldaşıma gǝlincǝ, onlar ağlayaraq boynu bükük halda evlǝrindǝ oturmuşdular, mǝn isǝ gǝnc vǝ güclü olduğum üçün evdǝn çıxırdım, müsǝlmanlarla birgǝ namaz qılırdım, bazarlara

gedirdim və məni heç kim danışdırmırdı. Namazdan sonra Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) adamlarla oturarkən yanına gəldim, onu salamlayaraq öz-özümə dedim: "Görəsən mənim salamımı qaytarmaq üçün dodaqlarını tərpətdimi?" Sonra ona yaxın bir yerdə namaz qılaraq oğrun-oğrun (xəlvəti) baxırdım. Mən namaz qılanda o mənə baxırdı, mən ona tərəf dönəndə o məndən üzünü çevirirdi. Müsəlmanlar tərəfindən soyuqluqla qarşılaşdığım bu uzun müddətdə (bir dəfə) əmim oğlu və insanların ən sevimlisi Əbu Qatadənin bağının hasarına (çəpər, barı) çıxaraq ona salam verdim, və Allaha and olsun ki, salamımı almadı. Ona dedim: "Ey Əbu Qatadə, səni Allaha and verirəm, bilmirsən mən Allahı və Elçisini (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sevirəm?" O susdu. Mən bir daha Allaha and verib soruşduqda o yenə də susdu. Mən birdə Allaha and verib soruşdum, o dedi: "Allah və Elçisi bilir!" Onda gözlərim yaşardı (doldu) və mən hasardan tullanaraq qayıtdım. (Bir müddət sonra) Mədinə bazarından keçərkən satmağa ərzaq gətirən Şamdan olan bir nəfər belə dediyini eşitdim: "Kim məni Kəab bin Malikin yanına aparar?". Adamlar məni göstərdilər. Yanıma gəlib Qassanilər hökmdarının (məlik, sultan) məktubunu verdi. Mən yazıb-oxuyan (katib, mirzə) olduğum üçün oxudum belə yazılmışdır: Daha sonra. Həqiqətən bizə çatdı ki, dostun səndən qaçır. Allah sənə məhəl qoymamağa, haqqının tapdalanmasına imkan verməz, qoşul bizə, bizdə təskinlik taparsan! Məktubu oxuyaraq,- özlüyümdə bu da həmçinin sınaqdır deyib-təndirə atıb yandırdım. Vəhy hələ də gəlmirdi. Əlli günün qırxıncı günü Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) elçisi gələrək dedi: "Allahın Elçisi arvadına yaxınlaşmağı sənə qadağan etdi!" Mən dedim: "Onu boşayım, yoxsa nə edim?" Dedi: "Xeyr, ondan uzaqlaş və ona yaxınlaşma". Eyni əmri digər iki yoldaşıma da etmişdi. Məndə arvadıma dedim: "Get valideynlərinin yanına, Allah bu məsələdə hökm verənə qədər orada qal". Hilal İbn Umeyyənin arvadı Allahın Elçisinin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək ona belə dedi: "Ey Allahın Elçisi, həqiqətən Hilal bin Umeyyə xadiməsi olmayan, qüvvədən düşmüş qocadır. Ona xidmət göstərməyimə narazısanmı? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: "Xeyr, lakin sənə yaxınlaşmasın!" Qadın dedi: "Allaha and olsun ki, onun heç hərəkət etməyə taqəti qalmayıb. Allaha and olsun ki, bu hadisə baş verəndən bəri o, dayanmadan ağlayır". Bundan sonra ailə üzvlərimdən bəziləri mənə dedilər: "Arvadına (sənə xidmət etməsi üçün) icazə verməsindən ötrü Allahın Elçisinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müraciət et, axı Hilal İbn Umeyyənin arvadına buna icazə verib". Mən dedim: "Bundan ötrü Allahın Elçisinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç nə demərəm, axı bilmirəm ki, Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buna nə deyər, həm də ki, mən cavanam". Və mən belə vəziyyətdə daha on gün qalmaqla adamların bizimlə danışması qadağan olunan əlli gün başa çatdı". Əllinci gecənin sabahı evlərimizdən birinin damında sübh namazını qılıb uca Allahın bizdən danışarkən qeyd etdiyi kimi elə bir halda oturmuşdum ki, ürəyim təngə gəlib sıxılır, gen dünya mənə dar gəlirdi. Elə bu zaman Sel dağına çıxmış bir insanın uca səslə səsləndiyini eşitdim: "Ey Kəab İbn Malik! Sevin!" Dərhal səcdəyə getdim və qurtuluşun gəldiyini anladım. Allahın elçisi sübh namazını qıldığı zaman tövbələrimizin Allah Təala tərəfindən qəbul olunduğunu insanlara bildirdi. Camaat da bizi müjdələməyə gəldi. Yoldaşlarımın yanına da müjdəçilər getdi. Yanıma biri atını çaparaq gəldi. Əsləm qəbiləsindən bir nəfər də sürətlə mənə doğru gəlib dağa qalxdı. Səs atdan daha sürətli idi. Səsini eşitdiyim adam yanıma gəlib məni müjdələdikdə üzərimdəki iki paltarımı çıxarıb muştuluq olaraq ona geyindirdim. Allaha and olsun ki, həmin gün o iki paltardan başqa paltarım yox idi. Buna görə də iki paltar borc götürüb geydim və Allah elçisinin

yanına getdim. Camaat dəstə-dəstə mənim qarşıma çıxıb tövbənin qəbul olması münasibəti ilə məni təbrik edir və: "Allahın sənin tövbəni qəbul etməsi mübarəkdir" – deyirdilər. Məscidə girdikdə Allah elçisinin insanlar tərəfindən dövrəyə alınmış bir vəziyyətdə oturduğunu gördüm. Təlha İbn Übeydullah (Allah ondan razı olsun) ayağa qalxdı və qaçaraq yanıma gəldi. (Əllə) salam verib məni təbrik etdi. Allaha and olsun ki, mühacirlərdən ondan başqa heç kəs ayağa qalxmadı. "Kəab Təlhanın bu hərəkətini heç vaxt unutmadı." Kəab deyir: Allahın elçisinə salam verdikdə üzü sevincdən parlayırdı. "Ananın səni doğduğu gündən bəri keçən ən xeyirli günlə, sevinci ilə müjdələn!" – dedi. Mən: "Ey Allahın elçisi! Sən tərəfdənmi, yoxsa Allah tərəfdən?" – deyə soruşdum. O: "Xeyr, Allah tərəfindən" – deyə cavab verdi. Allahın elçisi sevindiyi zaman üzündən nur yağardı və onun üzü ayın bir hissəsi kimi olardı. Biz onun bu xüsusiyyətinə bələd idik. Onun qarşısında əyləşdikdə dedim: "Ey Allahın elçisi! Tövbəmin qəbul olunmasına qarşılıq malımdan Allah və elçisi üçün sədəqə verəcəyəm" Allahın elçisi: "Malının bir hissəsini saxla. Çünki bu sənin üçün xeyirlidir" – deyə buyurdu. Mən: "Mən Xeybərdəki oxumu saxlayıram" – dedim. Sonra belə dedim: "Ey Allahın elçisi! Allah-taala məni doğruluğa görə xilas etdi. Yaşadığım müddətdə yalnız doğru söyləmək tövbəmin (pozulmaz) olmasıdır". Allaha and olsun ki, bu sözləri Allah elçisinə söylədiyim gündən bəri Allahın doğru danışmaqda məni imtahana çəkdiyindən daha yaxşı bir şəkildə müsəlmanlardan kimsəni imtahana çəkdiyini bilmirəm. Allaha and olsun ki, bu sözləri Allah elçisinə söylədiyim gündən bu günə kimi qəsdən yalan söyləmədim. Allahdan bundan sonra yaşadığım müddət ərzində məni qorumasını istəyirəm. Sonra Allah-Taala bu ayəni nazil etdi: "Allah çətin saatda bir qisminin ürəyi [şəkk-şübhəyə düşüb peyğəmbərdən və cihaddan] dönmək üzrə ikən Peyğəmbərə, onun ardınca gedən mühacirlərə və ənsara tövbə nəsib etdi. Sonra Allah onlara qarşı şəfqətli və mərhəmətli olduğu üçün tövbələrini qəbul buyurdu! Həmçinin [Təbuk döyüşündən] geri qalmış üç nəfərin də [tövbələrini qəbul etdi]. Belə ki, gen dünya onlara dar olmuş, ürəkləri [qəm-qüssədən] təngə gəlib sıxılmışdı. Onlar Allahdan [Allahın əzabından] yalnız Onun özünə sığınmağın mümkün olduğunu başa düşdülər. Allah onlara tövbə etmək üçün tövbə nəsib etdi. Şübhəsiz ki, Allah tövbələri qəbul edəndir və rəhmlidir! Ey iman gətirənlər! Allahdan qorxun və [imanında, sözündə, işində] doğru olanlarla olun! [Peyğəmbər və onun sadiq əshabələri ilə birlikdə olun!]" .Kəab deyir: Allaha and olsun ki, Allahın məni islama qovuşdurduqdan sonra mənə bəxş etdiyi ən böyük neməti Allah elçisinə düz danışaraq yalan danışıb həlak olanlar arasında olmamağım idi. Allah-taala vəhy nazil etdiyi zaman yalan söyləyənlər haqqında bir nəfərə söylədiyinin ən pisini söyləyərək belə buyurur: "Siz onların yanına gəldikdə onlar [yalandan] Allaha and içəcəklər ki, onlardan üz döndərəsiniz [onları məzəmmət etməkdən, cə-zalandırmaqdan əl çəkəsiniz]. Siz də onlardan üz döndərin! [Qoyun qiyamət günü əzabı daha şiddətli olacaq küfr və nifaqlarında davam etsinlər!] Çünki onlar murdardırlar və qazandıqları günahlara görə düşəcəkləri yer də Cəhənnəmdir! Onlardan razı olasınız deyə, qarşınızda [Allaha] and içəcəklər. Siz onlardan razı olsanız da, Allah fasiq bir tayfadan razı olmaz". Kəab deyir: Biz and içdikləri zaman andlarını Allah elçisinin qəbul etdiyi, onlardan beyət aldığı və onlar üçün bağışlanma dilədiyi həmin o üç nəfərdən arxada buraxıldıq. Allahın elçisi bizim işimizi Allah-taala bu barədə Öz hökmünü verənədək təxirə saldı. Nəhayət Allah Öz sözünü (hökmünü) dedi: " Həmçinin (Təbuk döyüşündən) geri qalmış üç nəfərin də (tövbələrini qəbul etdi). Belə ki, dünya onlara dar olmuş……………" Lakin Allah-taala burada bizim döyüşdən geri qalmağımızı deyil, Peyğəmbərə and içib üzür gətirdiyi zaman anı və üzürü Peyğəmbər tərəfindən qəbul olunan kəslərdən arxada buraxılmağımızı və işimizin təxirə salınmasını nəzərdə tuturdu."

## Dördüncü fəsil: Yüz adam öldürənin tövbəsinin qəbul olunması

4- Əbu Səid əl-Xudridən (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyi rəvayət edir: "Sizdən əvvəlkilərdən (ümmətlərdən) biri doxsan doqquz adam öldürdü. Dünyada ən çox bilənin kim olduğunu soruşdu və ona bir rahibi göstərdilər. Onun yanına gəlib belə dedi: Doxsan doqquz adam öldürmüşəm." Və (həmçinin) soruşdu ki, buna tövbə varmı? O dedi: "Xeyr",- adam rahibi də öldürərək bununla sayı yüzə tamamladı. Sonra dünyada ən çox bilənin kim olduğunu soruşdu və ona bir alimi göstərdilər. Onun yanına gəlib dedi ki, yüz adam öldürmüşəm və (həmçinin) soruşdu ki, buna tövbə varmı? O dedi: "Bəli! Kim tövbə edənlə tövbəsi arasına girə (tövbə edənə mane ola) bilər? İnsanların Allah Təalaya ibadət etdikləri (filan) yerə get, onlarla birgə Allaha ibadət elə və öz torpağına qayıtma, çünki ora pis (şər) yerdir. O yola düşüb yolun yarısı çatmışdır ki, ölüm onu haqladı. Onun üçün rəhmət və əzab mələkləri öz aralarında mübahisə etməli oldular. Rəhmət mələkləri dedilər: "O tövbə edərək qəlbi ilə Uca Allaha tərəf (doğru) gəlmişdir!" Əzab mələkləri isə dedilər: "O həqiqətən heç bir xeyir iş görməmişdir". Onların yanına insan qiyafəsində bir mələk gəldi. Onu öz aralarında hakim təyin etdilər. O dedi: "Bu iki (gəldiyi yerdən bura və burdan gedəcəyi yerə qədər) məsafəni ölçün, hansına yaxın olarsa, ora da aiddir. Ölçdükdə gördülər ki, gedəcəyi yerə yaxındır və onu (n ruhunu) rəhmət mələkləri aldılar" Qətədə Həsənin belə dediyini rəvayət edir: "Bizə deyildiyinə görə: "Bu adama ölüm gəlincə sinəsiylə (o tərəfə doğru) irəliləmişdir (Sürünmüşdür)."

## Beşinci fəsil:Kim günəş batdığı yerdən doğmamışdan əvvəl tövbə edərsə, Allah onun tövbəsini qəbul edər.

5- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Kim günəş batdığı yerdən doğmamışdan əvvəl tövbə edərsə, Allah onun tövbəsini qəbul edər."

## Altıncı fəsil: Gecə və gündüz günah edənlərin tövbəsinin qəbul olunması.

6- Əbu Musa (Allah ondan razı olsun)-Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən Günəş batdığı yerdən doğan zamana qədər gecə Allah Öz əlini açar ki, gündüz günah edənlər tövbə etsin, və gündüz Allah Öz əlini açar ki, gecə günah edənlər tövbə etsin."

## Yeddinci fəsil: Günahların bağışlanması.

7- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Əgər siz günah etməsəydiniz, Allah sizi həlak edib yerinizə günah edib sonra tövbə edən bir camaat gətirər və onları bağışlayardı."

## Səkkizinci fəsil: Allahın rəhmətinin genişliyi və həqiqətən onun (rəhmətinin) qəzəbinə qalib gəlməsi.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah yaratmağı təqdir etdikdə ərşin üzərində olan kitabında belə yazdı: "Rəhmətim qəzəbimə qalib gəldi."

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə dediyini rəvayət edir: "Həqiqətən Allahın yüz rəhməti vardı.Onlardan bir rəhməti insanlar, cin, heyvanlar ve böcəklər arasına endirmişdir, bu səbəblə bir-birlərinə acıyar və bu səbəblə bir-birinə rəhm edərlər. Vəhşi, balasına bu səbəblə mərhəmət edər. Allah doxsan doqquz rəhmətini geriyə buraxmışdır. Onlarla qiyamət günündə qullarına rəhmət edəcəkdir."

## Doquzuncu fəsil: Allahın yanında olan rəhmət və cəza.

10- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Əgər mömin Allahın yanındakı əzabı bilsə cənnətinə heç kim tamah etməzdi. Kafir də, Allah yanındakı rəhməti bilsə, cənnətindən heç kim umüdünü kəsməzdi."

## Onuncu fəsil: Allah qullarına, ananın övladına olan şəfqətindən daha mərhəmətlidir.

11- Ömər İbn əl-Xəttab (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hüzuruna bir qrup əsir gəlmişdi. Onların içlərində bir qadın uşağını axtarırdı. Əsirlərin içərisində bir uşaq tapanda onu götürüb bağrına basıb və onu əmizdirərdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bu qadın uşağını oda atarmı?". Biz dedik: "Yox, Allaha and olsun ki, gücü çatdığı qədər onu atmaz". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: "Allah qullarına bu qadının övladına olan şəfqətindən daha mərhəmətlidir."

## On birinci fəsil: Sizdən heç kəsi əməli qurtarmayacaqdır

12- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edərdi: "Doğrunu axtarın, yaxınlaşın və müjdələnin! Heç kimi öz əməli cənnətə salmayacaqdır. Səhabələr dedilər: "Hətta sənidə Ey Allahın elçisi:?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "(Bəli!) Məni də! Yalnız Allah Təala öz rəhməti ilə məni örtərsə. Bilin ki, Allaha ən sevimli əməl az da olsa ən davamlı edilən əməldir.

## On ikinci fəsil: Əziyyətə Allahdan daha səbirlisi yoxdur.

13- Abdullah İbn Qeys (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Eşitdiyi bir əziyyətə Allah Təaladan daha səbrlisi yoxdur. Onlar ona şərik qoşurlar, uşaq (Nisbət edir) iddia edir, buna baxmayaraq O onları ruziləndirir və salamat edir və, əta edir."

## On üçüncü fəsil: Allahdan daha qısqancı yoxdur.

14- Abdullah İbn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Öyülməyi Allahdan daha çox sevən yoxdur. Bunun üçün özünü öymüşdür. Allahdan daha qısqancı yoxdur. Bunun üçün də pis şeyləri haram etmişdir. Üzürü (qəbul etməyi) Allahdan daha çox sevən yoxdur. Bunun üçün kitabı endirmiş və Peyğəmbərlər göndərmişdir."

15- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən Allah qısqanır. Mömin də qısqanar. Allahın qısqanması, möminin Allah Təalanın haram etdiyi şeyi etməsidir."

## On dördüncü fəsil: Pıçıltı və qula günahlarını etiraf etdirilməsi.

16- Safvan İbn Muhriz belə rəvayət edir: "Bir kişi İbn Ömərə (Allah onların hər ikisindən razı olsun) belə dedi: "Pıçıltı haqqında Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) necə buyurduğunu eşitdin?" İbn Ömər belə eşitdiyini dedi: "Qiyamət günündə mömin Rəbbinə yaxınlaşacaq, hətta onun üzərinə Allah bağışlamağını endirəcək və ona günahlarını etiraf etdirəcək. Ona "(filan günahını) bilirsənmi?" deyə soruşacaq. Mömin: "Ey Rəbbim! bilirəm" deyəcək. Allah Təala: "Onu mən dünyada sənin üçün örtdüm. Bu gündə onu sənə bağışlayıram" deyəcək. Bu zaman yaxşılıqlarının səhifəsi veriləcək. Kafirlərlə, münafiqlərə isə, onlar üçün məxluqat hüzurunda: Allah adına yalan danışanlar bunlardır"deyə çağırılacaqdır."

## On beşinci fəsil: Qiyamət günündə Kafirə və Münafiqə nemətlərin iğrar olunması.

17- Əbu Hüreyrə (Allah ondan razı olsun) belə rəvayət edir: "Səhabələr Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedilər: "Ey Allahın elçisi! Biz qiyamət günündə Rəbbimizi görəcəyikmi?" O dedi: "Siz buludsuz bir gündə günorta vaxtı günəşi görmək üşün bir-birinizə maneəçilik edirsinizmi? Onlar: "Xeyr!" cavabını verdilər . Siz buludsuz bir gecədə bütövlənmiş ayı səmada görmək üçün bir-birinizə maneəçilik edirsinizmi? Onlar: "Xeyr!" cavabını verdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Nəfsim əlində olan Allaha and olsun ki, Siz Rəbbinizi görmək üçün necə ki, bu ayla günəşi görməkdə maneçilik etdiyiniz kimi maneçilik edəcəksiniz. Allah Təala qulu ilə qarşıslaşacaq və belə deyəcəkdir: "Ey filankəs! Sənə ikram etmədimmi? Səni rəis etmədimmi? Sənə arvad vermədimmi? Atı və dəvəni sənin istifadənə vermədimmi? Rəislik etməyinə, qənimət malının dörddə birini almağına icazə vermədimmi?" O da: "Bəli Ey Rəbb deyəcək." Allah Təala soruşacaq: "Mənimlə görüşəcəyinə zənn etdinmi?". O da: "Xeyr!" cavabını verəcəkdir." Bu zaman Allah Təala belə buyuracaqdır: "Məni unutduğun kimi,sənidə unuduram." Sonra ikinci qulu ilə qarşıslaşacaq və deyəcək: "Ey filankəs! Sənə ikram etmədimmi? Səni rəis etmədimmi? Sənə arvad vermədimmi? Atı və dəvəni sənin istifadənə vermədimmi? Rəislik etməyinə, qənimət malının dörddə birini almğına icazə vermədimmi?" O da: "Bəli Ey Rəbb" deyəcək. Allah Təala soruşacaq: "Mənimlə görüşəcəyinə zənn etdinmi?". O da: "Xeyr!" cavabını verəcəkdir. Bu zaman Allah Təala deyəcək. "Məni unutduğun kimi, sənidə unuduram". Sonra üçüncü qulu ilə qarşıslaşacaq, onada bunun kimisini söyləyəcək. Lakin o qul deyəcək: " Ey Rəbb! Mən Sənə, Sənin Kitabına və Peyğəmbərlərinə inandım, namaz qıldım, oruc tutdum və sədəqə verdim." Gücü çatdığı qədər xeyir səna edəcək. Allah Təala deyəcək: "Onda buraya buyur". Sonra ona deyiləcək: "İndi sənə şahidimizi göndərəcəyik". Qul öz-özünə fikirləşəcək ki, görəsən kim mənə şahidlik edəcək. Ağzına möhür vurulacaq və .buduna,.ətinə və sümüyünə: "Danış!" deyiləcək budu,əti və sümüyü onun əməlini söyləyəcəkdir. Bu ona öz adına bir üzr buraxmamaq üçündür. Və bu Allahın qəzəbinə düçar olan şəxsdir."

## On altıncı Fəsil: Qiyamət günündə insanın orqanlarının onun etdiyi əməllərə sahid olması.

18- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hüzurunda olduğumuz zaman o güldü və dedi: "Bilirsinizmi nədən gülürəm?" Biz: "Allah və Rəsulu daha yaxşı bilir." Dedik. dedi: "Qulun Rəbbinə xitab etməsindən gülürəm".Qul deyəcək: "Ey Rəbb! Sən məni zülmdən qorumadınmı?" O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun).belə buyurdu: "Allah Təala deyəcək: "Bəli qorudum". Qul deyəcək: "Amma mən özümə mənim tərəfimdən bir şahid gətirilməsindən başka bir şeyə razı deyiləm". Allah Təala deyəcək: Bu gün sənə "özünün şabid olması və Kiram əl-Kətibin (Əməllərinizi) yazan və (Allah dərgahında) çox hörmətli olan mələklərin) şahid olması kifayətdir. Və ağızına möhür vurulacaq. Üzvlərinə (orqanlarına) danış!" deyiləcək. Onlar da bunun əməllərini söyləyəcəkdir. Sonra danışmaq barəsində sərbəst buraxılacaq və o deyəcək: "Sizlər uzaq olun, iraq olun! Mən ancaq sizin üçün mübarizə edirdim."

## On yedinci fəsil: Allahdan Təaladan və cəzalndıracağı əzabdan şiddəti qorxmaq haqda.

19- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Heç yaxşılıq etməmiş bir adam ailəsinə: Mən öldüyüm vaxt məni yandırın, sonra (bədənimin) yarısını quruya, (bədənimin) yarısınıda dənizə səpələyin! Allaha and olsun! Əgər Allah Təalə məni diriltmək iqtidarında olsa mənə heç kəsə etmədiyi şiddətli əzab çəkdirəcəkdir". O adam öləndə, onun əmr etdiyini etdilər. Allah quruya əmr etdi, o içindəkini yığdı. Dənizə əmr etdi, o da içindəkini topladı. Sonra (o adama): "Bunu nə üçün etdin?" deyə soruşdu. O adam: "Sənin qorxundan ey Rəbbim! Sən daha yaxşı bilirsən"dedi. Allah Təala onu əfv etdi."

## On səkkizinci fəsil: Günah işləyəndən sonra Rəbbindən bağışlanma diləyən haqda.

20- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Rəbbindən belə nəql etdiyini rəvayət edir: "Allahın qullarından biri günah etdi sonra da: "Allahım! Mən günah etdim, günahımı bağışla!" dedi. Pak və Uca olan Allah: "Qulum günah etdi! Və bildi ki, günahı bağışlayan və günaha görə cəzalandıran bir Rəbb vardır. Sonra qul dönüb, təkrar günah İşlədi, və: "Ey Rəbbim! Mənim günahımı bağışla! dedi, Pak və Uca olan Allah: "Qulum günah etdi! Və bildi ki,günahı bağışlayan və günaha görə cəzalandıran bir Rəbb vardır. Sonra qul dönüb, təkrar günah işlədi. Və: Ey Rəbbim! Mənim günahımı bağışla! dedi. Pak və Uca olan Allah: "Qulum günah etdi! Və bildi ki,günahı bağışlayan (məğfirət edən) və günaha görə cəzalandıran bir Rəbb vardır. Sən istədiyini et. Artıq mən səni bağışladım" Əbd əl- Əalə belə demişdir: "Bilmirəm, üçüncüsündə yoxsa dördüncüsündə: "İstədiyini et!" dedi."\

## On doquzuncu fəsil: Günah edib sonra dəstamaz alıb və fərz namazı qılan kimsə.

21- Əbu Umamə (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə məsciddə oturduğumuz zaman birdən bir kişi gələrək: "Ey Peyğəmbər! Mən cəzaya isabət (layiq oldum) etdim. Onu mənə tətbiq et!"dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)ona cavab vermədən sakit durdu. Sonra o adam sözünü təkrarlayaraq: "Ey Peyğəmbər! Mən cəzaya isabət (layiq oldum) etdim. Onu mənə tətbiq et!" dedi. Yenə sakit durdu .Namaz qılındı. Əbu Ümamə deyir ki ,Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və

salamı olsun) oradan ayrılınca bu şəxs Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arxasınca getdi. Mən də bu adama nə cavab verəcəyini görüm deyə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arxasınca getdim. O adam Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) çatdı və dedi: "Ey Peyğəmbər! Mən cəzaya isabət (layiq oldum) etdim. Onu mənə tətbiq et!" dedi. Əbu Ümamə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) o şəxsə belə dediyini rəvayət edir: "Nə deyirsən, evindən çıxdığın vaxt gözəlcə dəstəmaz aldınmi?". O adam: "Bəli Ey Allahın elçisi dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Sonra bizimlə birlikdə namaz qıldınmi?" dedi. O adam: "Bəli Ey Allahın elçisi!" cavabını verdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona: "Allah həddini (cəzanı) bağışladı.Yaxud günahını bağışladı" deyə buyurdu."

### İyirminci fəsil: Cəhənnəmdən (xials üçün) Hər bir müsəlmana (əvəzinə), bir yəhudi və ya xristian fəda

22- Əbu Musa(Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə dediyini rəvayət edir: " Qıyamət günü gəldiyi vaxt Allah Təala hər müsəlmana bir yəhudi və ya xristian verəcək və: "Bu sənin cəhənnəmdən xilasındır." deyəcəkdir.

## Münafiqlər (İki üzlülük edənlər) kitabı.

### Birinci fəsil: Allah Təala buyurur: "Münafiqlər sənin yanına gəldikləri zaman" ayəsindən "hətta dağılıb getsinlər" ayəsinə kimi.

1- Zeyd İbn Ərqam (Allah ondan razı olsun) belə rəvayət edir: " Biz, Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə səfərə çıxdıq. O səfərdə insanlara qıtlıq baş verdi. Bu zaman münafiqlərin başçısı Abdullah İbn Ubeyy, yoldaşlarına dedi: "Allahın Peyğəmbəri yanında olanlara bir şey verməyin ki, ətrafından dağılıb getsinlər".(Zuheyr belə demişdir:: "o Abdullahın qiraətindədir.") Abdullah İbn Ubeyy sözünə davam edərək: "Əgər biz (Bəni Müstəliq vuruşunda) Mədinəyə qayıtsaq, ən güclülər (ən şərəflilər – münafiqlər) ən zəifləri (ən həqirləri – Peyğəmbəri və ona iman gətirənləri), əlbəttə, oradan çıxardacaqlar!" dedi. Bu zaman mən, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib bunu xəbər verdim. Daha sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Abdullah İbn Ubeyyə xəbər göndərərək bu sözün doğru olub olmadığını soruşdu. Abdullah İbn Ubeyy, bunu, söyləmədiyinə dair and içdi, sonra da: "Zeyd, Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yalan danışmışdır." dedi. Onların bu söylədiklərindən ürəyimə şiddətli bir hüzn düşdü. Nəhayət Allah, məni təsdiq edərək: "Münafiqlər gəldiyi zaman..." şəklində Munafiqun Surəsini endirdi. Zeyd deyir ki: "Sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onların bağışlanmağını diləmək üçün çağırdı. Amma onlar başlarını (buladılar) çevirdilər və "Onlar, sanki söykədilmiş dirəklərdir" ayəsi endi. Zeyd: "Bunlar, gözəl bədənli adamlar idi" deyə söylədi."

### İkinci fəsil:Münafiqlərin Peyğəmbərin (onlar üçün) bağışlanma istəməsindən üz çevirməsi.

2- Cabir İbn Abdullah (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim "Murar" deyilən  ağacın bitdiyi bu təpə yoluna çıxar? (Kim çıxarsa) İsrail oğullarından pozulan günahlar ondan da pozular". Oraya ilk çıxanlar, bizim süvarilərimiz, Xəzrəc oğullarının süvariləri oldu. Sonra camaatın hamısı gəlib tamam oldu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Bu qırmızı dəvənin sahibindən başqa sizin hamınıza bağışlama vardır". Biz dərhal o qırmızı dəvənin sahibinin yanına getdik. Ona: "Gəl, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sənin üçün bağışlama istəsin!" dedik. O adam: "Allaha and içərəm ki, mənə itirmiş dəvəmi tapmam, sizin yoldaşınızın mənim üçün bağışlama istəməsindən daha sevimlidir" dedi. Bu adam, bunu söyləyərkən itmiş dəvəsini soruşub araşdırmaqda idi."

## Üçüncü fəsil: Münafiqlər və onların əlamətləri haqda.

3- Qeys İbn Ubbad Ammara belə dediyini rəvayət edir. "Nə  deyirsən? Bu döyüşünüz, sizin gördüyünüz  bir rəydirmi? Çünki rəy, bəzən səhv, bəzən də doğru olar. Yoxsa bu, sizə, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) etdiyi bir əhdirmi ?" deyə soruşduq. Ammar dedi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bütün insanlara vəsiyyət etmədiyi bir şeyi bizə vəsiyyət etmiş deyildir". Sonra da: "Doğrusu Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Ümmətimin içində on iki münafiq vardır. Onlar dəvə iynə dəliyindən keçənə qədər cənnətə girə bilməyəcək, cənnətin iyinidə tapa bilməyəcəklər .Onların səkkizinə əd-Dubeylə yəni; "Sənin namin üçün onların çiyinlərində meydana çıxacaq, və sinələrindən yüksələcək atəşdən bir şam kifayətdir."

## Dördüncü fəsil: Fəsil: Aqəbə gecəsində münafiqlər və onların sayları haqda.

4- Əbu ət-Tufeyl belə rəvayət edir: "əl-Aqabə əhlidən olan bir kişi ilə Hüzeyfə arasında, insanlar arasında olan bəzi şeylərdən vardı. O adam dedi ki: "Allah xatirinə söylə, Aqəbəlilər neçə adam idilər? Bu zaman  camaat Hüzeyfəyə: "Madam soruşdu, ona xəbər ver!" dedilər. Hüzeyfə belə dedi: "Bizə on dörd olduqları xəbər verilərdi. Əgər sən də onlardansansa, bu camaat on beş adam olar. Allaha şahidlik edərəm ki, onlardan on ikisi həm dünya həyatında, həm də şahidlər (şahidlik etsinlər deyə) dikləcək gün Allaha və Elçisinə düşməndirlər." Üçünü üzürlü hesab etmişdir. Onlar belə dedilər: " Biz Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) carçısı (çağırışını) eşitmədik. Bu qövmün nə etmək istədiyini də bilmədik. Daşlıq bir yerdə idi. Getdi və: "Həqiqətən su azdır. Məndən əvvəl onun yanına heç kim varmasın!" dedi. Amma özündən əvvəl oraya çatmış bir qövm gördü və onları o gün lənətlədi."

## Beşinci fəsil: Münafiqin  misalı iki sürü arasında heyrətlə qalan qoyun misalı kimidir.

5- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Münafiqin misalı iki sürü arasında heyrətlə qalan qoyun misalı  kimidir. Bir dəfə o sürüyə hücum edər, bir dəfə də bu sürüyə!"

## Altıncı fəsil: Münafiqin öldüyü üçün şiddətli küləyin göndərilməsi.

6- Cabir (Allah ondan razı olsun) belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir səfərdən gəldi. Mədinə yaxınına gəldiyi vaxt süvarini basdıracaq dərəcədə şiddətli bir külək əsdi. Cabir deyir ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Bu külək bir münafiq öldüyü üçün göndərilmişdir". Mədinəyə gəldiyində gördü ki, münafiqlərdən böyük bir münafiq ölmüşdür."

### Yeddinci fəsil: Qiyamət günündə münafiqin əzabının şiddətliyi haqda.

7- Sələmə İbn əl-Əkva (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə xəstəni ziyarət etdik. Mən əlimi onun üzərinə qoyaraq dedim: "Allaha and olsun ki, bugünkü kimi hərarəti çox olan bir adam görmədim. Bu zaman Allahın Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: "Mən sizə qıyamət günündə bundan daha hərarətli birini xəbər verimmi?" O gün səhabələrindən olan iki adam üçün: "Heyvanlarına minib gedən bu iki adam!" deyə buyurdu."

### Səkkizinci fəsil: Yerin, dinindən dönmüş münafiq olan kəsi çıxarması və onu atılmış olaraq tərk olunması haqda.

8- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Bizdən yəni Nəccar oğullarından bir adam vardı. Bəqərə və əl- İmran Surələrini oxumuşdu. Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) vəhy katibliyi edirdi. Bu adam, qaçıb getdi. Əhli kitaba qatıldı. Onlar, onu mükafata verərək özləri yanındakı dərəcəsini yüksəltdilər. Sonra da: "Bu adam, Muhammədə vəhy katibliyi edirdi" dedilər və onu çox bəyəndilər. Lakin çox keçmədən Allah onu onların içərisində ikən boynunu vurdurub öldürdü. Əhl-i kitab, o adam üçün bir məzar qazıb onun içinə basdırdılar. Lakin səhər olunca, yer onu basdırıldığı yerdə xaricinə atmışdı. Sonra döndülər, ona təkrar bir çuxur qazaraq o adamı onun içinə basdırdılar. Səhər olunca yer yenə onu xaricinə atmışdı. Sonra döndülər, onun üçün təkrar bir çuxur qazaraq o adamı onun içərisinə basdırdılar. Lakin səhər olunca, yer yenə onu xaricinə atmışdı. Nəhayət onu atılmış olaraq buraxdılar."

## Qiyamətin vəsfi kitabı.

### Birinci fəsil: Qiyamət günü Allah Təala yeri ovcunun içinə alacaq (göylər isə Onun Əli ilə bükülləcəkdir).

1- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Uca Allah, qiyamət günü, göyləri bükəcək, sonra onları sağ əliylə götürəcəkdir." Sonra da: "Məlik (Şah,) ancaq Mənəm! Cəbbarlar (zalımlar) haradadır! Təkəbbürlülər haradadır!" deyəcəkdir. Sonra sol əliylə də yerləri bükəcək. Sonra da: Məlik (Şah,) ancaq Mənəm! Cəbbarlar (zalımlar) haradadır! Təkəbbürlülər haradadır!" deyə buyuracaqdır."

### İkinci fəsil: Qiyamət günündə yerin necə olacağının vəsfi.

2- Səhl İbn Səad Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qiyamət günü insanlar ağ, incə undan edilmiş

kökə kimi qırmızıya çalan ağ bir yerdə toplanacaqlar.orada heç kimin əlaməti (evi, ona aid nişanəsi) olmayacaqdır."

## Üçüncü fəsil: Hər bir qul öldüyü hal üzrə diriləcəkdir.

3- Cabir, Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Hər bir qul öldüyü hal üzrə diriləcəkdir."

## Dördüncü fəsil: Əməllər üzərində dirilmək.

4- Abdullah İbn Ömər, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təala bir qövmə əzab vermək istəsə orada olanların hamısına əzab toxunar. Sonra əməlləri üzərinə dirildilərlər."

## Beşinci fəsil: İnsanlar ayaqyalın, çılpaq və sünnətsiz məhşərə toplanacaqlar.

5- Aişə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Qiyamət günü insanlar ayaqyalın, çılpaq və sünnətsiz məhşərə toplanacaqlar". Mən dedim: "Ey Allahın Elçisi! Kişilər, qadınlar (birlikdə çılpaq olaraq həşr ediləcəklər və) bir-birilərinə baxmayacaqlar?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Aişə məsələ bir-birlərinə baxmaqlarından da pisdir!"

## Altıncı fəsil: İnsanlar firqələr olaraq həşr ediləcəklər.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İnsanlar üç firqə olaraq həşr ediləcəklər. İstəklilər, İstəməyənlər (çəkinənlər), iki adam bir dəvə üzərində, üç adam bir dəvə üzərində, dörd adam bir dəvə üzərində və on adam bir dəvə üzərində olanlar, Geri qalanlarını cəhənnəm yığacaq, gecələdikləri yerdə onlarla birlikdə gecələyəcək, istirahət etdikləri yerdə onlarla birlikdə istirahət edəcək; səhərlədikləri yerdə onlarla birlikdə səhərləyəcək, axşamladıqları yerdə onlarla birlikdə axşamlayacaqdır."

## Yeddinci fəsil: Qiyamət günü kafirin üzü üstə həşr olunması.

7- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Ey Allahın Elçisi Kafir qiyamət günündə üzü üstü necə həşr olunur?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Dünyada onu iki ayağı üstə yeridən (Allah), qiyamət günündə onu üzü üstə yeritməyə qadir deyilmi?" Qətədə "Bəli (əlbəttə) Rəbbimizin izzətinə and olsun ki (O qadirdir)" dedi."

## Səkkizinci Fəsil: Qiyamət günündə günəşin xalqa yaxınlaşması.

8- Süleym İbn Amir belə rəvayət edir: "Miqdad İbn əl-Əsvad mənə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət etdi: "Qiyamət günündə günəş məxluqata yaxınlaşacaq hətta onlara bir mil miqdarı yaxın olacaq" (Süleym İbn Amir belə demişdir: "Allaha and olsun ki, mil ilə nəyi; "yerin məsafəsinimi yoxsa gözə sürmə çəkilən milimi" nəzərdə tutduğunu

bilmirəm.) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: "İnsanlar əməlləri miqdarında tər içində olacaq; kimisi topuqlarına qədər, kimisi dizlərinə qədər, bəziləri körpücük sümüklərinə qədər olacaq bəzilərinə də isə tər .buxov kimi buxovlayacaqdır." Miqdad belə demişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əliylə ağızına işarə etdi."

### Doqquuncu fəsil: Qiyamət günü tərin çox olması.

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz ki, qiyamət günündə tər, yerin içinə yetmiş arşın gedəcəkdir. Və şübhəsiz ki, o insanlann ağızlarına yaxud qulaqlarına çatacaqdır" (Sovr onların ikisindən hansı olduğnu şəkk etmişdir.)"

10- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təala Cəhənnəm əhlindən ən yüngül əzab olunana deyəcək: "Əgər dünya və onun içindəkilər sənin olsaydı fəda edərdinmi?" O: "Bəli!" deyəcəkdir. Allah Təala deyəcək: "Artıq səndən Adəmin belində olanda bundanda daha yüngül bir şey: "şirk etmə!" (zənn edirəmki belə dedi) səni oda daxil etməyim." istədim. Sən isə (inad edərək) şirk etdin."

## Cənnətin vəsfi kitabı.

### Birinci fəsil: Cənnətə girən ilk dəstə haqda.

1- Muhəmməd (İbn Sirin) belə rəvayət edir: " Cənnətdə kişilər yoxsa qadınlar daha çox olacaq? "(bu məsələ barəsində Səhabələr) ya fəxr, ya da müzakirə etdilər. Bu zaman Əbu Hüreyrə(Allah ondan razı olsun) belə dedi: "Əb əl-Qasım (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) demədimi ki, "Həqiqətən cənnətə ilk girəcək zümrə Bədir (dolmuş ay) gecəsindəki ay şəklində, ondan sonra girənlər səmadakı parlaq ulduzların işığı şəklində olacaq. Onlardan olan hər bir kişiyə iki arvad veriləcək .Onların baldırının ilikləri ətin arxasından görünəcək. Cənnətdə subay olmayacaq."

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ümmətimdən cənnətə ilk girəcək zümrə, Bədir gecəsindəki ay şəklində, sonra onların ardından girənlər, göydəki ən işıqlı ulduz şəklində olacaq, bundan sonra onlar mənzil sahibi olacaqlar. Onlar heç nə ifraz etməzlər, Orada fınxırmazlar tüpürməzlər, Onların daraqları qızıl, buxulandıqları (tüstü şəklində ətirləndikləri) əl-Əluvva (ud ağacından olan) ətiri. tərləri müşk, əxlaqları ataları Adəm boyunda altmış ərşin uzun bir adamın əxlaqı olacaq." İbn Əbu Şeybə belə dedi: "Bir kişinin əxlaqı üzərində", Əbu Kureyb isə belə dedi: "Bir kişinin yaradılışında", İbn Əbi Şeybə isə "Atasının şəklində" dedi."

### İkinci fəsil: Cənnətə girən Adəmin surətində olacaq.

3- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Allah Təala Adəmi öz surətində yaratdı. Onun uzunluğu altmış dirsəkdir. Adəmi yaratdıqda ona dedi: "Get orada oturan mələklərə salam ver, onların səni necə salamlayacağına da (diqqət et) dinlə. O salam sənin və övladlarının salamı olacaqdır". Adəm getdi və "Əs-sələmu aleykum" - deyə salam verdi, mələklər də "Əs-sələmu aleykə və rahmətullah" -

deyə cavab verdilər. Onlar və rahmətullah (sözünü) əlavə etdilər. Cənnətə girən hər bir kəs Adəmin (ona Allahın salamı olsun) surətində,uzunluğu da altmış dirsək olacaqdır. Adəmdən sonra xalq (yaradılanlar) indiyə qədər əksilməkdə (kiçilməkdə) davam edir."

### Üçüncü fəsil: Cənnətə ürəkləri quş ürəyi kimi olan qövmlər girəcək

4- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cənnətə ürəkləri quş ürəyi kimi olan qövmlər girəcək."

### Dördüncü fəsil: Cənnət əhlinə razılığın halal edilməsi.

5- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz ki Allah, Cənnət əhlinə : "Ey Cənnət əhli" deyəcək. Onlar da: "Rəbbimiz! Buyur, əmrindəyik, eşidirik! Xeyir, Sənin əllərindədir" deyəcəklər. Allah: "Razı oldunuzmu?" deyə soruşacaq. Onlar: "Ya Rəbb! Sənin verdiklərinə necə razı olmayaq? Sən, məxluqatından heç kimə vermədiyin bu qədər neməti bizə verdin!" deyəcəklər. Allah: " Sizə bundan daha qiymətlisini verimmi?" deyəcək. Onlar: "Ya Rəbbi! Bundan daha qiymətli nə ola bilər". O da: "Sizə razılığımı halal edirəm, sizə heç vaxt qəzəblənməyəcəyəm!" deyəcək."

### Beşinci fəsil: Cənnət əhlinin otaq sahiblərini görmələri (baxmalıarı).

6- Əbu Səid əl-Xudri Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz Cənnət əhli üzərindəki otaq sahiblərini sizin şərq və ya qərb üfüqündə qovuşmaqda olan parlaq ulduzu gördüyünüz kimi görərlər. Çünki aralarında fərq vardır" Səhabələr: "Ya Peyğəmbər! Bunlar Peyğəmbərlərin yerləridir. Başqaları onlara çata bilməz" dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Əksinə! Nəfsim əlində olan Allaha and içərəm ki,Onlar Allaha iman edib və Peyğəmbərləri təsdiq edən adamlardır."

### Altıncı fəsil: Cənnət əhlinin cənnətdə yeməyi.

7- Cabir İbn Abdullah (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cənnətin sakinləri yeyib-içər, amma heç nə (sidik, nəcis) ifraz etməzlər, tüpürməzlər. Onların yedikləri gəyirməklə bədənlərindən xaric olar, ondan da müşk qoxusu gələr. Özlərinə nəfəs almaq ilham edildiyi kimi, təsbeh (subhanallah demək) və həmd ilham olunar."

### Yeddinci fəsil: Cənnət əhlinin töhfəsi (hədiyyəsi) haqda.

8- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mövalsı olan Sovban belə rəvayət edir: " Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında durmuşdum və bu zaman yəhudi alimlərindən bir alim gəlib "Əssələmu aleykə ya Muhəmməd "dedi. Bu zaman mən onu elə itələdim ki,az qala yıxılacaqdı. O "Məni nə üçün itələyirsən?" dedi. Mən dedim: "Ey Peyğəmbər deyə bilməzsənmi?" Yəhudi dedi: "Biz yalnız onu ailəsinin qoyduğu adla çağırırıq." Bu zaman Peyğəmbər (ona, ailəsinə və

səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Həqiqətən ailəmin məni qoyduğu adım Muhəmməddir." Yəhudi dedi: "Sənin yanına səndən (bəzi şeyləri )soruşmağa gəldim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Əgər sənə danışsam bir faydası olacaqmı?" Yəhudi dedi: "Qulaqlarımla dinləyirəm". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanındakı bir çubuq ilə yerə xəttlər çəkərək: "Soruş"dedi. Yəhudi dedi: "Yerin başqa yerlə və göylərin dəyişdiriləcəyi gün insanlar harada olacaq? "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Qaranlıq içində körpünün (Siratın) yanında olacaqlar". Yəhudi: "İnsanlardan (körpünü) ilk keçən kim olacaq?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Kasıb mühacirlər." Yəhudi dedi: " Cənnətə girərkən onların hədiyyəsi nə olacaq?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Balıq ciyərinin (ləzzətli) bir tərəfi!" Yəhudi" Onun arxasından yeməkləri nə olacaq?" deyə soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Onlara cənnətin ətrafında otlayan cənnət öküzü kəsiləcək." Yəhudi "Onun üstünə nə içkilər olacaq?" dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Orada Səlsəbil adı verilən bir çeşmədən (içkilər olacaq)". Yəhudi dedi: "Doğru söylədin." (və əlavə edərək) belə dedi: "Mən sənə yer üzərində yaşayanlardan bir peyğəmbərdən yaxud bir və ya iki adamdan başqa heç kəsin bilmədiyi bir şeyi soruşmağa gəldim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Əgər sənə danışsam bir faydası olacaqmı?" Yəhudi: "Qulaqlarımla dinləyirəm." cavabını verdi və əlavə etdi: " Sənə uşaq haqqında (onun necə meydana gəlməsini) soruşmağa gəldim". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Kişinin sperması ağ, qadının sperması isə sarıdır. Bunlar bir yerə gəldikdə, kişinin sperması qadının spermasına üstün gələrsə Allahın izni ilə oğlan doğular. Qadının sperması kişinin spermasına üstün gələrsə Allahın izni ilə qız doğular." Yəhudi: "Doğru söylədin həqiqətən sən Peyğəmbərsən" dedi sonra dönüb getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Həqiqətən bu adam mənə soruşacağını soruşdu. Amma mən onun sor-şduqlarından bir şey bilmirdim. Allah Təala onları mənə bildirdi."

## Səkkizinci fəsil: Cənnət əhlinin nemətinin davamiyyətli olması.

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cənnətə girən kimsə; nemət görər, kasıblıq görməz, paltarı köhnəlməz və gəncliyi tükənməz."

## Doqquzuncu fəsil: Cənnətdə bir ağac vardır ki, miniklə gedən onun kölgəsində yüz il gedər (amma ) kölgəsini bitirə bilməz.

10- Səhl İbn Səad (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Həqiqətən cənnətdə bir ağac vardır ki, miniklə gedən onun kölgəsində yüz il gedər (amma ) kölgəsini bitirə bilməz." Əbu Hazim deyir ki, ən-Numan İbn Əbi Abbas əz-Zuraqiyə bunu danışdım və o belə dedi. Əbu Səid əl-Xudri mənə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə rəvayət etdi: "Həqiqətən cənnətdə bir ağac vardır. Təlim keçmiş sürətli bir miniklə gedən yüz il gedər, onun kölgəsini bitirə bilməz."

## Onuncu fəsil: Cənnət çadrının vəsfi.

11- Əbu Musa (Allah ondan razı olsun) belə rəvayət edir Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən Cənnətdə içi boş incidən bir çadır vardır. Genişliyi altmış mildir. Onun hər küncündə bir ailə vardır. Onlar başqalarını görməzlər. Mömin onları gəzər."

### On birinci Fəsil:Cənnətin bazarı

12- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən, Cənnətdə insanların hər cümə gəldiyi bazar vardır. Orada insanların sifətlərinə və libaslarına vuraraq onları daha da gözəlləşdirən şimal küləyi əsir. Onlar gözəllikləri artmış halada öz əhillərinə dönərlər.Onların əhilləri (evdə qalanlar) onlara deyirlər: " Allaha and olsun ki, biz sizinlə vidalaşdıqdan sonra siz daha da gözəlləşmisiniz" Onlar isə belə deyəcəklər: "Biz də Allaha and olsun ki, sizdən ayrılandan sonra siz daha da gözəl olmusunuz."

### On ikinci Fəsil: Dünyadakı Cənnət çayları

13- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Seyhan, Ceyhan, Fərrat və Nil (çaylarının hamısı) cənnət çaylarındandır."

### On üçüncü fəsil: Cənnət xoşa gəlməyən şeylərlə sarılmışdır (əhatə edilmişdir).

14- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cənnət xoşa gəlməyən şeylərlə, cəhənnəm isə şəhvətlərlə əhatə edilmişdir."

### On dördüncü fəsil: Cənnət sakinlərinin ən azı qadınlardır.

15- Əbu ət-Təyyah belə rəvayət edir: "Mutərrif İbn Abdullahın iki arvadı vardı. Onların birinin yanından gəldi, o biri: "Sən filan xanımın yanındanmı gəldin?" deyə soruşdu. O da: "Mən İmran İbn Hüseynın yanından gəldim. O bizə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət etdi: "Həqiqətən cənnət sakinlərinin ən azı qadınlardır."

### On beşinci fəsil: Cənnət və Cəhənnəm əhli və onların dünyadakı əlamətləri.

16- Harisə İbn Vahb Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitmişdir: "Sizə Cənnət əhlini xəbər verimmi? Onlar: "Bəli" dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Hər zəif, insanlar tərəfindən zəif görülən hər mömin kimsə ( cənnətlikdir). O mömin kimsə, Allaha and içsə, şübhəsiz ki Allah o kimsəni andında doğru çıxarar" Sonra belə dedi: "Sizə cəhənnəm əhlini xəbər verimmi?". Onlar: "Bəli!" dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə buyurdu: " Hər daş ürəkli, lovğa (mal mülk yığan və sədəqəni qadağan edən) və təkəbbürlü olan (hər kimsə isə cəhənnəmlikdir)."

17- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Nə qədər qapılardan qovulmuş dağınıq (saçlı) insan vardır ki, Allaha and içsə şübhəsiz Allah onu bu andında doğru çıxarar."

18- İyad İbn Himar əl-Məcəşi (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün xütbəsində belə dedi: " "Bilin ki, Rəbbim mənə öyrətdiklərindən bilmədiklərinizi bu gün sizə öyrətməmi əmr edib; "Qula verdiyim hər mal halaldır. Mən qullarımın hamısını hənifl ər (müsəlman) olaraq yaratdım. Amma şeytanlar onlara gələrək dinlərindən döndərdilər və Mənim onlar üçün halal etdiklərimi, onların üzərinə haram etdilər. Mənim, haqqında dəlil endirmədiyim bir şeyi Mənə ortaq qoşmalarını əmr etdilər."Şübhəsiz ki Allah, yer xalqına baxaraq onların ərəbinə, əcəminə şiddətlə nifrət etmişdir. Yalnız Əhli kitabdan doğru din üzərində qalanlar müstəsna! Və demişdir: "Mən səni ancaq sınamaq və səninlə başqalarını sınayım deyə göndərdim. Sənə suyun yuyub apara bilmədiyi bir kitab endirdim. Onu yatarkən və oyaq ikən oxuyasan" Həqiqətən Allah mənə Qüreyşi yandırmamı (həqiqi mənada deyil; yəni haqq eşitdirməklə) əmr etdi. Mən: "Rəbbim! O halda mənim başımı bir çörək parçası kimi yarararaq bir çörək parçası kimi edərlər." dedim. Uca Allah: "Onlar səni necə çıxardılarsa sən də onları çıxar. Onlarla döyüş ki, sənə kömək edək. Xərclə ki, biz də sənə xərcləyək! Sən bir ordu göndər, Biz də onun kimi beş ordu göndərək! Sənə itaət edənlərlə birlikdə, üsyan edənlərə qarşı döyüş" buyurdu.Cənnətliklər üç qisimdir: "Qüvvət sahibi, ədalətli, sədəqə verməyə müvəffəq olmuş bir kimsə!", "Hər qohuma və müsəlmana qarşı zərif ürəkli, mərhəmətli olan bir kimsə!". "İffətli, namuslu, ailə sahibi olan kimsə Cəhənnəmliklər isə beş qisimdir: "Ağılı olmayan zəif adam! Belə kəslər, sizin aranızda sizə tabe olacaqlar. Heç bir ailə və mala tabe olmazlar. (Dini və dünyəvi mal əldə etmək üçün səy etməyəcəklər)", "Ac gözlüyü ortaya çıxmayan xain kimsə! Acgözlüyü incəlib kiçilsə də şübhəsiz xainlik edər.", "Axşam və səhər səni ailən və malın haqqında aldadan kimsə!", "Xəsisliyi və ya yalançılığı da zikr etdi.", "pozqun fahiş işlər görən."

### On altıncı fəsil: Cənnət əhlinin və cəhənnəm əhlinində olduqları yerdə əbədi qalması.

19- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Cənnət əhli cənnətə,cəhənnəm əhli də cəhənnəmə daxil olduqdan sonra ölüm bir qoç şəklində gətirilərək Cənnətlə Cəhənnəm arasında durdurular. Sonra bu ölüm qoçu kəsiləcək və "Ey Cənnət əhli, əbədilik var, ölüm yoxdur! Ey Cəhənnəm xalqı, əbədilik var, ölüm yoxdur!" deyiləcəkdir. Cənnət əhlinin sevincinin üzərinə sevinc, Cəhənnəm əhlinin kədərlərinin üzərinə isə kədər gələcəkdir."

# Cəhənəmin vəsfi kitabı.

### Birinci fəsil: Cəhənnəm zəncirləri.

1- Abdullah İbn Məsud (Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cəhənnəm yetmiş min zəncirlə gətiriləcək və həmin zəncirləri yetmiş min mələk dartacaqdır."

### İkinci fəsil: Cəhənnəm istiliyinin şiddəti

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Adəm oğlunun

yandırmaqda olduğu bu (dünya) atəşiniz, Cəhənnəm istiliyinin yetmiş hissəsindən bir hissədir." Səhabələr " Allaha and olsun ki, həqiqətən bu kifayət edəcək ey Allahın Elçisi." dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: "Həqiqətən Cəhənnəm atəşinin hər birinin istiliyi dünya atəşinin istiliyi qədər olmaqla ondan altmış doqquz dəfə daha çox yaradılmışdır."

### Üçüncü fəsil: Cəhənnəmin dibinin dərinliyi.

3- Əbu Hüreyrə ((Allah ondan razı olsun) belə rəvayət edir: "Bir gün biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bərabər idik. Birdən düşən bir şeyin səsini eşitdi. Bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Bu nədir? Bilirsinizmi?" deyə buyurdu. Biz: "Allah və Elçisi daha yaxşı bilir" dedik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Bu, yetmiş il əvvəl cəhənnəmin içinə atılmış bir daşdır. İndiyə kimi cəhənnəmin dibinə düşürdü. Nəhayət dibinə indi çatdı."

### Dördüncü fəsil: Cəhənnəm əhlinin əzab etibarı ilə ən yüngül olanı.

4- Numan İbn  Bəşir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cəhənnəm əhlinin ən yüngül əzaba düçar olanı onun oddan hazırlanmış iki ayaqqabısı və ayaqqabıların da bağları olacaq bir kəsdir. Onların istisindən qazan qaynayan kimi onun da beyni qaynayacaq. O özünə verilən əzabdan daha yüngülünü görməyəcək. O, əzaba düçar olanların ən yüngül əzab çəkəni olacaq."

### Beşinci fəsil: Od əzab görənlərdən nəyi yandıracaq (əhatə edəcək).

5- Səmurə İbn Cundub (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz ki cəhənnəm odu, (öz sakinlərinin) bəzilərini topuqlarına qədər, bəzilərini dizlərinə qədər, bəzilərini göbəyinə qədər və bəzilərini isə körpücük sümüklərinə qədər, bəzilərinin qurşağına qədər, bəzilərini isə hulqumuna kimi əhatə edəcəkdir."

### Altıncı fəsil: Cəhənnəmə inadkarlar Cənnətə isə zəiflər daxil olacaq.

6- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cənnətlə Cəhənnəm höcətləşdi. Cəhənnəm dedi: "Mənim içimə təkəbbürlülər və inadkarlar daxil olacaq". Cənnət dedi: "Bəs niyə mənim içimə zəiflər, aciz və (dünya işlərindən) qafil olanlar düşməlidir." Uca Allah Cənnətə buyurdu: "Sən Mənim rəhmətimsən. Səninlə dilədiyim kimsəyə rəhm edərəm". Sonra da Cəhənnəmə buyurdu: "Sən Mənim əzabımsan. Səninlə dilədiyim kimsəyə əzab verərəm. Hər birinizin içinə doldurulacaq (insanlar və cinlər) vardır". Amma Cəhənnəm dolmaq bilməz. Nəhayət Allah  Təala ayağını onun üzərinə qoyar, o da: "Bəsdi, Bəsdi! Deyər vəCəhənnəm dolar. Bir tərəfi o birinə büzüşər (yığılar). Allah heç bir kəsə zülm etməz. Cənnətə gəlincə Allah onun üçün bir neçə varlıqlar yaradır."

### Yeddinci fəsil: Cəhənnəmdə Saibə (Cahiliyyə dövründə heyvanı büt üçün buraxılar və onun üzərində heçbir şey daşınmazdı) qoyanın əzabı haqda.

7- İbn Şihab, Səid İbn əl-Museyyibdən belə eşitdiyini rəvayət edir: "Əl-Bəhira şeytanlar üçün sağılmaqdan saxlanılan (sağılması qadağan olan) dəvədir. Onu insanlardan heç kim sağa bilməzdi. Əs-Səibə isə, Ərəblərin ilahları üçün buraxdıqları dəvədir. Onun üzərində heç bir şey daşınmazdı. İbn əl-Museyyib deyir ki , Əbu Hüreyrə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini söylədi: "Mən Amr İbn Amiri cəhənnəmdə bağırsaqlarını sürüyərkən gördüm.Bu adam ilk səibə buraxan olmuşdu."

### Səkkizinci Fəsil: Cənənnəmdə kafirin azı dişinin böyüklüyü.

8- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " (Cənənnəmdə ) Kafirin azı dişi və ya köpək dişi Uhud dağı qədər olacaqdır. Dərisinin qalınlığı isə üç günlük yol qədər olacaqdır."

9- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Cəhənnəmdə kafirin iki çiyni arası, sürətli bir miniklinin üç gündə qət edəcəyi məsafə uzunluqda olacaqdır "

### Doqquzuncu fəsil: İnsanlara əzab verənlərin əzabı haqda.

10- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cəhənnəm əhlindən olan iki sinif insan var ki, onları görmədim. Yanlarında inək quyruğuna bənzər qamçılarla insanları vuranlar və geyinmiş çılpaq, əymiş və əyən qadınlar. Başları dəvə hörgücü kimidir. Onlar nəinki Cənnətə daxil olmaq, hətta onun qoxusunu belə hiss etməyəcəklər. Halbuki onun qoxusu filan qədər məsafədən duyulur."

11- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Çox yaşasan əllərində inək quyruqları kimi qamçılar olan Allahın qəzəbi içində səhərləyən və Allahın lənəti içərisində isə axşamlayan camaatı görməyin yaxındır."

### Onuncu fəsil: Dünyada ən nemətli olanı Cəhənnəmə bir dəfə salınıb çıxarılması və dünyada ən çətin həyat sürən birisini Cənnətə bir dəfə salınıb çıxarılması haqda.

12- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qiyamət günü Cəhənnəm əhlindən olub dünyada ən nemətli və gözəl yaşayan birisi gətirilib Cəhənnəmə bir dəfə salınıb çıxardılacaq. Ondan: "Ey Adəm oğlu! Sən heç dünyada ikən bir xeyir və nemət gördünmü?" deyə soruşulacaq? O da: "Xeyr, Ey Rəbbim! Heç bir xeyir və nemət görmədim". Deyəcək. Sonra qiyamət günü Cənnət əhlindən olub dünyada ən çətin və məşəqqətli həyat sürən birisi gətirilib Cənnətə bir dəfə salınıb çıxardılacaq. Ondan: "Ey Adəm oğlu! Sən dünyada ikən heç çətinlik və sıxıntı gördünmü?" deyə soruşulacaq? O da: "Xeyr, Ey Rəbbim! Mən heç bir həyat çətinliyi və sıxıntı görmədim!" deyəcəkdir."

# Fitnələr kitabı.

### Birinci fəsil: Fitnələrin yaxınlaşmaı və pislik (fitnə, fəsad) çoxaldıqda həlakın gəlişi haqda.

1- Zeynəb bintu Cəhş (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yuxusundan belə deyərək oyandı: "Lə iləhə illəllah! Yaxınlaşan şərdən ərəbin vay halına! Bu gün Yəcuc və Məcuc səddindən bu boyda dəlik açıldı". (Sufyan əliylə on düyünü etdi.) Bunun üzərinə mən: "Ey Allahın elçisi! İçimizdə saleh kimsələr olduğu halda biz həlakmı olacağıq?" dedim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bəli, (fasiqlik, fahiş əməllər, əxlaqsızlıq, zülm kimi) pisliklər çoxaldığı zaman."

2- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bu gün Yəcuc və Məcuc səddindən bu boyda dəlik açıldı" Vüheyb əliylə doxsan düyünü etdi."

## İkinci fəsil: Fitnələrin yağış yerləri kimi enməsi.

3- Usamə İbn Zeyd (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinənin qalalarının biri üzərinə çıxıb belə buyurdu: "Mənim gördüyümü görürsünüzmü? Mən sizin evlərinizin arasında fitnələrin yerlərini yağış yerləri kimi görürəm."

## Üçüncü fəsil: Fitnələrin ürəklərə ərz olunması və orada ləkə salması.

4- Huzeyfə (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz Ömərin (Allah ondan razı olsun) yanında idik. Bizdən: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) fitnə haqqındakı hədisini kim eşitdi?" deyə soruşdu. Camaat dedi: "Biz onu eşitmişik". O dedi: "Ola bilsin siz, adamın ailəsi malı və qonşusu barəsindəki fitnəsini nəzərdə tutursunuz?" Onlar "Bəli" dedilər. Ömər dedi: "(Xeyr!) o fitnəyə namaz, oruc və sədəqə kəffarə olar. Lakin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəniz dalğası kimi dalğalanacaq olan fitnələri izah edərkən hansınız eşitdi?" Hüzeyfə dedi: "O zaman camaat susdu. Mən isə "onu eşitmişəm" dedim. Ömər dedi: Sənmi! Allah atana rəhm etsin!" Hüzeyfə belə dedi: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu eşitdim: "Fitnələr ürəklərə həsir (çubuqları) kimi budaq budaq ərz olunar. Artıq onlar hansı ürəyə girərsə o ürəkdə qara bir ləkə hasil olar. Hansı ürək onları qəbul etməzsə o ürəkdə də ağ bir ləkə meydana gələr. Beləcə iki ürəyə yerləşərlər. (Bu ürəklərdən) biri (qəmbər) daş kimi ağdır; və göylərlə yer durduqca (davam etdikcə ) ona heç bir fitnə zərər verməz. O birisi isə ağ qara qarışıqlı, başı aşağı dayanan dolça kimidir. Nə bir yaxşını tanıyar, nə də bir pis şeyi inkar edər. Yalnız havasını dadan bilər."Huzeyfə dedi: "Həmçinin ona Səninlə bu fitnələr arasında, qırılmaq üzrə olan bağlı bir qapı vardır" deyə danışdım. Ömər dedi: "Qapı sınacaq? Bu işdə ciddi ol! Əgər açılsaydı bəlkə bağlanardı". Mən dedim: "Xeyr, qapı sındırılacaq". Və ona: " Bu qapının, öldürüləcək yaxud öləcək bir şəxs olduğunu və bunun səhv olmadığını (Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sözündən olduğunu) dedim." Əbu Xalid deyir ki: "Mən Saədə: "Ey Əbu Malik! Bu qara murbaad nədir?" dedim. O dedi: "Qaradakı şiddətli ağartı deməkdir." Mən ona dedim: "Kuzu mucaxxi nədir? O dedi: "(əyri) başı aşağı dolça." deməkdir."

## Dördüncü fəsil: Şeytanın öz ordularını insanları fitnəyə salmaq üçün göndərməsi.

5- Cabir (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " İblis öz taxtını suyun üzərində qurur. Sonra öz ordularını göndərir. Bunların ən çox fitnə edəni ona ən yaxın

olanıdır. Onlardan biri gəlib belə və belə etdim deyir. (İblisdə ona ) belə deyir: "Heç bir şey etmədin!" .Sonra onlardan biri gəlib deyir: "Kişini arvadından ayırmadan onları tərk etmədim!" İblis onu özünə yaxınlaşdırır və deyir: "Sən nə yaxşısan". Əmaş deyir ki, zənn edirəm: "onu mülazim edər." Dedi."

## Beşinci fəsil: Fitnələr və onun sifətləri.

6- Əbu İdris əl-Xəvləni Hüzeyfə İbn əl-Yəmənin belə dediyini rəvayət edir. "Allaha and olsun ki, mən özümlə qiyamət arasında olacak hər fitnəni insanlardan ən yaxşı bilənəm. Mən də Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu barədə mənə gizlicə bildirdiyi, məndən başqa heç bir kəsə söyləmədiyi bir sirdən başqa bir şey yoxdur. Lakin Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim də olduğum bir məclisdə fitnələrdən danışarkən söylədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) fitnələri sayarkən belə dedi: "Onlardan üçü heç bir şey buraxmayacaqdır. Onlardan yaz küləyi kimi fitnələr vardır ki, bəziləri kiçik, bəziləri isə böyükdür." Hüzeyfə belə buyurmuşdur: "Məndən başqa onların hamısı (ölüb) getmişdir."

7- Huzeyfə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) aramızdan qalxdı, o məqamından qıyamətə qədər olacaq hər şeyi söylədi. Əzbərləyən əzbərlədi, unudan da unutdu. Onları mənim bu yoldaşlarım bildi. Mən onlardan bir şey unudanda, yoldaşımı görürəm və xatırlayaram. Necə ki, bir kişi digərindən ayrıldığında, onun üzünü xatırlayar, sonra gördüyündə isə onu tanıyar."

8- Hüzeyfə ((Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə qiyamət qopana qədər olacaq hər şeyi xəbər verdi. Onlardan elə bir şey yoxdur ki, mən ondan soruşmayım. Yalnız ondan; "Mədinəliləri Mədinədən nə çıxaracaq?" deyə soruşmadım."

9- Əbu Zeyd (yəni Amr İbn Axtab) (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə sübh namazını qıldırdı və minbərə çıxaraq günorta vaxtı girənə qədər bizə xütbə oxudu. (Sonra) endi namazı qıldı. Sonra (yenə) minbərə çıxdı və bizə əsr vaxtı gələnə qədər xütbə oxudu. Sonra enərək namazı qıldı. Sonra təkrar minbərə çıxdı və bizə günəş batana qədər xütbə oxudu. Artıq bizə olmuş və olacaq hər şeyi xəbər verdi. Bunları ən yaxşı bilənimiz, ən yaxşı əzbərləyənimizdir."

## Altıncı fəsil: Fitnlər və onları əzbərləyən haqda.

10- Muhammad Cundubun belə dediyini rəvayət edir: "Əl-Cərəa günü (oraya) gəldim. Bir də baxdım bir adam oturub. Mən ona: "Burada bu gün mütləq qan töküləcək" dedim. O adam: "Allaha and olsun ki, Xeyr (elə deyil)!" dedi. Mən: "Allaha and olsun ki, Bəli (elədir)! "dedim. O: "Allaha and olsun ki, Xeyr (elə deyil)!" dedi. Mən: "Allaha and olsun ki, Bəli (elədir)!" dedim. O: "Allaha and olsun ki, Xeyr (elə deyil)!" Bu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə söylədiyi bir hədisidir." dedi. Mən: "Bu gündən bəri sən nə pis yoldaşsan. Eşidirsən ki, sənə müxalif çıxıram. Madam ki, bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdin, məni niyə qadağan etmirsən" dedim. Sonra: "Bu qəzəblənmək nəyə görədir?" dedim və ona dönərək soruşdum. Birdə gördüm ki, o adam Hüzeyfədir."

## Yeddinci fəsil: Fitnə məşriq tərəfdədir.

11- Səlim İbn Abdullah bin Ömərin (Allah onlardan razı olsun) belə dediyi rəvayət olunur: "Ey İraqlılar! Siz böyük günahları etdiyiniz halda kiçik günahlar barədə soruşursunuz! Eşitdim ki, atam Abdullah İbn Ömər Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini deyir."Şübhəsiz ki, fitnə bu tərəfdən gələcəkdir" və əli ilə məşriq tərəfə şeytanın iki buynuzunun çıxacağı yeri işarə etdi! Halbuki siz bir-birinizin boyunlarını vurursunuz. Musa (Ona Allahın salamı olsun) firovn əhlindən öldürdüyü şəxsi ancaq səhvən öldürmüşdü .Allah Təala ona dedi: "Sən bir nəfəri vurub öldürdün. Sonra Biz səni o qəmdən qurtardıq. Biz səni bir çox sınaqlardan keçirtdik "

## Səkkizinci fəsil: Kisra və Qeysərin xəzinələri mütləq Allah yolunda xərclənəcək.

12- .Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Artıq Kisra ölmüşdür. Ondan sonra Kisra yoxdur. Qeysər həlak olsa ondan sonra da Qeysər yoxdur. Nəfsim əlində olan Allaha and içərəm ki, onların ikisinin xəzinələri mütləq Allah yolunda xərclənəcək."

13- Cabir İbn Səmurə Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Müsəlmanlardan və yaxud möminlərdən bir kiçik bir dəstə Kisra əhlinin xəzinəsini mütləq fəth edəcəkdir." Quteybə: "Müsəlmanlardan" dedi.və şübhə etmədi."

## Doqquzuncu fəsil: Bir-birlərinin səbəbi ilə bu ümmətin həlak olması.

14- Səvban (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Həqiqətən Allah mənə yeri cəmlədi, onun şərqini və qərbini gördüm. Həqiqətən, mənim ümmətim mənə göstərilən ərazi üzərində hakim olacaq. Mənə qırmızı və ağ (olan) iki xəzinə də verildi. Mən Rəbbimdən ümmətim üçün onu qıtlıq iliylə həlak etməməsini istədim. Bir də onların üzərinə öz şəxsi aralarında olan düşmənlərdən başqa xarici düşməni göndərib məhv etməməsini istədim. Rəbbim buyurdu: "Ey Muhamməd! Mən bir hökm versəm, o geri çevrilməz. Mən ümmətini ümumi qıtlıqla həlak etməyəcəyimə və onlara öz şəxsi aralarında olan düşmənlərdən başqa xarici düşmən göndərib, həlak etməyəcəyimə vəd edirəm. Hətta qonşu əyalətlərin sakinləri də onların əleyhinə çıxsa, onların bütövlüyünü saxlayacağam. Amma yalnız o vaxta qədər ki,onlar bir-birini məhv və əsir edənə kimi."

15- Amir İbn Saad atasından belə rəvayət edir: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün Aliyədən gəldi. Bəni Muaviyə məscidinin yanından keçərkən oraya daxil oldu və iki rukət namaz qıldı. Bizdə onunla qıldıq. Rəbbinə uzun dua etdi. Sonra bizə tərəf çevrildi və dedi: "Rəbbimdən üç şey istədim, ikisini qəbul etdi, birini isə qəbul etmədi. İstədim ki, ümmətimi quraqlıqla həlak etməsin, ( bu )istəyimi qəbul etdi, (həmçinin) istədim ki, ümmətimi (daşqınla, sellə) boğaraq həlak etməsin, (onu da) qəbul etdi, (lakin])istədim ki, ümmətimin arasına ixtilaf salmasın (bir-biri ilə ixtilaf etməsinlər) bunu isə qəbul etmədi."

## Onuncu fəsil: Sizdən əvvəlkilərin yollarını təqib edəcəksiniz.

16- Əbu Səid əl-Xudri Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizdən əvvəlkilərin yollarını, şübhəsiz qarış-qarış, arşın-arşın təqib edəcəksiniz. Onlar bir kərtənkələ deşiyinə girsələr, siz

də arxalarınca girəcəksiniz." .Biz dedik : "Ey Allahın Elçisi! Yəhudilər və xaçpərəstlərmi deyirsən?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Başqa kim ola bilər?!" dedi."

### On birinci fəsil: "Ümmətimi Qüreyş həlak edəcək " və onlardan uzaq durmaq əmri.

17- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ümmətimi Qüreyşin bu qəbiləsi həlak edəcək" (Səhabələr) dedilər: "Bizə nə etməmizi əmr edərsən?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Kaş ki insanlar, onlardan uzaq dursalar!"

### On ikinci fəsil: Fitnələr olacaqdır.(Bu zaman) Oturan kimsə ayaqda durandan xeyirlidir.

18- Əbu Bəkrə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Fitnələr olacaqdır. Bilin ki,sonra bir fitnə çıxacaq. O fitnədə oturan kimsə yürüyəndən , yürüyən kimsə qaçandan xeyirlidir. Bilin ki, fitnə endiyi və ya olduğu vaxt kimin dəvələri varsa dərhal dəvələrinin yanına getsin. Kimin qoyunu varsa qoyunlarının yanına getsin. Və kimin torpağı varsa torpağına getsin!" Bu zaman bir kişi dedi: "Ey Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Dəvəsi, qoyunu və torpağı olmayana nə buyurursan? Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Qılıncını götürüb, daşla onun iti tərəfinə vursun. Sonra xilas olmağa gücü çatsa xilas olsun. Allahım! Təbliğ etdimmi? Allahım! Təbliğ etdimmi? Allahım! Təbliğ etdimmi?" dedi. Bir kişi dedi: "Ey Allahın elçisi! (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məcbur olunub iki səfdən birinə yaxud iki dəstədən birinə aparılsam və məni bir adam qılıncı ilə vurarsa, yaxud bir ox gələrək məni öldürsə (bu halda necə olacaq?) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Həm öz günahı, həm sənin günahın yüklənər və Cəhənnəm əhlinddən olar."

### On üçüncü fəsil: Əgər iki müsəlman qılıncları ilə üzləşərsə, ölən və öldürən cəhənnəmdədirlər".

19- Əhnaf İbn Qeys deyir ki, mən bu adamı nəzərdə tutaraq yola çıxdım. Mənə Əbu Bəkr rast gəldi və dedi: "Ey Ahnəf! Hara getmək istəyirsən?" Mən dedim: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əmisi oğlu Nasra (yəni Əliyə, Allah ondan razı olsun) getmək istəyirəm." Mənə dedi: "Ey Ahnəf. Geri dön! Çünki mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Əgər iki müsəlman qılıncları ilə üzləşərsə, öldürən və ölən cəhənnəmdədirlər " Mən dedim (və yaxud deyildi)" Ya Peyğəmbər! Bu öldurən (cəhənnəmdə olmasını başa düşürük).Bəs ölən niyə (cəhənnəmdə olur)?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə dedi: "O həqiqətən yoldaşını öldürmək istəyirdi."

### On dördüncü fəsil: Ammarı zülümkar bir dəstə öldürəcək.

20- Ummu Sələmə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ammarı zülümkar bir dəstə öldürəcək."

## On beşinci fəsil: İddiaları bir olan iki böyük dəstə vuruşmayınca qiyamət qopmayacaq.

21- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İki böyük dəstə vuruşmayınca və aralarında böyük bir hərb olmadıqca qiyamət qopmayacaq. (Halbuki) bunların iddiaları birdir."

## On altıncı fəsil: İnsan məzarın yanından keçərkən "Kaş ki, onun yerində mən olaydım"deməyincə, qiyamət saatı qopmayacaq.

22- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Nəfsim əlində olan Allaha and olsun ki, insan məzarın yanından keçərkən özünü yerə çırpıb; "Kaş ki, onun yerində mən olaydım" deməyincə, dünyanın sonu gəlməyəcək. Bu zaman ona üz verən bədbəxtçilikdən başqa onun heç bir borcu olmayacaq."

## On yeddinci fəsil: Qətl çoxalmadıqca qiyamət qopmayacaq.

23- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hərc  çoxalmadıqca qiyamət qopmayacaq." (Səhabələr ) dedilər: Hərc nədir Ey Allahın Elçisi?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Qətldir, qətldir!"

## On səkkizinci fəsil: Qatil nə üçün qətl törətdiyini bilmədiyi zaman gəlməyincə qiyamət saatı qopmayacaq.

24- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Nəfsim əlində olan Allaha and olsun ki,qatil nə üçün qətl törətdiyini, ölən isə nə üçün öldüyünü bilmədiyi zaman gəlməyənə qədər dünyanın sonu gəlməyəcək. Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə deyildi: " Bəs bu necə baş verəcək"? O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə dedi: "Bu elə qətllər olacaq ki, həm qatil həm də öldürülən cəhənnəmə düşəcəkdir."

## On doqquzuncu fəsil: Hicazdan alov püskürməyincə qiyamət qopmaz.

25- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hicazda, Busradakı dəvələrin boyunlarını işıqlandıran alov püskürməyincə qiyamət qopmaz."

## İyirminci fəsil: Dəvs qəbiləsi Zul-Xələsəhə ibadət etməyincə qiyamət saatı qopmayacaq.

26- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dəvs qəbiləsinin qadınları Zul-Xələsəh bütünün ətrafına fırlanmağa başlanmayınca qiyamət saatı qopmayacaq". O cahiliyyət dövründə Təbələtədə (Yəməndə yer adı) Dəvs qəbiləsinin ibadət etdiyi büt olmuşdur."

## İyirmi birinci fəsil: Lat ilə Uzzaya ibadət olunmadıqca Qiyamət qopmayacaq.

27- Aişə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Lat ilə Uzzaya ibadət olunmadıqca, gecə ilə gündüz getməyəcək". O zaman mən dedim: " Ey Allahın Elçisi! Mən zənn edirdim ki Allah: "Müşriklərin xoşuna gəlməsə də, onu (islamı) bütün dinlərdən üstün etmək üçün Öz Peyğəmbərini hidayət (Quran) və haqq dinlə göndərən Odur!" ayəsini endirdiyi vaxt iş tamam olmuşdur. Peyğəmbər(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Şübhəsiz ki, bundan Allahın istədiyi olacaq. Sonra Allah gözəl bir külək göndərəcək və ürəyində xardal dənəsi qədər iman olan hər kəsi öldürəcək, təkcə xeyirsiz olanlar qalacaq. Onlar da atalarının dininə dönəcəklər."

## İyirmi ikinci fəsil: Bir tərəfi quruda, bir tərəfi dənizdə olan bir şəhər zəbt olmadıqca qiyamət qopmayacaq.

28- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Siz bir tərəfi quruda, o biri tərəfi isə dənizdə olan bir şəhər haqqında eşitmisinizmi? "Səhabələr dedilər: "Bəli ya Peyğəmbər!" O, dedi: "İshaq oğullarından yetmiş min adam bu şəhəri zəbt etməyənə qədər qiyamət qopmayacaqdır. Onlar ona yaxınlaşıb dayanacaqlar. Onlar nə əllərində silahla vuruşacaq nə də ox atacaqlar. Onlar deyəcəklər: "Lə ilahə illəllah .Vallahu əkbər "(Allahdan başqa heç bir məbud yoxdur, Allah hər şeydən böyükdür) və qala divarlarının bir hissəsi dağılacaq (Sovr belə demişdir: "Mən onun ancaq belə dediyini bilirəm.") Dənizdəki tərəf dağılacaq. Sonra ikinci dəfə deyəcəklər : " Lə ilahə illəllah .Vallahu əkbər " və qala divarlarının başqa hissəsi dağılacaq. Sonra onlar üçüncü dəfə deyəcəklər: "Lə ilahə illəllah.Vallahu əkbər " və onların qarşısında yol açılacaq. Onlar şəhərə girib qənimət götürəcəklər. Onlar qənimətləri bölərkən belə səs eşidəcəklər: " Dəccal artıq çıxmışdır" Onlar da hər şeyi atıb geriyə dönəcəklər."

## İyirmi üçüncü fəsil: Fərat aralanmayana qədər və bu yerdə qızıldan dağ əmələ gəlməyənə qədər Qiyamət saatı qopmayacaq.

29- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Fərat aralanmayana qədər və bu yerdə qızıldan dağ əmələ gəlməyənə qədər Qiyamət saatı qopmayacaq. İnsanlar bu qızıla görə bir-biri ilə vuruşacaq və hər yüz adamdan doxsan doqquzu öləcək. Bu zaman onlardan hər biri belə deyəcək: "Bəlkə elə sağ qalan mən olacağam."
30- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Fəratın aralanacağı və onun yerində qızıl xəzinəsinin əmələ gələcəyi saata az qalıb. Kim ora gəlsə, ondan heç nə götürməsin."

## İyirmi dördüncü fəsil: Üzləri dəri ilə halqalanmış qalxanlara bənzər qövmlə döyüşmədikcə Qiyamət qopmaz.

31- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Siz Qiyamətə yaxın ayaqqabları tükdən, üzləri dəri ilə halqalanmış qalxanlara bənzər, üzləri qırmızı, gözləri kiçik, bir qövmlə döyüşəcəksiniz."

### İyirmi beşinci fəsil: Qahtandan olan adam çıxmayana qədər qiyamət saatı qopmayacaq.

32- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: Öz əsası ilə insanları ardınca aparan Qahtandan olan adam çıxmayana qədər qiyamət saatı qopmayacaq."

### İyirmi altıncı fəsil: Cəhcəh ləqəbli qul hakimiyyətə gəlməyənə qədər qiyamət saatı qopmayacaq.

33- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cəhcəh ləqəbli qul hakimiyyətə gəlməyənə qədər gecə və gündüz yox olmayacaqdır."

### İyirmi yeddinci fəsil: İnsanlar; "Allah, Allah" deməyi dayandırmayana qədər Qiyamət saatı qopmayacaq.

34- Ənəs (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " İnsanlar Allah, Allah deməyi dayandırmayana qədər Qiyamət saatı qopmayacaq."

### İyirmi səkkizinci fəsil: Yəməndən külək göndəriləcək və ürəyində zərrə qədər imanı olanı götürəcək.

35- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təala Yəməndən ipəkdən də zərif olan külək göndərəcək.O ürəyində (Əbu Əlqamə belə demişdir: misqal dənəsi.", Əbd əl-Əziz isə belə demişdir: "Misqal zərrə." qədər imanı olan heç bir kəsi sağ buraxmayacaqdır."

### İyirmi doqquzuncu fəsil: Qiyamət yalnız şər insanların üzərində qopacaq.

36- Abdullah bin Məsud (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qiyamət yalnız şər insanların üzərində qopacaqdır."

### Otuzuncu fəsil: Yalançı dəccal çıxmayana qədər qiyamət qopmaz.

37- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "(Sayı) Otuza qədər yalançı dəccal çıxmayana qədər qiyamət qopmaz. Onlardan hər biri Allahın elçisi olduğunu iddia edər."

38- Cəbir İbn Səmurə (Allah ondan razı olsun) Peyğəmbərdən(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Həqiqətən Qiyamətdən əvvəl yalançılar ortaya çıxacaq.(başqa bir rəvayətdə isə : "Cabir belə dedi: ") Onlardan çəkinin."

### Otuz birinci fəsil: Müsəlmanların yəhudilərlə döyüşməsi.

39- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Müsəlmanlar yəhudilər ilə döyüşməyənədək Qiyamət günü qopmayacaq. Müsəlmanlar onları

öldürəcəklər. Və yəhudilər daşlar və ya ağaclar arxasında gizlənəcəklər, ağaclar və ya daşlar isə deyəcəklər: "Ey müsəlman! Ey Allahın qulu! Mənim arxamda yəhudi gizlənib. Gəl və onu öldür!" Ancaq Ğarqad ağacı bunu etməyəcək, çünki o yəhudi ağacıdır."

### Otuz ikinci fəsil: İnsanların çoxu Rumlular olan zaman qiyamət qopacaq.

40- Musa bin Uley atasından belə rəvayət edir: "Əl-Mustəvrad əl-Qureyşi Amr bin əl-Asın yanında Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini dedi: "Qiyamət saatı gələndə, insanların çoxu Rumlular olacaq. Amr bin əl-Ass ona dedi: "Fikirləş gör nə danışırsan". O belə cavab verdi: "Mən Allahın Elçisindən eşitdiyimi deyirəm." Onda Amr dedi: "Əgər belədirsə onda onların dörd xüsusiyyəti var. Sınaq zamanı onlar görünməmiş dözüm göstərir, fəlakətdən sonra daha tez ayağa qalxır, qaçdıqdan sonra hamıdan tez qayıdır və kasıblara yetimlərə və köməksizlərə hamıdan yaxşı münasibət bəsləyirlər.Onların beşinci daha gözəl bir xüsusiyyəti də var. Onlar hökmdarlarının ədalətsizliklərindən (başqalarına nisbətən )daha çox qorunublar."

### Otuz üçüncü fəsil: Dəccalın çıxdığı zaman Rumlarla döyüş və qətllərin çox olması haqda.

41- Yuseyr İbn Cabir belə rəvayət edir: "Bir gün Kufədə qırmızı külək qopdu, sonra onların yanına bir kişi gəldi. O (güclü bürküyə ) fikir verməyib qışqırdı."Ey Abdullah bin Məsud! Qiyamət günü yetişdi! Abdullah dirsəklənərək uzanmışdı, ancaq kişini görüb qalxdı və oturdu. Sonra dedi: "Qiyamət günü müsəlmanların əldə etdikləri hərbi qənimətlərə görə sevinə bilməyəcəkləri və mirasları bölə bilməyəcəkləri saat gəlməyənə qədər yetişməyəcək. O Şama tərəf əl uzatdı və dedi: "Düşmən müsəlmanlara, müsəlmanlar isə düşmənə qarşı birləşəcəklər. (Yuseyr )dedi: "Sən rumluları nəzərdə tutursan? O, "Bəli" dedi. O zaman çox şiddətli bir döyüş baş verəcəkdir. Müsəlmanlar bu döyüşdə ya qələbə ya da ki ölüm şərtini qoyub ordu göndərəcəklər. Döyüş qaranlığa qədər davam edəcək. Heç kəs qalib gələ bilməyib qayıdacaq. Ancaq müsəlmanların sıraları azalacaq. Sonra müsəlmanlar ya qələbə ya da ki ölüm şərtini qoyub ordu göndərəcəklər. Döyüş qaranlığa qədər davam edəcək. Heç kəs qalib gələ bilməyib qayıdacaq. Müsəlmanlar yenə azalacaqlar. Sonra müsəlmanlar ya qələbə ya da ki ölüm şərtini qoyub ordu göndərəcəklər. Döyüş qaranlığa qədər davam edəcək. Heç kəs qalib gələ bilməyib qayıdacaq. Müsəlmanlar yenədə itki verəcəklər. Dördüncü gün döyüşə qalan müsəlmanlar da qatılacaq və Allah Təala zəfər əta edəcəkdir. Çox şiddətli döyüş baş verər. Nəticədə çoxlu adam öldürüləcək.Belə döyüş görünməmişdir, yaxud belə döyüş görülməyib." dedi (Bu bəşəriyyətin indiyə qədər görmədiyi döyüş olacaq).Hətta quş da döyüş meydanı üzərindən sağ salamat uçub keçə bilməyəcək.Yüz adam olan nəsildən yalnız bir nəfər qalacaq. Hansı qənimətə sevinəsən və hansı miras ı bölüşdürəsən? Qalib gəlmiş müsəlmanlar bax bu vəziyyitdə ikən daha böyük bəla ilə üzləşərlər.Onlara qışqırıq səs gələcək: Yalançı Məsih sizin ailənizə hücum etdi! Onlar əllərində olan hər şeyi atıb yola düşəcəklər. İrəli on atlı salacaqlar. Allah Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Mən onların adlarını, atalarının adlarını və atlarının rəngini bilirəm. O zamanlar onlar ən yaxşı süvarilər və ya yaxşılardan biri olacaqlar."

### Otuz dördüncü fəsil: Dəccaldan əvvəl müsəlmanların ( haranı) fəth edəcəkləri haqda.

42- Cabir İbn Səmurə o da Utbədən (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Bir döyüşdə Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə idik. Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına (Mədinənin) qərb tərəfindən üzərlərində yun paltarlar olan bir qövm gəldi. Və ona bir təpənin yanında rast gəldilər. Onlar ayaq üstə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) isə oturmuşdu. Nəfsim mənə dedi ki, onların yanına get və onlarla Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arasında dayan. Ona bir basqın etməsinlər! Sonra (öz özümə) dedim: "Bəlkə onlarla bir sirr danışır, onların yanlarına gəlib, onlarla Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) arasına dayandım. (Nafi )dedi: "Ondan dörd söz əzbərlədim, bunları əlimlə sayaram! Siz Ərəbistan yarımadası uğrunda döyüşəcəksiniz və Allah sizə onu fəth etməkdə yardım edəcək.Sonra siz Farslarla savaşacaqsınız və Allah sizə onu fəth etməkdə kömək edəcək.Sonra siz Rumlularla mübarizə aparacaqsınız və Allah sizə onu fəth etməkdə kömək edəcək.Sonra siz Dəccalla savaşacaqsınız Allah sizə onu fəth etməkdə kömək edəcək".Nafi dedi: "Ey Cabir!Rum fəth olunmadan Dəccalın çıxmağını zənn etmirəm."

## Otuz beşinci fəsil: Konstantinopolun fəthi.

43- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Son saat, rumlular Əhmaq və ya Dəbiqə (Suriyanın Hələb şəhərinin ətraflarına) çatmayınca baş verməyəcəkdir. Mədinədən onlara qarşı bir ordu çıxacaqdır. Bu orduda o dövrün ən yaxşı adamları toplaşacaqdır. Ordular düzüləndə rumlular deyəcəklər: "Qoyun biz, bizi söyənlərlə döyüşək." Müsəlmanlar: "Yox, Allaha and olsun ki, qardaşlarımızı sizinlə tək qoymarıq." - deyib onlarla vuruşacaqlar. Onların üçdə biri məğlub ediləcək, Allah onlara tövbə ilham etməyəcəkdir, üçdə biri qətlə yetiriləcəkdir və onlar Allah dərgahında ən yaxşı şəhidlərdən olacaqlar. Yerdə qalan üçdə biri qalib gələcək və cəzalandırılmayacaqlar.Məhz onlar Konstantinopolu fəth edəcəklər.Müsəlmanların qənimətləri bölüşdürməklə başları qarışacaq, qılınclarını zeytun ağacından asacaqlar. Bu zaman Şeytan qışqıracaq: "Məsih sizin ailənizə basqın etdi." Onlar geri çəkiləcəklər ancaq xəbər yalan olacaq. Onlar Şama gəlib çatanda ( Məsih )gələcək.Onlar döyüşə hazırlaşaraq sıralara düzüləcəklər. Namaza duranda İsa bin Məryəm nazil olacaq və onların yanına getmək istəyəcək. Allahın düşməni onu gördükdə duz suda əridiyi kimi əriyib yox olacaqdır. Əgər onu tərk etsə əriyib həlak olacaqdır. Allah onu İsanın əli ilə öldürəcəkdir. İsa onlara onun qanını öz nizəsində göstərəcək."

## Otuz altıncı fəsil: Kəbəyə hücum (qəsd edən) ordunun yerə batırılması.

44- Ubeydullah İbn əl-Qibtiyyə rəvayət edir ki, əl-Haris bin Əbu Rabiə və Abdullah İbn Safvan və mən də onlarla birlikdə Möminlərin anası Ummu Sələmənin (Allah ondan razı olsun) yanına daxil olduq.Onlar yerə batırılacaq ordu haqqında soruşdular. Bu İbn əz- Zubeyrin (xilafəti) günlərində idi.Ummu Sələmə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu dedi: "Bir nəfər Kəbəyə sığınacaq və ona bir ordu göndəriləcək. Bunlar yerin bir çölündə ikən yerə batırılacaqlar." Mən dedim: "Ey Allahın elçisi! Məcbur aparılanın halı necə olacaq?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Onlarla birlikdə o da batırılacaq. Lakin

o Qiyamət günündə niyyətinə görə diriləcəkdir." Əbu Cəfər dedi: "Bu çöl Mədinənin çölüdür."

## Otuz yeddinci fəsil: Qiyamət saatından əvvəl Mədinənin məskənləri və imarətləri haqda.

45- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Məskənlər İhəba yaxud Yəhəbə çatacaq!" Züheyr deyir ki,mən Süheylə dedim: "Bu Mədinədən nə qədər (məsafədədir)?"O dedi: "Bu qədər və bu qədər mildir."

## Otuz səkkizinci fəsil: Kəbəni Zul əs-Suveyqətin (göbəkayaqlı) həbəş dağıdacaq.

46- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kəbəni Zul əs-Suveyqətin (göbəkayaqlı) həbəş dağıdacaq."

## Otuz doqquzuncu fəsil: İraq öz dirhəmindən qadağan olacaq.

47- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İraq öz dirhəm və kafizlərindən (ölçü vahidi), Şam öz müdiy (ölçü vahidi) və dinarlarından, Misir isə öz irdəb (ölçü vahidi),və dinarlarından olacaqlar. Siz başladığınız yerə qayıdacaqsınız! Siz başladığınız yerə qayıdacaqsınız! Siz başladığınız yerə qayıdacaqsınız! Buna Əbu Hüreyranın qanı və əti şəhadət edir."

48- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qıtlıq, yağışsız qalmanız deyildir. Lakin qıtlıq sizə təkrar, təkrar yağış verilib, yerin heç bir şey bitirməməsidir."

## Qırxıncı fəsil: Qəlblərdən imanın və əmanətin qaldırılması.

49- Hüzeyfə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə iki hədis danışdı. Onlardan birini artıq gördüm, indi mən o birisini gözləyirəm.O bizə dedi: "Əmanət insanların ürəklərində bərkiyəcək, sonra insanlar onu Qurani Kərimdən və Sünnədən dərk edəcəklər. O həmçinin bizə əmanət insanların ürəyini tərk edəcəyindən bəhs etdi. O dedi: "İnsan yuxuya gedəcək, əmanət isə onun ürəyini tərk edəcək. geridə isə (ürəyinin rənginə müxalif olan) bir iz buraxacaqdır. O növbəti dəfə yuxuya gedəndə inam və sədaqət yenə onun ürəyini tərk edəcək, geridə isə qabar bir iz buraxacaqdır. İnsan qaynar kömürü tapdaladıqda ayağında yaranan suluq kimi olacaq. Sən onun dərinin üzərində qalxdığını görəcəksən, ancaq onun içi boş olcaq. Sonra balaca daş götürüb ayağının üzərində yuvarladı ( və dedi)" (Gün gələcək ) insanlar bir-biri ilə ticarət edəcək. Ancaq onların arasında əmanətləri öz sahiblərinə qaytaran olmayacaq. İnsanlar danışacaqlar ki, hansısa tayfada etibarlı bir kişi var.Hətta onun haqda: "O nə mətin, nə zərif, nə ağıllıdır." Deyiləcək. Halbuki O ürəyində hətta xardal dənəsi misqalında iman olmayan bir kəsdir. (Sonra Hüzeyfə əlavə etdi: ") Vaxt vardı mənim üçün kimlə ticarət etməyimin fərqi yox idi. Əgər bu, müsəlman idisə, dini onu kələkbazlıqdan qoruyurdu. Əgər bu xiristian və ya yəhudi idisə hökmdarı onu kələkbazlıqdan saxlayardı. Amma bu gün mən yalnız filankəs və filankəslə ticarət edirəm."

## Qırx birinci Fəsil: Qiyamətə yaxın malı ovucla ovuclayan xəlifə peyda olacaq.

50- Cüreyri Əbu Nadradan belə rəvayət edir: "Biz Cabir İbn Abdullahın yanında idik. O belə buyurdu: "Tezliklə İraq sakinlərinə nə kafiz (çəki vahidi), nə dirhəm gətirməyəcəklər." Biz dedik: "Niyə?" O cavab verdi: "Əcəmilər buna mane olacaqlar." Sonra o dedi: "Tezliklə Şam sakinlərinə nə dinar, nə mudy (çəki vahidi) gətirməyəcəklər." Ondan soruşdular: "Niyə?" O cavab verdi: "Rumlular buna mane olacaq." O, bir az susduqdan sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurduğunu dedi: "Mənim ümmətimin sonuncu nəsillərinin arasında malı ədədlə saymayan ovucla ovuclayan xəlifə peyda olacaq." Rəvayət edən deyir ki, mən Əbu Nadra ilə Əbu əl-Aləyə dedim: "O, Ömər İbn Abduləziz olduğunu görürsüzmü?" Onlar: "Xeyr "dedilər."

## Qırx ikinci fəsil: Qiyamətdən əvvəl olacaq əlamətlər.

51- Huzeyfə bin Əsəd əl-Ğifari (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz müzakirə edərkən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəldi və dedi: "Nə müzakirə edirsiniz?" Dedik ki: "Qiyamət saatını müzakirə edirik." O bizə dedi: "O saat yalnız on əlamətdən sonra gələcəkdir; Duman, Dəccal, heyvanın çıxması, günəşin öz qürub yerindən qalxması, İsa İbn Məryəmin  nazil olması, Yəcuc və Məcuc, yerin üç yerdə: "Şərqdə, Qərbdə və Ərəbistan yarımadasında batması və bütün bunlardan sonra Yəməndən alov (od) xaric olur və insanları öz məhşərinə (toplanış yerinə) qovur."

## Qırx üçüncü fəsil: Zülmət gecəyə bənzər fitnə olmamışdan əvvəl yaxşı əməllərə tələsin.

52- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Zülmət gecəyə bənzər fitnə olmamışdan əvvəl yaxşı əməllərə tələsin. Səhər mömin olan insan axşama kafir olacaq. Axşam mömin olan insan isə sabaha kafir olacaq. İnsanlar dünyəvi gəlirdən ötrü öz dinlərini satacaqlar."

## Qırx dördüncü fəsil: Altı şeydən əvvəl (yaxşı) əməllərə tələsin.

53- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Altı şeydən; Dəccal, tüstü, yer heyvanı, günəşin batdığı yerdən doğması, ümumi fitnə və birinizin başına gələcək xüsusi (ölümdən) əvvəl əməllərə tələsin."

## Qırx beşinci fəsil: Fitnə zamanında ibadət.

54- Maqil İbn Yəsar (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Fitnə zamanında ibadət, mənə hicrət etmək kimidir."

## Qırx altıncı Fəsil:İbn Səyyadın hekayəsi.

55- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Biz həcc və ya ümrə ziyarətinə çıxdıqda İbn Səyyad da bizimlə idi. Bir yerdə mənzil saldıq. Hərə bir yerə dağıldı. Mən onunla tək qaldım. Onun barədə deyilənlərə görə  ondan  vəhşətə gəlirdim. Öz şeylərini mənimkilərlə bir yerə qoydu. Mən dedim: Çox istidir. Şeyləri

o biri ağacın altına qoysan pis olmaz." O belə də etdi. Bizə bir qoyun gətirildi. O gedib böyük bir qabda süd gətirdi və dedi: "Ey Əbu Səid! İç bu südü." Mən dedim: "Çox istidir. Süd də həmçinin istidir." Mən onun əlindən içmək (və ya dedi; əlindən götürmək) istəmirdim. İbn Səyyad mənə dedi: "Ey Əbu Səid, Adamların mənim barəmdə dediklərinə görə ip götürüb özümü ağacdan asmağımı düşündüm. Ey Əbu Səid Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dəccal haqqında dediyi kimə gizli qaldı? Siz Ənsarlara gizli qalmadı.Sən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) hədislərini daha yaxşı bilən deyilsənmi? Məgər Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) deməmişdir: "O kafirdir."? Mən müsəlmanam, məgər Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) deməmişdir" O sonsuzdur, uşaqları olmaz"? Mən isə uşaqlarımı Mədinədə qoymamışam? Yaxud Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O Mədinə və Məkkəyə daxil ola bilməyəcəkdir"deməmişdir? Mən isə Mədinədən gəlib Məkkəyə getmirəmmi?" Əbu Səid əl-Xudri deyir ki, az qaldı ki onu üzürlü hesab edirdim. Sonra bunu dedi: "Allaha and olsun ki mən onu çox yaxşı bilirəm. Doğulduğu yeri və indi harada olduğunu da bilirəm." Mən: "Bu günün geri qalan hissəsi də heyf olsun sənə." dedim."

56- Əbu Səid (Allah ondan razı olsun) belə rəvayət edir: İbn Səyyad Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) cənnətin torpağı haqqında soruşdu. (Peyğəmbər ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun ) dedi: "Ağ undur, xalis müşkdür."

57- Muhəmməd İbn əl-Munkədir belə  rəvayət edir: "Cabir bin Abdullahın Allaha and içərək, İbn Səyyadın Dəccal olduğunu dediyini gördüm. Bu zaman mən dedim: "Sən Allaha and içirsən?" O dedi: "Mən Ömərin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında buna görə and içdiyini eşitdim. Peyğəmbərdə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona etiraz etmədi."

58- Abdullah İbn Ömər (Allah onların ikisindən razı olsun) belə rəvayət edir: "Ömər İbn əl-Xəttab (Allah ondan razı olsun) Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə bir camaatın içində İbn Səyyad tərəfə gəldilər. Onun Bəni Muğala evinin divarı dibində uşaqlarla oynadığını görürlər. Bu vaxt İbn Səyyad artıq həddi buluğa çatmaqda idi. O heç nə hiss etmirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun kürəyinə əlini vurdu və sonra ona dedi: "Şəhadət verirsənmi mən Allahın elçisiyəm?" İbn  Səyyad ona baxıb dedi: " Şəhadət verirəm ki,sən savadsızların Peyğəmbərisən." Bundan sonra İbn Səyyad Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Sən şəhadət verirsənmi mən Allahın elçisiyəm?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunu rədd etdi və dedi: "Allah və Onun rəsuluna iman gətirdim." Bundan sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona dedi: "Nə görürsən?" İbn Səyyad dedı: " Mən doğrunu da, yalanı da görürəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona dedi: " Hər şeyi qarışdırdın." Daha sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona dedi: " Sənə aid gizli bir şey vardır". İbn Səyyad dedi: " Bu "Duxx"-dur"tüstüdür". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Sus həddini aşma!" Ömər bin Xəttab dedi: " Ya Peyğəmbər qoy onun boynunu vurum." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona dedi: "Əgər bu odursa deməli sən onu öldürə bilmərsən.Yox əgər belə deyilsə onda onu öldürməyində xeyir yoxdur." Səlim İbn Abdullah, Abdullah İbn Ömərdən belə eşitdiyini rəvayət edir: "Bundan sonra Peyğəmbər Ubey bin Kəab

əl -Ənsari ilə birlikdə İbn Səyyadın olduğu xurma bağına gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) İbn Səyyadd onu görməmişdən qabaq onun xəbəri olmadan ondan bir şey eşitmək məqsədiylə əvvəlcə xurma ağacının arxasında gizləndi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onu məxmər bir döşəyin içərisində uzanmış və çox sakit bir səslə zümzümə etdiyini gördü. İbn Səyyadın anası ağacın dalında durmuş Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) görəndə oğluna dedi: "Ey Saf( İbn Səyyadın adıdır) Muhamməd buradadır." İbn Səyyad qalxdı. Bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Əgər onu bu vəziyyətdə qoysaydı hər şey aydınlaşardı." Səlim Abdullah İbn Ömərin belə dediyini rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) camaat arasında durdu. Allaha həmdü-səna etdi və sonra Dəccal barəsində danışdı. Mən sizi ondan çəkindirirəm. Elə bir Peyğəmbər yoxdur ki öz camaatını ondan çəkindirməsin. Nuh öz camaatını ondan çəkindirmişdir. Lakin mən sizə heç bir peyğəmbərin öz camaatına demədiyi bir sözü deyirəm. Bilin ki o tək gözdür, Allah tək göz deyildir." İbn Şihab deyir ki, Ömər bin Sabit əl-Ənsari ona belə xəbər verdi: " Ona Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bəzi səhabələri, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün Dəccaldan çəkindirərək belə dediyini xəbər verdilər: "İki gözünün arasında kafir yazılmışdır. Ona nifrət edən bunu oxuya bilir və ya hər bir mömin bunu oxuyur." və (həmçinin ) belə dedi: "Bilin ki sizdən heç kəs ölənə kimi öz Rəbbini görməyəcəkdir."

59- İbn Avn, Nafidən belə rəvayət edir: "Nafi İbn Səyyadın söhbətini edirdi. İbn Ömər dedi ki, mən onunla iki dəfə görüşdüm. Onlardan bəzilərinə dedim: "Siz deyirsiniz bu elə odur." O dedi: "Allaha and olsun ki yox." İbn Ömər dedi: "Düz demirsən. Allah and olsun ki, bəziləriniz deyir ki, o aranızda ən varlı və ən çox oğul uşaqlı adam olmayınca ölməyəcəkdir. Deyirlər bu gün elə belədə olmuşdur." İbn Ömər deyir ki; "Biz onunla söhbət etdik sonra isə ayrıldım və başqa bir dəfə də ona rast gəldim. Artıq gözü şişmişdi." Mən ona dedim; "Sənin gözünə nə olub." O: "Bilmirəm." dedi. İbn Ömər dedi: "Bilmirsən ki başında olana nə olub." O belə dedi: "Allah istəsə onu sənin bu əsanda xəlq edər." Bu zaman o, eşitdiyim ən bərk eşşək anqırması kimi anqırdı. ( İbn Ömər dedi: ) "Mənim yoldaşlarım söyləyir ki, mən onu öz əsamla özümdə bilmədən elə vurmuşdum ki əsam sınmışdı." Rəvayət edən deyir ki; "İbn Ömər gəlib Möminlərin anasının yanina daxil oldu və hadisəni ona izah etdi. Möminlərin anası belə dedi: "Ondan nə istəyirsən? Bilmirsənmi ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə demişdir: "Heç şübhə yox ki, onun insanlar üzərinə ilk göndərəcəyi, qəzəbləndiyi qəzəb olacaq."

60- Hüzeyfə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mən Dəccalla birkikdə nə olacağı haqqında çox şey bilirəm. Onun iki çayı vardır. Onlardan biri gözə ağ su rəngdə görünür. O biri isə gözə yanar od görünər. Sizlərdən biri,o çıxan vaxtı yaşayarsa, atəş gördüyü çaya gəlsin, gözünü yumsun. Sonra başını əyərək ondan içsin. Çünki o soyuq sudur. Həqiqətən Dəccalın gözü silinmişdir, üzərində qalın bir dəri vardır. İki gözünün arasında kafir yazılmışdır. Onu yazan və yazmayan hər mömin oxuyacaq."

61- Hüzeyfə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dəccal sol gözü kor, saçı çox olan bir kimsədir. Onunla birlikdə cənnət və cəhənnəm vardır. Onun Cəhənnəmi Cənnət,Cənnəti də Cəhənnəmdir."

62- Nəvvas İbn Səman (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir gün səhər Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizə Məsih əd- Dəccal haqqında danışmağa başladı. Onun haqqında səsini gah alçaldaraq, gah da yüksəldərək elə bir tərzdə danışdı ki, biz onu Nəhl (xurmalıq) deyilən bir yerdə zənn etdik. Biz onun yanına gəldikdə Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bizdə olan vəziyyəti görüb buyurdu: "Sizə nə olub?" Biz: "Ya Peyğəmbər! Bu gün səhər Dəccəl haqqında səsini gah alçaldaraq, gah da yüksəldərək elə bir tərzdə danışdın ki, biz onu Nəhl (xurmalıq) deyilən bir yerdə zənn etdik". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Sizdən ötrü məni qorxudan şey Məsih Dəccəl deyildir. Əgər o, mən sizin içinizdə ikən ortaya çıxarsa, mən onunla mübahisə edəcəyəm. Yox əgər mən olmayanda ortaya çıxarsa onda hər kəs özü-özünü ondan müdafiə etməlidir. Allah da hər bir müsəlman üçün məni əvəz edər. Dəccəl gəncdir. Saçları olduqca qıvrımdır. Bir gözü əyridir (sanki üzüm salxımından irəli çıxmış üzüm giləsi kimi). Mən onu Abdul Uzza İbn Qatana bənzədirəm. Sizlərdən hər kim o, çıxan vaxtı yaşayarsa ona qarşı Kəhf surəsinin ilk on ayəsini oxusun. Heç şübhəsiz ki, o Şam ilə İraq arasında olan bir yolda ortaya çıxacaqdır. Sağına da, soluna da öz fitnə-fəsadını yayacaqdır. Ey Allahın qulları möhkəm olun!" Biz: "Ya Peyğəmbər! O, yer üzündə nə qədər müddət qalacaqdır?" deyə soruşduq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Qırx gün. (Bu günlərdən) Bir günü bir ilə, bir günü bir aya, bir günü bir cüməyə (bir həftə) bərabər olacaqdır. (O qırx günün içində) Qalan günlər isə sizin günləriniz kimi olacaqdır" deyə buyurdu. Biz: "Ya Peyğəmbər! Bu bir il qədər olan o, bir gündə bizlərə bir günün namazı kifayət edirmi?" deyə soruşduq. Peyğəmbər: "Xeyr! (kifayət etməz) Siz o uzun gündə adi günlərdə qıldığınız namaz vaxtlarını hasablayıb, namazlarınızı qılın!" deyə buyurdu. Biz: "Ya Peyğəmbər! Dəccəl yer üzündə nə cür sürətlə yeriyəcəkdir?" deyə soruşduq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Küləyin qovduğu yağış buludlarının sürəti kimi (Arxasından külək əsən yağış kimidir.)" deyə buyurdu." O, bir qövmün yanına gəlib onları dəvət edəcəkdir. Onlar da ona iman gətirib itaət edəcəklər. Bundan sonra o, göyə əmr edəcəkdir. Göy də onun əmri ilə yağış yağdıracaqdır. Sonra yerə əmr edər. Yer də( hər cür bitkilərini) bitirəcəkdir. O, qövmün otlağa çıxmış heyvanları axşam otlaqdan ən gözəl bir halda, məmələri südlə dolu, ətlənmiş bir halda geri qayıdarlar. Sonra Dəccəl digər bir qövmə gəlib onları da dəvət edər. Lakin o qövm onun sözünü qəbul etməyib onu rədd edərlər. Dəccəl o qövmündən uzaqlaşdıqdan sonra onlar qıtlıq içində səhərləyəcəklər, əllərində mallarından bir şey qalmayacaq. Dəccəl bir xarabalığın yanına gəlib: "Öz xəzinələrini çıxart!" deyər və bal arılarının (ana) arının ardınca düşdükləri kimi xəzinələr də onun ardınca düşərlər.Sonra gənc yaşına çatmış bir gənci yanına çağıraraq onu qılınc ilə vuraraq iki hissəyə bölür. Parçalar oxun məsafəsi qədər bir-birindən ayrılırlar. Sonra Dəccəl iki hissəyə böldüyü gənci çağırar, o da həmin (anda) üzü parıldayaraq və gülərək gələr. Dəccəl öz fitnə-fəsadını yaydığı vaxt Allah Məryəm oğlu Məsihi, İsanı (ona Allahın salamı olsun) göndərər. İsa (ona Allahın salamı olsun) Dəməşqin şərqindəki ağ minarənin yanında əynində üstünə boya və zəfəran sürtülmüş paltar, əllərini iki mələyin qanadları üstünə qoymuş halda yerə enəcəkdir. O, başını aşağı salanda saçlarının işıltısı görünəcək, qaldıranda elə bil saçlarından mirvari kimi su damcılayacaqdır. Onun nəfəsinin iyini alan hər bir kafirə ölümdən başqa heç bir şey halal olmayacaq. Onun nəfəsinin ətri nəzərinin çatdığı yerdə qurtaracaq. İsa (ona Allahın salamı olsun) Dəccəlı axtaracaq. Nəhayət onu (Beytul-Məqdisə) yaxın bir yerdə Ludd qapısının yaxınlığında yaxalayaraq öldürəcək. Sonra İsa (ona Allahın salamı olsun) Allahın Dəccalın şərindən qoruduğu bir qövmün yanına gələcək. İsa (ona Allahın salamı olsun) onların üzərilərinə əli ilə toxunub məsh edəcək və onlara

Cənnətdəki dərəcələrini söyləyəcək. Onlar bu halda olduqları vaxt Allah Təalə İsaya (ona Allahın salamı olsun) "Mən indi Mənə aid olan qullarımı çıxaracağam ki, heç bir kimsənin onlarla müharibə etməyə nə qüdrəti, nə də qüvvəti çatar! Lakin sən, Ey İsa! Səninlə olanlara Tur dağında sığınacaq ver" deyə vəhy edəcək. Allah "Yəcuc və Məcuc" tayfalarını göndərəcək. "Yəcuc və Məcuc (səddinin) açılıb onlar hər tərəfdən (alçaq və yüksək təpələrdən) sürətlə axışdıqları zaman, onların əvvəlkiləri Təbəriyyə gölünə yetişib onun suyunu içəcəklər, axırıncılar oradan keçərkən and olsun ki: "Nə vaxtsa burada su vardı" deyəcəklər. Allahın peyğəmbəri İsa (ona Allahın salamı olsun) və onunla birlikdə olanlar mühasirədə qalacaqlar. Nəhayət onların birinə bir öküz başının dəyəri bu gün sizə görə yüz dinardan da xeyirli olur. İsa (ona Allahın salamı olsun) və səhabələri Allaha dua edərlər. Allah da onların (Yəcuc və Məcuc) boyunlarına qurdlar salar və səhəri hamısı məhv olub gedərlər. Sonra Allahın peyğəmbəri və onunla birlikdə olanlar yerə enərlər.Yer üzündə (Yəcuc və Məcuc tayfasının cəsədlərinin) iyi və üfunətindən bir qarış yer belə tapa bilməyəcəklər. Allahın peyğəmbəri və onunla birlikdə olanlar Allaha dua edəcəklər. Bu dualarına cavab olaraq Allah dəvə boyunları kimi uzun boylu quşlar göndərər. Quşlar o leşləri götürüb Allahın istədiyi yerə apararlar. Sonra Allah elə bir yağış göndərər ki, istər quru və sağlam palçıqdan olsun, istər gildən olsun heç bir ev o yağışın enməsinə mane ola bilməyəcəkdir. Yağış bütün yer üzünü yuyacaqdır. Nəhayət yer üzü güzgü kimi parlayacaqdır. Sonra Allah yer üzünə: "Meyvələrini bitir, bərəkətini qaytar!"deyə əmr edəcəkdir. O gün bir camaat bir narı yeyib doyacaqlar və qabığı altında kölgələnəcəklər. Südə bərəkət veriləcək Hətta yeni doğmuş bir dəvənin südü bir topluluğa kifayət edəcək. Yeni doğmuş bir inəyin südü bir qəbiləyə, yeni doğmuş bir qoyunun südü isə bir neçə ailəyə kifayət edəcək. Bu vaxt Allah xoş bir külək göndərəcək. Bu külək möminləri qoltuq altından yaxalayaraq bütün mömin və müsəlmanların ruhlarını alacaq. Yer üzündə insanların şərliləri qalacaq. Onlar orada heç bir kəsdən utanmadan eşşəklərin bir-biri ilə cinsi əlaqədə olduqları kimi, qadın və kişi bir-biri ilə cinsi əlaqədə olacaqlar. Qiyamət də onların üzərində qopacaq."

63- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir gün bizə Dəccal haqqında uzun bir hədis danışdı. Bizə danışdıqları arasında bu da vardı. Buyurdu ki: " Dəccal gələcək, lakin özünə Mədinənin yollarına girmək haram ediləcək. Buna görə də Mədinənin xaricindəki bəzi bar verməyən tarlalara qədər gələcəkdir. O günün ən xeyirli insanı yaxud ən xeyirli insanlarından bir adam çıxacaq və ona: "Mən şahidəm ki, Allah peyğəmbərinin bizə haqqında danışdığı sənsən." Dəccal deyəcək: "Nə deyirsiniz, mən bu adamı öldürsəm, sonra diriltsəm, bu işdə şübhə edərsinizmi?" (Oradakılar) "Xeyr!" cavabını verəcəklər.Bu zaman Dəccal onu öldürəcək, sonra dirildəcək.Diriltdiyi anda o adam: Allaha and olsun ki,mən səni çox yaxşı tanıyırdım. Bu gün səni lap yaxşı tanıdım." ( sənin haqqında heç bir zaman indikindən daha bəsirətli olmamışdım) Dəccal onu təkrar öldürmək istəyəcək, lakin ona müsəllət (hakim) edilməyəcək."

64- Əbu Səid əl-Xudri Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dəccal çıxacaq və möminlərdən bir şəxs onun tərəfinə doğru yönələcək. Bu kişinin qarşısını kəsən Dəccalın silahlı gözətçiləri ona deyəcəklər: "Nə istəyirsən?" Kişi deyəcək ki: "Bu çıxanı görmək istəyirəm." Gözətçilər soruşacaqlar: "Yoxsa bizim rəbbimizə iman gətirmisən?". Kişi deyir: "Bizim Rəbbimiz ( bir gizlilik yoxdur) aşkardır."Onlar." Onu öldürün!" deyəcəklər. Bəziləri bəzilərinə isə deyəcək: "Rəbbiniz sizə onsuz bir kimsəni öldürməsini qadağan etmədimi? "Mömin kişini Dəccalın hüzuruna gətirirlər. Mömin Dəccalı görən kimi deyir: "Camaat! Bu Peyğəmbərin bizə xatırlatdığı Məsih Dəccaldır. "Dəccal onun haqqında əmr verəcək və qarnı üzərinə uzadılacaq və bu zaman; "Onu götürün başını yarın!" deyəcək.Onun kürəyi və qarnı zərbələrdən

genişlənəcək. Dəccal ondan soruşacaq: "Yoxsa, mənə iman gətirmirsən?" Mömin deyəcək: "Sən yalançı Məsihsən." Dəccal onu mişarla parçalamağı əmr edəcək. Mömini başından başlayaraq iki ayağını aralayana qədər kəsəcəklər. Bundan sonra Dəccal onun iki parçası arasında gedəcək və sonra ona deyəcək: "Qalx!" Kişi sağ-salamat qalxıb ayaq üstə duracaq. Dəccal bir də soruşacaq: "Mənə iman gətirirsənmi?" Mömin adam deyəcək: "Mən səni daha yaxşı tanıdım." Bundan sonra o camaata deyəcək: "Camaat! Məndən sonra o heç kəslə bu əməli törədə bilməz. Dəccal onu kəsmək üçün dərhal tutacaq. Lakin mömininin boyu ilə körpücük sümüyü arasına mis qoyulacaq və Dəccal onu kəsə bilməyəcəkdir. Bu zaman əlləri və ayaqlarından tutaraq onu atacaq. İnsanlar elə hesab edəcəklər ki onu oda atdı. Ancaq o cənnətə atıldı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ( bu mömin barədə) demişdir: "Bu şəxs Aləmlərin Rəbbinin yanında insanların ən böyük şəhididir."

65- Muğirə İbn Şubə elə rəvayət: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məndən çox Dəccal haqqında soruşan olmadı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Ondan səni yoran nədir? O sənə zərər verə bilməyəcəkdir".Mən dedim: "Ey Allahın elçisi! deyirlər ki, onunla birlikdə yemək və çaylar olacaq." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "O Allah nəzdində bundan daha qiymətsizdir."

66- Numan İbn Səlim, Yaqub İbn Asim İbn Urva İbn Məsud əs-Səqafidən belə eşitdiyini rəvayət edir: "Eşitdim ki, bir kişi Abdullah İbn Amrın yanına gəlib dedi: "Rəvayət etməkdə olduğun bu hədis nədir? Deyirsən ki, heç şübhəsiz qiyamət filan və filan vaxta qədər qopacaq" Abdullah: "Sübhanallah! Yaxud La ilahə illallah" və ya buna oxşar bir söz söylədi. (Və belə davam etdi.)" Həqiqətən heç vaxt heç kimə bir şey rəvayət etməməyi düşündüm. Mən ancaq dedim ki, siz az zamandan sonra böyük bir hadisə görəcəksiniz. Kəbə yandırılacaq və belə, və belə olacaq." Sonra dedi ki; "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Dəccal ümmətimin arasında çıxacaq və qırx (zaman) qalacaq. (Bilmirəm ki,qırx günmü dedi, qırx aymı, yoxsa qırx ilmi.) Allah Təala Məryəm oğulu İsanı göndərəcək. O Urvə İbn Məsud kimidir. Dəccalı axtarıb həlak edəcəkdir. Sonra insanlar yeddi il qalacaqlar; iki adam arasında düşmənçlik olmayacaq. Sonra Allah Təala Şam tərəfindən soyuq bir külək göndərəcək və yer üzündə ürəyində zərrə qədər xeyir yaxud iman olan heç bir kimsə qalmayacaq, hamısının ruhunu alacaqdır. Hətta biriniz bir dağın içinə girmiş olsa, külək də girərək ruhunu alacaqdır." Mən bunu Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdim. Buyurdu ki: " Bu zaman quş yüngüllüyündə və yırtıcı təbiətli pis insanlar qalacaqlar. Nə bir yaxşılıq tanıyacaqlar, nə də bir pisliyi qadağan edecekler. Şeytan onlara görünərək; "(Mənə) cavab vermirsiniz?" deyəcək. Onlar da : "Bizə nə əmr edərsən? " cavabını verəcəklər. Və onlara bütlərə ibadət etməyi əmr edəcək. Onlar bu halda ruziləri bol yaşayışları gözəl davam edərkən sonra sur üfürüləcək. Bunu eşidən hər kəs boynunu bükəcək və boyun qaldıracaq. Onu ilk eşidən dəvələrinin hovuzunu palçıqlayan bir adam olacaq. O adam dərhal öləcək və insanlar da öləcəklər. Sonra Allah şeh kimi yaxud kölgə kimi (şəkk edən Numandır) bir yağış göndərəcək yaxud yağış endirəcək dedi." Ondan insanların cəsədləri bitəcək. Sonra bir daha sur üfürüləcək və birdən qalxıb baxacaqlar. Sonra: "Ey İnsanlar, Rəbbinizə gəlin! Bunları dayandırın! Çünki onlar sorğuya çəkiləcəklər." deyiləcək. Sonra: "Cəhənnəmlik olanları çıxarın!" deyiləcək . "Neçə adamdan?" deyə soruşulacaq. "Hər min adamdan doqquz yüz doxsan doqquzunu." deyiləcəkdir. "Uşaqları qocaldacaq gün və baldırın açılacağı gün budur."

## Qırx yeddinci fəsil: Günəşin öz məğribindən (batdığı yerdən) çıxması ilk əlamətlərdəndir.

67- Abdullah İbn Amr (Allah ondan razı olsun) belə rəvayər edir: "Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir hədis əzbərlədim və hələdə onu heç unutmadım.Eşitdim kiPeyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Günəşin qərbdən doğması ilə duha vaxtı insanlara qarşı bir heyvanın ortaya çıxması qiyamətin ilk çıxan əlamətlərindəndir. Onların hansı digərindən əvvəl reallaşarsa,digəri də onun ardınca, yaxın olaraq meydana gələr."

## Qırx səkkizinci fəsil: Dəccalın əlaməti, onun çıxması və Cəssasənin hekayəsi.

68- Amir İbn Şərahil əş-Şəabi (Şəabu Həmdən) ilk hicrət edən, əd-Dahhak İbn Qeysin bacısı Fatimə bint Qeysdən belə soruşdu: "Sən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) eşitdiyin və ondan qeyrisinə isnad etmədiyin bir hədisi mənə danış!" O dedi: "İstəsən danışaram." O da: "Bəli, danış!" dedi. (Fatimə bint Qeys) dedi: "İbn əl-Muğirə ilə nikahlandım. O, Qureyşin ən yaxşı gənclərindən idi. O, Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə olduğu ilk cihadda yaralandı. Mən dul qaldıqda Abdurrəhman İbn Avf Muhəmmədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrindən bir neçə nəfər içində məni istədi. Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni Üsame İbn Zeydə istədi. Mənə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyi rəvayət olunmuşdu: "Kim məni sevirsə Usaməni sevsin!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məni danışdıran zaman , ona dedim: "Əmrim sənin əlindədir. Kiminlə istəsən onunla nişanla." (Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Ummu Şərikin yanına get.(Ummu Şərik Ənsarlardan olan varlı, Allah yolunda çox xərcləyən bir qadın idi.) Ona qonaqlar gəlirdi. Mən: "(belədə) edərəm!" dedim. (Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Etmə, çünki Ummu Şərik qonağı çox olan qadındır. Mən sənin yaylığın düşməsini yaxud paltarın açılıb baldırlarından xoşlanmadığın bəzi yerlərini camaatın görməsini xoş qarşılamıram. Lakın sən əminoğlu Abdullah İbn Əmr İbn ummu Məktumun yanına  köç!" buyurdu. (Bu şəxs Qüreyşin fihri, Bəni Fihrdən bir adam idi. Özü Fatımənin qəbiləsindən idi.) Onun yanına köçdüm. İddətim qurtardıqdan sonra Mən Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) müəzzininin camatı namaza dəvət etdiyini eşitdim. Məscidə getdim. Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə namaz qıldıq. Mən camaatın arxasında durmuş qadınlar sırasında idim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı bitirdikdən sonra gülərək minbərdə oturdu və dedi: " Hər kəs namaz qıldığı yerdə qalsın! Bilirsiniz sizi nə üçün yığmışam? Onlar "Allah və Onun rəsulu daha yaxşı bilir" dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Allaha and olsun, mən sizi nə bir müjdə vermək, nə də qorxutmaq üçün toplamışam. Lakin mən sizləri bu səbəbə görə toplamışam: "Təmim əd-Dəri xristian bir adam idi. Gəldi, beyət edib İslamı qəbul etdi və mənə belə hadisəni rəvayət etdi. Onun söylədiyi bu rəvayət mənim sizə söylədiyim Məsih Dəccəl hadisəsi ilə uyğundur. O mənə danışdı ki, "Cudəm və Ləxm qəbilələrindən otuza yaxın kişi ilə birlikdə gəmiyə minmişlər. Dənizin dalğaları onları bir ay dənizdə saxlamış Sonra da günəşin batdığı yerdə dənizdə bir adaya yanaşmışlar və gəminin qayıqlarına minərək adaya girmişlər. Adada onların qarşısına tüklü iyrənc bir Dabbə (heyvan)

çıxmışdır. Tükü çox olduğundan onun arxa və qabağını seçə bilməmişlər. Onlar: " Sən kimsən?" deyə soruşmuşlar. O da: "Mən Cəssasəyəm" demişdir. Onlar: "Cəssasə nədir?" deyə soruşmuşlar. O məxluq: "Ey camaat siz kilsədəki adamın yanına gedin. O sizdən bir məlumat gözləyir." Təmim əd-Dəri dedi ki: "O bizə bir adam adı verincə, biz onun şeytan olmasından qorxduq və dərhal sürətlə gedib kilsəyə girdik. Birdən orada xəlq olunmuşların ən nəhəngi və ən şiddətlisi bağlanmış olan bir insan gördük. Onun əli boynuna iki dizinin arası topuğuna dəmirlə bağlanmışdı. Biz ona: "Vay olsun sənə, sən kimsən?" dedik. O belə cavab verdi: "Siz mənim xəbərimi almışsınız. İndi mənə xəbər verin, siz kimsiniz? Onlar: "Biz Ərəblərdən olan insanlarıq. Bir dəniz gəmisinə mindik. Dəniz coşduğu vaxta rast gəldik. Dalğa bizimlə bir ay oynadı. Sonra sənin bu adana yanaşdıq və gəminin qayıqlarına minərək adaya girdik. Və bu zaman qarşımıza tüklü iyrənc bir Dabbə (heyvan) çıxdı. Tükü çox olduğundan onun arxa və qabağını seçə bilmirdik. Biz "sən kimsən?" dedik. O da: "Mən Cəssasəyəm." dedi. Biz "Cəssasə nədir?" deyə soruşduq. O məxluq: "Ey camaat siz kilsədəki adamın yanına gedin. O sizdən bir məlumat gözləyir." dedi. Biz də tələsərək sənin yanına gəldik. Ondan qorxduq. Bir şeytan olmayacağından əmin deyildik. Bu zaman O: "Mənə Bəysən xurmalığından xəbər verin!" dedi. Biz: "Sənə onun hansı halından xəbər verək?" dedik. O: "Xurmalarından deyirəm. Onlar meyvə verirlərmi?" dedi. Biz: "Bəli, verir." dedik. O: "Onun meyvə verməmək vaxtı yaxınlaşır." dedi. O: "Mənə Təbəriyyə gölündən xəbər verin?" dedi. Biz: "Sənə onun hansı halından xəbər verək?" dedik. O: "Onda su varmı?" dedi. Biz: "Onun suyu çoxdur" dedik. O: "Xəbəriniz olsun ki, onun suyunun çəkilib getməsi zamanı yaxınlaşır." dedi. O: "Mənə Şamın qiblə hissəsində olan Aynu Zuqardan xəbər verin" dedi. Biz: "Sənə onun hansı halından xəbər verək?" dedik. O: "O bulaqda su varmı? Əhali əkinlərini bulaq suyu ilə suvarırmı?" dedi. Biz: "Bəli, o suyu bol olan bir bulaqdır. Əhali onun suyu ilə əkinləri suvarır" dedik. O: "Mənə Nəbiyyul (Peyğəmbər)- ummiyyin haqqında xəbər verin? O nə etdi?" dedi. Biz ona: "Məkkədən çıxıb Yəsribə (Mədinəyə) hicrət edib" dedik. O: "Ərəblər onunla vuruşdularmı?"dedi. Biz: "Bəli" dedik. O: "O nə etdi?" dedi. Biz: "Ərəblərdən ona dostluq edənlər və itaət edənlər zahir olmuşdur." dedik. O: "Həqiqətən bunlar oldumu?" dedi. Biz: "Bəli" oldu dedik. O: "Şübhəsiz ki, onların peyğəmbərə itaət etmələri onların özləri üçün xeyirlidir." dedi." İndi mən sizə özüm haqqında məlumat verəcəyəm. Mən Məsihəm. Mənə çıxmaq üçün izn verilən zaman yaxınlaşır. İzn verildikdə mən yer üzündə gəzəcəyəm və qırx gecə içində elə bir yer olmayacaq ki, ora ayağım dəyməsin. Məkkə və Mədinədən başqa. Bunların hər ikisi də mənə haram edilmişdir. Hər dəfə bu şəhərlərin birinə daxil olmaq istəyəndə qarşıma əlində siyrilmiş qılınc tutmuş mələk çıxacaq və məni geri qaytaracaqdır. Bu şəhərlərin qapılarının hər birini bu cür mələklər qoruyur." Fatimə bint Qeys (Allah ondan razı olsun) deyir ki; "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bunları söylədi və əlindəki dəyənək ilə minbərə vuraraq (və Mədinəni qəsd edərək): "Bura Teybədir! Bura Teybədir! Bura Teybədir! yəni Mədinədir. Diqqət edin, bunu sizə söyləmədimmi?" deyə buyurdu. Camaat "Bəli" dedi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Təmimin bu hədisi mənim çox xoşuma gəldi. Bu mənim sizə Dəccal və habelə Mədinə və Məkkə barədə dediklərimə uyğun gəlir. Bilin ki,Bu dəniz ya Şam dənizi, ya da ki, Yəmən dənizidir. Xeyr əksinə o şərq tərəfdəndir, şərq tərəfdəndir, şərq tərəfdəndir". Əlini də şərqə uzatdı. Mən Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu hədisi əzbərlədim."

69- Ənəs İbn Məlik Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Elə bir şəhər yoxdur ki, Dəccal ora ayaq basmasın.Yalnız Məkkə ilə Mədinə istisnadır, Mələklər onların giriş qapılarından

hər birində səf səf durub mühafizə edirlər. Dəccal Mədinəyə girə bilmədiyi üçün quraq bir əraziyə enər və Mədinəni üç dəfə titrədər. Mədinədə nə qədər kafir və münafiq varsa onların hamısı Dəccalın yanına çıxarlar."

### Qırx doqquzuncu fəsil: İsfahan yəhudilərindən yetmiş min nəfər Dəccala tabe olacaq.

70- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İsfahan yəhudilərindən yetmiş min nəfər Dəccala tabe olacaq. Onların əyinlərində yaşıl mantiyalar (plaşlar ) olacaqdır."

### Əllinci fəsil: İnsanların Dəccaldan dağlara qaçması və o günü ərəblərin az olması.

71- Ummu Şərik Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İnsanlar Dəccaldan dağlara qaçacaqlar." Ummu Şərik dedi: "Ey Allahın elçisi! O günü ərəblər harda olacaq?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Onlar azdılar."

### Əlli birinci fəsil: Adəmin yaradılışı ilə qiyamətin qopması arasında Dəccaldan daha böyük bir fitnə yoxdur.

72- Humeyd İbn Hilal o da aralarında Əbu Dəhmə və Əbu Qatədə olan bir camaatdan belə rəvayət edir: "İmran İbn Hüseynin yanına gələrkən Hişam İbn Amirə uğrayardıq. Bir gün o bunu söylədi: "Həqiqətən siz məni keçərək elə bir adamlara gedirsiniz ki, onlar nə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) məclisində məndən çox olmuşlar, nə də onun hədisini məndən yaxşı bilirlər. Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Adəmin yaradılışı ilə qiyamətin qopması arasında Dəccaldan daha böyük bir fitnə yoxdur."

### Əlli ikinci fəsil: İsanın (ona Allahın salamı olsun) nazil olması xaçı sındırması və donuzları öldürməsi.

73- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allaha and olsun ki, Məryəmin oğlu ədalətli bir hakim kimi nazil olacaq. Xaçı sındıracaq, donuzu öldürəcək, cizyə (can) vergisini ləğv edəcəkdir. Gənc dişi dəvələrə rəğbət edilməyəcək, kin-küdurət, qarşılıqlı nifrət və həsəd hissini keçirməyəcəklər. İsa (Ona Allahın salamı olsun) mala dəvət edəcək; lakin malı heç bir kimsə qəbul etmeyəcəkdir."

74- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Siz Məryəm oğlunun aranıza nazil olmasına və sizə başçılıq etməsinə necə baxırsınız?" İbn Əbu Zəibə dedim: "əl-Əvzai bizə əl-Zuhridən oda Nafidən oda Əbu Hüreyrədən rəvayət edir ki: " Sizin başçınız sizdən."deyə rəvayət etdi" İbn Əbu Zəib dedi: "Bilirsənmi "Sizə başçılıq etməsi." nə deməkdir?" Mən dedim (əl-Valid): "Mənə xəbər ver!". İbn Əbu Zəib dedi: "Sizə Rəbbiniz Allahın Kitabı və Peyğəmbərinizin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sünnəsi ilə başçılıq etməsi." deməkdir."

75- Cabir İbn Abdullah (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Mənim

ümmətimdən bir tayfa qiyamət gününə qədər haqq yolunda vuruşmaqdadır. İsa bin Məryəm nazil olacaqdır, onların başçıları deyəcəkdir: " Gəl bizim imamımız ol!" İsa deyəcəkdir "Yox! Siz özünüz özünüzə başçısınız. Bu, Allahın bu ümmətə bəxş etdiyi kəramətdir."

## Əlli üçüncü fəsil: "Mən və qiyamət günü, belə (iki barmaq kimi bir-birinə yaxın ) göndərildim."

76- Səhl İbn Səad (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Şəhadət və orta barmaqlarını işarə edərək belə dediyini eşitdim: "Mən və Qiyamət günü, belə (iki barmaq kimi bir-birinə yaxın ) göndərildim."

## Əlli dördüncü fəsil: Qiyamət saatının yaxınlaşması.

77- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "qiyamət nə vaxt qopacaq?" deyə soruşdu. Ənəs deyir ki, bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir an susdu. Sonra qarşısındakı, Əzdi Şənuə qəbiləsindən olan, bir oğlana baxaraq : " Bu uşaq yaşasa qiyamət qopmadan qocalıq ona çatmaz!" deyə buyurdu. Ənəs İbn Məlik deyir ki: "Bu uşaq o günü mənim yaşıdlarımdan idi."

78- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Bədəvi Ərəblər, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəldikləri zaman ondan: "Qiyamət nə vaxt qopacaq?" deyə soruşardılar. Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlardan ən gənc olana baxıb: "Əgər bu yaşasa ona qocalıq çatmadan üzərinizə qiyamətiniz qopar." Deyə buyurardı."

## Əlli beşinci fəsil: Bir adam dəvəsini sağarkən sağılan süd, süd qabının ağızına çatmadan qiyamət qopar.

79- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə rəvayət edir: "Bir adam dəvəsini sağarkən sağılan süd, süd qabının ağızına çatmadan qiyamət qopar. İki adam paltar alveri edərkən alverlərini hələ bitirməmiş vəziyyətdə olarkən qiyamət qopar və bir adam, öz su hovuzunu düzəldərkən, hələ oradan çıxmadan qiyamət qopar."

## Əlli altıncı fəsil: İki sur üfürülməsi arasında qırx vardır və Yalnız körpücük sümüyündən başqa İnsanın bütün bədəni çürüyəcək.

80- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İki sur üfürülməsi arasında qırx vardır." Səhabələr: "Ey Əbu Hüreyrə, qırx günmü?" deyə soruşdular. O: "Bir şey deyə bilmərəm!" deyə cavab verdi. Onlar: "Qırx aymı?" dedilər. O: "Bir şey deyə bilmərəm!" deyə cavab verdi. Onlar: "Qırx ilmi?" dedilər.O: "Bir şey deyə bilmərəm! "deyə cavab verdi. Sora isə belə buyurdu: " Sonra Allah səmadan su endirəcək və insanlar tərəvəz bitən kimi bitəcəklər. İnsanın çürüməyəcək heç bir yeri yoxdur. Yalnız bir sümükdən başqa. O.körpecük sümüyüdür. Qiyamət günü məxluqlar ondan yığılıb toplanacaq."

## Əlli yeddinci fəsil: Kişilərin ən zərərli fitnəsi qadınlardı.

81- Usamə İbn Zeyd İbn Harisə və Səid İbn Zeyd İbn Amr İbn Nufeyl onların hər ikisi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Özümdən sonra kişilər üçün qadından daha zərərli fitnə buraxmadım."

### Əlli səkkizinci fəsil: Qadınların fitnəsindən çəkinmək.

82- Əbu Səid əl-Xudri Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dünya şirindir və xoşdur. Allah sizi ona varis edəcək və sizin necə hərəkət edəcəyinizə baxacaq. Elə isə dünyadan (çəkinin) və qadınlardan (çəkinin) qorxun, çünki Bəni İsrail övladlarında ilk fitnə qadınların (əli ilə) olmuşdur."

# Zahidlik (tərki-dünyalıq) və (qəlbi) İncəliklər kitabı.

### Birinci fəsil: "Allahım! Muhammədin ailəsinin ruzisini (ehtiyacı) çatacaq qədər et".

1- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allahım! Muhammədin ailəsinin ruzisini, (ehtiyacı ) çatacaq qədər et". (Müslim / 1055).

### İkinci fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yaşayışının çətinliyi.

2- Urva Aişənin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: "Ey bacımın oğulu Allaha and içərəm ki, biz aya baxardıq. Sonra bir ayı da görərdik. Sonra o birsi ayı da görərdik. İki ayda üç hilal görüb tamamlayardıq lakin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) evlərində isə ocaq yandırılmazdı." Urva belə rəvayət edir: "Mən: "Ey xala! elə isə sizləri yaşadan şey (azuqəniz) nə idi?" deyə ondan soruşdum. O da: "İki qara şey: Xurma ilə su! Doğrusu Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ənsarlardan bəzi qonşuları var idi. Onların süd verən heyvanları vardı. Onlar bu heyvanların südlərindən sağıb Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) göndərərdilər. Peyğəmbər də (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu süddən bizlərə içirərdi".

3- Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gündə iki dəfə çörək və zeytun ( yağı) ilə doymadığı halda vəfat etmişdir".(Müslim /2974).

4- Aişənin (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: "Muhammədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ailəsi iki gün buğda çörəyindən doya doya yeməmişdir. İki günün birində mütləq xurma olmuşdur".

5- Əbu Hatim Əbu Hureyrənin belə dediyini rəvayət edir: "Nəfsim əlində olana and olsun ki, (İbn İbad belə demişdir: " və ya; "Əbu Hüreyrənin (Allah ondan razı olsun) nəfsi əlində olana and olsun ki,") Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ailəsini üç gün ardıcıl olaraq buğda çörəyi ilə doydurmadan dünyadan ayrıldı". (Müslim / 2976).

6- Aişə (Allah ondan razı olsun) rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) rəfimdə yalnız bir qədər arpadan

başqa , canlı bir kimsənin yediyi bir şey olmadığı zaman vəfat etdi. Arpadan uzun zaman yedim. Onu çəkdim və (bu arpa da) tükəndi." (Müslim / 2973).

## Üçüncü fəsil: Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qarınını doyuracaq pis xurma belə tapa bilmirdi.

7- Simak İbn Hərb Numan İbn Bəşirin belə xütbə verərkən eşitdiyini rəvayət edir: "Ömər, insanların dünyadan əldə etdiklərini xatırlayıb: " Mən, Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bütün gün qıvranaraq qarınını doyuracak pis xurma tapa bilməyərkən gördüm." (Mülim / 2978).

## Dördüncü fəsil: Mühacirlərin kasıbları qiyamət günündə cənnətə zənginlərdən əvvəl girəcəklər.

8- Əbu Əbd ər-Rəhman əl-Hubuli bir kişinin Abdullah İbn əl-Asdan belə soruşduğunu eşitdiyini rəvayət etmişdir: "Bir adam,Abdullahdan bir şey istəyərək: "Biz, Mühacirlərin kasıblarından deyilikmi?" dedi. Abdullah ona: "Sənin ona sığınacağın bir xanımın varmı?" deyə soruşdu. O adam: "Bəli, vardır" deyə cavab verdi. Abdullah yenə ondan soruşdu: "İçində oturmaqda olduğun bir evin varmı?". O adam; "Bəli, vardır" deyeə cavab verdikdə,. Abdullah belə buyurdu: "Elə isə sən zənginlərdənsən". Adam: "Amma mənim bir xidmətçim də var" dedi. Abdullah ona: "O halda sən hökmdarlardansan!" deyə buyurdu. Əbu Abdurraman belə buyurmuşdur: ",Mən Abdullah İbn Amr İbn əl-Asın yanında olduğum zaman üç nəfər gəlib ona belə dedi: "Ey Əbu Muhamməd! Allaha and olsun ki biz heç bir şeyə qadir deyilik. Nə sərf edəcək mala, nə heyvana, nə də əşyaya! Abdullah onlara: "Nə istəyirsiniz? İstəsəniz bizə müraciət edərsiniz. Biz də sizə Allahın sizin üçün verdiyindən verərik. İstəyirsiniz izin haqda hökmüdara xəbər verərik. Ya da istəsəniz səbr edərsiniz. Çünki mən Peyğəmbəri (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Şübhəsiz ki, mühacirlərin kasıbları qiyamət günündə cənnətə zənginlərdən qırx il əvvəl girəcəklər" buyurarkən eşitdim. O üç şəxs: "Elə isə səbr edirik və heç bir şey istəmirik." dedilər. (Müslim / 2979).

## Beşinci fəsil:Cəhənnəm əhlinin çoxu qadınlardır

9- Usamə İbn Zeyd (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Cənnətin qapısında durdum. Oraya girənlərin böyük çoxluğunun miskinlər (yoxsullar) olduğunu gördüm. Mal sahiblərindən Cəhənnəmlik olanlardan başqaları (haqq-hesab) üçün həbs olunmuşlardı. Atəş əhli olan zənginlərin isə Cəhənnəmə atılmaları əmr olunmuşdu. Cəhənnəmin qapısında da durdum. Bir də baxdım ki, Cəhənnəmə girənlərin çoxu qadınlardır " (Müslim / 2737).\

## Altıncı fəsil: Dünyada zahid olmaq və dünyanın Allah üçün dəyərsiz olması.

10- Cabir (Allah ondan razı olsun) rəvayət edir ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Mədinənin yuxarı tərəfindən bazara daxil oldu.Ətrafında insanlar var idi. Ölmüş kiçik qulaqlı (və yaxud qulağı kəsilmiş) bir oğlaqın yanından keçdi. Onun qulağından tutaraq buyurdu: "Sizdən kim bunu bir dirhəm qarşılığında almaq istər?". Səhabələr dedilər: "Biz onun heç bir şey qarşılığında bizim olmasını istəmirik. Onunla nə edə bilərik ki?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) buyurdu: "Bu sizin olmağını istəyirsinizmi? Səhabələr dedilər: "Allaha and olsun ki, o diri olsaydı belə

onu heç kəs almazdı. Çünkü qüsurlu oğlaqdır. Qulaqları kiçikdir (və yaxud kəsilibdir),ölü olduğu halda necə (kim onu istəyər ki)?" dedilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Allaha and olsun ki, bu sizin üçün nə qədər dəyərsiz olduğu kimi bu dünya da Allah üçün o, qədər dəyərsizdir" (Müslim / 2987).

11- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dünya möminin zindanı, kafirin isə cənnətidir." (Müslim /2906).

## Yeddinci fəsil: Dünyanın (naz-nemətlərinin) açılması və onun üçün (insanların) yarışmanın qorxusu.

12- Amr İbn əl-Ovf (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Ubeydə İbn Cərrahı Bəhreyinə oranın cizyəsini (vergisini) gətirmək üçün göndərdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bəhreyn xalqıyla müəyyən bir miqdarda cizyə vermə barəsində müqavilə bağlamışdı. Üzərlərinə əl-Alə İbn əl-Hadramini əmir təyin etmişdir. Əbu Ubeydə Bəhreyndən cizyə malını götürüb (Mədinəyə) gəldi.Ənsarlar Əbu Ubeydənin gəldiyini eşitdi və Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə səhər namazına gəldilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) namazı qılıb oradan ayrıldı. Onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qarşısına çıxdılar. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onları qarşısında gördüyü vaxt gülümsədi və sonra belə buyurdu: "Zənn edirəm ki, siz Əbu Ubeydənin Bəhreyndən bir şey ilə gəldiyini eşitdiniz?" Onlar: "Bəli, Ey Allahın elçisi!" deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O halda sevinin və sizi sevindirəcək şeyi ümid edin! Allaha and olsun ki, Mən sizin kasıb olmağınızdan qorxmuram, lakin mən sizin dünyanın sizdən əvvəlkilərə sərildiyi kimi, sizə də sərilməsindən və dünya üçün onların yarışdıqları kimi, sizin də yarışmağınızdan və dünyanın onları həlak etdiyi kimi, sizi də həlak edəcəyindən qorxuram" (Müslim / 2961).

## Səkkizinci fəsil: Dünya fəth olunan zaman bir-biri ilə yarışmaq və bir - birinə həsəd etməyin qorxusu.

13- Abdullah İbn Amr İbn əl-As Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizə Fars və Rum fəth olunduğu vaxt, sizlər hansı qövmsünüz?" Əbd ər-Rahman İbn Ovf belə dedi: "Allahın bizə əmr etdiyi kimi (həmd şükür və fəzilətini istəməyə dair sözlər) deyərik." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Bundan başqa bir şey etməzsinizmi? Yarış edərsiniz. Sonra bir-birinizə həsəd edərsiniz. Sonra bir-birinizə arxa çevirərsiniz. Sonra bir-birinizdən küsərsiniz. Yaxud buna bənzər şeylər edərsiniz. Sonra mühacirlərin kasıblarına gedib, onları bir-birləri üzərinə (vali) edərsiniz" (Müslim / 2962).

## Doqquzuncu fəsil: Dünya axirətlə müqayisədə, sizdən biriniz barmağını böyük bir dəryaya batırıb oradan çıxartdığı su qədərdir.

14- Mustəvrad Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Dünya axirətlə müqayisədə, sizdən biriniz bu

barmağını (Yəhya şəhadət barmağını işarə etdi) böyük bir dəryaya batırıb oradan çıxartdığı su qədərdir." (Müslim / 2858).

## Onuncu fəsil: Dünya ilə imtahana çəkilmək və orada necə əməl etmək haqda.

15- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: " İsrail oğullarının içərisində cüzam xəstəliyinə tutulan, biri keçəl, biri də kor olan üç adam vardı. Allah onları sınağa çəkmək istədi və onlara bir mələk göndərdi. Mələk cüzam xəstəliyi olanın yanına gəlib belə dedi: "Sənin ən çox istədiyin şey nədir? "O: "Gözəl rəng, gözəl dəri və insanların iyrəndiyi xəstəliyin məndən getməsi." Deyə cavab verdikdə, Mələk ona məsh çəkdi və ondan bu çirkin hal getdi, ona gözəl bir rəng və gözəl bir dəri verildi. Mələk dedi: "Sənin ən istədiyin mal hansıdır?"O "dəvədir" və yaxud "inəkdir" dedi. (İshaq şəkk edərək belə demişdir: "cüzam xəstəliyinə tulan və yaxun keçəl iksindən biri: "Dəvə", digəri isə: "İnək." Dedmişdir.") Ona doğması yaxın olan dişi bir dəvə verildi.Mələk "Allah sənə bu dəvədə bərəkət versin" dedi. Sonra keçəlin yanına gəldi və dedi: "Sənin ən çox istədiyin şey nədir?" Keçəl dedi: "Gözəl saç və insanların iyrəndiyi bu keçəlliyin məndən getməsidir!" Mələk ona məsh çəkdi və ondan bu çirkin hal getdi və ona gözəl bir saç verildi. Mələk dedi: "Sənin ən çox istədiyin mal hansıdır?" O: "İnəkdir" dedi və ona hamilə bir inək verildi. Mələk " Allah sənə bu inəkdə bərəkət versin" dedi. Sonra korun yanına gəlib dedi: "Sənin ən çox istədiyin şey nədir? O belə cavab verdi: "Allah mənə gözümü qaytarması və onunla insanları görməkdir. Mələk ona məsh çəkdi və Allah ona gözünü qaytardı. Mələk dedi: " Sənin ən çox istədiyin mal hansıdır?" O "qoyundur " dedi. Ona doğmuş bir qoyun verildi. Bir müddət sonra bunların malları balaladı. Dəvə istəyənin bir vadi dəvəsi, mal istəyənin bir vadi malı və qoyun istəyənində bir vadi dolusu qoyunu olmuşdur.Sonra Mələk cüzam xəstəliyinə tutulanın yanına onun əvvəlki şəklində gəlib dedi: " Mən kasıb bir adamam. Bu gün əvvəlcə Allah sonra səndən başqa məni (evimə) çatdıracaq yoxdur. Səndən bu gözəl rəngi, gözəl dərini və malı verən (Allah rizası üçün) bir dəvə istəyirəm. Yolumda onunla muradıma çatacağam". Cüzam xəstəliyinə tutulan dedi: "Haqqlar çoxdur." Mələk ona dedi: "Elə bil mən səni tanıyıram. Sən kasıb, insanların iyrəndiyi cüzam xəstəliyinə tutulan deyilsənmi? Sən kasıb idin, Allah sənə verdi." Cüzam xəstəliyinə tutulan dedi: "Mən bu malı ancaq büyükdən böyüyə bir miras olaraq əldə etdim". Mələk ona dedi: "Yalan danışırsansa Allah səni köhnə halına çevirsin!" Sonra mələk keçəlin də yanına köhnə surətində gələrək, buna söylədiyini ona da söylədi. O da bunun kimi cavab verdi. Mələkdə ona: "Yalan danışırsansa Allah səni köhnə halına çevirsin!" dedi. Sonra korun da yanına köhnə şəklində gəlib dedi: "Mən kasıb bir adamam, Bu gün əvvəlcə Allah sonra səndən başqa məni (evimə) çatdıracaq yoxdur. Səndən gözünü qaytaran (Allah rizası üçün) bir qoyun istəyirəm. Yolumda onunla muradıma çatacağam".Kor dedi: "Həqiqətən mən kor idim. Allah mənə gözümü qaytardı. İndi istədiyini götür, istədiyini də saxla! Allaha and olsun ki, bu gün Allah üçün götürdüyün bir şeydə sənə çətinlik çıxarmayacam". Onda mələk dedi: "Malın sənin olsun. Siz ancaq sınağa çəkildiniz. Səndən razı olundu, iki yoldaşına isə qəzəbləndi." (Müslim /2964).

## On birinci fəsil: Dünya (Nemətlərinin) az olması və ağac yarpağı yemək haqda.

16- Səad İbn Əbu Vaqqas (Allah ondan razı olsun) belə rəvayət edir: "Allaha and olsun ki,mən Allah yolunda Ərəblərdən ilk ox atan adamam. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ilə birlikdə Hublə ilə Səmur ağacının

yarpağından başqa yeyəcəyimiz bir şey olmadığı halda döyüşə gedərdik. Hətta hər birimiz qoyun kimi etiyacını ödərdi. Sonra Bəni Əsəd din naminə məni töhmət etdi. Bu halda mən xəsarətə uğradım və əməlim batil oldu." (Müslim / 2966).

17- Xalid İbn Umeyr əl-Adavi belə rəvayət edir: "Utbə İbn Ğazvan bizə xütbə verdi və Allaha həmd səna etdi. Sonra bunları söylədi: "Bundan sonra (məlum olsun ki) dünya keçici olduğunu bildirmiş və sürətlə keçib getmişdir. Ondan qabın dibində qalan və sahibi içən qalıntı kimi başqa bir şey qalmamışdır. Heç şübhə yoxdur ki, siz dünyadan fani olmayan bir diyara köçəcəksiniz. O halda əlinizdə olanın ən xeyirlisi ilə köçün. Bizə deyildiyinə görə "Cəhənnəmin kənarından bir daş atılar, dibinə çatmaq üçün yetmiş il düşər. Onun dibinin dərinliyi bilinməz. Allaha and olsun ki, cəhənnəmə doldurulacaqsınız. Yoxsa təəcüb edirsiniz? Bizə deyildiyinə görə, cənnət qapılarının hər iki çərçivəsinin arası qırx illik məsafədir. Cənnətdə elə bir gün gələcək ki, izdihamdan qapıya qədər dolacaq. Mən özümü, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ilə birlikdə olan yeddi adamın yeddincisi olduğumu görmüşəm. Ağac yaprağından başqa yeməyimiz yox idi. Hətta dodaqlarımız yara oldu. Mən bir əba tapdım və onu özümlə Sad İbn Malik arasında böldüm. Yarısı ilə özüm sarındım, yarısı ilə də Sad sarındı. Bu gün isə bizdən hər biri, şəhərlərdən birinə əmir olmuşuq. Mən nəfsim haqqında böyük, Allah yanında kiçik olmaqdan Allaha sığınaram. Həqiqətən heç bir Peyğəmbərlik yoxdur ki, nəsx olduqdan sonra aqibəti səltənətə çevrilməsin. Sizlər xəbər alacaq və bizdən sonra gələcək əmirləri təcrübə edəcəksiniz." (Müslim / 2967).

## On ikinci fəsil: Ölünün ailəsi və malı qayıdar, əməli isə onunla qalar.

18- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ölünü üç şey müşayiət edər: "ailəsi, malı və əməli. Bunlardan ikisi qayıdar, biri onunla qalar. Ailəsi və malı qayıdar, əməli onunla qalar." (Müslim / 2960).

## On üşüncü fəsil: Sizdən daha aşağıda olanlara baxın!

19- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizdən daha aşağıda olanlara baxın! Sizdən yuxarıda olanlara baxmayın! Bu, Allahın nemətini kiçik hesab etməmənizə daha uyğun olar." (Müslim / 2963).

## On dördüncü fəsil: Şübhəsiz ki, Allah Ondan qorxan, zəngin və özünü gözə soxmayan qulu sevər.

20- Amir İbn Sad belə rəvayət edir: "Sad İbn Əbu Vakkas dəvələrinin yanında idi.(Bu zaman) oğlu Ömər gəldi. Sad onu görüncə, "Bu süvarinin şərrindən Allaha sığınaram" dedi. Oğlu dəvədən endi və dedi: "Sən dəvələrinin və qoyunlarının içinə gəlib insanları öz aralarında mülk mübarizəsi edər halda tərkmi etdin?" dedi. Sad, oğulunun sinəsinə vurub belə dedi: "Sus! Mən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini eşitdim: "Şübhəsiz ki, Allah Ondan qorxan, zəngin və özünü gözə soxmayan qulu sevər" (Müslim 2965).

## On beşinci fəsil: Kim bir əməldə Allahdan başqasını şərik qoşarsa..

21- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təala buyurdu:

"Mən şirk qoşulanların şirklərindən Ucayam. Kim bir əməl işlər və onda başqasını mənə şərik qoşarsa, onu və şirkini tərk edərəm." (Müslim / 2985).

## On altıncı fəsil: Əməlini eşitdirən və riyakarlıq edən haqda.

22- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Hər kim əməlini eşitdirərsə, Allah onu eşitdirər. Və hər kim riyakarlıq edərsə, Allah onun iç üzünü meydana çıxarar". (Müslim /2986).

## On yeddinci fəsil: Danışdığı bir sözün onu Cəhənnəmə varid etməsi haqda.

23- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Şübhəsiz qul mənasını bilmədən bir söz danışar və bu səbəblə cəhənnəmdə şərq ilə qərb arası məsafədən daha uzağa düşər" (Müslim / 2988).

## On səkkizinci fəsil: Möminin bütün işləri xeyirdir.

24- Suheyb (Allah ondan razı osun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Möminin işi necə də qəribədir! Onun bütün işləri xeyirdir. Bu yalnız möminə məxsusdur. Ona sevinc üz verdikdə, Allah Təalaya şükür edər və bu onun üçün xeyir olar. Başına zərərli bir iş gələrsə səbr edər və bu da onun üçün xeyirli olar." (Müslim / 2999).

## On doqquzuncu fəsil: Sınaq zamanı dində səbr etmək və xəndək sahiblərinin hekayəsi.

25- Suheyb Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizdən əvvəlki qövmlərin birində bir şah yaşayırdı. O şahın bir sehrbazı var idi. Sehrbaz yaşlandığı zaman şaha belə dedi: "Mən artıq yaşlanmışam, mənə bir oğlan uşağı ver ki, ona sehri öyrədim". Şah da sehrbazın yanına bir oğlan uşağı göndərdi ki,ona sehr öyrətsin. Uşağın getdiyi yolda bir rahib yaşayırdı. Bir dəfə uşaq rahibin yanına gəlib oturdu və onun sözlərini eşitdi. Rahibin sözlərindən uşağın xoşu gəldi. Beləcə, uşaq sehrbazın yanına gələrkən, Rahiİbn yanında oturardı. Sehrbazın yanına gələndə sehrbaz onu (gecikdiyi üçün) döyərdi . Uşaq bu hadisə ilə bağlı rahibə şikayət etdi. Rahib də ona (məsləhət verərək) dedi ki, "əgər sehrbaz səni döyməyindən qorxsan, de ki: "ailəm məni gecikdirdi." Səni ailən döyməyindən qorxsan, de ki: "Sehrbaz məni gecikdirdi." Uşaq bu şəkildə davam edərkən bir gün nəhəng bir heyvanın insanların qarşısını kəsdiyini gördü. Bunu görən uşaq dedi: "Bu gün mən Rahibin, yoxsa sehrbazın Allaha daha yaxın olduğunu biləcəyəm. O, əlinə bir daş götürüb dedi: "Ey Allahım, əgər Rahibin işi, sehrbazın işindən Sənə daha sevimlidirsə, onda həmin heyvanı öldür ki, insanlar keçib getsinlər". O, bunları deyib əlindəki daşı atdı və heyvanı öldürdü. İnsanlar da keçib getdilər. Uşaq Rahibin yanına gəlib ona bunu xəbər verdi. Rahib uşağa dedi: "Ey uşaq, bu gün sən məndən üstünsən sənin işin (halın) gördüyüm həddə çatmışdır. Sən imtahana çəkiləcəksən. Əgər sən imtahan olunsan məni ələ verməǃ" Uşaq anadangəlmə korları, cüzam xəstəliyinə tutulanları və insanları başqa xəstəliklərdən müalicə edirdi. Həmişə şahın məclisində iştirak edən və yaxınlarından olan kor birisi uşaq barəsində eşitdi və onun yanına çoxlu hədiyyələrlə gedib belə dedi: "Mənə şəfa ver, burada olanların hamısı sənin olsun!" Uşaq dedi: "Mən heç kəsə şəfa vermirəm. Şəfa verən Allahdır. Əgər Allaha iman gətirsən, mən də Ona dua edərəm və sənə şəfa verər". O, Allaha iman gətirdi. (Uşaq

Allaha dua etdi,) Allah da ona şəfa verdi. Sonra həmin adam əvvəllər olduğu kimi gəlib şahın yanında oturdu. Şah ondan soruşdu: "Sənə gözlərini kim qaytardı?" O: "Rəbbim" deyə cavab verdi. Şah ona: "Sənin məndən başqa Rəbbinmi var?" deyə soruşdu. O: "Bəli!" Mənim və sənin Rəbbin olan Allah! dedi. Bundan sonra şah ona o qədər işgəncə verdi ki, axırda məcbur olub uşağın adını şaha söylədi. Şah uşağın yanına adam göndərib onu gəirtdi və ona dedi: "Oğlum, sehrin elə bir mərtəbəyə çatıb ki, anadangəlmə korları, cüzam xəstəliyinə tutulanlara şəfa verirsən". Uşaq dedi: "Mən heç kimə şəfa vermirəm. Şəfa verən ancaq izzət və cəlal sahibi olan Allahdır". Şah ona da işgəncə verməyə başladı. Nəhayət uşaq məcbur olub Rahibin adını söylədi. Şah Rahibin yanına adam göndərib onu gətirtdi. Ondan dinindən dönmək tələb edildi. Rahib onun bu tələbini yerinə yetirmədikdə, şah mişarla Rahibin başından ayağına kimi kəsib onu iki yerə parçaladı. Sonra da əvvəlcə kor olmuş yaxınını gətiritdi. Ondan dinindən dönmək tələb edildi. O da onun tələbini yerinə yetirmədi. (Şah tələbinin yerinə yetirilmədiyini görüb onu da) mişarla başından ayağına kimi kəsib iki yerə böldü. Sonra uşaqı gətirtdi.Ona da dinindən dönməsi tələb edildi. Uşaq da onun bu tələbinə qarşı çıxdı. Şah uşağı öz adamlarına verib onlara dedi: "Uşağı filan dağa aparın! Dağa qalxıb zirvəyə çatdıqda ondan dinindən dönməsini tələb edin! Yox əgər o, yenə də öz dinindən dönməsə, onda onu dağın başından aşağı atın!" Onlar uşağı apardılar və onunla dağa qalxdılar. Uşaq dedi: "Ey Allahım, Sən istədiyin şəkildə onlara qarşı məni qoru!" Bu zaman dağ sirkələndi və onların hamısı dağdan aşağı düşdülər. Uşaq yeriyərək şahın yanına gəldi. Şah ondan soruşdu: "Səninlə gedənlərə nə oldu?" Uşaq dedi: "Allah Təala məni onlara qarşı qorudu". Bundan sonra şah uşağı bir neçə nəfər adama tapşırıb dedi: "Aparın onu qayığa mindirin. Dənizin ortasına çatdıqda, ondan öz dinindən dönməsini tələb edin! Yox əgər dinindən dönməsə, onu dənizə atın!" Onlar uşağı apardılar. (Dənizin ortasına çatdıqda) uşaq dedi: "Ey Allahım, Sən istədiyin şəkildə onlara qarşı məni qoru!" Qayıq çevrildi bu zaman hamısı dənizə düşüb boğuldular. Uşaq yenə şahın yanına gəldi. Şah ondan soruşdu: "Səninlə gedənlərə nə oldu?" Uşaq: "Allah Təala məni onlara qarşı qorudu" deyə cavab verdi. Sonra uşaq (daha sonra üzünü şaha tutub ) belə dedi: "Sən mənim dediyimi etmədikcə, məni öldürə bilməyəcəksən". Şah soruşdu: "O nədir elə?" Uşaq dedi: " İnsanları bir yerə topla və məni bir kötüyə bağla, sonra da kamanından bir ox çıxart sonra oxu yayına qoy və "Uşağın Rəbbi olan Allahın adı ilə!" de və at! Əgər dediyim kimi etsən, məni öldürəcəksən. Şah belə də etdi insanları bir yerə topladı sonra uşağı bir kötüyə bağladı, sonra da kamanından bir ox çıxartdı və oxu "Uşağın Rəbbi olan Allahın adı ilə!" dedi və atdı. Ox uşağın gözü ilə qulağının arasına sancdı. Uşaq əlini oxun sancdığı yerə qoyub öldü. Bunu görən insnalar dedilər: "Biz uşağın Rəbbinə iman gətirdik. Biz uşağın Rəbbinə iman gətirdik. Biz uşağın Rəbbinə iman gətirdik." Bu zaman şaha belə dedilər: "Gördün, qorxduğun şey başına gəldi. İnsnaların hamısı iman gətirdi. Şah küçələrin ağzında xəndəklərin qazılmasını əmr etdi. Sonra da xəndəklərdə od qalatdırdı. Şah belə dedi: "Kim dinindən dönməsə onu xəndəyin içinə atın!" və yaxud hökümdara: "Sən at!" deyildi. Onlar da onu etdilər. Hətta növbə körpəsi ilə olan bir qadına gəldi. O qadın oda düşüb-düşməməkdə tərəddüd etdi. Lakin körpə (dil açıb ) anasına: "Ey anam, səbr et! Sən, həqiqətən də haqq üzərindəsən." deyə söylədi."

# Quranın fəzilətləri kitabı.

## Birinci fəsil: Fatihə surəsi fəziləti

1- İbn Abbas (Allah onlarin hər ikisindən razı olsun) belə rəvayət edir: "Cəbrail (ona Allahın salamı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında oturan zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yuxarıdan qapı səsinə oxşar bir səs eşitdi və başını qaldırdı. (Cəbrail ) dedi: "Bu, göydə bir qapıdır. Bugün açıldı. (Bundan əvvəl) Heç vaxt açılmayıb yalnız bu gun açıldı. Bu zaman oradan bir mələk endi. (Cəbrail) dedi: "Bu yer üzünə enən bir mələkdir. Bu günə qədər yer üzərinə heç enməmişdir".Mələk salam verdi və dedi: "Sənə verilən iki nur ilə mujdələn! Bu iki nur səndən əvvəl heç bir peyğəmbərə verilmədi. Bu iki nur, kitabı açan (əl-Fatihə) surəsi və əl-Bəqərə surəsinin son ayələridir . Onlardan oxuyacağın hər hərfə görə sənə (savab, etdiyin duan) veriləcəkdir" (Müslim / 254).

## İkinci fəsil: Quranı, əl-Bəqərə və Ali-İmran surələrini oxumağın fəziləti.

2- Əbu Umama əl-Bəhili (Allah ondan razı olsun) Peyğəmbərdan (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyini rəvayət edir: "Quranı oxuyun! Həqiqətən Quran qiyamət günü onu oxuyanlara şəfaətçi olaraq gələcək. "Zəhravayni" yəni əl-Bəqərə və əl-İmran surəsini oxuyun! Həqiqətən bu iki surə qiyamət günü iki bulud, ya da iki kölgə və yaxud göy üzündə qanadlarını açmış iki quş dəstəsi kimi gəlib oxuyucularını qoruyacaqdır. Bəqərə surəsini oxuyun! Həqıqətən onu oxumaq bərəkətdir. Onu tərk etmək isə peşmançılıqdır. Sehirbazların ona gücü çatmaz." (Müslim / 804).

## Üçüncü fəsil: Ayət əl-Kursinin fəziləti.

3- Ubey İbn Kaab (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Ey Əbu Munzir! Bilirsənmi Allahın kitabından əzbərlədiyin hansı ayə daha (Əzəmətlidir) böyükdür?" Mən: "Allah və Elçisi daha yaxşı bilir" deyə cavab verdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ey Əbu Munzir! Bilirsənmi Allahın kitabından əzərlədiyin hansı ayə daha (əzəmətlidir) böyükdür?" Mən" Allahu lə iləhə illə huval hayyul qayyum" deyə cavab verdim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sinəmə vurdu və dedi: "Elm sənə halal olsun ey Əbu Munzir!" (Müslim /810).

## Dördüncü fəsil: Bəqərə surəsinin axırıncı ayələrinin fəziləti.

4- Əbu Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir : "Kim bir gecə içərisində əl-Bəqərə surəsinin son bu iki ayəsini oxuyarsa ona bu iki ayə kifayət edər" (Müslim /808).

## Beşinci fəsil: Kəhf surəsinin fəziləti.

5- Əbu Darda (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Kim Kəhf surəsinin əvvəlindən on ayə əzbərləyərsə Dəccalın fitnəsindən qorunar" Başqa rəvayətdə isə belə dedyilir: "Kəhf surəsinin axırından" (Müslim / 809).

## Altıncı fəsil: İxlas surəsini oxumağın fəziləti

6- Əbu Darda (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Sizdən biriniz bir gecədə Quranın üçdə birini oxumağa acizdirmi?" (Səhabələr ): "Quranın üçdə biri necə oxuna bilər?" deyə soruşduqda, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Qul huvallahu əhəd." Quranın üçdə birinə bərabərdir" (Müslim / 811).

7- Aişə (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir kişini bölük başçısı olaraq göndərmişdi. O kişi yanındakılarla namaz qılarkən daimə "Qul huvallahu əhəd" surəsini oxuyardı. Onlar qayıtdıqda bunu Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bildirdilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)belə buyurdu: " Ondan nəyə görə bunu etdiyini soruşun". Səhabələr o kişidən soruşdular. O belə dedi: "Çünki İxlas surəsi Rəhmanın sifətidir. Mən də onu oxumağı sevirəm." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Ona xəbər verin ki, Allah da onu sevir" (Müslim / 813).

## Yeddinci fəsil: Fələq və Nəs surələrini oxumağın fəziləti.

8- Uqba İbn Amir (Allah ondan razı olsun) Peyğəmərin(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Gecə nazil olan və ona oxşarı heç görülməyən ayələri görmədinmi? (Onlar): "Qul əuzu birabbil fələq və Qul əuzu birabin nəs ( surəsindəki ayələrdir)." (Müslim / 814).

## Səkkizinci fəsil: Quranla kim yüksəlir.

9- Amir İbn Vasilə belə rəvayət edir: "Nafi İbn Əbd əl-Haris Ömərlə Asfan adlanan yerdə görüşdü. Ömər onu Məkkəyə başçı təyin etmişdi. Ömər ona belə buyurdu: "Vadi əhlinə başçı kimi təyin etdin?" O: "İbn Əbzəyyi" Ömər: "İbn Əbzəyy kimdir?" deyə ondan soruşdu. O: "Azad olunanlardan biri" deyə cavab verdikdə, Ömər belə dedi: "Onlara azad olunanı başçı qoydun?" O, belə dedi: "O Allahın Kitabını oxuyur və o miras elmini bilir". Ömər (Allah ondan razı olsun) belə buyurdu: "Peyğəmbəriniz (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə demişdir: "Həqiqətən Allah bu Kitabla (bəzi) qövümləri yüksəldir və başqalarını isə alçaldır. "(Müslim / 817).

## Doqquzuncu fəsil: Quranı öyrənməyin fəziləti.

10- Uqba İbn Amir (Allah ondan razı olsun ) belə rəvayət edir: "Biz Suffada olan vaxtı Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) (evindən) çıxıb belə buyurdu: "Sizdən hansınız hər gün heç bir gunah etmədən və qohumluq əlaqələrini kəsmədən Buthana ya da Aqiqa gedib və oradan iki dənə iri hörgüclü dişi dəvə gətirmək istəyər?" Biz: "Ey Allahın Elçisi bunu hamımız istəyirik". Deyə cavab verdikdə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə b uyurdu: "Sizdən birinizin məscidə gedib Allahin kitabından iki ayə öyrənməsi və ya oxuması onun üçün iki dişi dəvədən xeyirlidir. Üç ayə,üç dəvədən, dörd ayə dörd dəvədən və oxunacaq ayələr o qədər saydakı dəvələrdən daha xeyirlidir." (Müslim / 803).

## Onuncu fəsil: Quran oxuyanla, Quran oxumayanın misalı.

11- Əbu Musa əl-Aşari (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: " Quran oxuyan mömin dadı gözəl, ətiri gözəl Utruca (portaqal) meyvəsi kimidir. Quran oxumayan mömin dadı gözəl, amma ətiri olmayan xurma kimidir. Quranı oxuyan münafiq  kimsə ətiri gözəl, dadı acı reyhan otu kimidir. Quran oxumayan münafiq isə dadı acı, ətiri olmayan Hanzal (qarpızı bənzər lakin acı olan bir bitki) kimidir."

## On birinci fəsil: Quran oxumaqda məharətli olan və Quran oxumaqda çətinlik çəkən haqda.

12- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Quran oxumaqda məharətli olan "Səfəra" deyilən hörmətli və itaətkar mələklərlə bərabərdir. Ona çətin gəldiyi halda kəkələyərək Quranı oxuyan kəsə iki qat savab vardır". (Müslim / 798).

## On ikinci fəsil: Quranın oxunuşu üçün səkinətin (rahatlıq, sakinlik, hüzur) enməsi.

13- əl-Bəra (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir kişi Kəhf surəsini oxuyurdu.Yanında iki uzun kəndirlə bağlanan at var idi.(O kişinin ətrafını) bulud bürüdü. Bulud dönməyə və yaxınlaşmağa başladı. Atıda bundan hürkdü. Səhər açılanda bu kişi Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gəlib ( baş verənləri) ona bildirdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyrdu: "Bu səkinətdir, Quran üçün enmişdir." (Müslim 795).

14- Əbu Səid əl-Xudri (Allah ondan razı olsun) belə rəvayət edir: "Üseyd İbn Hudeyr bir gecə xurma qurudulan yerində Quran oxuyarkən atı şahlandı. O, oxumağa davam etdi. Sonra atı bir daha şahlandı. Useyd belə demişdir: "Atın (oğlum) Yahyanı tapdalamağından qorxdum və qalxıb atın yanına getdim. Bu arada başımın üstündə içində parıltılıar olan kölgə kimi bir şeyin yavaş-yavaş yüksələrək gözdən itdiyini gördüm. Səhər Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdim və belə dedim: "Ey Allahın Elçisi dünən axşam, gecə yarısı  xurma qurudulan yerimdə, (Quran) oxuyarkən birdən atım şahlandı". Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buuyurdu: "Oxu Hudeyrin oğlu!" Oxumaqda davam etdim. Sonra at yenə şahlandı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə: "Oxu Hudeyryn oğlu!" deyə buyurdu. Oxumaqda davam etdim.vSonra at yenə şahlandı. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenədə "Oxu Hudeyrin oğlu!" dedi. Artıq oxumaqdan imtina etdim. (Oğlum) Yahya ata yaxın bir yerdə idi. Qorxdum ki, uşağı at tapdalayar. O vaxtı bir kölgə, içində parıltılarla göyə qalxdı və gözümdən itdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "O mələklər idi. Sənin (Quran oxumağına ) qulaq asırdılar. Əgər səhərə qədər (quran ) oxumağa davam etsəydin insanlar da onları görərdilər. Onlar (insanlardan) gizlənməzdilər". (Müslim / 796).

## On üçüncü fəsil: Yalnz iki şeydə həsəd olar.

15- Səlim atasından (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurmuşdur: "İki sinif insandan başqasına qibtə edilməz. Bunlardan biri, Allah Təalanın ona Quran (elmi) verdiyi və o da gecə və gündüz onu oxuyub əməl edən kəs, digəri isə, Allah Təala ona çoxlu mal verdiyi və o da bu malı gecə və gündüz (Allah yolunda) xərcləyən kəsdir." (Müslim /815).

## On dördüncü fəsil: Quranı çox oxumaqla onu qorumaq.

16- Abdullah İbn Ömər (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: " Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyrmuşdur: "Quran (oxuma və əzbərinə) sahib olmanın misalı bağlı dəvə misalı kimidir. Əgər (dəvənin sahibi) onu qoruyarsa onu əli altında tutar əgər buraxarsa dəvə qaçıb gedər". (Müslim /789).

17- Abdullah İbn Məsud (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Bir kimsənin bu və bu ayələri unutdum deməsi nə pisdir. Əksinə o ayələr o kimsəyə unutdurulmuşdur. (Quranı oxuyun) müzakirə edin. Quranın kişilərin könüllərindən qaçması dəvənin kəndirlərindən qaçmasından daha tezdir." (Müslim / 790).

## On beşinci fəsil: Quran oxuyarkən səsi gözəlləşdirmək.

18- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə eşitdiyi rəvayət edir: "Allah Quranı səsi gözəlləşdirərək (avazla) oxuyan peyğəmbərinə verdiyi səvab qədər heç bir şeyə səvab verməmişdir."

19- Əbu Burdə Əbu Musanın Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə rəvayət etdiyini xəbər verir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əbu Musaya dedi: "Dünən görsəydin, mən sənin qiraətinə qulaq asırdım. Sənə artıq Davud ailəsinin mizmazından (gözəl səs, nəğmə, avaz) bir mizmaz .verilmişdir."

## On altıncı fəsil: Oxunuşunu avazla etmək

20- Muaviyə İbn Qurranın Abdullah İbn Muğəffəl əl-Muzənidən (Allah ondan razı olsun) belə eşitdiyi rəvayət olunur: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Fəth ilində səfərdə olarkən heyvanın üzərində əl-Fəth surəsini oxudu .Oxunuşunu avazlı etdi".Muaviyə( Hədisi rəvayət edən) dedi: "İnsanlar ətrafıma toplanmasından qorxmasaydım mən də (Abdullah İbn Muğaffəlin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oxumağını izah edərkən) avaz etdiyi kimi sizə oxuyardım."

## On yeddinci fəsil: Gecə səslə oxumaq və ona qulaq asmaq.

21- Aişə (Allah ondan razı olsun) rəvayət edir ki,Peyğəmbər(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gecə bir kişinin quran oxumağını eşitdi və dedi: "Allah ona mərhəmət etsin. Mənə filan ve filan ayələri xatırlatdı. Mən o ayələri filan və filan surələrdən salmışdım".

## On səkkizinci fəsil: Quranın yeddi hərf (oxunuş) üzrə oxunması.

22- Ömər (Allah ondan razı olsun) belə rəvayət edir: "Hişam İbn Hakimin Furqan surəsini mənim oxumadığım bir şəkildə oxuduğunu eşitdim. Halbuki Rasulullah (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu surəni mənə oxutmuşdu. Onun bu oxunuş şəklinə müdaxilə edəcəkdim. Sonra oxumağını qurtarana qədər möhlət verdim. Oxumağını qurtardıqdan sonra paltarından tutub Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirdim. Ona; "Ey Allahın Elçisi! Mən bundan Furqan surəsini mənə öyrətdiyindən

başqa bir şəkildə oxuduğunu eşitdim." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Burax onu oxusun! Ey Hişam! Oxu!" Buyurdu. Hişam da bu surəni mən ondan eşitdiyim kimi oxudu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "bu surə bu şəkildə endirildi "buyurdu. Sonrada mənə oxumağı buyurdu.Mən də mənə öyrətdiyi şəkildə oxudum. Mənə də" Bu surə bu şəkildə endirildi. Bu surə yeddi hərf (oxunuş) üzərində endirildi. Bunlardan hansı rahatdırsa o şəkildədə oxuyun! " buyurdu."

## On dpqquzuncu fəsil: Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başqasına Quran oxuması.

23- Ənəs İbn Məlik (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Ubeyy İbn Kabə belə dediyini rəvayət edir: "Allah Tala mənim sənə "ləm yəkunul ləzinə kəfəru" oxumağımı əmr etdi." (Ubeyy İbn Kab) dedi: "Allah sənə mənim adımı dedi?" Peyğəmbər ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Bəli" deyə buyurdu. O (Ubeyy) Ağlamağa başladı."

## İyirminci fəsil: Peyğəmbərin ( ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Cinlərə quran oxuması.

24- Amir (O Şəbidir) belə rəvayət edir: "Əlqamədən belə soruşdum: "İbn Məsud Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikdə cin gecəsində oldumu? (Rəvayət edən ) deyir ki Əlqamə dedi: "Mən İbn Məsuddan soruşdum ki; "Sizdən biriniz Cin gecəsində Peyğəmbərlə birlikdə oldumu?" (İbn Məsud) Dedi: "Yox,lakin bir gecə biz Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birlikə idik və biz onu itirdik. Onu vadilərdə və dağ yollarında axtardıq. (Tapa bilmədiyimiz halda ) dedik ki,cinlər onu götürüb uçublar yaxud da gizlincəsinə onu öldürüblər və beləcə də camaatın gecələyə biləcəyi ən pis bir gecəni gecələdik. Sabahladıqda birdən gördük ki, Peyğəmbər Hira tərəfdən gəlir. Dedik: "Ey Allahın elçisi, səni itirdik, axtardıq və tapmadıq və bir camaatın gecələyə biləcəyi ən pis bir gecəni gecələdik. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Mənə cinlərin dəvətçisi gəldi. Onunla getdim və cinlərə quran oxudum". Bizi aparıb cinlərin izlərini və ocaqlarının izlərini göstərdi. Onlar (Peyğəmbərdən özlərinin) yeməklərini soruşdular. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Əlinizə düşən Allahın adı çəkilən hər bir sümük. Ola bildiyi qədər bol ətli olaraq sizindi və hər bir (heyvanın) nəcasəti heyvanlarınızın yemidir."

25- Məan atasından belə eşitdiyini rəvayət edir: "Məsruqdan belə soruşdum: "Cinlərin quranı dinlədikləri gecə onların gəldiyini Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) kim bildirdi?" Dedi: " Mənə sənin atan (yəni İbn Məsud) söylədi ki,onların gəlişini Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir ağac bildirmişdi."

## İyirmi birinci fəsil: Peyğəmbərin(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) başqasından quranı dinləməsi.

26- Abdullah İbn Məsud Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona belə dediyini rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə; "Quran oxu!" dedi. Mən isə dedim: "Ey Allahın elçisi! Quran sənə endiyi halda onu sənə mənmi oxuyum?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə

buyurdu: "Mən onu başqasından dinləməyi xoşlayıram". Onda mən ən- Nisə surəsini oxumağa başladım. "Hər ümmətdən bir şahid gətirəcəyimiz zaman və səni də onlara şahid təyin edəcəyimiz zaman (kafirlərin halı) nə cür olacaq?" ayəsinə catdığım zaman başımı qaldırdım və, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) gözlərindən yaş axdığını gördüm."

27- Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Humusda idim. Camaatdan bəziləri mənə: "Bizə Quran oxu!" dedi. Mən də onlara Yusif surəsini oxudum. Camaatdan bir kişi; "Allaha and olsun ki, bu surə belə endirilməmişdi." dedi. Mən ona: "Sənə yazıqlar olsun Allaha and olsun mən bu surəni Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) oxudum və mənə; "gözəl oxudun." deyə buyurmuşdu." Mən onunla danışan zaman ondan araq iyini hiss etdim və ona dedim: "Sən araq içirsən və Allahın Kitabını yalanlayırsan? Sənə (içki içmənin cəzası olan) həddi vurmadıqca burdan getməyəcəksən!" dedim və ona həd cəzasını vurdum."

### İyirmi ikinci fəsil: Quranda ixtilaf etməkdən çəkinmək.

28- Abdullah İbn Amr (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Bir gün səhər tezdən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına getdim. Bir ayə üzərində anlaşılmazlığa düşən iki nəfərin səsləri gəldi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bayıra çıxdı. Üzündən hirsləndiyi görünürdü. Belə buyurdu: "Sizdən əvvəlkilər ancaq Kitabda anlaşılmazlığa düşdüklərinə görə həlak oldular."

29- Cundub İbn Abdullah əl-Bəcəliyy (Allah ondan razı olsun) Peyğəmbərin belə dediyini rəvayət edir: "Quranı qəlbləriniz onun üzərində birləşdiyi müdətcə oxuyun! Onun haqqında anlaşılmazlığa düşdükdə isə qalxın."

## Təfsir kitabı.

### Birinci Fəsil: Uca Allahın "Qapısından (Allaha) səcdə edən halda "hittə!" ("bizi bağışla!") söyləyərək daxil olun" ayəsi.

1- Əbu Hüreyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "İsrail oğullarına deyildi: " Qapısından (Allaha) səcdə edən halda "hittə!" ("bizi bağışla!") söyləyərək daxil olun, Biz də günahlarınızı bağışlarıq".Onlar isə əmri dəyişdirib arxaları üstə iməkləyərək girdilər. Hittə əvəzinə "Tükün içində bir dən" dedilər."

### İkinci Fəsil: Uca Allahın "Evlərinizə arxa tərəfdən girməniz yaxşı iş deyildir" ayəsi.

2- Əbu İshaq əl-Bəradan belə eşitdiyini rəvayət edir: "Ənsarlar həcc edib (Mədinəyə) qayıtdıqdan sonra evlərə yalnız arxa tərəfdən daxil olurdular.Ənsarlardan bir kişi evinə gəlib qapısından gaxil oldu və buna görə də başqaları onu danladılar.Uca Allah bu ayəni nazil etdi. "Evlərinizə (Cahiliyyət dövründə olduğu kimi) arxa tərəfdən girməniz yaxşı iş deyildir."

### Üçüncü fəsil: Uca Allahın "Ey Rəbbim, ölüləri nə cür diriltdiyini mənə göstər!" ayəsi
.

Bu barədə Əbu Hureyrənin (Allah ondan razı olsun ) rəvayət etdiyi hədis artıq "Fəzilətlər" bölümündə keçmişdir."

## Dördüncü fəsil: Uca Allahın "Siz ürəyinizdə olanı zahirə çıxarsanız da, çıxarmasanız da, Allah ona müvafiq sizinlə haqq-hesab çəkər"ayəsi.

3- Əbu Hureyrənin (Allah ondan razı olsun) rəvayət etdiyinə görə Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Göylərdə və yerdə nə varsa, (hamısı) Allaha məxsusdur. Siz ürəyinizdə olanı zahirə çıxarsanız da, çıxarmasanız da, Allah ona müvafiq sizinlə haqq-hesab çəkər. (Allah) istədiyini bağışlar, istədiyinə də əzab verər. Allah hər şeyə qadirdir" ayəsi enəndə bu səhabələrə çətin gəldi və onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib, diz üstə oturub dedilər: "Ey Allahın elçisi ! Biz bacardığımız, namaz, oruc, cihad, sədəqə kimi gücümüzün çatdığı əməlləri yerinə yetirməyə mükəlləf olduq. Lakin sənə nazil olan bu ayəyə bizim əməl etməyə gücümüz çatmır." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlara dedı: "Siz də, sizdən əvvəlki kitab əhli kimi eşitdik və qarşı çıxdıq (əməl etmədik) deməkmi istəyirsiniz? Əksinə deyin ki; "(Allahın hökmlərini) eşitdik (anladıq) və itaət etdik. Ey Rəbbimiz, bizi bağışla, (axırda) Sənin dərgahına (hüzuruna) qayıdacağıq!" Onlar da (Allahın hökmlərini) eşitdik (anladıq) və itaət etdik. Ey Rəbbimiz, bizi bağışla, (axırda) Sənin dərgahına (hüzuruna) qayıdacağıq!" dedilər." Bunları oxuyunca dilləri buna alışdı. Allah Təala da onun ardınca bu ayələri nazil etdi: "Peyğəmbər Rəbbi tərəfindən ona nazil edilənə (Qurana) inanmış və möminlər də iman gətirmişlər. (Onların) hamısı Allaha, Onun mələklərinə, kitablarına və (bütün) peyğəmbərlərinə iman gətirərək dedilər: "Biz Onun peyğəmbərləri arasında fərq qoymuruq. (Allahın hökmlərini) eşitdik (anladıq) və itaət etdik. Ey Rəbbimiz, bizi bağışla, (axırda) Sənin dərgahına (hüzuruna) qayıdacağıq!" Onlar bunu etdikə uca Allah o ayəni nəsx (ləğv) etdi və bu ayələri endirdi: "Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər yükləyər (bir işə mükəlləf edər). Hər kəsin qazandığı yaxşı əməl də, pis əməl də özünə aiddir. (Möminlər deyirlər: ) "Ey Rəbbimiz, (bəzi tapşırıqlarını) unutduqda və ya yanıldıqda bizi cəzalandırma! Uca Allah Bəli (istəyinizi yerinə yetirdim) buyurdu. Ey Rəbbimiz, bizdən əvvəlkiləri yüklədiyin kimi, bizi ağır yükləmə! Uca Allah Bəli (istəyinizi yerinə yetirdim) buyurdu. Ey Rəbbimiz, gücümüz çatmayan şeyi bizə yükləyib daşıtdırma! Uca Allah Bəli (istəyinizi yerinə yetirdim) buyurdu. Bizi əfv edib bağışla, bizə rəhm et! Sən bizim ixtiyar sahibimizsən (mövlamızsan). Kafirlərə qələbə çalmaqda bizə kömək et!" Uca Allah Bəli (istəyinizi yerinə yetirdim) buyurdu."

## Ali-İmran surəsi.

## Beşinci fəsil: Uca Allahın "Sənə Kitabı (Quranı) nazil edən Odur. Onun (Kitabın) bir hissəsi möhkəm (mənası aydın, hökmü bəlli)" ayəsi.

4- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu ayələri oxuduğunu rəvayət edir: "(Ya Rəsulum!) Sənə Kitabı (Quranı) nazil edən Odur. Onun (Kitabın) bir hissəsi (Quranın əslini, əsasını təşkil edən) möhkəm (mənası aydın, hökmü bəlli), digər qismi isə mütəşabih (çətin anlaşılan, dəqiq mənası bilinməyən, məğzi bəlli olmayan) ayələrdir. Ürəklərində əyrilik (şəkk-şübhə) olanlar fitnə-fəsad salmaq və istədikləri kimi məna vermək məqsədilə mütəşabih ayələrə uyarlar (tabe olarlar). Halbuki onların yozumunu (həqiqi mənasını) Allahdan (yaxud Allahdan və elmdə qüvvətli olanlardan) başqa heç kəs bilməz. Elmdə qüvvətli olanlar isə: " Biz onlara iman gətirdik, onların hamısı Rəbbimizin dərgahındandır", - deyərlər. Bunları ancaq ağıllı adamlar dərk

edərlər." Aişə (Allah indan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini bildirir: "Sizdən biriniz mütəşabih ayələrə tabe olanları gördükdə (bilin ki) onlar, Allah Təalanın adlandırdığı şəxslərdi və onlardan çəkinin."

### Altıncı fəsil: Uca Allahın: "Etdikləri əməllərə görə sevinən və görmədikləri işlərə görə tərif olunmağı sevən kimsələrin əzabdan xilas olacaqlarını güman etmə" ayəsi.

5- Əbu Səid əl-Xudrinin (Allah ondan razı olsun) rəvayət etdiyinə görə, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşə çıxdığı zaman münafiqlərdən olan kişilər döyüşə getməyib, ona müxalif olduqlarına görə sevindilər. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) döyüşdən qayıtdığı zaman (özlərinə bəraət qazandırmaq üçün ) ondan üzr istədilər və and içdilər. Görmədikləri işlərə görə tərif olunmağı istədilər. O (zaman) bu ayə nazil oldu: "(Ya Rəsulum!) Etdikləri əməllərə görə sevinən və görmədikləri işlərə görə tərif olunmağı sevən kimsələrin əzabdan xilas olacaqlarını güman etmə. Onları şiddətli bir əzab gözləyir."

6- Humeyd İbn Abdurrahmən İbn Avf rəvayət etdiyinə görə Mərvan qapıda duran gözətçilərdən birini İbn Abbasın yanına göndərib dedi: "Ey Rafi! Get İbn Abbasın yanına və ona de ki etdiyi əmələ görə sevinən və görmədyi işlə görə tərif olunmağı sevən hər bir kəsə əzab veriləcəksə onda bizim hamımız əzaba düçar olacayıq." İbn Abbas dedi: "Bu ayə əhli kitab barəsində endi." Sonra İbn Abbas bu ayəni oxudu. "Allah kitab əhlindən: "Siz onu (kitabda olanları) gizlətməyib, insanlar üçün aydınlaşdırmalısınız!" – deyə əhd aldığı zaman onlar bu əhdə arxa çevirdilər və onu az bir qiymətə satdılar. Onların bu alış-verişi necə də pisdir! Və (həmçinin bu ayənidə) oxudu. "Etdikləri əməllərə görə sevinən və görmədikləri işlərə görə tərif olunmağı sevən kimsələrin əzabdan xilas olacaqlarını güman etmə." İbn Abbas dedi: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onlardan bir şey soruşdu, onlar isə həqiqəti gizlədib, ona başqa cavab dedilər. Bunu etməklə onlar Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sualına verdikləri bu cavaba görə tərif olunmaq istədilər və həqiqəti gizlətdiklərinə görə də sevindilər."

## Nisə surəsi.

### Yeddinci fəsil: Uca Allahın: " Əgər yetim qızlarla (evlənəcəyiniz təqdirdə) ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa....."və "Səndən qadınlar barəsində fətva istəyirlər...."ayələri.

7- Urvə İbn Zubeyr Aişədən (Allah ondan razı olsun) Allah Təalanın; " Əgər yetim qızlarla (evlənəcəyiniz təqdirdə) ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa, o zaman sizə halal olan (bəyəndiyiniz) başqa qadınlardan iki, üç və dörd nəfərlə nikah bağlayın!" ayəsini soruşduğunu rəvayət edir. (Aişə Allah ondan razı olsun ) dedi: "Ey bacimin oğlu! O himayədə saxlanılana yetim bir qızdı. O himayədə saxlayanı öz malında şərik edir .Qızın malı və gözəlliyi kişinin xoşuna gəlir və istəyir ki, onunla mehrində ədalətli olmayaraq evlənsin. Başqasına nə qədər mehir verirsə ona da o qədər versin. Onlarla yalnız ədalətli olaraq və adətdə olan ən yüksək mehiri verməklə nikah bağlamağa icazə verildi və onlara halal olan (bəyəndikləri) qadınlardan nikah bağlamağa əmr olundu." Urvə Aişənin (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: "İnsanlar bu ayədən sonra Peyğəmbərdən fətva (əsasında hökm çıxarılan şəri məsləhət) istədilər. Allah Təala (bu ayəni) nazil etdi; "(Ya Rəsulum!) Səndən qadınlar barəsində fətva istəyirlər. De

ki: "Onlar barəsində fətvanı sizə Allah və Kitabdan (Qurandan) sizə oxunan (ayələr) verir. Onlar verilməsi vacib olanı (mirası) özlərinə verməyərək evlənmək istədiyiniz yetim qızlar (qadınlar) barədə olan ayələrdir." Aişə ( Allah ondan razı olsun ) dedi: "Allah Təalanın sizə kitabda oxunan deyə bəhs etdiyi ilk ayətdir; "Əgər yetim qızlarla (evlənəcəyiniz təqdirdə) ədalətlə rəftar edə bilməyəcəyinizdən qorxarsınızsa, o zaman sizə halal olan (bəyəndiyiniz) başqa qadınlardan nikah bağlayın!" Aişə belə buyurdu: "Allah Təalanın digər ayəti Kərimədə; "Onları nigah etmək istəyərsiniz" buyurması, sizdən birinizin tərbiyəsi altında olan yetim qızın malı və gözəlliyi az olduğu zaman, ona rəğbət göstərməsidir. Beləcə vəlilər bunlara rəğbət göstərmədikləri üçün, malına və gözəlliyinə rəğbət etdikləri yetim qadınları nigah etməkdən qadağan olundular. Ancaq ədalət göstərsələr onda bu müstəsnadır."

## Səkkizinci fəsil: Uca Allahın: "Kasıb isə qəbul olunmuş qayda üzrə yesin!"ayəsi.

8- Aişə (Allah ondan razı olsun) Allah Təalanın "Kasıb isə qəbul olunmuş qayda üzrə (ehtiyacı olduğu qədər, çəkdiyi zəhmətin əvəzi miqdarında) yesin" ayəsi haqqında belə dedi: "Bu ayə yetimi himayə edən və işlərini görən kimsə kasıb olduğu halda ondan yeməsini bəyan etmək üçün nazil olmuşdur."

## Doqquzuncu fəsil: Uca Allahın: "Siz nə üçün münafiqlər barəsində iki hissəyə ayrıldınız?" ayəsi.

9- Zeyd İbn Səbit (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uhuda getdi. Onunla olanlardan bir qismi geri qayıtdılar. Beləliklə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri iki dəstəsi bölündülər. Onların bəziləri: "onları öldürək." dedi. Bəziləri isə: "Yox(öldürməyək)." dedi. Onda "Siz nə üçün münafiqlər barəsində iki hissəyə ayrıldınız?" ayəsi nazil oldu.

## Onuncu fəsil: Uca Allahın: "Hər kəs bir mömin şəxsi qəsdən öldürərsə... "ayəsi.

10- Səid İbn Cubeyrin İbn Abbasa (Allah ondan razı olsun) belə dediyi rəvayət olunur: "Kim bir mömin şəxsi qəsdən öldürərsə ona tövbə varmı?" (İbn Abbas); "Yox!" dedi. Səid İbn Cubeyrin deyir ki, ona əl-Furqan surəsindəki bu ayəni; "Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz, Allahın haram buyurduğu cana nahaq yerə qıymazlar (onu öldürməzlər)...." ayəsini axıra kimi oxudum." İbn Abbas (Allah ondan razı olsun) dedi: "Bu Məkkə ayəsidir. Onu Mədinə ayəsi; "Hər kəs bir mömin şəxsi qəsdən öldürərsə, onun cəzası əbədi qalacağı Cəhənnəmdir." (ayənin hökmünü) ləğv etmişdir."

## On birinci fəsil: Uca Allahın: "Sizə müsəlman olduğunu bildirən (salam verən) bir kimsəyə "Sən mömin deyilsən!" deməyin!"ayəsi.

11- Abdullah İbn Abbasın (Allah onların hər ikisindən razı olsun) rəvayət etdiyinə görə Müsəlmanlardan bəziləri kiçik bir qoyun sürüsü içərisində bir adama rast gəldilər. Adam onlara: "əs-Sələmu aleykum" (Allahın salamı sizin üzərinizə olsun)" dedi. Onlar isə bu adamı tutub öldürdülər və bu kiçik sürünü də götürdülər. Onda bu ayə nazil oldu. Sizə müsəlman olduğunu bildirən (salam verən) bir kimsəyə (dünya həyatının puç mənfəətinə tamahlanaraq): "Sən mömin deyilsən!" deməyin!"

## On ikinci fəsil: Uca Allahın: "Əgər bir qadın öz ərinin qaba rəftarından, yaxud ondan üz çevirməsindən qorxarsa.." ayəsi.

12- Aişə (Allah ondan razı olsun ) Allah Talanın; "Əgər bir qadın öz ərinin qaba rəftarından, yaxud ondan üz çevirməsindən qorxarsa.." ayəsi haqqında dedi: "Bu ayə "Bir kişinin nikahında olan, yaxşı həyat tərzi keçirən, uşağı olan, sonra qadın kişinin onu boşamasını istəməyərək (məni boşama) mənim tərəfimdən hər şey sənə halal olduğu halda məni nikahında saxla." (deyən qadın haqqında) nazil olmuşdu."

## Əl-Maidə surəsi

### On üçüncü fəsil: Uca Allahın: "Bu gün dininizi sizin üçün kamil etdim..."ayəsi.

13- Tariq İbn Şihab Yəhudilərdən bir kişinin Ömərin (Allah ondan razı olsun) yanına gəlib belə dediyini rəvayət edir: "Ey möminlərin əmiri! Sizin kitabınızda, oxuduğunuz bir ayə var. Əgər biz yəhudilərə nazil olsaydı o günü biz bayram edərdik." Ömər (Allah ondan razı olsun); "Hansı ayə?" dedi. O (yəhudi) dedi: "Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və sizin üçün din olaraq islamı bəyənib seçdim". Ömər (Allah ondan razı olsun) dedi: "Mən o ayənin endirildiyi günü, və endirildiyi yerı bılırəm. O ayə cümə günü Ərafatda olarkən Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) nazil oldu."

## Əl-Ənam surəsi.

### On dördüncü fəsil: Uca Allahın: "İman gətirib imanlarını zülmə qatışdırmayanlar.." ayəsi.

14- Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "İman gətirib imanlarını zülmə qatışdırmayanlar." ayəsi nazil olanda, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələrinə (bu ayə) çətin gəldi və dedilər: "Bizdən hansımız özünə zülm etmir?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "O siz zənn etdiyiniz kmi deyil. Ancaq o Loğman (ona Allahın salamı olsun) oğluna dediyi kimidir; "Oğlum! Allaha şərik qoşma. Doğrudan da, Allaha şərik qoşmaq böyük zülmdür!"

### On beşinci fəsil: Uca Allahın: "İman gətirməmiş şəxsə (sonrakı) imanı heç bir fayda verməz." ayəsi.

15- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Üç şey (var ki,) onlar çıxdıqda "Əvvəlcə iman gətirməmiş və ya imanından bir xeyir qazanmamış şəxsə (sonrakı) imanı heç bir fayda verməz." Günəşin qərbdən (batdığı yerdən) çıxması, dəccalın çıxması və yer heyvanının çıxması."

16- Əbu Zərr,Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir gün belə dediyini rəvayət edir."Bu günəşin hara getdiyini bilirsinizmi? ( Səhabələr) dedilər: "Allah və Elçisi bilir". Peyğəmbər belə buyurdu: "(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun)" O, Ərşın altındakı gərargahına çatana kimi gedər və (orada) səcdəyə qapanır. Hətta ona: "Qalx, gəldiyin yerə qayıt!" Deyilənə qədər o halda qalır. (Sonra geri) dönər və səhər çıxdığı yerdən çıxar. Sonra Ərşın altındakı gərargahına çatana kimi gedər ve (yenə) səcdəyə qapanır. Hətta ona qalx gəldiyin yere qayıt! Deyilənə qədər o halda qalır.Və (təkrar) dönərək səhər çıxdığı yerdən çıxar. Artıq insanlar onun heç bir halını yadırğamaz olaraq ərşın altındakı gərargahına çatana kimi gedər. Nəhayət ona:

"Qalx, batdığın yerdən sabahlayaraq çıx!" Deyilər; o da battığı yerdən çıxar." Sonra isə belə dedi: "Bu nə zaman olacaq bilirsinizmi? Bu əvvəlcə iman gətirməmiş və ya imanından bir xeyir qazanmamış şəxsə (sonrakı) imanı heç bir fayda verməyəcəyi vaxtdır."

## Əl-Əraf surəsi.

### On altıncı fəsil: Uca Allahın "Ey Adəm oğulları! Məscidlərə (gedərkən) gözəl geyimlərinizi geyin" ayəsi.

17- Abdullah İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "(Cahiliyyət dövründə) qadın evi (Kəbəni) çılpaq halda təvaf edirdi və deyirdi: "Kim mənə təvaf etmək üçün paltar verə bilər?" Sonra o paltar ilə fərcini (cinsiyyət orqanını) örtər və deyərdi: "Bu gün onun bir hissəsi ya da hamısı görünəcək.Görünən tərəfi haram ediləcək" və bu ayə nazil oldu. "Ey Adəm oğulları! Məscidlərə (gedərkən) gözəl geyimlərinizi geyin!"

### On yeddinci fəsil: Uca Allahın Onlara: "Etdiyiniz əməllərə görə varisi olduğunuz Cənnət budur!" – deyə müraciət ediləcəkdir." ayəsi.

18- Əbu Səid əl-Xudri və Əbu Hureyrə (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edirlər: "Cənnətdəkilər cənnətə girdikdə bir çarçı belə car çəkəcəkdir: "Siz sağlam olub, heç vaxt xəstələnməyəcəksiniz. Siz yaşayıb, heç vaxt ölməyəcəksiniz. Siz gənc qalıb, heç vaxt qocalmayacaqsınız. Siz nemət içində olub, heç vaxt kədər (sıxıntı) çəkməyəcəksiniz." Allah Təalanın onlara sözü: "Etdiyiniz əməllərə görə varisi olduğunuz Cənnət budur!" olacaqdır."

## əl-Ənfal surəsi.

### On səkkizinci fəsil: Uca Allahın; "Halbuki sən onların arasında ola-ola Allah onlara əzab verən deyildir." ayəsi.

19- Ənəs İbn Məlik Əbu Cəhllin belə dediyini rəvayət edir: "Ya Allah! Əgər bu (Quran) Sənin tərəfindən gəlmiş haqdırsa, onda başımıza göydən daş yağdır və ya bizə şiddətli bir əzab göndər!" Onda bu ayə nazil oldu: "Halbuki sən onların arasında ola-ola Allah (sənə hörmət əlaməti olaraq) onlara əzab verən deyildir. (Tövbə edib) bağışlanmalarını diləyərkən də Allah onlara əzab verməz!" Lakin onlar (müşriklər) Məscidülhəramın sahibləri (və ya ona xidmət etməyə layiq) olmadıqları halda, (möminlərə onu təvaf etməyə) mane olduqda Allah nə üçün onlara əzab verməsin! Onun sahibləri (və ya Allahın dostları) yalnız Allahdan qorxub pis əməllərdən (küfrdən, şirkdən, bütpərəstlikdən) çəkinənlərdir." Lakin onların (müşriklərin) əksəriyyəti bunu bilməz!"

## Bəraət (ət-Tovbə) surəsi.

### On doqquzuncu fəsil: Uca Allahın: "Onlardan (münafiqlərdən) ölən heç bir kəsə heç vaxt namaz qılma, qəbrinin başında durma" ayəsi.

(Bu haqda) İbn Ömərin hədisi artıq "Ömərin (Allah ondan razı olsun) fəzilətləri" (mövzusunda) keçmişdir.

### İyirminci fəsil: Bəraət, əl-Ənfal və əl-Həşr surələrinin mahiyyəti.

20- Səid İbn Cubeyrin İbn Abbasa (Allah ondan razı olsun) belə dediyini rəvayət edir: "Tövbə surəsi (nə haqqında endi?)" (İbn Abbas) dedi: "Tövbə surəsimi? Xeyr, o, əl-Fadihadır. Çünki o surə davamlı olaraq "Va minhum" və "Minhum" "Onlardan" və "Onlardan" deyə enirdi. Hətta bizlərdən hərkəsin bu surə İçində zikr olunacağını zənn etdilər." Ona: "Ənfal surəsi (nə haqqında endi?)" dedim. ( İbn Abbas): "O, Bədr (döyüşü və bu döyüşlə əlaqədar hökümlər haqqında enmiş ) surədir." dedi. Ona: "Həşr surəsi ( nə haqqında endi)?" dedim. O (İbn Abbâs): "Bu surə Nadr oğulları haqqında endi" dedi."

## Hud surəsi.

### İyirmi birinci fəsil: Uca Allahın: "Həqiqətən, (beş vaxt namaz kimi) yaxşı əməllər pis işləri (kiçik günahları) yuyub aparar."ayəsi.

21- Abdullah İbn Məsud (Allah ondan razı olsun) bir kişinin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib belə dediyini rəvayət edir: "Mən şəhərin ən ucqar tərəfində bir qadını müalicə edirdim. Onunla (cinsi əlaqəyə girmədən) yaxınlıq etdim. Bu mənəm və istədiyin hökmü mənə ver." Ömər ona dedi: "Allah Təala sənin bu eybini örtdü. Səndə eybini örtsəydin." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona cavab vermədi. O kişi qalxdı və getdi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun ardınca bir kişini göndərib onu çağırtdı və ona bu ayəni oxudu. "Namazı gündüzün iki başında (günortadan əvvəl və sonra, yəni səhər, günorta və gün batan çağı və ya günün iki başında, yəni səhər-axşam) və gecənin (gündüzə yaxın) bəzi saatlarında (axşam və gecə vaxtı) qıl. Həqiqətən, (beş vaxt namaz kimi) yaxşı əməllər pis işləri (kiçik günahları) yuyub aparar. Bu, (Allahın mükafatını və cəzasını) yada salanlara öyüd-nəsihətdir (xatırlatmadır)." Camaatdan bir kişi dedi: "Ey Allahın Peyğəmbəri! Bu yalnız ona aiddir?" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Əksinə ,bütün insanlar üçündür."

## Subhan (əl-İsra) surəsi.

### İyirmi ikinci fəsil: Uca Allahın: "Səndən ruh haqqında soruşarlar.." ayəsi.

22- Abdullah İbn Məsudun (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbərlə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) birgə Mədinənin boş əkin sahələrindən birində idim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) xurma ağacından olan bir əsaya söykənmişdi. Bu vaxt bir dəstə yəhudi yanımızdan keçərək öz aralarında: "Ondan ruh barəsində soruşun!"- dedilər. Onlardan bəziləri: "Soruşmayın! Ola bilsin ki, onun verdiyi cavab sizin xoşunuza gəlməsin [sizdə şübhə oyatsın]", digərləri isə: "(Yox!) Soruşun" - dedilər. Onlardan bəziləri ayağa qalxıb ruh haqqında soruşdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) susdu. Ona heç bir cavab qaytarmadı. Mən bildim ki, ona vəhy nazil olur və mən ayağa qalxdım. Vəhy nazil olduqdan sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu ayəni onlara oxudu: "Səndən ruh (ruhun mahiyyəti və keyfiyyəti) haqqında soruşarlar. De: "Ruh Rəbbimin əmrindədir. (Allahın əmri ilə yaradılmışdır). Sizə (bu barədə) yalnız cüzi (az) bir bilik verilmişdir!"

### İyirmi üçüncü fəsil: Uca Allahın: "Onların tapındıqları tanrıların özlərindən hər hansı biri (Allah dərgahına) daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır" ayəsi.

23- Abdullah İbn Məsud (Allah ondan razı olsun) "Onların tapındıqları tanrıların özlərindən hər hansı biri (Allah dərgahına) daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır " ayəsi haqqında belə dedi: "İnsanlardan bir dəstə cinlərdən bir dəstəyə ibadət edirdilər. Cinlərdən olan dəstə müsəlman oldular. İnsanlar isə bu cinlərə ibadət etməkdə davam etdilər və bu ayə endi: " Onların tapındıqları tanrıların özlərindən hər hansı biri (Allah dərgahına) daha yaxın olsun deyə, Rəbbinə vəsilə axtarır."

### İyirmi dördüncü fəsil: Uca Allahın: "Namaz qılarkən səsini nə çox qaldır, nə də çox alçalt..." ayəsi.

24- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) Allah Təalanın " Namaz qılarkən səsini nə çox qaldır, nə də çox alçalt. Bunun (bu ikisinin) arasında orta bir yol tut!" ayəsi haqqında belə buyurdu: "Bu ayə nazil olanda Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Məkkədə gizli dəvət edirdi. O, səhabələri ilə namaz qılarkən Quranı uca səslə oxuyardı. Müşriklər də bunu eşitdikdə həm Quranı, həm onu endirəni həm də onunla gələni söyərdilər. Allah Təala Peyğəmbərinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Namaz qılarkən səsini nə çox qaldır" müşriklər oxuduğunu eşidib Quranı təhqir etməsinlər," nə də çox alçalt" yəni səhabələlər nə oxuduğunu eşitsin. Səsi çox qaldırma  Bunun(bu ikisinin) arasında orta bir yol tut!" Deyir ki, çox qaldırmaqla,alçatmaq arasında."

25- Aişə (Allah ondan razı olsun): " Namaz qılarkən səsini nə çox qaldır, nə də çox alçalt" ayəsi barədə belə buyurur: "Bu ayə dua haqqında nazil olmuşdur."

## Əl-Kəhf surəsi.

### İyirmi beşinci fəsil. Uca Allahın: "Biz (qiyamət günü) onlar üçün bir daş-tərəzi qurmayacağıq (yəni: "heç bir qədir qiymət qoymayacağıq")!"ayəsi.

26- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qiyamət günü böyük, kök, bir kişi gəlir. Allah Təalanın yanında milçəyin qanadı qədər də çəkisi olmayacaq."Biz (qiyamət günü) onlar üçün bir daş-tərəzi qurmayacağıq! (yəni: "heç bir qədir qiymət qoymayacağıq")" ayəsini oxuyun."

## Məryəm surəsi.

### İyirmi altıncı fəsil: Uca Allahın: "Peşmançılıq günü ilə qorxut!" ayəsi.

27- Əbu Səid əl-Xudri(Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qiyamət günündə ölüm bir qoç şəklində gətirilir və Cənnətlə Cəhənnəm arasında durdurulur. Sonra: "Ey Cənnət əhli, bunu tanıyırsınızmı?" Deyilir. Cənnətliklər başlarını qaldırıb baxarlar və: "Bəli, bu ölümdür." deyərlər. Cəhənnəm əhlinə də: "Ey Cəhənnəm əhli, bunu tanıyırsınızmı?" deyilər. Onlar da başlarını qaldırıb baxarlar və: "Bəli bu ölümdür." deyərlər. O anda Allahdan əmr gələr və ölüm qoçu kəsilir. Sonra: "Ey Cənnət əhli, əbədilik var, ölüm yoxdur!, Ey Cəhənnəm əhli, əbədilik var, ölüm yoxdur!" deyilər Bundan sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə

Allahın salavatı və salamı olsun) bu ayəni oxudu: "Qəflətdə olanları və iman gətirməyənləri işin bitmiş olacağı (haqq-hesab çəkilib mö'minlərin Cənnətə, kafirlərin isə Cəhənnəmə girəcəyi) peşmançılıq günü (insanın pis əməllərinə görə peşman olacağı, lakin bu peşmançılığın heç bir fayda verməyəcəyi qiyamət günü) ilə qorxut!" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) əli ilə dünyaya işarə etdi."

İyirmi yeddinci fəsil: Uca Allahın: "Ayələrimizi inkar edəni gördünmü?" ayəsi.

28- Xəbbab (Allah ondan razı olsun) belə rəvayət edir: "As İbn Valinin mənə borcu var idi. Mən gəlib ondan borcumu istədikdə o dedi: "Muhamməddə küfr etməyənə qədər sənin borcunu ödəməyəcəyəm." Mən ona: "Allah səni öldürüb sonra diriltməyincə mən ona küfr etmərəm." (yəni mən heç vaxt küfr etməyəcəyəm) dedikdə, o : "Mən öldükdən sonra diriləcəyəm? Onda mən malıma və övladıma qayıtdıqda borcumu ödəyəcəm." dedi. Və Uca Allah "Ayələrimizi inkar edib: "(Əgər qiyamət qopsa, axirətdə) mənə mütləq mal-dövlət və övlad veriləcəkdir!" deyən adamı gördünmü"? ayəsindən, "hüzurumuza tək-tənha gələcəkdir." ayəsinə kimi nazil etdi."

əl-Ənbiyə surəsi.

İyirmi səkkizinci fəsil: Uca Allahın: "(O gün insanları) ilk dəfə (yoxdan) yaratdığımız kimi qaytarıb (dirildib) əvvəlki halına salarıq" ayəsi.

29- İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) öyüd-nəsihət verərək dedi: "Ey insanlar siz ayaqyalın, çılpaq və sünnətsiz toplanacaqsınız. "(O gün insanları) ilk dəfə (yoxdan) yaratdığımız kimi qaytarıb (dirildib) əvvəlki halına salarıq. Biz yerinə yetirməli olduğumuz vədi mütləq yerinə yetirəcəyik". Bilin ki,qiyamət günü ilk dəfə geyindirilən İbrahim (Ona Allahın salamı olsun) olacaq. Mənim ümmətimdən kişilər gətiriləcək. Yaxınlaşdıqları onlara mane qoyularaq. Sol tərəfə götürüləcəklər. Mən deyəcəyəm: "Ey Rəbbim onlar mənim səhabələrimdir." Mənə belə deyiləcək: "Sən bilmrsən onlar səndən sonra nə törətdilər." Saleh qul (İsa Peyğəmbərin (Ona Allahın salamı olsun) dediyi kimi deyəcəyəm: " Nə qədər ki, onların arasında idim, onlara şahid mən idim.(onları belə nalayiq hərəkətlər etməyə qoymurdum) Sən məni (göyə qaldırıb dərgahına) qəbul etdikdən sonra onlara nəzarətçi Özün oldun. Yalnız Sən hər şeyə şahidsən! Əgər onlara əzab versən, şübhə yoxdur ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, yenə şübhə yoxdur ki, Sən yenilməz qüvvət sahibi, hikmət sahibisən." Mənə belə deyiləcəkdir: "Sən onlardan ayrılan gündən onlar dinlərindən dönməkdə davam etdilər."

Əl-Həcc surəsi.

İyirmi doqquzuncu fəsil: Uca Allahın: "Rəbbi barəsində mübahisə aparan bu iki zümrə (möminlər və kafirlər bir-birinə) düşməndir"ayəsi.

30- Qeys İbn Ubbəd belə rəvayət edir: " Əbu Zərrin and içərək belə dediyi eşitdim: "Rəbbi barəsində mübahisə aparan bu iki zümrə (möminlər və kafirlər bir-birinə) düşməndir" ayəsi Bədr döyüşündə mübarizə aparan (bir biri ilə təkbətək vuruşan) Əli, Həmzə, Ubeydə İbn əl- Haris (Allah onlardan razı olsun), Şeybə İbn Rəbiə, Ütbə İbn Rəbiə və Vəlid İbn Ütbə barəsində enmişdir."

Ən-Nur surəsi.

## Otuzuncu fəsil: Uca Allahın: "Həqiqətən, (Aişə barəsində) yalan xəbər gətirənlər öz içərinizdə olan bir zümrədir (münafiqlərdir)." ayəsi.

31- Əz- Zuhri belə rəvayəy edir: "Mənə Səid İbn əl-Museyyib,Urvə İbn əl-əz-Zubeyr ,Əlqamə İbn Vaqqas,Ubeydullah İbn Abdullah İbn Utbə İbn Məsud Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişənin (Allah ondan razı olsun) hədisindən belə xəbər verdilər: "O vaxt ki,böhtan əhli ona böhtan atdığı zaman, Allah Təala onu, onların dediklərindən təmizə çıxardı. Bu ravilərin hamısı mənə onun hədisinin bir qisimim rəvayət etdi. Onun hədisini bəzisi bəzisindən daha yaxşı bəlli və rəvayət tərəfindən daha sabit idi. Bunların hər birindən mənə rəvayət etdiyi hədisi yaxşı qavradım. Hədisləri birbirini təsdiq etməkdədir. Dediklərinə görə Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcəsi Aişə (Allah ondan razı olsun) rəvayət edir ki; "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səfərə çıxmağa hazırlaşdıqda zövcələri arasında püşk atardı. Püşk kimə düşsəydi onu da özü ilə səfərə aparardı. Döyüşlərin birində o yenə bizim aramızda püşk atdı və bu dəfə mənə düşdü. Mən onunla birgə səfərə çıxdım. Bu vaxt artıq hicab ayəsi nazil olduğundan məni kəcavənin içərisində apardılar. Səfər biz döyüşü başa vurub geri dönənə qədər davam etdi. Biz Mədinəyə qayıtdıqda ona yaxın bir yerdə [dincəlmək üçün] dayandıq. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) orada gecələməyib, səfərə çıxmağı əmr etdi. Mən [zəruri ehtiyacımı ödəmək üçün təkbaşına] qoşundan uzaqlaşmışdım. Ehtiyacımı ödəyib, geri qayıtdıqda yolda əlimi sinəmə toxundurub Yəmən muncuğundan olan boyunbağımın qırılıb düşdüyünü gördüm və onu axtarmaq üçün yenidən geri qayıtdım. Elə onu axtarmaq da məni yoldan saxladı. Kəcavəni aparanlar mənim onun içərisində olduğumu güman edərək onu götürüb dəvənin üstünə qoydular. O zamanlar qadınlar az yedikləri üçün yüngül çəkili olurdular və elə bu səbəbdən də onlar kəcavəni qaldırarkən onun çəkisindəki fərqi hiss etmədilər. Mən o zamanlar çox gənc idim və onlar beləcə dəvəni sürüb apardılar. Boyunbağını tapıb geri qayıtdıqda qoşun artıq çıxıb getmiş, orada nə bir çağıran, nə də bir cavab verən qalmışdı. Mən onların məni yerimdə tapmadıqları üçün mütləq dönəcəklərini güman edərək kəcavənin dayandığı yerə gəldim. Az sonra oturduğum yerdə yuxuladım. Bu vaxt Səfvan İbn Muattil əs-Suləmi əz-Zəkvani (Allah ondan razı olsun) qoşunun ardı ilə gəlirdi. O mən olan yerə səhərə yaxın gəlib çatdı və yatmış bir insan qaraltısı görüb mənə yaxınlaşdı. O hicab ayəsi nazil olmamışdan öncə məni gördüyü üçün dərhal məni tanıdı. Mən onun istirca (innə lilləhi va innə iləyhi raciun) etməsinə oyandım və çarşabla üzümü örtdüm. Vallahi o məni heç danışdırmadı və mən də ondan istircadan başqa bir kəlmə də eşitmədim. O dəvəsini diz çökdürdü və mən ona mindikdən sonra [üzəngisindən] tutaraq sürüb apardı. Nəhayət biz şiddətli isti olduğundan çayın qırağında oturmuş orduya yetişdik. Bu zaman bir çoxları [mənə iftira atmaqla] həlak oldu. Böhtan atanların başçısı Abdullah İbn Ubey İbn Səlul idi. Mədinəyə çatdıqdan sonra bir ay xəstə oldum. Bu andan camaat böhtan atanların söz-söhbətlərini müzakirə edir, mən isə bütün bunlardan xəbərsiz idim. Həmişə xəstələndiyim zaman Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə göstərdiyi qayğını indi ondan görməməyim məni şübhələndirirdi. O (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sadəcə olaraq yanıma gəlir, salam verib "vəziyyətin necədir?" deyir və gedirdi. Bütün bunlar məni şübhələndirsə də mənə yönələn şərdən xəbərim yox idi. Sağaldıqdan sonra Ummu Mistahla (Allah ondan razı olsun) birgə Mədinənin kənarında olan bir yerə getmək üçün evdən çıxdım. Bura bizim gecədən-gecəyə zəruri ehtiyaclarımızı ödəmək üçün gəldiyimiz yerlər idi. O vaxtlar hələ evlərin

yaxınlığında ayaqyolular tikilməmişdi və bütün bunlar əvvəlki ərəblərin təmizlik adətlərinə görə idi. Evlərin yaxınlığında ayaq yolular tikmək bizə əziyyət edərdi. Ummu Mistahın (Allah ondan razı olsun) atası Əbu Ruhm İbn Əbd əl-Mutallib İbn Əbd əl-Mənaf, anası Əbu Bəkrin (Allah ondan razı olsun) xalası İbn Səxr İbn Amir, oğlu isə Mistah İbn Usasə İbn Abbad İbn əl-Mutallibdir. Biz birgə evə yaxınlaşdıqda onun ayağı əbasına ilişdi və: "Mistah həlak olsun!" dedi. Mən ona dedim: "Sənin dediyin necə də pisdir! Bədr döyüşündə iştirak etmiş bir kimsəni söyürsən?! O dedi: "Ey qadın! Məgər sən onun nə dediyini eşitməmisən?" Mən: "O nə deyib ki?" deyə soruşdum və o da iftiraçıların mənim haqqımda dediklərini mənə xəbər verdi. Xəstəliyim daha da şiddətləndi. Evə gəldikdən sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yenə mənim yanıma gəldi. O əvvəlki tək salam verib əhvalımı soruşdu. Mən ondan valideynlərimin yanına getməyə izn istədim, o da etiraz etmədi. Mənim niyyətim bu xəbərin doğru olub-olmadığını valideynlərimdən dəqiqləşdirib əmin olmaq idi. Valideynlərimin yanına getdim və anama: "Anacan camaat nə danışır?" dedim. O dedi: "Qızım özünü üzmə [öz sağlığını düşün] çox nadir hallarda rast gəlmək olar ki, gözəl qadını əri sevsin və ortaqları [ərin başqa zövcələri] onun əleyhinə danışmasınlar." Mən: "Sübhanəllah! Demək insanlar bunu danışırlarmış" dedim. Mən bütün gecəni ağladım, səhərə qədər göz yaşım dayanmadı və bir anlıq belə yuxulaya bilmədim. Vəhy nazil olması gecikdiyi üçün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əli İbn Əbu Talibi (Allah ondan razı olsun) və Usamə İbn Zeydi (Allah ondan razı olsun) zövcəsini tərk edib-etməməsi barədə məsləhət almaq üçün yanına dəvət etdi. Usamə İbn Zeyd (Allah ondan razı olsun) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənim namuslu olduğumu və bizi ürəkdən istədiyini bildirərək dedi: "Ey Allahın elçisi! Biz onun barəsində yalnız yaxşı şey bilirik!" Əli İbn əbu Taliİbn (Allah ondan razı olsun) cavabı isə belə oldu: "Allah sənə heç bir hədd qoymayıb. Ondan başqa nə çox qadınlar var. Əgər Aişənin (Allah ondan razı olsun) xidmətçisindən Bərirədən (Allah ondan razı olsun) soruşsan, o sənə düzünü deyər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Bərirəni (Allah ondan razı olsun) çağırıb dedi: "Ey Bərirə! Səni şübhələndirəcək bir şey görmüsənmi?" Bərirə (Allah ondan razı olsun): "Xeyr! Səni haqq ilə göndərənə and olsun ki, ondan bir qəbahət iş görsəydim onu qınayardım. Yalnız onu deyə bilərəm ki, az yaşlı qız uşağı olduğu üçün mən yoğurduğum xəmiri qorumağı ona tapşırdıqda o yatırdı və qoyun gəlib xəmiri yeyirdi" dedi. Abdullah İbn Ubey İbn Səlul dediyinə görə üzrxahlıq istəsin deyə həmin gün Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərə qalxıb dedi: "Ey müsəlman camaatı! Sizlərdən kim mənim əhlimə əziyyət verən kimsənin ittihamlarını rədd edərək əhlimə bəraət qazandıra bilər? Mən öz həyat yoldaşımın barəsində xeyirdən başqa bir şey bilmirəm (heç bir pis hərəkət görməmişəm). Eləcə də ittiham olunan kişinin Səfvan İbn Muattilin (Allah ondan razı olsun) barəsində də xeyirdən başqa bir şey bilmirəm. O heç vaxt mənsiz bizim evə daxil olmayıb". Bu vaxt Səd İbn Muaz əl-Ənsari (Allah ondan razı olsun) ayağa qalxıb dedi: "Ey Allahın elçisi, mən sənə haqq qazandırmaq istəyirəm. Əgər ittiham edən şəxs Əvs qəbiləsindəndirsə biz onun boynunu vurarıq, yox əgər qar-daşlarımız olan Xəzrəc qəbiləsindəndirsə əmr et, sənin əmrini yerinə yetirək". Bu vaxt Xəzrəc qəbiləsinin başçısı əvvəl əməlisaleh olan, sonra isə qəzəbi onu cahilləşdirmiş Səd İbn Ubadə Səd İbn Muaza (Allah ondan razı olsun) dedi: "Allaha and olsun ki, sən yalan danışdın! Sən onu nə öldürənsən, nə də öldürməyə qadirsən!" Bu sözdən sonra - Səd İbn Muazın (Allah ondan razı olsun) əmisi oğlu - Useyd İbn Xudeyr (Allah ondan razı olsun) qalxıb Səd İbn Ubadəyə dedi: "Allaha and olsun ki, sən yalan danışdın! Biz onu mütləq öldürərik. Həqiqətən, sən münafiqsən və münafiqləri müdafiə edirsən." Beləliklə Xəzrəc və Əvs qəbilələri

arasında elə çaxnaşma düşdü ki, az qala bir-birlərini öldürəcəkdilər. Bu vaxt Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) minbərdə dayanıb onları sakitləşdirirdi. Onlar susana qədər Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onları sakitləşdirdi. Mən o günümü və sonrakı gecəni dayanmadan ağladım və yatmadım.(Səhərisi gün valideynlərim mənim dayanmadan ağladığımın şahidi olduqda) elə zənn etdilər ki, ciyərim parça-parça olacaq. Onlar mənim yanımda olarkən ənsar qadınlardan biri mənim yanıma daxil olmaq üçün izn istədi və gəlib mənimlə bərabər ağladı. Elə bu zaman Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) içəri daxil oldu və salam verib oturdu. Bu söz-söhbət başlanandan o mənim yanımda oturmamışdı. Bir ay keçməsinə baxmayaraq mənim barəmdə heç bir ayə enmirdi. O,(ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allaha həmd-səna etdikdən sonra dedi: "Ey Aişə! Sənin barəndə mənə filan-filan xəbərlər çatıb. Əgər günahkar deyilsənsə Allah səni təmizə çıxaracaq. Yox əgər günah iş görmüsənsə Allahdan bağışlanma dilə, tövbə et! Həqiqətən, bəndə günahını etiraf edib tövbə edərsə Allah onun tövbəsini qəbul edər." Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) sözünü qurtardıqdan sonra mənim göz yaşım kəsildi və gözümdən bir damla yaş belə çıxmadı. Mən atama: "Allahın elçisinə cavab ver!" dedim. O dedi: "Allaha and olsun ki, ona nə deyəcəyimi bilmirəm". Sonra mən anama: "Allahın elçisinə cavab ver!" dedim. O dedi: "Allaha and olsun ki mən də bilmirəm Allahın elçisinə nə deyim." Mən az yaşlı qız uşağı olduğum üçün, Qurandan da çox bilmədiyimə görə dedim: "Həqiqətən, hər şey mənə bəlli oldu. Siz insanların danışdıqları bütün bu söhbətləri eşitdiniz, bu sizin qəlbinizdə özünə yer tapdı və siz onu təsdiq etdiniz. Əgər mən sizə günahsız olduğumu desəm, Allah da bilir ki, həqiqətən, mən günahsızam, siz mənə inanmayacaqsınız. Yox əgər günahkar olduğumu etiraf etsəm, Allah da bilir ki, mən o günahdan uzağam, siz buna inanacaqsınız. Allaha and olsun ki, Yusifin (ona Allahın salamı olsun) atası Yaqubun (ona Allahın salamı olsun) dediyindən başqa misal çəkə bilmərəm: "Mənə yalnız gözəl (tükənməz dözümlə) səbr gərəkdir. Dediklərinizi [sübut etməyə isə] Allahdan kömək diləmək lazmıdır". Bunları deyib dönüb getdim və yerimə uzandım. O zaman bilirdim ki, mən günahsızam və Allah mənim günahsız olduğumuda üzə çıxaracaq. Mən ümid edirdim ki, Allahın elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) mənə bəraət qazandıracaq bir yuxu görəcək. Lakin mən heç vaxt inanmazdım ki, Uca Allah mənim günahsız olduğum barədə oxunacaq ayələr nazil edəcək.Allaha and olsun ki, Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) heç yerindən qalxmamış və ev əhlindən də hələ çolə bir kəs çıxmamış, Allah ona vəhy nazil etdi. O hər dəfə vəhy nazil olduğu zaman düşdüyü görkəmi aldı. Endirilən kəlamın ağırlığından o çox şiddətli sıxıntı keçirir və qış günündə belə ondan mirvari dənəsi kimi damla-damla tər tökülürdü. Vəhy nazil olduqdan sonra o sevincindən gülürdü. Dediyi ilk söz isə bu oldu: "Ey Aişə, Müjdələn! O səni təmizə çıxartdı". Anam dərhal: "Qızım, Peyğəmbərə doğru qalx (və ona təşəkkür et!)"-dedi. Mən isə dedim: "Vallahi mən nə ona tərəf qalxacağam, nə də Allahdan başqa bir kimsəyə həmd edəcəyəm!" O Allah məni təmizə çıxartmaq ayəsi endirdi. "Həqiqətən, [Aişə] barəsində yalan xəbər gətirənlər öz içərinizdən olan bir zümrədir [münafiqlərdir]. Onu [o xəbəri] pis bir şey zənn etməyin o bəlkə də sizin üçün xeyirlidir." on ayə endi. Mənə bəraət qazandıran ayələr nazil olduqdan sonra, qohumluq əlaqələrinin hörmətinə və kasıb olduğuna görə Mistah İbn Usasəyə (Allah ondan razı olsun) öz malından xərcləyən Əbu Bəkr əs-Siddiq (Allah ondan razı olsun) dedi: "And olsun Allaha! Mistah Aişə barəsində belə dedikdən sonra mən ona malımdan heç bir şey verməyəcəyəm." Uca Allah da bu ayəni nazil etdi: "Aranızda olan fəzilət sərvət sahibləri qohum-əqrəbaya, miskinlərə və Allah yolunda hicrət edənlərə [heç bir şey

verməyəcəkləri, heç bir kömək göstərməyəcəkləri barədə] and içməsinlər. [Onları] əfv edib, [cəzalandırmaqdan] vaz keçsinlər! Məgər siz [bu yaxşılıq müqabilində] Allahın sizi [günahlarınızı] bağışlamağını istəmirsinizmi? Allah [bəndələrini] bağışlayan və rəhm edəndir!" Əbu Bəkr (Allah ondan razı olsun) dedi: "Əksinə, Allaha and olsun ki, mən istəyirəm ki, Allah məni bağışlasın!" O, yenə də malından xərcləməyinə davam etdi və dedi: "Allaha and olsun ki, Mən heç vaxt malımı ondan əsirgəməyəcəyəm!" Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Zeynəb binti Cəhşdən (Allah ondan razı olsun) mənim barəmdə soruşub dedi: "Ey Zeynəb! Sən [bu haqda] nə bilirsən, yaxud nə görmüsən?" O dedi: "Ey Allahın elçisi! Mən gözümü, qulağımı [görmədiyim, eşitmədiyim şeylərdən] qoruyuram! Mən onun barəsində xeyirdən başqa bir şey bilmirəm". Bu o Zeynəbdir ki, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) zövcələri arasında gözəlliyi və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanında olan mövqeyi ilə mənimlə rəqabət aparırdı. Lakin (bunun pis aqibətindən) qorxduğuna görə Allah onu qorudu. Bacısı Həmnə isə ona qarşı müharibəyə başladı [iftiraçıların Aişə barəsində söylədikləri böhtanları yaymağa başladı] və bu səbəbdən də iftiraçılardan həlak olanlarla birgə həlak oldu." Zujri belə demişdir: "bu Cammat haqda bizə çatan (xəbər) burdur!"

Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Bir adam Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) qulunun anası ilə zinada ittiham olunurdu. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Əliyə (Allah ondan razı olsun) Get onun boynunu vur! Deyə əmr etdi. Əli onun yanına gəldikdə o quyunun içində sərinlənirdi. Əli ona: "Çıx!" dedi və əlini ona uzdaraq onu çıxardı. Onun övrətinin kəsilmiş olduğunu gördü və əlini ondan çəkdi. Sonra Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək: "Ey Allahın Elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun). O Məccbubdur (yəni) övrəti yoxdur." Deyə buyurdu."

### Otuz birinci fəsil: Uca Allahın: "Cariyələrinizi zinakarlığa məcbur etməyin!" ayəsi.

32- Cabir İbn Abdullah (Allah ondan razı olsun) belə rəvayət edir: "Abdullah İbn Ubey İbn Səlulun Museykə və Umeymə adlı iki cariyəsi var idi. O, cariyələri zinakarlığa məcbur etdiyinə görə onlar Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) şikayət etdilər. Uca Allah da bu ayəni nazil etdi: "Əgər cariyələriniz ismətlərini qoruyub saxlamaq istəsələr, fani dünya malı əldə etmək xatirinə onları zinaya məcbur etməyin. Kim cariyələri zinakarlığa məcbur edərsə, [bilsin ki] onların bu məcburiyyətindən sonra, əlbəttə, Allah [zinakarlığa vadar olanları] bağışlayar və rəhm edər."

## Əl-Furqan surəsi

### Otuz ikinci fəsil: Uca Allahın: "Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz!" ayəsi.

33- İbn Abbas (Allah ondan razı olsun) belə rəvayət edir: "Müşriklərdən olan( bir dəstə ) insanlar çox adam öldürmüş və çox zina etmişdilər. Onlar Muhammədin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib dedilər: "O Allah ki, bizi Ona tərəf çağırırsan, yaxşılıq edəndir? Bizim bu etdiklərimizin kəffarəsi varmı?" Uca Allah da bu ayəni: "Onlar Allahla yanaşı başqa bir tanrıya ibadət etməz, Allahın haram buyurduğu cana nahaq yerə qıymaz (onu öldürməz), zina etməzlər. Hər kəs bunu (bu işləri) etsə, cəzasını çəkər" və bu ayəni: "(Ya

Peyğəmbər! Mənim adımdan qullarıma] de ki: "Ey mənim (günah törətməkl) özlərinə zülm etməkdə həddi aşmış bəndələrim! Allahın rəhmindən ümidsiz olmayın. Allah [tövbə etdikdə] bütün günahları bağışlayar. Həqiqətən, O, bağışlayan və rəhm edəndir!" nazil etdi."

Əs-Səcdə surəsi.

### Otuz üçüncü fəsil: Uca Allahın: " Etdikləri əməllərin mükafatı olaraq (Allah dərgahında) onlar (möminlər) üçün göz oxşayan (onları sevindirəcək) nə cür nemətlər gizlənib saxlandığını heç kəs bilməz!" ayəsi.

34- Əbu Hureyrə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Allah Təala belə buyurmuşdur: "Mən öz mömin bəndələrimə gözün görmədiyi, qulağın eşitmədiyi və ruhun hiss etmədiyini hazırlamışam. Allah Təala sizə belə bir şey göstərməmişdir. Sonra bu ayəni oxudu: "Etdikləri əməllərin mükafatı olaraq onlar üçün göz oxşayan nə cür nemətlər gizlənib saxlanıldığını heç kəs bilməz!"

### Otuz dördüncü fəsil: Uca Allahın: " Biz ən böyük əzabdan (axirət əzaİbndan) əvvəl onlara mütləq dünya əzaİbndan daddıracağıq. Bəlkə, (tövbə edib düz yola) qayıdalar!" ayəsi.

35- Ubey İbn Kəab (Allah ondan razı olsun) Biz ən böyük əzabdan (axirət əzabından) əvvəl onlara mütləq dünya əzabından daddıracağıq ayəsi barəsində belə dedi: "Dünya müsibətləri, Rum, möhkəm yaxalamaq, duman, Şöbə (hədisi rəvayət edənlərdən biri) möhkəm yaxalamaq və yaxud dumanda şəkk etdi."

Əl-Əhzab surəsi.

### Otuz beşinci fəsil: Uca Allahın: "O zaman onlar üstünüzə həm yuxarı, həm də aşağı tərəfdən (vadinin üst və alt tərəfindən) hücum etmiş..." ayəsi.

36- Aişə (Allah ondan razı olsun) Uca Allahın "O zaman onlar üstünüzə həm yuxarı, həm də aşağı tərəfdən (vadinin üst və alt tərəfindən) hücum etmiş və (qorxudan) gözünüz hədəqəsindən çıxıb ürəyiniz ağzınıza gəlmişdi." ayəsi haqqında dedi: "Bu Xəndək günü oldu."

Yasin surəsi

### Otuz altıncı fəsil: Uca Allahın "Günəş də özü üçün müəyyən olunmuş yerdə seyr edən..." ayəsi.

37- Əbu Zər (Allah ondan razı olsun) Peyğəmbərdən (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Uca Allahın: "Günəş də özü üçün müəyyən olunmuş yerdə seyr edən..." ayəsini soruşduğunu rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "Onun qərar tutduğu yer ərşin altıdır."

Əz-Zumər surəsi.

### Otuz yeddinci fəsil: Uca Allahın: "(Muşriklər) Allahı lazımınca qiymətləndirmədilər." ayəsi.

38- Abdullah İbn Məsud (Allah ondan razı olsun) Yəhudilərdən bir alimin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gələrək belə dediyini rəvayət edir: "Ey Muhammədvə yaxud Əbu əl-Qasim! Qiyamət gunu Allah göyləri bir barmağı, yerləri bir barmağı, dağları və ağacı bir barmağı, suyu və torpağı bir barmağı, digər məxluqatı da bir barmağı uzərinə qoyar. Sonra onları hərəkət etdirərək: "Məlik ancaq mənəm"buyurur." (Abdullah İbn Məsud belə) deyir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) onun sözündən təəcüb edərək və söylədiyini təsdiq edərək arxa dişləri görünənə qədər güldüyünü gördüm. Sonra bu ayəni oxudu: "(Müşriklər) Allahı lazımınca qiymətləndirmədilər (uca tutmadılar). Halbuki Qiyamət günü yer bütünlüklə Onun ovcunun içində olacaq, goylər isə Onun sağ əli ilə büküləcəkdir. (Allah muşriklərin Ona) aid etdikləri sifətlərdən tamamilə uzaq və ucadır!"

## Əs-Səcdə surəsi

### Otuz yeddinci fəsil: Uca Allahın: "Siz qulaqlarınızın, gözlərinizin və dərilərinizin əleyhinizə şəhadət verəcəklərindən qorxub (günah işləməkdən) çəkinmir, etdiyiniz əməllərin çoxunu isə Allahın bilməyəcəyini zənn edirsiniz." ayəsi.

39- Abdullah İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Üç nəfər Kəbənin yanında toplaşdı.Onların ikisi Qureyişdən biri isə Səqafi qəbiləsindən, ya da onların ikisi Səqafi biri isə Qureyişli idi. Qəlbləri anlayışsız və kök (adamlar) idi. Onlardan biri dedi: "Görəsən Allah bizim dediyimizi eşidir?" O birirsi belə dedi: "Biz yüksəkdən danışsaq eşidir. Əgər yavaş danışsaq eşitmir." O birsi isə dedi: "Əgər bizi yüksəkdən danışanda eşidirsə, onda yavaş danışanda da eşidir". Allah Təala bu ayəni nazil etdi. "Siz qulaqlarınızın, gözlərinizin və dərilərinizin əleyhinizə şəhadət verəcəklərinizdən qorxub (günah işləməkdən) çəkinmir, etdiyiniz əməllərin çoxunu isə Allahın bilməyəcəyini zənn edirsiniz."

## Əd-Duxan surəsi.

### Otuz doqquzuncu fəsil: Uca Allahın: "Sən göyün aşkar bir dumana bürünəcəyi günü gözlə." ayəsi.

40- Məsruq belə rəvayət edir: "Abdullah İbn Məsudun yanında oturmuşduq. O bizim aramızda uzanmışdı.Onun yanına bir kişi gəlib dedi: "Ey əbu Abdurraman Kində qapılarının yanında bir nəfər deyir ki, Duman gəlib, kafirlərin ruhlarını götürəcək, möminlər isə soyuqdəyməyə tutulacaq." Abdullah İbn Məsud qəzəblənərək oturdu və dedi: "Ey İnsanlar Allahdan qorxun. Sizdən kim bir şey bilirsə onu desin yox əgər bilmirsə, Allah daha yaxşı bilir desin. Sizdən birinizin bilmədiyi bir şeyə, Allah daha yaxşı bilir deməsi onun elmli olmasına sübutdur. Allah Təala Peyğəmbərinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə buyurdu: "De: "Mən buna (risaləti, Allahın hökmlərini təbliğ etməyə) görə sizdən heç bir əcr (mükafat) istəmirəm. Və mən özümdən bir şey uydurub deyənlərdən də deyiləm! (Allahdan mənə nə vəhy olunursa, yalnız onu sizə çatdırıram. Bu Quran mənim sözüm deyil,) Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) insanların (qəbul etməyib) arxa çevirdiklərini gördükdə( belə dua etdi): "Allahım Yusifin yeddi ili kimi yeddi il!" Həttaaclıqdan dərilər və meyitləri yeməyə başladılar. Onlardan biri göyə baxır və dumana oxşar bir şey görür. Əbu Sufyan Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gəlib dedi: "Ey Muhamməd! Sən Allaha itaət etməyi və qohumluq

əlaqələrini qurmağı buyuraraq gəldin. Sənın qövmün artıq həlak olur. Onlar üçün Allaha dua et." Allah Təala buyurdu: "Sən göyün aşkar bir dumana bürünəcəyi günü gözlə! (O gün müşriklərə elə bir aclıq üz verəcəkdir ki, gözləri qaranlıq gətirib yerlə göyün arasını, sanki bir duman bürüdüyünü görəcəklər!), (Elə bir duman ki) insanları saracaqdır. Bu, şiddətli bir əzabdır! (Doğrudan da, Qüreyş müşriklərinə küfrləri üzündən belə bir aclıq üz vermiş, onlar çarəsizlikdən napak şeyləri belə yeməyə məcbur olmuşlar). (Belə bir bəlaya uğrayan müşriklər deyəcəklər: ) "Ey Rəbbimiz! Bizi bu əzabdan qurtar. Biz, həqiqətən iman gətirəcəyik!" (Məkkə müşriklərinin bu yalvarışından sonra Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Allaha dua etmiş, Allah da onları həmin bəladan qurtarmışdı. Lakin müşriklərin çoxu öz sözünün üstündə durmamışdı). Onlar hara, öyüd-nəsihət eşitmək hara?! Halbuki onlara açıq-aşkar bir peyğəmbər gəldi, Onlar isə ondan üz çevirib belə dedilər: "(Bu başqası tərəfindən) öyrədilmiş bir divanədir! (Özü heç bir şey bilmir, Quranı kimsə ona öyrədir)." Biz sizi bu əzabdan azacıq qurtaracağıq, siz isə (yenidən küfrə) qayıdacaqsınız!" Dedi: "Axirət əzabından qurtarılacaqlarmı? Onları lap möhkəm yaxalayacağımız gün (qiyamət, yaxud Bədr vuruşu günü), şübhəsiz ki, Biz (onlardan) intiqam alacağıq! Möhkəm yaxalamaq Bədr günündə oldu. Artıq duman, möhkəm yaxalamaq, (dünyada və axirətdə əzab) mütləq olması və Rum ayəsi keçmişdir."

41- Abdullah İbn Məsud(Allah ondan razı olsun) belə rəvayət edir: "Beş şey artıq keçmişdir; "(Onlar) Duman, (dünyada və axirətdə əzab) mütləq olması, Rum, möhkəm yaxalamaq və ay."

## Əl-Fəth surəsi

### Qırxıncı fəsil: Uca Allahın: "Onların əlini sizdən çəkən odur..." ayəsi.

42- Ənəs İbn Məlik (Allah ondan razı olsun) belə rəvayət edir: "Səksən nəfər silahlı Məkkə müşriki Tənim dağı tərəfdən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) üzərinə hücum edərək Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) və əshabını qəfildən yaxalamq istəmişdilər. Lakin əsir tutulub Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına gətirilmişdilər. O da onlara heç bir cəza verməyib hamısını azad etmiş və bu ayə nazil olmuşdu: "Sizi onlara [müşriklərə] qalib etdikdən sonra Məkkə vadisində [Hüdeybiyyədə] onların əlini sizdən, sizin də əlinizi onlardan çəkən [onları sizinlə, sizi də onlarla vuruşmağa qoymayan] Odur."

## Əl-Hucurat surəsi.

### Qırx birinci fəsil: Uca Allahın: "Səsinizi Peyğəmbərin səsindən artıq qaldırmayın... "ayəsi.

43- Ənəs İbn Məlik (Allah ondan razı olsun) rəvayət edir ki, "Ey iman gətirənlər! Səsinizi Peyğəmbərin səsindən artıq qaldırmayın" ayəsi nazil olanda Səbit İbn Qeys evində oturdu və mən cəhənnəm əhlindənəm deyib Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) yanına artıq getmədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) Saad İbn Muazdan soruşaraq belə buyurdu: "Ey Əbu Amr Səbitin vəziyyəti necədir ?Xəstələndimi?" Saad dedi: "O,mənim qonşumdur. Onun heç bir şeydən şikayətçi olduğunu bilmirəm." Saad onun yanına gəldi və Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dediyini ona bildirdi. Səbit dedi: "Bu ayə endirildi. Artıq bilirsiniz ki, Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın

salavatı və salamı olsun) yanında sizlərdən ən yüksək səsi olan mənəm və mən cəhənnəm əhlindənəm." Saad (Səbitin dediklərini) Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) söylədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "Əksinə o cənnət əhlindəndir" deyə buyurdu."

## Qaf surəsi

### Fəsil: Uca Allahın "O gün Biz Cəhənnəmə: "Doldunmu?" – deyəcək, o isə: "Yenə varmı?" – deyə cavab verəcəkdir"ayəsi.

44- Abdulvahhab İbn Əta "O gün Biz Cəhənnəmə: "Doldunmu?" – deyəcək, o isə: "Yenə varmı?" – deyə cavab verəcəkdir" ayəsi haqqında belə dedi: "Bizə Səid Qətədədən o da Ənəs İbn Məlikin Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət etdi: " Cəhənnəmə (Cəhənnəm əhli) atılmaqda o qədər davam edəcək, Cəhənnəm isə"Yenə varmı?" – deyəcəkdir. Nəhayət Allah Təala ayağını Cəhənnəmin üzərinə qoyacaq.və (Cəhənnəmin) bir tərəfi o biri tərəfinə büzüləcək və belə deyəcəkdir: "İzzətin və Kəramına and veirirəm, kifayətdir, kifayətdir." Cənnətdə isə hələdə ( qalmış) yerlər olacaq və Allah Təala ora üçün məxluqlar inşa edəcək (yaradacaq) və onları orada məskunlaşdıracaqdır."

## Əl-Qəmər surəsi.

### Qırx üçüncü fəsil: Uca Allahın: "Amma heç bir ibrət alan (öyüd-nəsihət qəbul edən) varmı?!" ayəsi.

45- Əbu İshaq belə rəvayət edir: "Bir kişinin məsciddə Quran öyrədən əl-Əsvəd İbn Yəziddən belə soruşduğunu gördüm: "Fəhəl min muddəkir"ayəsini necə oxuyaq? Dəl yoxsa zəl (hərfi ilə). O belə Dedi: "Dəl hərfi ilə.. Abdullah İbn Məsudun belə dediyini eşitdim: "Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Muddəkir."-dəl- ilə deməsini eşitdim."

## Ər-Rəhman surəsi.

### Qırx dördüncü fəsil: Uca Allahın: "(Cinlərin əcdadı) Cannı da tüstüsüz (təmiz) oddan O xəlq etdi" ayəsi.

46- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Mələklər nurdan, Cinlər tüstüsüz (təmiz) oddan, Adəmdə sizə vəsf olunandan ( palçıqdan) yaradıldı."

## Əl-Hədid surəsi.

### Qırx beşinci fəsil: Uca Allahın: "İman gətirənlərin qəlblərinin Allahın zikri və haqdan nazil olan (Quran) üçün yumşalması vaxtı gəlib çatmadımı?!" ayəsi.

47- İbn Məsud (Allah ondan razı olsun) belə rəvayət edir: "Bizim müsəlman olmağımız ilə, Allahın: "İman gətirənlərin qəlblərinin Allahın zikri və haqdan nazil olan (Quran) üçün yumşalması vaxtı gəlib çatmadımı?!" ayəsi ilə bizi tənbeh etməsi arasında yalnız dörd il vardı."

## Əl-Həşr surəsi.

### Qırx altıncı fəsil: Uca Allahın: "Onlardan (mühacirlərdən və ənsarlardan) sonra gələnlər belə deyirlər: "Ey Rəbbimiz! Bizi və bizdən əvvəlki iman gətirmiş (din) qardaşlarımızı bağışla!"ayəsi.

48- Urvə belə rəvayət edir: "Aişə (Allah ondan razı olsun) mənə dedı: "Ey bacımın oğlu onlara Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri üçün Allahdan bağışlanma diləmələri əmr olundu, onlar isə onları söydülər."

## Əl-Cinn surəsi

### Qırx yeddinci fəsil: Uca Allahın: "De: "Mənə vəhy olundu ki, bir dəstə cin (Məkkə və Taif arasında sübh namazı vaxtı Quranı dinləyib öz həmcinslərinin yanına qayıtdıqları zaman) dedilər: "Biz çox qəribə (təsəvvür edilməz dərəcədə gözəl olan) bir Quran eşitdik" ayəsi.

49- Abdullah İbn Abbas (Allah onların hər ikisindən razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) cinlərə oxumadı və onları görmədi. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bir dəstə səhabə ilə Ukaz bazarına getdilər. Artıq şeytanlar səmavi xəbəri [Allahın mələklərə verdiyi xəbəri] oğrun-oğrun öyrənməkdən məhrum olmuş və onları yandırıb yaxan ulduzlar təqib etmişdirlər. Onlar öz qövümlərinə qayıtdılar. (Onlara sizə nə olub?) dedilər: "Onlar da "Biz səmavi xəbəri öyrənməkdən məhrum olduq və üstümüzə yanar ulduzlar endirildi!" Dedilər: "Sizə mane olan baş vermiş yeni hadisədir! Gedin, yer üzünü məşriqdən məğribə kimi gəzin və bu hadisənin nə olduğunu öyrənin!" Onlar, səmavi xəbəri öyrənməyə mane olan əsas səbəbi öyrənmək üçün yer üzünü məşriqdən məğribə kimi gəzib dolaşdılar. Onlardan bir dəstə Tihaməyə tərəf getdi. Bu zaman onlar Ukaz bazarına getmək istəyən Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) səhabələri ilə birlikdə fəcr namazını qıldığını gördülər və onun oxuduğu Qurana qulaq asıb dedilər: "Budur bizi səmavi xəbərdən məhrum edən." Sonra onlar öz qövmünün yanına qayıdıb dedilər: "Ey qövm! Biz çox qəribə, təsəvvür edilməz dərəcədə gözəl olan bir Quran eşitdik. O, haqq yolu göstərir Biz ona iman gətirdik və bir daha heç kəsi Rəbbimizə şərik qoşmayacağıq." Uca Allah da Peyğəmbərinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu ayələri nazil etdi: "(Ya Peyğəmbər) De: "Mənə vəhy olundu ki, bir dəstə cin [Məkkə və Taif arasında sübh namazı vaxtı Quranı] dinləyib [öz həmcinslərinin yanına qayıtdıqları zaman] dedilər: "Biz çox qəribə, [təsəvvür edilməz dərəcədə gözəl] olan bir Quran eşitdik…"

## Əl-Qiyamə surəsi.

### Qırx səkkizinci fəsil: Uca Allahın: "Onu tələmtələsik əzbərləmək üçün dilini tərpətmə" ayəsi.

50- İbn Abbas (Allah onların hər ikisindən razı olsun): "onu tələmtələsik əzbərləmək üçün dilini tərpətmə! " ayəsi barəsində belə demişdir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ona nazil olan ayələri əzbərləmək üçün (və ya ayə nazil olduğu zaman üzərinə düşən məşəqqətdən tez qurtarmaq üçün bu ayələri) dodaqlarını tərpədərək tələmtələsik oxuyardı. Mən də onun dodaqlarının

necə tərpətməsini sizə göstərirəm. Eynilə Səid İbn Cubeyr də (öz tələbələrinə): "Mən də İbn Abbasın dodaqlarının necə tərpəndiyini gördüyüm kimi dodaqlarımı tərpədəcəyəm!"- deyib dodaqlarını tərpətdi. Uca Allah bu ayələri nazil etdi: "(Ya Peyğəmbər! Cəbrail sənə Quranı oxuduğu zaman) onu tələmtələsik əzbərləmək üçün dilini tərpətmə! (Sən də onunla birlikdə Quranı təkrar etmə, yalnız dinlə!) Çünki onu (sənin qəlbində) cəm etmək, (dilində) oxutmaq Bizə aiddir". Yəni, "Quranı sənin qəlbində cəm edəcəyik və sən də onu oxuyacaqsan. Biz onu oxuduğumuz zaman diqqətli ol, onu dinlə və sus! Həqiqətən, onu sənin dilində oxutmaq Bizə aiddir." Bu hadisədən sonra Cəbrail (ona Allahın salamı olsun) hər dəfə Allahın elçisinə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) ayələr nazil etdikdə o, bu ayələri yalnız dinləyərdi. Cəbrail (ona Allahın salamı olsun) çıxıb getdikdən sonra isə Allahın elçisi (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) bu ayələri eşitdiyi kimi oxuyardı."

## Əl-Mutəffifin surəsi.

### Qırx doqquzuncu fəsil: Uca Allahın: "O gün bütün insanlar (haqq-hesab üçün) aləmlərin Rəbbinin (Allahın) hüzurunda duracaqlar!" ayəsi.

51- İbn Ömər (Allah onların hər ikisindən razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun): "O gün bütün insanlar (haqq-hesab üçün) aləmlərin Rəbbinin (Allahın) hüzurunda duracaqlar!" ayəsi barəsində belə dediyini rəvayət edir: "Hətta onlardan biri (o gün) qulaqlarının yarısına kimi öz tərinin içində olaraq) duracaqdır."

## Əl-İnşiqaq surəsi

### Əllinci fəsil: Uca Allahın: "Yüngül haqq-hesab çəkiləcək" ayəsi.

52- Aişə (Allah ondan razı olsun) Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dediyini rəvayət edir: "Qiyamət günü sorğu-suala çəkilən hər kəs əzab görəcək." Aişə belə byurdu: "Bu zaman mən Ona (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedim: "Məgər Allah Təala buyurmurmu ki; " Yüngül haqq-hesab çəkiləcək?" Peyğəmbər (Ona Allahın salavatı və salamı olsun!) buyurdu: "Bu ərz etmədir, haqq-hesab deyil. Haqq-hesabı müzakirə edilən əzab görəcək."

## Əl-Leyl surəsi

### Əlli birinci fəsil: Uca Allahın: " And olsun kişini və qadını yaradana!" ayəsi.

53- Əlqəmə belə rəvayət edir: "Biz Şama gəldik. Əbu Dərda (Allah ondan razı olsun) bizim yanımıza gəlib dedi: "Sizdən Abdullanın qiraətini oxuya bilən varmı?" Dedim ki; "Bəli! Mən bilirəm. Əbu Dərda soruşdu: "Sən onun: "And olsun bürüməkdə olan gecəyə!" ayəsini necə oxuduğunu eşitdin?" Əlqəmə dedi: "Mən onun belə oxuduğunu eşitdim: "And olsun bürüməkdə olan gecəyə. And olsun kişiyə və qadına!" O (Allah ondan razı olsun) belə dedi: "Allaha and olsun ki, mən də Peyğəmbərin (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə oxuduğunu eşitmişəm. Bunlar isə mənim ayəni: "And olsun kişini və qadını yaradana!" Kimi oxumağımı istəyirlər. Ancaq mən, onların dediklərinə qulaq asmıram."

## Əd-Duha surəsi.

### Əlli ikinci fəsil: Uca Allahın: "Sənin Rəbbin [bir müddət vəhy nazil etməməklə] nə səni tərk etdi, nə də [sənə] nifrət etdi.." ayəsi.

54- Əl-Əsvəd Cündəb İbn Süfyandan (Allah ondan razı olsun) belə eşitdiyini rəvayət edir" Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) iki-üç gün xəstə yatdı. Bu vaxt bir qadın gəlib Peyğəmbərə (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) belə dedi: "Ümid edirəm şeytanın səni tərk edib! İki-üç gecədir ki, mən onun sənə yaxınlaşdığını (vəhy nazil etdiyini) görmürəm?" Bu vaxt Uca Allah bu ayələri nazil etdi: "And olsun sakitləşən (və zülməti artmaqda olan) gecəyə! Sənin Rəbbin (bir müddət vəhy nazil etməməklə) nə səni tərk etdi, nə də (sənə) nifrət etdi."

## Ət-Təkəsur surəsi.

### Əlli üçüncü fəsil: Uca Allahın: "Çoxluq ilə öyünmək sizi o qədər şirnikləndirdi (başınızı o qədər qatdı) ki," ayəsi.

55- Abdullah İbn Şixxir (Allah ondan razı olsun) belə rəvayət edir: "Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) "Çoxluq ilə öyünmək sizi o qədər şirnikləndirdi (başınızı o qədər qatdı) ki.." (ayəsini) oxuyanda onun yanına gəldim. Peyğəmbər (ona, ailəsinə və səhabələrinə Allahın salavatı və salamı olsun) dedi: "Adəm oğlu; "malım, malım" deyir. Halbuki sənin yeyib tükətdiyin, geyib köhnəltdiyin və yaxud sədəqə verib keçdiyindən başqa malın varmı?"

## Ən Nəsr surəsi

### Əlli dördüncü fəsil: Uca Allahın: "(Ya Peyğəmbər!) Allahın köməyi və zəfər (Məkkənin fəthi) gəldiyi zaman" ayəsi.

56- Ubeydullah İbn Utbə (Allah ondan razı olsun) belə rəvayət edir: "İbn Abbas (Allah onların hər ikisindən razı olsun) mənə belə dedi: "Qurandan ən axırıncı nazil olan surənin (hansı olduğunu) bilirsənmi (Harun isə belə demişdir: "Dərk edirsən?") Dedim ki; "Bəli! ən-Nəsr surəsidir." O (Allah onların hər ikisindən razı olsun): "Doğru söylədin." dedi."

## Оглавление